# Mündəricat

## İZAHLI ŞƏRİƏT HÖKMLƏRİ

**Point**

Çoxluq: Hosseini Sistani, Ali, - ۱۳۰۹

Müəllifin adı və adı: Əl-Masalənin izahı / Fatvaya görə Ali Hüseyni Sistani

.[Nəşr məlumatları: Qom: Böyük Ayətullah əl-Sistani, ۱۴۲۵ AD [۱۳۸۳

Görünüş: s ۶۳۰

ISBN: ۹۶۴-۴۸۴-۰۶۶-۶۶۹۰۰۰ Oral; ۹۶۴-۴۸۴-۰۶۶-۶۶۹۰۰۰ Oral

Kataloq statusu: əvvəlki kataloqlama

Mövzu: Jafari fiqhi - Praktiki müəllimi

Mövzu: Şiə Fatvası - ۱۴-cü əsr

Əlavə ID: Grand Ayatullah Sistani Damzadeh ofisi

Konqresin təsnifatı: BP۱۸۳ / ۹ / H۴vT۹ ۱۳۸۳

Dewey təsnifatı: ۲۹۷/۳۴۲۲

Milli Biblioqrafiya nömrəsi: M۸۳-۱۵۹۷۰

P:۱

## TƏQLİDİN HÖKMLƏRİ

Məsələ ۱: Hər bir müsəlmanın üsuli-dinə əqidəsi bəsirət və dəlil əsasında olmalıdır. Üsuli-dində təqlid edə bilməz. Yəni üsuli-dində ayrı bir şəxsin sözünü, yalnız onun deməsinə etimad edərək qəbul etmək olmaz. Amma haqq İslami əqidələrə yəqini olan bir şəxs onları izhar edirsə, bu əqidəsi bəsirət üzündən olmasa belə, o şəxs müsəlman və mö'min sayılır, bütün İslam və iman hökmləri onun üzərində caridir. Müsəlman dinin zəruri və qəti olan hökmlərindən başqa, din hökmlərində ya müctəhid olub dini

hökmləri çıxara bilməli, ya bir müctəhidə təqlid etməli, ya da öz təklifini (şəri vəzifəsini) düzgün yerinə yetirməsinə yəqin edəcək bir şəkildə, ehtiyat yolu ilə əməl etməlidir. Məsələn, müctəhidlərin bəzisi bir əməlin haram olduğunu, digərləri isə haram olmadığını söyləyirlərsə, o əməli etməməli və əgər bir əməli müctəhidlərdən bəzisi vacib, digərləri isə müstəhəbb buyururlarsa, onu etməlidir. Deməli müctəhid olmayan .şəxslərin və ehtiyata əməl edə bilməyənlərin bir müctəhidə təqlid etmələri vacibdir

Məsələ ۲: Hökmlərdə təqlid, müctəhidin göstərişlərinə əməl etməkdir. Təqlid ediləcək müctəhid kişi, həddi-büluğa çatmış, ağıllı, on iki imam (ələyhimus-səlam) şiəsi, halalzadə, diri və adil olmalıdır. Adil, vacib olan işləri yerinə yetirib, ona haram olan şeylərdən çəkinən şəxsə deyilir. İnsanın zahirdə yaxşı olması ədalətin nişanəsidir, belə ki, onunla bir yerdə yaşayan camaatdan, qonşulardan və ya onunla əlaqədə olan şəxslərdən onun haqqında soruşsalar, onun yaxşı bir insan olduğunu təsdiq etsinlər. Ehtiyac duyulan yerdə və ümumi məsələlərdə müctəhidlər arasında hətta müxtəsər olsa belə, fətva ixtilafı olduğu təqdirdə insanın təqlid etdiyi müctəhid ə’ləm olmalıdır. Yəni Allahın hökmlərini dərk etməkdə zəmanəsinin müctəhidlərinin hamısından daha .bacarıqlı olmalıdır

:Məsələ ۳: Müctəhid və ə’ləm üç yoldan biri ilə tanınır

İnsanın özü yəqin etsin; məsələn, insanın özü elm əhli olub müctəhid və ə’ləmi .۱ .tanıya bilsin

Müctəhid və ə’ləmi tanıyan iki adil alimin, bir şəxsin müctəhid və ya ə’ləm olduğunu .۲ təsdiq etmələri ilə; yalnız bunlar kimi başqa iki adil alim, bunların sözlərinin əksini söyləməməsi şərti ilə; hətta bir şəxsin müctəhid və ya ə’ləm olmağı, insanın inamı olan .mütəxəssis bir şəxsin sözü ilə də sübut oluna bilər

İnsan əqlin qəbul etdiyi yolla bir şəxsin müctəhid və ya ə’ləm olmasına xatircəm .۳ olsun. Məsələn, müctəhid və ə’ləmi tanımağa qadir olan və sözlərindən xatircəmlik hasil olan bir dəstə elm əhlinin bir şəxsin müctəhid və ya ə’ləm olduğunu təsdiq .etmələri ilə

:Məsələ ۴: Müctəhidin fətvasını, yəni göstərişini əldə etməyin dörd yolu vardır

.Müctəhidin özündən eşitmək .۱

.Müctəhidin fətvasını nəql edən iki adil şəxsdən eşitmək .۲

.Sözünə inanılmış bir şəxsdən eşitmək .۳

.(Müctəhidin risaləsində görmək; (risalənin düzlüyünə əmin olmaq şərti ilə .۴

Məsələ ۵: İnsan müctəhidin fətvasının dəyişdiyini yəqin etməyənə qədər, onun risaləsində yazılmış fətvalara əməl edə

.bilər. Əgər hökmün dəyişdiyinə sadəcə ehtimal versə, axtarış aparmaq lazım deyil

Məsələ ۶: Ə’ləm müctəhidin fətva verdiyi bir məsələdə, o müctəhidin müqəllidi, yəni ona təqlid edən şəxs başqa müctəhidin fətvasına əməl edə bilməz. Amma fətva verməsə və «ehtiyat bu şəkildə əməl etməkdir» deyərsə, məsələn; ehtiyat budur ki, namazın birinci və ikinci rəkətində Həmdi oxuduqdan sonra şəxs bir surə oxumalıdır, müqəllid ya ehtiyat-vacib deyilən bu ehtiyata əməl etməlidir, yaxud ondan sonrakı mərhələdəki ə’ləmlik dərəcəsini gözləməklə başqa bir müctəhidin fətvasına əməl etməlidir. Belə ki, əgər o müctəhid təkcə Həmdi kifayət bilirsə, buna əsasən o, surəni tərk edə bilər. Həmçinin ə’ləm müctəhid bir məsələnin üzərində düşünülməli və ya .iradlı olduğunu deyərsə, bu da eyni hökmdədir

Məsələ ۷: Ə’ləm müctəhid, bir məsələdə fətvasını verdikdən sonra və ya fətva verməzdən əvvəl, o məsələdə ehtiyat edərsə, məsələn; «nəcis bir qab kürr suda bir dəfə yuyularsa, pakdır, amma ehtiyat odur ki, üç dəfə yuyulsun» deyirsə, onun .müqəllidi bu ehtiyatı tərk edə bilər və buna ehtiyat-müstəhəb deyilir

Məsələ ۸: Əgər insanın təqlid etdiyi müctəhid dünyadan köçərsə, vəfatından sonra da dirilik hökmünü daşıyır. Buna görə, əgər o, diri olan müctəhiddən ə’ləm imişsə, ehtiyac duyulan məsələlərdə hətta müxtəsər olsa belə, fətva fərqləri olduğu təqdirdə vəfat etmiş müctəhidə təqlid etməkdə baqi qalmalıdır. Amma diri müctəhid ondan ə’ləm olarsa, diri müctəhidə təqlid etməlidir. Əgər onların hansının ə’ləm olması mə'lum olmasa, yaxud bərabər olsalar, öz əməlini hansı birinin fətvasına uyğun yerinə yetirməkdə ixtiyarlıdır. Amma əgər namazı tamam, yaxud qəsr qılmaq kimi ixtilaflı hallarda təklifinə icmali elmi olsa, yaxud icmalı höccət bərqərar olsa, ehtiyat-vacibə əsasən hər iki fətvaya riayət etməlidir. Məsələnin əvvəlində gələn təqliddən əsas məqsəd, müctəhidin fətvasına əməl etmək deyil, müqəllid üçün müəyyən bir .müctəhidin fətvalarına əməl etməyə iltizamlı olmasından ibarətdir

Məsələ ۹: Mükəlləfin, öyrənməmək vasitəsi ilə günaha düşməsinə (yəni vacibi tərk etməsinə, yaxud haram iş görməsinə) ehtimal verdiyi məsələləri öyrənməsi lazımdır.

Məsələ ۱۰: İnsan, hökmünü bilmədiyi bir məsələylə qarşılaşarsa, ya ehtiyata əməl etməlidir, ya da deyilmiş şərtlərə əsasən bir müctəhidə təqlid etməlidir. Amma əgər o məsələdə, ə'ləm müctəhidin fətvasını öyrənmək imkanı yoxdursa, növbəti mərhələdə ə'ləmliyə, riayət etməklə qeyri-ə'ləmə təqlid etməyi icazəlidir.

Məsələ ۱۱: Bir şəxs bir müctəhidin fətvasını başqa bir şəxsə söyləyərsə, sonradan o müctəhidin fətvası dəyişərsə, ona fətvanın dəyişdiyini xəbər verməyə ehtiyac yoxdur. Amma fətvanı söylədikdən sonra səhv dediyini başa düşsə, onun fətvanı səhv deməsi, o şəxsin şəri vəzifəsinə əks əməl etməsinə səbəb olarsa ehtiyat-lazıma əsasən imkan daxilində o səhvi aradan qaldırmalıdır.

Məsələ ۱۲: Bir mükəlləf, əməllərini bir müddət təqlidsiz yerinə yetirsə, əgər onun əməlləri vaqe ilə, yaxud hal-hazırda onun təqlid edəcəyi müctəhidin fətvasına uyğun olsa, əməlləri səhihdir. Bundan başqa hallarda əgər qasir cahil olarsa və əməlin nöqsanlı olması rükn və bu kimi şeylər cəhətindən olmazsa, əməli səhihdir. Həmçinin, əgər müqəssir cahil də olsa, əməli nöqsanlı olması cahillik surətində səhih olan bir cəhətdən olarsa, məsələn namazı alçaqdan oxumaq yerinə ucadan oxumaq və ya əksinə, olarsa, hökm eynidir. Əgər keçmiş əməllərini necə yerinə yetirildiyin bilməzsə, «Minhac» da qeyd olunan hallar istisna olmaqla səhihliyinə hökm olunur.

## TƏHARƏTİN HÖKMLƏRİ

### Mütləq və muzaf su

Məsələ ۱۳: Su mütləq (saf), və ya muzafdır (qarışıq). Muzaf su bir şeydən alınan suya deyilir. Qarpız və gül suyu kimi, ya bir şeylə qarışan su, belə ki ona «su» deyilməyəcək şəkildə, palçıq və ona bənzər bir şeylə qarışmış olan suya deyilir. Bunlardan başqa qalan sular mütləq sudur. Mütləq su beş qismə ayrılır:

۱. Kürr suyu;

۲. Az su;

۳. Axar su;

۴. Yağış suyu;

۵. Quyu suyu;

### ۱ – KÜRR SUYU

Məsələ ۱۴: Otuz altı qarış olan bir qabı dolduran miqdarda suya, kürr suyu deyilir və təqribən ۳۸۴ letirdir.

Məsələ ۱۵: Əgər sidik, qan, kimi eyni nəcis, həmçinin nəcis olmuş paltar və nəcis olmuş bir şey kürr suya dəyərsə, o suyun iyi və ya rəngi, ya da dadı nəcasətin təsirindən dəyişərsə, kürr suyu nəcis olur; əgər dəyişməzsə nəcis olmaz.

Məsələ ۱۶: Əgər kürr suyun iyi, rəngi və ya dadı nəcasətdən başqa bir şeylə dəyişərsə, nəcis olmaz.

Məsələ ۱۷: Əgər kürr su miqdarından artıq olan suyun bir hissəsinin iyi, rəngi və ya dadı, qan kimi nəcisin dəyməsi ilə dəyişərsə və dəyişməyən hissəsi kürr miqdarından az olsa, o suyun hamısı nəcisdir. Amma dəyişməyən hissə, kürr

miqdarında və ya daha artıq olsa, yalnız iyi, rəng və ya dadı dəyişən hissə nəcis, qalan .hissə isə pakdır

Məsələ ۱۸: Fəvvarənin suyu, kürr suya birləşik olsa, nəcis bir suyu pak edər. Ancaq nəcis suyun üzərinə damla-damla tökülərsə, onu pak etməz. Lakin fəvvarənin üzərinə bir şey tutsalar və su, damla-damla olmazdan əvvəl nəcis suya qovuşarsa, onu pak .edər. Amma fəvvarə suyunun nəcis su ilə qarışması lazımdır

Məsələ ۱۹: Kürr suya birləşən bir krantın altında yuyulan nəcis bir şeydən tökülən su, əgər kürr suya birləşmiş olsa və nəcasətən iyi, rəng və ya dadını almamışdırsa və .nəcasətin özü də onda olmazsa, pakdır

Məsələ ۲۰: Əgər kürr suyun bir miqdarı buz bağlayarsa, qalan hissəsi də kürr miqdarında olmazsa və ona nəcasət dəyərsə, nəcis olur; buzdan əriyib su olan hissə .də nəcisdir

Məsələ ۲۱: Kürr suyu miqdarında olan bir suyun, bu miqdardan azalıb-azalmadığına şəkk edilirsə, kürr su hökmündədir. Yəni nəcasəti pak edər və ona nəcasət dəydiyi vaxt (rəngi, dadı və iyi dəyişməsə,) nəcis olmaz. Kürr su miqdarından az olan bir suyun da, kürr miqdarına çatıb-çatmadığında insan şəkk edərsə, kürrdən az su hökmünü .daşıyır

:Məsələ ۲۲: Suyun kürr olması iki yolla sübut olunur

.İnsanın özü bir suyun kürr olduğunu yəqin edə və ya əmin ola .۱

İki adil şəxs suyun kürr olduğunu bildirələr. Amma əgər bir adil, yaxud etimadlı şəxs .۲ və ya su ixtiyarında olan şəxs xəbər versə, amma xatircəmlik hasil olmasa, onun .sözünə etibar etmək işkallıdır

## AZ SU – ۲

.Məsələ ۲۳: Yerdən qaynamayan və kürr su miqdarından az olan suya, «az su» deyilir

Məsələ ٢۴: Az su nəcis bir şeyin üzərinə tökülərsə və ya onun üzərinə nəcis bir şey tökülsə nəcis olur. Amma yuxarıdan

nəcis bir şeyin üzərinə tökülərsə, nəcis şeyə çatan hissəsi nəcis, qalan hissəsi isə .pakdır

Məsələ ٢٥: Eyni-nəcisi (nəcisin özünü) pak etmək üçün, nəcis şeyin üzərinə tökülərək ondan ayrılan az su bir dəfə yuyulmaqla pak olmayan şeylərdə nəcisdir. Həmçinin ehtiyat- lazıma görə, eyni nəcisin aradan qaldırılmasından sonra, nəcis şeyi suya .çəkmək üçün onun üzərinə tökülərək ayrılan su da nəcisdir

Məsələ ٢۶: Sidik və ğait məxrəcinin yuyulduğu az su beş şərtlə dəydiyi ayrı bir şeyi :nəcis etməz

.Nəcasətin iyi, rəng və ya dadını almasın .١

.Kənardan başqa bir nəcis ona çatmasın .٢

.Sidik və ya ğaitlə birlikdə qan kimi ayrı bir nəcasət gəlməsin .٣

.Suyun içərisində ğait zərrələri olmasın .۴

.Nəcasət məxrəc yerinin ətrafına adi qaydadan artıq yayılmamış olsun .۵

**AXAR SU – ٣**

;Axar su o sulara deyilir ki

.Təbii mənbəyi olsun-١

;Hətta müəyyən vəsitə ilə cari (axar) etsələr belə axar olsun-٢

Müəyyən qədər axımı davamlı olsun, və təbii mənbəyə birləşik olması lazım deyil.-٣ Deməli təbii şəkildə ondan (mənbədən) ayrılsa, yuxarıdan damcılar şəkildə tökülmək kimi, yerin üstündə cərəyan etməsi fərz olunduqda, cari su hesab edilir. Amma əgər bir şey onun mənbəyə birləşməsinə mane olsa, məsələn əgər suyun axmasına, yaxud qaynamasına mane olsa, yaxud onun mənbə ilə olan əlaqəsini kəssələr, qalan su hətta .cərəyan etsə belə, axar su hökmündə deyil

Məsələ ٢٧: Axar su kürr su miqdarından az belə olsa, ona nəcasət dəydiyi zaman iyi, rəngi və ya dadı nəcasət vasitəsilə dəyişməyincə, pakdır.

Məsələ ۲۸: Əgər axar suya nəcasət dəysə və onun bir hissəsinin iyi, dadı və ya rəngi nəcasət dəyməsi ilə dəyişərsə o hissəsi nəcisdir. Dəyişməyən hissənin çeşməyə birləşən hissəsi kürr sudan az olsa belə, pakdır. Çayın digər tərəfinin suları əgər kürr miqdarında olsa, yaxud dəyişməmiş su vasitəsi ilə çeşmə tərəfinə birləşsə pak, əks .halda nəcisdir

Məsələ ۲۹: Axmayan, amma suyundan bir az götürüldükdə təkrar qaynayan çeşmə, axar su hökmündə deyildir. Yəni əgər kürr miqdarından az olsa, nəcasət dəydikdə .nəcis olur

Məsələ ۳۰: Arxın qırağında toplanmış, axar suya birləşmiş durğun su, axar su .hökmündə deyil

Məsələ ۳۱: Qışda coşan, yayda isə coşmayan və yaxud da əks şəkildə olan su, təkcə .coşduğu zanan axar su hökmündədir

Məsələ ۳۲: Suyu kürrdən az olan hamamın kiçik hovuzu, bir mənbəyə bağlı olsa əgər hovuzun və mənbənin suyu hər ikisi birlikdə kürr miqdarında olsa, ona nəcis dəydiyi .zaman iyi, rəng və ya dadı dəyişməsə, nəcis olmaz

Məsələ ۳۳: Hamam və binaların krant və duşlarının borularından tökülən su, bağlı .olduqları mənbədəki su ilə birlikdə kürr miqdarında olsa, kürr hökmünü daşıyır

Məsələ ۳۴: Yer üzərində axan, lakin yerdən qaynamayan su, kürr su miqdarından azdırsa, nəcasət dəyərsə nəcis olur. Amma yuxarıdan aşağıya axsa, aşağı hissəsinə .dəyərsə, yuxarı hissəsi nəcis olmaz

### YAĞIŞ SUYU – ۴

Məsələ ۳۵: Üzərində nəcisin eyni olmayan nəcis bir şeyin hər yerinə bir dəfə yağış yağarsa, pak olar. Ehtiyat-vacib budur ki, sidik ilə nəcis olan bədən və paltara isə iki dəfə yağması lazımdır. Xalça, paltar və bunun kimi şeyləri sıxmaq lazım deyil. Amma iki-üç damcı yağmasının faydası yoxdur, «yağış yağır» deyiləcək şəkildə yağması

.gərəkdir

Məsələ ٣۶: Əgər yağış nəcasətin eyninin üstünə yağıb başqa yerə sıçrasa, bu halda nəcasətin eyni o damcılarla birlikdə

olmasa və nəcasətin iyi və ya rəngi yaxud da dadını özünə götürməsə, pakdır. Deməli, əgər yağış qanın üstünə yağıb başqa yerlərə sıçrasa, bu halda qanın zərrələri sıçrayan .suda olarsa, yaxud o su, qanın iy və ya rəng, yaxud dadını özünə götürərsə, nəcisdir

Məsələ ۳۷: Əgər bir binanın tavanı və ya damı üzərində eyni nəcis varsa, yağış yağdığı müddətdə o nəcisə dəyərək tavandan və ya damdakı navalçadan tökülən su pakdır. Amma yağış kəsildikdən sonra, gəlməkdə olan suyun o nəcisə dəydiyi bilinirsə, .nəcisdir

Məsələ ۳۸: Nəcis olan bir yerə yağış yağarsa, pak olar. Əgər yağış suyu yerdə axmağa başlayıb, yağmağa davam etdiyi halda, tavanın altındakı nəcis yerə yetişirsə, oranı da .pak edər

Məsələ ۳۹: Yağış suyunun bütün hissələrini əhatə etdiyi nəcis torpaq pak olur, bu şərtlə .ki, suyun torpağa yetişməsi səbəbilə muzaf olması məlum olmasın

Məsələ ۴۰: Bir yerdə toplanmış yağış suyu, kürr miqdarından az olsa belə, yağış yağdığı zaman nəcis bir şey onun içərisində yuyularsa, o su nəcasətin iyi, rəng və ya dadını .almazsa, nəcis şey pak olar

Məsələ ۴۱: Nəcis bir yer üzərində sərili olan pak bir xalçanın üzərinə yağış yağsa və yağış yağmağa davam etdiyi halda xalçadan yerə keçərsə, xalça nəcis olmaz. Həmin .yer isə nəcisdən paklanar

## QUYU SUYU – ۵

Məsələ ۴۲: Yerdən qaynayan quyu suyu, kürr su miqdarından az olsa belə, nəcasət ona dəydiyi zaman onun iyi, rəng və ya dadı o nəcasət vasitəsi ilə dəyişməyincə, .həmin su pakdır

Məsələ ۴۳: Əgər quyuya nəcis tökülsə və onun iyini və ya rəngini, yaxud da dadını dəyişsə, suda baş verən dəyişiklik aradan getsə pak olur. Amma ehtiyat-vacibə .əsasən pak olmağı bu şərtlədir ki, quyudan coşub çixan su ilə qarışsın

## SULARIN HÖKMLƏRİ

Məsələ ۴۴: Mənası on üçüncü məsələdə deyilən muzaf su nəcis şeyi pak etmir, onunla .alınan dəstəmaz və qüsl batildir

Məsələ ۴۵: Muzaf su, kürr miqdarında olsa belə, ona bir zərrə nəcasət dəysə, nəcis olur. Amma yuxarıdan nəcis bir şeyin üzərinə tökülərsə, nəcis şeyə dəyən hissəsi nəcis və qalan hissəsi pakdır. Məsələn, gül suyunu gülab suyu qabından nəcis olan əl üzərinə .tökərlərsə, ələ yetişən hissəsi nəcisdir, ələ yetişməyən hissəsi isə pakdır

Məsələ ۴۶: Əgər nəcis olan muzaf su, kürr yaxud axar su ilə, daha ona muzaf su .deyilməyəcək şəkildə qarışsa, pak olar

Məsələ ۴۷: Mütləq olan bir suyun sonradan muzaf olub-olmadığı bilinməzsə, mütləq su kimidir, yəni nəcis şeyi pakladığı kimi onunla dəstəmaz və qüsl də səhihdir. Muzaf olan bir suyun da sonradan mütləq olub-olmadığı bilinməzsə, muzaf su kimidir, yəni nəcis .şeyi paklamadığı kimi, onunla dəstəmaz və qüsl də batildir

Məsələ ۴۸: Mütləq və ya muzaf olduğu bəlli olmayan bir suyun, əvvəlcədən də muzaf və ya mütləq olduğu məlum olmazsa, nəcasəti paklamadığı kimi, onunla dəstəmaz və qüsl də batildir. Ona bir nəcasət dəyərsə və su, kürr miqdarından az olsa nəcis olur. .Əgər kürr miqdarında və ya ondan çox olarsa, ehtiyat-vacibə əsasən nəcis olur

Məsələ ۴۹: Qan və sidik kimi nəcasətin dəyməsi ilə bir suyun iyi, rəng və ya dadı dəyişərsə, kürr və ya axar su olsa belə, nəcis olur. Hətta suyun iyi, rəng və ya dadı onun xaricində olan bir nəcasət vasitəsilə dəyişərsə, məsələn; suyun kənarında olan murdar olmuş heyvan bir miqdar onun iyini dəyişdiribsə, ehtiyat-lazıma görə nəcis .olur

Məsələ ۵۰: Qan və sidik kimi eyni nəcisin tökülməsi nəticəsində iyi, rəng və ya dadı dəyişən bir su, əgər kürr və ya

axar suya bitişərsə, yaxud üzərinə yağış yağsa və ya külək yağışı ona çiləyərsə və yaxud yağış suyu yağış yağa-yağa navalçadan onun üzərinə tökülərsə və bu halların hamısında onun dəyişikliyi yox olarsa, həmən su pak olar. Amma gərək, yağış suyu .kürr və ya axar su ilə qarışsın

Məsələ ۵۱: Nəcis bir şeyi kürr və ya axar su içərisində yusalar, onun pak olduğu .yuyulmadan sonra ondan tökülən su pakdır

Məsələ ۵۲: Pak olan bir suyun, sonra nəcis olub-olmadığı bilinməzsə, pakdır. Nəcis olan .bir suyun da pak olub-olmadığı bilinməzsə, nəcisdir

## TƏXƏLLİNİN HÖKMLƏRİ

### Point

Məsələ ۵۳: Təxəlli və digər vaxtlarda insana vacibdir ki, öz övrətini yetkinlik yaşına çatmış adamlardan, ona məhrəm olan ana və bacısından, dəlidən, yaxşını pisdən seçən uşaqdan gizlətsin. Lakin ər və arvada öz övrətlərini bir-birindən gizlətmək lazım .deyil

Məsələ ۵۴: İnsanın övrətini xüsusi bir şeylə örtməsi vacib deyil, məsələn, öz əli ilə də .örtsə kifayətdir

Məsələ ۵۵: Ehtiyat-lazıma əsasən təxəlli zamanı bədənin ön tərəfi, yəni qarın və sinə .yaxud arxası qibləyə olmasın

Məsələ ۵۶: Təxəlli vaxtında bədəninin ön tərəfi və ya arxa tərəfi qibləyə tərəf olan bir şəxs, yalnız övrətini qiblədən döndərərsə, kifayət etməz. Ehtiyat-vacib budur ki, təxəlli .vaxtında övrətini də üzü və arxası qibləyə çevirməsin

Məsələ ۵۷: Ehtiyat-müstəhəb budur ki, bədənin qabaq tərəfi (hökmləri sonradan açıqlanan) istibrada, həmçinin sidik və ğaitin məxrəci yuyularkən üz və arxa, qibləyə .tərəf olmasın

Məsələ ۵۸: Əgər insan, naməhrəm bir adamın onu görməməsi üçün, ön və ya arxa tərəfini qibləyə çevirəcək şəkildə oturmağa məcburdursa ehtiyat-lazıma əsasən .arxası qibləyə oturmalıdır

Məsələ ۵۹: Ehtiyat-müstəhəb budur ki, uşağı da təxəlli zamanı üzü və ya arxası qibləyə .tərəf oturtmasınlar

:Məsələ ۶۰: Dörd yerdə təxəlli etmək haramdır

Sahibi icazə verməyən bağlı küçələrdə (dalanlarda) və bundan başqa, camaatın . ۱ ;əziyyətinə səbəb olacaq küçələrdə və yollarda

.Xüsusi şəxslər üçün vəqf olan yerlərdə, məsələn, bəzi mədrəsələrdə .۳

Möminin qəbri üzərində ona hörmətsizlik olarsa; Hətta əgər ehtiramsızlıq olmasa .۴ da, haramdır; amma əgər yer əsli mübah yerlərdən olsa haram olmaz. Həmçinin bir .din və məzhəb müqəddəslərinin hörmətinin aradan getməsinə səbəb olsa, haramdır

:Məsələ ۶۱: Üç halda ğaitin çıxış yeri, yalnız su ilə pak edilir

.Qaitlə birlikdə başqa nəcasət (qan kimi) çölə gələrsə -۱

Kənardan bir nəcasət ğaitin məxrəcinə dəymişdirsə. Qadınlarda bövlün ğait-۲ .məxrəcinə yetişməsi istisnadır

.Məxrəcin ətrafı adi miqdardan artıq bulaşmışdırsa-۳

Bu üç haldan başqa qalan hallarda, məxrəc su ilə yuyula bildiyi kimi, qarşıda göstəriləcəyi qaydada, parça, daş və bunlara bənzər şeylərlə də paklana bilər, amma .su ilə yuyulması daha yaxşıdır

Məsələ ۶۲: Sidiyin məxrəci sudan başqa bir şeylə paklanmaz. Bir dəfə yumaq kifayətdir. Amma ehtiyat-müstəhəb budur ki, iki dəfə yuyulsun. Daha yaxşı olar üç .dəfə yuyulsun

Məsələ ۶۳: Ğaitin məxrəci su ilə yuyulduğu təqdirdə, orada ğait qalmamalıdır. Amma rənginin və iyinin qalmasında heç bir maneə yoxdur. Birinci dəfə yuyulduqda onda .ğaitdən bir zərrə belə qalmasa, ikinci dəfə yuyulmasına ehtiyac yoxdur

Məsələ ۶۴: Ğaitin məxrəci quru və pak olan daş, kəsək, bez parçası və buna bənzər şeylərlə paklana bilər, hətta məxrəcə təsir etməyəcək şəkildə azacıq rütubətli olsa .belə, heç bir maneəsi yoxdur

Məsələ ۶۵: Ğaitin məxrəcini daş, kəsək və ya bez parçası ilə bir dəfə silməklə tamamilə paklanırsa, kifayətdir. Amma daha yaxşı olar üç dəfə silinsin. Hətta üç ayrı parça olması daha yaxşıdır. Amma əgər üç dəfə silməklə paklanmazsa, məxrəc tamamilə

paklanıncaya qədər davam etmək gərəkdir. Amma adətən yuyulmadan aradan .getməyən zərrələrin qalmasının eybi yoxdur

Məsələ ۶۶: Allahın və Peyğəmbərlərin adları yazılmış kağız kimi, ehtiram göstərilməsi vacib olan şeylərlə ğaitin məxrəcini

.paklamaq haramdır. Sümük və təzəklə də ğait məxrəcinin paklamağın eybi yoxdur

Məsələ ۶۷: Məxrəcini paklayıb paklamadığında şəkk edən bir şəxs adətən sidik və .ğaitdən sonra dərhal özünü pak edirmişsə də, yenidən paklaması lazımdır

Məsələ ۶۸: Əgər namazdan sonra bir şəxs namazdan əvvəl övrətinin məxrəcini paklayıb-paklamadığında şəkk edərsə, qıldığı namaz səhihdir. Amma sonrakı .namazlar üçün paklaması lazımdır

## İSTİBRA

Məsələ ۶۹: İstibra, kişilərin sidikdən sonra, sidiyin sidik kanalında qalmamasına əmin olmaları üçün yerinə yetirdikləri müstəhəbb bir əməldir. İstibra bir neçə növdür: Onlardan ən yaxşısı budur ki, əgər sidik kəsildikdən sonra, ğaitin məxrəci nəcis olmuşdursa, əvvəlcə onu pak etməli, sonra üç dəfə sol əlin orta barmağı ilə ğaitin məxrəcindən alətin kökünə qədər çəkməli və daha sonra baş barmağı alətin üzərinə və onun yanındakı barmağı da alətin altına qoyaraq, aləti sünnət olunan yerə qədər üç .dəfə çəkməlidir. Sonra isə alətin başını üç dəfə sıxmalıdır

Məsələ ۷۰: Bəzən şəhvət hissinin təhrik olunmasından sonra insandan gələn «məzi» adlanan su, pakdır. Həmçinin, mənidən sonra gələn «vəzi» adlanan və bəzən sidikdən sonra gəlib «vədi» adlanan su da əgər bövl və məni ona qatışmayıbsa pakdır. Belə ki, əgər insan bövl etdikdən sonra istibra etsə və sonra ondan bir su gəldiyi zaman sidik .və ya bu üç sudan biri olmasında şəkk edərsə, pakdır

Məsələ ۷۱: Əgər insan istibra edib-etməməsinə dair şəkk edirsə və ondan bir nəm xaric olursa, onun pak və ya nəcis olmasını bilmirsə, nəcisdir və dəstəmaz alıbsa batildir. Amma etdiyi istibranın səhih olub-olmadığında şəkk edirsə və bu zaman ondan nəm gəlirsə və bunun pak olub-olmadığını bilmirsə, pak sayılır və dəstəmazı .batil deyil

Məsələ ۷۲: İstibra etməyən şəxs, əgər bövl etdiyi vaxtdan bir müddət keçəndən sonra məcrada sidiyin qalmamasına arxayın olsa və sonra bir nəm görüb onun pak olub-olmamasında şəkk edərsə, o nəm pakdır. Dəstəmazı da batil etmir.

Məsələ ۷۳: Əgər insan sidikdən sonra istibra edib dəstəmaz alsa və dəstəmazdan sonra özündə sidik, və ya məni olması ona məlum olan bir nəmlik müşahidə edərsə, bu halda ehtiyata əsasən qüsl edib dəstəmaz alması vacibdir. Amma dəstəmaz almamışdırsa, yalnız dəstəmaz alması kifayətdir.

Məsələ ۷۴: Qadın üçün bövlün istibrası yoxdur. Əgər özündə nəmlik görərsə və bu nəmliyin sidik olub-olmamasına şəkk edərsə, pakdır. Həmin rütubət qüslü və dəstəmazı da batil etməz.

## TƏXƏLLİNİN MÜSTƏHƏBATI VƏ MƏKRUHATI

Məsələ ۷۵: İnsanın təxəlli vaxtında bir şəxsin görməyəcəyi bir yerdə oturması, təxəlli yerinə daxil olduğu zaman əvvəl sol ayağını və çıxanda əvvəl sağ ayağını atması, təxəlli halında ikən başını örtməsi və bədəninin ağırlığını sol ayağına salması müstəhəbbdir.

Məsələ ۷۶: Təxəlli vaxtında Günəşlə və ya Ayla üzbəüz oturmaq məkruhdur. Amma övrətini bir şeylə örtsə məkruh deyil. Habelə külək qabağında, yolda, xiyabanda, küçədə, evin qapısında və meyvə verən ağacın altında təxəlli etmək, təxəlli vaxtı nə isə yemək, çox oturmaq, sağ əl ilə yumaq məkruhdur. Həmçinin təxəlli vaxtı danışmaq, (da məkruhdur) amma məcbur qalarsa və ya zikr edərsə eybi yoxdur.

Məsələ ۷۷: Ayaq üstə, bərk yerə, heyvanların yuvasına, suya, xüsusi ilə durğun (axarı olmayan) suya bövl etmək məkruhdur.

Məsələ ۷۸: Bövl və qaitin qarşısını almaq məkruhdur. Əgər qarşısını almaqla bədənə böyük bir zərər çatsa, haramdır.

Məsələ ۷۹: İnsanın namazdan, yatmazdan, cinsi əlaqədən əvvəl və məni gəldikdən

## NƏCASƏTLƏR

**Point**

.Məsələ ۸۰: Nəcasət on şeydən ibarətdir

.Sidik .۱

.Ğait .۲

.Məni .۳

.Murdar olmuş heyvan .۴

.Qan .۵

.İt .۶

.Donuz .۷

.Kafir .۸

.Şərab .۹

.Nəcis yeyən heyvanın təri .۱۰

**(BÖVL VƏ ĞAİT (İFRAZAT ۲ – ۱**

Məsələ ۸۱: İnsanın və atıcı qanı olan (yəni, damarını kəsdikdə, qanı sıçrayışla gələn) haram ətli heyvanların sidik və ğaiti nəcisdir. Atıcı qanı olmayan heyvanların; məsələn: əti haram olan balığın sidik və ğaiti və kiçik canlıların; məsələn: əti olmayan ağcaqanad və milçəy kimi, həşəratın fəzləsi pakdır. Lakin ehtiyat-lazım budur ki, gərək qanı .sıçramayan əti haram heyvanların sidiyindən çəkinilsin

Məsələ ۸۲: Əti haram olan quşların sidik və ğaitləri pakdır, amma daha yaxşı budur ki, .onlardan çəkinilsin

Məsələ ٨٣: Nəcasət yeyən heyvanın bövl və ğaiti nəcisdir. Yeməlilərin və içməlilərin hökmlərində aydınlaşdırılacağı kimi donuz südü əmən keçi balasının, həmçinin (nəuzu billah) insanın cinsi əlaqədə olduğu heyvanın sidik və ğaiti də eyni hökmü daşıyır.

## MƏNİ – ۳

Məsələ ۸۴: Kişinin və sıçrayan qanı olan hər heyvanın mənisi, nəcisdir. Qadından şəhvətlə xaric olan və onun cənabətli olmasına səbəb olan rütubət, ۳۴۵-ci məsələdə qeyd olunacağı kimi, məni hökmündədir. Ehtiyat-vacibə görə, sıçrayıcı qanı olan əti halal erkək heyvanında mənisindən çəkinmək lazımdır.

## MURDAR – ۴

Məsələ ۸۵: İnsanın, eləcə də istər özü ölmüş olsun, istərsə şəri qaydalara görə kəsilməmiş olsun, sıçrayan qanı olan heyvanın ölüsü nəcisdir. Balığın sıçrayan qanı olmadığından, suyun içində belə ölsə, pakdır.

Məsələ ۸۶: Murdar olmuş heyvanın yun, tük, keçi yunu, sümük və diş kimi, ruhu olmayan hissələri pakdır.

Məsələ ۸۷: İnsanın və ya sıçrayan qanı olan bir heyvanın bədənindən diri ikən, ət və ya ruhu olan başqa bir şey qoparılsa, o şey nəcisdir.

Məsələ ۸۸: Dodaqdan və bədənin ayrı yerlərindən qoparılan azacıq dərilər ruhu olmasa və asanlıqla qoparılmış olsa, pakdır.

Məsələ ۸۹: Toyuğun qarnından çıxarılan yumurta qabığı bərkiməmiş olsa belə, pakdır. Amma gərək zahiri suya çəkilsin.

Məsələ ۹۰: Ot yeməyə başlamadan ölən quzu və çəpişin qursağından tutulan pendir mayası pakdır, amma maye olması sübut olmasa gərək murdarın bədəninə toxunan hissə yuyulsun.

Məsələ ۹۱: İnsan xarici ölkələrdən gətirilən maye dərmanlar, ətir, krem, yağ və sabunun nəcis olduğuna əmin olmazsa, pakdır.

Məsələ ۹۲: Şəriət qaydalarına əsasən kəsilən heyvandan olduğuna ehtimal verilən ət, piy və dəri pakdır. Amma əgər kafirin əlindən alınarsa və ya kafirdən, şəri üsullara

görə kəsilmiş olan heyvandan olub-olmadığını araşdırmadan almış olan bir müsəlmanın əlində olarsa, bu ət və piyin yeyilməsi

haramdır. Amma belə bir dəridə namaz qılmaq icazəlidir. Bununla belə müsəlmanların bazarından və ya kafirdən almış olduğu bilinməyən halda bir müsəlmandan alsa, və yaxud kafirdən alınmışsa da, təhqiq edildiyi ehtimal verilərək alınan ət və piyin yeyilməsi icazəlidir. Bu şərtlə ki, o müsəlman, onda halal ətə məxsus olan bir təsərrüf .etsin, məsələn, yeyilmək üçün satsın

**QAN – ۵**

Məsələ ۹۳: İnsanın və sıçrayan qanı olan, yəni damarı kəsildikdə qanı sıçrayaraq axan hər bir heyvanın qanı nəcisdir. Buna görə, balıq və ağcaqanad kimi sıçrayan qanı .olmayan heyvanların qanı pakdır

Məsələ ۹۴: Şəriət qanunlarına görə kəsilən, əti halal heyvanın qanı normal miqdarda axdıqdan sonra, bədənində qalan qan pakdır. Amma nəfəs alması və ya heyvanın .başının yuxarıda olması səbəbilə qan heyvanın bədəninə qayıdarsa, o qan nəcisdir

Məsələ ۹۵: Ehtiyat-müstəhəb budur ki, toyuq yumurtasının sarısında qan zərrəsi olarsa .çəkinilsin

.Məsələ ۹۶: Bəzən süd sağılarkən görünən qan nəcisdir və südü də nəcis edir

Məsələ ۹۷: Dişlərin arasından gələn qan, əgər ağızın suyu ilə qarışması nəticəsində .aradan gedirsə, ağızın suyundan çəkinmək lazım deyil

Məsələ ۹۸: Əzilmə nəticəsində dırnaq və ya dəri altında ölən qan, qan deyilməyəcək bir formaya gəlmişdirsə, pakdır. Amma əgər, ona qan deyilərsə, xaricə çıxarsa, nəcisdir. Bu halda dırnaq və ya dəri deşilmişdirsə, qan bədənin zahirindən bir hissə hesab olunursa, dəstəmaz və ya qüsl almaq üçün, o qanı xaricə çıxararaq oranı paklamaq .əziyyətlidirsə, təyəmmüm etməlidir

Məsələ ۹۹: Əgər insan, dəri altında ölü qan toplandığını və ya əzilmə nəticəsində ətin o .hala gəldiyini bilməzsə, pakdır

Məsələ ١٠٠: Ehtiyat-lazıma əsasən əgər xörək qaynayan zaman içinə bir zərrə qan .düşsə, xörək və onun qabı nəcis olur. Qaynamaq, hərarət və od, paklayıcı deyil

Məsələ ١٠١: Sağalmaqda olan yaranın ətrafında olan sarı rəngli suyun qanla qarışması .məlum olmasa, pakdır

**İT VƏ DONUZ ٧ – ۶**

Məsələ ١٠٢: İt və donuz hətta onların tükü, sümüyü, pəncəsi, dırnağı və rütubəti .nəcisdir

**KAFİR – ٨**

Məsələ ١٠٣: Kafir, yəni Allaha və Onun vahidliyinə inanmayan şəxs və ğulat, (yəni İmamlardan (əleyhimus-səlam) hər hansı birisinin Allah olduğuna inanan və ya Allahın onlarda hülul etdiyini söyləyən şəxs), həmçinin xəvaric və nəvasib, (yəni İmamlara düşmənlik elan edənlər,) nəcisdirlər. Həmçinin nübüvvəti (Allah tərəfindən peyğəmbərlər göndərildiyini) və ya dinin zəruri hökmlərindən birini (namaz və oruc kimi), inkar edərsə, bu iş hətta ümumi şəkildə olsa belə, Peyğəmbərin (səlləllahu əleyhi və alihi və səlləm) təkzib olunmasını lazım tutarsa, nəcisdir. Amma kitab əhlinin, .(yəhudi, xristian və məcusilər) pak olmasına hökm olunur

.Məsələ ١٠۴: Kafirin bütün bədəni, hətta dırnaq, tük və rütubəti də nəcisdir

Məsələ ١٠۵: Əgər həddi-büluğa çatmamış uşağın atası, anası, babası və nənəsi kafir olarsa, nəcisdir. Amma o, ağlıkəsən olub müsəlman olduğunu izhar etsə, pakdır. Əgər öz ata-anasından üz döndərib müsəlmanlara meyl etsə, yaxud təhqiqat və araşdırma halında olsa, onun nəcis olmasına hökm etmək müşküldür. Amma əgər ata, ana, baba, və nənəsindən biri müsəlman olarsa ٢١٧-ci məsələdə aydınlaşdırıldığına əsasən o uşaq .pakdır

Məsələ ۱۰۶: Müsəlman olub-olmadığı bilinməyən və müsəlman olduğuna dəlil olacaq bir nişanə də olmayan şəxs pakdır. Lakin müsəlmanların sair hökmləri ona aid edilmir; məsələn: müsəlman qadınla evlənə, yaxud müsəlmanların qəbiristanlığında dəfn .oluna bilməz

Məsələ ۱۰۷: Əgər müsəlman şəxs, on iki İmamlardan (əleyhimus-səlam) birinə .düşmənlik üzündən nalayiq söz desə, nəcisdir

## ŞƏRAB – ۹

Məsələ ۱۰۸: Şərab nəcisdir. Amma insanı məst edən (sərxoş edən) sair şeylər nəcis .deyil

.Məsələ ۱۰۹: Texniki və tibbi spirtin bütün növləri pakdır

Məsələ ۱۱۰: Üzüm suyu, özü-özünə və ya bişirmək vasitəsi ilə qaynayarsa pakdır, amma içilməsi haramdır. Həmçinin ehtiyat-vacibə əsasən qaynadılmış üzümün də .içilməsi haramdır, amma nəcis deyil

Məsələ ۱۱۱: Xurma, mövüc və kişmiş, və onların suyu qaynasa da belə, pak və .yeyilməsi halaldır

Məsələ ۱۱۲: Əksər hallarda arpadan çəkilən yüngülvari sərxoşluq gətirən və pivə deyilən şeyin içilməsi haram və ehtiyat-vacibə görə nəcisdir. Amma heç bir məstliyə .səbəb olmayan arpa suyu pak və halaldır

## NƏCASƏT YEYƏN DƏVƏNİN TƏRİ – ۱۰

Məsələ ۱۱۳: İnsan nəcisini yeməyə adət edən dəvənin təri nəcisdir. Həmçinin, ehtiyat-.vacibə görə, insan nəcisini yeməyə adət edən sair heyvanlar da bu hökmə malikdirlər

.Məsələ ۱۱۴: Haram yolla cünub olanın təri pakdır, onunla namaz qılmaq səhihdir

## NƏCASƏTİN SÜBUT OLUNMASI YOLLARI

:Məsələ ۱۱۵: Bir şeyin nəcis olmasını üç yolla sübut etmək olar

Bir şeyin nəcis olduğuna, insanın özünün yəqin etməsi və ya ağıl kəsən yolla əmin -۱ olmasıyla. Əgər bir şeyin nəcis olduğunu güman edərsə, ondan çəkinməsi lazım deyil. Buna görə murdar və paklığa riayət etməyən, bu kimi məsələlərə laqeyd olan adamların yemək yediyi çayxana və mehmanxanalarda insan, onun üçün gətirilmiş .xörəyin nəcis olmasına əmin deyilsə, bunun eybi yoxdur

Yalançılıqla müttəhim olmayan bir şəxsin öz ixtiyarında olan bir şeyin nəcis olmasını -۲ söyləməsi. Məsələn, insanın həyat yoldaşı, nökəri, yaxud qulluqçu öz əlindəki şeyin .(qab, yaxud başqa bir əşyanın) nəcis olduğunu söyləsə, o şey nəcisdir

İki adil kişinin bir şeyin nəcis olmasını xəbər verməleri. Amma bir şərtlə ki, onların -۳ nəcis olmasının səbəbini desinlər. Məsələn, filan şeyin qan, və ya sidiyə dəyməsi nəticəsində nəcis olmasını desələr. Əgər bir adil, yaxud etibarlı sayılan bir kişi xəbər versə və onun sözündən xatircəmlik hasil olmasa, ehtiyat-vacib budur ki, o şeydən .çəkinsinlər

Məsələ ۱۱۶: Əgər məsələni, bilmədiyi üçün bir şeyin, məsələn, siçan füzləsinin nəcis olub-olmadığını bilməzsə, gərək məsələni soruşub öyrənsin. Amma məsələni bildiyi halda, bir şeyin nəcis və ya pak olduğunda şəkk edərsə, məsələn, bir şeyin qan olub olmadığında və ya insan, yoxsa ağcaqanad qanı olduğuna şəkk edərsə, o şey pakdır. .Axtarış aparmaq və soruşmaq lazım deyil

Məsələ ۱۱۷: İnsan əvvəlcədən nəcis olan şeyin sonradan pak olub-olmamasında şəkk edərsə, nəcisdir. Əgər əvvəlcədən pak olan bir şeyin sonradan nəcis olub-olmaması barədə şəkk edərsə, pakdır. Onun nəcis və ya pak olmamasını başa düşmək imkanı .olsa belə, axtarış lazım deyildir

Məsələ ۱۱۸: Hər ikisindən istifadə etdiyi iki qab, yaxud iki paltardan birinin nəcis olmasını bilsə, amma müəyyən şəkildə

hansının nəcis olmasını bilməsə, gərək hər ikisindən çəkinsin. Amma öz libasının, yaxud ümumiyyətlə istifadə etmədiyi və başqasının olan paltarın nəcis olması .barəsində şəkk etsə, öz paltarından çəkinməsi lazım deyil

## PAK ŞEYLƏRİN NƏCİS OLMASI YOLLARI

Məsələ ۱۱۹: Əgər pak bir şey, nəcis bir şeyə dəyərsə və onlardan biri və ya hər ikisi rütubətin bir-birinə keçəcəyi şəkildə yaş olarsa, pak olan şey də nəcis olar. Amma vasitələr çoxaldığı halda nəcis olmur. Məsələn: sağ əl sidik dəyməsi nəticəsində nəcis olarsa və təzə bir rütubətlə sol ələ dəyərsə, sol əl də nəcis olacaq. Sol əl quruduqdan sonra yenidən yaş olan bir paltara dəyərsə, o paltar da nəcis olur. Amma o paltar ayrı bir rütubətli şeyə dəyərsə, o şeyin nəcis olduğuna hökm edilməz. Əgər rütubət o birinə .sirayət etməyəcək qədər az olsa, pak olan şey nəcisin eyninə dəysə belə, nəcis olmaz

Məsələ ۱۲۰: Əgər pak şey nəcis şeyə dəyərsə və insan onlardan birinin və ya hər .ikisinin rütubətli olub-olmadığında şəkk edərsə, pak olan şey nəcis olmaz

Məsələ ۱۲۱: İnsanın hansının nəcis, hansının pak olduğunu bilmədiyi iki şeydən birinə, yaş olan pak bir şey sonradan toxunarsa, ondan çəkinmək lazım deyil. Amma bəzi hallarda, məsələn: Hər iki şeyin əvvəl nəcis olduğu halda, yaxud başqa bir vasitə ilə .digər pak bir şeyə rütubətlə toxunmuş olduqda, çəkinmək lazımdır

Məsələ ۱۲۲: Yer, parça və buna bənzər şeylər yaş olduqları zaman, bunların yalnız nəcasətin dəydiyi hissələri nəcis olur, qalan hissələri pakdır. Xiyar, qovun və buna .bənzər şeylər də eyni hökmü daşıyır

Məsələ ۱۲۳: Şirə, yağ və buna bənzər şeylərdən, bir az götürüldükdə, yeri boş qalmayacaq qədər axıcıdırsa onun bir nöqtəsi nəcis olduğu halda, hamısı nəcis olur. Amma əgər ondan bir az götürüldüyü zaman yeri boş qalacaq şəkildə qatı olsa və .sonradan dolursa, bu halda yalnız nəcisin dəydiyi yer nəcis olur

Buna görə əgər siçanın füzləsi ona düşərsə, sadəcə onun düşdüyü yer nəcis, qalan .hissəsi isə pakdır

Məsələ ۱۲۴: Milçək və ya ona bənzər həşərat yaş olan nəcis bir şeyin üzərinə qonduqdan sonra, uçub yenə yaş olan pak bir şeyin üzərinə qonarsa, insan da onun .özü ilə birlikdə nəcasət daşıdığını bilsə, o pak şey də nəcis olur. Əgər bilməsə, pakdır

Məsələ ۱۲۵: Bədənin tərləmiş olan bir yeri nəcis olduğu halda, tər oradan bədənin ayrı hissələrinə yayılarsa, tərin yayıldığı yerlər nəcis olar. Əgər tər başqa bir yerə .yayılmazsa, bədənin digər hissələri pakdır

Məsələ ۱۲۶: Burun və boğazdan gələn qatı bəlğəmin içində qan varsa, qan olan hissələri nəcis, digər hissələri isə pakdır. Buna görə əgər bu bəlğəm ağızın və burunun xaricinə dəyərsə, bəlğəmin nəcis hissələrinin toxunduğuna yəqin edilən yerlər nəcis, .şəkk edilən yerlər isə pakdır

Məsələ ۱۲۷: Altı dəlik olan aftafanı nəcis bir yer üzərinə qoysalar, əgər aftafanın suyu sızarsa və onun altında aftafadakı su ilə bir sayılacaq şəkildə su toplanırsa, aftafanın suyu nəcis olur. Amma əgər aftafanın suyu təzyiqlə axmaya davam edərsə, nəcis .olmaz

Məsələ ۱۲۸: Bədənə daxil olaraq nəcasətə dəyən bir şey, bayıra çıxdıqdan sonra nəcasətə bulaşıq olmazsa pakdır. Buna görə ğait məxrəcinə daxil edilən imalə aləti və ya onun suyu və yaxud bədənə batan iynə, bıçaq və buna bənzər şeylər, xaricə çıxdıqdan sonra nəcasətə bulaşıq olmazsa, nəcis deyildir. Həmçinin içəridə qana dəyən ağız suyu və burun suyu, bayıra çıxdıqdan sonra qana bulaşıq olmadığı halda, .eyni hökmü daşıyır

## NƏCASƏTİN HÖKMLƏRİ

Məsələ ۱۲۹: Quranın yazısını və eləcədə hörmətsizliyə səbəb olduqda vərəqini nəcis etmək haramdır. Əgər nəcis olsa, gərək dərhal suya çəkilsin. Hətta ehtiyat-vacibə .əsasən hörmətsizlik olmasa da nəcis etmək haram və suya çəkmək vacibdir

Məsələ ۱۳۰: Əgər Quranın cildi nəcis olsa və bu, Qurana hörmətsizlik hesab edilsə, .gərək onu suya çəksinlər

Məsələ ۱۳۱: Quranı qan və murdar kimi eyni nəcisin üstünə qoymaq eyni nəcis quru .olsa da ona hörmətsizlik olduğu halda, haramdır

Məsələ ۱۳۲: Nəcis mürəkkəblə Quran yazmaq, hətta bir hərf olsa belə, onu nəcis etmək kimi bir şeydir. Əgər yazılmışdırsa, suya çəkmək, yonmaq, və ya buna bənzər .bir yolla həmin yazını pozmaq lazımdır

Məsələ ۱۳۳: Quranı kafirə vermək əgər Qurana hörmətsizlik olarsa haram və ondan .almaq vacibdir

Məsələ ۱۳۴: Əgər Quranın vərəqi, yaxud Allahın, Peyğəmbərin (səlləllahu ələyhi və alihi və səlləm) və imamların adı üstünə yazılan kağız kimi, hörməti vacib olan şey tualetə düşsə, hərçənd xərci də olsa onu çıxartmaq və suya çəkmək vacibdir. Əgər onu çıxartmaq mümkün deyilsə, vərəqin tamamilə aradan getməsinə yəqin etməyənə kimi o tualetə getmək olmaz. Həmçinin tualetə türbət düşsə və çıxardılması mümkün .olmasa, tamamilə aradan getməsinə yəqin edilməyənə kimi oraya getmək olmaz

Məsələ ۱۳۵: Nəcis olan bir şeyin həm yeyilib-içilməsi, həm də başqasına yedirdilib-içirdilməsi haramdır. Amma uşaq və dəliyə yedirdilməsi icazəlidir. Həmçinin uşağın və ,dəlinin özü

nəcis olmuş bir yeməyi yeyərsə və ya əli ilə yeməyi nəcis etdikdən sonra yeyərsə, .onun qarşısını almaq lazım deyil

Məsələ ۱۳۶: Paklanması mümkün olan nəcis bir şeyi satmağın və ya başqasına icarəyə verməyin eybi yoxdur. Amma aşağıdakı iki şərtlə qarşı tərəfə o şeyin nəcis olduğunu :deməlidir

Tərəfin (alıcının), şəri təkliflə müxalifət etməsi gözlənilərsə, məsələn, onu yeməkdə -۱ və içməkdə işlədəcəyi bilinərsə, (ona bildirməlidir). Amma əgər belə olmazsa deməsi lazım deyil. Məsələn: tərəf (alıcı, icarəçi) onunla namaz qılmaq istəsə, ona paltarının .nəcis olduğunu bildirməsi lazım deyil. Çünki, paltarın pak olması real şərt deyildir

Tərəfin, onun sözünə etina edəcəyinə ehtimal verməlidir. Amma əgər tərəfin onun -۲ .sözünə etina etməyəcəyini bilirsə, söyləməsi lazım deyil

Məsələ ۱۳۷: İnsan, birisinin nəcis bir şeyi yediyini və ya nəcis libasla namaz qıldığını .görsə, ona deməsi lazım deyil

Məsələ ۱۳۸: Əgər evinin və ya xalçasının bir yeri nəcis olan bir şəxs, onun evinə girən şəxslərin bədən, libas və ya başqa bir şeylərinin rütubətli olaraq o nəcis yerə dəydiyini görsə, onda onun özü buna səbəb olmuşsa, əvvəlki məsələdə açıqlanan iki şərtlə .məsələni onlara deməlidir

Məsələ ۱۳۹: Əgər ev sahibi yemək yiyərkən yeməyin nəcis olduğunu başa düşsə, qeyd etdiyimiz ikinci şərtlə gərək qonaqlara desin. Amma qonaqlardan biri başa düşsə, sair qonaqlara xəbər verməsi lazım deyil. Əgər, demədiyi təqdirdə onlarla ünsiyyəti .nəticəsində özü də nəcisə bulanacaqsa, gərək qonaqlara desin

Məsələ ۱۴۰: Əgər insanın kirayə etdiyi bir şey nəcis olarsa, ۱۳۶-cı məsələdə keçən iki .şərtlə, onun sahibinə bildirməlidir

Məsələ ۱۴۱: Əgər uşaq, bir şeyin nəcis olduğunu və ya nəcis bir şeyi yuduğunu söyləyərsə, sözü qəbul edilməməlidir. Amma müməyyiz və pak-nəcisi yaxşı-yaxşı dərk

edən bir uşaq bir şeyi yuduğunu söyləyərsə, əgər o şey onun istifadə etdiyi bir şey olsa və ya onun sözündən insana xatircəmlik gəlsə, sözü qəbul edilməlidir. Həmçinin bir .şeyin nəcis olduğunu söyləyərsə yenə də hökm eynidir

## PAKLAYICILAR

### Point

:Məsələ ۱۴۲: On iki şey nəcasəti pak edir. Bu şeylərə mütəhhirat (pak edicilər) deyilir

.Su .۱

.Torpaq .۲

.Günəş .۳

.İstihalə .۴

.İnqilab .۵

.İntiqal .۶

.İslam .۷

.Təbəiyyət .۸

.Eyni nəcasətin aradan getməsi .۹

.Nəcis yeyən heyvanın istibrası .۱۰

.Müsəlmanın qayib olması .۱۱

.Başı (şəriət qaydaları əsasında) kəsilən heyvandan bir miqdar qan axması .۱۲

.Bunların hökmləri gələcək məsələlərdə geniş şəkildə açıqlanacaqdır

### SU – ۱

:Məsələ ۱۴۳: Su, dörd şərt daxilində nəcis şeyi pak edir

ci şərt budur ki, mütləq olsun. Deməli, əgər gülab suyu, söyüd ağacının yağı və s. kimi-۱ .muzaf olsa, nəcis şeyi pak etməz

.ci şərt budur ki, pak olsun-۲

cü şərt budur ki, su, nəcis şeyi yuyarkən muzafa çevrilməsin və təkrar yumanın-۳ lazım olmadığı halda son

yuyulmada su nəcasətin iyi, rəng və ya dadını özünə almasın; amma ondan qabaqkı yuyulmalarda dəyişməsinin bir zərəri yoxdur. Məsələn: iki dəfə yuyulması lazım olan bir şeyi, kürr və ya az su ilə yuduqda, birinci yuyulmada su dəyişsə də, ikinci dəfə .dəyişilməmiş su ilə paklasalar, o şey pak olar

cü şərt budur ki, nəcis şeyi yuduqdan sonra, onda eyni nəcisin kiçik zərrələri-۴ qalmamalıdır. Nəcis şeyin az su, yəni kürrdən az olan su ilə paklanmasının digər .şərtləri də vardır ki, onlar daha sonra açıqlanacaq

Məsələ ۱۴۴: Nəcis qabın iç hissəsi, az su ilə üç dəfə yuyulmalıdır. Həmçinin ehtiyat-vacibə əsasən kürr, axar və yağış suyunda da üç dəfə yuyulmalıdır. Amma içərisində itin su və ya buna bənzər axıcı bir şeyi yediyi qaba, əvvəlcə pak torpaq sürtülməli, torpaq təmizlənib aradan aparıldıqdan sonra kürr, az və ya axar suda iki dəfə yuyulmalıdır. Həmçinin, itin yaladığı qab yuyulmazdan qabaq gərək torpaqla sürtülsün. İçinə itin ağzının suyu töküldüyü yaxud bədəninin bir yeri toxunan qabı da ehtiyat-.lazıma əsasən gərək əvvəlcə torpaqla sürtülüb sonra isə üç dəfə su ilə yuyulsun

Məsələ ۱۴۵: İtin ağzını sürtdüyü qabın ağzı dardırsa, əvvəlcə içinə torpaq töküb o qabın içinin hər tərəfinə torpaq çatıncaya qədər şiddətlə silkələməli və sonra qeyd edildiyi .şəkildə yuyulmalıdır

Məsələ ۱۴۶: Donuzun yaladığı və ya içində axıcı bir şey içdiyi və yaxud içində çöl siçanı öldüyü qab kürr, az və ya axar suda yeddi dəfə yuyulmalıdır; torpaqla sürtülməsi lazım .deyil

Məsələ ۱۴۷: Şərabla nəcis olan qab kürr, axar və ya bu kimi sularla olsa belə üç dəfə .yuyulmalıdır. Ehtiyat-müstəhəb budur ki, yeddi dəfə yuyulsun

Məsələ ۱۴۸: Nəcis palçıqdan hazırlanmış və ya nəcis su, hopmuş kuzə əgər axar su və ya kürr suya buraxılarsa, suyun dəydiyi hər yer pak olur. Onun içini də paklamaq istəsələr, kürr və ya axar suda su hər tərəfinə dəyincəyə qədər qalmalıdır. Əgər o qabda onun içinə suyun toxunmasına mane olan bir rütubət varsa, qabaqca onu

.qurudub sonra axar və ya kürr suya qoymaq lazımdır

:Məsələ ۱۴۹: Nəcis olmuş qabı, az su ilə iki cür yumaq olar

.ci budur ki, qabı üç dəfə doldurub-boşaltsınlar-۱

ci budur ki, üç dəfə onun içinə bir miqdar su töksünlər və hər dəfədə suyu bütün-۲ nəcis yerlərinə çatacaq şəkildə onun içində hərəkət etdirsinlər, sonra isə suyu .boşaltsınlar

Məsələ ۱۵۰: Qazan və xum kimi nəcis olmuş böyük bir qab üç dəfə su ilə doldurulub-boşaldılmaqla pak olur. Həmçinin, əgər ona yuxarıdan aşağıya doğru hər tərəfinə yetişəcək şəkildə üç dəfə su töksələr və hər dəfəsində dibində toplanan suyu çıxarıb atsalar pak olur. Ehtiyat-müstəhəbə əsasən suları kənara çıxartmaq üçün işlədilən .qab ikinci və üçüncü dəfə yuyulmalıdır

Məsələ ۱۵۱: Əgər nəcis mis və ona bənzər şeyləri əridib sonra suya çəksələr, onun .zahiri pak olur

Məsələ ۱۵۲: Sidik ilə nəcis olan təndirin, hər tərəfinə yetişəcək şəkildə yuxarıdan aşağıya doğru bir dəfə su töksələr, pak olar. Amma ehtiyat-müstəhəb budur ki, bu işi iki dəfə etsinlər. Sidikdən başqa bir şeylə nəcis olmuşdursa, nəcasətin özü aradan qaldırıldıqdan sonra, qeyd edildiyi şəkildə üzərinə bir dəfə su tökülməsi kifayətdir. Suların cəm olması üçün təndirin dibində bir çuxur qazıb, orda yığılan suları .çıxardıqdan sonra, o çuxuru pak torpaqla doldurmaq daha yaxşıdır

Məsələ ۱۵۳: Nəcis bir şey, (nəcis olan yerlərin hər tərəfinə su çatacaq şəkildə), kürr və axar suya bir dəfə salınarsa, pak olar. Xalça, paltar və buna bənzər şeyləri sıxmaq, tapdalamaq lazım deyil. Amma bədən və ya paltar sidik ilə nəcis olmuşdursa, ehtiyat-vacibə görə kürr suda iki dəfə yumaq lazımdır. Amma axar suda bir dəfə yumaqla pak .olur

Məsələ ۱۵۴: Sidik ilə nəcis olan bir şeyi az su ilə yumaq istəsələr, əgər bir dəfə üzərinə su tökülüb ondan su ayrıldıqdan sonra, o şeydə sidik qalmazsa, pak olur. Amma paltar və bədənin pak olmaları üçün gərək onların üzərinə iki dəfə su töksünlər. Ancaq libas,

xalça və bunlara bənzər şeylər az su ilə yuyulduğu təqdirdə, ğüsalənin çıxması üçün sıxılması lazımdır. (Ğüsalə, yuyulan bir şeydən, yuyulduğu zaman və ya ondan sonra, öz–özünə və ya sıxılmaq nəticəsində, adi şəkildə ayrılan suya deyilir).

Məsələ ۱۵۵: Yemək yeməyə başlamamış, südəmər oğlan və qız uşağının bövlü ilə nəcis olan bir şeyin üzərinə, nəcis yerlərin hər tərəfinə yetişəcək şəkildə bir dəfə su tökülsə, hərçənd su az da olsa, pak olar. Amma ehtiyat-müstəhəb budur ki, ikinci dəfə də .üzərinə su töksünlər. Libas və xalça kimi şeyləri sıxmaq lazım deyil

Məsələ ۱۵۶: Sidikdən digər bir nəcisə bulaşan şeyin üzərinə, nəcis aradan aparıldıqdan sonra bir dəfə az su tökülərsə, su ondan axıb ayrıldıqdan sonra pak olar. Amma paltar .və buna bənzər şeyləri sıxaraq ğüsaləsini çıxarmaq lazımdır

Məsələ ۱۵۷: Əgər iplə toxunmuş nəcis bir həsiri kürr və ya axar suya salsalar, eyni nəcis aradan gedəndən sonra pak olur. Amma onu az su ilə yumaq istərlərsə, gərək .mümkün olan bir yolla, tapdalamaqla olsa belə, sıxaraq ğüsaləsini çıxartsınlar

Məsələ ۱۵۸: Əgər buğda, düyü, və buna bənzər şeylərin zahiri nəcis olarsa, kürr və ya axar suya salınarsa, pak olar. Onları az su ilə də paklamaq olar. Amma içləri nəcis .olarsa, kürr və ya axar su onların içinə dəysə, pak olar

Məsələ ۱۵۹: Əgər sabunun zahiri nəcis olsa, onu paklamaq olar. Amma onun içi nəcis olsa, onu paklamaq olmaz. Əgər insan, nəcis suyun sabunun içinə keçib-.keçməməsində şəkk edərsə, onun içi pakdır

Məsələ ۱۶۰: Əgər düyü, ət və bunlara bənzər şeylərin zahiri nəcis olsa onları pak bir qaba qoyaraq, üzərinə bir dəfə su töküb boşaltsalar, pak olar. Amma nəcis bir qaba qoyarlarsa, bu işi üç dəfə təkrarlamaq lazımdır. Bu zaman qab da pak olur. Əgər libas və buna bənzər sıxılması lazım olan bir şeyi qabın içərisində yumaq istərsələr, üzərinə su töküldüyü hər dəfəsində sıxılmalı və qabı əyərək içərisində cəm olan ğüsaləsini .tökməlidirlər

Məsələ ۱۶۱: Lil və buna bənzər bir rənglə boyanmış olan nəcis libası, kürr və ya axar suya batırsalar və su libasın rəngilə muzaf halını almazdan qabaq onun hər tərəfinə yetişərsə, o libas pak olur. Əgər az su ilə yuyurlarsa, sıxılarkən ondan muzaf su .tökülməzsə, pak olur

Məsələ ۱۶۲: Paltarı kürr və ya axar suda yuduqdan sonra onun üzərində su yosunu olduğu görünsə və onun, suyun paltarın

.içinə keçməsinə mane olduğu ehtimal olunmazsa, o paltar pakdır

Məsələ ۱۶۳: Əgər libas və buna bənzər şeyləri yuduqdan sonra üzərində palçıq və ya sabun parçası olduğu görünsə, onun, suyun libasa yetişməsinə mane olduğu ehtimalını verməsələr, o libas pakdır. Amma nəcis su palçığın və ya sabunun içinə .işləmişdirsə, onların zahiri pak, daxili isə nəcisdir

Məsələ ۱۶۴: Nəcis bir şeydən, nə qədər ki, nəcasətin eyni aradan qaldırılmayıb, pak olmaz. Amma nəcasətin rəngi və ya iyi o şeydə qalsa eybi yoxdur. Deməli, əgər qanı .paltardan təmizləyib suya çəkdikdən sonra qanın rəngi o paltarda qalsa paltar pakdır

Məsələ ۱۶۵: Bədəndə olan nəcasəti kürr və ya axar suyla aradan aparsalar, bədən pak olar. Ehtiyat-vacibə əsasən bədən sidik ilə nəcis olsa bir dəfə yumaqla pak olmaz, amma sudan kənara çıxıb, təkrar suya girmək də lazım deyil. Əgər suyun altında əlini .oraya çəkib suyu bədəndən ayırsa və ikinci dəfə suyu bədənə çatdırsa, kifayət edər

Məsələ ۱۶۶: Dişlərin arasında qalan nəcis yemək, ağıza su alınıb çalxalanaraq nəcis .yeməyin hər tərəfinə çatdırılsa, pak olar

Məsələ ۱۶۷: Saç və saqqalın tükünü az su ilə suya çəksələr, saç və saqqal həddən artıq deyilsə, ğüsalənin çıxması üçün sıxılması lazım deyil. Çünki su öz-özünə normal .miqdarda ayrılır

Məsələ ۱۶۸: Bədən və ya paltarın bir yeri az su ilə yuyulduqda, o yerə bitişik olub, yuyulma zamanı suyun adətən çatdığı yerlər də nəcis yerin pak olması ilə pak olar. Yəni nəcis yerin ətrafını ayrıca yumaq lazım deyil. Əksinə nəcis yer və onun ətrafı suya çəkilərkən birlikdə pak olurlar. Həmçinin nəcis bir şeyin yanına pak bir şey qoyub və hər ikisinin üzərinə su töküldükdə də hökm eynidir. Buna görə nəcis bir barmağı yumaq üçün barmaqların hamısının üzərinə su tökülsə, nəcis və pak su onların .hamısına yetişsə, nəcis olan barmaq pak olduğu zaman o biri barmaqlar da pak olur

Məsələ ١۶٩: Nəcis olan ət və quyruq digər şeylər kimi yuyulur. Suyun daxilinə keçməsinə maneə olmayacaq miqdarda, az yağlı olan bədən, qab və libas da eyni .hökmü daşıyır

Məsələ ١٧٠: Nəcis olan bədən və ya qab, sonradan suyun yetişməsinə mane olacaq bir şəkildə yağlansa, o bədən və ya qabı suya çəkmək istədikləri zaman, suyun qabın .səthinə yetişməsi üçün yağın aradan aparılması lazımdır

.Məsələ ١٧١: Kürr suya birləşmiş olan krantdan gələn su, kürr su hökmündədir

Məsələ ١٧٢: Bir şeyi yuyub pakladığını yəqin etdikdən sonra, onun üzərindən eyni nəcisin aradan aparıb-aparmamasında şəkk edərsə, eyni nəcisi aradan aparılmasına .yəqin etməsi üçün onu yenidən yuması lazımdır

Məsələ ١٧٣: Üzərinə qumla (narın və qalın) qapalı olan yer kimi, suyun batdığı bir yer .nəcis olarsa, az su ilə də pak olur

Məsələ ١٧۴: Daş və ya kərpiclə döşənmiş olan və ya suyun batmadığı sərt yer nəcis olsa, az su ilə pak olur; amma axıncaya qədər onun üzərinə su tökülməlidir. Bu halda əgər, onun üzərinə tökülən su bir çökəkdən kənara çıxmazsa və bir yerdə toplanarsa, oranın da pak olması üçün orada toplanan suyun bir parça və ya qabla kənara atılması .lazımdır

.Məsələ ١٧۵: Duz daşı və buna bənzər şeylərin zahiri nəcis olsa, az su ilə də pak olur

Məsələ ١٧۶: Ərimiş nəcis şəkərdən hazırlanan qənd, kürr və ya axar suya qoyulmaqla .pak olmaz

## TORPAQ – ٢

:Məsələ ١٧٧: Yer, dörd şərtlə nəcis olmuş ayağın və ayaqqabının altını pak edər

;Yer pak olmalıdır .١

;Quru olmalıdır .٢

Ehtiyat-lazıma əsasən ayaq və ya ayaqqabının altı yer tərəfdən yeriməklə nəcis .٣
;olsun

Ayağın və ya ayaqqabının altında tapılan qan və bövl kimi eyni nəcis və ya nəcis .۴ olmuş palçıq kimi sonradan nəcis olan şey, yol yerimək və ya ayağı sürtməklə aradan qaldırılmalıdır; əgər nəcasət qabaqcadan aradan qaldırılarsa, ehtiyat-lazıma əsasən ayaq və ayaqqabının altı yol getmək və ya yerə sürtməklə pak olmaz. Həmçinin yer ya torpaq olmalı, ya da daş, kərpic və ya bunlara bənzər şeylərlə döşənmiş olmalıdır. Xalça, həsir və çəmənlik üzərində yol getməklə nəcis olmuş ayağın və ya ayaqqabının .altı pak olmaz

Məsələ ۱۷۸: Nəcis ayaq və ayaqqabının altının, asfalt və ya ağacla döşənmiş yer .üzərində yeriməklə pak olması işkallıdır

Məsələ ۱۷۹: Ayağın və ayaqqabının altında olan nəcasət on beş ziradan az yol getməklə və ya yerə sürtməklə aradan aparılsa belə, ayaq və ya ayaqqabının pak .olması üçün, on beş zira və ya daha artıq yol getmək daha yaxşıdır

Məsələ ۱۸۰: Ayağın və ayaqqabının altının nəcisinin yaş olması lazım deyil; əgər quru .da olsa, yol getməklə paklanır

Məsələ ۱۸۱: Nəcis olan ayağın və ayaqqabının altı, yol getməklə paklandıqdan sonra, .adətən onun ətrafından palçığa bulaşan tərəfləri də pak olur

Məsələ ۱۸۲: Əlləri və dizləri üzərində yeriyən şəxs, əl və ya dizləri nəcis olsa, onların yol getməklə pak olmaları işkallıdır. Həmçinin çəliyin, süni ayağın altı, heyvanların nalı, .avtomobilin, faytonun təkərləri və buna bənzər şeylər də eyni hökmü daşıyır

Məsələ ۱۸۳: Yol getdikdən sonra, ayağın və ya ayaqqabının altında nəcasətin gözlə görünməyən zərrəciklərinin, yaxud iyinin və ya rənginin qalmasının eybi yoxdur. Amma ehtiyat-müstəhəb budur ki, bunların da qalmamaları üçün bir qədər yol getmək .lazımdır

Məsələ ۱۸۴: Ayaqqabının içi yol getməklə pak olmur. Corabın altının yol getməklə paklanması işkallıdır. Əgər corabın altı dəri və ya buna bənzər şeylərdəndirsə və .onlarla yol getmək adətdirsə yol getməklə paklanar

## GÜNƏŞ – ۳

:Məsələ ۱۸۵: Günəş beş şərtlə yeri, binanı və divarı pak edir

Nəcis olan şey, başqa bir şeyin ona dəydiyi zaman yaşlığı ona təsir edəcək qədər -۱ yaş olmalıdır. Buna görə, əgər quru olarsa, günəşin onu qurutması üçün bir yolla onu .islatmaq lazımdır

.Üzərində eyni nəcisdən bir şey qalmamalıdır -۲

Bir şey günəşin şüalarına mane olmamalıdır. Buna görə günəş pərdə, bulud və buna -۳ bənzər şeyin arxasından saçaraq nəcis olan şeyi qurudarsa, o şey pak olmaz. Amma, .bulud günəşin saçmasına mane olmayacaq qədər zəif olsa, eybi yoxdur

Nəcis şeyi günəş təklikdə qurutmalıdır. Əgər, nəcis şey günəş və küləyin vasitəsilə -۴ quruyarsa, pak olmaz. Amma əgər «külək nəcis şeyin qurumasına kömək etdi» .deyilməyəcək qədər yüngül olarsa, eybi yoxdur

Günəş, yer və binanın nəcasət təsir edən hissəsini bir dəfəyə qurutmalıdır. Əgər -۵ günəş birinci dəfə nəcis yer və binanın üzərini və ikinci dəfə də altını qurudarsa, yalnız .onların üzü pak olur. Altı isə nəcis qalır

Məsələ ۱۸۶: Günəş nəcis həsiri pak edər, lakin həsir iplə toxunmuşdursa, onun iplərini .pak etmir. Həmçinin, ağacın, bitkinin, qapı və pəncərənin günəşlə pak olması işkallıdır

Məsələ ۱۸۷: Günəş nəcis bir yerə saçdıqdan sonra, əgər insan, günəş saçdığı anda o yerin yaş olub-olmamasında və ya yaşlığının günəş vasitəsi ilə quruyub-qurumamasında şəkk edərsə, o yer nəcisdir. Həmçinin o yerdən eyni nəcisin aradan aparılıb-aparılmamasında və ya günəşin şüalarına bir şeyin maneə olub-olmamasında .şəkk edərsə, işkallıdır

Məsələ ۱۸۸: Əgər günəş, nəcis divarın bir tərəfinə saçarsa və bunun nəticəsində, divarın günəşin saçmadığı digər tərəfi də quruyarsa, hər iki tərəfin də pak olması qeyri mümkün sayılmaz. Amma əgər bir gün yerin və divarın üzünü sonrakı gün isə içini

## (İSTİHALƏ( BİR HALDAN BAŞQA HALA KEÇMƏK – ۴

Məsələ ۱۸۹: Əgər nəcis olan bir şeyin cinsi dəyişərək pak bir şeyin şəklini alırsa, pak olur. Məsələn, nəcis ağacın yanıb kül olması və ya itin duzlağa düşüb duza çevrilməsi kimi, amma əgər nəcis şeyin cinsi dəyişməzsə məsələn: nəcis buğdadan un .hazırlanması və ya çörək bişirilməsi kimi, pak olmaz

Məsələ ۱۹۰: Nəcis palçıqdan hazırlanan kuzə və buna bənzər şeylər nəcisdir. Amma nəcis odundan əldə edilən kömür, əvvəlki xüsusiyyətlərindən heç biri onda olmazsa, pakdır. Əgər nəcis palçıq odun tə'sirindən saxsıya və ya kərpicə çevrilərsə, ehtiyat-.vacibə görə nəcisdir

.Məsələ ۱۹۱: İstihalə olub-olmaması məlum olmayan nəcis şey, öz nəcisliyində qalır

## İNQİLAB – ۵

Məsələ ۱۹۲: Şərab, öz-özünə və ya içinə sirkə və duz kimi şeyin qatılması səbəbi ilə .çevrilib sirkəyə çevrilsə, pak olar

Məsələ ۱۹۳: Nəcis üzüm və bu kimi şeylərdən hazırlanan şərab, və ya bir nəcisin .dəydiyi şərab, dəyişib sirkə olsa pak olmaz

.Məsələ ۱۹۴: Nəcis xurma, kişmiş və üzümdən hazırlanan sirkə nəcisdir

Məsələ ۱۹۵: Əgər üzümün və xurmanın çör-çöpü onların içində olsa və eləcə sirkə tökülsə zərəri yoxdur. Həmçinin, onların içinə sirkə olmazdan qabaq xiyar, badımcan və bunlara bənzər şeyləri də tökərlərsə, sirkə olmazdan qabaq sərxoş edici olmadığı .təqdirdə, eybi yoxdur

Məsələ ۱۹۶: Üzüm suyu odda və ya özü-özünə qaynayarsa, haram olar. Amma əgər qaynayaraq üçdə ikisi getsə və üçdə biri qalsa, halal olur. Əgər sərxoş edici olduğu sabit olsa bəzi

fəqihlər deyiblər ki, öz-özünə qaynayıbsa, yalnız sirkə olmaqla halal olur. ۱۱۰-cu .məsələdə üzüm suyunun qaynamaqla nəcis olmadığına dair hökm qeyd edildi

Məsələ ۱۹۷: Qaynamadan üçdə ikisi azalan üzüm suyunun qalan hissəsi qaynayarsa, əgər ona camaat arasında şirə deyil, üzüm suyu deyilirsə, ehtiyat-lazım əsasən .haramdır

Məsələ ۱۹۸: Qaynayıb-qaynamadığı bilinməyən üzüm suyu halaldır, amma əgər qaynayarsa, insan, onun qaynayaraq üçdə ikisinin azaldığını yəqin etməyincə halal .olmaz

Məsələ ۱۹۹: Əgər, bir salxım yetişməmiş üzümdə (qorada) bir neçə yetişmiş üzüm dənəsi tapılırsa, ondan alınan suya üzüm suyu deyilmirsə, qaynadığı təqdirdə .yeyilməsi halaldır

Məsələ ۲۰۰: Əgər odda qaynamaqda olan bir şeyin içərisinə bir üzüm dənəsi düşərsə və qaynadığı halda yox olmazsa, ehtiyat-vacibə görə yalnız o üzüm dənəsini yemək .haramdır

Məsələ ۲۰۱: Bir-birindən ayrı olan bir neçə qazanda şirə qaynadarkən, qaynamış .qazanın qarışdırıldığı kəfkir ilə qaynamamış qazanın qarışdırılması icazəlidir

.Məsələ ۲۰۲: Qora, və ya üzüm olduğu bilinməyən bir şey qaynayarsa, halaldır

**( İNTİQAL( BİR YERDƏN BAŞQA YERƏ NƏQL OLUNMA – ۶**

Məsələ ۲۰۳: Əgər ürfə görə qanı olmayan bir heyvan insanın, yaxud sıçrayan qanı olan bir heyvanın qanını, ağcaqanadın insan və ya heyvanın bədənindən sorduğu kimi, öz bədəninə sorarsa və o heyvanın bədənində həzm olunma ərəfəsində olarsa, o qan pak olur və buna intiqal deyilir. Amma müalicə üçün, zəlinin insandan sorduğu qan, .onun bədəninin bir hissəsi sayılması məlum olmadığından nəcisdir

Məsələ ۲۰۴: Əgər insan, bədəninə qonan ağcaqanadı öldürsə və ağcaqanadın ondan çəkdiyi qan xaricə çıxarsa, o qan pakdır. Çünki, o qan ağcaqanadın qidası olmaq

Baxmayaraq ki, qanın sorulması və ağcaqanadın öldürülməsi arasındakı zaman .fasiləsi çox az idi, amma ehtiyat-müstəhəb budur ki, o qandan çəkinilsin

## İSLAM – ۷

Məsələ ۲۰۵: Əgər kafir olan bir adam kəlmeyi-şəhadəti (Əşhədü ən la ilahə illəllah və əşhədü ənnə Mühəmmədən Rəsulullah) deyərsə, yəni Allahın yeganəliyinə və Xatəmül-Ənbiya Həzrət Muhəmməd ibn Əbdullahın (səlləllahu ələyhi və alihi və sələm) nübüvvətinə şəhadət versə, hansı dil ilə söyləyərsə söyləsin, müsəlman olur. Onun qabaqcadan hər nə qədər nəcis, olmasına hökm edilirdisə də, müsəlman olduqdan sonra, artıq onun bədəni, ağızının və burnunun suyu və təri pak olar. Amma əgər, müsəlman olduğu zaman, onun bədənində eyni nəcis olarsa, onu aradan qaldırıb, yerini pak etməsi lazımdır. Hətta bədənində olan eyni nəcis, müsəlman olmazdan qabaq aradan aparılmışsa belə, ehtiyat-vacibə əsasən onun yerini su ilə .yumalıdır

Məsələ ۲۰۶: Əgər, kafir olduğu zamanda paltarı yaş halda bədəninə dəymişdirsə, istər müsəlman olduğu zaman o paltar üzərində olsun və ya olmasın, ehtiyat-vacibə .əsasən o paltardan çəkinməlidir

Məsələ ۲۰۷: Əgər kafir kəlmeyi-şəhadəti deyərsə və insan onun qəlbən müsəlman olub-olmadığını bilməzsə pakdır. Hətta qəlbən müsəlman olmadığını bildiyi halda, .ondan söylədiyi kəlmeyi-şəhadətə zidd bir hərəkət görünməzsə hökm eynidir

## TƏBƏİYYƏT – ۸

Məsələ ۲۰۸: Təbəiyyət odur ki, nəcis bir şey, başqa nəcis şeyin pak olması vasitəsi ilə .paklansın

Məsələ ۲۰۹: Şərab sirkə olsa, şərabın qabı da qaynadığı halda yetişdiyi yerə qədər pak olur. Onun üzərinə adi qaydada qoyulan bez parçası və başqa bir şey də onun vasitəsi ilə nəcis olmuşsa, o da pak olur. Amma qabın zahirinə şərab dəymişsə, şərabın sirkə .olmasından sonra, ehtiyat-vacibə əsasən ondan çəkinmək lazımdır

:Məsələ ۲۱۰: İki yerdə kafirin uşağı təbəiyyət yolu ilə pak olur

Bir kafir müsəlman olarsa, onun uşağı da paklıqda ona tabedir. Həmçinin əgər kafir -۱ uşağın anası, ya baba və ya nənəsi müsəlman olarsa, uşaq da pak olar. Amma bu təqdirdə, uşağın yeni müsəlmanın yanında və onun kəfaləti altında olması və ondan .uşağa daha yaxın olan bir kafir yanında olmaması lazımdır

Kafir bir uşaq, bir müsəlmana əsir düşsə, onun yanında atası və ya babalarından biri -۲ yoxdursa pak olur. Amma bu halda uşağın təbəiyyət yolu ilə pak olması üçün, uşaq .ağlıkəsəndirsə, kafir olduğunu izhar etməməlidir

Məsələ ۲۱۱: Üzərində meyyit yuyulan taxta və ya daş, meyyitin övrət yerinə örtülən parça və meyyitə qüsl verənin əli, meyyitlə yuyulan hər bir şey meyyitin qüslü sona .çatdıqdan sonra pak olur

Məsələ ۲۱۲: Əgər bir şəxs əli ilə bir şeyi yuyarsa, o şey pak olduqdan sonra onunla .birlikdə yuyulan əli də pak olur

Məsələ ۲۱۳: Paltar və buna bənzər şeylər az su ilə yuyulsa, normal həddə sıxılıb onun .yuyulduğu suyu çıxardıqdan sonra, o libasda qalan su pakdır

Məsələ ۲۱۴: Az su ilə yuyulan nəcis qabın paklanması üçün onun üzərinə tökülən suyun .ayrılmasından sonra, onun üzərində qalan su damlaları pakdır

## NƏCASƏTİN ARADAN GETMƏSİ – ۹

Məsələ ۲۱۵: Əgər bir heyvanın bədəninə qan kimi eyni nəcis və ya nəcis olan su kimi mütənəccis bulaşsa, onlar aradan getdikdən sonra, o heyvanın bədəni pak olur. İnsanın ağız, burun

və qulağın içi kimi bədəninin batini də eyni hökmdədir. Yəni kənardan gələn bir nəcasət vasitəsi ilə nəcis olur və onun aradan getməsi ilə də pak olur. Dişlərin arasından gələn qan kimi, bədənin batin hissəsinə aid bir nəcasət bədənin batin hissəsinin nəcis olmasına səbəb olmaz. Həmçinin kənardan bir şey bədənin batinindəki (daxili) nəcasəta dəyərsə nəcis olmaz. Buna görə də ağızda olan taxma dişə, digər dişin arasından gələn qan dəyərsə, onu su ilə yumaq lazım deyil, amma əgər nəcis bir .yeməyə dəyərsə, onu yumaq lazımdır

Məsələ ۲۱۶: Əgər ağızın içinin qanı dişlərin arasında qalan yemək qalıqlarına dəyərsə, .onu nəcis etməz

Məsələ ۲۱۷: Göz qapaqlarının və dodaqların bağlandığı zaman bir-birinin üzərinə gələn miqdarı, bədənin batin hissəsi hökmündədir. Buna görə onlara kənardan bir nəcis dəyərsə, onu yumaq lazım deyil. Amma əgər bədənin daxili və ya xarici hissəsindən .olduğunu bilmədiyi bir yerinə, xaricdən bir nəcis dəyərsə, yumaq lazımdır

Məsələ ۲۱۸: Əgər nəcis toz və ya torpaq quru libas, xalça və buna bənzər şeylərə qonsa silkələdikdə ondan yəqin olunan miqdarda toz və torpaq tökülürsə, o pakdır və .yumaq lazım deyil

## NƏCASƏT YEYƏN HEYVANIN İSTİBRASI – ۱۰

Məsələ ۲۱۹: İnsan nəcasətini yeməyə adət etmiş heyvanın bövl və ğaiti nəcisdir. Onu pak etmək üçün istibra etmək lazımdır. Yəni nəcasət yeyən heyvan deyilməyəcək qədər bir müddət, onu nəcasət yeməkdən saxlamalı və ona pak yemək verilməlidir. Bu müddətdən sonra ona bir daha nəcasət yeyən deyilməsə də, ehtiyat-müstəhəb budur ki, nəcasət yeyən dəvəni qırx, inəyi iyirmi, qoyunu on, qaz və ördəyi yeddi və ya beş, .toyuğu üç gün nəcasət yeməkdən saxlasınlar

## MÜSƏLMANIN QAİB OLMASI – ۱۱

Məsələ ۲۲۰: Əgər baliğ və ya təharət və nəcasəti ağlıkəsən bir müsəlmanın bədəni, libası və ya xalça, qab və s. kimi, istifadə etdiyi bir şeyi nəcis olsa və o müsəlman bir müddət gözdən qeyb olsa, insan o müsəlmanın onu yuduğuna ağılı kəsən bir ehtimal .versə pak olar

Məsələ ۲۲۱: Əgər insanın özü, nəcis olan bir şeyin pak olduğuna yəqin etsə və ya xatircəm olarsa və yaxud iki adil şəxs şəhadət verərsə və onların şəhadəti pak olmasını göstərərsə, o şey pakdır. Məsələn bövl ilə nəcis olmuş paltarı iki dəfə yumasına şəhadət versələr. Həmçinin, əgər yalançılıqda ittiham edilməyən bir şəxs, öz ixtiyarında olan nəcis bir şeyin pak olduğunu söyləyərsə və ya bir müsəlman nəcis olan bir şeyi paklamaq məqsədi ilə yuyarsa onun düzgün şəkildə suya çəkib-çəkməməsi .bilinməsə də, o şey pakdır

Məsələ ۲۲۲: İnsanın libasını yumağı öz boynuna götürən (bu işə vəkil olan) bir şəxs, onu .yuduğunu söyləyərsə və onun sözündən insana xatircəmlik gələrsə, o libas pakdır

Məsələ ۲۲۳: Əgər insanda, nəcis bir şeyi yuyarkən onun pak edildiyinə yəqin etmədiyi .bir hal vəsvaslıq halı varsa, camaatın yuduğu normal şəkildə yuyarsa kifayət edər

## QANIN ADİ ŞƏKİLDƏ AXMASI – ۱۲

Məsələ ۲۲۴: ۹۴-cü məsələdə açıqlandığı şəkildə, şəri üsullarla başı kəsilən heyvanın .qanı normal miqdarda axdıqdan sonra, onun bədənində qalan qan pakdır

Məsələ ۲۲۵: Keçən məsələdə qeyd olunan hökm ehtiyat-vacibə əsasən əti halal olan .heyvanlara məxsusdur və əti haram heyvanlara aid deyil

## QABLARIN HÖKMLƏRİ

Məsələ ۲۲۶: İt, donuz və ya murdar olmuş heyvanın dərisindən hazırlanan bir qabda bir şey yemək və içmək, hər hansı bir rütubətin o şeyin nəcis olmasına səbəb olduğu təqdirdə haramdır. O qabın dəstəmaz və qüsl kimi, pak şeylə edilməsi lazım olan işlərdə də istifadə edilməsi icazəli deyil. İt, donuz və murdar olmuş heyvanın dərisindən, qab olmasa da, istifadə etməmək ehtiyat müstəhəbbdir.

Məsələ ۲۲۷: Qızıl və gümüşdən hazırlanan qablarda yemək və içmək, hətta ehtiyat-vacibə görə, onların hər cür istifadə edilməsi haramdır. Amma onlarla otağı və buna bənzər şeyləri bəzəmək və onları saxlamağın eybi yoxdur, lakin bunu da tərk etmək əhvətdir: zinət və ya saxlamaq üçün qızıl və gümüş qabları düzəltməyin və yaxud onları alıb-satmağın da hökmü eynidir.

Məsələ ۲۲۸: Qızıl və gümüşdən düzəldilən stəkan tutacağına qab deyilirsə, qızıl və gümüş stəkan hökmündədir. Əgər ona qab deyilmirsə, istifadə olunmasının heç bir maneəsi yoxdur.

Məsələ ۲۲۹: Üzərinə qızıl və gümüş suyu çəkilmiş qabın istifadə edilməsinin eybi yoxdur.

Məsələ ۲۳۰: Bir filizi qızıl və ya gümüşlə qarışdırıb qab hazırlayarlarsa, qabdakı filizin miqdarı, ona qızıl və ya gümüş deyilməyəcək qədər artıq olsa, istifadə olunmasının maneəsi yoxdur.

Məsələ ۲۳۱: İnsanın, qızıl və ya gümüş qabda olan yeməyi ayrı bir qaba boşaltmasının, adi halda ikinci qab birinci qabdan yemək yeməyə vasitə olmazsa, eybi yoxdur.

Məsələ ۲۳۲: Qəlyanın üfürən yeri, qılıncın qını, bıçaq və Quranın qabı, qızıl və gümüşdən hazırlansa istifadə etməyin eybi yoxdur. Ehtiyat-müstəhəb budur ki, qızıl və gümüşdən hazırlanmış kül qabı, ətir və sürmə qabından istifadə edilməsin.

Məsələ ۲۳۳: Məcburiyyət halında qızıl və ya gümüş qabda zərurəti aradan aparacaq miqdarda yeyib-içməyin heç bir eybi yoxdur. Amma bu miqdardan artıq yeyib-içmək .icazəli deyil

Məsələ ۲۳۴: Qızıl-gümüşdən və ya digər bir şeydən hazırlandığı bilinməyən bir qabdan .istifadə etməyin eybi yoxdur

## DƏSTƏMAZ

**Point**

Məsələ ۲۳۵: Dəstəmaz alarkən üz və qolları yumaq, başın ön hissəsinə və ayaqların .üzərinə məsh çəkmək vacibdir

Məsələ ۲۳۶: Üz, (dəstəmaz üçün olan uzunluq miqdarına görə), gərək alının yuxarı hissəsindən (tüklərin bitdiyi yerdən) çənənin axırına qədər yuyulsun. Eni isə, gərək baş barmaqla orta barmağın tutduğu miqdarda yuyulsun. Əgər bu miqdardan hətta azacıq yuyulmasa, dəstəmaz batildir. Bu miqdarın tamamilə yuyulmasına yəqin etmək üçün, .gərək onun ətrafından da bir az yusun

Məsələ ۲۳۷: Əgər bir kəsin üzü və ya əli, normal insanların üzü və ya əlindən böyük və ya kiçik olsa, camaat arasında normal adamın üzünü haraya qədər yuduğuna diqqət etməli, o da oraya qədər yumalıdır. Həmçinin əgər alnında tük çıxarsa və ya başının .önündə tük olmazsa, alnını normal miqdarda yumalıdır

Məsələ ۲۳۸: Qaşlarında, gözünün və ya dodaqlarının kənarında suyun keçməsinə mane olacaq çirk və ya başqa bir şeyin olduğuna ehtimal verirsə və bu ehtimal camaatın nəzərində düzgün bir ehtimaldırsa, dəstəmaz almamışdan əvvəl yoxlamalı, əgər varsa .aradan qaldırmalıdır

Məsələ ۲۳۹: Əgər üzün dərisi, tüklərin arasından görünərsə, gərək suyu dəriyə çatdırsın. Amma görünməsə, tükləri yumaq kifayətdir və suyun tüklərin altına .çatdırılması lazım deyil

Məsələ ۲۴۰: Üzün dərisinin tüklərin arasından görünüb-görünmədiyində şəkk edərsə, .ehtiyat-vacibə əsasən saqqalı yumalı, üzün dərisinə də suyu çatdırmalıdır

Məsələ ۲۴۱: Burnun içini və qapadığı zaman göz və dodaqların görünməyən yerini yumaq vacib deyil. Amma əgər insan yuyulması vacib olan miqdarın yuyulmasına əmin .deyilsə, buna yəqin etməsi üçün onlardan bir miqdarını yuması vacibdir

Bu hökmü bilməyən şəxs əvvəlcə almış olduğu dəstəmazda vacib olan miqdarı yuyub-yumadığını bilməzsə, o dəstəmazla qılmış olduğu namaz səhihdir; sonrakı namaz .üçünsə yenidən dəstəmaz alması lazım deyil

Məsələ ۲۴۲: Ehtiyat-lazıma əsasən qollar və üz gərək yuxarıdan aşağıya doğru .yuyulsun. Aşağıdan yuxarı doğru yusa, dəstəmaz batildir

Məsələ ۲۴۳: Əgər əlini isladıb üzünə və qollarına çəkərsə, əlinin nəmliyi onları isladacaq .miqdarda olarsa, kifayətdir. Bu halda onların üzərindən su axıdılması lazım deyil

Məsələ ۲۴۴: Üzü yuyandan sonra sağ qolunu, daha sonra isə sol qolunu dirsəklərdən .barmaqların ucuna qədər yumalıdır

Məsələ ۲۴۵: Əgər insan dirsəyi bütünlüklə yuduğuna əmin deyilsə, buna yəqinlik hasil .etməsi üçün gərək dirsəyindən bir az yuxarıdan yusun

Məsələ ۲۴۶: Üzünü yumamışdan əvvəl əllərini biləklərinə qədər yuyan bir şəxs dəstəmaz alarkən qolunu dirsəkdən barmaqlarının ucuna qədər yumalıdır. Əgər təkcə .biləklərinə qədər yusa, dəstəmazı batildir

Məsələ ۲۴۷: Dəstəmaz alarkən üzü və qolları bir dəfə yumaq vacib, iki dəfə yumaq müstəhəbb, üç və daha artıq yumaq isə haramdır. Birinci dəfə yumaq dəstəmaz qəsdi ilə üz və ya qoluna tökdüyü su onun hər tərəfini əhatə etdiyi və heç bir ehtiyat yeri qalmadığı zaman tamam olur. Məsələn əgər birinci dəfə yumaq qəsdi ilə on dəfə belə üzünə su tökərsə, su onun hər tərəfini əhatə edincəyə qədər maneçiliyi yoxdur. Həmçinin dəstəmaz niyyəti ilə üzü yumağı qəsd etməyənə qədər birinci yuma gerçəkləşməz. Buna görə üzün hamısını bir neçə dəfə yuyub axırıncı dəfə dəstəmaz niyyəti ilə yumağı qəsd edə bilər. Lakin ikinci yumada niyyətin vacib olması nəzəri işkalsız deyil. Ehtiyat-lazıma əsasən birinci yumadan sonra üzü və qolları dəstəmaz .qəsdi ilə olmasa belə, bir dəfədən çox yumamalıdır

Məsələ ۲۴۸: Hər iki əl yuyulduqdan sonra, gərək əldə qalan dəstəmaz suyunun yaşı ilə başın üstünə məsh çəksin. Ehtiyat-müstəhəb budur ki, sağ əlin içi ilə məsh çəkilsin və

Məsələ ۲۴۹: Başın, alnın qabağında yerləşən dörd hissəsindən biri məsh yeri hesab edilir. Bu hissənin hər yerinə və hər nə qədər məsh çəkilsə kifayətdir. Hərçənd ehtiyat-.müstəhəb budur ki, uzunluğu bir barmaq və eni üç bağlı barmaq qədəri olsun

Məsələ ۲۵۰: Məshin başın dərisinə çəkilməsi lazım deyil, başın ön hissəsindəki tüklərə də məsh çəkilməsi düzgündür. Amma başın qabağının tükü darananda üzə tökülərsə, yaxud başın o biri hissəsinə çatarsa, onda tüklərin dibinə məsh çəkilməlidir. Əgər üzünə tökülən, yaxud başın başqa yerinə çatan tükləri başın qabağında bir yerə yığıb onlara məsh çəksə və ya başın başqa yerlərinin qabağa gələn tüklərinə məsh çəksə, .batildir

Məsələ ۲۵۱: Başa məsh çəkəndən sonra dəstəmaz suyunun əldə qalmış yaşlığı ilə ayağın üstünə barmaqların birinin başından oynağa kimi məsh edilməlidir. Ehtiyat-.müstəhəb budur ki, sağ ayağa sağ əllə, sol ayağa sol əllə məsh edilsin

Məsələ ۲۵۲: Ayağa çəkilən məshin eni hər ölçüdə olsa kifayətdir. Amma daha yaxşısı budur ki, üç bağlı barmağın eni qədəri olsun, hətta ayağın bütün üstünə məsh .çəkilməsi daha yaxşıdır

Məsələ ۲۵۳: Ayağın məshində, sağ əlini ayağın barmaqlarının başına qoyandan sonra ayağın üzərinə çəkməsi lazım deyil. Əli bütünlüklə ayağın üzərinə qoyub, azacıq məsh .çəkə də bilər

Məsələ ۲۵۴: Ayağa və başa məsh edərkən, əli onların üzərinə çəkməlidir. Əgər əli saxlayıb başı və ya ayağı ona çəksə, dəstəmaz batildir. Amma əli çəkdiyi vaxtda ayaq, .yaxud baş azacıq hərəkət etsə, eybi yoxdur

Məsələ ۲۵۵: Məsh çəkilən yer quru olmalıdır. Əgər əlin nəmliyi ona təsir etməyəcək qədər yaş olarsa, məsh batildir. Amma əgər nəm olsa və ya onda olan nəmlik əlin .rütubətində itəcək qədər az olarsa, eybi yoxdur

Məsələ ۲۵۶: Əgər məsh etmək üçün, əlin içində yaşlıq olmasa, ayrı bir su ilə əlini islada bilməz. Gərək öz saqqalının

yaşlığından götürüb onunla məsh etsin. Saqqaldan qeyri yerdən yaşlıq götürüb onunla .məsh etmək işkallıdır

Məsələ ۲۵۷: Əlin içində yalnız başa məsh çəkmək qədər yaşlıq olsa, ehtiyat-vacib budur ki, başa həmən yaşla məsh çəksin və ayağa məsh çəkmək üçün öz saqqalının .yaşlığından nəmlik götürsün

Məsələ ۲۵۸: Corab və ayaqqabının üstündən məsh çəkmək batildir. Amma şiddətli soyuqdan, oğrudan, yırtıcı heyvandan və bu kimilərdən qorxmaq üzündən corab və ayaqqabını çıxarda bilməsə ehtiyat-vacib budur ki, corab və ayaqqabının üzərindən məsh çəksin və həmçinin təyəmmüm də etsin. Əgər təqiyyə halında olsa, corab və .ayaqqabının üzərindən məsh çəkmək kifayət edər

Məsələ ۲۵۹: Əgər ayağın üstü nəcis olsa və ona məsh çəkmək üçün suya çəkə bilməsə, .təyəmmüm etməlidir

## İRTİMASİ DƏSTƏMAZ

Məsələ ۲۶۰: İrtimasi dəstəmaz, insanın üzü və əllərini dəstəmaz niyyəti ilə suya salmasına deyilir. Ehtiyata zidd olmasına baxmayaraq, zahir odur ki, isrimasi olaraq .yuyulan əlin nəmi ilə məsh etməyin eybi yoxdur

Məsələ ۲۶۱: İrtimasi dəstəmazda da, gərək üz və əllər yuxarıdan aşağıya doğru yuyulsun. Əgər üz və əlləri dəstəmaz məqsədilə suya batırsa, gərək üzü alın tərəfdən, .əlləri isə dirsək tərəfdən suya salsın

Məsələ ۲۶۲: Əgər dəstəmaz üzvlərindən bəzilərini irtimasi, bəzilərini isə qeyri-irtiması .yolla yerinə yetirsə, eybi yoxdur

## DƏSTƏMAZ VAXTI MÜSTƏHƏB OLAN DUALAR

:Məsələ ۲۶۳: Müstəhəbdir ki, dəstəmaz alan şəxs, suyu gördükdə desin

بِسْمِ اللهِ وَبِاللهِ وَالْحَمْدُ لِلهِ الَّذِی جَعَلَ الْمَاءَ طَهُورًا وَلَمْ یَجْعَلْهُ نَجِساً

.Bismillahi və billahi vəl-həmdu lil-lahilləzi cəələl-maə təhurən və ləm yəcəlhu nəcisa

Allahın adı ilə. Həmd olsun O Allaha ki, suyu paklayıcı qərar verib, onu nəcis qərar“ ”.vermədi

:Dəstəmazdan qabaq əllərini yuyanda desin

أَللَهَمّ اجْعَلْنِی مِنَ التَّوَّابِینَ وَاجْعَلْنِی مِنَ الْمُتَطَهّرِینَ

.Əllahumməcəlni minət-təvvabinə vəcəlni minəl-mütətəhhirin

”!İlahi! Məni tövbə edənlərdən, pak olanlardan qərar ver“

:Ağzında suyu dolandıranda (yəni məzməzə edəndə) desin

أَللَّهُمَّ لَقِّنِی حُجَّتِی یَوْمَ أَلقَاکَ وَأَطْلِقْ لِسَانِی بِذِکْرِکَ

.Əllahummə ləqqini huccəti yovmə əlqakə və ətliq lisani bizikrikə

İlahi! Səninlə görüşdüyüm gün höccətimi mənə təlqin et və dilimi Sənin zikrinlə“ ”! danışdır

:İstinşaq (yəni suyu buruna çəkdiyi) vaxtı desin

أَللَّهُمَّ لاَ تُحَرِّمْ عَلَیَّ رِیحَ الْجَنَّهِ وَاجْعَلْنِی مِمَّنْ یَشُمُّ رِیحَهَا وَرَوْحَهَا وَطِیبَهَا

Əllahummə la tuhərrim ələyyə riyhəl-cənnəti, vəcəlni mimmən yəşummu riyhəha və .rəvhəha və tiybəha

”!İlahi! Mənə cənnət iyini haram etmə və məni cənnətin iyini iyləyənlərdən qərar ver“

:Üzünü yuyanda desin

أَللَّهُمَّ بَيِّضْ وَجْهِی يَوْمَ تَسْوَدُّ فِيهِ الْوُجُوهُ وَلاَ تُسَوِّدْ وَجْهِی يَوْمَ تَبْيَضُّ فِيهِ الْوُجُوهُ

Əllahummə bəyyiz vəchi yovmə təsvəddu fihil-vücuh və la tusəvvid vəchi yəvmə .təbyəzzu fihil-vücuh

İlahi! Üzlərin qara olduğu gün, mənim üzümü ağart və üzlərin ağ olduğu vaxt mənim“ ”!üzümü qaraltma

:Sağ əlini yuyanda desin

أَللَّهُمَّ أَعْطِنِی كِتَابِی بِيَمِينِی وَالْخُلْدَ فِی الْجِنَانِ بِيَسَارِی وَحَاسِبْنِی حِسَابًا يَسِيرًا

.Əllahummə ətini kitabi bi yəmini vəl-xüldə fil-cənani biyəsari və hasibni hisabən yəsira

İlahi! Mənim əməl kitabımı sağ tərəfdən əta et və cənnətlərdə əbədi qalmağı əta et və“ ”!mənim hesabımı yüngül hesablardan qərar ver

:Sol əlini yuyanda desin

أَللَّهُمَّ لاَ تُعْطِنِی كِتَابِی بِشِمَالِی وَلاَ مِنْ وَرَاءِ ظَهْرِی وَلاَ تَجْعَلْهَا مَغْلُولَهً إِلَی عُنُقِی وَ أَعُوذُ بِكَ مِنْ مُقَطَّعَاتِ النِّيرَانِ

Əllahummə la tutini kitabi bi şimali və la min vərai zəhri və la təcəlha məğlulətən ila .unuqi və əuzu bikə müqəttiatin-niyran

İlahi mənim əməl kitabımı sol əlimə və arxa tərəfdən vermə və əməl kitabımı“ ”!boynumdan asılı halda qərar vermə! Mən odun parçalarından Sənə pənah aparıram

:Başına məsh çəkdiyi vaxt desin

أَللَّهُمَّ غَشِّنِی بِرَحْمَتِكَ وَبَرَكَاتِكَ وَعَفْوِكَ

.Əllahummə ğəşşini birəhmətikə və bərakatikə və əfvikə

"!İlahi ! Məni Öz rəhmət, bərəkət və əfvinlə ört"

:Ayağına məsh edəndə desin

أَللّهُمَّ ثَبِّتْنِى عَلَى الصِّراطِ يَوْمَ تَزِلُّ فِيهِ الْأَقْدَامُ وَاجْعَلْ سَعْيِى فِى مَايُرْضِيكَ عَنِّى يَاذَا الْجَلاَلِ وَالْإِكْرَامِ

Əllahummə səbbitni ələssirati yovmə təzillu fihil-əqdamu vəcəl səyi fima yurzikə ənni, .ya zəl-cəlali vəl-ikram

"İlahi! Qədəmlərin lərzəyə gəlib sürüşdüyü gün, məni Siratda sabit qədəm et və səyimi "!Sənin məndən razı olduğun şeylərdə qərar ver, ey Cəlal və İkram sahibi

## DƏSTƏMAZIN SƏHİH OLMA ŞƏRTLƏRİ

:Dəstəmazın səhih olmasının bir neçə şərti var

۱-ci şərt: Dəstəmazın suyu pak olsun. Başqa bir nəzərə əsasən şər`i baxımdan pak olsa belə, əti halal heyvanın bövlü, pak olan murdarın əti və ya yara çirki kimi insanın .nifrət etdiyi şeylərlə də qatışıq olmamalıdır. Bu nəzər ehtiyata uyğundur

.۲-ci şərt: Dəstəmazın suyu mütləq olsun

Məsələ ۲۶۴: Nəcis və muzaf su ilə alınan dəstəmaz batildir. Hətta əgər insan onun nəcis və muzaf olmasını bilməsə, yaxud unutsa da batildir. Əgər bu sular ilə alınan .dəstəmazla namaz qılsa, gərək o namazı yenidən, səhih dəstəmazla qılsın

Məsələ ۲۶۵: Əgər dəstəmaz alması üçün palçıqlı muzaf sudan başqa bir su yoxdursa, bu halda namazın vaxtı azdırsa, təyəmmüm etməlidir; vaxt varsa suyun durulmasını gözləməli və ya başqa bir vasitə ilə suyu duruldub saf su ilə dəstəmaz almalıdır. Amma .palçıqlı su o vaxt muzaf olur ki, artıq ona su deyilməsin

.۳-cü şərt: Dəstəmazın suyu mübah olsun

Məsələ ۲۶۶: Qəsb edilmiş və ya sahibinin razı olub-olmadığı məlum olmayan su ilə dəstəmaz almaq haram və batildir. Həmçinin əgər dəstəmazın suyu üz və əllərindən qəsbi olan yerə tökülərsə və ya dəstəmaz aldığı yerin fəzası qəsbi olarsa, o yerdən başqa bir yerdə dəstəmaz almaq imkanı da yoxdursa, şəxsin vəzifəsi təyəmmümdür. Əgər ayrı bir yerdə dəstəmaz alması mümkündürsə, həmin yerdə dəstəmaz almalıdır. Hər iki təqdirdə əgər orada dəstəmaz alarsa, dəstəmazı səhih amma günah etmiş .olur

Məsələ ۲۶۷: Ümumi istifadə üçün və ya yalnız o mədrəsədə təhsil alanlar üçün vəqf olunduğu məlum olmayan hovuz, adətən camaatın o hovuzda dəstəmaz aldıqları surətdə və bir şəxsin bunu qadağan etmədiyi təqdirdə insanın o, hovuzda dəstəmaz .almasının heç bir maneəsi yoxdur

Məsələ ۲۶۸: Bir şəxs namaz qılmaq istəmədiyi bir məscidin hovuzunun hamı üçünmü, yoxsa orada namaz qılanlar üçünmü vəqf edildiyini bilməzsə, o məscidin hovuzundan dəstəmaz ala bilməz. Amma əgər adətən orada namaz qılmaq istəməyən şəxslər də o hovuzdan dəstəmaz alırsa və bir şəxs də bunu qadağan etmirsə, həmin hovuzdan .dəstəmaz ala bilər

Məsələ ۲۶۹: Otellərin, karvansaların və buna bənzər yerlərin hovuzlarından orada yaşamayan şəxslərin dəstəmaz almaları, ancaq orada yaşamayan şəxslərin də onların suyundan dəstəmaz aldığı və bir şəxsin də bunu qadağan etmədiyi təqdirdə .səhihdir

Məsələ ۲۷۰: İnsan, sahiblərinin razı olduqlarını bilməzsə belə, onlardan istifadə etməyin caiz olmasına əql sahiblərinin nəzər verdiyi nəhrlərdə, istər sahibi böyük olsun, istərsə kiçik, dəstəmaz almağın eybi yoxdur. Hətta əgər onların sahibləri dəstəmaz almağı qadağan edərsə və ya insan sahibinin razı olmadığını bilərsə və yaxud həmin nəhrin .sahibi uşaq və ya dəli olarsa, onların suyundan istifadə etmək caizdir

Məsələ ۲۷۱: Əgər insan suyun qəsb edilmiş olduğunu unudaraq onunla dəstəmaz alarsa, səhihdir. Amma suyu özü qəsb etmiş olan şəxs onun qəsb etmiş olduğunu

Məsələ ۲۷۲: Əgər dəstamazın suyu onun öz mülkü olsa, amma qəsbi qabda olsa, şəxsin ondan başqa bir qabı da olmazsa, suyu o qabdan şəri bir yolla ayrı bir qaba boşalda bilərsə, bu halda onu boşaldaraq dəstəmaz alması lazımdır; bu da mümkün deyilsə, təyəmmüm etməlidir. Amma əgər ayrı bir suyu varsa, onunla dəstəmaz alması lazımdır. Hər iki təqdirdə əgər müxalifət edib qəsbi qabda olan su ilə dəstəmaz .alarsa, dəstəmazı səhihdir

Məsələ ۲۷۳: Bir daşı və ya kərpici belə qəsbi olan hovuzdan su götürmək, ümumxalqın nəzərində o daşlardan və ya kərpicdən istifadə etmək sayılmasa, dəstəmaz almağın heç bir maneəsi yoxdur. İstifadə etmək sayıldığı təqdirdə isə ondan su götürmək .haramdır, amma dəstəmazı səhihdir

Məsələ ۲۷۴: İmamlardan (əleyhimus-səlam) və ya imam övladlarından birinə aid olan yer əvvəlcədən qəbiristanlıq olub, sonra orada hovuz düzəldilərsə və ya oradan arx axıdılarsa, insan o səhnin (İmamlara aid olan yer) yerinin qəbiristanlıq üçün vəqf edilmiş olduğunu bilməzsə, onda həmin hovuz və ya arxda dəstəmaz almağın eybi .yoxdur

cü şərt: Dəstəmaz üzvləri yuyulduqda və məsh edildikdə pak olsun. Hərçənd-۴ dəstəmaz halında, onu yumazdan və ya məsh etməzdən əvvəl paklasa belə; Əgər .kürr və bu kimi su ilə yuyursa, yumaqdan qabaq paklamaq lazım deyil

Məsələ ۲۷۵: Dəstəmaz tamamlanmazdan əvvəl yumuş olduğu və ya məsh etdiyi bir yer .nəcis olarsa, dəstəmaz səhihdir

Məsələ ۲۷۶: Bədənin dəstəmaz üzvlərindən başqa bir yeri nəcis olsa, dəstəmaz səhihdir. Amma ehtiyat-müstəhəb budur ki, əgər sidik və ya ğaitin məhəllini .yumamışsa, əvvəlcə onu paklasın və sonra dəstəmaz alsın

Məsələ ۲۷۷: Dəstəmaz üzvlərindən biri nəcis olarsa və dəstəmaz aldıqdan sonra dəstəmazdan əvvəl oranı pak edib etmədiyində şəkk edərsə, dəstəmazı səhihdir. .Amma gərək nəcis olan yeri yusun

Məsələ ٢٧٨: Üzündə və ya qollarında qanaxması dayanmayan, suyun zərər vermədiyi bir kəsik yer və ya yara olarsa, gərək ardıcıllıqla o üzvün sağlam yerlərini yuduqdan

sonra kəsik və ya yara olan yeri kürr və ya axar suya salıb qanı kəsilincəyə qədər sıxmalı və onun üzərindən su axması üçün suyun altında yuxarıdan aşağıya doğru barmağı ilə yaranı və ya kəsiyi sıxmalıdır. Sonra aşağı hissələri yumalıdır. Belə alınan .dəstəmaz səhihdir

.ci şərt: Dəstəmaz alıb namaz qılmaq üçün kifayət qədər vaxt olmalıdır-۵

Məsələ ۲۷۹: Dəstəmaz alacığı halda namazın hamısı və ya bir hissəsi öz vaxtından sonraya qalacaq qədər vaxt az olarsa, gərək təyəmmüm etsin. Amma dəstəmaz və ya .təyəmmümün hər biri üçün eyni qədər vaxt olarsa, gərək dəstəmaz alsın

Məsələ ۲۸۰: Namazın vaxtının darlığı üzündən təyəmmüm etməli olan bir şəxs, əgər Allaha yaxınlıq niyyəti ilə və ya Quran oxumaq kimi müstəhəbb bir iş üçün dəstəmaz alarsa, dəstəmazı səhihdir. O namazı qılmaq üçün dəstəmaz alarsa da, hökm eynidir. .Əgər bu zaman qürbət (Allaha yaxınlıq) qəsdi gerçəkləşməzsə, dəstəmaz batildir

cı şərt: Dəstəmazı qürbət qəsdi ilə, yəni aləmlərin Rəbbinin əmrlərini yerinə yetirmək-۶ üçün dəstəmaz alsın. Amma sərinlənmək, yaxud başqa məqsədlə dəstəmaz alsa, .batildir

Məsələ ۲۸۱: Dəstəmazın niyyətini dili ilə söyləməsi və ya qəlbindən keçirməsi lazım .deyil. Dəstəmazın bütün əməllərini Allahın əmri üçün yerinə yetirərsə, kifayətdir

ci şərt: Dəstəmazı qeyd olunan tərtiblə almalıdır, yəni əvvəlcə üzü, sonra sağ qolu,-۷ sonra sol qolu yumalı və ondan sonra başa, nəhayət ayaqlara məsh çəkməlidir. Ehtiyat-müstəhəb budur ki, hər iki ayağı birlikdə məsh etməsin, hətta sol ayağa sağ .ayaqdan sonra məsh etsin

.ci şərt: Dəstəmazın işlərini ardıcıl (fasiləsiz) olaraq yerinə yetirsin-۸

Məsələ ۲۸۲: Dəstəmazın əməlləri arasında camaatın nəzərində ardıcıl sayılmayacaq qədər fasilə versə, dəstəmaz batil olur. Amma insan üçün unutmaq və ya suyun qurtarması kimi bir üzrlü səbəb əmələ gəldiyi zaman bu məsələ şərt deyildir. Əgər

və ya məsh etdiyi yerlərin hamısının nəmliyi qurumuş olsa dəstəmaz batildir. Amma əgər yumaq və ya məsh etmək istədiyi yerdən əvvəlki yerin nəmliyi qurusa, amma ondan da əvvəlki yerlər qurumamış olarsa, məsələn, sol qolunu yumaq istədiyi zaman .sağ qolunun rütubəti qurusa və üzünün nəmliyi qalırsa, dəstəmaz səhihdir

Məsələ ۲۸۳: Dəstəmazın əməllərini ardıcıl olaraq yerinə yetirdiyi halda havanın istiliyi, bədənin hərarətinin çox olması və buna bənzər səbəblər üzündən əvvəlki yerlərin .nəmliyi quruyarsa, dəstəmaz səhihdir

Məsələ ۲۸۴: Dəstəmaz əsnasında yol getməyin eybi yoxdur. Deməli, bir şəxs üzü və əlləri yuduqdan sonra bir neçə addım gedib sonra başa və ya ayaqlara məsh etsə, .dəstəmazı səhihdir

cu şərt: Üzün, əllərin yuyulmasını, başa və ayağa məsh çəkilməsini insanın özü-۹ yerinə yetirsin. Başqası ona üçün dəstəmaz alsa və ya suyu onun üzünə və əllərinə .tökməkdə yaxud da baş və ayaqlarına məsh etməkdə kömək etsə, dəstəmazı batildir

Məsələ ۲۸۵: Özü dəstəmaz ala bilməyən şəxs, hərçənd yuma və məsh etmə iki nəfərin iştirakı ilə olsa belə, başqasından yardım almalıdır. Belə ki, köməkçi ücrət (muzd) istəsə də imkanı olduğu təqdirdə və maddi cəhətdən ona zərər dəyməzsə gərək ödəsin. Amma niyyəti özü etməli və öz əli ilə məsh çəkməlidir. Əgər özünün də iştirak etməsi mümkün olmazsa, başqasından ona dəstəmaz aldırmasını xahiş etməlidir. Bu zaman ehtiyat-vacibə əsaən hər ikisi dəstəmaz niyyəti etsinlər. Əgər mümkün olsa gərək köməkçi onun əlindən tutub məsh ediləcək yerlərə çəksin. Əgər bu da mümkün deyilsə, köməkçi onun əlindəki nəmliyi əlinə alaraq başına və ayaqlarına məsh .çəkməlidir

Məsələ ۲۸۶: Dəstəmazın bəzi əməllərini ozü (köməksiz) yerinə yetirə bilirsə onlar üçün .kömək almamalıdır

.cu şərt: Sudan istifadə etməyin dəstəmaz alan üçün bir maneəsi olmamalıdır-۱۰

Məsələ ۲۸۷: Dəstəmaz aldığı zaman xəstələnəcəyindən və ya suyu dəstəmaz üçün

qorxan şəxsin vəzifəsi, dəstəmaz almaq deyildir. Əgər sudan istifadə etdiyi zaman ona zərərli olduğunu bilməyib dəstəmaz alarsa, həqiqətdə isə suyun ona zərəri varsa, .dəstəmazı batildir

Məsələ ۲۸۸: Əgər üz və qollarına dəstəmazın səhih olacağı az bir miqdarda su toxundurmasının zərəri olmazsa və ondan çoxunun zərəri olarsa, o az miqdar su ilə .dəstəmaz almalıdır

ci şərt: Dəstəmaz üzvlərində suyun bədənə dəyməsinin qarşısını alan maneə-۱۱ .olmasın

Məsələ ۲۸۹: Əgər dəstəmaz üzvlərinə bir şeyin yapışdığını bilirsə, amma onun suyun yetişməsinə mane olub-olmadığında şəkk edirsə, onu aradan aparmalı və ya suyu .onun altına çatdırmalıdır

Məsələ ۲۹۰: Dırnağın altının çirkli olmasının dəstəmaz üçün eybi yoxdur; amma əgər dırnaq kəsildiyi zaman, o çirklər suyun dəriyə çatmasına maneçilik törədərsə, gərək dəstəmaz üçün onları təmizləsin. Həmçinin əgər dırnaq normadan artıq uzun olarsa, .normadan artığının altındakı çirkləri təmizləmək gərəkdir

Məsələ ۲۹۱: Üzdə, qollarda, başın ön hissəsində və ya ayaqlarının üstündə yanıq və ya başqa bir səbəbdən qabar olarsa, onun üstünü yumaq və ya məsh etmək kifayətdir. Bu qabar deşilsə də, dərinin altına suyu çatdırmaq lazım deyil. Hətta əgər qabarın bir bölümünün dərisi soyulsa belə, suyu soyulmamış olan qisminin altına çatdırmaq lazım deyil. Amma soyulmuş dəri bəzən bədənə yapışır, bəzən də qalxırsa, onu qopartmalı .və ya suyu onun altına çatdırmalıdır

Məsələ ۲۹۲: Əgər insan, dəstəmaz üzvlərinə bir şey yapışıb-yapışmamasında şəkk etsə, bu halda onun ehtimalı camaatın nəzərində yerli ehtimal olsa; məsələn: palçıqla işlədikdən sonra, palçığın əlinə yapışıb-yapışmamasında şəkk etsə, gərək axtarış aparsin və ya əlini o qədər sürtsün ki, əminlik hasil olsun ki, olan halda o təmizlənib və .ya olan halda su onun altına çatıb

Məsələ ٢٩٣: Əgər yuyulması və ya məsh edilməsi lazım gələn bir yer çirkə bulaşmışsa, amma suyun bədənə yetişməsinə mane olmasa, bir eybi yoxdur. Həmçinin gəc düzəltmə və buna

bənzər işlərdən sonra əlin üstündə qalan və suyun dəriyə yetişməsinə mane olmayan ləkələrin də maneçiliyi yoxdur. Amma əgər onların olduğu təqdirdə suyun bədənə .yetişib-yetişməməsində şəkk edərsə, gərək onları aradan qaldırsın

Məsələ ۲۹۴: Dəstəmazdan əvvəl dəstəmaz üzvlərinin bəzisində suyun dəriyə yetişməsinə mane olan bir şeyin olduğunu bilərsə və dəstəmaz aldıqdan sonra .dəstəmaz alarkən suyu ora çatdırıb-çatdırmadığında şəkk edərsə, dəstəmazı səhihdir

Məsələ ۲۹۵: Əgər dəstəmaz üzvlərindən bəzisində suyun bəzən onun altına keçdiyi, bəzən də keçmədiyi bir maneə olarsa və insan dəstəmaz aldıqdan sonra suyun onun altına keçib-keçmədiyində şəkk edərsə, bu halda dəstəmaz alarkən suyun onun altına keçməsini nəzərdə tutmadığını bilirsə, ehtiyat-müstəhəb budur ki,yenidən dəstəmaz .alsın

Məsələ ۲۹۶: Dəstəmazdan sonra dəstəmaz üzvlərində suyun dəriyə keçməsinin qarşısını alan maneənin olduğunu görsə və onun dəstəmaz alanda mövcud olduğunu, yoxsa sonradan meydana gəldiyini bilməzsə, dəstəmazı səhihdir. Amma dəstəmaz alarkən o maneədən agah olmadığını bilirsə, yenidən dəstəmaz alması müstəhəbb .ehtiyatdır

Məsələ ۲۹۷: Dəstəmaz aldıqdan sonra dəstəmaz üzvlərində suyun dəriyə keçməsinin .qarşısını alan bir maneənin olub-olmadığında şəkk edərsə, dəstəmazı səhihdir

## DƏSTƏMAZIN HÖKMLƏRİ

**Point**

Məsələ ۲۹۸: Dəstəmazın əməllərində və şərtlərində suyun pak olması və qəsbi .olmaması kimi, çox şəkk edən şəxs gərək öz şəkkinə etina etməsin

Məsələ ۲۹۹: Əgər dəstəmazının batil olub-olmamasında şəkk etsə, dəstəmazlı olduğunu qəbul etməlidir. Amma bövldən sonra istibra etməmiş dəstəmaz alsa və dəstəmazdan sonra ondan rütubət xaric olsa, onun bövl və ya başqa şey olmasını .bilməsə, dəstəmazı batildir

.Məsələ ۳۰۰: Dəstəmaz alıb-almamasında şəkk edən şəxs gərək dəstəmaz alsın

Məsələ ۳۰۱: Əgər bir şəxs dəstəmaz aldığını və ondan hədəs baş verdiyini; məsələn: bövl etməsini bilsə, amma hansının qabaq və hansının sonra olduğunu bilməsə, əgər namazdan qabaqdırsa, gərək dəstəmaz alsın. Əgər namaz əsnasındadırsa, namazı pozub dəstəmaz alsın; əgər namazdan sonra olsa, qıldığı namazı səhihdir. Sonrakı .namazlar üçün gərək dəstəmaz alsın

Məsələ ۳۰۲: Əgər dəstəmaz aldıqdan sonra və ya dəstəmaz aldığı zaman dəstəmaz üzvlərinin bəzi yerlərini yumadığını və ya məsh etmədiyini yəqin edərsə, əgər çox vaxt keçdiyindən o yerdən öncə olan yerlərin rütubəti qurumuşsa, gərək yenidən dəstəmaz alsın. Amma qurumamışsa və ya havanın isti olması və buna bənzər bir səbəb üzündən qurumuşsa, yadından çıxardığı yeri və ondan sonrakı yerləri yumalı və məsh etməlidir. Dəstəmaz aldığı zaman bir yerin yuyulmasında və ya məsh edilməsində .şəkk edərsə, yenə də bu qaydaya əməl etməlidir

Məsələ ۳۰۳: Əgər namazdan sonra dəstəmaz alıb-almamasında şəkk etsə, namaz .səhihdir, lakin sonrakı namazlar üçün gərək dəstəmaz alsın

Məsələ ۳۰۴: Əgər namaz əsnasında dəstəmaz alıb-almadığında şəkk edərsə, ehtiyat-vacibə görə gərək dəstəmaz alıb, yenidən namaz qılsın.

Məsələ ۳۰۵: Namazdan sonra, dəstəmazının batil olduğunu bilərsə, amma namazdan qabaq və ya sonra batil olduğunda şəkk edərsə, qıldığı namaz səhihdir.

Məsələ ۳۰۶: İnsanda yaranan bir xəstəlik üzündən ondan damla-damla bövl gəlirsə və ya ğaitinin çıxmasının qarşısını ala bilmirsə, bu halda əgər namaz vaxtının əvvəlindən sonuna qədər olan müddət ərzində dəstəmaz alıb namaz qıla biləcək miqdarda fürsət tapacağına yəqini varsa, namazı fürsət tapacağı vaxtda qılmalıdır. Əgər fürsəti yalnız namazın vacibinə yetəcək qədər olsa, fürsət tapan kimi namazın yalnız vaciblərini yerinə yetirməli, azan, iqamə və qunut kimi, müstəhəbb olan əməlləri tərk etməlidir.

Məsələ ۳۰۷: Əgər dəstəmaz və namazın bir hissəsinə yetəcək qədər bir fürsət tapırsa və namaz əsnasında bir və ya bir neçə dəfə ondan sidik və ya ğait xaric olursa, ehtiyat-lazım budur ki, bu fürsət müddətində dəstəmaz alıb namaz qılmalıdır. Namaz əsnasında xaric olan bövl və ğait üçün dəstəmazını təzələməsi lazım deyil.

Məsələ ۳۰۸: Sidik və ya ğaiti dəstəmaz və namazın bir hissəsi üçün belə fürsət olmayacaq şəkildə ardıcıl xaric olan şəxsin bir neçə namazı üçün bir dəstəmaz kifayətdir. Amma əgər yuxu kimi ayrı bir səbəbdən dəstəmazı pozulsa, yaxud bövl və ğaiti təbii şəkildə xaric olsa, bir dəstəmaz bir neçə namaz üçün kifayət etməz. Amma hər namaz üçün bir dəstəmaz alması daha yaxşıdır. Lakin unudulmuş səcdə və təşəhhüdün qəzası ilə ehtiyat namazı üçün ayrı bir dəstəmaz alması lazım deyil.

Məsələ ۳۰۹: Sidik və ya ğaiti ardıcıl olaraq çıxan şəxsin dəstəmazdan sonra dərhal namaz qılması lazım deyil. Amma daha yaxşı olar ki, dərhal qalsın.

Məsələ ۳۱۰: Sidik və ya ğaiti ardıcıl xaric olan şəxnin namazdan başqa vaxtda olsa belə, dəstəmaz aldıqdan sonra Quranın yazılarına toxunması icazəlidir.

Məsələ ۳۱۱: Sidiyi damcı-damcı tökülən şəxs namaz üçün içində pambıq və ya başqa bir şey olub sidiyin başqa yerlərə dəyməsinin qarşısını alan bir şeylə özünü qorumalıdır. Ehtiyat-vacibə əsasən namazdan əvvəl nəcis olan sidik məxrəcini ayrıca yumalıdır. Həmçinin ğaitinin xaricə çıxmasının qarşısını ala bilməyən şəxs mümkün olduğu təqdirdə namaz müddətində ğaitin başqa yerlərə sirayət etməsinin qarşısını almalıdır. Ehtiyat-vacib budur ki, əgər əziyyəti yoxdursa, hər namaz üçün ğaitin .məhəllini yusun

Məsələ ۳۱۲: Sidik və ya ğaitin xaricə çıxmasının qarşısını ala bilməyən şəxsin mümkün olduğu təqdirdə namaz müddətində xərci olsa belə bövl və ya ğaitin xaricə çıxmasının qarşısını alması yaxşıdır. Hətta əgər onun xəstəliyi asanlıqla aradan qaldırıla bilərsə, .özünü müalicə etdirməsi daha yaxşıdır

Məsələ ۳۱۳: Sidik və ya ğaitin xaricə çıxmasının qarşısını ala bilməyən şəxsin, xəstəliyi zamanında vəzifəsinə uyğun qıldığı namazlarını sağaldıqdan sonra qəza etməsi lazım deyil. Amma namaz vaxtı keçməmişdən qabaq sağalsa, ehtiyat-lazıma əsasən o, .vaxtda qıldığı namazı yenidən qılsın

Məsələ ۳۱۴: Yel çıxmasının qarşısını ala bilməyən şəxs, bövl və ya ğaitinin qarşısını ala .bilməyən şəxsin vəzifəsinə uyğun əməl etməlidir

## DƏSTƏMAZ ALINMASI VACİB OLAN ƏMƏLLƏR

:Məsələ ۳۱۵: Altı şey üçün dəstəmaz almaq vacibdir

Meyyit namazından başqa sair vacib namazlar üçün. Müstəhəb namazların səhihliyi .۱ .üçündə dəstamaz şərtdir

Unudulmuş səcdə və təşəhhüd üçün; əgər onunla namaz arasında bövl etmək kimi .۲ dəstəmazı pozan bir hədəs baş vermişdirsə; amma səcdeyi-səhv üçün dəstəmaz .almaq vacib deyil

.Həcc və ümrə əməllərindən olan Kəbə evinin vacib təvafı üçün .۳

.Dəstəmaz alması üçün Allah ilə əhd bağlasa, and içsə və ya nəzr etsə .۴

.(Məsələn; Qurani-şərifi öpəcəyinə nəzr etmişdirsə. (Əgər xəttini öpərsə .۵

Nəcisə bulaşmış Quranı suya çəkmək və ya onu (Quranı) hörmətsizlik olan yerdən .۶ (tualet və onun kimi yerlərdən) çıxarmaq üçün əlini və ya bədəninin başqa yerini Quranın yazısına vurmağa məcbur olarsa; amma əgər dəstəmaz almaq müddətinə qədər Qurana hörmətsizlik olarsa, gərək dəstəmaz almadan Quranı bu kimi yerlərdən .çıxarsın və ya nəcis olsa, suya çəksin

Məsələ ۳۱۶: Quranın yazılarına toxunmaq, yəni bədənin hər hansı bir yerini Quranın yazılarına vurmaq dəstəmazsız şəxsə haramdır. Amma fars dilinə və ya başqa dillərə .tərcümə edilmiş Qurana toxunmağın eybi yoxdur

Məsələ ۳۱۷: Uşaqların və dəlilərin Quran yazısına toxunmasının qarşısını almaq vacib .deyil. Amma onların toxunması Qurana qarşı hörmətsizlikdirsə, gərək qarşısı alınsın

Məsələ ۳۱۸: Dəstəmazı olmayan şəxsin hansı dildə yazıldığından asılı olmayaraq, Allah-təalanın adına və Ona xas olan sifətlərini bildirən sözlərə toxunması ehtiyat-vacibə əsasən haramdır. Yaxşı olar ki, həzrət Peyğəmbərin (səlləllahu ələyhi və alihi və səlləm), İmamların (ələyhimus-səlam) və həzrət Zəhranın (ələyha səlam) mübarək .adlarına da dəstəmazsız toxunmasın

Məsələ ۳۱۹: Dəstəmazı hər vaxt alsa, istər namazın vaxtı yetişməmişdən əvvəl, istər ona yaxın, istər fasilə ilə yaxud vaxt daxil olandan sonra əgər qürbət qəsdilə alsa səhihdir. Vacib, yaxud müstəhəbb niyyəti etmək də lazım deyil. Hətta əgər səhvən .vacib niyyəti edərsə və sonradan vacib olmaması məlum olarsa, dəstəmaz səhihdir

Məsələ ۳۲۰: Vaxtın yetişdiyinə yəqin edən şəxs əgər vacib dəstəmaz niyyəti ilə .dəstəmaz alsa və sonra vaxtın yetişmədiyini anlasa, dəstəmaz səhihdir

Məsələ ۳۲۱: Dəstəmazı olan şəxsin hər namaz üçün yenidən dəstəmaz alması da müstəhəbdir. Fəqihlərdən bəzisi

buyurmuşdur ki, cənazə namazı qılmaq, qəbiristan əhlini ziyarət etmək, məscidə və İmamların (ələyhimus-səlam) hərəmlərinə getmək, yanında Quran gəzdirmək, Quran oxumaq və yazmaq, onun haşiyəsinə toxunmaq və eləcə də yatmaq üçün dəstəmaz almaq müstəhəbbdir. Amma bu işlər üçün dəstəmaz almağın müstəhəb olması sübuta yetməyib. Amma əgər müstəhəb olması ehtimalı ilə dəstəmaz alsa, səhihdir və dəstəmazla yerinə yetirilməli olan hər bir işi edə bilər. Məsələn: o dəstəmazla namaz .qıla bilər

## DƏSTƏMAZI BATİL EDƏN ŞEYLƏR

:Məsələ ۳۲۲: Yeddi şey dəstəmazı batil edir

Sidik; Zahirən insandan, bövldən sonra və istibradan əvvəl xaric olan nəmlik də sidik .۱ .hökmündədir

;Ğait .۲

;Qaitin məxrəcindən xaric olan mədə və ya bağırsağın yeli .۳

Gözün görmədiyi, qulağın eşitmədiyi yuxu halı; amma gözün görməyib, qulağın . ۴ .eşitdiyi hal, dəstəmazı batil etməz

.Əqli aradan aparan şeylər; dəlilik, sərxoşluq, huşdan getmək və s. kimi .۵

;(Qadının istihazəsi (sonrdan deyiləcək .۶

Cünub olmaq; hətta ehtiyat-müstəhəb budur ki, qüslü vacib edən hər bir iş . ۷ .dəstəmazı pozar

## CƏBİRƏ DƏSTƏMAZININ HÖKMLƏRİ

Yara və sınığa bağlanan şey, həmçinin yara və bu kimi şeylərin üzərinə qoyulan .dərmanlar «cəbirə» adlanır

Məsələ ۳۲۳: Əgər dəstəmaz yerinin birində yara, çiban və ya sınıq olsa, belə ki, üstü



.açıq olduqda su ona zərər yetirməzsə, gərək adi qaydada dəstəmaz alınsın

Məsələ ۳۲۴: Əgər yara, çiban və ya sınıq üzdə və əllərdə olsa, onun üstü açıq olsa və onun üstünə su tökməyin zərəri varsa, gərək yara və çibanın ətrafı dəstəmazda deyildiyi kimi yuxarıdan aşağıya yuyulsun. Ən yaxşısı odur ki, əlin suyunu yaranın üzərinə çəkməyin zərəri yoxdursa, əlin suyunu onun üzərinə çəksin, sonra yaranın üstünə pak parça qoysun və əlin suyunu parçanın üzərinə də çəksin. Amma sınıqda .təyəmmüm etmək lazımdır

Məsələ ۳۲۵: Əgər yara, çiban və sınıq başın qabağında, yaxud ayaqların üstündədirsə və üstü açıqdırsa, belə ki, ona məsh çəkə bilməsə, məsələn; yara məsh yerini tamamilə örtmüşdürsə və ya sağlam olan yerlərini də məsh etməyə imkanı olmasa, bu surətdə təyəmmüm etmək lazımdır. Həmçinin ehtiyat-müstəhəbə görə dəstəmaz alıb, məsh yerinin üzərinə pak bir parça qoyaraq, əlində olan dəstəmaz suyunun nəmliyi ilə .onun üzərinə məsh etsin

Məsələ ۳۲۶: Əgər çiban, yara və sınığın üstü bağlı olsa, onu açmaq əziyyətsiz mümkündürsə və suyun onun üçün zərəri yoxdursa, gərək açsın və dəstəmaz alsın, istər yara və onun misli üzdə və əllərdə olsun, istərsə başın qabağında və ayaqların .üstündə olsun

Məsələ ۳۲۷: Əgər üstü bağlı yara, çiban və ya sınıq üzdə və əllərdə olsa, onu açıb üzərinə su tökməyin zərəri varsa, ətrafının mümkün olan miqdarını yumalı və ehtiyat-.vacibə görə cəbirənin üzünə məsh etməlidir

Məsələ ۳۲۸: Əgər yaranın üstünü açmaq mümkün olmasa, lakin yara və onun üzərinə qoyulan şey pak olsa, suyun yaraya çatdırılması mümkündürsə və zərəri yoxdursa, gərək suyu yuxarıdan aşağıya doğru yaranın üzərinə çatdırsın. Əgər yara və ya onun üzərinə qoyulan şey nəcis olsa, lakin onu yuyaraq yaraya çatdırmaq mümkün olsa, onu yumalı və dəstəmaz alarkən suyu yaraya çatdırmalıdır. Yaraya zərəri olmadığı təqdirdə də, suyu ona çatdırmaq mümkün olmasa, yaxud yara nəcis olarsa və onu yumaq mümkün olmazsa, yaxud açılması çətinliyə və ya zərərə səbəb olarsa, .təyəmmüm etməlidir

Məsələ ۳۲۹: Əgər cəbirə, dəstəmaz üzvlərinin bəzisinin hər yerini örtmüş olsa, cəbirə dəstəmazı kifayətdir. Amma əgər dəstəmaz üzvlərinin hamısını ya çoxunu örtmüş .olsa, ehtiyat olaraq təyəmmüm etməli və cəbirə dəstəmazı da almalıdır

Məsələ ۳۳۰: Cəbirənin namaz qılınması səhih olan şeylərdən olması gərək deyil, hətta ipəkdən və ya əti yeyilməsi icazəli olmayan heyvanın üzüvlərindən olsa belə, onun .üzərinə məsh çəkmək olar

Məsələ ۳۳۱: Əlinin içində və barmaqlarında cəbirə olan və dəstəmaz aldığı zaman islanmış əlini onun üstünə çəkən şəxs baş və ayaqlarını da həmin nəmliklə məsh edə .bilər

Məsələ ۳۳۲: Cəbirə ayağın üzərinin hamısını eninə əhatə etmiş olduğu halda barmaq tərəfindən və ayağın üst tərəfindən bir qədər açıq qalmışsa, açıq olan yerlərdə ayağın .üstünə və cəbirə olan yerlərdə cəbirənin üstünə məsh çəkməlidir

Məsələ ۳۳۳: Əgər üzdə və ya əllərdə bir neçə cəbirə olsa, gərək onların arasını yusun və əgər cəbirələr başda və ya ayaqların üstündədirsə, gərək onların arasına məsh .çəksin və cəbirə olan yerlərdə isə cəbirə göstərişinə uyğun əməl etsin

Məsələ ۳۳۴: Cəbirə yaranın ətrafından normadan çox yeri tutsa və əziyyətsiz onu qaldırmaq mümkün olmasa, cəbirə təyəmmüm yerlərində deyilsə, təyəmmüm etməlidir. Əgər təyəmmüm yerindədirsə, həm təyəmmüm etməli, həm də dəstəmaz almalıdır. Hər iki halda əgər cəbirəni qoparmaq əziyyət vermirsə, gərək onu qoparsın. Deməli əgər cəbirə üz və qollardadırsa onun ətrafını yumalıdır; əgər başda və ya ayaqların üzərindədirsə, onun ətrafını məsh etməlidir. Yara olan yer üçünsə, cəbirə .hökmlərinə əməl etməlidir

Məsələ ۳۳۵: Əgər dəstəmaz üzvlərində yara, kəsik və ya sınıq yoxdursa, amma başqa .səbəbə görə su ona zərər verirsə, təyəmmüm etməlidir

Məsələ ۳۳۶: Dəstəmaz üzvlərindən bir yerin damarı zədələnmişsə və onu suya çəkə bilmirsə, təyəmmüm etməsi lazımdır. Amma suyun onun üçün zərəri varsa, gərək

Məsələ ۳۳۷: Əgər dəstəmaz və qüsl yerinə, aradan qaldırılması mümkün olmayan və ya dözülməyəcək qədər əziyyətli olan bir şey yapışıbsa, bu halda həmin şey təyəmmüm yerlərində deyilsə, təyəmmüm etməlidir. Təyəmmüm yerlərində olduğu təqdirdə isə, həm dəstəmaz almalı, həm də təyəmmüm etməlidir. Amma əgər .yapışmış olan şey dərmandırsa, cəbirə hökmünü daşıyır

Məsələ ۳۳۸: Meyyit qüslündən başqa digər qüsllərdə cəbirə qüslü eynilə cəbirə dəstəmazı kimidir. Amma ehtiyat-lazıma görə o, tərtibi qaydada yerinə yetirilməlidir. Bədəndə yara və çiban olduğu təqdirdə mükəlləf qüsl və təyəmmüm arasında ixtiyar sahibidir, (hansını istəsə edə bilər). Qüsl etməyi seçdiyi təqdirdə, ehtiyat-müstəhəb budur ki, üstü açıq olan yara və ya çibanın üstünə pak bir parça qoyub, həmin parçanın üstünə məsh çəksin. Bədəndə sınıqlıq olduqda isə qüsl etməli və ehtiyatən cəbirənin də üstünə məsh çəkməlidir. Amma əgər cəbirənin üstünə məsh etmək mümkün .deyilsə və ya sınığın üstü açıqdırsa, təyəmmüm etmək lazımdır

Məsələ ۳۳۹: Vəzifəsi təyəmmüm etmək olan bir şəxsin təyəmmüm üzvlərinin bəzisində yara, çiban və ya sınıq olarsa cəbirə dəstəmazında açıqlanan qayda üzrə cəbirə .təyəmmümünü yerinə yetirməlidir

Məsələ ۳۴۰: Cəbirə qüslü və ya dəstəmazı ilə namaz qılmalı olan şəxs, əgər vaxtın sonuna qədər üzrünün aradan qalxmayacağını bilirsə, vaxtın əvvəlində namazını qıla bilər. Amma vaxtın axırına qədər üzrünün aradan qalxacağına ümidvardırsa, yaxşı olar ki, səbr etsin. Əgər üzrü aradan qalxmazsa, vaxtın sonunda namazını cəbirə qüslü və ya dəstəmazı ilə qılsın. Namazını vaxtın əvvəlində qıldığı surətdə, vaxtın sonunda üzrü aradan qalxarsa, ehtiyat-müstəhəb budur ki, dəstəmaz alaraq və ya qüsl edərək, .namazını yenidən qılsın

Məsələ ۳۴۱: Əgər insan, gözündə olan xəstəliyə görə kipriklərini yapışdırmalı olsa, .gərək təyəmmüm etsin

Məsələ ۳۴۲: Vəzifəsi təyəmmüm və ya cəbirə dəstəmazı olmasını bilməyən şəxs .ehtiyat-vacibə əsasən hər ikisini yerinə yetirməlidir

Məsələ ۳۴۳: İnsanın cəbirə dəstəmazı ilə qıldığı namazları səhihdir və o dəstəmazla .sonrakı namazları da qıla bilər

## VACİB QÜSLLƏR

### Point

:Vacib qüsllər yeddidir

.Cənabət qüslü .۱

.Heyz qüslü .۲

.Nifas qüslü .۳

.İstihazə qüslü .۴

.Məssi-meyyit qüslü .۵

.Meyyit qüslü .۶

.Nəzr, and içmə sair səbəblərlə vacib olan qüsllər .۷

Əgər Günəş və ya Ay kamil şəkildə tutularsa və mükəlləf bilərəkdən ayət namazını qılmayıb qəzaya verərsə ehtiyat-vacibə əsasən onun qəzasını qılmaq üçün gərək qüsl .etsin

### CƏNABƏTİN HÖKMLƏRİ

:Məsələ ۳۴۴: İnsan iki yolla cünub olur

;Cima (cinsi əlaqə) ilə .۱

Məninin xaric olması ilə; istər yuxuda olsun, istərsə ayıqlıqda, istər az olsun, istərsə .۲ .çox, istər şəhvətli olsun, istər şəhvətsiz, istər ixtiyari olsun, istər ixtiyarsız

Məsələ ۳۴۵: Əgər insandan məni, ya sidik və ya başqa bir şey olduğunu bilməyən bir rütubət xaric olsa, belə ki, həmin rütubət şəhvətli və ya sıçrayaraq xaric olubsa, bu halda əgər xaric olduqdan sonra bədəni süst olarsa, o rütubət məni hökmündədir.

Əgər bu üç nişanədən heç biri və ya onlardan bəziləri onda olmasa, məni hökmündə deyildir. Amma xəstə adamda o rütubətin sıçrayaraq xaric olması və xaric olduğu zaman bədənin süst olması lazım deyil; sadəcə əgər şəhvətlə xaric olsa məni hökmünü daşıyır. Qadınlarda isə mazaqlaşan zaman, yaxud

şəhvət yaradan şeyləri təsəvvür etməklə hiss etdikləri zaman xaric olan rütubət pakdır, qüslü yoxdur, dəstəmazı da batil etmir. Amma qadınlarda şəhvətlə çıxan, «inzal» adlana biləcək həddə olan və libaslarını bulayan, adətən də şəhvətin ən şiddətli vaxtında xaric olan rütubət nəcisdir və cənabətə səbəb olur. Həmçinin ehtiyat-vacibə əsasən əgər ləzzətin son həddinə çatmasa amma məni xaric olandakı kimi, su çox olsa .eyni hökümdədir

Məsələ ۳۴۶: Xəstə olmayan bir kişidən, əvvəlki məsələdə deyildiyi kimi üç nişanədən birinə aid olan bir su çıxsa və başqa nişanələrin də onda olub-olmadığını bilməsə, o suyun çıxmasından əvvəl dəstəmazlı olubsa, həmin dəstəmazla kifayətlənə bilər. Əgər .dəstəmazlı deyildisə, sadəcə dəstəmaz alması kifayət edər, qüsl etməsi lazım deyil

Məsələ ۳۴۷: İnsanın, məni xaric olduqdan sonra bövl etməsi müstəhəbbdir. Bövl etmədiyi təqdirdə, qüsldən sonra ondan, məni və ya başqa rütubət olduğunu bilmədiyi .bir nəmlik xaric olarsa, həmin nəmlik məni hökmündədir

Məsələ ۳۴۸: Əgər insan qadınla cinsi əlaqədə olarkən alət, sünnət olunan yerə qədər və ya çox daxil olsa, istər qabaqdan olsun, istərsə arxadan, istər həddi-büluğa çatsın, .istərsə çatmasın, məni xaric olmasa da, hər ikisi cünub olar

Məsələ ۳۴۹: Sünnət olunan miqdarda daxil olub-olmadığında şəkk edən şəxsin qüsl .etməsi vacib deyil

Məsələ ۳۵۰: Əgər (nəuzu billah!) heyvanla yaxınlıq etsə və məni də gəlsə, təkcə qüsl kifayətdir. Amma məni gəlməsə, bu halda vətydən əvvəl dəstəmazlı olsa, yenə də qüsl kifayətdir. Əgər dəstəmazlı olmasa ehtiyat-vacib budur ki, qüsl edib dəstəmaz da .alsın. Həmçinin kişi və oğlan ilə yaxınlıq (livat) edənin də hökmü belədir

Məsələ ۳۵۱: Əgər məni öz yerindən hərəkət etsə, amma çölə gəlməsə; yaxud məninin .çölə gəlib-gəlməməsində şəkk etsə, qüsl vacib deyil

Məsələ ۳۵۲: Qüsl edə bilməyən, amma təyəmmüm etməsi mümkün olan şəxs, namaz .vaxtı daxil olduqdan sonra da əyalı ilə yaxınlıq edə bilər

Məsələ ۳۵۳: Əgər bir şəxs öz paltarında məni görsə və onu, özündən olub, ondan ötrü qüsl etmədiyini bilərsə, qüsl etməlidir. Belə ki, o məninin gəlməsindən sonra qıldığına əmin olduğu namazları da qəza etməlidir. Amma məninin gəlməsindən qabaq qıldığına .ehtimal verdiyi namazları qəza etməsi lazım deyil

## CÜNUB ŞƏXSƏ HARAM OLAN ŞEYLƏR

:Məsələ ۳۵۴: Cünuba beş şey haramdır

Öz bədənindən hər hansı bir yeri Quranın yazısına və ya Allahın adına (hansı dildə .۱ olsa) toxundurmaq. Peyğəmbərlərin, İmamların və həzrət Zəhranın (ələyhimus-.səlam) da adlarına toxundurmaması daha yaxşıdır

Məscidul-hərama və Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) məscidinə .۲ .girmək. Bir qapıdan daxil olub, digər qapıdan xaric olsa belə

Başqa məscidlərdə və ehtiyat-vacibə əsasən İmamların (ələyhimus-səlam) .۳ hərəmlərində dayanmaq. Amma məscidin bir qapısından daxil olub, digər qapısından .xaric olduğu halda, maneəsi yoxdur

Ehtiyat-lazıma əsasən, bir şeyi məscidə qoymaq, ya bir şeyi məsciddən .۴ .götürməkdən ötrü daxil olmaq Hərçənd özü daxil olmasa belə

:Vacib səcdəsi olan ayələri oxumaq. Onlar bu dörd surədən ibarətdidir .۵

;ci «Səcdə» surəsi-۳۲

;ci «Fussilət» surəsi-۴۱

;cü «Nəcm» surəsi-۵۳

.cı «Ələq» surəsi-۹۶

## CÜNUB ŞƏXSƏ MƏKRUH OLAN ŞEYLƏR

۱-۲. Yemək-içmək. Lakin əllərini və ya üzünü yusa və məz-məzə edərsə (ağızı su ilə yaxalasa), məkruh deyil. Əgər yalnız əllərini yusa kərahəti azdır.

۳. Quranın vacib səcdəsi olmayan surələrdən yeddi ayədən artıq oxumaq.

۴. Bədənindən hər hansı bir yerini Quranın cildinə, haşiyəsinə və ya yazılarının arasına toxundurmaq.

۵. Quranı özü ilə gəzdirmək.

۶ . Yatmaq; amma dəstəmaz alsa, yaxud suyun olmamasına görə qüslün əvəzinə təyəmmüm etsə, məkruh deyil.

۷. Həna və buna bənzər şeylərə boyanmaq.

۸. Bədənə yağ çəkmək.

۹. Möhtəlim olandan (yəni yuxuda məni xaric olandan) sonra cinsi əlaqədə olmaq.

## CƏNABƏT QÜSLÜ

Məsələ ۳۵۶: Cənabət qüslü, vacib namazı qılmaq və bu kimi şeylər üçün vacibdir. Amma meyyit namazı, səcdeyi-səhv, şükr səcdəsi və Quranın vacib səcdələri üçün cənabət qüslü etmək lazım deyil.

Məsələ ۳۵۷: Qüsl edərkən vacib qüsl edəcəyini niyyət etməsi lazım deyil. Yalnız qürbət qəsdi ilə, yəni Allahın dərgahında bəndəçilik və Onun əmrini yerinə yetirməkdən ötrü qüsl edərsə, kifayətdir.

Məsələ ۳۵۸: Namaz vaxtının daxil olduğuna əmin olub, vacib qüsl niyyəti edərək qüsl edər və sonra namaz vaxtından əvvəl qüsl etdiyini bilərsə, qüslü səhihdir.

Məsələ ۳۵۹: Cənabət qüslü, tərtibi və irtimasi olaraq iki şəkildə yerinə yetirilir.

## TƏRTİBİ QÜSL

Məsələ ۳۶۰: Tərtibi qüsldə, ehtiyat-lazıma əsasən, əvvəlcə qüsl niyyəti ilə baş və boyun, daha sonra bədən yuyulmalıdır. Əvvəlcə bədənin sağ tərəfinin, sonra isə sol tərəfinin yuyulması daha yaxşıdır. Tərtibi qüslün gerçəkləşməsində, suyun altında qüsl niyyəti ilə üç üzvə hərəkət vermək işkalsız deyildir və ehtiyat budur ki, onunla kifayətlənilməsin. Əgər qəsdən bədənini, başın və boynun yuyulması qurtarmazdan .qabaq yuyarsa ehtiyata əsasən qüslü batildir

Məsələ ۳۶۱: Bədəni başdan əvvəl yuduğu halda, qüslü yenidən alması lazım deyildir, .belə ki, bədəni ikinci dəfə yuyarsa, qüslü səhihdir

Məsələ ۳۶۲: Əgər iki hissəni, yəni baş və boyunla bədəni tamamilə yuduğuna yəqini olmazsa, gərək buna əmin olması üçün hər bir hissəni yuyarkən əvvəlki hissədən də .bir miqdarı onunla birlikdə yusun

Məsələ ۳۶۳: Əgər qüsldən sonra bədəninin bir yerini yumadığını bilərsə, amma hansı yer olduğunu bilməsə başı yenidən yuması lazım deyil, bədəninin yumadığına ehtimal .verdiyi yerini yumalıdır

Məsələ ۳۶۴: Əgər qüsldən sonra, bədəninin bir miqdar yerinin yuyulmadığını bilərsə, yuyulmayan yer sol tərəfdədirsə, o qədər yeri yumaq kifayətdir. Əgər sağ tərəfdədirsə, ehtiyat-müstəhəb budur ki, o miqdarı yuduqdan sonra, sol tərəfi yenidən yusun. Amma əgər baş və boyundursa, ehtiyat-vacibə görə gərək o miqdarı yuduqdan .sonra bədənini yenidən yusun

Məsələ ۳۶۵: Əgər qüsl tamam olmazdan əvvəl sol və ya sağ tərəfin bir miqdarının yuyulub-yuyulmamasında şəkk edərsə, o miqdarı yuması lazımdır. Amma əgər baş və boynunun bir miqdarının yuyulmasında şəkk edərsə, ehtiyat-lazıma əsasən, şəkk .etdiyi yeri yuduqdan sonra gərək yenidən bədənini yusun

## İRTİMASİ QÜSL

.İrtimasi qüsl iki şəkildə: bir dəfəyə və tədrici olaraq edilir

Məsələ ۳۶۶: Bir dəfəyə olan irtimasi qüsldə, su bədənin hamısını bir anda əhatə etməlidir, amma qüslə başlamazdan əvvəl bədənin hamısının sudan xaricdə olması şərt deyildir. Əgər bədənin bir miqdarı xaricdə olan zaman qüsl niyyəti ilə suya girərsə, .kifayət edir

Məsələ ۳۶۷: Tədrici olaraq edilən irtimasi qüsldə, gərək bədəni ürfi birliyi qorumaq şərti ilə yavaş-yavaş suya salsın. Bu cür irtimasi qüsldə, qüslə başlamazdan əvvəl hər üzv .sudan xaricdə olmalıdır

Məsələ ۳۶۸: İrtimasi qüsldən sonra bədənin bir miqdarına su dəymədiyini bilərsə, istər .onun yerini bilsin, istərsə də bilməsin, yenidən qüsl etməlidir

Məsələ ۳۶۹: Əgər tərtibi qüsl etməyə vaxtı olmasa, irtimasi qüsl üçün vaxtı varsa, .irtimasi qüsl etməlidir

Məsələ ۳۷۰: Həcc və ya ümrə üçün ehram bağlayan şəxs irtimasi qüsl edə bilməz, .amma əgər unudaraq irtimasi qüsl edərsə, qüslü səhihdir

## QÜSLÜN HÖKMLƏRİ

Məsələ ۳۷۱: İrtimasi və ya tərtibi qüsldə, bədənin qüsldən qabaq tamamilə pak olması lazım deyil, əksinə, qüsl niyyəti ilə suya batmaqla, yaxud suyu bədənə tökməklə bədən pak olsa, qüsl gerçəkləşmiş olur. Bu şərtlə ki, qüsl aldığı su pak olmaqdan xaric .olmasın, məsələn kürr su ilə qüsl etsin

Məsələ ۳۷۲: Haramla cünub olmuş şəxs isti su ilə qüsl etsə, hətta tərləsə belə, onun .qüslü səhihdir

Məsələ ۳۷۳: Qüsl edərkən bədəndə başın bir tükü qədər yuyulmamış yer qalsa, qüsl batildir. Amma qulağın, burunun içi kimi bədənin iç hissəsi sayılan yerin yuyulması .vacib deyil

Məsələ ۳۷۴: Bədənin zahirindən və ya batinindən olmasında şəkk edilən yer .yuyulmalıdır

Məsələ ۳۷۵: Əgər sırğanın dəliyi və s. kimi yerlər çox geniş olub daxili görünsə və .bədənin zahiri hesab olunsa, gərək onu yusun. Əks halda yuyulması lazım deyildir

Məsələ ۳۷۶: Suyun bədənə çatmasına maneə olan şeyi aradan qaldırmaq lazımdır. .Əgər aradan qaldırdığına əmin olmadan qüsl edərsə, qüslü batildir

Məsələ ۳۷۷: Qüsl edərkən bədənində suyun bədənə çatmasına maneə olan şeyin olub-olmadığına ağıl kəsən ehtimal versə, gərək axtarış aparıb maneənin olmadığına əmin .olsun

Məsələ ۳۷۸: Qüsl edərkən bədənin bir üzvindən sayılan qısa tüklər yuyulmalıdır, amma uzun tüklərin yuyulması vacib deyildir. Hətta əgər onları islatmadan belə suyu bədənin dərisinə çatdırarsa qüslü səhihdir. Amma əgər onları yumadan bədəninin dərisinə .suyu çatdırmaq mümkün deyilsə, suyu bədənə çatdırmaq üçün onları yumalıdır

Məsələ ۳۷۹: Dəstəmazın səhih olmasında qeyd olunan şərtlər, suyun pak olması, qəsbi olmaması və s. bütünlüklə qüslün də səhih olması üçün şərtdir. Amma qüsldə bədənin

yuxarıdan aşağıya doğru yuyulması lazım deyil. Həmçinin tərtibi qüsldə də, başı və boyunu yuduqdan dərhal sonra bədəni yumaq vacib deyildir. Belə ki, baş və boyunu yuduqdan sonra bir müddət səbr edərək sonra bədəni yumağın eybi yoxdur. Hətta baş və boyunun, yaxud bədənin bütünlüklə bir dəfəyə yuyulması da lazım deyildir. Məsələn başı yuduqdan bir müddət sonra boyunun yuyulması icazəlidir. Amma sidik və ya ğaitinin gəlməsinin qarşısını ala bilməyən şəxs, əgər qüsl edib, namaz qıla biləcəyi bir müddət ərzində ondan ğait və ya sidik gəlməsə, gərək dərhal qüsl etsin və qüsldən .dərhal sonra namazı qılsın

Məsələ ٣٨٠: Hamamçının razı olub-olmadığını bilmədən hamamda nisyə yuyunmaq .niyyətində olan şəxsin qüslü, sonradan hamamçını razı salsa belə, batildir

Məsələ ٣٨١: Hamamçının pulun nisyə verilməsinə razı olduğu təqdirdə, qüsl edən şəxsin məqsədi, onun pulunu ödəməmək və ya haram puldan ödəmək olarsa, qüslü .batildir

Məsələ ٣٨٢: Əgər xümsü verilməmiş pulu hamamçıya versə, harama mürtəkib olsa da, zahir budur ki, onun qüslü səhihdir və xümsə müstəhəqqlərin haqqı onun boynunda .qalır

Məsələ ٣٨٣: Qüsl edib-etmədiyində şəkk edən şəxs, qüsl etməlidir. Amma qüsldən sonra etdiyi qüslün səhih olub-olmadığında şəkk edərsə, yenidən qüsl etməsi lazım .deyil

Məsələ ٣٨٤: Əgər qüsl əsnasında kiçik hədəs baş versə, məsələn, bövl etsə, qüslü tərk etməsi və yenidən qüsl etməsi lazım deyil, əksinə öz qüslünü tamamlaya bilər və bu halda ehtiyat-lazıma əsasən gərək dəstəmaz da alsın. Amma əgər niyyətini tərtibi qüsldən irtimasiyə və ya irtimasidən tərtibi qüslə çevirsə dəstəmaz almağı da lazım .deyil

Məsələ ٣٨٥: Əgər vaxtın dar olması üzündən mükəlləfin vəzifəsi təyəmmüm olubsa, amma o, qüsl və namaz qədər vaxtın qaldığını sanıb qüsl edərsə, onda qüslü qürbət

qəsdi ilə etmiş olsa, hətta namazı yerinə yetirmək üçün qüsl etmiş olsa belə qüslü .səhihdir

Məsələ ٣٨٦: Cünub olmuş şəxs namazdan sonra qüsl edib-etmədiyində şəkk etsə, qıldığı namazlar səhihdir. Amma sonrakı namazlar üçün qüsl etməlidir. Əgər namazdan sonra ondan kiçik

hədəs baş veribsə, dəstəmaz da alması lazımdır. Əgər vaxt qalmışdırsa, ehtiyat-lazıma əsasən qıldığı namazı yenidən qılmalıdır.

Məsələ ۳۸۷: Boynunda bir neçə vacib qüsl olan bir şəxs hamısının niyyəti ilə bir qüsl edə bilər. Zahir budur ki, əgər onlardan müəyyən birini niyyət etsə, qalanları üçün kifayət edir.

Məsələ ۳۸۸: Əgər bədənin bir yerinə Quran ayəsi və ya Allah-təalanın adı yazılmış olsa, belə ki, tərtibi qüsl etmək istəsə, gərək suyu bədəninə əli o yazıya dəyməyəcək şəkildə çatdırsın. Həmçinin əgər dəstəmaz da almaq istəsə, təkcə Quran ayəsi xüsusunda deyil, həm də Allahın adlarında da ehtiyat-vacibə görə hökm eynidir.

Məsələ ۳۸۹: Cənabət qüslü edən şəxs namaz üçün dəstəmaz almamalıdır. Hətta dəstəmaz almasının ehtiyat-müstəhəb olmasına baxmayaraq, mütəvəssitə istihazədən başqa digər vacib qüsllərlə, eləcə də ۶۳۳-cü məslədə izah olunacaq müstəhəbb qüsllərlə də dəstəmaz almadan namaz qıla bilər.

## İSTİHAZƏ

### Point

Qadından xaric olan qanlardan biri də istihazə qanıdır. İstihazə qanı görən qadına .müstəhazə deyilir

Məsələ ۳۹۰: Əksər vaxtlarda istihazə qanı sarı rəngdə və soyuq olur, təzyiqsiz, yandırıcı olmadan xaricə gəlir və qatı olmur. Amma bəzən qara, qırmızı və qatı olması, təzyiqlə .və yandırıcı halda da xaric olması mümkündür

:Məsələ ۳۹۱: İstihazə üç qismdir

.(Qəlilə (az -۱

.(Mütəvəssitə (orta -۲

.(Kəsirə (çox -۳

Qəlilə istihazə budur ki, qan, qadının övrətinin daxilinə qoyduğu pambığın bir .tərəfindən keçib o biri tərəfində zahir olmasın

Mütəvəssitə istihazə odur ki, qan qadının övrətinə qoyduğu pambığa hopub o biri tərəfindən zahir olsun. Amma qadınların, adətən, qanaxmanın qarşısını almaq üçün .qoyduqları dəsmala çatmasın

.Kəsirə istihazə budur ki, qan ora qoyulan pambıqdan keçib dəsmala da çatsın

### İSTİHAZƏNİN HÖKMLƏRİ

Məsələ ۳۹۲: Qəlilə istihazədə qadın, hər namaz üçün bir dəstəmaz almalıdır. Pambığı suya çəkməsi və ya dəyişdirməsi ehtiyat-müstəhəbbdir. Amma fərcin zahirinə qan .yetişibsə, suya çəkməlidir

Məsələ ۳۹۳: Mütəvəssitə istihazədə, ehtiyat-lazıma əsasən, qadın öz namazları üçün gündəlik bir qüsl etməlidir. Həmçinin

gərək əvvəlki məsələdə deyildiyi kimi, az istihazəsi olan qadının da vəzifəsinə əməl etsin. Buna əsasən əgər istihazə sübh namazından əvvəl, yaxud həmin anda hasil olsa, gərək sübh namazı üçün qüsl etsin. Əgər qəsdən və ya unutqanlıq üzündən sübh namazı üçün qüsl etməsə, gərək zöhr və əsr namazı üçün qüsl etsin. Əgər zöhr və əsr namazı üçün qüsl etməsə, gərək məğrib və işa namazından əvvəl qüsl etsin, istər qan .gəlsin, istərsə də kəsilsin fərqi yoxdur

Məsələ ۳۹۴: Kəsirə istihazədə ehtiyat-vacibə əsasən, qadın hər namaz üçün pambıq və dəsmalı ya dəyişməli, ya da suya çəkməlidir. Həmçinin bir qüsl sübh namazı üçün, bir qüsl zöhr və əsr namazı üçün, bir qüsl də məğrib və işa namazı üçün yerinə yetirməlidir. Zöhr və əsr, məğrib və işa namazları arasında gərək fasilə salmasın. Əgər fasilə salsa, gərək əsr və işa namazları üçün ikinci dəfə qüsl etsin. Bunlar hamısı qanın ardıcıl olaraq pambıqdan dəsmala çatdığı hal üçündür. Amma qan pambıqdan dəsmala bir qədər fasilə ilə çatsa, qadın o fasilədə bir namaz, ya daha çox namaz qıla bilərsə, ehtiyat-lazım budur ki, hər vaxt qan pambıqdan dəsmala çatsa pambıq və dəsmalı suya çəksin və qüsl etsin. Əgər məsələn qadın qüsl etsə və zöhr namazını qılsa, əsr namazını qılmamışdan qabaq və ya onun əsnasında qan yenidən pambıqdan dəsmala axarsa, əsr namazı üçün də qüsl etməlidir. Amma fasilə iki və ya daha artıq namaz qıla biləcək miqdarda olarsa, məsələn, qan ikinci dəfə pambıqdan dəsmala yetişməzdən qabaq məğrib və işa namazını da qıla bilsə, o namazlar üçün başqa qüsl etmək lazım .deyildir və hər bir halda olarsa kəsirə istihazədə qüsl dəstəmaz əvəzinə də yetərlidir

Məsələ ۳۹۵: İstihazə qanı namaz vaxtından əvvəl gəlmişdirsə, belə ki, qadın o qan üçün dəstəmaz almamış və ya qüsl etməmişdirsə, namaz vaxtı müstəhazə olmasa da belə, .dəstəmaz almalı və ya qüsl etməlidir

Məsələ ۳۹۶: Həm qüsl etməsi, həm də ehtiyat-lazıma əsasən dəstəmaz almalı olan mütəvəssitə istihazəli qadın, əvvəlcə qüsl etməli, sonra dəstəmaz almalıdır. Amma kəsirə istihazəli qadın dəstəmaz almaq istəsə, qüsldən əvvəl dəstəmaz alması .lazımdır

Məsələ ۳۹۷: Əgər qadının qəlilə istihazəsi sübh azanından sonra müvəssitə olsa, gərək zöhr və əsr namazı üçün qüsl etsin. Əgər zöhr və əsr namazından sonra mütəvəssitə .olsa, gərək məğrib və işa namazı üçün qüsl etsin

Məsələ ۳۹۸: Əgər qadının qəlilə, yaxud mütəvəssitə istihazəsi sübh namazından sonra kəsirə olsa və bu halda qalsa, gərək ۳۹۴-cü məsələdə deyildiyi hökmə uyğun əməl .etsin, zöhr, əsr, məğrib və işa namazını qılsın

Məsələ ۳۹۹: ۳۹۴-cü məsələdə deyildiyi kimi, kəsirə istihazəsi olan qadının qüslü ilə namazı arasında fasilə salmaması lazım olduğu halda, əgər namaz vaxtı çatmamışdan əvvəl qüsl etməsi araya fasilə düşməsinə səbəb olsa, o qüslün faydası yoxdur və namaz üçün yenidən qüsl etməsi gərəkdir. Bu hökm mütəvəssitə istihazəli qadına da .aiddir

Məsələ ۴۰۰: Qəlilə və mütəvəssitə istihazəsi olan qadın (hökmü deyilən gündəlik namazlardan başqa) istər vacib olsun, istərsə də müstəhəbb, hər namaz üçün dəstəmaz almalıdır. Amma əgər qıldığı gündəlik namazını ehtiyatən yenidən qılmaq istəyərsə və ya fürada (təklikdə) qıldığı namazı yenidən camaat ilə qılmaq istəyərsə, istihazə üçün qeyd olunan bütün işləri yerinə yetirməlidir. Amma namazdan dərhal sonra yerinə yetirdiyi təqdirdə, ehtiyat namazını, unudulan səcdə və təşəhhüdü və həmçinin bütün hallarda səcdeyi-səhv yerinə yetirmək üçün, istihazə işlərini görməsi .lazım deyildir

Məsələ ۴۰۱: İstihazəli qadının qanı kəsildikdən sonra qılacağı yalnız birinci namaz üçün .gərək istihazənin işlərini yerinə yetirsin və sonrakı namazlar üçün bu lazım deyildir

Məsələ ۴۰۲: İstihazəsinin hansı növdən olduğunu bilməyən qadın, namaz qılmaq istədiyi zaman, ehtiyata əsasən özünü yoxlamalıdır. Məsələn, fərcinə bir qədər pambıq daxil edərək, bir az səbr etdikdən sonra çıxarır və istihazənin üç növdən hansı birinin olduğunu bildikdən sonra, o növə aid olan işləri yerinə yetirir. Amma əgər namaz qılacağı vaxta qədər istihazənin dəyişməyəcəyini bilirsə, namaz vaxtı daxil .olmamışdan da özünü yoxlaya bilər

Məsələ ۴۰۳: İstihazəli qadın özünü yoxlamamışdan əvvəl namaza başlasa, belə ki, qürbət qəsdi ilə öz vəzifəsinə əməl etmiş olsa, məsələn, istihazəsi qəlilə olmuşdursa və qəlilə istihazəsinin vəzifəsinə əməl etmiş olsa, onun namazı səhihdir. Əgər qürbət qəsdi ilə olmasa və ya əməl vəzifəsinə uyğun olmasa, məsələn, istihazəsi mütəvəssitə olduğu halda qəlilənin vəzifəsinə əməl etsə, namazı batildir.

Məsələ ۴۰۴: İstihazəli qadın özünü yoxlaya bilməsə, həqiqi vəzifəsinə əməl etməlidir. Məsələn, əgər istihazəsinin qəlilə və ya mütəvəssitə olduğunu bilmirsə, qəlilə istihazənin işlərini yerinə yetirməlidir. Əgər istihazəsinin mütəvəssitə və ya kəsirə olduğunu bilmirsə, mütəvəssitə istihazəsinin işlərinə əməl etməlidir. Amma əgər əvvəllər üç növdən hansı birinin olduğunu bilirdisə, həmin növə aid vəzifəsinə əməl etməlidir.

Məsələ ۴۰۵: Əgər istihazə qanı birinci dəfə zahir olanda, daxilində olsa və zahirə gəlməsə, qadının aldığı dəstəmaz və ya qüslü batil etməz. Əgər zahirə gəlsə, az da olsa belə, dəstəmaz və ya qüslü batil edər.

Məsələ ۴۰۶: Müstəhazə qadın namazdan sonra özünü yoxlasa və qan görməsə, yenə qan gələcəyini bilsə belə, aldığı dəstəmazla namaz qıla bilər.

Məsələ ۴۰۷: Əgər müstəhazə qadın dəstəmaz və ya qüslə başladığı andan etibarən özündən qan gəlmədiyini və fərcin daxilində də olmadığını bilərsə, pak qalacağını bildiyi zamana qədər namaz qılmasını təxirə sala bilər.

Məsələ ۴۰۸: Əgər müstəhazə qadın, namaz vaxtı keçməzdən qabaq tamamilə pak olacağını və ya namaz qıla biləcəyi bir vaxtda qanın dayanacağını bilərsə, ehtiyat-lazıma əsasən səbr edib, pak olduğu vaxt namazını qılmalıdır.

Məsələ ۴۰۹: Əgər dəstəmaz və qüsldən sonra zahirdə qan kəsilsə, istihazəli olan qadın namazını təxirə salmaqla qüsl, dəstəmaz və namazı yerinə yetirəcək qədər tam pak olacağını bilərsə, ehtiyat-lazıma əsasən, namazını təxirə salmalı, tamamilə pak olduğu zaman, yenidən dəstəmaz və qüsl edib, namazını qılmalıdır. Əgər qanın zahirdə

daralarsa, yenidən dəstəmaz alıb qüsl etməsi lazım deyil. Qabaqcadan aldığı .dəstəmaz və qüsl ilə namazını qıla bilər

Məsələ ۴۱۰: Kəsirə istihazəsi olan qadın qandan tamamilə pak olduqda əvvəlki namaz üçün qüsl etməyə başladığı andan etibarən, artıq qan gəlmədiyini bilirsə, yenidən qüsl etməsi lazım deyil. Əks təqdirdə qüsl etməlidir. (Əlbəttə, bu hökmün ümumi olması ehtiyata əsasəndir.) Amma mütəvəssitə istihazədə qandan tamamilə pak olması üçün .qüsl etməsi lazım deyildir

Məsələ ۴۱۱: Qəlilə istihazəli olan qadın dəstəmazdan sonra, mütəvəssitə istihazəli olan qadın qüsl və dəstəmazdan sonra, kəsirə istihazəli olan qadın isə qüsldən sonra ۳۹۴ və ۴۰۷-ci məsələdə işarə olunan iki hal istisna olmaqla dərhal namaza başlamalıdır. Amma namazdan qabaq azan və iqamə demələrinin eybi yoxdur. Namaz vaxtı qunut kimi .müstəhəbb olan əməlləri də yerinə yetirə bilər

Məsələ ۴۱۲: Vəzifəsi dəstəmaz və ya qüsl ilə namaz arasında fasilə salmamaq olan müstəhazəli qadın, əgər vəzifəsinə əməl etməsə, gərək yenidən dəstəmaz alıb və ya .qüsl edib, dərhal namaza başlasın

Məsələ ۴۱۳: İstihazəli qadının qanı axar vəziyyətdə olub kəsilməsə, ona zərəri olmadığı təqdirdə, ehtiyat-vacibə görə gərək qüsldən qabaq qanın gəlməsinin qarşısını almalıdır. Belə ki, səhlənkarlıq etməsi nəticəsində ondan qan xaric olarsa, əgər namaz qılmışdırsa, gərək onu yenidən qılsın. Hətta ehtiyat-müstəhəb budur ki, yenidən qüsl .etsin

Məsələ ۴۱۴: Əgər qüsl vaxtında qan kəsilməsə, qüsl səhihdir. Amma qüsl əsnasında .mütəvəssitə istihazə kəsirəyə çevrilsə, gərək qüslü əvvəldən başlasın

Məsələ ۴۱۵: Ehtiyat-müstəhəb budur ki, istihazəli olan qadın orucdursa, bütün gün .ərzində bacardığı qədər qanın gəlməsinin qarşısını alsın

Məsələ ۴۱۶: Məşhur nəzərə əsasən, kəsirə istihazəli qadının tutacağı oruc o zaman səhihdir ki, sabahı oruc tutmaq istədiyi bir gecənin məğrib və işa namazının qüslünü və

həmçinin gündüzün də gündüz namazları üçün vacib olan qüslləri etmiş olsun. Amma onun orucunun səhih olmasında qüslün şərt olmaması

uzaq bir nəzər deyildir. Həmçinin daha güclü (əqva) nəzərə əsasən, bu qeyd olunan .hökm mütəvəssitə istihazəli olan qadında da şərt deyildir

Məsələ ۴۱۷: Əgər qadın əsr namazından sonra müstəhazə olsa və axşam çağına kimi .qüsl etməsə, orucu səhihdir

Məsələ ۴۱۸: Əgər qadının qəlilə istihazəsi namazdan əvvəl mütəvəssitə, yaxud kəsirə olsa, gərək mütəvəssitə, yaxud kəsirə üçün deyilmiş əməlləri yerinə yetirsin. Əgər mütəvəssitə istihazə kəsirə olsa, gərək kəsirə istihazənin əməllərini yerinə yetirsin. Əgər mütəvəssitə istihazə üçün qüsl etmiş olsa, faydası yoxdur, gərək ikinci dəfə .kəsirə üçün qüsl etsin

Məsələ ۴۱۹: Əgər namaz əsnasında qadının mütəvəssitə istihazəsi kəsirəyə çevrilsə, namazı pozmalı, kəsirə istihazəsi üçün qüsl edib dəstəmaz almalı və onun sair işlərini yerinə yetirib həmin namazı qılmalıdır. Ehtiyat-müstəhəb budur ki, qüsldən qabaq dəstəmaz da alsın. Əgər qüsl etməyə vaxtı çatmasa, onun yerinə təyəmmüm etməlidir. Əgər təyəmmüm etməyə də vaxt yoxdursa, ehtiyat-müstəhəbə əsasən, namazını pozmadan, həmin halda namazını tamamlamalıdır. Amma sonradan qəzasını qılması lazımdır. Həmçinin əgər qadının qəlilə istihazəsi namaz əsnasında mütəvəssitə və ya kəsirə olarsa, namazı pozmalı, mütəvəssitə və ya kəsirə istihazənin əməllərini .yerinə yetirməlidir

Məsələ ۴۲۰: Namaz əsnasında qan kəsilərsə və müstəhazə qadın qanın içəridən də kəsilib-kəsilmədiyini bilməzsə, yaxud paklıq (təharət) hasil edib namazı, ya onun bir hissəsini qılmağa möhlət verib-vermədiyini bilməsə ehtiyat-vacibə görə vəzifəsinə .müvafiq dəstəmaz alaraq və ya qüsl edərək namazı yenidən qılması lazımdır

Məsələ ۴۲۱: Əgər qadının kəsirə istihazəsi mütəvəssitə olsa, gərək birinci namaz üçün kəsirənin əməlini və sonrakı namazlar üçün mütəvəssitənin əməlini yerinə yetirsin. Məsələn, əgər zöhr namazından əvvəl kəsirə istihazə mütəvəssitə olsa, gərək zöhr namazı üçün qüsl etsin və əsr, məğrib və işa namazları üçün yalnız dəstəmaz alsın. Amma əgər zöhr namazı üçün qüsl etməsə və yalnız əsr namazını qılmaq miqdarında

namazı üçün qüsl etsin; və əgər əsr namazı üçün də qüsl etməsə, gərək məğrib namazı üçün qüsl etsin; və əgər onun üçün də qüsl etməsə və yalnız işa namazını .qılmaq miqdarında vaxtı olsa, gərək işa namazı üçün qüsl etsin

Məsələ ٤٢٢: Əgər hər namazdan əvvəl qadının kəsirə istihazəsi kəsilsə və ikinci dəfə .gəlsə, hər namaz üçün gərək bir qüsl etsin

Məsələ ٤٢٣: Əgər kəsirə istihazəsi qəlilə olsa, gərək birinci namaz üçün kəsirənin əməlini və sonrakı namazlar üçün qəlilənin əməlini yerinə yetirsin. Həmçinin əgər mütəvəssitə istihazə qəlilə olsa, gərək birinci namaz üçün mütəvəssitənin əməlini qabaqcadan yerinə yetirməyibsə yerinə yetirsin və sonrakı namazlar üçün qəlilənin .əməlini yerinə yetirsin

Məsələ ٤٢٤: Əgər istihazəli qadın, ona vacib olan işlərdən birini tərk etsə, namazı .batildir

Məsələ ٤٢٥: Qəlilə və ya mütəvəssitə istihazəli olan qadın, əgər namazdan başqa, dəstəmazın şərt olduğu başqa bir iş görmək istəsə, məsələn, bədəninin bir yerini Quranın yazısına toxundurmaq istəsə, belə ki, namaz tamam olandan sonra olsa belə, gərək ehtiyat-vacibə görə dəstəmaz alsın. Namaz üçün aldığı dəstəmaz kifayət .deyildir

Məsələ ٤٢٦: İstihazəli qadın, ona vacib olan qüslləri yerinə yetirdiyi təqdirdə, məscidə daxil olması, orada dayanması, vacib səcdəsi olan ayəni oxuması və əri ilə yaxınlıq etməsi, hərçənd namaz üçün yerinə yetirmiş olduğu, pambığı və parçanı dəyişdirmək kimi digər işləri yerinə yetirməmiş olsa belə, ona halal olur. Bu işlər qüslsüz belə .icazəlidir

Məsələ ٤٢٧: Kəsirə və mütəvəssitə istihazəsi olan qadın, əgər namaz vaxtından əvvəl, vacib səcdəsi olan ayəni oxumaq və ya məscidə getmək istəsə, ehtiyat-müstəhəb .budur ki, qüsl etsin. Əri onunla yaxınlıq etmək istədiyi təqdirdə də, eyni hökmü daşıyır

Məsələ ٤٢٨: Ayət namazı istihazəli qadına vacibdir və gərək ayət namazı üçün də

.gündəlik namazlar üçün deyilən bütün işləri yerinə yetirsin

Məsələ ۴۲۹: Gündəlik namazın vaxtında, istihazəli qadına ayət namazı vacib olsa, hər ,ikisini ardıcıl yerinə yetirmək istəsə

.ehtiyat-lazıma əsasən, hər ikisini bir qüsl və dəstəmazla qıla bilməz

Məsələ ۴۳۰: İstihazəli qadın qəza namazı qılmaq istədikdə, əda namazı üçün vacib olan bütün əməlləri, hər qəza namazı üçün də yerinə yetirməlidir. Həmçinin ehtiyata .əsasən, qəza namazında, əda namazında yerinə yetirdiyi əməllərlə kifayətlənə bilməz

Məsələ ۴۳۱: Əgər qadın özündən gələn qanın yara qanı olmadığını bilirsə və istihazə, heyz, yaxud nifas qanı olduğuna ehtimal verirsə, bu surətdə əgər o qan şər`i baxımdan heyz və nifas qanının hökmünü daşımasa, həmin qadın istihazə hökmünə əməl etməlidir. Hətta əgər istihazə qanı və ya digər qanlar olduğunda şəkk edərsə, onların nişanəsini daşımırsa, ehtiyat-vacibə əsasən, istihazənin əməllərini yerinə .yetirməlidir

## HEYZ

### Point

Heyz, əksər halda, hər ayda, bir neçə gün müddətində, qadınların rəhimindən xaric .olan bir qandır. Qadın heyz qanı gördüyü zaman, haiz adlanır

Məsələ ۴۳۲: Heyz qanı əksər hallarda qəliz və istidir, rəngi qara yaxud qırmızıdır. .Təzyiqlə və azacıq yandırıcılıqla xaric olur

Məsələ ۴۳۳: Qadınların altımış yaşından sonra gördükləri qan heyz hökmündə deyildir. Qüreyşiyyə (səyyidə) nəslindən olmayan qadınlar əlli yaşından sonra altımış yaşının tamam olmasına qədər qəti olaraq heyz hökmündə olan bir qan görsə haizə haram olan şeyləri tərk edib, istihazəliyə lazım olan işləri yerinə yetirmələri ehtiyat .müstəhəbdir

.Məsələ ۴۳۴: Qızın doqquz yaşı tamam olmamışdan qabaq gördüyü qan, heyz deyildir

Məsələ ۴۳۵: Hamilə və uşağa süd verən qadınların da heyz qanı görmələri mümkündür. Bu xüsusda hamilə ilə hamilə olmayan qadının hökmü eynidir. Ancaq əgər hamilə qadın adətinin əvvəlindən ۲۰ gün keçdikdən sonra heyz xüsusiyyətini daşıyan bir qan görsə, ehtiyatən heyzli qadına haram olan işləri tərk etməli və istihazəliyə lazım olan .işləri də etməlidir

Məsələ ۴۳۶: Yaşının doqquz olub-olmadığını bilməyən bir qız, əgər heyzin nişanələri olmayan qan görsə, heyz deyildir. Əgər heyzin nişanələri olarsa, onun heyz olma hökmü, işkallıdır. Amma əgər onun heyz olduğuna xatircəmlik hasil edərsə, heyzdir və .bu təqdirdə, doqquz yaşını tamamladığı məlum olur

Məsələ ۴۳۷: Altmış yaşı olub-olmamasında şəkk edən bir qadın, əgər qan görsə və o qanın heyz olub-olmadığını bilməsə, altmış yaşının tamamlanmadığını əsas .götürməlidir

Məsələ ۴۳۸: Heyzin müddəti üç gündən az və on gündən çox olmur. Üç gündən azacıq .az olsa da belə heyz deyildir

Məsələ ۴۳۹: Heyzin əvvəlinci üç günü ardıcıl olmalıdır. Deməli, əgər məsələn; iki gün .qan görüb, bir gün pak olursa və yenidən bir gün qan görürsə, heyz deyildir

Məsələ ۴۴۰: Heyzin başlanğıcında qanın xaricə çıxması lazımdır. Amma bütün üç gün ərzində qanın xaricə çıxması lazım deyildir. Fərcin daxilində qan olsa kifayətdir. Əgər üç gün ərzində, bütün və ya bəzi qadınlar arasında normal olduğu kimi, azacıq pak olsa .belə, heyzdir

Məsələ ۴۴۱: Birinci və dördüncü gecə qan görməsi lazım deyildir. Amma ikinci və üçüncü gecələrdə qan kəsilməməlidir. Belə ki, əgər birinci gün sübhün əvvəlindən üçüncü günün axşamına qədər, ardıcıl qan gəlsə və əsla kəsilməzsə, heyzdir. Həmçinin əgər birinci günün ortalarında başlayarsa və dördüncü gün həmin vaxtda kəsilərsə də, .eyni hökmü daşıyır

Məsələ ۴۴۲: Əgər üç gün ardıcıl qan görüb kəsildikdən sonra təkrar qan görərsə və qan gördüyü və arada pak olduğu günlər birlikdə on gündən çox olmazsa, qan gördüyü bütün günlər heyzdir. Amma ehtiyat-lazıma əsasən arada pak olduğu günlərdə isə həm heyz olmayan qadına vacib olan işləri yerinə yetirməli, həm də heyzli qadına .haram olan şeylərdən çəkinməlidir

Məsələ ۴۴۳: Əgər qadın, müddəti üç gündən artıq və on gündən az olan qan görüb o qanın çiban və ya yara yaxud heyz qanı olduğunu bilməsə, onu heyz qanı hesab .etməməlidir

Məsələ ۴۴۴: Əgər qadın yara yaxud heyz qanı olduğunu bilmədiyi bir qan görsə, əvvəlki .halı heyz olmamışdırsa ibadətlərini yerinə yetirməlidir

Məsələ ۴۴۵: Əgər qadın bir qan görüb heyz qanı, yaxud istihazə qanı olduğunda şəkk .edərsə, heyz nişanələrini daşıdığı təqdirdə, o qanı heyz hesab etməlidir

Məsələ ۴۴۶: Əgər qadın heyz və ya bəkarət qanı olduğunu bilmədiyi bir qan görsə, özünü yoxlamalıdır: yəni fərcinə bir miqdar pambıq daxil edib, bir az gözlədikdən sonra çıxarmalıdır, əgər pambığın ətrafı bulaşmışdırsa, bəkarət qanıdır. Əgər qan onun hər .yerinə yetişibsə, heyz qanıdır

Məsələ ۴۴۷: Əgər üç gündən az qan görərsə və pak olduqdan sonra yenidən üç gün qan görərsə, ikinci qan heyzdir. Birinci dəfə gördüyü qan adət günlərində olsa belə, .heyz deyildir

## HAİZİN HÖKMLƏRİ

:Məsələ ۴۴۸: Haiz qadına bir neçə şey haramdır

Namaz kimi dəstəmaz, qüsl və ya təyəmmümlə yerinə yetirilməsi lazım olan .۱ ibadətlər; Əgər haiz qadın bu kimi əməlləri səhih əməl qəsdi ilə yerinə yetirsə, icazəli deyil. Lakin meyyit namazı kimi dəstəmaz, qüsl və ya təyəmmüm tələb etməyən .ibadətləri yerinə yetirsə, eybi yoxdur

.(Cünub şəxsə haram olan şeylərin hamısı; (cənabət hökmlərində izah olunub .۲

Fərc ilə (cinsiyyət üzvü ilə) cima etmək; həm kişi, həm də qadın üçün, hətta əgər .۳ sünnət olunan yerə qədər daxil olsa və məni gəlməsə də, haramdır. Ehtiyat-vacib budur ki, sünnət olunan yerdən az da daxil etməsin. Bu hökm arxadan edilən yaxınlığa şamil deyil. Amma ehtiyata əsasən qadınla arxadan (anal dəliyindən) cinsi əlaqədə .olmaq, əgər qadın razı olmasa istər haiz olsun, istərsə də olmasın, icazəli deyil

Məsələ ۴۴۹: Qadının heyz olduğu qəti olaraq məlum olmadığı, amma şərən özünü heyzli hesab etməsi lazım olan günlərdə də, onunla cima etmək haramdır. O halda on gündən çox qan görən və sonradan açıqlanacaq göstərişlərə əməl edən qadın gərək öz qohumlarının adət günlərini özünə heyz qərar versin. Əri o günlərdə onunla yaxınlıq .edə bilməz

Məsələ ۴۵۰: Əgər kişi öz qadını ilə heyz halında yaxınlıq etsə, istiğfar etməsi lazımdır. Kəffarənin vacib olmamasına baxmayaraq verilməsi daha yaxşıdır. Onun kəffarəsi heyizin əvvəlində bir misqal sikkəli qızıldır və onun ortasında misqalın yarısı və axırında .misqalın dörtdə biridir. Şəri misqal, ۱۸ noxuddur

Məsələ ۴۵۱: Haiz qadınla yaxınlıqdan başqa, öpüşmək və mazaqlaşmaq kimi, sair

Məsələ ۴۵۲: Heyz halında ikən qadına təlaq vermək təlaq hökmlərində izah olunacağı .kimi, batildir

Məsələ ۴۵۳: Qadın heyzli olduğunu və ya heyzdən pak olduğunu söyləyərsə, yalan danışmaqla ittiham edilmirsə, sözü qəbul edilməlidir. Əks təqdirdə, sözünün qəbul .edilməsi işkallıdır

Məsələ ۴۵۴: Əgər qadın namaz əsnasında haiz olsa, namazı batildir. Hətta əgər heyz, axırıncı səcdədən sonra və salamın axırıncı hərfindən qabaq olsa, ehtiyat-vacibə görə .batil olur

Məsələ ۴۵۵: Əgər qadın namaz əsnasında haiz olub-olmamasında şəkk edərsə, namazı səhihdir. Amma namazdan sonra, namaz əsnasında haiz olduğunu başa düşərsə, .keçən məsələdə dediyimiz kimi, qıldığı namaz batildir

Məsələ ۴۵۶: Qadının, heyz qanından pak olduqdan sonra namaz, dəstəmaz və ya qüsllə, yaxud təyəmmüm ilə yerinə yetirilən digər ibadətlər üçün qüsl etməsi vacibdir. Heyz qüslü eynilə cənabət qüslü kimi yerinə yetirilir. Dəstəmaz əvəzinə də kifayət edir. .Qüsldən qabaq dəstəmaz da alması daha yaxşıdır

Məsələ ۴۵۷: Qadına, heyz qanından pak olduqdan sonra qüsl etməyibsə də, təlaq vermək səhihdir və əri də onunla cinsi əlaqədə ola bilər. Amma ehtiyat-lazıma əsasən cinsi əlaqə fərcin yuyulmasından sonra olsun. Həmçinin ehtiyat-müstəhəb budur ki, qüsl etməzdən qabaq, onunla cinsi əlaqədə olmaqdan çəkinilsin. Amma Quranın yazısına toxunmaq kimi heyzli olduğu zaman təharətin şərt olması səbəbindən ona haram olan şeylər, qüsl etməyincə halal olmaz. Həmçinin ehtiyat-vacibə görə, məsciddə dayanmaq kimi haramlığı təharətin şərt olduğuna görə haram olması .sübuta yetməyən işlər də eyni hökmü daşıyır

Məsələ ۴۵۸: Əgər su, dəstəmaz və qüslə kifayət edəcək qədər olmasa, yalnız qüsl edəcək miqdarda olarsa, gərək qüsl etsin. Dəstəmaz əvəzinə də təyəmmüm etməsi daha yaxşıdır, əgər su yalnız dəstəmaza yetəcək miqdarda olsa və qüslə yetəcək

miqdarda olmasa, onunla dəstəmaz alması daha yaxşıdır, qüsl əvəzi olaraq, təyəmmüm etməlidir. Əgər onlardan heç birisi üçün suyu olmasa, bu zaman qüsl əvəzinə təyəmmüm etməlidir. Daha yaxşısı budur ki, dəstəmaz əvəzinə də təyəmmüm .etsin

Məsələ ۴۵۹: Qadının heyzli olduğu zaman qılmadığı namazların qəzası yoxdur. Amma heyzli ikən tutmadığı Ramazan ayının oruclarını qəza etməlidir. Həmçinin ehtiyat-lazıma əsasən, nəzr səbəbilə müəyyən vaxtda vacib olub, (amma həmin vaxtda) heyz .halında olduğu üçün tutmadığı orucları da qəza etməlidir

Məsələ ۴۶۰: Əgər namaz vaxtı daxil olsa və qadın namazını təxirə salacağı təqdirdə, heyzli olacağını bilirsə, dərhal namazını qılmalıdır. Həmçinin ehtiyat-lazıma əsasən, .namazını təxirə salacağı təqdirdə, haiz olacağına ehtimal verərsə də, hökm eynidir

Məsələ ۴۶۱: Əgər qadın namazını təxirə salsa və vaxtın əvvəlindən bütün müqəddimələr ilə birlikdə, o cümlədən dəstəmaz almaq pak libas tədarük görmək və s. ilə namaz qıla biləcəyi qədər vaxt keçdikdən sonra haiz olsa, həmin namazın qəzası ona vacibdir. Hətta əgər vaxt daxil olsa və dəstəmaz, qüsl və ya təyəmmümlə bir namaz qıla bildiyi halda qılmasa, ehtiyat-vacibə görə, hərçənd sair şəraitləri tədarük görməyə vaxt çatmayıbsa belə gərək onun qəzasını qılsın, Amma tələsik qılma, yavaş oxuma və digər şeylərdə öz vəziyyətini nəzərə almalıdır, məsələn, səfərdə olmayan bir qadın əgər günorta vaxtının əvvəlində namaz qılmazsa, onun qəzası ancaq günortanın əvvəlindən su ilə dəstəmaz və ya təyəmmüm alıb dörd rəkət namaz qıla biləcək qədər bir müddət keçdikdən sonra haiz olursa, vacibdir. Müsafir olan qadın üçünsə təharət hasil etdikdən sonra iki rəkət namaz qıla biləcək qədər müddətin .keçməsi kifayətdir

Məsələ ۴۶۲: Əgər qadın namazın vaxtının axırında qandan pak olsa, qüsl edib bir rəkət, yaxud bir rəkətdən çox namaz qılmağa vaxtı olmuş olsa, o namazı qılmalıdır. Əks .təqdirdə, onun qəzasını yerinə yetirməlidir

Məsələ ۴۶۳: Əgər haiz qadın paklandıqdan sonra qüsl edəcək qədər vaxtı olmasa, amma təyəmmüm ilə namazı vaxtında qıla bilərsə, ehtiyat-vacib budur ki, o namazı təyəmmüm ilə qılsın. Əgər qılmasa qəza etməlidir. Amma əgər vaxtın darlığından digər ,bir səbəbə görə, vəzifəsi təyəmmüm etmək olsa, məsələn

suyun ona zərəri olsa, təyəmmüm edib, o namazı qılmalıdır. Əgər qılmasa, qəza .etməlidir

Məsələ ۴۶۴: Heyzli qadın pak olduqdan sonra namaz üçün vaxt qalıb-qalmadığında .şəkk edərsə, namazını qılmalıdır

Məsələ ۴۶۵: Əgər hədəsdən pak olub bir rəkət qıla biləcək qədər vaxt qalmadığını güman edib namaz qılmazsa və sonradan vaxt qalmış olduğunu anlayarsa, o namazın .qəzasını qılmalıdır

Məsələ ۴۶۶: Müstəhəbdir ki, heyzli qadın namaz vaxtında qanlarını təmizləsin, pambığı və dəstmalı dəyişsin, dəstəmaz alsın, əgər dəstəmaz ala bilmirsə təyəmmüm etsin və .namaz qıldığı yerdə üzü qibləyə oturub zikr, dua, salavat desin

Məsələ ۴۶۷: Quran oxumaq, Quranı özü ilə aparmaq, bədənin hər hansı yerini onun yazılarının arasına vurmaq və həmçinin həna və s. kimi şeylərlə rənglənmək, haiz .qadına məkruhdur

## HAİZ QADINLARIN NÖVLƏRİ

### Point

:Məsələ ۴۶۸: Haiz qadınlar altı qismdir

Vəqtiyyə və ədədiyyə adət sahibi olan qadın; o qadındır ki, ardıcıl olaraq iki ayda, hər-۱ ayın müəyyən vaxtlarında heyz görsün, heyz olduğu günlərin sayı da, hər iki ayda bir-birinə bərabər olsun; məsələn: iki ay ardıcıl olaraq, hər birində, ayın əvvəlindən .yeddisinə qədər qan görsün

Vəqtiyyə adət sahibi olan qadın; o qadındır ki, ardıcıl olaraq, iki ayın müəyyən-۲ günlərində heyz qanı görsün. Amma hər iki ayda heyz gördüyü günlərin sayı bir-birinə bərabər olmasın; məsələn: ardıcıl olaraq iki ayda, hər ayın əvvəlindən qan görsün. .amma birinci ayda yeddinci gün, ikinci ayda isə səkkizinci gün qandan paklansın

Ədədiyyə adət sahibi olan qadın; o qadındır ki, heyz günlərinin sayı, ardıcıl olan iki-٣ ayda, bərabər olsun, amma o iki qanın görünmə vaxtı eyni olmasın; məsələn: birinci ayda, ayın beşindən onuna qədər, ikinci ayda isə on ikisindən on yeddisinədək qan .görsün

Müztəribə; o qadındır ki, bir neçə ayda qan görsün, amma müəyyən bir adəti-۴ .olmasın, yaxud adəti pozulusun və təzə bir adət də tapmamış olsun

.Mübtədiə; o qadındır ki, ilk dəfə olaraq qan görsün-۵

.Nasiyə; o qadındır ki, öz adətini unutmuş olsun-۶

(.Bunların hər birinin özünə məxsus hökmləri vardır ki, gələcək məsələlərdə deyiləcək)

## VƏQTİYYƏ VƏ ƏDƏDİYYƏ ADƏT SAHİBLƏRİ OLAN QADINLAR – ۱

:Məsələ ۴۶۹: Vəqtiyyə və ədədiyyə adəti olan qadınlar iki qismdirlər

İki ayda ardıcıl olaraq eyni vaxtda heyz qanı görüb, eyni vaxtda da pak olanlar; .۱ məsələn: iki ayda, hər ayın birinci günü qan görüb, yeddinci günü pak olsa, onun heyz .adəti hər ayın birindən yeddisinə qədərdir

Qadın iki ay ardıcıl müəyyən vaxtında heyz qanı görür və üç gün, yaxud daha çox .۲ qan gördükdən sonra bir gün və ya bir neçə gün pak olub yenidən qan görürsə və qan gördüyü günlərlə ortada pak olduğu günlər on gündən artıq olmasa və hər iki ayda qan gördüyü günlərlə ortada pak olduğu günlər eyni sayda olsa onun adəti qan gördüyü günlərin sayı qədərdir, qan görüb və ortada pak olduğu günlərin hamısı qədər deyil. Beləliklə gərək qan gördüyü və pak olduğu günlərin sayı hər iki ayda eyni olsun. Məsələn, əgər birinci ayda və həmçinin ikinci ayda ayın birinci günündən üçüncü gününə kimi qan görsə və üç gün pak olsa və ikinci dəfə üç gün qan görsə bu qadının adəti fərqli olaraq altı gündür. Arada pak olduğu ۳ gündə isə, ehtiyat-vacibə görə, haizə haram olan işləri tərk etməli, müstəhazənin əməllərini də yerinə yetirməlidir. Əgər ikinci ayda qan gördüyü günlərin sayı az və ya çox olarsa, bu qadın ədədiyyə .adətinin yox, vəqtiyyə adətinin sahibidir

Məsələ ۴۷۰: Vəqtiyyə adəti olan qadın (istər adəti-ədədiyyəsi də olsun, istərsə olmasın) əgər adət vaxtında bir gün və ya iki gün yaxud da çox qabaqcadan qan görsə «adəti qabaqa düşübdür» deyiləcək şəkildə bir neçə gün vaxtından qabaq qan görərsə o qanda heyz əlamətləri olmasa belə, heyzli qadınlar üçün deyilən hökmlərə əsasən əməl etməlidir. Əgər sonradan heyzli olmadığını başa düşərsə, məsələn; üç gündən .qabaq pak olarsa, yerinə yetirmədiyi ibadətlərin qəzasını yerinə yetirməlidir

Məsələ ۴۷۱: Vəqtiyyə və ədədiyyə adəti olan bir qadın, əgər adətindən bir neçə gün qabaq başlayıb, bütün adət günlərində və adət günlərindən bir neçə gün sonraya qədər qan görərsə, bu müddət birlikdə on gündən artıq olmasa, hamısı heyzdir. Əgər on gündən artıq olarsa, yalnız öz adət günlərində gördüyü qan heyzdir. Ondan qabaq və sonrakı günlərdə gördüyü qan isə istihazədir. Belə ki, adətindən qabaq və sonrakı günlərdə yerinə yetirmədiyi ibadətləri qəza etməlidir. Əgər bütün adət günləri ilə birlikdə bir neçə gün də adətindən qabaq qan görsə və hamısı birlikdə on gündən artıq olmasa, hamısı heyzdir. Əgər on gündən artıq olarsa, yalnız adət günləri heyz nişanələrini daşımasa belə heyzdir. Ondan qabaq gördüyü qanlarda heyzin əlamətləri olsa belə istihazədir. Belə ki, əgər o günlərdə ibadətlərini yerinə yetirməyibsə, gərək onları qəza etsin. Əgər bütün adət günləri ilə birlikdə bir neçə gün adətindən sonra qan görsə və hamısı birlikdə on gündən artıq olmasa, hamısı heyzdir. Amma əgər on .gündən artıq olarsa, adət günləri heyz, qalanı isə istihazədir

Məsələ ۴۷۲: Vəqtiyyə və ədədiyyə adəti olan qadın, əgər bir miqdar adət günlərində və ondan əvvəl bir neçə gün qan görsə və üst-üstə on gündən artıq olmasa, hamısı heyzdir. Əgər on gündən artıq olsa, adət günlərində gördüyü qan, adətindən bir neçə gün qabaq gördüyü qanın adəti miqdarına çatanı heyz, əvvəlki günləri isə istihazə hesab edilməlidir. Əgər adət günlərindən bir miqdarını və adətindən bir neçə gün sonra qan görsə və üst-üstə on gündən çox olmasa, hamısı heyzdir; əgər on gündən artıq olsa, adəti günlərində gördüyü qan ilə, sonrakı bir neçə gün

gördüyü qanın adət günlərinə çatdığı qədərini, gərək heyz hesab etsin, qalanlarını isə .istihazə hesab etməlidir

Məsələ ۴۷۳: Adəti olan qadın üç gün, yaxud üç gündən daha artıq qan görüb paklansa və yenidən qan görsə, bu iki qan arasındakı zaman fasiləsi on gündən az olsa və qan gördüyü günlərin hamısı, arada pak olduğu günlərlə birlikdə on gündən artıq olsa; məsələn, beş gün qan görüb sonra beş gün pak olsa və yenidən beş gün qan görsə, bu :halda bunun bir neçə şəkli vardır

Birinci dəfə gördüyü qanın hamısı və ya bir miqdarı heyz adət günlərində olsa və .۱ paklandıqdan sonra gördüyü ikinci qan adət günlərində olmasa, birinci qanı bütünlüklə heyz və ikinci qanı istihazə hesab etməlidir. Amma əgər ikinci qanda heyz əlamətləri olsa, onda birinci qan görmə günləri ilə ondan sonrakı pak olduğu günlərin hamısı on gündən artıq olmasa heyz, qalanı isə istihazədir. Məsələn, əgər üç gün qan görüb paklandıqdan sonra beş gün heyz əlamətlərini daşıyan qan görsə, birinci üç gün və ikinci qan görmənin dörd günü heyzdir. Aradakı pakolmada isə ehtiyat-vacibə görə .qeyri-haizin vaciblərini yerinə yetirməli, haizə haram olan şeyləri isə tərk etməlidir

Birinci qan adət günlərində olmasa və ikinci qanın hamısı, yaxud bir miqdarı adət .۲ .dövrünə düşsə, gərək ikinci qanın hamısı heyz, birinci isə istihazə hesab etsin

Birinci və ikinci qanın bir miqdarı adət günlərində olsa, bu halda birinci qanın adət .۳ günlərində olan miqdarı üç gündən az olmazsa, arada pak olduğu günlər və ikinci qanın adət günlərilə birlikdə on gündən çox olmazsa (adət günlərində olan) hər iki qan heyzdir. Arada pak olduğu günlərdə isə ehtiyat-vacibə görə həm heyzdən pak olan qadının görməli olduğu işləri yerinə yetirməli, həm də heyzli qadına haram olan işlərdən çəkinməlidir. İkinci qanın adət günlərindən sonra olan qismi isə istihazədir. Birinci qanının adət günlərindən əvvəl olan qisminə gəlincə, əgər ona «adəti qabaqa düşüb» deyilirsə, o da heyz hökmünü daşıyır. Lakin bununla birlikdə onun heyzli olmasına hökm vermək, ۲-ci qanın adət günlərində olan qisminin bir qədərinin və ya hamısının heyzin on gündən kənar düşməsinə səbəb olsa, bu təqdirdə o istihazə ,hökmünü daşıyır. Məsələn

qadının adəti ayın üçündən onuna qədər olur, amma bir ay ayın əvvəlindən altısına qədər qan görürsə və sonradan iki gün paklanıb, sonra yenidən on beşinə qədər qan görürsə, ayın əvvəlindən onuna qədər gördüyü qanlar heyz, on birindən on beşinə .qədəri isə istihazədir

Birinci və ikinci qandan bir miqdarı adət günlərində olsa amma birinci qanın adət .۴ günlərindəki miqdarı üç gündən azdırsa, belə halda ilk qanın adət günlərindəki üç günü heyz hesab etsin, həmçinin ikinci qandan əvvəlki üç gün, aradakı paklıqla birgə on gündən çox olmayan hissəsini heyz, qalanını isə istihazə qərar verməlidir. Əgər pak olduğu günlər yeddi gün olsa, ikinci dəfə gördüyü qanın hamısı istihazədir. Bəzi vaxtlar :birinci qanın hamısını heyz hesab etsin. Bu isə iki şərtlə mümkündür

;O qan adətini qabaqlamışdır» deyiləcək miqdarda adətdən əvvəl olmalı» (۱

Onu heyz sayması ikinci qanın adət günlərində olan miqdarının bir qisminin, heyzin (۲ on günündən kənara çıxmasına yol açmamalıdır. Məsələn, qadının adəti ayın üçündən onuna qədərdirsə, amma o, ayın əvvəlindən dördüncü gününün sonuna qədər qan görüb iki gün pak olursa, sonra da ayın on beşinə qədər qan görürsə, ilk qanın hamısı .və ikinci qanın onuncu gününün sonuna qədər olanı heyzdir

Məsələ ۴۷۴: Vəqtiyyə və ədədiyyə adəti olan qadın, əgər adət vaxtında qan görməsə və ondan başqa vaxtda heyz günlərinin sayında və heyzin nişanələri olan qan görsə, istər adət vaxtından qabaq olsun, istərsə ondan sonra olsun, gərək onu heyz qərar .versin

Məsələ ۴۷۵: Vəqtiyyə və ədədiyyə adətli qadın, əgər adət vaxtında üç gün, yaxud daha çox qan görsə və onun günlərinin sayı adət günlərinin sayından az, yaxud çox olsa və pak olandan sonra yenidən öz adət günlərinin sayında qan görsə, burada bir neçə :surət vardır

O iki qanın cəmi, aradakı paklıqla birlikdə on gündən çox olsa, o iki qanın cəmi, .۱ .birlikdə bir heyz sayılır

O iki qan arasında olan paklıq on gün və ya daha çox olsa, o qanların hər biri ayrıca .۲
.bir heyz sayılar

O iki qan arasındakı paklıq on gündən az olsa, amma o iki qanın cəmi, aradakı .۳ .paklıqla birlikdə on gündən çox olun. Bu halda birinci qan heyz, ikinci isə istihazə sayılır

Məsələ ۴۷۶: Vaxt və say cəhətindən adət sahibi olan bir qadın əgər on gündən çox qan görsə, adət günlərində gördüyü qanda heyz nişanələri olmasa belə, o, heyzdir. Adət günlərindən sonra gördüyü qan isə heyzin xüsusiyyətini daşısa belə, istihazədir. Məsələn; heyz adəti ayın əvvəlindən yeddisinə qədər olan qadın əgər ayın əvvəlindən .on ikisinə qədər qan görsə, onun ilk yeddi günü heyz, sonrakı beş günü isə istihazədir

### VƏQTİYYƏ ADƏT SAHİBİ OLAN QADINLAR – ۲

Məsələ ۴۷۷: Vaxt cəhətdən adət sahibi olub, adətlərinin başlanğıcı müəyyən olan :qadınlar iki qismdir

İki ay ardıcıl müəyyən bir vaxtda heyz qanı görüb, bir neçə gün sonra təmizlənən, .۱ lakin hər iki ayda qan gördüyü günlərin sayı eyni olmayan qadın; məsələn, iki ay ardıcıl ayın birində qan gördüyü halda, birinci ay yeddinci gün, ikinci ay səkkizinci gün qandan .pak olarsa, bu qadın ayın birinci gününü, heyz adətinin ilk günü hesablamalıdır

İki ay ardıcıl müəyyən bir vaxtda üç gün və ya daha çox heyz qanı görüb pak olan, .۲ sonra ikinci dəfə qan görən və qan gördüyü bütün günlər arada pak olduğu günlərlə birlikdə, on gündən çox olmaması ilə birlikdə, ikinci ayın qanı birinci aydan az və ya çox olan qadın, məsələn; birinci ay səkkiz gün, ikinci ay doqquz gün qan görən qadın, hər iki ayın əvvəlindən qan görsə ayın ilk gününü heyz adətinin birinci günü hesab .etməlidir

Məsələ ۴۷۸: Vəqtiyyə adətli qadın, əgər öz adəti vaxtında və ya adətindən iki-üç gün qabaq qan görərsə, haiz qadınlar üçün söylənən hökmlərə əsasən əməl etməlidir. Bu məsələnin geniş izahı ۴۷۰-ci məsələdə deyilmişdir. Amma bu iki surətdən başqa, məsələn; «adətini qabaqlamışdır» deyilməyib, «adətindən başqa vaxtda qan görmüşdür» deyiləcək qədər adətindən xeyli qabaq qan görürsə və ya adətinin vaxtı ,keçdikdən sonra qan görürsə

gördüyü qan heyz nişanələrini daşıyırsa, haiz qadınlar üçün söylənən hökmlərə əsasən əməl etməlidir. Həmçinin heyz nişanələrini daşımadığı halda, o qanın üç gün davam edəcəyini bilirsə də, hökm eynidir. Amma üç gün davam edib-etməyəcəyini bilməsə, vacib-ehtiyata əsasən, həm istihazəli qadına vacib olan əməlləri yerinə .yetirməli, həm də heyzli qadına haram olan əməllərdən çəkinməlidir

Məsələ ۴۷۹: Vəqtiyyə adəti olan qadın, əgər öz adət vaxtında qan görsə və o qanın miqdarı on gündən çox olsa, onların bəzisində heyz nişanəsi olub bəzisində olmasa, heyz əlamətləri olan günlərin sayı on gündən çox, üç gündən az olmasa, onu heyz, qalanını istihazə hesab etməlidir. Əgər bir qan həmin şərtlə yenidən təkrar olsa, məsələn dörd gün heyz nişanələri, dörd gündə də istihazə nişanələri olan qan gəlsə, yenidən dörd gün heyzin nişanəsi, dörd gün də istihazə nişanəsi olan qan gəlsə, fəqət ilk qanı heyz hesab etməlidir, qalanı isə istihazədir, Əgər heyz əlaməti olan qan üç gündən az olsa, onu heyz hesab etməli, onun sayını sonradan gələn iki yolla (qohumlarına müraciət etməklə ya da bir ədəd seçməklə) təyin etməlidir. Əgər on gündən artıq olsa, onun bir hissəsini o iki yoldan biri ilə heyz qərar verməlidir. Əgər heyzin miqdarını onun nişanələrinin vasitəsilə təyin edə bilməsə, yəni onun qanının hamısı bir növ nişanəyə malik olsa, yaxud heyz nişanələrinə malik olan qan on gündən artıq olsa, yaxud da üç gündən az olsa, gərək qohumlarından bəzisinin adətini özü üçün heyz qərar versin. İstər ata tərəfi olsun, istərsə ana; istər diri olsun, istərsə ölü, :amma iki şərtlə

Adət miqdarının öz heyz miqdarı ilə zidd olduğunu bilməsin, məsələn, özü cavan, .۱ səhhəti qüvvətli olsa və adətini özü üçün heyz qərar verdiyi qadın isə yaisə yaşına yaxın olsun ki, adətən onun miqdarı az olur. Bu halın əksində də bu cürdür. Bunun .mənası və hökmü ۴۸۸-ci məsələdə gələcək

Adət miqdarının birinci şərtdə olduğu kimi digər qohumlarının adət miqdarı ilə fərqi .۲ olduğunu bilməsin; Amma fərq hesab olunmayacaq dərəcədə az olsa, eybi yoxdur. Həmçinin vəqtiyyə adəti olan qadın əgər adət vaxtında əsla qan

görməsə və bu vaxtdan başqa on gündən artıq olan qan görərsə, heyzin miqdarını da .nişanələrindən ayırd edə bilməsə, eyni hökmü daşıyır

Məsələ ۴۸۰: Vəqtiyyə adəti olan qadın heyzi, öz adət vaxtından kənarda qərar verə bilməz. Demək, əgər onun adətinin başlama vaxtı məlum olsa, məsələn, hər ay birinci gündən qan görmüş olsa və bəzən beşinci gün, bəzəndə altıncı gün pak olsa, belə ki, bir ayda on iki gün qan görsə və heyzin nişanələri ilə onun sayını müəyyən edə bilməsə, gərək ayın birinci günlərini heyz hesab etsin və onun sayında əvvəlki məsələdə deyilənə müraciət etsin. Əgər onun adətinin ortası və ya sonu məlum olarsa, on gündən artıq qan gördüyü təqdirdə, heyz sayını, onun ortası ilə sonu adət .vaxtına müvafiq olan bir şəkildə qərar verməlidir

Məsələ ۴۸۱: Vəqtiyyə adəti olan qadın on gündən artıq qan görərsə və ۴۷۹-cı məsələdə açıqlanan hökmə əsasən onu müəyyən edə bilməsə, üç gündən on günə qədər heyz miqdarı ilə uyğun gördüyü hər hansı bir miqdarı heyz qəbul etmək xüsusunda ixtiyar sahibidir. Amma əgər özünə münasib görürsə, yeddi günü heyz qəbul etməsi daha yaxşıdır. Əlbəttə, əvvəlki məsələdə deyildiyi kimi, heyz qərar verdiyi günlərinin sayının .adət vaxtı ilə uyğun olması labüddür

### ƏDƏDİYYƏ ADƏTİ OLAN QADINLAR – ۳

İki ay ardıcıl heyz günlərinin sayının eyni miqdarda olmasına baxmayaraq, qan .۱ görmə vaxtı eyni olmayan qadın. Bu qadının qan gördüyü günlər hər nə qədərdirsə, bu onun heyz adəti sayılır. Məsələn; birinci ay, birinci gündən beşinci günə qədər, ikinci ay .isə on birinci gündən on beşinci günə qədər qan görürsə, onun adəti beş gün olar

İki ay ardıcıl üç gün və ya daha çox qan görüb, bir gün və ya daha çox paklandıqdan .۲ sonra, yenidən qan görən, lakin birinci və ikinci ayda qangörmə vaxtı fərqli olan qadın; bu xüsusda əgər

qan gördüyü günlərin sayı ilə arada kəsildiyi günlərin sayı, birlikdə on gündən artıq olmasa və qan gördüyü günlərin sayı da eyni olarsa, bütün qan gördüyü günlər heyz adəti olar. Arada pak olduğu günlərdə də ehtiyata əsasən, pak olan qadına vacib olan işləri yerinə yetirməli, haiz olan qadına haram olan işlərdən də çəkinməlidir. Məsələn; birinci ay, ayın birinci günündən üçüncü gününə qədər qan görüb iki gün pak olur və yenidən üç gün qan görürsə, ikinci ay da ayın on birindən on üçünə qədər qan görür və iki gün pak olur və yenidən üç gün qan görürsə, onun adəti altı gündür. Amma bir ayda məsələn; səkkiz gün qan görür və ikinci ayda dörd gün qan görüb paklanır, sonra yenidən qan görür və qan gördüyü bütün günlər, arada pak olduğu günlərlə birlikdə səkkiz gün olarsa, bu qadın adəti-ədədiyyə sahibi deyil, hökmü sonra açıqlanacaq .müztəribə hesab olunur

Məsələ ۴۸۲: Ədədiyy adəti olan bir qadın, əgər öz adət sayından az və ya çox qan görürsə və müddəti on gündən artıq olmursa, onların hamısını heyz qərar verməlidir. Amma on gündən çox olarsa, gördüyü bütün qanlar eyni şəkildədirsə, qan gördüyü andan etibarən adət günlərinin sayını heyz, qalanını isə istihazə hesab etməlidir. Əgər gördüyü bütün qanlar eyni şəkildə olmasa və bir neçə günü heyz nişanələrini, qalanı isə istihazə nişanələrini daşıyırsa, əgər qanın heyz nişanəsi olan günləri adət günlərinin sayı ilə eyni ölçüdədirsə, o günləri heyz, qalanını istihazə hesab etməlidir. Əgər qanın heyz nişanəsi olan günləri onun adət günlərindən artıq olsa, yalnız adət günlərinin qədəri heyz, qalanı isə istihazədir. Əgər qanın heyz nişanəsi olan günləri onun adət günlərindən az olsa, o günləri, birlikdə hesablandığı zaman adət günlərinin sayının miqdarında olan bir neçə günlə birlikdə heyz, qalanını isə istihazə hesab .etməlidir

### MÜZTƏRİBƏ – ۴

Məsələ ۴۸۳: Müztəribə yəni iki ay ardıcıl qan görən, lakin nə vaxt cəhətindən, nə də sayı cəhətindən bir adət tapmamış qadındır. Belə bir qadın, əgər on gündən çox qan görsə və

gördüyü bütün qanlar eyni şəkildə olarsa, yəni onların hamısı heyz nişanələrini, yaxud istihazə nişanələrini daşıyarsa, ehtiyata əsasən bu qadın öz adət vaxtından kənar qan görüb, nişanədən heyzi istihazədən ayırd edə bilməyən, vəqtiyyə adəti olan qadının hökmünü daşıyır. Belə ki, bu qadın öz qohumlarının bəzisinin adətini özü üçün heyz qərar verməlidir. Bu mümkün olmadığı təqdirdə isə, ۴۷۹ və ۴۸۱-ci məsələdə deyildiyi .kimi, üç günlə on gün arasında bir neçə günü özü üçün heyz qərar verməlidir

Məsələ ۴۸۴: Əgər müztəribə bir neçə günü heyz və bir neçə günü də istihazə nişanələrini daşıyan halda on gündən çox qan görərsə, ۴۷۹-cı məsələnin əvvəlində .deyilən göstərişə əməl etməlidir

## MÜBTƏDİƏ – ۵

Məsələ ۴۸۵: İlk dəfə qan görən qadına «mübtədiə» deyilir. Əgər bu qadın on gündən çox qan görsə və gördüyü bütün qanlar eyni şəkildə olsa, ۴۷۹-cu məsələdə deyilən iki şərtlə gərək qohumlarından birinin adətini özünə heyz, qalanını isə özü üçün istihazə qərar versin. Əgər bu mümkün olmasa, ۴۸۱-ci məsələdə izah olunan göstərişə əsasən, .üç ilə on gün arasında olan bir neçə günü özünə heyz qərar verməlidir

Məsələ ۴۸۶: Əgər mübtədiə olan bir qadın bir neçə günü heyz və digər bir neçə günü istihazə nişanələrini daşıyan on gündən çox qan görərsə, əgər heyz nişanələrini daşıyan qan üç gündən az və on gündən çox olmasa, onun hamısı heyzdir. Amma əgər heyz nişanələrini daşıyan qanın üzərindən on gün keçməmiş, yenidən heyz nişanələrini daşıyan bir qan görərsə, məsələn; beş gün qara qan və doqquz gün sarı qan və yenidən beş gün qara qan görərsə, müztəribədə deyildiyi kimi, birinci qanı .heyz, qalan iki qanı da istihazə qərar verməlidir

Məsələ ۴۸۷: Mübtədiə, əgər on gündən artıq qan görsə, ondan bir neçə günü heyz nişanəsi və digər neçə günü istihazə

nişanəsi olarsa, amma heyz nişanəsi olan qan üç gündən az, yaxud on gündən çox .olarsa, gərək ۴۷۹-cı məsələdə deyilmiş göstərişə əməl etsin

**NASİYƏ – ۶**

Məsələ ۴۸۸: Nasiyə öz adətinin zamanını və ya miqdarını yaxud hər ikisini unudan qadına deyilir. Əgər bu qadın üç gündən az on gündən çox olmayan bir qan görsə :hamısı heyzdir. Əgər on gündən artıq olsa, o bir neçə qismdir

Say baxımından və ya vaxt yaxud da hər ikisində adət sahibi olur və öz adətini-۱ bütünlüklə unudur; hətta icmalən olsa belə, vaxt və sayını yadına sala bilməsə, bu .qadın yuxarıda deyilən mübtədiə hökmündədir

Vəqtiyyə adəti olsun, istər ədədiyyə də olsun, istər olmasın, amma öz adətinin-۲ vaxtından icmal olaraq bir şey xatırlayır. Məsələn bilir ki, filan gün onun adətinin bir hissəsi idi, yaxud onun adət dövrü ayın birinci yarısında olurdu. Belə qadının hökmü mübtədiə kimidir. Amma heyzin elə bir vaxta qərar verməməlidir ki, dəqiq şəkildə adətinin əksinə olsun. Məsələn, ayın ۱۷-si onun adətinin bir günü olduğunu, ya onun adəti ayın ikinci yarısında olduğunu bilsə, indi isə ayın əvvəlindən ۲۰-ə qədər qan görsə öz adətini ayın ilk on günündə qərar verə bilməz. Hətta əgər heyzin nişanələrini, ikinci .on günlük isə istihazənin nişanələrini daşısa belə

Ədədiyyə adəti olub adətinin miqdarını unutmuş olsa; bu qadın da mübtədiə-۳ hökmündədir, amma heyz qərar verdiyi miqdar, heyzin sayı o miqdardan az olduğunu bildiyi bir miqdardan az qərar verə bilməz. Həmçinin adətinin sayını o miqdardan artıq olmadığı miqdardan artıq da qərar verə bilməz. Gərək bu məsələyə naqis ədədiyyə adətində də riayət edilsin. Naqisə yəni adət sayları (iki ədəd arasında tərəddüdlü olsun) üç gündən artıq və on gündən az olmaq arasında tərəddüdlü olan qadına deyilir, onlar kimi, hər ay altı və ya yeddi gün qan görən bir qadın heyz xüsusiyyətlərini və ya qohumlarından bəzisinin

adətini yaxud da on gündən artıq qan gördüyü zaman, bir sayı seçə bilməz, (bu o haldadır ki, on gündən çox qan görsün) altı gündən az və yeddi gündən çoxu heyz .qərar verə bilməz

## HEYZİN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۴۸۹: Mübtədiə, müztəribə, nasiyə və adəti-ədədiyyəsi olan qadınlar, əgər heyzin nişanələri olan bir qan görsələr, ya yəqin etsələr ki, üç gün çəkəcək, gərək ibadəti tərk etsinlər. Əgər sonradan heyz olmadığını başa düşsələr, gərək yerinə .yetirilməmiş ibadətləri qəza etsinlər

Məsələ ۴۹۰: Heyzdə adət sahibi olan qadın, istər bu adət heyzin vaxtında olsun, istərsə heyzin sayında və ya həm vaxt, həm də say baxımından adət sahibi olsun, əgər iki ay ardıcıl öz adətinin əksinə olaraq, vaxt və ya günlərin sayı, ya da həm vaxtı, həm də sayı eyni olan bir qan görərsə, onun adəti bu iki ayda gördüyünə qayıdır. Məsələn; əgər ayın birindən yeddisinə qədər qan görüb paklanırdısa, əgər iki ayın onundan on yeddisinə qədər qan görür və paklanırsa, onun adəti ayın onundan on yeddisinə qədər .olur

Məsələ ۴۹۱: Bir aydan məqsəd, adəti vəqtiyyənin təyin olunduğu haldan başqa qan görmənin əvvəlindən otuz gün keçməsidir, ayın əvvəlindən axırına qədərki müddət .deyil. Amma vəqtiyyə adətin təyin olunduğu hal isə şəmsi deyil, qəməri, ayıdır

Məsələ ۴۹۲: Adətən ayda bir dəfə qan görən qadın, əgər bir ayda iki dəfə qan görərsə və onların biri heyz nişanələrini daşımasa da, arada pak olduğu günlərin sayı on .gündən az olmasa, hər ikisini də heyz hesab etməlidir

Məsələ ۴۹۳: Əgər heyzi, qanın xüsusiyyətlərindəki fərqə görə ayırd edən qadın üç gün və daha artıq bir müddətdə, heyz xüsusiyyətlərini daşıyan qan görsə, bundan sonra on gün və ya daha çox istihazə xüsusiyyətlərini daşıyan qan görsə, ikinci dəfə üç gün heyz xüsusiyyətlərini daşıyan qan görsə, heyz xüsusiyyətlərini daşıyan əvvəlki və sonrakı .qanı heyz saymalıdır

Əgər iki qandan biri adət günlərində olsa, aradakı on günün də hamısının istihazə olması, yaxud bir qisminin heyz olması məlum olmasa, bu halda adət günlərində .gördüyü qan heyz, qalanları istihazədir

Məsələ ۴۹۴: Əgər qadın on gündən qabaq paklanıb və batində qan qalmadığını bilərsə, on gün tamamlanmazdan qabaq yenidən qan görəcəyini guman etsə belə, ibadətləri üçün qüsl etməlidir. Əgər on gün tamamlanmazdan qabaq təkrar qan görəcəyinə əmin olsa, əvvəldə deyildiyi kimi, ehtiyata əsasən qüsl edib, ibadətlərini yerinə .yetirməli, heyzliyə haram olan şeyləri də tərk etməlidir

Məsələ ۴۹۵: Əgər qadın on gün tamam olmamış paklanıb içəridə qan olduğuna ehtimal verərsə, ya ibadətlərin ehtiyatən əncam verməli, ya istibra etməlidir. İstibra etmədən ibadətləri tərk etməsi icazəli deyil. İstibra bundan ibarətdir ki, fərcinə bir az pambıq daxil edib, bir müddət gözlədikdən sonra çıxarmalıdır (əlbəttə, qadınlar arasında adət sayılan heyz zamanı pak olduqları müxtəsər miqdardan çox gözləməlidir). Pambıq pakdırsa, qüsl etməli və ibadətlərini yerinə yetirməlidir. Əgər pak deyilsə, pambığa sarı rəngli su belə bulaşmış olsa, əgər heyz də adəti yoxdursa və ya adəti on gündürsə, ya da adət günləri hələ tamam olmamışdırsa, gözləməlidir. Əgər on gündən əvvəl paklanarsa qüsl etməlidir. Müddət on günə çatmış və ya qanı on gün həddini keçmişsə, onuncu günün tamamında qüsl etməlidir. Amma əgər adəti on gündən azdırsa, on gün .tamamlanandan və ya onuncu günün başında paklanacağını bilirsə, qüsl etməməlidir

Məsələ ۴۹۶: Əgər qadın bir neçə günü heyz sayıb, ibadət etməzsə və sonradan o zaman heyz olmadığını başa düşərsə, o günlərdə yerinə yetirmədiyi namaz və orucları qəza etməlidir. Əgər bir neçə günü də «heyz deyil» gumaniylə ibadət edib sonradan o zaman heyz olduğunu başa düşərsə, o günlərdə vacib oruc da tutmuşdursa, onları .qəza etməlidir

## NİFAS

Məsələ ۴۹۷: Uşağın ilk üzvü ananın bətnindən çıxdığı andan etibarən, qadından gələn, on gündən qabaq, yaxud on gün tamam olan müddətdə kəsilən hər qan nifas qanıdır .bu şərtlə ki, ona doğuş qanı deyilə bilsin. Nifas halında olan qadına nəfsa deyilir

Məsələ ۴۹۸: Qadından, uşağın ilk üzvünün çölə gəlməsindən qabaq gördüyü qan, nifas .deyildir

Məsələ ۴۹۹: Uşağın xilqətinin tamamlanmış olması lazım deyildir. Natamam doğulan uşaq bağlı (laxta) qan surətində olan ələqə, ya ət parçası şəklində olan müzğə .halətindən keçmiş olsa və düşsə, qadının on günə qədər gördüyü qan, nifas qanıdır

Məsələ ۵۰۰: Nifas qanı, bir anlıqdan artıq gəlməyə bilər. Amma on gündən də artıq ola .bilməz

Məsələ ۵۰۱: Əgər qadın özündən bir şey düşüb-düşmədiyində şəkk etsə, yaxud düşən şeyin uşaq olub-olmadığında şəkk etsə, araşdırmağı lazım deyil və ondan xaric olan .qan şərən nifas qanı deyil

Məsələ ۵۰۲: Haizə vacib olan işlər nəfsaya da vacibdir. Ehtiyat-vacibə görə, məsciddə dayanmaq, digər qapıdan çıxmaq olmadan daxil olmaq iki məsciddən (Məscidül-həram və Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) məscidindən) keçmək, vacib səcdəsi olan ayələri oxumaq, Quranın yazısına və Allahın adına toxunmaq nəfsaya .haramdır

Məsələ ۵۰۳: Nifas halında olan qadına təlaq vermək və onunla yaxınlıq etmək .haramdır. Amma kəffarəsi yoxdur

Məsələ ۵۰۴: Ədədiyyə adəti olmayan qadının qanı on gündən keçməsə, onun hamısı nifasdır. Əgər on gündən əvvəl pak olsa, gərək qüsl etsin və öz ibadətlərini yerinə yetirsin. Əgər sonra bir dəfə, yaxud çox qan görsə, belə ki, qan gördüyü günlərlə arada pak olduğu günlər birlikdə on gün və ya on gündən az olsa, gördüyü qanların

ehtiyatən pak qadına vacib olan işləri yerinə yetirsin, nüfəsaya haram olan işləri tərk etsin. Buna görə oruc tutmuşdursa, gərək qəza etsin. Əgər sonda gördüyü qan on günü keçərsə, o qanın on gün ərzində gördüyü qismini nifas, on gündən sonrasını da .istihazə qəbul etməlidir

Məsələ ۵۰۵: Ədədiyyə adəti olan qadının (doğuşdan sonra) gördüyü qan, adət günlərindən artıq olsa, on gündən keçməsə də ehtiyat-vacibə görə, adət günlərindən sonrakı günlərdə nüfəsaya haram olan işləri, tərk edib müstəhazəyə vacib olanları əmələ gətirsin. Əgər bir dəfədən artıq qan görsə, və onların arasında pak olsa, adət günləri qədərini nifas qərar versin, ehtiyata əsasən aradakı pak olduğu günlərdə və adətindən artıq qan gördüyü günlərdə nəfsaya haram olanları tərk edib vacib olanları .əmələ gətirsin

Məsələ ۵۰۶: Nifas qanından pak olan qadın, əgər içəridə qan olduğuna ehtimal verərsə, ya ehtiyat olaraq qüsl etməli, və ibadətləri yerinə yetirməli, ya da istibra etməlidir. İbadətlərini istibra olmadan tərk etməsi icazəli deyil. İstibranın qaydası ۴۹۵-cı .məsələdə qeyd olunub

Məsələ ۵۰۷: Əgər qadının nifas qanı on günü keçsə, heyzdə ədədiyyə adəti vardırsa, onun adət günləri qədəri nifas, qalanı istihazədir. Əgər adəti yoxdursa, on günə kimi nifas və qalanı istihazə olar. Əgər öz adətini unutmuşdursa, adətin ehtimal verdiyi ən yüksək ədədi fərz etməlidir. Ehtiyat-müstəhəb budur ki, adəti olan qadın adətindən sonrakı gündən və adəti olmayan qadın ۱۰-cu gündən etibarən doğumun on səkkizinci .gününə kimi istihazənin işlərini yerinə yetirsin və nüfəsaya haram olan işləri tərk etsin

Məsələ ۵۰۸: Heyzdə ədədiyyə adəti olan qadın, doğumdan sonra bir aya qədər və ya daha artıq ardıcıl qan görərsə, onun adət günləri qədəri nifasdır. Nifasdan sonra gələn on gün boyunca gördüyü qan, adəti vəqtiyyə sahibi olsa belə və aylıq adət günlərində olsa belə, istihazədir. Məsələn; heyz adəti hər ayın iyirmisindən iyirmi yeddisinə qədər olan qadın, əgər ayın onunda doğarsa və bir ay və ya daha artıq ardıcıl qan görərsə, ayın on yeddisinə qədər nifas və on yeddinci gündən etibarən on

gün, hətta öz adət günləri olan ayın iyirmisindən iyirmi yeddisinə qədər gördüyü qan istihazədir. On gün keçdikdən sonra gördüyü qan isə, adəti vəqtiyyə sahibi olsa və gördüyü qan adət günlərində olmasa, gözləməsi bir ay ya daha çox belə çəksə və bu müdət ərzində qan heyz nişanələrini daşısa belə, adət günlərini gözləməlidir. Amma əgər qadın adəti-vəqtiyyə sahibi olmasa, mümkün olduğu təqdirdə, heyzini onun nişanələri ilə təyin etməlidir (bunun qaydası ۴۷۹-cı məsələdə qeyd olundu). Əgər bu mümkün olmasa, məsələn; nifasdan on gün sonra gördüyü qanların hamısı eyni şəkildə olsa və bir ay və ya bir neçə ay eyni halda davam edərsə, hər ay öz qohumlarından bəzisinin heyz adətini (۴۷۹-cı məsələdə deyilən əsasda) özünə heyz qəbul etməlidir. Əgər bu mümkün deyilsə, özünə münasib bildiyi sayı heyz olaraq .seçməlidir. Bu məsələlərin geniş açıqlanması ۴۸۱-ci məsələdə izah olunmuşdur

Məsələ ۵۰۹: Heyzdə adəti-ədədiyyəsi olmayan bir qadın, əgər doğumdan sonra bir ay və ya daha çox ardıcıl qan görərsə, onun ilk on günü nifas, ikinci on günü isə istihazədir. Ondan sonra gördüyü qana gəlincə, heyz olması mümkün olduğu kimi, istihazə də ola bilər. Heyzi təyin etmək üçün əvvəlki məsələdə açıqlanan göstərişə .əsasən əməl edilməlidir

## MƏSS–MEYYİT QÜSLÜ

Məsələ ۵۱۰: Bir şəxs ölmüş bir insanın soyumuş və qüsl edilməmiş bədəninə məss edərsə, yəni bədəninin bir yerini ona toxundurarsa, istər yuxuda olsun, istərsə ayıqlıqda, istər ixtiyari olsun, istərsə qeyri-ixtiyari, hətta əgər onun dırnaq və ya sümüyünün bir yeri meyyitin dırnaq və ya sümüyünə toxunarsa, məssi-meyyit (meyyitə toxunmaq) qüslü etməlidir. Amma ölmüş bir heyvana toxunarsa, qüsl etməsi .vacib deyildir

Məsələ ۵۱۱: Bədəni tamamilə soyumamış ölüyə məss etdikdə, hətta bədəninin .soyumuş hissələrinə məss etsə də, qüsl vacib deyildir

Məsələ ۵۱۲: Əgər öz tükünü meyyitin bədəninə toxundursa, yaxud öz bədənini .meyyitin tükünə və ya tükünü meyyitin tükünə toxundursa, qüsl vacib deyildir

Məsələ ۵۱۳: Uşaq ölü şəkildə dünyaya gəlsə ehtiyat-vacibə görə onun anası gərək məssi-meyyit qüslü etsin. Anası öldükdən sonra dünyaya gələn uşaq, baliğ olduqdan .sonra ehtiyat-vacibə görə məssi-meyyit qüslü etməlidir

Məsələ ۵۱۴: Əgər bir adam, üç qüslü tamamilə verilmiş meyyitə məss etsə, ona qüsl vacib deyil, amma əgər üçüncü qüsl tamam olmamışdan qabaq bədəninin bir yerini .məss etsə, o yerdə üçüncü qüsl tamam olmuş olsa da, gərək məss-meyyit qüslü etsin

Məsələ ۵۱۵: Əgər dəli və ya baliğ olmayan uşaq meyyitə toxunsa, o dəli ağıllandıqdan sonra və uşaq baliğ olandan sonra, gərək məss-meyyit qüslü etsin. Əgər uşaq .müməyyiz olsa, qüslü səhihdir

Məsələ ۵۱۶: Əgər diri bədəndən, yaxud qüslü verilməmiş ölü bədəndən bir hissə ayrılsa, ayrılmış hissəyə qüsl verilməmişdən qabaq, insan ona toxunsa, məss-meyyit qüslü lazım deyil. Əgər o

hissədə sümük olmuş olsa da hökm eynidir. Amma bir kəsin bədəni tikə-tikə olsa, bir .adam onların hamısnı, yaxud əksər hissəsini məss etsə, qüsl vacibdir

Məsələ ۵۱۷: Qüslü verilməmiş bir sümüyə toxunmaq, üçün istər ölüdən ayrılmış olsun, istərsə də canlı insandan, qüsl vacib olmaz. Həmçinin ölü və ya diri insandan ayrılan .dişə toxunmaq da eyni hökmü daşıyır

Məsələ ۵۱۸: Məss-meyyit qüslü eynilə cənabət qüslü kimi yerinə yetirilir və dəstəmaz .əvəzindən kifayət edir

Məsələ ۵۱۹: Əgər bir neçə meyyitə toxunsa, yaxud bir meyyitə neçə dəfə məss etsə, .bir qüsl kifayətdir

Məsələ ۵۲۰: Meyyitə toxunduqdan sonra qüsl etməyən şəxsin məsciddə dayanması, qadınla yaxınlıq etməsi və səcdəsi vacib olan ayələri oxumasının eybi yoxdur. Amma .namaz və bu kimi əməllər üçün qüsl etməlidir

## MÖHTƏZİRİN (CAN VERƏNİN) HÖKMLƏRİ

**Point**

Məsələ ۵۲۱: Mühtəziri, yəni can verməkdə olan bir mömini, istər kişi olsun, istərsə qadın, istər böyük olsun, istərsə kiçik, ehtiyata əsasən mümkün olduğu təqdirdə, .ayaqlarının altı qibləyə tərəf arxası üstə uzatmalıdırlar

Məsələ ۵۲۲: Meyyitin qüslü tamam olmayanadək onu əvvəlki məsələdə deyildiyi kimi, üzü qibləyə uzatmaq daha yaxşıdır. Amma qüslü tamam olduqdan sonra, ona namaz .qılınan zaman uzandırıldığı şəkildə uzatmaq daha yaxşıdır

Məsələ ۵۲۳: Ehtiyata əsasən mühtəziri üzü qibləyə çevirmək hər bir müsəlmana vacibdir. Belə ki, mühtəzirin özü razı olsa və qasir də olmasa, bu iş üçün onun vəlisindən icazə almaq lazım deyildir. Bundan digər hallarda onun vəlisindən icazə .almaq ehtiyata əsasən lazımdır

Məsələ ۵۲۴: Müstəhəbdir ki, can verən halda olan hər şəxsə, iki şəhadət kəlmələrini (kəlmeyi şəhadəti), on iki İmamın (əleyhis-səlam) adlarını və s. kimi haqq əqidələrini, elə təlqin etsinlər ki, başa düşsün. Həmçinin, müstəhəbdir ki, qeyd olunan əməlləri .öldüyü ana qədər təkrar etsinlər

:Məsələ ۵۲۵: Müstəhəbdir bu duanı can verən şəxsə elə təlqin etsinlər ki, başa düşsün

أَللَّهُمَّ اغْفِرْلِیَ الْکَثِیرَمِنْ مَعَاصِـیکَ وَاقْبَلْ مِنِّی الْیَسِـیرَ مِنْ طَاعَتِکَ یَا مَنْ یَقْبَلُ الْیَسِیرَ وَیَعْفُ عَنْ الْکَثِیرِ إِقْبَلْ مِنِّی الْیَسِیرَ وَاعْفُ عَنِّی الْکَثِیرَ إِنَّکَ أَنْتَ الْعَفُوُّ الْغَفُورُ أَللهُمَّ ارْحَمْنِی فَإِنَّکَ رَحِیم.

Əllahumməğfir liyəl-kəsirə min məasikə vəqbəl minnil-yəsirə min taətikə ya mən yəqbəlul-yəsir, və yə`fu ənil-kəsir, iqbəl minnil-yəsir və`fu ənnil-kəsir, innəkə əntəl-.əfuvvul-ğəfur. Əllahummərhəmni fəinnəkə rəhim

Məsələ ۵۲۶: Müstəhəbdir ki, çətin can verən insanı narahat olmadığı halda, namaz .qıldığı yerə aparsınlar

Məsələ ۵۲۷: Müstəhəbbdir ki, can verən şəxsin rahat olması üçün başı üstündə mübarək“Yasin”, “Saffat”, “Əhzab”, surələri, “Ayətəl-kürsi”, “Əraf” surəsinin ۵۴-cü ayəsi və “Bəqərə” surəsinin son üç ayəsini, eləcə də Qurandan mümkün olan digər ayələri .oxusunlar

Məsələ ۵۲۸: Can verən şəxsi tək qoymaq, onun qarnının üstünə ağır bir şey qoymaq, cənabətli, heyzli şəxslərin onun yanında olması, həmçinin onun yanında çox danışmaq, .ağlamaq, qadınları can verənin yanında tək qoymaq məkruhdur

## ÖLÜMDƏN SONRANIN HÖKMLƏRİ

Məsələ ۵۲۹: Ölümdən sonra müstəhəbdir ki, meyyitin ağzını, gözlərini, çənəsini bağlasınlar, əllərini və ayaqlarını uzatsınlar, onun üstünə parça çəksinlər. Əgər gecə ölübsə, öldüyü yerdə çıraq yandırsınlar və onu dəfn etmək üçün möminlərə xəbər versinlər. Onu dəfn etməkdə tələssinlər. Amma onun ölümünə yəqinlikləri olmasa, gərək gözləsinlər ki, məlum olsun. Əgər meyyit hamilə olsa və qarnındakı uşaq diri olsa, gərək dəfn işini o qədər təxirə salsınlar ki, onun böyrünü yarıb uşağı çölə .çıxartsınlar, sonra yarılan yeri tiksinlər

## MEYYİTİN QÜSL, KƏFƏN, NAMAZ VƏ DƏFNİNİN VACİBATI

Məsələ ۵۳۰: Müsəlmanın qüslü, hənutu, kəfəni, namaz və dəfni on iki imama e`tiqdı olmasa da, onun vəlisinə vacibdir. Vəli bu işləri özü görməli və ya başqa birini ona məmur etməlidir. Bu işləri bir şəxs vəlinin icazəsi ilə yerinə yetirsə, vəzifə vəlinin üstündən götürülər. Əgər dəfn və bu kimi işləri

vəlinin icazəsi olmadan yerinə yetirsələr, yenə də vəzifə vəlinin üzərindən götürülər, onları yenidən yerinə yetirmək lazım deyildir. Əgər meyyitin vəlisi olmasa, yaxud vəli onun işlərini yerinə yetirməkdən imtina etsə, digər mükəlləflərə vacibi-kifayidir ki, onun işlərini yerinə yetirsinlər. Əgər bəziləri yerinə yetirsələr, başqalarının boynundan götürülür. Əgər heç kəs yerinə yetirməsə, hamısı günah ediblər. Meyyitin vəlisi imtina .edən surətdə onun icazəsi şərt deyil

Məsələ ۵۳۱: Əgər bir şəxs meyyitin işləri ilə məşğul olsa, başqasına bu işlə məşğul olmaq vacib deyildir. Amma əgər o əməli yarımçıq qoysa, gərək başqaları tamam .etsinlər

Məsələ ۵۳۲: Əgər insan, başqa birisinin meyyitin işləri ilə məşğul olduğuna əmindirsə, meyyitin işləri ilə məşğul olması ona vacib deyildir. Amma əgər şəkk və ya guman .edərsə, gərək məşğul olsun

Məsələ ۵۳۳: Bir şəxs meyyitin qüsl, kəfən, namaz və ya dəfninin batil şəkildə yerinə yetirildiyini bilərsə, yenidən yerinə yetirməlidir. Amma əgər batil olduğunu guman .edərsə və ya düzgün olub-olmadığında şəkk edərsə, məşğul olması lazım deyildir

Məsələ ۵۳۴: Qadının vəlisi onun əridir. Bundan başqa hallarda isə, irsin təbəqələrində deyildiyi kimi, varis meyyitin vəlisidir, irs aparan kişilər, aralarındakı tərtibə əsasən, qadınlardan qabaqdırlar. Meyyitin atasının meyyitin oğlundan, meyyitin babasının onun qardaşından, meyyitlə atabir-anabir qardaş olanın yalnız ata və ana tərəfdən olan qardaşından, yalnız ata tərəfdən olan qardaşının ana tərəfdən olan qardaşından və əmisinin meyyitin dayısından irəli olması işkallıdır. Başqa sözlə, belə hallarda .ehtiyata əməl olunmalıdır. Əgər vəli bir neçə nəfər olsa, birinin icazəsi kifayətdir

Məsələ ۵۳۵: Həddi-büluğa çatmamış uşaq və dəli, meyyitin işlərini yerinə yetirməkdə vəli deyildir. Həmçinin şəxsən özü və ya bir nəfəri meyyitin işlərini görməyə təyin edə .bilməyən qaib bir şəxsin vilayət haqqı yoxdur

Məsələ ۵۳۶: Əgər bir şəxs “mən meyyitin vəlisiyəm” və ya “meyyitin vəlisi mənə,

yerinə yetirmək üçün izn vermişdir” və yaxud “meyyitin bütün işlərini tədarük görməydə mən onun vəsisiyəm” deyərsə, bu halda əgər ona xatircəmlik hasil olarsa, yaxud meyyit onun ixtiyarında olsa və yaxud da iki adil şəxs onun dediyi sözün .doğruluğuna şəhadət verərlərsə, onun sözü qəbul edilməlidir

Məsələ ۵۳۷: Əgər meyyit özünün qüsl, kəfən, dəfn və namazı üçün vəlisindən qeyrisini təyin edərsə, bu işləri yerinə yetirmənin vilayəti ona aiddir. Meyyitin bu işləri yerinə yetirməsinə vəsiyyət etdiyi şəxsin bu vəsiyyəti qəbul etməsi lazım deyildir. Amma əgər .qəbul edərsə, gərək ona əməl etsin

## MEYYİT QÜSLÜNÜN QAYDASI

:Məsələ ۵۳۸: Meyyitə üç qüsl vermək vacibdir

;Sidr ilə qarışmış su ilə .۱

;Kafur ilə qarışmış su ilə .۲

;Xalis su ilə .۳

Məsələ ۵۳۹: Sidr və kafur, gərək suyu müzaf edəcək qədər çox olmasin; habelə, .həddindən artıq az da olmamalıdır ki, “ona sidr və kafur qatılmayıb” deməsinlər

Məsələ ۵۴۰: Əgər lazım olan miqdarda sidr və kafur tapılmasa, ehtiyat-müstəhəb .budur ki, tapılan miqdarı suya töksünlər

Məsələ ۵۴۱: Ehram halında ölən bir şəxsə, kafurlu su ilə qüsl verilməz, onun əvəzində xalis su ilə qüsl verilməlidir. Amma onun ehramı təməttö-həcci ehramıdırsa, təvaf, namaz və səyi tamamlanmışsa, yaxud da qiran və ya ifrad həcci ehramında olub həlq .etmiş olursa, bu iki halda ona kafurlu su ilə qüsl verilməsi lazımdır

Məsələ ۵۴۲: Əgər sidr və kafur, yaxud bunlardan biri tapılmasa və ya onun istifadəsi caiz olmasa, məsələn: qəsbi olasa, gərək ehtiyata əsasən ona bir təyəmmüm verilsin, meyyitə

.hər biri ilə qüsl vermək mümkün deyilsə əvəzinə xalis su ilə qüsl verilsin

Məsələ ۵۴۳: Meyyitə qüsl verən aqil, müsəlman və ehtiyat-vacibə əsasən on iki imam şiəsi olmalıdır. Həmçinin qüsl məsələlərini də bilməlidir. Əgər müməyyiz uşaq qüslü səhih şəkildə yerinə yetirsə, kifayət edər. Həmçinin ١٢ imamçı olan şiə məzhəbli başqa məzhəbdə olan müsəlman meyyitə öz həmməzhəbi, məzhəbinin qaydası üzrə qüsl versə, təklif ١٢ imamçı mö`minin öhdəsindən götürülür. Amma əgər o, meyyitin vəlisi .olsa, təklif onun öhdəsindən götürülmür

Məsələ ۵۴۴: Meyyitə qüsl verən şəxsin qürbət qəsdi olmalıdır, qüslü Allah-taalanın .əmrini yerinə yetirmək məqsədilə verməsi kifayətdir

Məsələ ۵۴۵: Müsəlman uşağına qüsl vermək, hətta zinadan doğulmuş olsa belə, vacibdir. Kafirin və onun övladının qüsl, kəfən və dəfni vacib deyildir. Kafirin övladı müməyyiz olub İslamı izhar etsə, müsəlmandır. Uşaqlıqdan dəli olub, bu halda baliğ .olan şəxsin, ata-anası müsəlmandırsa gərək qüsl verilsin

Məsələ ۵۴۶: Siqt olan (düşən, salınan) uşaq, əgər dörd aylıq və ya daha çox olarsa, ona qüsl verilməlidir. Hətta əgər dörd aylıq olmasa belə, bədən quruluşu tamamlanmış olarsa, ehtiyata əsasən ona qüsl verilməlidir. Bu iki haldan başqa, sair hallarda .ehtiyat-vacibə əsasən, bir parçaya bükülərək, qüsl verilmədən dəfn edilməlidir

Məsələ ۵۴۷: Kişi naməhrəm qadına qüsl verə bilməz və həmçinin qadın da naməhrəm .kişiyə qüsl verə bilməz. Amma qadın öz ərinə, ər də öz arvadına qüsl verə bilər

Məsələ ۵۴۸: Kişi müməyyiz olmayan qız uşağına və qadın da müməyyiz olmayan oğlan .uşağına qüsl verə bilər

Məsələ ۵۴۹: Məhrəm olan şəxslər bir-birlərinə qüsl verə bilərlər. İstər ana, bacı kimi nəsəbi olsun, istərsə süd əmmək vasitəsilə və ya evlənmək yolu ilə ona məhrəm olsunlar. Qüslün (övrətdən başqa) libas altından verilməsi, yaxşı olmasına baxmayaraq, lazım deyil, amma ehtiyat-vacibə əsasən, kişi məhrəm olan qadına o halda qüsl verə bilər ki, ona qüsl verəcək

bir qadın tapılmasın və həmçinin (kişiyə qüsl verə biləcək kişi tapılmasa, məhrəm qadın qüsl verə bilər.)

Məsələ ۵۵۰: Əgər meyyit və ona qüsl verən hər ikisi kişi, yaxud hər ikisi qadın olsa, yaxşı olar ki, övrətdən başqa meyyitin başqa yerləri açıq olsun. Amma daha yaxşısı budur ki, libasın altından qüsl versinlər.

Məsələ ۵۵۱: Meyyitin övrətinə baxmaq ər və arvaddan başqasına haramdır, əgər ona qüsl verən adam baxsa, günah edib, lakin qüsl batil olmaz.

Məsələ ۵۵۲: Əgər meyyitin bədəninin bir yerində eyni-nəcis olsa, qüsl verməzdən əvvəl oranı paklamaq lazımdır. Meyyitin bütün bədəninin, qüsl verilməzdən əvvəl nəcasətdan pak olması daha yaxşıdır.

Məsələ ۵۵۳: Meyyit qüslü, cənabət qüslü kimidir. Ehtiyat-vacibə görə tərtibi qüsl vermək mümkün olduğu vaxta qədər, meyyitə irtimasi qüsl verilməsin. Tərtibi qüsldə sağ tərəfin, sol tərəfdən əvvəl yuyulması lazımdır.

Məsələ ۵۵۴: Heyz və ya cənabət halında ölən bir şəxsə, heyz və cənabət qüslü vermək lazım deyil, meyyit qüslü kifayətdir.

Məsələ ۵۵۵: Meyyitə qüsl vermək üçün muzd (əmək haqqı) almaq, ehtiyat-vacibə əsasən, haramdır. Əgər bir kəs muzd almaq üçün meyyitə qüsl versə, belə ki, bu iş qəsdi-qürbətə zidd olsa, o qüsl batildir. Amma qüsldən qabaq bəzi hazırlıq işləri üçün muzd almaq haram deyildir.

Məsələ ۵۵۶: Şəriət qaydalarına görə meyyit qüslündə cəbirə qüslü yoxdur. Əgər su tapılmasa və ya sudan istifadə etməyin maneəsi vardırsa, qüsl əvəzinə meyyitə bir təyəmmüm verməlidirlər. Amma ehtiyat-müstəhəb budur ki, üç təyəmmüm versinlər.

Məsələ ۵۵۷: Meyyitə təyəmmüm verən şəxs, öz əlini torpağa vurub, meyyitin üzünə və əllərinin arxasına çəkməlidir. Mümkün olduğu təqdirdə, ehtiyat-müstəhəbə əsasən, meyyitin öz əli ilə ona təyəmmüm verilməlidir.

## MEYİTİN KƏFƏNİNİN HÖKMLƏRİ

Məsələ ٥٥٨: Müsəlman meyyiti, gərək “fitə” (long), “köynək” və “sərtasər” adlanan üç .parça ilə kəfənə bükülsün

Məsələ ٥٥٩: Ehtiyat-vacibə əsasən fitə gərək göbəkdən dizə qədər bədəni örtsün. Daha yaxşı olar ki, sinədən ayağın üstünə qədər çatsın. Köynək gərək ehtiyat-vacibə əsasən çiyinin başından baldırın yarısına qədər bütün bədəni örtsün və daha yaxşısı budur ki, ayağın üstünə çatsın. Amma sərtasər gərək bütün bədəni örtsün. Uzunluğunun, bədənin baş və ayaq tərəfindən bağlanacaq qədər, eninin isə, bir tərəfi .o biri tərəfinin üstünə gələcək qədər olması ehtiyat-vacibə əsasəndir

Məsələ ٥٦٠: Əvvəlki məsələdə deyilən kəfənin vacib miqdarı meyyitin malının əslindən götürülür. Məlum və adi qaydada, eləcə də meyyitin şəninə uyğun kəfənin normal olan müstəhəb miqdarı da meyyitin malının əslindən götürülə bilər. Amma ehyiyat-müstəhəbə görə kəfənin vacib miqdarından artığını, baliğ olmayan varislərin payından .götürməsinlər

Məsələ ٥٦١: Bir şəxs kəfənin müstəhəbb olan miqdarını, onun malının üçdə birindən götürmələrini vəsiyyət edərsə və ya malının üçdə birini onun özünə xərcləməyi vəsiyyət etmiş olsa, lakin onun haraya sərf ediləcəyini təyin etməmiş olsa, yaxud onun sərf ediləcəyi yerin yalnız bir miqdarını təyin etmiş olsa, kəfənin müstəhəbb olan .miqdarını normadan artıq olsa belə, onun malının üçdə birindən götürə bilərlər

Məsələ ٥٦٢: Əgər meyyit, kəfəni malının üçdə birindən götürməsini vəsiyyət etməmişdirsə, bu halda kəfəni onun malının əslindən götürmək istəsələr, gərək ٥٦١-ci məsələdə söylənilən artığını, meyyitin şəninə layiq olmadığı, xalq arasında adət olmayan müstəhəb şeyləri onun malının əslindən götürməsinlər. Əgər normadan daha bahalı bir şeyi kəfən üçün götürsələr, onun artıq qiymətini malın əslindən verə bilməzlər, amma vərəsələrdən baliğ olanlar öz paylarından götürülməsinə izn .versələr, onların izn verdikləri miqdarda onların paylarından götürə bilər

Məsələ ۵۶۳: Qadının özünün malı olsa da, kəfəni ərin öhdəsindədir. Əgər qadına (təlaq əhkamında izah olunacağı kimi) rici təlaq versələr və iddəsi tamam olmazdan əvvəl ölərsə, əri onun kəfənini verməlidir. Əgər əri baliğ olmasa və ya dəli olarsa, ərinin vəlisi .qadının kəfənini onun malından verməlidir

Məsələ ۵۶۴: Sağlığında yaşayış xərcləri qohumlarına vacib olan şəxs, öləndən sonra .kəfəni, onlara vacib deyil

Məsələ ۵۶۵: Əgər meyyitin, kəfən hazırlamaq üçün malı olmasa, çılpaq dəfn edilməsi icazəli deyil; ehtiyata əsasən müsəlmanlara vacibdir ki, onu kəfənə büksünlər, onun .xərcini də zəkatdan hesablamaları caizdir

Məsələ ۵۶۶: Ehtiyat-vacibə əsasən, kəfən üçün istifadə olunan hər üç parça, meyyitin bədəni onun altından görünəcək qədər nazik olmamalıdır. Amma hər üçünü birləşdirdikdə, meyyitin bədəni onların altından görünməyəcək şəkildə olarsa, .kifayətdir

Məsələ ۵۶۷: Qəsbi şeylə kəfən etmək, başqa şey tapılmasa da icazəli deyil. Əgər meyyitin kəfəni qəsbi olsa və onun sahibi razı olmasa, dəfn etmiş olsalar da, gərək onu bədənindən çıxartsınlar. Bəzi hallar istisnadır onlar haqda geniş danışmaq bəhsdən .xaricdir

Məsələ ۵۶۸: Nəcis, xalis ipək parça və ehtiyat-vacibə əsasən qızıl ilə toxunmuş parça ilə .meyyiti kəfən etmək icazəli deyil, amma çarəsiz halda eybi yoxdur

Məsələ ۵۶۹: İxtiyar halında murdar olmuş heyvanın nəcis dərisi ilə kəfən etmək caiz deyil. Hətta murdar olmuş heyvanın pak dərisi ilə və həmçinin ehtiyat-vacibə əsasən əti haram olan heyvanın tük, yaxud yunundan hazırlanmış parça ilə ixtiyar halında icazəli deyil. Amma əgər kəfən, əti halal olan heyvanın dəri, yun ya tükündən olsa, eybi .yoxdur. Ehtiyat-müstəhəb budur ki, bu ikisi ilə də kəfən edilməsin

Məsələ ۵۷۰: Əgər meyyitin kəfəni öz nəcasəti və ya başqa bir nəcasətlə nəcis olarsa, belə ki, kəfən xarab olmasa, qəbrə qoyulduqdan sonra olsa belə, nəcis olan miqdarı

yuyulmalı və ya kəsilməlidir. Əgər onu yumaq və ya kəsmək mümkün deyilsə, .dəyişdirilməsi mümkün olduğu təqdirdə dəyişdirilməlidir

Məsələ ۵۷۱: Həcc, yaxud ümrə üçün ehram bağlayan şəxs ölsə, gərək başqaları kimi .kəfən olunsun, başını və üzünü örtməyin eybi yoxdur

Məsələ ۵۷۲: İnsanın sağ ikən, özünün kəfən, sidr və kafurunu hazırlaması .müstəhəbbdir

**HƏNUTUN HÖKMLƏRİ**

Məsələ ۵۷۳: Qüsldən sonra meyyitin hənut olunması vacibdir; yəni alnına, əllərinin içinə, dizlərinə və ayaq baş barmaqlarının ucuna, bir qədər onların üzərində qalacaq şəkildə, sürtməklə olmasa belə, kafur vurulmalıdır. Meyyitin burnunun ucuna da kafur sürtmək müstəhəbbdir. Gərək kafur təzə, pak, mubah (qəsbi olmayan) və əzilmiş .olsun. Əgər köhnə olduğuna görə iyi aradan getsə, kifayət deyildir

Məsələ ۵۷۴: Ehtiyat-müstəhəb budur ki, kafuru əvvəlcə meyyitin alnına sürtsünlər, .amma başqa yerlərdə tərtib şərt deyildir

Məsələ ۵۷۵: Daha yaxşı olar ki, kəfənə bükməmişdən əvvəl, meyyitə hənut vursunlar. .Amma kəfənə bükmə əsnasında və ondan sonra da vurmağın maneəsi yoxdur

Məsələ ۵۷۶: Həcc və ya ümrə üçün ehram bağlayan şəxs ölərsə, onu hənut etmək .icazəli deyildir. ۵۴۲-ci məsələdə izah olunan iki hall istisnadır

Məsələ ۵۷۷: Etikaf bağlayan və əri ölüb, iddəsi tamam olmayan qadın özünü .ətirləməsinin haram olmasına baxmayaraq, ölərsə, ona hənut vurmaq vacibdir

Məsələ ۵۷۸: Ehtiyat-müstəhəb budur ki, meyyitə müşk, ənbər, ud və sair xoş ətirlər .vurmasınlar. Bunları kafurla da qarışdırmasınlar

Məsələ ۵۷۹: Müstəhəbdir ki, Həzrət Seyyidüş-şühədanın (ələyhis-səlam) türbətindən bir qədər kafura qarışdırsınlar. Amma gərək o kafurdan ehtiramsızlıq olan bədən üzvlərinə

vurmasınlar. Həmçinin, gərək türbət o qədər çox olmasin ki, kafurla qarışanda daha .ona kafur deyilməsin

Məsələ ۵۸۰: Əgər kafur tapılmazsa və ya təkcə qüsl miqdarında olarsa, hənut lazım deyil əgər qüslə istifadə olunan miqdardan çox olarsa, amma yeddi üzvün hənutuna çatmasa, ehtiyat-müstəhəbbə əsasən, gərək əvvəlcə alnına vursunlar. Əgər çox .qalarsa, başqa üzvlərə vursunlar

Məsələ ۵۸۱: İki ədəd yaş və təzə çubuğu meyyitlə birlikdə qəbrə qoymaq .müstəhəbbdir

**MEYYİT NAMAZININ HÖKMLƏRİ**

Məsələ ۵۸۲: Müsəlman və ya İslam hökmünə tabe olan altı yaşlı uşağın meyyitinə, .namaz qılmaq vacibdir

Məsələ ۵۸۳: Ehtiyat-vacibə əsasən altı yaşı tamam olmayan amma namazın nə olduğunu başa düşən uşağa namaz qılmaq lazımdır. Əgər namazın nə olduğunu bilmirsə, rəcaən ona namaz qılmağın maneəsi yoxdur. Ancaq dünyaya ölü gəlmiş bir .uşağa namaz qılmaq müstəhəbb deyildir

Məsələ ۵۸۴: Meyyit namazı qüsl, hənut və kəfəndən sonra qılınmalıdır. Əgər bunlardan qabaq və ya bu əməlləri yerinə yetirərkən qılınsa məsələni bilməmək və ya unutqanlıq .üzündən olsa belə, kifayət deyildir

Məsələ ۵۸۵: Meyyit namazı qılmaq istəyən şəxsin dəstəmazlı, qüsllü, yaxud təyəmmümlü olması və bədəninin və ya libasının pak olması lazım deyil. Əgər onun libası qəsbi olsa da, eybi yoxdur. Amma digər namazlarda lazım olan bütün əməllərə .riayət etməsi daha yaxşıdır

Məsələ ۵۸۶: Meyyitə namaz qılan şəxs, gərək üzü qibləyə dayansın. Həmçinin vacibdir ki, meyyiti onun qarşısında arxası üstə elə uzatsınlar ki, başı namaz qılanın sağ .tərəfində, ayağı isə sol tərəfində olsun

Məsələ ۵۸۷: Namaz qılanın məkanı meyyitin yerindən alçaq və ya uca olmamalıdır. Amma azacıq alçaq və ya uca olmağının

.eybi yoxdur. Ehtiyat-müstəhəb budur ki, namaz qılanın yeri qəsbi olmasın

Məsələ ۵۸۸: Namaz qılan şəxs gərək meyyitdən uzaq olmasın. Amma meyyit namazını camaatla qılan şəxs, meyyitdən uzaq olsa və camaat namazının cərgələri bir-birinə .bitişik olsa, eybi yoxdur

Məsələ ۵۸۹: Meyyit namazı qılan şəxs, gərək meyyitlə üzbəüz dursun. Amma namaz .camaatla qılınsa meyyitin müqabilində durmayan şəxslərin namazının eybi yoxdur

Məsələ ۵۹۰: Meyyitlə namaz qılan şəxsin arasında gərək pərdə, divar və s. kimi şeylər .olmasın. Amma meyyit, tabut və bu kimi şeylərin içində olsa, eybi yoxdur

Məsələ ۵۹۱: Meyyit namazı qılınan vaxt, gərək meyyitin övrəti örtülsün. Əgər onu kəfənləmək mümkün olmazsa, gərək onun övrətini hətta taxta, kərpic və s. kimi .şeylərlə də olsa örtsünlər

Məsələ ۵۹۲: Meyyit namazını, gərək ayaq üstə və qürbət niyyəti ilə qılsın və niyyətdə meyyit müəyyənləşdirilməlidir; məsələn: "bu meyyitə namaz qılıram, qürbətən iləllah" deyə niyyət etsin. Ehtiyat-vacib budur ki, gündəlik namazlarda şərt sayılan bədənin .qərarlaşmasına riayət olunsun

Məsələ ۵۹۳: Əgər meyyitə ayaq üstə namaz qıla bilən bir şəxs tapılmazsa, oturan halda .namaz qılan şəxs ona namaz qıla bilər

Məsələ ۵۹۴: Əgər meyyit, müəyyən bir şəxsin ona namaz qılmasını vəsiyyət etmişdirsə, .o şəxsin meyyitin vəlisindən icazə almasının yaxşı olmasına baxmayaraq, lazım deyil

Məsələ ۵۹۵: Bəzi fəqihlərin nəzərinə görə meyyitə bir neçə dəfə namaz qılmaq məkruhdur, amma bu mətləb sübut olmayıb. Amma əgər meyyit əhli-elm və təqvalı .olsa, məkruh deyil

Məsələ ۵۹۶: Əgər meyyit, qəsdən və ya unudularaq, yaxud da başqa bir səbəbdən namaz qılınmadan dəfn edilərsə, yaxud dəfn edildikdən sonra onun üçün qılınan namazın batil olduğu məlum olarsa, ona namaz qılmaq üçün qəbrini açmaq icazəli

deyildir. Amma cəsədi çürüyüb dağılancaya qədər, meyyit namazı üçün söylənən .şərtlərlə, rəca qəsdi ilə qəbrinə namaz qılmağın eybi yoxdur

## MEYYİT NAMAZININ QAYDASI

Məsələ ٥٩٧: Meyyit namazının beş təkbiri var: Əgər namaz qılan şəxs beş təkbiri bu :tərtiblə desə kifayətdir. Niyyətdən və birinci təkbirdən sonra desin

أَشهَدُ أَن لاَإِلَهَ إِلاَّاللهُ وَأَنَّ مُحَمَّداً رَسُولُ اللهِ

.Əşhədu ənla ilahə illəllah və ənnə Muhəmmədən Rəsulullah

:İkinci təkbirdən sonra desin

أَللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ

.Əllahummə səlli əla Muhəmmədin və Ali-Muhəmməd

:Üçüncü təkbirdən sonra desin

أَللَّهُمَّ اغْفِرْلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ

.Əllahumməğfir lil-mu`minin vəl-mu`minat

:Dördüncü təkbirdən sonra əgər meyyit kişidirsə, desin

أَللَّهُمَّ اغْفِرْ لِهَذَا الْمَيِّتْ

.Əllahumməğfir li hazəl-məyyit

:Əgər qadındırsa,dördüncü təkbirdən sonra desin

أَللَّهُمَّ اغْفِرْ لِهَذِهِ الْمَيِّتَهِ

.Əllahumməğfir li hazihil-məyyit

Sonra beşinci təkbiri desin, bununla da namaz bitir. Daha yaxşısı budur ki, birinci :təkbirdən sonra desin

أَشْهَدُ أَنْ لَاإِلَهَ إِلَّااللهُ وَحْدَهُ لَاشَرِيکَ لَهُ وَ أَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبدُهُ وَرَسُولُهُ أَرْسَلَهُ بِالْحَقِّ بَشِيرًا وَنَذِيرًا بَيْنَ يَدَیِ السَّاعَهِ

Əşhədu ən la ilahə illəllah, vəhdəhu la şərikə ləh və əşhədu ənnə Muhəmmədən» .«əbduhu və rəsuluh, ərsələhu bil-həqqi bəşirən və nəzirən bəynə yədəyis-sa`ə

:İkinci təkbirdən sonra desin

أَللَّهُمَّ صَلِّ عَلَی مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَبَارِکْ عَلَی مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَارْحَمْ مُحَمَّدًا وَآلَ مُحَمَّدٍ کَأَفْضَلِ مَاصَلَّيْتَ وَبَارَکْتَ وَتَرَحَّمْتَ عَلَی إِبْرَاهِيمَ وَآلِ إِبْراهِيمَ إِنَّکَ حَمِيدٌ مَجِيدٌ وَصَلِّ عَلَی جَمِيعِ الْأَنْبِيَاءِ وَالْمُرْسَلِينَ وَ الشُّهَدَاءِ وَالصِّدِّيقِينَ وَجَمِيعِ عِبَادِاللهِ الصَّالِحِينَ.

Əllahummə səlli əla Muhəmmədin və ali Muhəmməd, və barik əla Muhəmmədin və ali» Muhəmməd, vərhəm Muhəm-mədən və alə Muhəmməd kəəfzəli ma səlləytə və barəktə və tərəhhəmtə əla İbrahimə və ali İbrahim, innəkə həmidun məcid, və səlli əla .«cəmi`il-ənbiya`i vəl-mursəlin vəşşu-hədai vəssiddiqin və cəmii ibadillahissalihin

:Üçüncü təkbirdən sonra desin

أَللَّهُمَّ اغْفِرْ لِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَالْمُسْلِمِينَ وَالْمُسْلِمَاتِ الأَحْيَاءِ مِنْهُمْ وَالْأَمْوَاتِ تَابِعْ بَيْنَنَا وَبَيْنَهُمْ بِاالْخَيْرَاتِ إِنَّکَ مُجِيبُ الدَّعَوَاتِ إِنَّکَ عَلَی کُلِّ شَیءٍ قَدِيرٍ.

Əllahumməğfir lil-mu`mininə vəl-mu`minat vəl-musliminə vəl-muslimat əl-əhyai» minhum vəl-əmvat tabi` bəynəna və bəynəhum bil-xəyrat innəkə mucibuddə`əvat, .«innəkə əla kulli şəyin qədir

:Dördüncü təkbirdən sonra meyyit kişidirsə desin

أَللَّهُمَّ إِنَّ هَذَا عَبْدُكَ وَابْنُ عَبْدِكَ وَابْنُ أَمَتِكَ نَزَلَ بِكَ وَأَنْتَ خَيْرُ مَنْزُولٍ بِهِ ، أَللَّهُمَّ إِنَّا لاَ نَعْلَمُ مِنْهُ إِلَّا خَيْرًا وَأَنْتَ أَعْلَمُ بِهِ مِنَّا، أَللَّهُمَّ إِنْ كَانَ مُحْسِنًا فَزِدْ فِى إِحْسَانِهِ وَ إِنْ كَانَ مُسِيئًا فَتَجَاوَزْ عَنْهُ وَاغْفِرْ لَهُ، أَللَّهُمَّ اجْعَلْهُ عِنْدَكَ فِى أَعْلَى عِلِّيِّينَ وَاخْلُفْ عَلَى أَهْلِهِ فِى الْغَابِرِينَ وَارْحَمْهُ بِرَحْمَتِكَ يَاأَرْحَمَ الرَّاحِمِينَ.

Əllahummə innə haza əbdukə vəbnu əbdikə vəbnu əmətikə nəzələ bikə və əntə xəyru» mənzulin bih, əllahummə inna la nə`ləmu minhu illa xəyrən və əntə ə`ləmu bihi minna, əllahummə in kanə muhsinən fəzid fi ihsanihi və in kanə musi`ən fətəcavəz ənhu vəğfir ləhu əllahumməc`əlhu indəkə fi ə`la illiyyin vəxluf əla əhlihi fil-ğabirin .«vərhəmhu bi rəhmətikə ya ərhəmər-rahimin

:Sonra beşinci təkbiri desin

:Əgər meyyit qadındırsa dördüncü təkbirdən sonra desin

أَللَّهُمَّ إِنَّ هَذِهِ أَمَتُكَ وَابْنَتُ عَبْدِكَ وَابْنَتُ أَمَتِكَ نَزَلَتْ بِكَ وَأَنْتَ خَيْرُ مَنْزُولٍ بِهِ ، أَللَّهُمَّ إِنَّا لاَ نَعْلَمُ مِنْهَا إِلَّا خَيْرًا وَأَنْتَ أَعْلَمُ بِهَا مِنَّا، أَللَّهُمَّ إِنْ كَانَتْ مُحْسِنَةً فَزِدْ فِى إِحْسَانِهَا وَإِنْ كَانَتْ مُسِيئَةً فَتَجَاوَزْ عَنْهَا وَاغْفِرْلَهَا، أَللَّهُمَّ اجْعَلْهَا عِنْدَكَ فِى أَعْلَى عِلِّيِّينَ وَاخْلُفْ عَلَى أَهْلِهَا فِى الْغَابِرِينَ وَارْحَمْهَا بِرَحْمَتِكَ يَا أَرْحَمَ الرَّاحِمِينَ.

Əllahummə innə hazihi əmətukə vəbnətu əbdikə vəbnətu əmətikə nəzələt bikə və» əntə xəyru mənzulin bih, əllahummə inna la nə`ləmu minha illa xəyrən, və əntə ə`ləmu biha minna, əllahummə in kanət muhsinətən fəzid fi ihsaniha, və in kanət musiə`tən fətəcavəz ənha, vəğfir ləha, əllahumməc`əlha indəkə fi ə`la illiyyin vəxluf əla əhliha fil-ğabirin, vərhəmha birəhmətikə ya ərhə-mərrahimin» deməsi daha .yaxşıdır

.Sonra beşinci təkbiri desin

Məsələ ۵۹۸: Meyyit namazının təkbirləri və duaları elə ardıcıl oxunmalıdır ki, gərək .namaz, öz surətindən çıxmasın

Məsələ ۵۹۹: Meyyitin namazını camaat ilə qılan şəxs (məmum) gərək təkbirləri və .duaları oxusun

## MEYYİT NAMAZININ MÜSTƏHƏBATI

:Məsələ ۶۰۰: Bir neçə şey meyyit namazında müstəhəbdir

Meyyit namazı qılan şəxsin dəstəmazlı, qüsllü və ya təyəmmümlü olması; Amma . ۱ ehtiyata əsasən, dəstəmaz və ya qüsl alması mümkün olmadığı təqdirdə yaxud dəstəmaz aldığı və ya qüsl etdiyi təqdirdə, meyyit namazına çatmamasından .qorxarsa, təyəmmüm etməlidir

Əgər meyyit kişidirsə, camaata imamlıq edən, yaxud ona namazı təklikdə qılan şəxs, .۲ ;cənazənin orta hissəsinin; və əgər meyyit qadındırsa, sinəsinin müqabilində dursun

.Ayaqyalın namaz qılması .۳

.Hər təkbirdə əllərini yuxarı qaldırması .۴

Meyyitlə onun arasındakı məsafənin, külək libasını hərəkət etdirirsə, cənazəyə . ۵ ;dəyəcək miqdarda az olması

;Meyyit namazının camaatla qılınması .۶

İmam-camaat duaları və təkbirləri ucadan oxusun, onunla namaz qılanlar isə . ۷ .alçaqdan oxusunlar

Camaatla qılınan meyyit namazında məmumun, bir nəfər olsa belə, imamın . ۸ ;arxasında durması

;Namaz qılanın meyyiti və möminləri çox dua etməsi .۹

.Camaat namazında, namazdan qabaq üç dəfə «Əssalat» deməsi .۱۰

Meyyit namazını, camaatın meyyit namazı qılmaq üçün daha çox getdikləri yerdə .۱۱
;qılmaları

Meyyit namazını camaatla qılmaq istəyən heyzli qadının, tək dayanması və namaz .۱۲
;qılanların sıralarına qatılmaması

Məsələ ۶۰۱: Məscidlərdə meyyit namazı qılmaq məkruhdur, amma Məscidül-həramda
.məkruh deyildir

## DƏFNİN HÖKMLƏRİ

Məsələ ۶۰۲: Vacibdir ki, meyyit elə dəfn edilsin ki, onun iyi çölə gəlməsin və yırtıcı heyvanlar onun bədənini çölə çıxara bilməsin. Amma yırtıcı heyvanların onun bədənini çıxarmasından qorxu yaransa, gərək qəbri kərpic və s. kimi şeylərlə möhkəmlətsinlər.

Məsələ ۶۰۳: Əgər meyyitin dəfni yerdə mümkün olmasa, dəfnin yerinə onu binada və ya tabutda da qoya bilərlər.

Məsələ ۶۰۴: Gərək meyyiti qəbirdə sağ çiyni üstə elə uzatsinlar ki, bədəninin qabağı üzü qibləyə olsun.

Məsələ ۶۰۵: Əgər bir şəxs gəmidə ölsə, bu halda cəsədi çürüməzsə və gəmidə qalmasının maneəsi olmazsa, gərək gözləsinlər ki, gəmi quruya çatsın və onu torpaqda dəfn etsinlər. Əks halda gərək, gəmidə qüsl verib, hənut-kəfən etməli, namaz qıldıqdan sonra ağır bir şeyi ayağına bağlayıb dəryaya buraxmalı, yaxud onu böyük bir xumrəyə qoyub ağzını bağlamalı, dəryaya atmalıdırlar. Mümkün olsa, gərək elə yerdə atsınlar ki, dərhal heyvanlara yem olmasın.

Məsələ ۶۰۶: Əgər düşmən, qəbri açıb meyyiti çıxaracağından və sonra qulağını, burnunu və ya başqa üzvlərini kəsəcəyindən qorxsalar, onda mümkün olan surətdə, gərək əvvəlki məsələdə deyildiyi qaydada, onu dəryaya atsınlar.

Məsələ ۶۰۷: Meyyitin dəryaya atılmasının və ya qəbrinin möhkəmləndirilməsinin xərcləri lazım olan surətdə meyyitin malının əslindən götürülə bilər.

Məsələ ۶۰۸: Əgər kafir bir qadın ölərsə və bətnindəki uşaq da ölmüş olarsa, əgər uşağın atası müsəlmandırsa, uşağın üzü qibləyə olması üçün, qadın qəbirdə sol tərəfi üstə, arxası qibləyə olacaq şəkildə, uzandırılmalıdır. Həmçinin, ehtiyat-müstəhəb budur ki, onun bətnindəki uşağın bədəninə ruh daxil olmadığı təqdirdə də, eyni hökmə əməl olunmalıdır.

Məsələ ۶۰۹: Müsəlmanın kafir, kafirin də müsəlman qəbiristanlığında dəfn edilməsi caiz

Məsələ ۶۱۰: Müsəlmanı, ehtiramsızlıq olacağı yerlərdə; məsələn: toz-torpaq və zibil .tökülən yerlərdə dəfn etmək caiz deyildir

Məsələ ۶۱۱: Meyyiti qəsb olan yerdə və məscid kimi meyyitin dəfnindən başqa bir şey üçün vəqf olan yerdə vəqfə zərər yetirəcəyi, yaxud hansı məqsədlə vəqf olunubsa, həmin məqsədə maneçilik törətdiyi surətdə dəfn etmək icazəli deyildir. Həmçinin .ehiyat-vacibə görə, zərər və ya maneçilik törətməsə də, hökm eynidir

Məsələ ۶۱۲: Başqa ölünün qəbrində meyyiti dəfn etmək üçün açmaq icazəli deyil, .amma qəbir köhnəlib və birinci meyyit tamamilə aradan gedibsə, caizdir

Məsələ ۶۱۳: Meyyitdən ayrılan şeylər, hətta tük, dırnaq, diş kimi olsa da belə, gərək onunla dəfn olunsun. Əgər meyyitdən ayrılan üzv meyyitin dəfn edilməsindən sonra tapılarsa, o üzv meyyitin dırnaq, tük və ya dişi olsa belə, ehtiyat-lazıma əsasən başqa bir yerdə dəfn edilməlidir. İnsanın sağlığında ondan ayrılan dırnağı və dişi yerə .basdırmaq müstəhəbdir

Məsələ ۶۱۴: Əgər bir şəxs quyuya düşüb ölsə və onu çıxarmaq mümkün olmasa, gərək .quyunun ağzını bağlayıb o quyu onun üçün qəbir edilsin

Məsələ ۶۱۵: Əgər uşaq ananın bətnində ölsə və onun ananın bətnində qalması ana üçün təhlükəli olsa, gərək ən asan yol ilə xaricə çıxarsınlar. Belə ki, onu tikə-tikə etməkdə çarəsiz qalsalar, eybi yoxdur. Amma əgər əri bacarırsa, gərək ərinin vasitəsilə onu çıxarsınlar. Əgər mümkün deyildirsə, bacaran bir qadın onu çıxarmalıdır. Qadın bu işi yaxşı bacran adama, naməhrəm olsa belə, özünə daha münasib olan .adama müraciət edə bilər

Məsələ ۶۱۶: Əgər qadın ölsə və uşaq onun bətnində diri olsa, uşağın az müddət diri qalacağına ümid olsa da belə, gərək bədənin, uşağın salamatçılığı üçün daha uyğun olan qismini yarıb, uşağı çıxarmalı və yenidən oranı tikməlidirlər. Amma bu işlə uşağın .ölməsinə yəqin etsələr və ya xatircəm olsalar, icazəli deyil

## DƏFNİN MÜSTƏHƏBATI

Məsələ ۶۱۷: Müstəhəbdir ki, qəbri orta boylu insanın boyu ölçüsündə qazsınlar və meyyiti yaxın qəbiristanlıqda dəfn etsinlər. Əgər uzaq qəbiristanlıqda yaxşı adamlar dəfn olunmuş olsa ya camaat əhli-qübura fatihə verməkdən ötrü oraya çox getsələr, meyyiti uzaq qəbiristanda da dəfn etmək olar. Müstəhəbdir ki, cənazəni qəbrə bir neçə zira qalmış yerə qoyub üç dəfə az-az qəbrə yaxınlaşdırsınlar və hər dəfə də cənazəni yerə qoyub-götürsünlər dördüncü dəfədə qəbrə qoysunlar. Əgər meyyit kişidirsə, üçüncü dəfədə başı qəbrin aşağı tərəfində olacaq şəkildə yerə qoyub, dördüncü dəfədə onu baş tərəfindən qəbrə endirsinlər. Əgər qadındırsa, üçüncü dəfədə qəbrin qiblə tərəfində yerə qoyub yandan qəbrə daxil etsinlər və qəbrə qoyan vaxt qəbrin üzərinə bir parça tutsunlar. Həmçinin meyyiti tabutdan aramla götürüb, qəbirə qoymaları, göstəriş verilən duaları dəfndən qabaq və dəfn arasında oxumaları, meyyiti qəbrə qoyduqdan sonra kəfənin bağlarını açmaları, meyyitin üzünü torpağın üzərinə qoymaları, başının altına torpaqdan bir yastıq düzəltmələri, arxası üstə aşmaması üçün, meyyitin arxasına kərpic və ya kəsək qoymaları, qəbri örtməzdən əvvəl sağ əlini sağ çiyninə vurub, sol əllə də meyyitin sol çiynindən sıxaraq, ağzını meyyitin qulağına yaxınlaşdırıb, onu şiddətlə hərəkət etdirərək belə demələri də :müstəhəbbdir

إِسْمَعْ إِفْهَمْ يَافُلَانَ ابْنَ فُلَان

”İsmə ifhəm ya Fulanəbnə fulan“

Fulan” kəlməsinin yerinə meyyitin adını və atasının adını desinlər; məsələn: əgər“ :meyyitin adı Məhəmməd, atasının adı Əli olarsa, üç dəfə desinlər

إِسْمَعْ إِفْهَمْ يَا مُحَمَّدَ بْنَ عِلِيّ

"İsmə ifhəm, ya Məhəmmədəbnə Əli"

:Ondan sonra desinlər

هَلْ أَنْتَ عَلَى الْعَهْدِ الَّذِى فَارَقْتَنَا عَلَيْهِ مِنْ شَهَادَتِ أَنْ لَا إِلَهَ إِلَّااللَّهُ وَحْدَهُ لَا شَرِيكَ لَهُ وَأَنَّ مُحَمَّدًا صَلَّى اللَّهُ عَلَيْهِ وَآلِهِ عَبْدُهُ وَرَسُولُهُ وَسَيِّدُ النَّبِيِّينَ وَخَاتَمُ الْمُرْسَلِنَ وَأَنَّ عَلِيًّا أَمِيرُ الْمُؤمِنِينَ وَسَيِّدُ الْوَصِيِّينَ وَإِمَامٌ إِفْتَرَضَ اللهُ طَاعَتَهُ عَلَى الْعَالَمِينَ وَأَنَّ الْحَسَنَ وَالْحُسَيْنَ وَعَلِيَّ بْنَ الْحُسَيْنِ وَمُحَمَّدَ بْنَ عَلِيٍّ وَجَعْفَرَبْنَ مُحَمَّدٍ وَمُوسَى بْنَ جَعْفَرٍ وَعَلِيَّ بْنَ مُوسَى وَمُحَمَّدَ بْنَ عَلِيٍّ وَعَلِيَّ بْنَ مُحَمَّدٍ وَالْحَسَنَ بْنَ عَلِيٍّ وَالْقَائِمَ الْحُجَّهَ الْمَهْدِىَّ صَلَوَاتُ اللهِ عَلَيْهِمْ أَئِمَّهُ الْمُؤْمِنِينَ وَحُجَجُ اللهِ عَلَى الْخَلْقِ أَجْمَعِينَ وَأَئِمَّتُكَ أَئِمَّهُ هُدًى بِكَ أَبْرَارٌ يَا فُلانَ بْنَ فُلان.

«Həl əntə ələl-əhdilləzi, farəqtəna ələyhi min şəhadəti ən la ilahə illəllahu vəhdəhu la şərikə ləh, və ənnə Muhəmmədən səlləllahu ələyhi alihi əbduhu və rəsuluh və səyyidun-nəbiyyinə və xatəmul-mursəlinə, və ənnə Əliyyən əmirul-mu`mininə və səyyidul-vəsiyyinə və imamun iftərəzəllahu taətəhu ələl aləmin, və ənnəl Həsənə vəl-Husəynə və Əliyyəbnəl-Husəyni və Muhəmmədəbnə Əliyyin və Cə`fərəbnə Muhəmmədin və Musəbnə Cə`fərin və Əliyyəbnə Musa və Muhəmmədəbnə Əliyyin və Əliyyəbnə Muhəmmədin vəl Həsənəbnə Əliyyin vəl Qaiməl huccətəl Məhdi səlavatullahi ələyhim ə`immətul mu`mininə və hucəcullahi ələl-xəlqi əcməin və ə`immətukə ə`immətu hudən bikə əbrar, ya fulanəbnə fulan».

"Fulan ibni fulan" kəlməsinin yerinə meyyitin adını və atasının adını deyib sonra desinlər:

إِذَا أَتَاكَ الْمَلَكَانِ الْمُقَرَّبَانِ رَسُولَيْنِ مِنْ عِنْدِاللهِ تَبَارَكَ وَتَعَالَى وَسَأَلَاكَ عَنْ رَبِّكَ وَعَنْ نَبِيِّكَ وَعَنْ دِينِكَ وَعَنْ كِتَابِكَ وَعَنْ قِبْلَتِكَ وَعَنْ أَئِمَّتِكَ فَلَا تَخَفْ وَلَا تَحْزَنْ وَقُلْ فِى جَوَابِهِمَا اللهُ رَبِّى وَمُحَمَّدٌ صَلَّى اللهُ عَلَيهِ وَآلِهِ وَ سَلَّم نَبِيٍّ وَالْإِسْلامُ دِينِى وَ

الْقُرْآنُ كِتَابِى وَالْكَعْبَهُ قِبْلَتى وَأَمِيرُ الْمُؤْمِنِينَ عَلِىُّ بْنُ أَبِى طَالِبٍ إِمَامِى وَالْحَسَنُ بْنُ عَلِىٍّ الْمُجْتَبى إِمَامِى وَالْحُسَيْنُ بْنُ عَلِىٍّ الشَّهِيدُ بِكَرْبَلاَ إِمَامِى وَعَلِىٌّ زَيْنُ الْعَابِدِينَ إِمَامِى وَمُحَمَّدٌ الْبَاقِرُ إِمَامِى وَجَعْفَرٌ الصَّادِقُ إِمَامِى وَمُوسَى الْكَاظِمُ إِمَامِى وَعَلِىٌّ الرِّضَا إِمَامِى وَمُحَمَّدٌ الْجَوَادُ إِمَامِى وَعَلِىٌّ الْهَادِى إِمَامِى وَالْحَسَنُ الْعَسْكَرِىُّ إِمَامِى وَالْحُجَّهُ الْمُنْتَظَرُ إِمَامِى هَؤُلاَءِ صَلَوَاتُ اللهِ عَلَيْهِمْ أَئِمَّتِى وَسَادَتِى وَقَادَتِى وَشُفَعَائِى بِهِمْ أَتَوَلَّى وَمِنْ أَعْدَائِهِمْ أَتَبَرَّءُ فِى الدُّنْيَا وَالْآخِرَهِ ثُمَّ إِعْلَمْ يَا فُلاَنَ بنَ فُلاَن.

İza ətakəl mələkanil muqərrəbani rəsuləyni min indillahi təbarəkə və tə`ala və» sə`ələkə ən rəbbikə və ən nəbiyyikə və ən dinikə və ən kitabikə və ən qiblətikə və ən ə`immətikə fəla təxəf və la təhzən və qul fi cəvabihima Əllahu rəbbi və Muhəmmədun səlləllahu ələyhi və alihi nəbiyyi. Vəl islamu dini vəl Qur`anu kitabi. Vəl kə`bətu qibləti və Əmirul-mu`mininə Əliyyubnu Əbi Talibin imami vəl Həsənubnu Əliyyin əl muctəba imami vəl-Husəynubnu Əliyyin əş-şəhidu bi Kərbəla imami və Əliyyun Zəynul-abidinə imami və Muhəmmədun Baqiru imami və Cə`fərunissadiqu imami və Musəl Kazimu imami və Əliyyur-riza imami və Muhəmmədul Cəvadu imami və Əliyyul Hadi imami vəl Həsənul Əskəri imami vəl Huccətul muntəzəru imami haulai sələvatullahi ələyhim ə`imməti və sadəti və qadəti və şufə`ai bihim ətəvəlla və min ə`daihim ə`təbərrə`u .«fiddunya vəl axirə, summə i`ləm ya fulanəbnə fulanin

:Fulanəbnə fulan” kəlmələrinin yerinə meyyitin və atasının adını deyib sonra desinlər“

إِنَّ اللهَ تَبَارَكَ وَتَعَالَى نِعْمَ الرَّبُّ وَأَنَّ مُحَمَّداً صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَ سَلَّم نِعْمَ الرَّسُولُ وَأَنَّ عَلِىَّ بْنَ أَبِى طَالِبٍ وَأَوْلاَدَهُ الْمَعْصُومِينَ الْأَئِمَّهَ الْإِثْنَى عَشَرَ نِعْمَ الْأَئِمَّهُ وَأَنَّ مَاجَاءَ بِهِ مُحَمَّدٌ صَلَّى اللهُ عَلَيهِ وَ آلِهِ وَ سَلَّم حَقٌّ وَأَنَّ الْمَوْتَ حَقٌّ وَسُؤالَ مُنْكَرٍ وَنَكِيرٍ فِى الْقَبْرِ حَقٌّ وَالْبَعْثَ حَقٌّ وَالنُّشُورَ حَقٌّ وَالصِّرَاطَ حَقٌّ وَالْمِيزَانَ حَقٌّ وَتَطَايُرَ

الْکُتُبِ حَقٌّ وَأَنَّ الْجَنَّهَ حَقٌّ وَالنَّارَ حَقٌّ وَأَنَّ السَّاعَهَ آتِیَهٌ لاَرَیْبَ فِیهَا وَأَنَّ اللهَ یَبْعَثُ مَنْ فِی الْقُبُورِ.

İnnəllahə təbarəkə və tə`ala ni`mərrəb, və ənnə Muhəmmədən səlləllahu ələyhi və» alihi ni`mərrəsul, və ənnə Əliyyəbnə əbi Talibin və ovladəhul mə`suminəl-ə`immətəl isna əşərə ni`məl ə`immə və ənnə ma ca`ə bihi Muhəmmədun səlləllahu ələyhi və alihi həqqun və ənnəl movtə həqqun. Və sualə munkərin və nəkirin fil-qəbri həqqun Vəl bə`sə həqqun vənnuşurə həqqun vəssiratə həqqun, vəlmizanə həqqun. Və tətayurəl kutubi həqqun, və ənnəl cənnətə həqqun, vənnarə həqqun, və ənnassaətə .«atiyətun la rəybə fiha və ənnəllahə yəb`əsu mən fil qubur

:Sonra desin

أَفَهِمْتَ یَا فُلان

Əfəhimtə ya fulan

:Fulan" kəlməsinin yerinə meyyitin adını deyib, sonra isə bunu desin"

ثَبَّتَکَ اللهُ بِالْقَوْلِ الثَّابِتِ وَهَدَاکَ اللهُ إِلَی صِرَاطٍ مُّسْتَقِیمٍ عَرَّفَ اللهُ بَیْنَکَ وَبَیْنَ أَوْلِیَائِکَ فِی مُسْتَقَرٍّ مِنْ رَحْمَتِهِ

Səbbətəkəllahu bil-qovlissabiti və hədakəllahu ila siratin mustəqim, ərrəfəllahu» «bəynəkə və bəynə ovliyaikə fi mustəqərrin min rəhmətih

:Sonra bunu desin

أَللَّهُمَّ جَافِ الْأَرْضَ عَنْ جَنْبَیْهِ واصْعَدْ بِرُوحِهِ إِلَیْکَ وَلَقِّهِ مِنْکَ بُرْهَانًا أَللَّهُمَّ عَفْوَکَ عَفْوَکَ.

Əllahummə cafil-ərzə ən cənbəyhi və əs`id biruhihi iləykə vələqqihi minkə burhanən.» .«Əllahummə əfvəkə əfvək

Məsələ ۶۱۸: Müstəhəbdir ki, meyyiti qəbrə qoyan şəxs təharətli, başı açıq, ayaqyalın olsun və meyyitin ayaq tərəfindən qəbirdən çıxsın. Meyyitin qohumlarından başqa, orada olan şəxslər, əllərinin arxası ilə torpağı qəbrə töküb, “inna lillahi və inna iləyhi raciun” desinlər. Əgər meyyit qadın olsa, onu, məhrəm olanlardan biri qəbrə qoysun. .Əgər məhrəmi olmazsa, sair qohumları onu qəbrə qoysun

Məsələ ۶۱۹: Qəbiri dörd bucaq şəklində düzəltmək, yer səviyyəsindən dörd barmaq qədərincə yuksəltmək, səhv düşməməsinə görə üzərinə bir nişanə qoymaq, qəbrin üzərinə su səpmək, suyu səpdikdən sonra orada olanların əllərini qəbrin üzərinə qoyub, barmaqlarını açaraq qəbirə batırıb yeddi dəfə «Qədr» surəsini oxumaları, :meyyitin bağışlanmasını Allahdan diləmələri və bu duaları oxumaları müstəhəbbdir

أَللَّهُمَّ جافِ الْأَرْضَ عَنْ جَنْبَیْهِ وَاَصْعِدْ إِلَیْکَ رُوحَهُ وَلَقِّهِ مِنْکَ رِضْوَانًا وَاَسْکِنْ قَبْرَهُ مِنْ رَحْمَتِکَ مَاتُغْنِیهِ بِهِ عَنْ رَحْمَهِ مَنْ سِوَاکَ.

Əllahummə cafil-ərzə ən cənbəyhi və əs`id iləykə ruhəhu və ləqqihi minkə rizvanən» «.və əskin qəbrəhu min rəhmətikə ma tuğnihi bihi ən rəhməti mən sivakə

Məsələ ۶۲۰: Cənazənin dəfn mərasimində iştirak edənlər gedəndən sonra müstəhəbdir ki, meyyitin vəlisi, yaxud vəlisinin tərəfindən icazəsi olan bir şəxs göstərişi verilən .duaları meyyitə təlqin etsin

Məsələ ۶۲۱: Dəfndən sonra müstəhəbdir ki, matəm sahiblərinə başsağlığı verilsin. Amma müəyyən müddət keçsə və başsağlığı vermək, baş verən müsibəti onlara xatırlatmağa səbəb olarsa, onu etməmək daha yaxşıdır. Həmçinin müstəhəbdir ki, üç gün meyyitin ev əhlinə (ailə üzvlərinə) yemək göndərilsin. Onların yanında və .mənzillərində yemək yemək məkruhdur

Məsələ ۶۲۲: Müstəhəbdir ki, insan qohumlarının, xüsusilə də övladının ölümündə səbirli ,olsun, hər vaxt meyyiti yad edəndə

İnna lillahi və inna iləyhi raciun" desin; meyyit üçün Quran oxusun, ata-ananın" qəbrinin yanında Allahdan hacətlərini istəsin. Qəbri, tez xarab olmaması üçün möhkəm .düzəltsinlər

Məsələ ۶۲۳: İnsan bir kəsin ölümündə üzünü və bədənini cırması və saçlarını yolması .ehtiyata əsasən icazəli deyildir. Amma üzə və başa vurmaq caizdir

Məsələ ۶۲۴: Ata və qardaşın ölümündən başqa, sair şəxslərin ölümündə, yaxa cırmaq, ehtiyata əsasən icazəli deyil. Ehtiyat-müstəhəbb budur ki, onların müsibətlərində də .yaxa cırmasınlar

Məsələ ۶۲۵: Əgər qadın meyyitin əzasında üzünü cırsa və qanatsa, ya saçlarını yolsa, ehtiya-müstəhəb budur ki, bir qul azad etsin, ya on fəqirə təam versin və ya geyindirsin. Həmçinin kişi, arvad və övladının ölümündə, yaxa və ya paltarını cırsa, eyni .hökmü daşıyır

.Məsələ ۶۲۶: Ehtiyat-müstəhəb budur ki, meyyitə ağlarkən səsi çox ucaltmasınlar

## VƏHŞƏT NAMAZI

Məsələ ۶۲۷: Meyyitin dəfn olunduğu ilk gecə, onun üçün iki rəkət vəhşət namazı qılmaq daha yaxşıdır. Onun qılınma qaydası belədir: Birinci rəkətdə Həmd surəsindən sonra bir dəfə "Ayətul-kürsünü" oxusunlar. İkinci rəkətdə isə Həmd surəsindən sonra on :dəfə "İnna ənzəlnahu" surəsini oxunsunlar, namazın salamından sonra belə desinlər

أَللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَدٍ وَابْعَثْ ثَوَابَهَا إِلَى قَبْرِ فُلان

"Əllahummə səlli əla Mühəmmədin və ali Mühəmməd vəbəs səvabəha ila qəbri fulan"

.Fulan kəlməsinin yerinə mərhumun adını desinlər

Məsələ ۶۲۸: Vəhşət namazını, mərhumun dəfn olunduğu ilk gecənin hər saatında olsa, .qılmaq olar. Amma daha yaxşı olar ki, işa namazından sonra gecənin əvvəlində qılınsın

Məsələ ۶۲۹: Əgər meyyiti uzaq bir şəhərə aparmaq istəsələr, yaxud başqa səbəblərə görə onun dəfni təxirə düşsə, bu halda gərək vəhşət namazını onun qəbrə qoyulduğu .ilk gecəyə qədər təxirə salsınlar

## QƏBRİN AÇILMASI

Məsələ ۶۳۰: Müsəlmanın qəbrini açmaq hətta uşaq və ya dəli olsa belə, haramdır. .Amma bədəni çürüyüb aradan getsə və torpağa çevrilsə, eybi yoxdur

Məsələ ۶۳۱: İmamzadələrin, şəhidlərin, alimlərin qəbrini, habelə qəbrin açılması hörmətsizlik sayılan hər bir qəbri xarab etmək, illər keçmiş olsa və bədənləri aradan .getmiş olsa da belə, bu iş haramdır

:Məsələ ۶۳۲: Bir neçə halda qəbri açmaq haram deyildir

Meyyit qəsbi torpaqda dəfn olunsa və yerin sahibi də onun orada qalmasına razı .۱ olmasa; qəbrin açılması da həddindən artıq əziyyətə səbəb olmasa; əks halda qəsb edəndən başqasına lazım deyil. Əgər qəbrin açılması daha mühüm bir nəhyi lazım tutsa lazım deyil, üstəlik caiz də deyil. Məsələn, əgər meyyitin bədəninin tikə-tikə olmasına, hətta əgər hörmətsizlik olmasına səbəb olarsa, ehtiyat-vacibə əsasən .icazəli deyil. Yalnız meyyitin özünün o yeri qəsb etmiş olduğu halda caizdir

Kəfən və ya meyyitlə dəfn edilən başqa bir şey qəsbi olarsa və onun qəbirdə .۲ qalmasına sahibi razı olmasa; Həmçinin meyyitin varislərə çatacaq malı onunla birgə dəfn edilsə və varisləri onun qəbirdə qalmasına razı olmasalar da, eyni hökmü daşıyır. Amma əgər meyyit bir dua (kitabı), Quran və ya üzüyün onunla dəfn edilməsini vəsiyyət etmişdirsə və onun vəsiyyəti də nüfuzlu olarsa, bunları çıxarmaq üçün qəbri .aça bilməzlər. Əvvəlki bənddə qeyd olunan istisna halları burada da qüvvədədir

Qəbri açmaq hörmətsizliyə səbəb olmasa və meyyit qüslsüz və ya kəfənsiz dəfn .۳ olunmuşsa, yaxud qüslün batil

olmasını başa düşsələr və ya şəri qaydada kəfənə bükülmədiyini yaxud onu qəbirdə ;üzü qibləyə qoymadıqlarını bilsələr

Qəbri açmaqdan daha əhəmiyyətli olan bir haqqın sübuta yetirilməsi üçün meyyitin .۴ ;bədənini görmək istəsələr

Meyyiti, ehtiramsızlıq olan bir yerdə; məsələn: kafirlərin qəbristanlığında, yaxud toz- .۵ ;torpaq, zibil tökülən yerlərdə dəfn etmiş olsalar

Qəbrin açılmasından daha çox əhəmiyyətli, olan şəri bir mətləb üçün qəbri açsalar; .۶ ;məsələn: diri uşağı ölmüş anasının bətnindən çıxartmaq istəsələr

Vəhşi heyvanların meyyitin bədənini parçalamasından, sel aparmasından, . ۷ ;düşmənlərin çıxartmasından qorxslar

Meyyit, onu müqəddəs yerlərdən birinə aparılmasını vəsiyyət etmişdirsə, belə ki, .۸ onu həmin yerə aparmaq üçün heç bir maneə olmadığı halda, qəsdən və ya unudularaq həmin yerə aparılmadan dəfn edilərsə, hörmətsizlik olmazsa, və başqa bir maneə də olmasa, qəbri açıb meyyitin bədənini çıxarıb müqəddəs yerə apara bilərlər. .Hətta bu halda qəbri açıb cənzəni aparmaq vacibdir

## MÜSTƏHƏB QÜSLLƏR

;Məsələ ۶۳۳: Müqəddəs İslam Şəriətində müstəhəb qüsüllər çoxdur, o cümlədən

Cümə qüslü: Onun vaxtı (cümə günü) sübh azanından zöhr azanına qədərdir. Daha .۱ yaxşı olar ki, zöhrə yaxın vaxtlarda yerinə yetirilsin. Əgər bir şəxs zöhrə qədər yerinə yetirə bilməsə, yaxşı olar ki, əda və qəza niyyəti etmədən cümənin əsr vaxtınadək yerinə yetirsin. Əgər cümə günü qüsl etməsə, müstəhəbdir şənbə günü sübhdən qüruba qədər onun qəzasını yerinə yetirsin. Əgər bir şəxs cümə günündə su tapmayacağını bilsə cümə axşamı günü yaxud cümə axşamı gününün gecəsi qüsl edə bilər. Cümə axşamı gecəsində “rəca” niyyəti ilə etsin. Cümə qüslünü alan zaman :müstəhəbdir ki, bu duanı oxusun

أَشْهَدُ أَنْ لاَ اِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَشَرِيکَ لَهُ وَأَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ أَللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَاجْعَلْنِى مِنَ التَّوَّابِينَ وَاجْعَلْنِى مِنَ الْمُتَطَهِّرِينَ.

Əşhədu ənla ilahə illəllah vəhdəhu la şərikələh və ənnə Muhəmmədən əbduhu və“ rəsuluh, əllahummə səlli əla Muhəmmədin və ali Muhəmməd, vəc`əlni minət-.”təvvabin, vəc`əlni minəl-mutətəhhirin

;Ramazan ayının ۱-ci, ۱۷-ci, ۱۹-cu, ۲۱-ci, ۲۳-cü və ۲۴-cü gecələrinin qüslü .۷ - ۲

Fitir və Qurban bayramı gününün qüslü; Bunun vaxtı sübh azanından Günəş .۹ - ۸ .batana qədərdir. Daha yaxşı olar ki, onu bayram namazından qabaq etsinlər

Zil-Həccənin ۸-ci və ۹-cu günlərinin qüslü; ۹-cu günün qüslü, daha yaxşı olar ki, .۱۱ - ۱۰ .zöhrə yaxın vaxtlarda yerinə yetirilsin

;Bədəninin hər hansı bir yerini qüsl verilmiş meyyitin bədəninə vuran şəxsin qüslü .۱۲

;Ehram qüslü .۱۳

;Məkkə şəhərinin hərəm sayılan qismətlərinə daxil olmaq qüslü .۱۴

;Məkkəyə daxil olmaq qüslü .۱۵

;Kəbə evinin ziyarəti qüslü .۱۶

;Kəbəyə daxil olmaq qüslü .۱۷

;Nəhr və zibh üçün qüsl .۱۸

;Həlq üçün edilən qüsl .۱۹

;Mədineyi-Münəvvərənin hərəminə daxil olmaq qüslü .۲۰

;Mədineyi-Münəvvərəyə daxil olmaq qüslü .۲۱

;Peyğəmbərin (Səlləllahu ələyhi və alihi və səlləm) məscidinə daxil olmaq qüslü .۲۲

;Peyğəmbərin (Səlləllahu ələyhi və alihi və səlləm) pak qəbrinin vida qüslü .۲۳

;Düşmənlə mübahilə üçün edilən qüsl .۲۴

;Dünyaya təzə gələn uşağa verilən qüsl .۲۵

;İstixarə üçün edilən qüsl .۲۶

;İstisqa (yağış tələb etmək) üçün edilən qüsl .۲۷

Məsələ ۶۳۴: Fəqihlər müstəhəbb qüsl kimi bir sıra qüsllər deyiblər ki, onlardan bəziləri :bunlardır

۱. Ramazan ayının tamam tək gecələri və axırıncı on günlüyün tamam gecələrinin qüslü və ۲۳-cü gecəsinin axırındakı başqa bir qüsl.

۲. Zilhəccənin ۲۴-cü gününün qüslü.

۳. Novruz bayramının, Şəbanın ۱۵-ci və rəbiəl-əvvəlin ۹-cu və ۱۷-ci gecələri, zil-qədənin ۲۵-ci gününün qüslü.

۴. Ərindən özgəsi üçün xoş ətir vuran qadının qüslü.

۵. Məst halda yatan şəxsin qüslü.

۶. Dara asılanın tamaşasına gedib onu görən şəxsin qüslü. Amma əgər təsadüfən və ya çarəsizlikdən gözü sataşsa, yaxud

.məsələn, şəhadət vermək üçün getsə, qüsl etmək müstəhəbb deyildir

Yaxından və ya uzaqdan, məsumların (ələyhimus-səlam) ziyarəti üçün edilən qüsl. .۷ Amma bunun müstəhəb olması sübuta yetməyib. Bu qüslləri yerinə yetirmək istəyən .şəxs gərək rəca qəsdi ilə yerinə yetirsin

Məsələ ۶۳۵: Əgər insan ۶۳۴-cü məsələdə zikr edilən müstəhəbb qüslləri kimi şərən müstəhəbb olması sübuta yetən bir qüslü edərsə, namaz kimi dəstəmaz vacib olan işləri görə bilər. Amma ۴۳۵-ci məsələdə deyildiyi rəca qəsdilə edilən qüsllər dəstəmaz .əvəzində kifayət etməz

Məsələ ۶۳۶: Əgər bir şəxsə bir neçə qüsl müstəhəb olsa, hamısının niyyəti ilə bir qüsl etsə kifayətdir. Amma əgər mükəlləfin gördüyü bir iş səbəbilə ona müstəhəbb olan qüsslər, məsələn, bədənin bir yerini qüslü verilmiş meyyitə toxunduran şəxsin qüslü kimi; bu kimi qüsüllərdə bir neçə müxtəlif səbəb üçün bir qüsüllə kifayətlənmək .işkallıdır

## TƏYƏMMÜM

**Point**

.Yeddi yerdə dəstəmaz və qüsl əvəzi olaraq, gərək təyəmmüm edilsin

**BİRİNCİ YER**

:Suyun olmaması

Məsələ ۶۳۷: Əgər insan abad bir yerdə olarsa, dəstəmaz və ya qüsl suyu tapmaq üçün ümidini kəsilincəyə qədər axtarmalıdır. Əgər səhrada yaşayırsa (çadırlarda yaşayanlar kimi,) hökm eynidir. Əgər insan səhrada səfər halında olsa, yolda və mənzil saldığı yerlərdə su axtarmalıdır. Əgər həmin yer dərə-təpəli olsa və ya ağacların çoxluğundan oraya getmək çox çətindirsə, ehtiyat-lazıma əsasən qədim zamanlarda yayla atılan bir oxun uçuş məsafəsi qədər dörd tərəfə su axtarmaq üçün getməlidir. Düz yerdə isə .hər tərəfə iki ox uçuşu ölçüsündə axtarış etməlidir

Məsələ ۶۳۸: Əgər dörd tərəfdən bir qismi düzənlik, digər yerlər isə eniş-yoxuşlu olsa, gərək düzənlik tərəflərdə iki ox, düzənlik olmayan tərəfdə isə bir ox miqdarda axtarış .aparılsın

.Məsələ ۶۳۹: Su olmadığına yəqin etdiyi yerləri axtarmaq lazım deyil

Məsələ ۶۴۰: Namaz vaxtı dar olmayan və su tapmaq üçün vaxtı olan şəxsin, əgər axtarması lazım gələn məsafədən bir az uzaqda su olduğuna yəqini varsa və ya əmindirsə, su əldə etmək üçün oraya getməsi lazımdır. Amma oraya getmək camaat arasında “suyu yoxdur” deyilə biləcək qədər uzaqdırsa, getməsi

.lazım deyil. Əgər orada su olduğunu guman edirsə, oraya getməsi lazım deyil

Məsələ ۶۴۱: İnsanın şəxsən özünün su axtarmağa getməyi vacib deyildir. Su axtardığı .və sözünə inandığı şəxsin də deməsinə kifayətlənə bilər

Məsələ ۶۴۲: Əgər səfər yüklərinin arasında, ya mənzilində, yaxud da karvanda, su olmasına ehtimal versə, gərək o qədər axtarış aparsın ki, suyun olmamasına yəqinlik hasil olsun və ya onu tapmağa ümidi qalmasın. Amma əvvəllər bir yerdə su olmayıbsa .və sonradan su tapılmasına ehtimal versə, axtarış lazım deyil

Məsələ ۶۴۳: Əgər namaz vaxtı daxil olmamışdan əvvəl axtarış aparıb su tapmasa, namaz vaxtına qədər həmin yerdə qalsa və ehtimal versə ki, su tapacaq, ehtiyat-.müstəhəb budur ki, ikinci dəfə su axtarsın

Məsələ ۶۴۴: Əgər namazın vaxtı daxil olandan sonra axtarış edib su tapmasa və növbəti namazın vaxtına qədər orada qalsa, belə ki, su tapmağına ehtimal versə, .ehtiyat-müstəhəb budur ki, yenidən su axtarmağa getsin

Məsələ ۶۴۵: Əgər namaz vaxtı dar olsa, yaxud oğrudan və ya yırtıcıdan qorxsa və həmçinin su axtarmağın çətinliyinə görə onun kimilər adətən bu çətinliyə dözə .bilməsə, axtarış aparması lazım deyil

Məsələ ۶۴۶: Əgər namaz vaxtı daralıncaya qədər su axtarmağa getməsə, axtarış etdiyi .halda su tapa biləcəkdisə, günah etmişdir. Amma təyəmmümlə qıldığı namaz səhihdir

Məsələ ۶۴۷: Su tapa bilməyəcəyinə əmin olan bir şəxs, əgər su axtarmağa getməyib, təyəmmümlə namaz qılarsa və namazdan sonra, su axtardığı təqdirdə tapa biləcəyini .bilərsə, ehtiyata əsasən dəstəmaz alıb o namazı yenidən qılmalıdır

Məsələ ۶۴۸: Əgər axtarış apardıqdan sonra su tapa bilməsə, və tapacağından ümidini kəsərək təyəmmümlə namaz qıldıqdan sonra, axtardığı yerdə suyun olduğunu bilərsə, .namazı səhihdir

Məsələ ۶۴۹: Namaz vaxtının dar olduğuna əmin olan bir şəxs axtarış etmədən

namaz vaxtı keçməmiş axtarış üçün vaxt qaldığını bilərsə, ehtiyat-vacibə əsasən .namazını yenidən qılmalıdır

Məsələ ۶۵۰: Əgər dəstəmazlı olsa və dəstəmazını pozduğu təqdirdə, artıq su tapa bilməsinin mümkün olmadığını yaxud dəstəmaz ala bilməməsini bilərsə, dəstəmazını pozmaması mümkündürsə, ehtiyat-vacibə əsasən dəstəmazını pozmamalıdır, istər vaxt daxil olmazdan əvvəl olsun, istərsə də daxil olandan sonra. Amma qüsl etməsinə .qadir olmayacağını bilsə belə xanımı ilə yaxınlıq edə bilər

Məsələ ۶۵۱: Yalnız dəstəmaz və ya qüslə kifayət edəcək qədər suyu olan şəxs, onu tökdükdə su tapa bilməyəcəyini bilərsə, namaz vaxtı daxil olduqda o suyu tökməsi .haramdır. Ehtiyat-vacibə əsasən namaz vaxtından qabaq da o suyu tökməsin

Məsələ ۶۵۲: Su tapa bilməyəcəyini bilən şəxs, dəstəmazını batil edərsə, yaxud malik olduğu suyu dağıtsa, xilaf iş görməsinə baxmayaraq təyəmmümlə namazı səhihdir. .Lakin, ehtiyat-müstəhəb budur ki, o namazın qəzasını qılsın

## İKİNCİ YER

:Suyu əldə edə bilməmək

Məsələ ۶۵۳: Qocalıq, qüdrətsizlik və ya oğru yaxud vəhşi heyvanların qorxusundan və bunlar kimi, yaxud quyudan su çəkmək üçün bir vasitə olmamağından su əldə edə .bilməsə, gərək təyəmmüm etsin

Məsələ ۶۵۴: Əgər suyu quyudan çəkmək üçün ip vedrə və s. kimi şeylərə ehtiyac duyulsa və onları almağa, yaxud kirayə etməyə məcbur olsa, hətta onların qiyməti, adi vaxtdakı qiymətdən bir neçə dəfə baha olsa da, onu almalıdır. Həmçinin, əgər suyu öz qiymətindən bir neçə qat baha qiymətə satsalar da eyni qayda ilə, (yəni almalıdır). Amma onları almaq üçün çoxlu pul istəsələr, belə ki, alanın vəziyyətinə zərər yetirsə, .alması vacib deyil

Məsələ ۶۵۵: Əgər su hazırlamaq üçün əlacsız olaraq borc etməli olarsa, gərək borc etsin. Amma borcunu verə bilməyəcəyini bilən, yaxud güman edən şəxsə borc etmək .vacib deyildir

Məsələ ۶۵۶: Əgər quyu qazmağın böyük əziyyəti olmasa, gərək su əldə etmək üçün .quyu qazsın

.Məsələ ۶۵۷: Əgər bir şəxs minnətsiz su bağışlayırsa, gərək onu qəbul etsin

**ÜÇÜNCÜ YER**

:Suyun işlədilməsindən törənən qorxu

Məsələ ۶۵۸: Əgər su işlətmək insanın ölümünə səbəb olsa, yaxud su işlətmək vasitəsilə onda bir eyb və ya xəstəlik əmələ gələrsə, yaxud xəstəliyi uzansa və ya şiddətlənsə, yaxud çətinliklə müalicə olacaqsa, gərək təyəmmüm etsin. Amma əgər suyun zərərini dəf edə bilsə, məsələn, suyu isitmək kimi, gərək bu işi etsin və dəstəmaz alsın, qüsl .lazım olan vaxtda da qüsl etsin

Məsələ ۶۵۹: Suyun ona zərər edəcəyini yəqin etməsi lazım deyildir. Əgər zərər verəcəyini ehtimal etsə və onun bu ehtimalı camaatın nəzərində düzgün bir ehtimal .hesab edilərsə, təyəmmüm etməlidir

Məsələ ۶۶۰: Suyun ona zərər verəcəyini yəqin və ya ehtimal etdiyinə görə təyəmmüm edən şəxs namazdan əvvəl suyun ona zərəri olmadığını bilərsə, təyəmmümü batildir. Əgər namaz qıldıqdan sonra bilərsə, namazı dəstəmaz və ya qüsl ilə yenidən qılmalıdır. Amma əgər zərərə yəqin və ya ehtimal halında qüsl və ya dəstəmaz .dözülməsi çox çətin ruhi nigarançılığa səbəb olsa, bu hal istisnadır

Məsələ ۶۶۱: Suyun ona zərəri olmayacağını yəqin edən şəxs, qüsl edib və ya dəstəmaz .aldıqdan sonra, suyun ona zərəri olduğunu bilərsə, dəstəmaz və ya qüslü batildir

## DÖRDÜNCÜ YER

:Məşəqqət və çətinlik

Məsələ ۶۶۲: Su tapmasa və ya onu dəstəmaz və ya qüsl üçün istifadə etdiyi təqdirdə, adətən dözülə bilməyən dərəcədə zəhmətə düşəcəksə təyəmmüm edə bilər. Amma .əgər dözərək dəstəmaz alsa və ya qüsl etsə, onun dəstəmaz və qüslü səhihdir

## BEŞİNCİ YER

:Susuzluğu yatırmaq üçün suya ehtiyac olarsa

Məsələ ۶۶۳: Əgər susuzluğu dəf etmək üçün suya ehtiyac olarsa, təyəmmüm etməlidir. .Bu səbəbə görə təyəmmümün caizliyi iki haldadır

Suyu dəstəmaz və ya qüsl üçün istifadə edərsə onun hal-hazırda və ya sonradan (۱ susuzluqdan ölməsinə, xəstələnməsinə və ya dözülməsi çox çətin olan bir əziyyətə ;səbəb olacağı təqdirdə

Özündən başqa, ona bağlı olan kəslər üçün qorxarsa, hətta, qorunması vacib olan-۲ nəfsi-möhtərəmədən olmasa belə: Əgər onun məişət işləri onun üçün əhəmiyyətli olarsa, istər şiddətli əlaqə (bağlılıq) üzündən olsun, ya onun tələf olması şəxsə maddi zərər vurduğundan ya da dost və ya qonşu kimi vəziyyətinə riayət edilməsi ürfən .lazım olsa

Bu iki haldan başqa, da susuzluq təyəmmümün edilməsinə əsas ola bilər, amma bu cəhətdən deyil, bəlkə şəxsin canının qorunmasının vacibliyi, ya ölüm, ya taqətsizliyi .şübhəsiz özünə ağır çətinlik yaradacağına görədir

Məsələ ۶۶۴: Əgər dəstəmaz və qüsl üçün sahib olduğu pak su ilə yanaşı, özü içəcəyi qədər nəcis suyu da olsa, pak suyu içmək üçün saxlamalı, namazı isə təyəmmümlə qılmalıdır. Amma ona bağlı olan şəxslər üçün su lazımdırsa, onlar susuzluqlarını yatırmaq üçün nəcis su içmək məcburiyyətində qalsalar belə, pak su ilə dəstəmaz ala və qüsl edə bilərlər. Hətta əgər onların suyun nəcisliyindən xəbərləri olmasa və ya

çəkinməzlərsə, pak suyu dəstəmaz və ya qüsl üçün istifadə etməsi gərəkdir. Həmçinin nəcis suyu heyvana və ya həddi-büluğa çatmamış uşağa vermək istəsə də hökm .belədir. Nəcis suyu onlara verib, pak su ilə dəstəmaz və qüsl etməlidir

**ALTINCI YER**

:Dəstəmaz və ya qüsl digər daha mühüm yaxud bərabər olan bir təkliflə zidd olarsa

Məsələ ۶۶۵: Əgər bədən və ya libası nəcis olan bir şəxsin az miqdarda suyu olsa və bununla dəstəmaz aldıqda və ya qüsl etdikdə, bədən və ya libasını yumağa su qalmayacaqsa, o su ilə bədən və libasını yumalı və təyəmmümlə namaz qılmalıdır. Amma əgər üzərinə təyəmmüm edəcəyi bir şey yoxdursa, suyu dəstəmaz və ya qüsl .üçün istifadə etməli və nəcis bədən və ya libasla namaz qılmalıdır

Məsələ ۶۶۶: İstifadə edilməsi haram olan su və ya qabdan başqa bir su və ya qab yoxdursa, məsələn, su və ya qabı qəsbi olsa, bunlardan başqa su və qabı olmasa, .gərək qüsl və dəstəmaz yerinə təyəmmüm etsin

**YEDDİNCİ YER**

:Vaxtın dar olması

Məsələ ۶۶۷: Dəstəmaz və ya qüsl etməsi, namazın hamısının və ya bir miqdarının vaxtından sonra qılınmasına (qəzaya getməsinə) səbəb olacaq qədər vaxt dar olarsa, .təyəmmüm etməlidir

Məsələ ۶۶۸: Əgər bilərəkdən namazı çox təxirə salsa və qüsl, yaxud dəstəmaz üçün vaxt olmasa, günah etmişdir, amma onun namazı təyəmmümlə səhihdir. Ehtiyat-.müstəhəb budur ki, o namazın qəzasını qılsın

Məsələ ۶۶۹: Dəstəmaz aldıqda və ya qüsl etdikdə namaz üçün vaxt qalıb-.qalmayacağında şəkk edən şəxs, təyəmmüm etməlidir

Məsələ ۶۷۰: Vaxtın darlığına görə təyəmmüm etmiş olan şəxs, namazdan sonra dəstəmaz almağa imkanı olduğu halda, su əlindən çıxıncaya qədər dəstəmaz almazsa, belə ki, vəzifəsi təyəmmüm etmək olduğu təqdirdə, əvvəlki təyəmmümünü pozmamış .olsa belə, sonrakı namazlar üçün yenidən təyəmmüm etməlidir

Məsələ ۶۷۱: Suyu olan şəxs, əgər vaxtın darlığından təyəmmümlə namaza başlasa və namaz əsnasında o su əlindən getsə, belə ki, vəzifəsi təyəmmümdürsə, sonrakı namazlar üçün təyəmmüm etməsi yaxşı olmasına baxmayaraq sonrakı namazlar .üçün ikinci dəfə təyəmmüm etməsi lazım deyil

Məsələ ۶۷۲: Əgər insanın dəstəmaz almağa, qüsl etməyə, namazın iqamə və qünut kimi müstəhəbb işlərini görmədən namaz qılmağa vaxtı vardırsa, gərək qüsl etsin və ya dəstəmaz alsın və namazı müstəhəbb işlərsiz yerinə yetirsin. Hətta surəni oxuyacaq qədər vaxtı olmasa belə, qüsl edib və ya dəstəmaz alıb, namazını surəsiz .qılmalıdır

## TƏYƏMMÜMÜN SƏHİH OLDUĞU ŞEYLƏR

Məsələ ۶۷۳: Torpağa, daşa, quma və kəsəyə təyəmmüm etmək səhihdir. Amma ehtiyat-müstəhəbb budur ki, torpaq olduğu təqdirdə ayrı bir şeyə təyəmmüm etməsin və əgər torpaq yoxdursa, torpaq adlana biləcək çox yumşaq quma, bu da mümkün olmasa kəsəyə, o da mümkün olmasa quma, o da olmadığı təqdirdə, daşa təyəmmüm .etsin

Məsələ ۶۷۴: Gəc və əhəng daşına təyəmmüm etmək səhihdir. Həmçinin, ürfə görə yumşaq torpaq sayıldığı təqdirdə, xalça, paltar və bu kimi şeylərin üzərində toplanmış toz-torpağa təyəmmüm etmək səhihdir. Amma ehtiyat-müstəhəbb budur ki, ixtiyar halında onun üzərinə təyəmmüm edilməsin. Həmçinin ehtiyat-müstəhəbb budur ki, ixtiyar halında bişirilmiş gəc, əhəng, kərpic, eləcə də əqiq kimi mə`dən daşına .təyəmmüm edilməsin

Məsələ ۶۷۵: Əgər torpaq, qum, kəsək və daş tapa bilməsə, palçığa təyəmmüm edə bilər. Əgər palçıq da tapa bilməsə, xalqın

nəzərində torpaq sayılacaq miqdarda olmayan xalça, libas və bu kimi şeylərin layında olan və ya üzərində toplanan toz-torpağa təyəmmüm etməlidir. Əgər bunların heç biri tapılmasa, ehtiyat-müstəhəbb budur ki, namazı təyəmmümsüz qılsın. Amma .sonradan bu namazın qəzasını yerinə yetirmək vacibdir

Məsələ ۶۷۶: Əgər xalçanı çırpmaqla və bu kimi işlərlə torpaq hazırlaya bilsə, tozlu şeyə təyəmmüm batildir. Əgər palçığı qurudub onunla torpaq hazırlaya bilərsə, palçığa .təyəmmüm etmək batildir

Məsələ ۶۷۷: Suyu olmayıb, qar və ya buzu olan bir şəxs, mümkün olduğu təqdirdə, onu əridərək su əldə edib, onunla dəstəmaz almalı və ya qüsl etməlidir. Əgər bu mümkün olmasa və üzərinə təyəmmüm səhih olan bir şeyi də yoxdursa, namazını vaxt xaricində qəza etməlidir. Amma qar və ya buzla dəstəmaz və ya qüsl üzvlərini islatması, əlindəki rütubətlə başa və ayağa məsh çəkməsi, əgər bu da mümkün deyilsə, buz və ya qara təyəmmüm edib, namazını vaxtında qılması daha yaxşıdır. Hər .iki halda qəzasını qılması lazımdır

Məsələ ۶۷۸: Əgər torpağa və quma, təyəmmümün edilməsi batil olan bir şey qatılıbsa, o torpağa və quma təyəmmüm edə bilməz. Amma əgər o şey, torpağın və ya qumun tərkibində aradan gedəcək qədər az miqdarda olarsa, o torpağa və quma təyəmmüm .səhihdir

Məsələ ۶۷۹: Təyəmmüm etmək üçün bir şey olmazsa, imkan daxilində gərək almaqla .və s. yollarla əldə etsin

Məsələ ۶۸۰: Palçıq divara təyəmmüm etmək səhidir. Amma ehtiyat-müstəhəb budur ki, .quru yer və quru torpaq olan halda, nəmli torpağa və yerə təyəmmüm olunmasın

Məsələ ۶۸۱: Təyəmmüm edilən şey şər`ən gərək pak olsun. Ehtiyat-vacib görə, ürfən də gərək təmiz olsun, yəni iyrəncliyə səbəb olan bir şeyə qarışmasın. Əgər təyəmmüm etməsi səhih olan pak bir şey tapılmasa, namaz ona vacib deyildir. Amma gərək (sonradan) onun qəzasını əmələ gətirsin. Daha yaxşı odur ki, namazı vaxtında da qılsın.

Amma əgər toz–torpaqlı xalça və bu kimi şeylərə növbə çatsa, əgər onlar nəcisdirsə, ehtiyat–vacib

.budur ki, onunla təyəmmüm etsin, namazı qılsın, sonradan namazın qəzasını da qılsın

Məsələ ۶۸۲: Əgər bir şeyə təyəmmümün səhih olduğunu yəqin etdikdən sonra təyəmmüm edib, sonradan o şeyə təyəmmüm etməyin batil olduğunu başa düşərsə, o .təyəmmümlə qıldığı namazları gərək yenidən qılsın

Məsələ ۶۸۳: Üzərinə təyəmmüm edilən şey qəsb edilmiş olmamalıdır. Belə ki, əgər qəsb .edilmiş torpaq üzərinə təyəmmüm edərsə, təyəmmümü batildir

Məsələ ۶۸۴: Qəsbi fəzada təyəmmüm batil deyildir. Deməк əgər öz mülkündə əllərini yerə vursa və icazəsiz başqasının mülkünə daxil olub əllərini alnına çəksə, günah .etməsinə baxmayaraq, onun təyəmmümü səhihdir

Məsələ ۶۸۵: Qəsb edilmiş şeyin qəsb edildiyini unudaraq və ya qafil olaraq üzərinə təyəmmüm edərsə, səhihdir. Amma əgər bir şeyi özü qəsb edərsə və qəsb etdiyini .unudaraq üzərinə təyəmmüm edərsə, təyəmmümünün səhih olması işkallıdır

Məsələ ۶۸۶: Qəsbi yerdə məhbus olan bir şəxs, o yerin suyu və torpağı qəsbi olarsa, .gərək təyəmmümlə namaz qılsın

Məsələ ۶۸۷: Ehtiyat-lazıma əsasən üzərinə təyəmmüm etdiyi şeyin əldə qalacaq qədər tozu olsun və ona əlini vurduqdan sonra, əlini, onda qalan tozun hamısı töküləcək .şəkildə şiddətlə çırpmamalıdır

Məsələ ۶۸۸: Çuxur yerə, yolların torpağına, üzərini duz örtməyən şoran yerə .təyəmmüm etmək məkruhdur. Amma duz onun üstünü tutmuş olsa, batildir

## DƏSTƏMAZ VƏ QÜSL ƏVƏZİNƏ OLAN TƏYƏMMÜMÜN QAYDASI

:Məsələ ۶۸۹: Dəstəmaz və ya qüsl əvəzinə edilən təyəmmümdə üç şey vacibdir

Əllərin ikisinin içini birlikdə təyəmmüm səhih olan şeyə vurmaq, ya da qoymaq. (۱ .Ehtiyat-lazıma əsasən bu iş gərək iki əlin içində birlikdə əmələ gətirilsin

Ehtiyat-vacibə əsasən hər iki əlin içini alının tük bitən yerindən başlayaraq, qaşlara (۲ qədər, tamam alına və həmçinin onun iki tərəfinə, burnunun yuxarısına qədər çəksin .və ehtiyat-müstəhəb budur ki, əlləri qaşların üstünə də çəksin

Sol əlin içini, tamam sağ əlin arxasına çəkmək və sonra sağ əlin içini tamam sol əlin (۳ arxasına çəkmək. Ehtiyat-vacib budur ki, sağ əllə sol əl arasındakı tərtibə riayət etsin. Lazımdır ki, dəstəmazda deyildiyi kimi, təyəmmümü də niyyət və qürbət qəsdi ilə .yerinə yetirsin

Məsələ ۶۹۰: Ehtiyat-müstəhəb budur ki, istər dəstəmaz, istərsə də qüsl əvəzində olan təyəmmümü, bu tərtiblə yerinə yetirsin; bir dəfə əlləri yerə vurub alına və əllərin .arxasına çəksin və başqa bir dəfə də əllləri yerə vurub əllərin arxasına məsh etsin

## TƏYƏMMÜMÜN HÖKMLƏRİ

Məsələ ۶۹۱: Əgər alın və ya əllərin üstünün kiçik bir yerinə məsh etməsə, istər qəsdən, istərsə də məsələni bilməməzlik və ya unutqanlıq üzündən olsun, təyəmmüm batildir. Amma, artıq diqqət etmək də lazım deyil;"bütün alnına və əllərinə məsh çəkildi" .desələr, kifayətdir

Məsələ ۶۹۲: Əllərin üstünün bütünlüklə məsh etməsini yəqin etmək üçün gərək biləkdən bir az yuxarı da məsh etsin, amma barmaqların arasına məsh etmək lazım .deyil

Məsələ ۶۹۳: Alına və əllərin arxasını, ehtiyata əsasən yuxarıdan aşağıya doğru məsh etməli və təyəmmüm işlərini ardıcıl olaraq yerinə yetirməlidir. Əgər onların arasında .«təyəmmüm edir» deyilməyəcək qədər fasilə verərsə, təyəmmümü batildir

Məsələ ۶۹۴: Niyyət zamanı təyəmmümün qüsl əvəzi və ya dəstəmaz əvəzi olmasını müəyyən etməsi lazım deyil. Amma iki təyəmmüm etməsi lazım olan yerlərdə, onun hər birini təyin etməlidir. Əgər üzərinə bir təyəmmüm vacib olsa və hal-hazırkı vəzifəsinə əməl etmək qəsdilə təyəmmüm edərsə, onu müəyyən etməkdə səhv etsə .belə, təyəmmümü səhihdir

Məsələ ۶۹۵: Təyəmmüm edərkən alının və əllərin içi və arxasının pak olmasının yaxşı .olmasına baxmayaraq, alının və əllərin içi və arxasının pak olması lazım deyil

Məsələ ۶۹۶: İnsan əllərinə məsh çəkən vaxtda gərək üzüyünü barmağından çıxarsın. Əgər alında və ya əllərin içində və arxasında maneə olsa, məsələn, bir şey onlara .yapışmış olsa, gərək onu aradan qaldırsın

Məsələ ۶۹۷: Əgər alın və ya əllərin arxası yara olsa və ona bağladığı parçanı aça bilməsə, gərək əlini onun üstünə çəksin. Habelə əgər əlin içi yaradırsa və ona bağladığı parça və ya bu kimi şeyi aça bilməsə, gərək əli həmən parça ilə təyəmmüm səhih olan şeyə vursun, sonra alına və əllərinin üstünə çəksin. Amma əgər onun bir hissəsi açıq .olsa, o qədəri yerə vurub, elə onunla məsh etməsi kifayətdir

Məsələ ۶۹۸: Əgər alında, əllərin üstündə adi qaydada tük olsa, eybi yoxdur. Amma .başın tükü alına tökülmüş olsa, gərək onları arxaya çəksin

Məsələ ۶۹۹: Əgər insan, alnında, əllərinin içində və ya arxasında bir maneə olduğuna ehtimal versə və onun bu ehtimalı camaatın nəzərində doğru bir ehtimal olarsa, .maneə olmadığına əmin oluncaya qədər araşdırmalıdır

Məsələ ۷۰۰: Əgər vəzifəsi təyəmmüm etmək olduğu halda, təklikdə təyəmmüm edə bilməsə, başqa birisindən kömək almalıdır. Bu zaman kömək edən şəxs əllərini təyəmmümün səhih olduğu bir şeyə vurub, onun alnına və əllərinin üstünə qoymalıdır ki, mümkün olduğu təqdirdə onun özü hər iki əllərinin içini alnına və əllərinin arxasına çəksin. Əgər bu mümkün deyilsə, naib onun öz əli ilə ona təyəmmüm verməlidir. Əgər bu da mümkün deyilsə, naib öz əlini təyəmmümün səhih olduğu şeyə vurub, onun alnına və əllərinin arxasına çəkməlidir. Bu iki təqdirdə, ehtiyat-lazıma əsasən hər ikisi .də təyəmmüm niyyəti etməlidir. Amma birinci surətdə, mükəlləfin öz niyyəti kifayətdir

Məsələ ۷۰۱: Təyəmmüm əsnasında, təyəmmümün bir qismini unudub-unutmadığında şəkk edərsə, onun məhəlli

keçmişdirsə, şəkkinə etina etməməlidir. Əgər məhəlli keçməmişdirsə, o bölümü yerinə .yetirməlidir

Məsələ ۷۰۲: Sol əlini məsh etdikdən sonra, təyəmmümü düzgün edib-etmədiyində şəkk edərsə, təyəmmümü səhihdir. Amma əgər şəkk, sol əlinin məshində olarsa, onu məsh etməlidir. Əgər ürfün nəzərincə, artıq təyəmmümdən çıxmış hesab olunursa, məsələn; təharətli olmağın şərt olduğu bir əmələ başlamışdırsa, yaxud ardıcıllıq .pozulmuş olarsa, onu məsh etməsi lazım deyil

Məsələ ۷۰۳: Vəzifəsi təyəmmüm olan şəxs, namazın tamam vaxtında üzrünün aradan gedəcəyindən ümidsiz olsa, yaxud tə`xirə salarsa vaxt daxilində təyəmmüm edə bilməyəcəyinə ehtimal versə, namaz vaxtından əvvəl təyəmmüm edə bilər. Əgər başqa bir vacib, yaxud müstəhəbb iş üçün təyəmmüm etsə və namaz vaxtına qədər .üzrü qalsa, həmən təyəmmümlə namaz qıla bilər

Məsələ ۷۰۴: Vəzifəsi təyəmmüm olan şəxs, əgər vaxtın axırına qədər üzrünün qalacağını bilsə, yaxud onun aradan getməsindən ümidsiz olsa, geniş vaxtda təyəmmümlə namaz qıla bilər. Amma əgər vaxtın sonuna qədər üzrünün aradan gedəcəyini bilərsə, gözləyib dəstəmaz və ya qüsl ilə namaz qılmalıdır. Hətta əgər vaxtın sonuna qədər üzrünün aradan getməsindən ümidini kəsməmişdirsə, ümidi kəsilməyincəyə qədər təyəmmümlə namaz qıla bilməz. Amma əgər tez təyəmmümlə namaz qılmadıqda vaxtın axırına qədər hətta təyəmmümlə belə, namaz qıla .bilməməsinə ehtimal versə, (vaxtın əvvəlində) təyəmmümlə qıla bilər

Məsələ ۷۰۵: Dəstəmaz ala və ya qüsl edə bilməyən şəxs, əgər üzrünün aradan getməsindən ümidini kəsmişdirsə, qəza namazlarını təyəmmümlə qıla bilər. Ehtiyat-vacibə əsasən üzrü aradan getdikdən sonra, o namazları dəstəmaz və ya qüsl ilə yenidən qılsın. Əgər üzrünün aradan getməsindən ümidini kəsməmişdirsə, ehtiyat-.lazıma əsasən, qəza namazlarını təyəmmümlə qıla bilməz

Məsələ ۷۰۶: Dəstəmaz ala və ya qüsl edə bilməyən şəxs, gecə və gündüz nafilələri kimi, müəyyən vaxtları olan

müstəhəbb namazları təyəmmümlə qıla bilər. Amma onların vaxtlarının sonuna qədər üzrünün aradan getməsindən ümidini kəsməmişdirsə, ehtiyat-lazıma əsasən onları, vaxtlarının əvvəlində yerinə yetirməməlidir. Amma müəyyən vaxtları olmayan .namazları isə hər bir halda təyəmmümlə qıla bilər

Məsələ ۷۰۷: Ehtiyatən cəbirə qüslü və təyəmmüm edən şəxs, əgər qüsl və təyəmmümdən sonra namaz qılsa və namazdan sonra kiçik hədəs baş verərsə, məsələn; bövl edərsə, sonrakı namazlar üçün dəstəmaz almalıdır. Belə ki, əgər hədəs .namazdan əvvəl baş verərsə, o namaz üçün də dəstəmaz almalıdır

Məsələ ۷۰۸: Əgər bir şəxs su olmaması, yaxud başqa səbəblərə görə təyəmmüm etsə, .üzrü aradan qalxdiqdan sonra təyəmmümü batil olur

Məsələ ۷۰۹: Dəstəmazı batil edən şeylər dəstəmaz əvəzinə olan təyəmmümü də batil .edər. Qüslü batil edən şeylər qüsl əvəzinə olan təyəmmümü də batil edər

Məsələ ۷۱۰: Qüsl edə bilməyən şəxs, üzərinə bir neçə qüsl vacib olarsa, onların hamısının əvəzinə bir təyəmmüm etməsi caizdir. Amma ehtiyat-müstəhəbb budur ki, .hər birisinin əvəzinə bir təyəmmüm etsin

Məsələ ۷۱۱: Qüsl edə bilməyən şəxs, əgər onun üçün qüsl vacib olan əməli yerinə yetirmək istəsə, qüslün əvəzinə təyəmmüm etməlidir. Dəstəmaz ala bilməyən şəxs də, əgər onun üçün dəstəmaz vacib olan bir əməli yerinə yetirmək istəyərsə, .dəstəmaz əvəzinə təyəmmüm etməlidir

Məsələ ۷۱۲: Əgər cənabət qüslü əvəzinə təyəmmüm etsə, namaz üçün dəstəmaz almaq lazım deyildir və əgər başqa qüsllərin əvəzinə təyəmmüm etsə də, hökm eynidir, baxmayaraq ki, ehtiyat-müstəhəbb budur ki, dəstəmaz da alsın. Əgər .dəstəmaz ala bilməsə, başqa bir təyəmmüm də dəstəmaz əvəzinə etsin

Məsələ ۷۱۳: Əgər qüsl əvəzinə təyəmmüm etsə və sonra dəstəmazı batil edən bir iş onun qarşısına çıxsa, belə ki, sonrakı namazlar üçün qüsl edə bilməsə, gərək dəstəmaz alsın və ehtiyat-müstəhəbb budur ki, təyəmmüm də etsin. Əgər dəstəmaz

Məsələ ۷۱۴: Vəzifəsi təyəmmüm olan şəxs, əgər bir iş üçün təyəmmüm edərsə, təyəmmümü və üzrü aradan getməyənə qədər, dəstəmaz və ya qüsllə etməli olan əməlləri, yerinə yetirə bilər. Amma əgər üzrü vaxtın darlığı imişsə, yaxud suyu olduğu halda meyyit namazı üçün və ya yatmaq üçün təyəmmüm edibsə, yalnız onun üçün .təyəmmüm etdiyi işi yerinə yetirə bilər

Məsələ ۷۱۵: Bir neçə yerdə, insanın təyəmmümlə qıldığı namazları yenidən qılması :daha yaxşıdır

Sudan istifadə etməkdən qorxduğu halda qəsdən özünü cünub edib, təyəmmümlə (۱ ;namaz qılmışdırsa

Su tapa bilməyəcəyini bildiyi və ya guman etdiyi halda, qəsdən özünü cünub edib, (۲ ;təyəmmümlə namaz qılmışdırsa

Vaxtın axırına qədər, qəsdən su axtarmağa getməsə və təyəmmümlə namaz qılıb, (۳ ;sonradan, axtardığı təqdirdə su tapa biləcək olduğunu başa düşərsə

;Qəsdən namazı təxirə salıb, vaxtın axırında təyəmmümlə namaz qılmışdırsa (۴

Su tapa bilməyəcəyini bildiyi və ya guman etdiyi halda, mövcud olan suyunu dağıdıb, (۵ .təyəmmümlə namaz qılmışdırsa

## NAMAZIN HÖKMLƏRİ

**Point**

Namaz dinin ən mühüm əməllərindəndir ki, əgər Allah-təalanın dərgahında qəbul olsa, sair ibadətlər də qəbul olar; əgər qəbul olunmazsa, sair əməllər də qəbul olunmaz. Necə ki, insan gündə beş dəfə çayda çimsə, bədəni çirkdən təmizləndiyi kimi, beşlik təşkil edən namazlar da insanı günahlardan təmizləyir. Daha yaxşı olar ki, insan namazı vaxtın əvvəlində qılsın. Hər şəxs namazı alçaq və yüngül saysa, namaz qılmayanlar kimidir. Peyğəmbəri-Əkrəm (səlləllahu ələyhi və alihi və səlləm) buyurub: ."“Namaza əhəmiyyət verməyən və onu yüngül sayan şəxs, axirət əzabına layiqdir

Günlərin birində, Həzrəti Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) məsciddə idi. Bir kişi məscidə daxil olub namaza başladı, amma rüku və səcdəni layiqincə yerinə yetirmədi. Həzrət buyurdu: “Əgər bu kişi, namazı belə olan halda dünyadan getsə, ."mənim dinimdə dünyadan getməyib

Deməli, insan gərək çalişsın ki, namazı əlüstü və təcili halda qılmasın. Namaz halında Allahı yad etsin, xüzu və xüşu və vüqarlı olsun. Xatırlasın ki, kiminlə danışır. Özünü Allahın böyüklüyü və əzəməti qarşısında çox zəlil və əhəmiyyətsiz görsün. Əgər insan namaz vaxtı bu məsələlərə tam diqqət yetirsə, özündən xəbərsiz olar. Necə ki, namaz halında Əlinin (ələyhis-salam) mübarək ayağından oxu çıxardılar və o həzrət bunu hiss .etmədi

Həmçinin, namaz qılan şəxs tövbə və istiğfar etməli, namazın Allah dərgahında qəbul olmasının qarşısını alan günahları (həsəd, təkəbbür, qeybət, haram mal yemək, məstedici şeylər içmək, xüms-zəkat verməmək, ümumiyyətlə hər günahı) tərk etsin. Həmçinin, daha yaxşı olar ki, namazın savabını azaldan işləri də etməsin; məsələn: yuxulu halda, bövlün qabağını zorla

saxladığı halda namaza dayanmasın, namazda göylərə tərəf baxmasın. Həmçinin, namazın savabını artıran əməlləri yerinə yetirsin, məsələ, əqiq üzük taxsın, pakizə .paltarlar geysin, başını darayıb, dişlərini yusun, özünü ətirləsin

## VACİB NAMAZLAR

:Vacib namazlar altıdır

.Gündəlik namazlar .۱

.Ayət namazı .۲

.Meyyit namazı .۳

.Kəbə evinin təvaf namazı .۴

.Atanın, böyük oğulun üzərinə ehtiyata-əsasən vacib olan qəza namazı .۵

Əhd etmək, and içmək, nəzr demək və icarə etməklə vacib olan namazlar, cümə .۶ .namazı da gündəlik namazlardandır

## GÜNDƏLİK VACİB NAMAZLAR

Gündəlik vacib namazlar beşdir: Zöhr və əsr namazı hər biri dörd rəkətdir. Məğrib .namazı üç rəkətdir, işa namazı dörd rəkətdir və sübh namazı iki rəkət

Məsələ ۷۱۶: Səfərdə dörd rəkətli namazlar sonradan deyiləcəyi şərtlər daxilində iki .rəkət qılınır

## ZÖHR VƏ ƏSR NAMAZLARININ VAXTI

Məsələ ۷۱۷: Zöhr və əsr namazının vaxtı zəvaldan şəri zöhrdən günəş batana qədərdir. Amma əsr namazını qəsdən zöhr namazından əvvəl qılsa batildir. Amma əgər vaxtın bitməsinə, yalnız bir namaz qıla biləcək qədər bir müddət qaldığı zamana qədər, bir şəxs zöhr namazını qılmamışdırsa, artıq onun zöhr namazı qəza olmuşdur və gərək əsr namazını qılsın. Əgər bir şəxs, bu vaxtdan qabaq səhvən əsr namazını tamamilə, zöhr namazından qabaq qılarsa, namazı səhihdir və zöhrü qılmalıdır. Amma ehtiyat-müstəhəb budur ki, ikinci dörd rəkət namazı «mafiz-zimmə» niyyətilə qılsın.

Məsələ ۷۱۸: Zöhr namazını qılmadan, səhvən əsr namazına məşğul olarsa və namaz əsnasında səhv etdiyini bilərsə, niyyəti zöhr namazına çevirməlidir. Yəni «indiyə qədər qıldığım, indi qılmaqda olduğum və bundan sonra qılacağımın hamısı zöhr namazı olsun» deyə, niyyət etməli və namazı tamamladıqdan sonra, əsr namazını qılmalıdır.

## CÜMƏ NAMAZI VƏ ONUN HÖKMLƏRİ

Məsələ ۷۱۹: Cümə namazı, sübh namazı kimi iki rəkətdir. Amma fərqi budur ki, cümə namazından əvvəl iki xütbə oxunur. Cümə namazı vacibi-təxyiridir. Yəni mükəlləf, cümə günü şərtlərin mövcud olduğu təqdirdə, cümə namazı və ya zöhr namazının hansı birini qılmaqda ixtiyar sahibidir. Əgər cümə namazını qılarsa, zöhr namazının əvəzindən kifayət edər. Cümə namazının vacib olmasının bir neçə şərti vardır:

Vaxtın daxil olması; cümə namazının vaxtı, zəval vaxtının ürfi baxımdan ilk bölümü .۱ sayılan qismidir. Belə ki, əgər cümə namazını bu vaxtdan gecikdirərsə, artıq onun vaxtı .sona çatmışdır və zöhr namazını qılmalıdır

Fərdlərin sayı, imamla birlikdə ۵ nəfər olmalıdır. Əgər beş nəfər müsəlman cəm .۲ .olmasa cümə namazı vacib olmaz

İmamət şərtlərinə malik olan imamın olması. Camaat namazı bölümündə gələcəyi .۳ kimi, imam camaat, ədalət və digər sifətlərə malik bir imam olmalıdır. Əks təqdirdə .cümə namazı vacib olmaz

:Cümə namazının səhih olmasının bir neçə şərti vardır

Camaatla qılınmalıdır, buna görə də fərdi qılınması səhih deyildir. Əgər məmum .۱ cümə namazının ikinci rəkətində rükudan əvvəl imama yetişib, iqtida edərsə kifayət edər, bir rəkətini də özü fürada qılmalıdır. Amma əgər ikinci rəkətin rükusunda imama qoşularsa, ehtiyat-vacibə görə bu cümə namazına kifayət edə bilməz gərək zöhr .namazını qılsın

Namazdan qabaq iki xütbə oxunmalıdır. Birinci xütbədə Allaha həmd-səna deyilib, .۲ təqvaya və günahlardan qorunmağa tövsiyyə edilərək Qurandan qısa bir surə oxunur. İkinci xütbədə də Allaha həmd-səna edib Rəsuli-əkrəmə (səlləllahu ələyhi və alihi və səlləm) və müsəlmanların imamlarına (on iki imam) salavat göndərməlidir. Ehtiyat-müstəhəb budur ki, mömin kişi və qadınların da Allahdan bağışlanmalarını istəsin. Xütbələrin namazdan əvvəl oxunması lazımdır. Əgər iki xütbədən qabaq namaza başlayarsa, səhih deyildir. Xütbələrin zöhrdən (zöhr azanından) qabaq oxunması işkallıdır. Xütbə oxuyan imam xütbə oxuyarkən, ayaq üstə durmalıdır. Əgər oturan halda oxusa səhih deyildir. Həmçinin iki xütbə arasında azacıq oturaraq fasilə verməsi lazımdır. Belə ki, bu oturmanın qısa və müxtəsər olması gərəkdir. Xütbəni imam camaatın özü oxumalıdır. Allaha həmd-səna etmək və Peyğəmbəri-əkrəm (səlləllahu ələyhi və alihi və səlləm) ilə müsəlmanların imamlarına (on iki imama) salavat göndərmək, ehtiyata əsasən ərəb dilində olmalıdır. Amma yerdə

qalanların ərəb dilində olması şərt deyildir. Hətta əgər namazda hazır olanların çoxu ərəbcə bilmirlərsə, ehtiyat-lazıma əsasən təqvaya dəvət etmək hazır olanların dilində .olması gərəkdir

İki cümə namazı arasında olan məsafə bir fərsəxdən az olmamalıdır. Buna əsasən .۳ də bir fərsəxdən az bir məsafədə ayrı bir cümə namazı da qılınarsa, belə ki, hər ikisi də eyni zamanda başlanarsa, hər ikisi batildir. Amma əgər biri, hətta təkcə təkbirətül-ehramı o birindən əvvəl demiş olsa, birincisi səhih, ikincisi isə batildir. Bununla belə, əgər cümə namazı qılındıqdan sonra, bir fərsəxdən az bir məsafədə ondan əvvəl və ya onunla eyni zamanda ayrı bir cümə namazının da qılındığı aşkar olarsa, zöhr namazını qılmaq vacib deyildir. Zikr olunmuş məsafə daxilində bir cümə namazının qılınması, digər bir cümə namazına, yalnız özünün bütün şərtlərinə malik olub, səhih olduğu .təqdirdə maneəli olur. Əks təqdirdə mane olmaz

Məsələ ۷۲۰: Şərtlərə mövcud olan bir cümə namazı qılınarsa və əgər onu qılan Məsum İmamın (ələyhis-salam) özü və ya onun təmsilçisi (nümayəndəsi) olsa, o cümə namazında iştirak etmək vacibdir. Əks təqdirdə iştirak etmək vacib deyildir. Birinci .təqdirdə də bir neçə qrup adama iştirak etmək vacib deyil

.Qadınlar .۱

.Qullar .۲

Müsafir hətta onun vəzifəsi, namazını tamam qılması olsa belə (iqamə qəsdində olan .۳ .(müsafir kimi

.Xəstələr, korlar və qocalar .۴

.Cümə namazı qılınan yerlə onların arasındakı məsafə iki fərsəxdən artıq olanlar .۵

.Yağış, şiddətli külək və buna oxşar maneələrlə üzləşən şəxs .۶

Məsələ ۷۲۱: Cümə namazı vacib olan bir şəxs onun yerinə zöhr namazını qılsa, namazı .səhihdir

## CÜMƏ NAMAZI HAQDA BİR NEÇƏ HÖKM

Qeyd olunanlara əsasən, cümə namazı imamın (əleyhis-səlam) qaib olduğu . ۱
.zamanda vacibi-təyini deyil; vaxtın əvvəlində də zöhr namazını qılmaq olar

İmamın xütbə oxumağa məşğul olduğu zaman danışmaq məkruhdur və əgər . ۲
.xütbəni eşitməyə mane olarsa, ehtiyat olaraq icazəli deyildir

Ehtiyat-vacibə əsasən hər iki xütbəni dinləmək lazımdır. Amma xütbənin mənasını .۳
.bilməyən şəxslərin dinləməsi vacib deyildir

.İmamın xütbə oxuduğu zaman hazır olmaq vacib deyildir .۴

## MƏĞRİB VƏ İŞA NAMAZLARININ VAXTI

Məsələ ۷۲۲: Əgər insan, günəşin batıb-batmamasında şəkk etsə və dağların, binaların, ya ağacların arasında olmasına ehtimal versə, günəşin batmasından sonra, günçıxan tərəfdə zahir olan qırmızılığın, başın üzərindən günbatana doğru keçməsindən qabaq, məğrib namazı qılınmamalıdır. Əgər şəkk etməsə də ehtiyat-vacibə görə deyilən vaxta .qədər gözləməlidir

Məsələ ۷۲۳: Məğrib və işa namazlarının vaxtı, sərbəst olan şəxs üçün, gecə yarısına qədərdir. Amma üzrlü olan bir şəxs üçün məsələn, unutmaq, yuxuya qalmaq və ya heyzli olmaq və buna bənzər bir səbəbdən, namazı gecə yarısına qədər qılmamışdırsa məğrib və işa namazlarının vaxtı sübh açılana qədər davam edər. Ancaq hər surətdə, qafil olmadığı halda bu iki namaz arasında tərtibə riayət etmək şərtdir. Yəni işa namazı qəsdən məğrib namazından qabaq qılınarsa, batildir. Amma əgər gecə yarısına, yalnız işa namazını qıla biləcək qədər vaxt qalmışdırsa, gərək işa namazını məğrib .namazından qabaq qılsın

Məsələ ۷۲۴: Əgər bir şəxs səhvən işa namazını məğrib namazından qabaq qılsa və namazdan sonra başa düşsə, namazı səhihdir. Məğrib namazını ondan sonra .qılmalıdır

Məsələ ۷۲۵: Əgər məğrib namazını qılmamışdan əvvəl, səhvən işa namazını qılsa və namaz əsnasında səhv etdiyini başa düşsə, belə ki, dördüncü rəkətin rükusuna getməyibsə, gərək niyyəti məğrib namazına döndərib namazı tamam etsin və sonra işa namazını qılsın. Əgər dördüncü rəkətin rükusuna getmişdirsə, işanı tamam edə .bilər və sonra məğribi yerinə yetirər

Məsələ ۷۲۶: İxtiyarı öz əlində olan şəxs üçün işa namazının axırıncı vaxtı gecə yarısıdır. .Gecə isə gün batandan sübh açılana qədərdir

Məsələ ۷۲۷: Əgər ixtiyar üzündən məğrib və ya işa namazını gecə yarısına qədər qılmasa, ehtiyat-vacibə əsasən, gərək sübh azanından qabaq, əda və qəza niyyəti .etmədən o namazı yerinə yetirsin

## SÜBH NAMAZININ VAXTI

Məsələ ۷۲۸: Sübh azanına yaxın gün çıxan tərəfdən bir ağartı yuxarıya tərəf hərəkət edir ki, ona «birinci fəcr» deyilir. O ağartı yayılan vaxt «ikinci fəcr» və sübh namazının .əvvəl vaxtıdır. Sübh namazının axır vaxtı günəşin çıxan vaxtıdır

## NAMAZ VAXTININ HÖKMLƏRİ

Məsələ ۷۲۹: İnsan, yalnız vaxtın daxil olduğuna yəqin etdiyi və ya iki nəfər adil kişinin vaxtın daxil olduğunu xəbər verdikləri zaman, namaz qılmağa başlaya bilər. Hətta əmin olduğu təqdirdə, namaz vaxtını şiddətlə və dəqiq şəkildə riayət edən şəxsin azan .oxuması və vaxtı bilən bir şəxsin sözü ilə kifayətlənə bilər

Məsələ ۷۳۰: Əgər bir şəxs bir maneə vasitəsilə, məsələn, kor və ya zindanda olduğuna görə namaz vaxtının əvvəlində, vaxtın daxil olub-olmadığını yəqin edə bilməsə, gərək namaz vaxtının daxil olmasına əmin olana, yaxud yəqinlik tapana qədər namazı tə`xirə salsın. Həmçinin ehtiyat-lazıma əsasən, əgər vaxtın daxil olmasına yəqinlik hasil etməyə maneə olan bir şey bulud, toz və bu kimi ümumi maneələrdən olarsa da .hökm eynidir

Məsələ ۷۳۱: Əgər insana, yuxarıda adı çəkilən yollardan biri ilə namaz vaxtının daxil olduğu sübut olub və namaza başlayarsa, sonra namaz əsnasında vaxtın hələ daxil olmadığını anlayarsa, namazı batildir. Əgər namazdan sonra bütün namazı vaxtından qabaq qılmış olduğunu bilərsə də, hökm eynidir. Amma əgər namaz əsnasında, vaxtın daxil olduğunu anlayarsa və ya namazdan sonra, namazda ikən vaxtın daxil olduğunu .bilərsə, namazı səhihdir

Məsələ ۷۳۲: Əgər insan, namaz vaxtının daxil olduğunu yəqin etməklə, namaza başlamalı olduğunu bilmədən namaz qılarsa, namazdan sonra bütün namazı vaxtında qıldığını anlayarsa, namazı səhihdir. Əgər namazı vaxtından əvvəl qıldığını başa düşsə, yaxud bilməsə ki, vaxtında qılıb, yaxud vaxtından qabaq, namazı batildir. Hətta əgər .namazdan sonra, vaxtın daxil olduğunu anlasa belə, o namazı yenidən qılmalıdır

Məsələ ۷۳۳: Əgər vaxtın daxil olmasını yəqin edib namaza başlasa və namaz əsnasında vaxtın daxil olub-olmamasında şəkk etsə, namazı batildir. Amma namaz əsnasında vaxtın daxil olmasına yəqin edib, qıldığı miqdarın vaxt daxilində olub-olmamasında .şəkk etsə, namazı səhihdir

Məsələ ۷۳۴: Əgər namazın vaxtı çox dar olsa və namazın müstəhəbb işlərindən bəzisini əmələ gətirdikdə, onun bir hissəsi vaxtdan sonra qılınacaqsa, gərək o müstəhəbbi işi əmələ gətirməsin. Məsələn, əgər qunutu deməklə namazın bir hissəsi vaxtdan sonra qılınacaqsa, gərək qunutu deməsin. Əgər deyərsə, namaz o vaxt səhih olar ki, ən azı .bir rəkəti vaxt daxilində qılınmış olsun

Məsələ ۷۳۵: Bir şəxsin bir rəkət namaz qılmaq miqdarında vaxtı olsa, gərək namazı əda .niyyəti ilə qılsın. Amma, gərək namazı qəsdən bu vaxta qədər təxirə salmasın

Məsələ ۷۳۶: Müsafir olmayan şəxsin, əgər gün batan vaxta kimi beş rəkət namaz qılmağa vaxtı vardırsa, gərək zöhr və əsr namazının hər ikisini tərtiblə qılsın. Əgər ondan az vaxtı vardırsa, gərək əvvəlcə əsr namazını qılsın və sonra zöhr namazını qəza etsin. Habelə əgər gecə yarısına kimi beş rəkətqılmağa vaxtı vardırsa, gərək məğrib və işa namazını tərtiblə qılsın. Əgər vaxtı ondan azdırsa, gərək əvvəlcə işa .namazını qılsın və sonra məğrib namazını əda və qəza niyyəti etmədən yerinə yetirsin

Məsələ ۷۳۷: Müsafir olan şəxsin, əgər gün batana qədər üç rəkət namaz qılmağa vaxtı vardırsa, gərək zöhr və əsr namazını tərtiblə qılsın. Əgər ondan az vaxtı vardırsa, gərək əvvəlcə əsr namazını qılsın və sonra zöhr namazını qəza etsin. Əgər gecə yarısına qədər dörd rəkət namaz qıla biləcək qədər vaxtı vardırsa, gərək məğrib və işa namazını tərtiblə qılsın. Əgər üç rəkət namaz qıla biləcək qədər vaxtı vardırsa, əvvəlcə işanı qılmalı, sonra da məğrib namazının bir rəkətini vaxtında qılması üçün, dərhal məğrib namazını qılmalıdır. Əgər üç rəkət namaz qılınacaq müddətdən daha az vaxt vardırsa, əvvəlcə işanı qılmalı, sonra da əda və qəza niyyəti etmədən, məğrib namazını yerinə yetirməlidir. Amma işa namazını qıldıqdan sonra, gecə yarısına bir rəkət qıla biləcək və ya daha çox vaxt qaldığı məlum olarsa, dərhal məğrib namazını .əda niyyəti ilə qılmalıdır

Məsələ ۷۳۸: Müstəhəbdir ki, insan namazı onun əvvəl vaxtında qılsın. Bu barədə çoxlu tövsiyələr olunmuşdur. Namaz nə qədər vaxtın əvvəlinə yaxın vaxtlarda qılınsa daha yaxşıdır. Amma namazı daha yaxşı bir cəhətə ğörə təxirə salmaq olar; məsələn: .gözləsin ki, namazı camaatla birlikdə qılsın. Fəzilət vaxtının keçməməsi şərti ilə

Məsələ ۷۳۹: Əgər insanın bir üzrü olub, vaxtın əvvəlində namaz qılmaq istədiyi təqdirdə təyəmmümlə namazı qılmağa naçardırsa, əgər üzrün vaxtın sonuna qədər qalacağına ,ehtimal versə və ya onun aradan qaldırılmasından ümidini kəsmişsə

vaxtın əvvəlində təyəmmüm edib namaz qıla bilər. Amma əgər üzrünün aradan qalxmasına ümidini kəsməmişsə, gərək üzrü aradan gedənə qədər və ya ümidini kəsənə qədər gözləsin. Əgər üzrü aradan qalxmazsa, vaxtın sonunda namaz qılmalıdır. Namazın yalnız vacib işlərini görə biləcək qədər gözləməsi lazım deyil. Azan, iqamə və qunut kimi namazın müstəhəblərini yerinə yetirə biləcək qədər vaxtı olduğu halda da təyəmmüm edib namazını müstəhəbbatı ilə birlikdə yerinə yetirə bilər. Lakin, təyəmmümdən başqa digər üzrlərdə üzrünün aradan qalxmasına ümid kəsməsə belə, namazı vaxtın əvvəlində qılması caizdir; amma vaxt sona çatmamışdan əvvəl üzrü .aradan qalxsa, o namazı yenidən qılması gərəkdir

Məsələ ۷۴۰: Namaz hökmlərini bilməyən, ya onları öyrənmədən namaza səhih şəkildə yerinə yetirə bilməyən və ya namazdakı şəkklər və səhvlərlə bağlı hökmləri bilməyən bir şəxs əgər namaz qıldığı vaxt bunlardan biri ilə qarşılaşacağına və hökmü öyrənmədiyi üzündən vacib bir hökmü tərk edəcəyinə və ya haram işə mürtəkib olacağına ehtimal verirsə, bunları öyrənmək üçün namazı vaxtın əvvəlindən təxirə salınmalıdır. Amma namazı düzgün bir şəkildə yerinə yetirmək ümidilə namaza vaxtın əvvəlində başlarsa, bu halda əgər hökmünü bilmədiyi bir Məsələ ilə qarşılaşmazsa, namazı səhihdir. Əgər hökmünü bilmədiyi bir məsələ ortaya çıxarsa, vəzifəsi olması ümidi ilə ehtimal verdiyi iki tərəfdən birinə əsasən əməl edərək, namazı tamamlaması caizdir; amma namazdan sonra məsələni soruşmalı, əgər namazı batil imişsə, yenidən .qılmalıdır. Əgər səhih imişsə, yenidən qılması lazım deyil

Məsələ ۷۴۱: Namaz vaxtının geniş olduğu bir müddətdə, tələbkar öz tələbini (namaz qılan şəxsdən) istəyərsə, mümkün olduğu təqdirdə, əvvəlcə öz borcunu verməli, sonra namaz qılmalıdır. Həmçinin, dərhal yerinə yetirməli olan ayrı bir vacib əməllə qarşılaşarsa, məsələn; məscidin nəcis olduğunu görərsə, əvvəlcə məscidi pak etməli və sonra namaz qılmalıdır. Hər iki təqdirdə də, əgər əvvəlcə namazı qılarsa, günah .etməsinə baxmayaraq, namazı səhihdir

## TƏRTİBLƏ QILINMALI OLAN NAMAZLAR

Məsələ ۷۴۲: İnsan gərək əsr namazını zöhrdən, işa namazını isə məğribdən sonra qılsın. Əgər bilərəkdən əsr namazını zöhrdən və işa namazını məğribdən əvvəl qılsa, .batildir

Məsələ ۷۴۳: Əgər zöhr namazı niyyəti ilə namaza başlayarsa və namaz əsnasında zöhr namazını qılmış olduğunu anlayarsa, niyyətini əsr namazına çevirə bilməz. Belə ki, .namazını pozub, əsr namazını qılmalıdır. Məğrib və işa namazlarında da hökm eynidir

Məsələ ۷۴۴: Əgər əsr namazında ikən zöhr namazını qılmadığını yəqin edərsə və niyyətini zöhr namazına çevirdikdən sonra zöhr namazını qılmış olduğunu xatırlarsa, niyyəti əsr namazına döndərib namazı tamamlaya bilər və əgər namazın bəzi qismlərini zöhr niyyəti ilə yerinə yetirməyibsə, yaxud əgər yerinə yetiribsə də, onları əsr niyyəti ilə yerinə yetiribsə, namazı sona çatdıra bilər. Amma əgər o qism (zöhr niyyəti ilə yerinə yetirmiş olduğu qism) rəkət olursa, namazı batildir. Həmçinin əgər .rüku və ya bir rəkətin iki səcdəsi olsa da, ehtiyat-lazıma əsasən namazı batildir

Məsələ ۷۴۵: Əsr namazında ikən, zöhr namazını qılıb-qılmadığında şəkk edərsə, o namazı əsr niyyəti ilə tamamlamalı, sonra da zöhr namazını qılmalıdır. Amma əgər vaxt, çox az olsa və namazın tamamlamasından sonra günəş batacaqsa və bir rəkət namaz qıla biləcək miqdarda belə, vaxt qalmazsa, zöhr namazını qəza etməsi lazım .deyildir

Məsələ ۷۴۶: İşa namazında ikən, məğrib namazını qılıb-qılmadığında şəkk edərsə, işa niyyəti ilə namazı tamamlamalı, sonra da məğrib namazını qılmalıdır. Amma əgər vaxt, çox az olsa və namazın tamamlanmasından sonra gecə yarısı olacaqsa və bir rəkət namaz qılacaq miqdarda belə, vaxt qalmazsa, məğrib namazını qəza etməsi lazım .deyil

Məsələ ۷۴۷: Əgər işa namazında, dördüncü rəkətin rükusuna çatdıqdan sonra, məğrib ,namazını qılıb-qılmadığında şəkk etsə

namazını tamamlamalıdır. Əgər sonradan məğrib namazı üçün vaxt qalsa, məğrib .namazını da qılmalıdır

Məsələ ۷۴۸: Əgər insan qıldığı namazı ehtiyat üzündən ikinci dəfə qılsa və namaz əsnasında yadına düşsə ki, qıldığı namazdan əvvəl qılası olduğu namazı qılmamışdır, niyyətini o namaza döndərə bilməz. Məsələn, əgər əsr namazını ehtiyat üzündən qılan .vaxt zöhr namazını qılmadığı yadına düşsə, niyyətini zöhr namazına çevirə bilməz

Məsələ ۷۴۹: Niyyəti qəza namazından əda namazına və müstəhəb namazından vacib .namaza döndərmək olmaz

Məsələ ۷۵۰: Əgər əda namazının vaxtı geniş olsa, insan namaz əsnasında onun boynunda qəza namazı olduğu yadına düşsə, niyyəti qəza namazına çevirə bilər. Amma niyyəti qəza namazına döndərməsi mümkün olmalıdır. Məsələn; zöhr namazını qılarkən, üçüncü rəkətin rükusuna çatmamışdırsa, niyyəti sübh namazının qəzasına .çevirə bilər

## MÜSTƏHƏB NAMAZLAR

Məsələ ۷۵۱: Müstəhəb namazlar çoxdur və onlara «nafilə» deyilir. Müstəhəb namazlardan gecə-gündüz nafilələrini qılmaq daha çox tövsiyə olunmuşdur. Onlar cümə günündən başqa günlərdə otuz dörd rəkətdir ki, səkkiz rəkəti zöhrün nafiləsi, səkkiz rəkəti əsrin nafiləsi, dörd rəkəti məribin nafiləsi, iki rəkəti işanın nafiləsi, on bir rəkət gecə nafiləsi və iki rəkət sübhün nafiləsidir. İşa namazının nafiləsinin iki rəkəti ehtiyat-vacibə əsasən oturan yerdə qılınmalı olduğuna görə bir rəkət hesab olunur. Amma cümə günündə zöhrlə əsrin nafiləsinin on altı rəkətinə dörd rəkətdə artırılır. Daha yaxşısı budur ki, bu iyirmi rəkəti zəvaldan qabaq yerinə yetirsin. Amma onun iki .rəkətini zəval vaxtı qılmaq yaxşıdır

Məsələ ۷۵۲: Gecə nafiləsinin on bir rəkətindən səkkiz rəkəti gecə nafiləsi niyyəti ilə, iki rəkəti şəf namazı niyyəti ilə, bir rəkəti «vitr» niyyəti ilə qılınmalıdır. Gecə nafiləsinin .kamil göstərişi dua kitablarında deyilmişdir

Məsələ ۷۵۳: Nafilə namazlarını hətta ixtiyar halında belə, oturan yerdə qılmaq olar. Oturaq halda qıldığı iki rəkət nafilə namazı bir rəkət hesablamaq da lazım deyil, amma yaxşı olar ki, ayaq üstə qılsın. İşa namazının nafiləsini isə ehtiyat-vacibə görə gərək .oturan halda qılsın

Məsələ ۷۵۴: Zöhr və əsr namazlarının nafiləsi səfər zamanı qılınmamalıdır. Amma .işanın nafiləsini rəca qəsdilə qılmağın eybi yoxdur

## GÜNDƏLİK NAFİLƏ NAMAZLARININ VAXTLARI

Məsələ ۷۵۵: Zöhr namazının nafiləsi zöhr namazından əvvəl qılınır. Onun vaxtı günortanın əvvəlindən başlayıb, onu günorta namazından əvvəl qılmağın mümkün olduğu zamana qədər davam edir. Ancaq əgər bir şəxs günortanın nafiləsini günortadan sonra görünməyə başlayan şaxisin kölgəsinin onun boyunun yeddidə ikisinə çatmasına qədər, yəni əgər şaxisin hündürlüyü yeddi qarışdırsa, kölgənin miqdarı iki qarışa çatarsa, artıq bu vaxtda günorta namazını nafilədən qabaq qılması daha yaxşıdır. Amma əgər nafilənin bir rəkətini ondan əvvəl qılıbsa, onda nafiləni .fərizədən (zöhrdən) əvvəl tamamlaması daha yaxşıdır

Məsələ ۷۵۶: Əsrin nafiləsi, əsr namazından qabaq qılınır. Onun vaxtı əsr namazından əvvəl qılma imkanı oluncaya qədər davam edər; ancaq əgər bir şəxs əsrin nafiləsini şaxisin kölgəsinin yeddidə dördünə yetişincəyə qədər tə`xirə salarsa, artıq əsr namazını nafilədən qabaq qılması daha yaxşıdır. Amma əvvəlki məsələdə deyilən hal .buraya da aiddir

Məsələ ۷۵۷: Şam nafiləsinin vaxtı şam namazının tamamlanmasından sonra, vaxt daxilində qılmaq imkanı olana qədər davam edir; lakin, bir şəxs onu günəşin batmasından sonra göy üzünün qərb tərəfində görünən qırmızılığın itdiyi zamana .qədər təxirə salsa, əvvəlcə işa namazını qılması daha yaxşıdır

Məsələ ۷۵۸: İşa nafiləsinin vaxtı işa namazının tamamlanmasından, gecə yarısına qədərdir. İşa namazından sonra gözləmədən dərhal qılınması daha yaxşıdır.

Məsələ ۷۵۹: Sübh nafiləsi sübh namazından əvvəl qılınır və onun vaxtı gecə namazı vaxtından gecə namazı qıla biləcək qədər bir müddət keçdikdən sonra başlayıb, onu sübh namazından əvvəl qılmağın mümkün olduğu zamana qədər davam edir. Amma əgər bir şəxs sübhün nafiləsini şərq tərəfdə qırmızılığın görünməsinə qədər təxirə salsa, bu vaxtda sübh namazını qılması daha yaxşıdır.

Məsələ ۷۶۰: Məşhur nəzərə əsasən, gecə namazının əvvəl vaxtı, gecə yarısıdır. Bunun əhvət və daha yaxşı olmasına baxmayaraq, gecənin əvvəlindən olması, vaxtının azandan başlayıb sübh azanına qədər davam etməsi uzaq nəzər deyil. Amma sübh azanına yaxın qılınması daha yaxşıdır.

Məsələ ۷۶۱: Əgər sübh açılan zaman oyansa, gecə namazını, əda və qəza niyyəti etmədən qıla bilər.

## ĞÜFEYLƏ NAMAZI

Məsələ ۷۶۲: Müstəhəb namazlardan biri də ğufeylə namazıdır ki, məğrib və işa namazları arasında qılınır. Onun birinci rəkətində Həmddən sonra surə əvəzinə bu ayə oxunur:

وَذَا النُّونِ إِذْ ذَهَبَ مُغَاضِباً فَظَنَّ أَنْ لَنْ نَقْدِرَ عَلَيْهِ فَنَادَى فِى الظُّلُمَاتِ أَنْ لاَ إِلهَ إِلاَّ أَنْتَ سُبْحَانَكَ إِنِّى كُنْتُ مِنَ الظَّالِمينَ. فَاسْتَجَبْنَا لَهُ وَ نَجَّيْنَاهُ مِنَ الغَمِّ وَكَذَالِكَ نُنْجِى الْمُؤْمِنِينَ.

Və zənnuni iz zəhəbə muğazibən fə zənnə ən lən nəqdirə ələyhi fə nada fizzulumati ən la ilahə illa əntə subhanəkə inni kuntu minəzzaliminə, fəstəcəbna ləhu və nəccəynahu minəl-ğəmmi və kəzalikə nuncil-muminin.

:İkinci rəkətdə isə həmddən sonra Surənin yerinə bu ayəni oxumalıdır

وَعِنْدَهُ مَفَاتِحُ الْغَيْبِ لاَ يَعْلَمُهَا إِلاَّ هُوَ وَيَعْلَمُ مَا فِى الْبَرِّوَ الْبَحْرِ وَمَا تَسْقُطُ مِنْ وَرَقَةٍ إِلاَّ يَعْلَمُهَا وَلاَحَبَّةٍ فِى ظُلُمَاتِ الْأَرْضِ وَلاَ رَطْبٍ وَلاَ يَابِسٍ إِلاَّ فِى كِتابٍ مُبِينٍ.

Və indəhu məfatihul-ğəybi la yələmuha illa huvə və yələmu ma fil-bərri vəl-bəhri və ma təsqutu min vərəqətin illa yələmuha və la həbbətin fi zulumatil-ərzi və la rətbin və :la yabisin illa fi kitabin mubin. Onun qunutunda isə belə deyilməlidir

أَللَّهُمَّ إِنِّى أَسَأَلُكَ بِمَفَاتِحِ الْغَيْبِ الَّتِى لاَيَعْلَمُهَا إِلاَّ أَنْتَ أَنْ تُصَلِّىَ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَأَنْ تَفْعَلَ بِى كَذَا وَ كَذَا

Əllahummə inni əsəlukə bi məfatihil-ğəybilləti la yələmuha illa əntə, ən tusəlliyə əla ;Muhəmmədin və Ali-Muhəmmədin və ən təf`ələ bi kəza və kəza

:Kəza və kəza” kəlmələrinin yerinə öz hacətlərini deyib sonra desin“

أَللَّهُمَّ أَنْتَ وَلِيُّ نِعْمَتِى وَالْقَادِرُ عَلَى طَلِبَتِى تَعْلَمُ حَاجَتِى فَأَسْأَلُكَ بِحَقِّ مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ عَلَيْهِ وَعَلَيْهِمُ السَّلاَمُ لَمَّا قَضَيْتَهَالِى.

Əllahummə əntə vəliyyu neməti, vəl-qadiru əla təlibəti, tələmu hacəti, fə əsəlukə bi həqqi Muhəmmədin və Ali-Muhəmməd, ələyhi və ələyhimussəlam ləmma qəzəytəha .li

## QİBLƏNİN HÖKMLƏRİ

**Point**

Məsələ ۷۶۳: Qiblə, əzəmətli Məkkə şəhərində yerləşən Kəbə evidir ki, yerin sonundan göylərin nəhayətinədək qiblədir. Gərək namaz, onunla üzbəüz duraraq qılınsın. Amma oradan uzaqda olan şəxs üzü qibləyə dursa, belə ki, "üzü qibləyə namaz qılır" desələr, kifayətdir. Həmçinin başqa işlər də (heyvan başının şəxsilməsi kimi) gərək üzü qibləyə .yerinə yetirilsin

Məsələ ۷۶۴: Vacibi namazı ayaq üstə qılan bir şəxs, gərək elə dayansın ki, üzü, sinəsi, qarnı və ayaqlarının qabağı üzü qibləyə olsun. Ehtiyat-müstəhəb budur ki, ayaqların .barmağı da üzü qibləyə olsun

Məsələ ۷۶۵: Oturan halda namaz qılmalı olan şəxsin sinəsi və qarnı qibləyə tərəf olmalı .və hətta üzü də qiblədən çox dönməməlidir

Məsələ ۷۶۶: Oturan halda namaz qıla bilməyən şəxs namaz halında ikən bədəninin ön qismi qibləyə tərəf olacaq şəkildə, böyrü üstə uzanmalıdır. Ehtiyat-lazıma əsasən sağ böyrü üstə uzanması mümkün olacaq təqdirdə, sol böyrü üstə uzanmamalıdır. Əgər bu ikisi də mümkün olmazsa, ayaqlarının altı qibləyə tərəf olacaq şəkildə, arxası üstə .uzandığı halda namaz qılmalıdır

Məsələ ۷۶۷: Ehtiyat namazı, yaddan çıxmış səcdə və təşəhhüd gərək üzü qibləyə yerinə yetirilsin. Ehtiyat-müstəhəbə görə səcdeyi-səhvni də üzü qibləyə yerinə .yetirmək gərəkdir

Məsələ ۷۶۸: Müstəhəbb namazı yol gedərkən və minik halında qılmaq olar. Əgər insan .bu iki halda müstəhəb namazı qılsa, üzü qibləyə olması lazım deyildir

Məsələ ۷۶۹: Namaz qılmaq istəyən şəxs, qiblənin hansı tərəfə olduğuna əmin oluncaya və ya (iki adilin şəhadət verməsi kimi) yəqin hökmündə olan bir dəlil əldə edincəyə qədər qibləni təyin etmək üçün çalışmalıdır. Əks təqdirdə, müsəlmanların

məscidlərinin mehrablarından, möminlərin məzarlarından və ya buna bənzər digər yollardan əldə edilən gumanə görə əməl etməlidir. Hətta elmi qaydalara əsasən qibləni tanıyan bir kafir və ya fasiqin sözündən qibləni tanımaq güman edilərsə də, .kifayətdir

Məsələ ۷۷۰: Qiblənin hansı istiqamətdə olmasına gümanı olan bir şəxs daha güclü güman tapa bilərsə, öz gümanına əməl etməməlidir. Məsələn, əgər qonaq, ev sahibinin dediyinə əsasən qibləyə güman tapsa, amma başqa yolla daha bir güclü .güman əldə edə bilsə, onun sözünə əməl etməməlidir

Məsələ ۷۷۱: Əgər qibləni tapması üçün bir vəsilə yoxdursa, yaxud çalışmaqla bir gümana gələ bilmirsə, bir tərəfə namaz qılsa kifayətdir. Amma ehtiyat-müstəhəbə .əsasən namaz vaxt geniş olduğu təqdirdə, dörd tərəfə namaz qılmalıdır

Məsələ ۷۷۲: Əgər qiblənin iki tərəfdən biri olduğunu yəqin və ya guman edərsə, hər iki .tərəfə də namaz qılmalıdır

Məsələ ۷۷۳: Bir neçə tərəfə namaz qılmaq istəyən şəxs, əgər zöhr və əsr namazı kimi, biri digərindən sonra qılınmalı olan iki namaz qılmaq istəyərsə, birinci namazı neçə .tərəfə qılacaqsa, qılmalı və daha sonra ikinci namaza başlaması ehtiyat-müstəhəbdir

Məsələ ۷۷۴: Qibləyə yəqinliyi olmayan şəxs, əgər namazdan başqa bir iş görmək istəsə, gərək o işi üzü qibləyə əmələ gətirsin. Məsələn; bir heyvanın başını kəsmək istəsə, gümanına əməl etsin və əgər güman mümkün deyildirsə, hansı tərəfə əncam .versə, səhihdir

## NAMAZDA BƏDƏNİN ÖRTÜLMƏSİ

Məsələ ۷۷۵: Kişi gərək namaz halında, hətta əgər bir şəxs onu görməsə də, övrəteynini .örtsün. Daha yaxşı olar ki, göbəkdən dizlərə qədər örtsün

Məsələ ۷۷۶: Qadın gərək namaz halında bədənini tamamilə, hətta başını və saçını örtsün. Ehtiyat-vacib budur ki, bədənini özündən də örtsün. Belə ki, əgər çadraya

bədənini görsə, işkallıdır. Amma üzünü, əllərini biləyə kimi və ayaqlarını topuğuna kimi örtməsi lazım deyildir. Amma vacib olan miqdarın örtüldüyünə yəqin etməsi üçün, .gərək üzün ətrafının bir qədərini və biləkdən bir qədər aşağını da örtsün

Məsələ ۷۷۷: İnsan unudulmuş səcdənin və ya unudulmuş təşəhhüdün qəzasını yerinə yetirirsə, gərək özünü namaz vaxtı olduğu kimi örtsün. Ehtiyat-müstəhəb budur ki, .səcdeyi-səhvi yerinə yetirərkən də özünü örtsün

Məsələ ۷۷۸: Əgər insan qəsdən namazda övrətini örtməsə, namazı batildir, əgər məsələni bilməmək üzündən örtməsə, belə ki, əgər onun bilməməzliyi məsələni öyrənməkdə səhlənkarlığa görə olubsa, ehtiyat-vacibə görə gərək namazını yenidən .qılsın

Məsələ ۷۷۹: Əgər insan, namazda ikən övrət yerinin açıq olduğunu anlayarsa, onu örtməlidir. Bu namazı yenidən qılması da lazım deyil. Amma ehtiyat-vacibə əsasən, övrət yerinin açıq olduğunu bildiyi halda, namazdan bir şey yerinə yetirməməlidir. Amma əgər namazdan sonra, namaz halında ikən övrət yerinin açıq olduğunu .anlayarsa, namazı səhihdir

Məsələ ۷۸۰: Əgər ayaq üstə duran halda paltarı övrətini örtsə, amma başqa hallarda, məsələn, rüku və səcdə halında örtməsə, belə ki, övrəti açıq olan vaxtda bir vəsilə ilə onu örtsə, onun namazı səhihdir. Amma ehtiyat-müstəhəbb budur ki, o paltarla namaz .qılmasın

Məsələ ۷۸۱: İnsan namaz üçün özünü ot və ağac yarpağı ilə örtə bilər. Amma ehtiyat-.müstəhəb budur ki, libası olmadıqda özünü bunlarla örtsün

Məsələ ۷۸۲: İnsan çarəsiz qalıb, öz övrət yerini örtməyə bir şey tapmasa, övrətinin .dərisi bəlli olmamaq üçün ona palçıq və palçığa bənzər şey sürtərək örtə bilər

Məsələ ۷۸۳: Əgər şəxsin namazda özünü örtəcək bir şeyi yoxdursa, onu tapmaqdan ümidi kəsilməmişsə, ehtiyat-vacib budur ki, namazını vaxtın axırına qədər təxirə salsın. Bu halda əgər bir şey tapmazsa, vaxtın sonunda namazını vəzifəsinə uyğun

olaraq qıla bilər. Amma əgər tapacağından ümidini kəsibsə namazını vaxtın əvvəlində .vəzifəsinə uyğun qıla bilər

Əgər bu halda namazı vaxtın əvvəlində qılsa və ondan sonra üzrü aradan qalxsa, .yenidən qılması lazım deyil

Məsələ ۷۸۴: Namaz qılmaq istəyən şəxs əgər özünü örtmək üçün hətta ağac yarpağı, ot, palçıq və lığ belə tapmasa və vaxtın sonuna qədər özünü örtəcək bir şey tapacağından ümid kəsmiş olsa, əgər ağlı kəsən bir şəxsin onu görməyəcəyindən əmindirsə, ayaqüstə, adi şəkildə rüku və səcdələrlə namaz qıla bilər. Amma əgər ağlı kəsən bir şəxsin onu görəcəyinə ehtimal verirsə, övrəti açıq olmayacaq bir şəkildə məsələn, oturan halda namaz qılması gərəkdir. Əgər özünü ağlı kəsən bir kəsin nəzərindən saxlamaq üçün ayaq üstə durmağa, rüku və səcdəni tərk etməyə məcbur olsa, yəni hər üç halda onu görəcəklərsə, oturub rüku və səcdəni işarə ilə yerinə yetirər. Əgər bu üç şeydən yalnız birini tərk etməyə məcburdursa, elə təkcə onu tərk etməlidir. Deməli əgər ayaq üstə dayana bilsə rüku və səcdəni işarə ilə yerinə yetirməlidir. Əgər ayaq üstə dayanmaq (ovrətin) görünməsinə səbəb olsa, oturub rüku və səcdəni yerinə yetirməlidir. Bu surətdə ehtiyat-müstəhəb budur ki, həm bu cür oturub namaz qılsın, həm də ayaq üstə rüku və səcdəni işarə etməklə qılsın. Ehtiyat-lazıma əsasən, lüt olan şəxs namaz halında övrətini əzalarının bəzisi ilə örtməlidir. .Məsələn, oturduğu zaman budları ilə, ayaq üstə ikən əlləri ilə onu örtə bilər

## NAMAZ QILANIN PALTARININ ŞƏRTLƏRİ

:Məsələ ۷۸۵: Namaz qılanın paltarının altı şərti vardır

.Pak olsun .۱

.Ehtiyat-vacibə əsasən mübah olsun .۲

.Murdarın (ölü heyvan) üzvlərindən olmasın .۳

Yırtıcı heyvandan olmasın, hətta ehtiyat-vacibə əsasən əti haram heyvandan . ۴ .olmasın

.Əgər namaz qılan kişidirsə, onun paltarı xalis ipəkdən və qızıllı parçadan olmasın .۵-۶

## BİRİNCİ ŞƏRT

Məsələ ۷۸۶: Namaz qılanın paltarı gərək pak olsun. Əgər bir kəs ixtiyari şəkildə nəcis bədənlə və libasla namaz qılsa, namazı batildir.

Məsələ ۷۸۷: Şəri məsələni öyrənməkdə səhlənkarlıq üzündən, nəcis bədən və libası ilə namazın batil olduğunu bilməyən, yaxud məsələn məninin nəcis olduğunu bilməyən şəxs, əgər nəcis bədən və ya libasla namaz qılarsa, ehtiyat-vacib əsasən gərək namazı yenidən (pak libas və bədənlə) qılsın, vaxtı keçibsə qəzasını etsin.

Məsələ ۷۸۸: Əgər məsələni bilmədiyinə görə nəcis bədən və ya paltarda namaz qılsa, və məsələni öyrənməkdə səhlənkarlıq etməmiş olsa, namazını yenidən qılması və ya qəza etməsi lazım deyil.

Məsələ ۷۸۹: Əgər bir şəxs, bədən və ya libasının nəcis olmadığına əmin olsa və namaz qıldıqdan sonra, nəcis olduğunu anlayarsa, namazı səhihdir.

Məsələ ۷۹۰: Bədən və ya paltarının nəcis olduğunu unudaraq namaz əsnasında və ya namazdan sonra vəziyyətini xatırlasa, əgər onun unutması öz etinasızlıq və səhlənkarlığından baş vermişsə, ehtiyat-lazıma əsasən o namazı yenidən qılmalıdır. Əgər vaxt keçmişsə, namazın qəzasını əmələ gətirməlidir. Əks təqdirdə namazı yenidən qılması lazım deyil. Amma əgər namaz əsnasında yadına düşsə, sonrakı məsələdə izah olunacaq hökmə görə əməl etməlidir.

Məsələ ۷۹۱: Vaxt geniş ikən namaz qılmaqda olan bir şəxs namaz əsnasında bədən və ya libasının nəcis olduğunu bilsə və namaza başladıqdan sonra nəcis olduğuna ehtimal verərsə, bədən və ya libasını yuyacağı, ya da libasını çıxaracağı və ya dəyişdirəcəyi təqdirdə namaz pozulmazsa, namazda ikən bədən və ya libasını yumalı və ya libasını dəyişdirməli, ya da övrət yerini örtən başqa bir şey varsa, o libasını çıxarmalıdır. Amma əgər bədən və ya libasını yuduğu və ya çıxardığı ya da libasını dəyişdirdiyi zaman namaz pozulacaq haldadırsa, yaxud libasını

çıxarmağı ilə çılpaq qalacaqsa, ehtiyat-lazım budur ki, o namazı pak paltarla yenidən .qılsın

Məsələ ۷۹۲: Vaxt dar ikən namaz qılmaqda olan bir şəxs, əgər namazda ikən paltarının nəcis olduğunu bilsə və namaza başladıqdan sonra nəcis olduğuna ehtimal verərsə, paltarını yumaq, dəyişdirmək və ya çıxarmaq namazı pozmayacaq bir halda olsa və libasını çıxara bilirsə, o libası yumalı və ya dəyişdirməli, ya da övrət yeri başqa bir şey ilə örtülüdürsə, libası çıxararaq namazı tamamlamalıdır. Amma əgər övrət yerini ayrı bir şey örtməmişsə və libası yumağa və ya dəyişməyə imkanı da yoxdursa, həmin .paltarla namazı tamamlamalıdır

Məsələ ۷۹۳: Vaxt dar ikən namaz qılmaqda olan bir şəxs, əgər namaz qılmaqda ikən bədəninin nəcis olduğunu bilsə, namaza başladıqdan sonra nəcis olduğuna ehtimal verərsə, bədəni yumaq namazı pozmazsa, yumalıdır. Amma əgər namazı pozacaq .haldadırsa, o halla namazı tamamlamalıdır və həmin namaz səhihdir

Məsələ ۷۹۴: Bədən və ya libasının pak olub-olmadığında şəkk edən şəxs, əgər axtarıb, onda bir şey tapa bilməsə və namaz qılsa, və namazdan sonra bədən və ya libasının nəcis olduğunu başa düşərsə, namazı səhihdir. Əgər axtarış etməmişdirsə ehtiyat-.lazıma əsasən namazını yenidən qılmalıdır. Əgər vaxt keçmişdirsə, qəza etməlidir

Məsələ ۷۹۵: Əgər paltarını suya çəkdikdən sonra paklığına əmin olaraq, onunla namaz .qılsa və namazdan sonra pak olmamış olduğunu anlayarsa, namazı səhihdir

Məsələ ۷۹۶: Əgər bədən və ya libasında qan gördükdə, o qanın nəcis olmayan qanlardan olmadığına əmin olarsa, məsələn; ağcaqanad qanı olduğuna əmin olarsa və namazdan sonra, o qanın namaz qılına bilməyən qanlardan olduğunu anlayarsa, .namazı səhihdir

Məsələ ۷۹۷: Əgər bədən və ya libasında olan bir qanın, namazı batil etməyən nəcis qanlardan olduğuna əmin olarsa, məsələn; çiban və ya yara qanı olduğuna əmin olsa və namazdan sonra, namazı batil edən qanlardan olduğunu anlayarsa, namazı

Məsələ ۷۹۸: Əgər bir şeyin nəcis olduğunu unudarsa və bədən və ya libası islaq olaraq, ona yetişərsə, belə ki, unutduğu halda namaz qıldıqdan sonra xatırlayarsa, namazı səhihdir. Amma əgər bədəni, islaq olaraq nəcis olduğunu unutduğu bir şeyə dəyərsə və onu yumadan qüsl edib namaz qılarsa, qüsl və namazı batildir. Amma əgər qüsl etməklə bədəni də pak olacaq və su nəcis olmayacaq halda olsa, məsələn, cari suda qüsl etsə, onun qüslü və namazı batil olmaz. Həmçinin əgər dəstəmaz üzvlərindən bir yeri, islaq olaraq nəcis olduğunu unutduğu bir şeyə dəyərsə və onu yumadan dəstəmaz alıb namaz qılarsa, dəstəmaz almaqla bədəni də pak olacaq su da nəcis .olmayacaq halda olmasa, dəstəmazı və namazı batildir

Məsələ ۷۹۹: Təkcə bir libası olan şəxsin bədən və libası nəcis olduqda, yalnız onlardan birini yumağa yetəcək qədər suyu olarsa, ehtiyat-lazıma əsasən bədənini yumalı və nəcis libası ilə namaz qılmalıdır. Bu halda libasını yuyub, nəcis bədənlə namaz qılması icazəli deyildir. Amma libasının nəcasəti daha çox və ya daha şiddətli olduğu təqdirdə, .hər hansı birini yumaq xüsusunda ixtiyar sahibidir

Məsələ ۸۰۰: Nəcis libasdan başqa bir libası olmayan şəxs, nəcis libasla namaz .qılmalıdır. Belə olan təqdirdə namazı səhihdir

Məsələ ۸۰۱: İki ədəd libası olan şəxs, əgər onlardan birinin nəcis olduğunu bilirsə, lakin dəqiq şəkildə hansı birinin nəcis olduğunu bilməzsə, vaxtı vardırsa, onların hər ikisi ilə də namaz qılmalıdır. Məsələn; zöhr və əsr namazını qılmaq istəyirsə, onların hər birisi ilə bir zöhr və bir əsr namazı qılması lazımdır. Amma əgər vaxt az olsa, və onlardan heç biri ehtimalın güclü və əhəmiyyətli olması baxımından üstünlüyə malik olmasa, hər biri .ilə namaz qılsa, kifayətdir

## İKİNCİ ŞƏRT

Məsələ ۸۰۲: Namaz qılan şəxsin övrəteyni örtdüyü libası ehtiyat-vacibə əsasən mübah olmalıdır. Qəsbi libası geyməyin

haram olduğunu bilən bir şəxs və ya məsələnin hökmünü bilməməsi öz təqsiri üzündən olan bir şəxs, qəsdən qəsbi libas ilə namaz qılarsa, ehtiyata əsasən namazı batildir. Amma təklikdə övrəti örtə bilməyən şeylərin və ya təkcə övrəti örtməsi mümkün olsa belə, namaz qılanın cibinə qoyduğu dəsmal və şal kimi, hal-hazırda geymədiyi şeylərin və həmçinin üzərində (mübah olan ayrı bir geyimi olduğu halda) namaz qılanın geymiş olduğu şeylərin qəsb olmasının namaza bir zərəri yoxdur. Amma .ehtiyat budur ki, namaz qılan bunlardan da çəkinsin

Məsələ ۸۰۳: Qəsbi libası geyməyin haram olduğunu bildiyi halda, onunla namaz qılmağın hökmünü bilməyən bir şəxs, əgər qəsdən qəsbi libasla namaz qılarsa, əvvəlki .məsələdə deyildiyi kimi, ehtiyata əsasən namazı batildir

Məsələ ۸۰۴: Əgər paltarının qəsbi olmasını bilməsə və ya unutsa və onunla namaz qılsa, namaz səhihdir. Amma əgər bir şəxs özü paltarı qəsb etsə və qəsb etməsini .unudub onunla namaz qılsa, ehtiyata əsasən namazı batildir

Məsələ ۸۰۵: Paltarının qəsbi olduğunu bilməyən və ya unudan şəxs namazda ikən bunu anlayarsa, əgər başqa bir şey övrət yerini örtsə, dərhal və ya namazın muvalatı pozulmadan o paltarı çıxara bilərsə, onu çıxartmalı və namazı davam etdirməlidir. Ancaq ayrı bir şey övrətini ağlı kəsən adamdan örtməyibsə və ya dərhal qəsbi paltarı .çıxara bilmirsə, namazı elə həmin paltarda davam etdirməlidir və namazı səhihdir

Məsələ ۸۰۶: Əgər bir şəxs canını qorumaq üçün qəsbi paltarla namaz qılsa, belə ki, vaxtın axırına qədər ayrı bir paltarla namaz qıla bilməsə, yaxud onu geyməyə çarəsiz olması özünün tədbirsizliyi ucbatından olmasa, məsələn, özü qəsb etməmiş olsa, namazı səhihdir. Həmçinin oğrunun qəsbi paltarı apara bilməməsi üçün onunla namaz qılsa, və vaxtın axırına qədər başqa paltarla namaz qıla bilməsə, yaxud qəsbi paltarı, .ilk fürsətdə sahibinə çatdırmaq üçün geyibsə, namazı səhihdir

Məsələ ۸۰۷: Əgər xümsü verilməyən pul ilə paltar alsa, amma onun pulu ümumi halda zimməsində olsa, (necə ki, əksər müamilələr belədir) paltar onun üçün halaldır və verdiyi pulun xümsünü borclu olur. Amma əgər xümsü verilməmiş pulun özü

ilə paltar alsa o paltar ilə şəriət hakiminin icazəsi olmadan namaz qılmağın hökmü, .qəsbi paltarla namaz qılmağın hökmü ilə eynidir

## ÜÇÜNCÜ ŞƏRT

Məsələ ٨٠٨: Namaz qılanın təklikdə övrət yerini örtən paltarı atıcı qanı olan (yəni damarı kəsildikdə qanı sıçrayan) ölmüş heyvanın üzvlərindən olmamalıdır. Bu şərt ehtiyat-vacibə əsasən, təklikdə övrəti örtməyən libasda da sabitdir. Amma ilan kimi qanı atıcı olmayan ölmüş heyvandan paltar hazırlansa, ehtiyat-müstəhəb budur ki, .onunla namaz qılınmasın

Məsələ ٨٠٩: Murdarın bir üzvü, ət və dəri kimi ruhu olan bir şey namaz qılanın üstündə .olarsa, namazı səhihdir

Məsələ ٨١٠: Əgər əti halal murdarın tük və yunu kimi ruhu olmayan bir şey namaz .qılanın yanında olsa, yaxud onunla hazırlanmış paltarla namaz qılsa, namazı səhihdir

## DÖRDÜNCÜ ŞƏRT

Məsələ ٨١١: Namaz qılanın corab kimi övrəti təklikdə örtməyən şeylərdən başqa paltarı yırtıcıların üzvlərindən, hətta ehtiyat-lazıma əsasən, ümumiyyətlə əti haram olan heyvandan olmamalıdır. Həmçinin, bədən və libas o heyvanın sidiyinə, nəcisinə, tərinə, südünə və tükünə bulaşmamalıdır. Amma heyvanın bir tükü paltarın üzərində olsa heç bir eybi yoxdur. Onlardan bir şey, misal üçün, qutuya qoyub özü ilə götürsə hökm .eynidir

Məsələ ٨١٢: Əgər pişik kimi əti haram olan heyvanın ağzının, burnunun suyu, yaxud başqa rütubəti yaş halda namaz qılanın bədənində, ya paltarında olsa, namazı batildir. .Əgər quru olsa və onun eyni aradan getsə, namazı səhihdir

Məsələ ٨١٣: Əgər bir şəxsin ağız suyu, təri və ya tükü namaz qılanın bədənində və ya libasında olarsa, eybi yoxdur. Həmçinin

.namaz qılanın yanında mirvari, mum və bal olarsa da, eyni hökmü daşıyır

Məsələ ٨١٤: Əgər bir şəxs libasının, əti halal və ya haram heyvandan hazırlandığı barədə şəkk edərsə, istər müsəlman ölkəsində hazırlanmış olsun, istərsə kafir .ölkəsində hazırlanmış olsun, onunla namaz qılmaq caizdir

Məsələ ٨١٥: Sədəfin, əti haram heyvanın üzvlərindən hazırlanmış olduğu məlum .olmadığından, insanın onunla namaz qılması icazəlidir

Məsələ ٨١٦: Namazda sincab dərisi geyinməyin eybi yoxdur. Amma ehtiyat-müstəhəb .budur ki, sincab dərisi ilə namaz qılınmasın

Məsələ ٨١٧: Əgər əti haram heyvandan olduğunu bilmədiyi və ya unutduğu bir paltarla .namaz qılarsa, namazı səhihdir

**BEŞİNCİ ŞƏRT**

Məsələ ٨١٨: Qızıldan toxunmuş paltar geymək kişiyə haramdır və onunla namaz qılsa, .batildir. Amma qadın üçün namaz və s. hallarda eybi yoxdur

Məsələ ٨١٩: Sinəyə qızıl zəncir taxmaq, barmağa qızıl üzük taxmaq, qola qızıl qolbağlı saat bağlamaq kişiyə haram və onunla namaz qılmaq batildir. Amma qadın üçün .namazda və qeyri vaxtlarda eybi yoxdur

Məsələ ٨٢٠: Əgər bir kişi, üzük və ya paltarının qızıldan olduğunu bilməsə və ya unudarsa, yaxud qızıldan olub-olmadığı haqda şəkk edərsə, onunla namaz qılarsa, .namazı səhihdir

**ALTINCI ŞƏRT**

Məsələ ٨٢١: Namaz qılan kişinin təklikdə övrətini örtə bilən paltarı, gərək xalis ipəkdən .olmasın. Namazdan digər vaxtlarda da onu geyinməsi haramdır

Məsələ ۸۲۲: Əgər paltarın astarının hamısı, yaxud bir hissəsi xalis ipəkdən olsa, onun .geyilməsi kişi üçün haram, onunla qılınan namaz da batildir

Məsələ ۸۲۳: Kişinin, xalis ipəkdən və ya başqa bir şeydən hazırlandığını bilmədiyi bir .paltarı geyinməsi icazəlidir. Onunla namaz qılmağın da eybi yoxdur

Məsələ ۸۲۴: İpək dəsmal və bu kimi şeylər kişinin cibində olsa eybi yoxdur, namazı da .batil etmir

.Məsələ ۸۲۵: Qadın üçün namaz və ya başqa vaxtda xalis ipək geyməyin eybi yoxdur

Məsələ ۸۲۶: Çarəsizlik halında, xalis ipək və ya qızıldan hazırlanan libasın geyilməsinin eybi yoxdur. Həmçinin, libas geyməkdə çarəsiz qalan bir şəxsin, bundan başqa bir .paltarı yoxdursa, bu paltarlarla namaz qıla bilər

Məsələ ۸۲۷: Əgər qəsbi ya xalis ipək və ya qızıldan toxunan paltardan başqa bir paltarı yoxdursa və paltar geyinməyə zərurət duymursa, gərək çılpaqlara aid göstərişə əməl .etsin və namaz qılsın

Məsələ ۸۲۸: Yırtıcı heyvandan hazırlanmış paltardan başqa bir paltarı olmayan şəxs əgər paltar geymək məcburiyyətindədirsə, vaxtın axırına qədər məcburiyyət öz halında qalsa, o paltarla namaz qıla bilər. Amma əgər paltar geymək məcburiyyətində deyilsə, çılpaqlar üçün söylənən təlimat üzrə namaz qılmalıdır. Həmçinin yırtıcı olmayan, amma əti haram olan heyvandan hazırlanan libasdan başqa bir paltarı olmayan şəxs əgər paltar geymək məcburiyyətində olmazsa, ehtiyat-lazıma əsasən iki namaz qılmalıdır bir dəfə o paltarla, bir dəfə də çılpaqlar üçün deyilən göstərişə .əsasən namaz qılmalıdır

Məsələ ۸۲۹: Namazda övrət yerini örtmək üçün bir şeyi olmayan şəxs, kirayə etməklə və ya satın almaqla olsa belə, bunu hazırlaması vacibdir. Amma onu hazırlamaq, əlində olan pula nisbətən çox pul tələb edirsə və ya pulu paltar üçün xərcləməsi onun halına .zərər verəcəkdirsə, çılpaqlara aid olan göstərişə əsasən, namaz qıla bilər

Məsələ ٨٣٠: Paltarı olmayan şəxsə başqası paltar bağışlayarsa və ya ariyəyə verərsə, əgər bunu qəbul etmək onun

üçün çətin deyilsə, qəbul etməlidir. Hətta icarə və ya hədiyyəni tələb etmək onun üçün .çox çətin deyilsə, libası olan şəxsdən icarə və ya hədiyyəni tələb etməlidir

Məsələ ۸۳۱: Parçası, rəngi və ya modeli ona uyğun olmayan bir libası geymək, onun hörmətsizliyinə və xar olmasına səbəb olduğu təqdirdə, haramdır. Amma o libasla .namaz qılarsa, satiri (örtüyü) təkcə o olsa belə, namazı səhihdir

Məsələ ۸۳۲: Kişinin qadın paltarı geyinməsi və qadının kişi paltarı geyinməsi, haram deyil, onunla namaz qılmaq da batil deyil. Amma ehtiyat-vacibə əsasən kişinin özünü .qadın formasına, qadının da özünü kişi formasına salması icazəli deyil

Məsələ ۸۳۳: Uzanmış halda namaz qılmalı olan şəxsin yorğan ya mələfəsinin namaz qılanın libasının şərtlərinə malik olması lazım deyil. Amma ona «geyinmişdir» deyiləcək .şəkildə, məsələn ona büründüyü təqdirdə onunla namaz qılmaq icazəli deyil

## NAMAZ QILANIN PALTAR VƏ BƏDƏNİNİN PAK OLMASININ LAZIM OLMADIĞI HALLAR

Məsələ ۸۳۴: Aşağıda izah olunacaq üç halda namaz qılanın bədən və ya paltarı nəcis :olarsa, namazı səhihdir

Bədənində olan yara, (cərahət) və ya çiban səbəbilə paltarı və ya bədəni qana .۱ ;bulaşarsa

Bədən və ya paltarı bir dirhəmdən az qana bulaşarsa, ehtiyat-vacibə görə dirhəm .۲ .şəhadət barmağının axır bəndi miqdarında hesablansın

;Nəcis paltar və ya bədənlə namaz qılmağa naçar olsa .۳

Bir halda da əgər namaz qılanın paltarı nəcis olsa, namazı səhihdir. Bu hal namaz qılanın corab və ərəqçin kimi kiçik paltarının nəcis olduğu haldır. Bu dörd halın .hökmləri, sonrakı məsələdə təfsilatı ilə deyiləcək

Məsələ ۸۳۵: Namaz qılanın bədəni və ya paltarında yara, cərahət və ya çiban qanı olarsa, o yara, cərahət və ya çiban

sağalıncaya qədər həmin qanla namaz qıla bilər. Həmçinin əgər qanla çirk gəlsə və ya yara üzərinə qoyulan dərman nəcis olarsa və onun paltar və ya bədənində olsa, hökm .eynidir

Məsələ ۸۳۶: Əgər tez yaxşılaşan və yuyulması asan olan bir kəsik və ya yaraya aid qan namaz qılanın bədən və ya paltarında olsa, dirhəm qədərində və ya ondan çox olsa .namazı batildir

Məsələ ۸۳۷: Əgər bədənin və ya paltarının yaraya uzaq olan bir yeri yaranın rütubəti ilə nəcis olsa, onunla namaz qılmaq icazəli deyildir. Amma əgər bədən və ya paltarının adi halda yaradan rütubət yetişəcək miqdarı o rütubətlə nəcis olsa, onunla namaz .qılmağın heç bir maneəsi yoxdur

Məsələ ۸۳۸: Əgər bavasir yarasından və ya ağız, burun və bu kimi üzvün içində olan yaradan gələn qan bir şəxsin bədən və ya paltarında olsa, onunla namaz qıla bilər. Ucu .çöldə olan bavasirlə daxildə olan arasında heç bir fərq yoxdur

Məsələ ۸۳۹: Bədəni yara olan bir şəxs, bədənində, yaxud paltarında dirhəmdən çox qan görüb yara qanı və ya başqa qan olduğunu bilməsə, ehtiyat-vacibə görə onunla .namaz qılmasın

Məsələ ۸۴۰: Əgər bədənin bir neçə yerində yara olsa və onlar bir-birinə çox yaxın olub bir yara hesab olunsalar, nə qədər ki, hamısı sağalmayıb, onlarla namaz qılmağın eybi yoxdur. Amma əgər hər biri ayrı bir yara sayılacaq qədər bir-birlərindən uzaq olarsa, .hansı yaxşılaşsa namaz üçün o yaradan bədən və paltara bulaşan qanı yumalıdır

Məsələ ۸۴۱: Əgər iynə ucu qədər heyz qanı namaz qılanın bədən və ya paltarında olarsa, namazı batildir. Ehtiyata görə donuz kimi eyni-nəcis olan heyvanın habelə, murdar və əti haram olan heyvanın qanı və nifas və istihazə qanı da eyni hökmü daşıyır. Amma insan qanı və ya əti halal olan heyvan qanı kimi digər qanlar bədənin bir neçə yerində olsa belə, birlikdə dirhəm miqdarından az olarsa, onunla namaz qılmağın .eybi yoxdur

Məsələ ٨۴٢: Astarsız paltara tökülüb arxasından çıxan qan, bir qan hesab edilir; hər tərəfin əhatəsi çox olsa, onu hesab etmək lazımdır. Amma əgər onun arxasına ayrıca bir qan dəymiş olsa, hər birisini ayrı hesab etmək gərəkdir. Deməli paltarının

üzü və arxasında görünən qan birlikdə bir dirhəmdən az olsa, onunla namaz qılmaq .səhihdir, əgər dirhəm qədər və ya ondan çox olsa namaz batildir

Məsələ ۸۴۳: Əgər qan astarlı paltarın üstünə tökülüb astarına da yetişərsə və ya astarına tökülüb üzünə də çıxarsa, ya bir paltardan digərinə dəysə, hər birini ayrı qan hesab etmək gərəkdir. Əgər birlikdə hesab etdikdə dirhəmdən az olsa, onunla namaz səhih, əks halda isə batildir. Amma əgər məsələn, xalq arasında bir qan sayılacaq qədər bir-birilə bitişik olarsa, sahəsi çox olan tərəfin qanı dirhəmdən az olarsa, onunla .namaz səhihdir. Əgər dirhəm qədər ya ondan çox olarsa, batildir

Məsələ ۸۴۴: Əgər bədən və ya paltarında olan qan dirhəmdən az olsa və ona bir rütubət dəyəndən sonra ətrafa yayılsa, o rütubət və qan birlikdə bir dirhəm miqdarınca olmazsa belə, onunla namaz batildir. Amma əgər rütubət yalnız qana .dəyib və ətrafa yayılmazsa, onunla namaz qılmağın heç bir maneəsi yoxdur

Məsələ ۸۴۵: Əgər bədən və ya paltar qana bulaşmayıb amma islaq olaraq qana dəyməsi nəticəsində nəcis olsa, nəcis olan miqdarın bir dirhəmdən az olmasına .baxmayaraq, onunla namaz qılmaq olmaz

Məsələ ۸۴۶: Əgər bədən və ya paltarda olan qan dirhəmdən az olsa və ona başqa bir nəcasət da dəyərsə, məsələn, onun üzərinə bir damla bövl tökülsə, o bədənin və ya paltarın pak bir yerinə də dəysə, onunla namaz qılmaq icazəli deyildir. Hətta bədən və ya paltarın pak bir yerinə dəyməyibsə belə, ehtiyat-lazıma əsasən onunla namaz .qılmaq səhih deyildir

Məsələ ۸۴۷: Namaz qılanın ərəqçin və corab kimi övrət yerini örtməyən kiçik paltarları nəcis olsa, əgər murdar və it kimi eyni-nəcis heyvandan düzəldilməmişsə, onlarla namaz səhihdir. Əgər nəcis murdardan, ya nəcis heyvandan düzəldilibsə, ehtiyat-vacibə əsasən onlarla namaz qılmaq batildir. Əgər nəcis üzüklə namaz qılarsa, heç bir .maneəsi yoxdur

Məsələ ۸۴۸: Namaz qılanın üstündə nəcis dəsmal, açar, bıçaq və buna bənzər şeylərin

.paltarın namaz qılanın üstündə olmasının namaza bir zərəri yoxdur

Məsələ ۸۴۹: Əgər onun bədən və ya paltarında olan qanın bir dirhəmdən az olduğunu bilərsə, amma namazda əfv olunmayan (icazə verilməyən) qanlardan olduğuna .ehtimal verərsə, o qanla namaz qılması caizdir

Məsələ ۸۵۰: Əgər paltar və ya bədənində olan qan bir dirhəmdən az olsa və əfv olunan (icazə verilən) qanlardan olduğunu bilmədən namaz qılsa, sonra da icazə verilməyən qanlardan olduğu məlum olsa, namazı yenidən qılmaq lazım deyil. Həmçinin əgər qanın bir dirhəmdən az olduğuna etiqad edib namaz qılsa və sonra da bir dirhəm miqdarında və ya daha çox olduğu məlum olarsa, o namazı yenidən qılmaq lazım .deyildir

## NAMAZ QILANIN PALTARINDA MÜSTƏHƏB OLAN ŞEYLƏR

Məsələ ۸۵۱: Fəqihlər (Allah onlara rəhmət eləsin!) namaz qılanın paltarında bir neçə şeyi müstəhəb bilmişlər: o cümlədən: təhtül-hənəki olan əmmamə qoymaq, əba və ağ .paltar geymək, ən pak paltar geymək, xoş ətirdən istifadə etmək, əqiq üzük taxmaq

## NAMAZ QILANIN PALTARINDA MƏKRUH OLAN ŞEYLƏR

Məsələ ۸۵۲: Fəqihlər (Allah onlara rəhmət eləsin!) bir neçə şeyi namaz qılanın paltarında məkruh bilmişlər. O cümlədən qara, çirkli, dar paltar geyinmək, şərab içənin ,paltarını geymək

nəcasətdan pəhriz etməyənin paltarını geymək, paltarın düymələrini açıq qoymaq, .üzərində şəkil olan üzüyü barmağa taxmaq və üzərində şəkil olan paltar geymək

## NAMAZ QILANIN YERİ

:Namaz qılanın məkanının yeddi şərti vardır

:Birinci şərt

.Ehtiyat-vacibə əsasən mübah olmalıdır

Məsələ ۸۵۳: Bir kəs qəsbi mülkdə namaz qılsa, əgər xalça və taxt, bu kimi şeylərin üstündə belə olsa, ehtiyat-lazıma əsasən namazı batildir. Amma qəsbi tavan altında .və qəsbi xeymədə namaz qılmağın maneəsi yoxdur

Məsələ ۸۵۴: Mənfəəti başqasının malı olan bir mülkdə oranın mənfəətinə sahib olan şəxsin icazəsi olmadan namaz qılmaq, qəsbi bir yerdə namaz qılmaq hökmündədir. Məsələn, kirayə edilmiş bir evdə, evin sahibi və ya başqa birisi, ev kirayələyən şəxsin .izni olmadan namaz qılarsa, ehtiyat-vacibə əsasən namazı batildir

Məsələ ۸۵۵: Bir kəs məsciddə otursa, əgər başqası onu kənar edib onun yerini işğal .etsə və o yerdə namaz qılsa, günah etməsinə baxmayaraq namazı səhihdir

Məsələ ۸۵۶: Qəsb edilmiş olduğunu bilmədiyi bir yerdə namaz qılarsa və namazdan sonra o yerin qəsb edilmiş olduğunu bilərsə və ya qəsb edilmiş olduğunu unutduğu bir yerdə namaz qılıb sonra xatırlayarsa, namazı səhihdir. Amma əgər özü qəsb .etmişdirsə, bunu unudaraq, orada namaz qılarsa, ehtiyata əsasən namazı batildir

Məsələ ۸۵۷: Əgər bir yerin qəsb edilmiş olduğunu və ondan istifadə etməyin haram olduğunu bilirsə, amma qəsb edilmiş yerdə namazın işkallı olduğunu bilməzsə və .orada namaz qılarsa, ehtiyata əsasən namazı batildir

Məsələ ۸۵۸: Vacib namazını minik üzərində qılmaq məcburiyyətində olan bir şəxsin əgər mindiyi heyvan və ya

yəhəri, ya da nalı qəsb edilmiş olarsa, ehtiyat-vacibə əsasən namazı batildir. O miniyin .üzərində müstəhəb bir namaz qılmaq istərsə də, hökm eynidir

Məsələ ۸۵۹: Bir mülkdə başqa birisi ilə şərik olan şəxs şərikinin hissəsi ayrılmamış, şərikinin icazəsi olmadan, o mülkün bir şeyindən istifadə edə bilməz və orada namaz .qılmaq ehtiyat-vacibə əsasən batildir

Məsələ ۸۶۰: Xümsü verilməmiş pulla bir mülk alsa, əksər müamilələrdə olduğu kimi, külli şəkildə zimməsinə alsa, o mülkü işlətmək (təsərrüf etmək) halaldır və verdiyi pulun xumusuna borcu olur. Amma əgər xümsü verilməyən pulun eyni ilə mülk alsa, oradan istifadə etmək şəriət hakiminin icazəsi olmadan haram və orda namaz qılmaq .ehtiyat-vacibə görə batildir

Məsələ ۸۶۱: Əgər mülkün sahibi dili ilə namaz qılmağa icazə versə və insan onun qəlbən razı olmamasını bilsə, o mülkdə namaz qılmaq icazəli deyildir. Amma əgər icazə .vermədiyi halda, insan onun qəlbən razı olduğuna əmin olarsa, namaz qılmaq caizdir

Məsələ ۸۶۲: Zəkat borcu və ya camaata borclu olan bir meyyitin mülkündən istifadə etmək, əgər onun evində namaz qılmaq kimi o haqqları verməklə bir ziddiyyəti olmazsa, varislərin icazəsi ilə maneəsizdir. Həmçinin əgər onun borcunu versələr və ya verməyə zamin olub zimməyə alsalar, yaxud onun borcu miqdarında irsdən ayırsalar, hətta tələfə səbəb olsa da, onun mülkündən istifadə etməyin maneçiliyi .yoxdur

Məsələ ۸۶۳: Əgər meyyitin onun mirasçılarından bəzisi kiçik (səğir) və ya dəli, ya da qaib olarsa, onların vəlilərinin icazəsi olmadan o mülkdən istifadə etmək haramdır və orada namaz qılmaq icazəli deyildir. Amma meyyitin dəfn üçün hazırlanmasında lazım .olan, adi təsərrüflərin eybi yoxdur

Məsələ ۸۶۴: Başqasının mülkündə namaz qılmaq ancaq açıqca izn verdiyi və ya namaz qılmağa dair razı olduğunu göstərən bir söz söylədiyi zaman (bir şəxsə onun evində oturmağa və yatmağa izn vermiş olur ki, bundan namaz qılmağa

da razı olduğu anlaşılır), ya da insan ayrı bir yoldan mülk sahibinin razı olduğuna .güman etdiyi təqdirdə caizdir

Məsələ ۸۶۵: Çox geniş ərazilərin sahibi kiçik (səğir) və ya dəli olsa, yaxud orada namaz qılmağa razı olmasa belə, orada namaz qılmaq caizdir. Ətrafında divar və qapı olmayan açıq yerlərdə də sahiblərindən icazə almadan namaz qılına bilər. Amma bu halda malikinin razı olmadığı məlum olarsa, orada təsərrüf edilməməlidir. Amma əgər onların sahibi kiçik (səğir) və ya dəli olarsa, ya da razı olmadığı guman edilərsə, .ehtiyat-lazıma görə onlarda təsərrüf edilməməli və namaz qılınmamalıdır

:İkinci şərt

Məsələ ۸۶۶: Namaz qılanın məkanı, vacib namazlarda namaz qılanın ayaq üstə durmasına, rüku və səcdələri yerinə yetirməsinə mane olacaq qədər çox hərəkətli olmamalıdır. Hətta ehtiyat-lazıma əsasən, onun bədəninin sükunətinə də mane olmamalıdır. Əgər vaxtın darlığından və yaxud başqa səbəbdən, məsələn; maşın, gəmi və qatar kimi hərəkət edən yerdə namaz qılmaq məcburiyyətində qalarsa, mümkün olduğu qədər qibləyə və bədənin sükunətinə riayət etməlidir. Əgər onlar qiblədən başqa tərəfə hərəkət etsə, gərək qibləyə tərəf dönsün. Əgər qibləyə dəqiq şəkildə riayət etmək mümkün olmasa, çalışmalıdır ki, qiblə ilə olan fərq ۹۰ dərəcədən artıq olmasın. Əgər bu da mümkün olmasa, gərək təkcə təkbirətül-ehramda qibləyə riayət .etsin. Bu da mümkün olmasa qibləyə riayət etməsi lazım deyil

Məsələ ۸۶۷: Avtomobil, gəmi, qatar və bu kimi yerlərdə onların dayandığı vaxt namaz qılmağın maneəsi yoxdur. Həmçinin hərəkət etdiyi vaxt, namaz qılanın bədəninin aram .olmağına mane olmayan tərzdə olsa, eybi yoxdur

Məsələ ۸۶۸: Üstündə dayanmaq mümkün olmayan, arpa, buğda xırmanlarında və s. bu .kimi yerlərdə namaz batildir

:Üçüncü şərt

Namazı tamamlaya biləcəyinə ehtimal verdiyi bir yerdə namaz qılmalıdır. Külək, yağış,

səbəbdən namazını tamamlaya bilməyəcəyindən əmin olduğu bir yerdə rəcaən .namaz qılarsa hərçənd təsadüfən namazı tamamlasa belə eybi yoxdur

Məsələ ۸۶۹: Əgər orada qalmaq haram olan yerdə, məsələn; uçulmağa məruz qalmış bir tavanın altında namaz qılarsa, günah etməsinə baxmayaraq, namazının işkalı .yoxdur

Məsələ ۸۷۰: Üzərində dayanmağı və oturmağı haram olan bir şeyin üstündə namaz qılmaq, məsələn, xalçanın Allahın adı yazılmış bir yerində əgər qürbət qəsdinə mane .olarsa, səhih deyil

:Dördüncü şərt

Namaz qılanın (yerin) tavanı, onun ayaq üstə düz dayanmasına mane olacaq qədər .alçaq olmamalı, həmçinin rüku və səcdə edə bilməyəcək qədər kiçik olmamalıdır

Məsələ ۸۷۱: Əgər ayaq üstə durmaq imkanı əsla olmayan bir yerdə namaz qılmaq məcburiyyətində qalarsa, oturaraq namaz qılmalıdır. Əgər rüku və səcdə etməyə .imkanı yoxdursa, onlara başı ilə işarə etməlidir

Məsələ ۸۷۲: Ehtiramsızlıq olduğu təqdirdə, Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) və İmamların (ələyhimus-səlam) qəbirlərinin qabağında (yəni arxası qəbrə tərəf) namaz qılmamalıdır. Amma əgər hörmətsizlik olmasa, eybi yoxdur. Amma hər iki .halda namaz səhihdir

:Beşinci şərt

Namaz qılanın yeri nəcis olarsa, namazı batil edən nəcislərdəndirsə bədən və ya libasına yetişəcək qədər yaş olmamalıdır. Amma alnını qoyduğu yer nəcis olarsa, quru olsa belə, namazı batildir. Ehtiyat-müstəhəb budur ki, namaz qılanın məkanı .ümumiyyətlə nəcis olmasın

:Altıncı şərt

Ehtiyat-lazıma əsasən qadın (namazda) kişidən arxada dayanmalıdır. Qadının səcdə etdiyi yer, heç olmazsa, kişinin

.səcdə halında ikən dizlərinin yeri miqdarında olacaq qədər arxada olmalıdır

Məsələ ۸۷۳: Əgər qadın, kişi ilə bərabər və ya bir az qabaqda durarsa və birlikdə namaza başlayarlarsa, ehtiyat-vacibə əsasən namazlarını yenidən qılmalıdırlar. Biri .digərindən qabaq namaza başlayarsa da, hökm eynidir

Məsələ ۸۷۴: Əgər kişi və qadın bərabər və ya qadın qabaqda dayanarsa və namaz qılsalar, divar, ya pərdə, ya başqa bir şey arada olsa belə ki, bir-birlərini görməsələr, .ya aralarında on zira fasilə olsa, hər ikisinin namazı səhihdir

:Yeddinci şərt

Namaz qılanın alın yeri, dizlərindən və ayaq barmaqlarının başından dörd bağlı barmaqdan çox alçaq, ya uca olmasın. Bu məsələnin təfsilatı səcdənin hökmlərində .deyiləcəkdir

Məsələ ۸۷۵: Naməhrəm kişi və qadının, günaha düçar olma ehtimalını verdikləri bir .yerdə dayanmaları haramdır. Ehtiyat-müstəhəbb budur orada namaz qılmasınlar

Məsələ ۸۷۶: Qina oxunan, ya haram musiqi çalınan yerdə namaz qılmaq, onları .dinləmək və istifadə etməyin günah olmasına baxmayaraq, batil deyildir

Məsələ ۹۷۷: Ehtiyat-vacib budur ki, Kəbə evində və onun damında ixtiyar halında vacibi .namaz qılmasın, amma əlacsız halda eybi yoxdur

Məsələ ۹۷۸: Kəbə evində və damında müstəhəbb namaz qılmağın eybi yoxdur. Hətta .Kəbə evinə daxil olarkən, hər rüknün qarşısında iki rəkət namaz qılmaq müstəhəbdir

## NAMAZ QILMAĞIN MÜSTƏHƏB OLDUĞU YERLƏR

Məsələ ۸۷۹: Müqəddəs İslam şəriətində, namazın məsciddə qılınmasına aid çoxlu tövsiyə olunmuşdur. Məscidlərdən ən yaxşısı Məscidül-həram, sonra Peyğəmbər -(səllallahu ələyhi və alihi və səlləm) məscidi, sonra Kufə məscidi, sonra Beytül

müqəddəs məscidi, ondan sonra hər şəhərin came məscidi, sonra məhəllə məscidi, .nəhayət bazar məscididir

Məsələ ۸۸۰: Qadınların namazlarını, istər ev, istər məscid olsun və ya başqa bir yer, .naməhrəmdən qorunmaq üçün daha münasib olan bir yerdə qılmaları daha yaxşıdır

Məsələ ۸۸۱: İmamların (ələyhimus-səlam) hərəmlərində namaz qılmaq müstəhəbdir, hətta məsciddən daha yaxşıdır. Əmirəl-möminin Əlinin (ələyhis-səlam) mütəhhər .hərəmində qılınan namaz, iki yüz min namaz bərabərdir

Məsələ ۸۸۲: Məscidə çox getmək və namaz qılanı olmayan məscidə getmək müstəhəbdir. Məscidin qonşuluğunda olanın bir üzrü olmasa, məsciddən başqa yerdə .namaz qılması məkruhdur

Məsələ ۸۸۳: İnsanın, məscidə getməyən şəxs ilə yemək yeməməsi, işlərində onunla .məsləhətləşməməsi, ona qonşu olmaması və ona qız verib-almaması müstəhəbbdir

## NAMAZ QILMAĞIN MƏKRUH OLDUĞU YERLƏR

:Məsələ ۸۸۴: Bir neçə yerdə namaz qılmaq məkruhdur. O cümlədən

.Hamamda (۱

.Şoranlıq yerdə (۲

.İnsanın qarşısında (۳

.Açıq qapı qarşısında (۴

Yolda, xiyabanda və o küçədə; belə ki, oradan keçən kəslər üçün əziyyət olmasın, (۵ .əgər onlara zəhmət olsa, haramdır

.Od və çırağın qarşısında (۶

.Mətbəxdə və od kürəsi olan yerlərdə (۷

Sidik yeri olan quyu və çala qarşısında (۸

Ruhu olan canlının şəkil və heykəli ilə üzbəüz; amma üstünə pərdə çəkilsə eybi (۹
.yoxdur

.Cünub şəxs olan otaqda (۱۰

.Şəkil olan yerdə, hətta namaz qılan onunla üzbəüz olmasa da (۱۱

.Qəbrin qarşısında (۱۲

.Qəbrin üstündə (۱۳

.İki qəbrin arasında (۱۴

.Qəbiristanlıqda (۱۵

Məsələ ۸۸۵: Camaatın keçdiyi yerdə namaz qılan və ya namazda ikən qarşısında bir şəxs olan şəxsin, önünə bir şey qoyması müstəhəbdir. Bir çubuq və ya ip parçası olsa .kifayətdir

## MƏSCİDİN HÖKMLƏRİ

Məsələ ۸۸۶: Məscidin yer, tavan, dam və daxili divarını nəcis etmək haramdır. Onun nəcis olduğunu anlayan hər bir şəxsin, dərhal onun nəcasətini aradan qaldırması və paklanması lazımdır. Ehtiyat-müstəhəb budur ki, Məscidin divarının xaricini də nəcis etməsinlər. Əgər nəcis olarsa, onu aradan qaldırmaq lazım deyil. Amma məscidin divarının xaricini nəcis etmək, məscidin hörmətsizliyinə səbəb olarsa, əlbəttə haramdır. O hissəni paklayıb aradan qaldırmaqla, hörmətsizliyi aradan qaldırmaq .lazımdır

Məsələ ۸۸۷: Əgər bir şəxs məscidi paklaya bilməsə və ya yardımçı lazım olduğu halda tapa bilməsə, məscidi paklamaq ona vacib deyil. Amma əgər başqasına xəbər verdiyi təqdirdə paklama işinin aparılacağını bilirsə, belə ki, nəcasətin qalması hörmətsizliyə .səbəb olarsa, ona xəbər verməsi gərəkdir

Məsələ ۸۸۸: Əgər məscidin nəcis olan bir yerini paklamaq, oranı pozmadan və ya qazmadan da mümkün deyilsə, bu iş, az bir təxribi və ya qazmağı tələb edirsə, qazmaq və ya uçurmaq cüzi miqdarda olsa, ya məscidə hörmətsizliyin aradan qaldırılması böyük miqdarda sökməyə və ya qazmağa bağlıdırsa, oranı qazmaları və ya təxrib etmələri gərəkdir. Əks təqdirdə oranı təxrib etməsi işkallıdır. Qazılan yerin doldurulması və uçurulan yerin təkrar düzəldilməsi vacib deyildir. Amma əgər məscidin kərpici kimi bir şey nəcis olarsa, mümkün olduğu təqdirdə yuduqdan sonra, .təkrar öz yerinə qoymaları lazımdır

Məsələ ۸۸۹: Əgər bir məscidi qəsb edib, onun yerində ev və buna bənzər bir şey tiksələr və ya artıq ona məscid deyilməyəcək qədər xarab olarsa, onu nəcis etmək .haram deyil. Əgər nəcis olarsa, onu paklamaq vacib deyildir

Məsələ ۸۹۰: İmamların (əlyhimus-səlam) hərəmini nəcis etmək haramdır. Əgər nəcis olsa və nəcasətin orada qalması ehtiramsızlığa səbəb olsa, onu paklamaq vacibdir. .Hətta ehtiyat-müstəhəbə görə ehtiramsızlığa səbəb olmasa da paklasinlar

Məsələ ۸۹۱: Əgər məscidin həsiri ya kovroliti nəcis olsa gərək onu suya çəkəsən, amma əgər nəcis olan yeri kəsmək daha yaxşı olsa, gərək kəsilsin. Amma onun etina olunacaq qədər böyük hissəsini kəsmək, yaxud nöqsanlı olmasına səbəb olacaq şəkildə paklamaq məhəlli işkaldır. Amma əgər onun tərk olunması hörmətsizliyə səbəb .olarsa, həmin qaydada paklanmalıdır

Məsələ ۸۹۲: Eyni-nəcisin və mütənnəcisin məscidə aparılması, məscidə hörmətsizlik olsa, haramdır. Hətta ehtiyat-müstəhəb budur ki, ehtiramsızlıq olmasa da, eyni-nəcis məscidə aparılmasın. Amma əgər insana bağlı olan bir şey, məsələn insanın bədən və .ya paltarında olan yara qanı kimi şeyləri aparmağın eybi yoxdur

Məsələ ۸۹۳: Əgər rövzəxanlıq üçün məsciddə çadır fərş və qara vursalar, çay avadanlığı aparsalar, əgər bu işlərdən məscidə zərər dəyməsə və namaz qılmağa .mane olmazsa, eybi yoxdur

Məsələ ۸۹۴: Ehtiyat-vacibə görə Məscidi qızılla zinətləndirməsinlər. Ehtiyat-müstəhəb . budur ki, insan və heyvan kimi ruhu olan şeylərin rəsmləri ilə də zinətləndirməsinlər

Məsələ ۸۹۵: Əgər məscid xarab da olsa, onu sata bilməzlər; yola və ya mülkə aid edə .bilməzlər

Məsələ ۸۹۶: Məscidin qapı, pəncərə və s. şeylərini satmaq haramdır. Əgər məscid xarab olarsa, gərək bunları onun təmirinə sərf etsinlər. Əgər o məscidin işinə yaramasa, gərək digər məscid üçün istifadə olunsun. Amma başqa məscidlərin də işinə yaramasa onu sata bilərlər və onun pulunu mümkün olduğu təqdirdə o məscidin .təmirinə sərf etsinlər. Əks təqdirdə başqa məscidin təmiri üçün sərf etsinlər

Məsələ ۸۹۷: hətta camaatın ehtiyacı üçün sökülməmiş bir məscidi uçurub, daha da .böyüdə bilərlər

Məscid tikmək və xarab olmaq üzrə olan məscidi təmir etmək müstəhəbdir. Əgər məscid təmirlə düzəlməyəcək şəkildə xarab

olubsa, onu yıxıb yenidən tikə bilərlər. Hətta, xarab olmamış məscidi camaatın .ehtiyacını nəzərə alaraq yıxıb, ondan daha böyüyünu tikə bilırlər

Məsələ ۸۹۸: Məscidi təmizləmək, məscidin çıraqlarını yandırmaq müstəhəbbdir. Məscidə getmək istəyən şəxsin xoş ətir vurması, pak və qiymətli paltarını geyməsi və başmağının altını nəcasət olmadığını bilmək üçün yoxlaması müstəhəbdir. Məscidə daxil olanda əvvəl sağ ayağını, çıxanda isə sol ayağını atması müstəhəbbdir. Həmçinin insanın hamıdan qabaq məscidə gəlib, hamıdan sonra məsciddən çıxması da .müstəhəbbdir

Məsələ ۸۹۹: İnsan məscidə daxil olan zaman, təhiyyət və ehtiram niyyəti ilə iki rəkət .namaz qılsın. Əgər vacib və ya başqa müstəhəb namaz da qılsa, kifayətdir

Məsələ ۹۰۰: Məsciddə yatmaq (əgər insan çarəsiz olmasa), dünya söhbətləri etmək, bir sənətlə məşğul olmaq və nəsihətli olmayan şerlər oxumaq məkruhdur. Həmçinin ağızın, burunun və sinənin bəlğəmini məscidə tökmək məkruhdur, hətta bəzi vaxtlarda haramdır. Həmçinin itmiş şeyi tələb etmək, səsi yüksəltmək məkruhdur. .Amma azanı uca səslə deməyin maneəsi yoxdur

Məsələ ۹۰۱: Dəlinin məscidə daxil olmasına yol vermək məkruhdur. Həmçinin, namaz qılanlara zəhmət verəcəyi və ya məscidi nəcis edəcəyi ehtimalı vardırsa, uşağın da məscidə daxil olmasına yol vermək eyni hökmü daşıyır. Bu iki haldan başqa, uşağı məscidə gətirməyin eybi yoxdur hətta bəzi hallarda da uşağı məscidə aparmaq daha yaxşıdır. Soğan, sarımsaq və bu kimi şeyləri yeyib, ağzının iyi camaatı narahat edən .şəxsin də məscidə daxil olması məkruhdur

## AZAN VƏ İQAMƏ

### Point

Məsələ ۹۰۲: Kişi və qadının gündəlik vacib namazlardan qabaq azan və iqamə deməsi müstəhəbdir. Digər vacib və müstəhəbb namazlar üçün isə, azan və iqamə məşru (şəri qanun) deyildir. Amma camaatla qılınan Fitr və Qurban bayramı namazlarından əvvəl .üç dəfə «Əssəlat» demək müstəhəbdir

Məsələ ۹۰۳: Uşağın dünyaya gəldiyi birinci gün yaxud göbəyi düşməzdən əvvəl sağ .qulağına azan və sol qulağına iqamə demək müstəhəbbdir

:Məsələ ۹۰۴: Azan ۱۸ cümlədir

Dörd dəfə: Əllahu əkbər

İki dəfə: Əşhədu ən la ilahə illəllah

İki dəfə: Əşhədu ənnə Muhəmmədən rəsulullah

İki dəfə: Həyyə ələssəlah

İki dəfə: Həyyə ələl-fəlah

İki dəfə: Həyyə əla xəyril-əməl

İki dəfə: Əllahu əkbər

İki dəfə: La ilahə illəllah

İqamə isə ۱۷ (on yeddi) cümlədir, yəni əvvəldə iki dəfə «Əllahu əkbər» deyilir, «La ilahə illəllah» azanın sonundan bir dəfə azaldılır, «Həyyə əla xəyril-əməl» dedikdən sonra isə .iki dəfə «Qəd qamətissəlah» əlavə edilir

Məsələ ۹۰۵: Əşəhədü ənnə Əliyyən vəliyyullah azan və iqamənin hissələrindən deyil. Amma yaxşı olar ki, əşhədü ənnə Mühəmmədən Rəsululah dedikdən sonra qürbət

## AZAN VƏ İQAMƏNİN TƏRCÜMƏSİ

أَللهُ أَكبَر

.Əllahu əkbər -Allah, vəsf olunduğundan çox böyükdür

أَشْهَدُ أَن لَا إِلهَ الاّ الله

Əşhədu ənla ilahə illəllah-şəhadət verirəm ki, yeganə və misilsiz olan Allahdan başqa, .heç bir pərəstiş olunacaq məbud yoxdur

أَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ الله

Əşədu ənnə Muhəmmədən Rəsulullah -şəhadət verirəm ki, həzrət Mühəmməd .(səlləllahu ələyhi və alihi və səlləm) Allahın peyğəmbəri və elçisidir

أَشْهَدُ أَنَّ أَمِيرَ الْمُؤْمِنِينَ عَلِيًّا وَلِيّ الله

Əşhədu ənnə Əmirəl-muminin Əliyyən vəliyyullah-şəhadət verirəm ki, həzrət Əli (sələvatullahi və səlamuhu ələyh) möminlərin əmiri, Allahın bütün məxluqatı içərisidə .vəlisi, rəhbəridir

حَيَّ عَلَى الصَّلَوهِ

!Həyyə ələs-səlat -namaza tələsin

حَيَّ عَلَى الْفَلَاحِ

!Həyyə ələl-fəlah -nicat tapmaq üçün tələsin

حَيَّ عَلَى خَيْرِ الْعَمَلِ

!Həyyə əla xəyril-əməl -işlərin ən yaxşısı olan namaz üçün tələsin

قَدْ قَامَتِ الصَّلَاهِ

!Qəd qamətis səlat -həqiqətən namaz bərqərar olub

لَا إِلَهَ إِلَّا الله

La ilahə illəllah -yeganə və misilsiz olan Allahdan başqa pərəstiş olunacaq məbud .yoxdur

Məsələ ۹۰۶: Azan və iqamənin cümlələri arasında gərək çox zaman fasiləsi olmasin. .Əgər onların arasında adi qaydadan artıq fasilə düşsə, gərək onu yenidən desin

Məsələ ۹۰۷: Azan və iqamə oxuyarkən, səsi boğaza salmaq əgər ğina halını alırsa, yəni azan və iqaməni oyun və əyləncə məclislərində mahnı oxuyanlar kimi oxuyarsa, .haramdır. Amma əgər ğina olmazsa, (boğaza salmaq) məkruhdur

Məsələ ۹۰۸: İki namazın ardıcıl və onların müştərək vaxtında qılındığı hər yerdə, əgər namaz qılan birinci namaz üçün azan oxumuşdursa, istər Zilhiccə ayının ۹-cu günü olan ərəfə günü Ərəfatda olmasa belə, zöhrün fəzilət vaxtında qılınan və ya günorta və ikindi namazını Məşərul-haramda qılan şəxs üçün Qurban bayramı axşamının işa namazının fəzilət vaxtında qılınan məğrib və işa namazları kimi o iki namazı birlikdə qılmaq yaxşı olsun və ya olmasın, sonrakı namazdan azan saqit olur. Əlbəttə, bu yerlərdə azanın saqit olması o iki namaz arasında əsla fasilə olmadığı və ya çox az fasilə olduğu təqdirdədir. Amma nafilə namazı və təqibin fasilə olmasının zərəri yoxdur. Ehtiyat-vacibə əsaən bu iki yerdə Ərəfə günündə və Məşərdə hərçənd məşru olma qəsdi ilə azan oxunmamalıdır, hərçənd bu son iki yerdə şəri qəsdi olmadan .oxumaq ehtiyata xilafdır

Məsələ ۹۰۹: Camaat namazı üçün azan və iqamə deyilmişsə, o camaatla namaz qılan .şəxs öz namazı üçün azan və iqamə oxumamalıdır

Məsələ ۹۱۰: Əgər namaz qılmaq məqsədi ilə məscidə gedərsə və camaat namazının bitmiş olduğunu görərsə, sıralar pozulmayıb, camaat dağılmamışsa, öz namazı üçün azan və iqamə oxumaya bilər. Yəni onları oxumaq artıq təkidli müstəhəbb deyildir. Hətta azan oxumaq istəsə də, çox yavaşdan oxuması yaxşıdır. Ayrı bir camaat namazı .təşkil etmək istəsə də, azan və iqamə deməməlidir

Məsələ ۹۱۱: Əvvəlki məsələdə deyilən hallardan başqa, ۶ şərtlə azan və iqamə saqit :olur

Camaat namazı məsciddə olsun; əgər məsciddə olmazsa, azan və iqamə saqit .۱ .olmur

;Əvvəlki camaat namazı üçün azan və iqamə deyilmiş olsun .۲

;Camaat namazı batil olmasın .۳

Onun namazı, camaat namazı ilə eyni məkanda olsun. Deməli, əgər camaat namazı .۴ məscidin içində olsa və insan məscidin damında namaz qılmaq istəsə müstəhəbdir ki, .azan və iqamə desin

Camaat namazı əda olmalıdır; amma o fürada (tək) qılırsa onun namazının da əda .۵ .olması şərt deyildir

Onun namazı ilə camaat namazının vaxtı müştərək olmalıdır; məsələn, hər ikisi ya .۶ zöhr və ya əsr namazı qılmalı və ya camaatla qılınan namaz zöhr və onun namazı əsr və yaxud onun namazı zöhr və camaatla qılınan namaz əsr olmalıdır. Amma əgər camaat namazı son vaxtında qılınan əsr namazı olsa, o isə ondan sonra məğrib .namazını əda olaraq qılmaq istəyirsə, azan və iqamə saqit olmaz

Məsələ ۹۱۲: Əgər əvvəlki məsələdə söylənən şərtlərdən üçüncüsündə şəkk edərsə, yəni camaat namazının səhih olub-olmadığına şəkk edərsə, azan və iqamə ondan saqitdir. Amma yerdə qalan beş şərtin birində şəkk edərsə, yaxşı olar ki, azan və iqaməni desin. Amma əgər şəkki camaatda olarsa, rəca (qəbul olma) ümidi ilə

.oxumalıdır

Məsələ ۹۱۳: Başqasının elan məqsədilə və ya camaat namazı üçün oxuduğu azanı .eşidən şəxsin, eşitdiyi hər qismi səssiz olaraq təkrar etməsi müstəhəbdir

Məsələ ۹۱۴: Bir şəxs başqasının azan və iqaməsini eşitsə, istər azan və iqamənin sözlərini onunla birlikdə desin və ya deməsin, o azan və iqamə ilə qılmaq istədiyi namaz arasında çoxlu fasilə olmamışsa, eşitməyin əvvəlindən namaz qılmaq qəsdi olmuşsa, onun öz azan və iqaməsinə kifayət edə bilər. Amma bu hökm, yalnız imamın .eşitmiş olduğu, yaxud təkcə məmumun eşitmiş olduğu camaat barəsində işkallıdır

Məsələ ۹۱۵: Kişi qadının azanını ləzzət qəsdi ilə dinlərsə, ondan azan saqit olmaz, hətta .qadının azanını eşitməklə ondan azanın saqit olması mütləq şəkildə işkallıdır

Məsələ ۹۱۶: Camaat namazının azan və iqaməsini gərək kişi oxusun; amma qadınların camaat namazında qadın da azan və iqamə oxuyarsa, kifayətdir. Kişiləri qadınlara məhrəm olan camaat namazında qadının azan və iqaməsi ilə kifayətlənmək məhəlli .işkaldır

Məsələ ۹۱۷: İqamə gərək azandan sonra oxunsun. Həmçinin, iqaməni ayaq üstə və .hədəsdən pak olan halda (dəstəmaz, qüsl və ya təyəmmümlü) oxunması şərtdir

Məsələ ۹۱۸: Əgər bir şəxs azan və iqamənin cümlələrini tərtibsiz (ardıcıllıq olmadan) desə; məsələn: “həyyə ələl-fəlah” “həyyə ələs-səllat”-dan qabaq desə, gərək tərtibi .pozduğu yerə qayidıb yenidən desin

Məsələ ۹۱۹: Azan və iqamə arasında fasilə salınmamalıdır. Əgər onların arasında çox fasilə düşsə və deyilən azan, arxasınca deyilən iqamənin azanı hesab olunmazsa, azanı batildir. Həmçinin əgər azan və iqamə ilə namaz arasında, oxunan azan və .iqamənin o namaza aid sayılmayacağı qədər fasilə versə, o azan və iqamə batildir

Məsələ ۹۲۰: Azan və iqamə ərəbcə səhih oxunmalıdır; belə ki, əgər ərəbcə səhv oxusa və ya bir hərfin yerinə ayrı bir hərf deyərsə, ya da onun başqa dildə, məsələn türkcə .tərcüməsini deyərsə, səhih deyildir

Məsələ ۹۲۱: Azan və iqamə namaz vaxtı daxil olandan sonra oxunmalıdır; əgər qəsdən və ya unudaraq vaxtından əvvəl oxuyarsa, batildir. Lakin, ۷۳۲-ci məsələdə izah olunduğu kimi, əgər namaz əsnasında vaxt daxil olduğu təqdirdə, o namazın

.səhih olduğuna hökm edilirsə, ondan əvvəl oxunan azan və iqamə də səhihdir

Məsələ ۹۲۲: İqaməyə başlamamışdan əvvəl azan oxuyub-oxumadığında şəkk etsə, azan oxumalıdır. Amma iqaməyə başladıqdan sonra azan oxuyub-oxumadığında şəkk .edərsə, azan oxuması lazım deyildir

Məsələ ۹۲۳: Azan və iqamə oxuyarkən, bir hissəni oxumağa başlamamışdan, ondan əvvəlki cümləni oxuyub-oxumadığında şəkk edərsə, şəkk etdiyi cümləni oxumalıdır. Amma azan və iqamənin bir hissəsini oxuyarkən, ondan əvvəlki cümləni oxuyub-.oxumadığında şəkk edərsə, onu oxuması lazım deyil

Məsələ ۹۲۴: İnsanın azan oxuyarkən üzü qibləyə olması, dəstəmazlı və ya qüsllü olması, əllərini qulaqlarına qoyması, səsini yüksəldib uzatması, azanın cümləri .arasında bir az fasilə verməsi və onların arasında danışmaması müstəhəbbdir

Məsələ ۹۲۵: İqamə oxuyarkən insanın bədəninin hərəkətsiz (aram) olması, onu azandan bir az asta oxuması və cümlələrini bir-birinə yapışdırmaması müstəhəbdir. Ancaq iqamənin cümləri arasında, azanın cümləri arasında buraxdığı fasilə qədər, .fasilə verməməlidir

Məsələ ۹۲۶: Azan və iqamə arasında bir addım atmaq, bir az oturmaq, səcdə etmək, zikr oxumaq, dua etmək, bir az səssiz dayanmaq, danışmaq və ya iki rəkət namaz qılmaq müstəhəbdir. Amma sübh namazının azan və iqaməsi arasında danışmaq .müstəhəb deyildir

Məsələ ۹۲۷: Azan oxumaq üçün təyin edilən şəxsin adil, vaxtı bilən və gur səsli olması, .azanı yüksək bir yerdə duraraq oxuması müstəhəbdir

## NAMAZIN VACİBATI

### Point

:Namazın vacibatı on bir şeydir

;Təkbirətul-ehram; yəni namazın əvvəlində «Əllahu-əkbər» demək.۳

;Rüku .۴

;Səcdə .۵

;Qiraət .۶

;Zikr .۷

;Təşəhhüd .۸

;Salam .۹

;Tərtib .۱۰

;(Müvalat; (yəni namazın hissələrini bir-birinin arxasınca, fasiləsiz demək .۱۱

Məsələ ۹۲۸: Namazın vacibatından bəzisi namazın rüknü sayılır. Yəni əgər insan onları yerinə yetirməsə, istər qəsdən istərsə səhvən olsa, namaz batil olur. Bəziləri rükn :deyildir, yəni əgər səhvən azalsa, namaz batil olmur. Namazın rüknü beşdir

;Niyyət .۱

;Təkbirətul-ehram .۲

;Rükuya bitişik qiyam, yəni rükudan əvvəl ayaq üstə durmaq .۳

;Rüku .۴

.Bir rəkətdə iki səcdə .۵

Amma bilərəkdən artırılsa, mütləqən namaz batil olur. Əgər səhv üzündən rüku, ya bir rəkətdə iki səcdəni artırsa, namaz ehtiyat-lazıma əsasən batildir. Əks təqdirdə batil .deyildir

## NİYYƏT

Məsələ ۹۲۹: İnsan gərək namazı qürbət qəsdi ilə (yəni, Allah-təalanın əmrini yerinə yetirmək niyyəti ilə qılmalıdır.) Niyyəti qəlbdən keçirmək və ya misal üçün, dildə "dörd rəkət zöhr namazı qılıram, qürbətən iləllah" demək, lazım deyil.

Məsələ ۹۳۰: Əgər zöhr və ya əsr namazını qılarkən, «dörd rəkət namaz qılıram» deyə niyyət edərsə, amma o namazın zöhr və ya əsr namazı olduğunu müəyyən etməzsə, namazı batildir. Amma zöhr namazını birinci namaz, əsri də ikinci namaz kimi

təyin edərsə kifayətdir. Həmçinin məsələn; zöhr namazının qəzası boynuna vacib olan şəxs, zöhr namazının vaxtında, zöhr namazının ədasını və ya qəzasını qılmaq .istəyərsə, qılacağı namazı niyyətində müəyyən etməlidir

Məsələ ۹۳۱: İnsan namazın əvvəlindən axırına qədər öz niyyətində sabit qalmalıdır. Deməli, əgər namaz əsnasında özündən xəbərsiz (qafil) olarsa, belə ki, "nə edirsən?" .deyə soruşsalar nə deyəcəyini bilməsə, namazı batildir

Məsələ ۹۳۲: İnsan, yalnız mütəal Allahın qarşısında bəndəçilik göstərmək və Onun əmrini yerinə yetirmək üçün namaz qılmalıdır. Belə ki, riya, yəni özünü xalqa göstərmək üçün namaz qılan şəxsin namazı batildir. İstər sırf xalqa göstərmək üçün .olsun, istərsə həm Allahı, həm də camaatla birlikdə nəzər də tutsun, fərqi yoxdur

Məsələ ۹۳۳: Əgər namazın bir hissəsini Allahdan qeyrisi üçün yerinə yetirsə; istər yerinə yetirdiyi hissə namazın vacib hissəsi olsun (Həmd və Surə kimi,) istərsə də müstəhəb olsun (qunut kimi) namazı batildir. Bütün namazı Allah üçün qılsın amma camaata göstərmək üçün məscid kimi xüsusi yerdə, yaxud əvvəl vaxt kimi xüsusi bir vaxtda və ya camaat namazını; məsələn: xüsusi bir tərzdə camaatla qılsa, namazı .batildir

## TƏKBİRƏTÜL–EHRAM

Məsələ ۹۳۴: «Əllahu-əkbər»-i hər namazdan əvvəl demək vacib və rükndür. «Əllah» və «Əkbər»-in hərflərini, eləcə də Əllah və Əkbər kəlmələrini ardıcıl demək lazımdır. Habelə gərək bu iki kəlmə ərəbcə düzgün deyilsin, əgər ərəbcə səhv deyilsə, yaxud .məsələn, onun tərcüməsini türkcə desə, səhih deyildir

Məsələ ۹۳۵: Ehtiyat-müstəhəb budur ki, namazın təkbirətul-ehramını ondan əvvəl oxuduğu şeylərə, məsələn, iqaməyə və təkbirdən əvvəl oxuduğu dualara .birləşdirməsin

Məsələ ۹۳۶: Əgər insan, «Əllahu Əkbər» kəlməsini ondan sonra oxuduğu şeyə, məsələn; «Bismillahir-rəhmanir-rəhim» kəlməsinə bitişdirmək istəyərsə, «əkbər»-in « r »

ilə oxuması daha yaxşıdır. Amma ehtiyat-müstəhəb budur ki, vacib namazda onu .sonrakı kəlməyə bitişdirməsinlər

Məsələ ۹۳۷: Təkbirətul-ehram deyən vaxtda, gərək vacib namazda bədən sakit (aram) .olsun. Əgər qəsdən bədəni hərəkətdə olan zaman təkbirətul-ehram desə, batildir

Məsələ ۹۳۸: Təkbir, Həmd, Surə, zikr və duanı gərək elə oxusun ki, şəxsin özü eşitsin. Əgər qulağın ağırlığı, karlığı və ya səs-küyün çoxluğu səbəbi ilə eşitməsə, elə deməlidir .ki, mane olmazsa eşidə bilsin

Məsələ ۹۳۹: Hər hansı bir səbəb üzündən lal olan və ya dilindəki xəstəlik səbəbi ilə «Əllahu Əkbər»i söyləyə bilməyən bir şəxs, necə söyləyə bilirsə, o cür də deməlidir. Heç cür söyləyə bilmirsə, təkbiri qəlbindən keçirməli və onun ləfzini göstərməyə uyğun olacaq şəkildə barmağı ilə işarə etməli və mümkün olduğu təqdirdə dil və dodaqlarını da tərpətməlidir. Ancaq anadangəlmə lal olan bir şəxs, təkbiri söyləyən şəxslər kimi dil .və dodağını hərəkət etdirməli və onun üçün barmağı ilə də işarə etməlidir

Məsələ ۹۴۰: Təkbirətul-ehramdan əvvəl aşağıda göstərilən duanı rəca qəsdi ilə :oxumaq müstəhəbbdir

يَامُحْسِنُ قَدْ أَتَاكَ الْمُسِيئُ وَقَدْ أَمَرْتَ الْمُحْسِنَ أَنْ يَتَجَاوَزَ عَنِ الْمُسِيئِ أَنْتَ الْمُحْسِنُ وَأَنَا الْمُسِيئُ بِحَقِّ مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَتَجَاوَزْ عَنْ قَبِيحِ مَاتَعْلَمُ مِنِّى

Ya muhsinu qəd ətakəl-musi`. Və qəd əmərtəl-muhsinə ən yətəcavəzə ənil-musi`.» Əntəl-muhsinu və ənəl-musi`. Bihəqqi Muhəmmədin və ali Muhəmməd. Səlli əla .«Muhəmmədin və ali Muhəmməd. Və təcavəz ən qəbihi ma tə`ləmu minni

Yəni,“ey bəndələrinə ehsan edən Allah! Sənin günahakar bəndən Sənin dərgahına gəlmişdir. Sən də ehsan edənə əmr etmisən ki, günahkarın günahından keçsin. Sən ehsan edən, mən isə günahkaram. Səni and verirəm Mühəmməd və Ali-Mühəmmədin hörmətinə, Öz rəhmətini Mühəmməd və Ali-Mühəmmədə göndər, mənim pis ”!əməllərimdən keç

Məsələ ۹۴۱: Müstəhəbdir ki, namazın birinci təkbirini, həmçinin, namaz əsnasındakı sair .təkbirləri deyəndə, əlləri qulaqların bərabərinə qədər qaldırsın

Məsələ ۹۴۲: Əgər təkbirətül-ehramı deyib-deməməsində şəkk etsə, bu halda qiraətə məşğuldursa, öz şəkkinə etina etməməlidir; əgər bir şey oxumamışdırsa, gərək təkbiri .desin

Məsələ ۹۴۳: Əgər təkbirətul-ehramı dedikdən sonra, onu düzgün deyib-demədiyi barədə şəkk edərsə, istər bir şeyi oxumağa başlamış olsun və ya olmasın, şəkkinə .etina etməməlidir

## QİYAM

Məsələ ۹۴۴: Təkbirətul-ehram deyilən vaxtdakı qiyam ilə rükuya bitişik qiyam adlanan, rükudan qabaqkı qiyam rükndür. Amma Həmd-surə oxunan vaxtdakı qiyam və rükudan sonrakı qiyam rükn deyildir. Əgər bir şəxs onu unudaraq yerinə yetirməsə, .namazı səhihdir

Məsələ ۹۴۵: Təkbirətul-ehramı qiyam halında deməsinə əmin ola bilməsi üçün bir az .ondan qabaq və bir az da ondan sonra, ayaq üstə dayanması vacibdir

Məsələ ۹۴۶: Əgər Həmd və surəni oxuduqdan sonra, unudaraq rüku etmədən oturarsa və rüku etmədiyini xatırlayarsa, ayağa qalxıb rükuya getməlidir. Əgər ayaq üstə durmadan, elə əyilən halda rüku halına qayıdarsa, rükuya bitişik qiyamı tərk etdiyinə .görə, kifayət etməz

Məsələ ۹۴۷: Təkbirətul-ehram və ya qiraət üçün ayaq üstə durarsa, yol getmək (bədənə hərəkət vermək) yaxud bir tərəfə əyilmək olmaz. Ehtiyat-lazıma əsasən .ixtiyar halında gərək bir yerə söykənməsin. Amma əgər əlacsız olsa, eybi yoxdur

Məsələ ۹۴۸: Qiyam halında olduğunu unudaraq, bir qədər yerisə ya bir tərəfə əyilsə, ya .bir yerə söykənsə, eybi yoxdur

Məsələ ۹۴۹: Ehtiyat-vacib budur ki, ayaq üstə olan vaxt hər iki ayağ yerdə olmalıdır.

.ayağın üstünə düşməsi lazım deyil, hətta bir ayağın üstünə də düşsə eybi yoxdur

Məsələ ۹۵۰: Düzgün şəkildə ayaq üstə dura bilən şəxs, əgər ayaqlarını xeyli aralı qoysa, belə ki, ayaq üstə dayanmaq adlana bilməsə namazı batildir. Həmçinin ehtiyat-lazıma .əsasən, ayaqlarını ona «ayaq üstədir» deyiləcək şəkildə olsa belə, xeyli aralı qoymasın

Məsələ ۹۵۱: İnsanın, namazda vacib zikri oxuduğu zaman, bədəni hərəkətsiz olmalıdır. Həmçinin ehtiyat-lazıma əsasən, müstəhəbb zikrləri oxumağa məşğul olduğu zaman da, hökm eynidir. Əgər azacıq qabağa və arxaya getmək və ya bədənini sağa və ya .sola bir az hərəkət etdirmək istəyərsə, gərək bir şey oxumasın

Məsələ ۹۵۲: Əgər bədənin hərəkəti vaxtı bir müstəhəbbi zikr desə, məsələn, rükuya, yaxud səcdəyə gedən vaxt təkbir desə, belə ki, namazda göstəriş verilən zikr qəsdi ilə deyərsə, o zikr səhih deyildir, amma namazı səhihdir. «Bihəvlillahi və quvvətihi əqumu .və əq`ud»-u ayağa qalxarkən deməlidir

Məsələ ۹۵۳: Həmd oxuyan zaman əli və barmaqları hərəkət etdirməyin eybi yoxdur. .Amma ehtiyat-müstəhəb budur ki, onları da hərəkət etdirməsin

Məsələ ۹۵۴: Əgər Həmd-surəni, yaxud təsbihatı oxuyanda ixtiyarsız olaraq müəyyən qədər hərəkət etsə və bədəni aramlıq halından çıxsa, ehtiyat-müstəhəb budur ki, .bədən aram olandan sonra hərəkət halında dediklərini yenidən desin

Məsələ ۹۵۵: Əgər bir şəxs namaz əsnasında ayaq üstə dura bilməsə, gərək otursun, otura da bilməsə, gərək uzansın. Amma bədəni aramlaşmayınca gərək vacib .zikirlərdən heç nə deməsin

Məsələ ۹۵۶: İnsan, ayaq üstə namaz qılmağa imkanı olduğu təqdirdə, oturaraq namaz qılmamalıdır. Məsələn; ayaq üstə durduğu zaman bədəninin hərəkətini saxlaya bilməyən və ya bir şeyə söykənmək məcburiyyətində qalan, ya da bədənini bir az əymək məcburiyyətində qalan bir şəxs, hər nə qədər imkanı vardırsa, bu cür ayaq üstə durub, namazını qılmalıdır. Amma əgər heç bir şəkildə ayaq üstə dura bilmirsə, .düzgün oturaraq, namazını qılmalıdır

Məsələ ۹۵۷: İnsan oturaraq namaz qıla bildiyi zaman, uzanaraq namaz qılmamalıdır. Əgər düz otura bilmirsə, hər nə qədər imkanı varsa, o cür oturmalıdır. Əgər heç bir şəkildə otura bilmirsə, qiblə hökmlərində söyləndiyi kimi, bədəninin qabaq tərəfi üzü qibləyə olacaq şəkildə yanı üstə uzanmalıdır. Ehtiyat-lazıma əsasən, sağ yanı üstə uzanması mümkün olduğu təqdirdə, sol yanı üstə uzanmamalıdır. Əgər bu da mümkün .deyilsə, ayaqlarının altı qibləyə tərəf olacaq şəkildə, arxası üstə uzanmalıdır

Məsələ ۹۵۸: Oturan halda namaz qılan bir şəxs Həmd-surəni oxuduqdan sonra ayağa durub rükunu ayaq üstə yerinə yetirə bilsə, gərək ayağa dursun və ayaq üstə olan .halda rükuya getsin. Əgər bunu da edə bilməsə, gərək oturan halda rüku etsin

Məsələ ۹۵۹: Uzandığı yerdə namaz qılan şəxs, namaz əsnasında otura bilirsə, gərək bacardığı miqdarda oturub qılsın və əgər dura bilirsə, bacardığı qədər ayaq üstə qılsın. Lakin bədəni sakit olmayınca vacibi zikrlərdən bir şey oxumasın. Amma əgər çox az miqdarda ayaq üstə dura bilməsini bilərsə, gərək o miqdarı rukuya müttəsil olan .qiyama məxsus etsin

Məsələ ۹۶۰: Oturduğu yerdə namaz qılan şəxs, əgər namaz əsnasında dura bilsə, gərək qüdrəti miqdarda ayaq üstə dayandıqda qılsın, amma bədəni sakit olmayınca, vacib zikrdən bir şey oxumasın. Amma əgər çox az miqdarda ayaq üstə dayanacağını .bilsə, gərək o miqdarı rukuya müttəsil olan qiyama məxsus etsin

Məsələ ۹۶۱: Əgər ayaq üstə qalxa bilən şəxs, durmaqla xəstələnəcəyindən və ya bir zərəri olmasından qorxsa, oturaq halda namaz qıla bilər. Əgər oturaq halda da .qorxarsa, uzanaraq namazını qıla bilər

Məsələ ۹۶۲: Əgər insanın vaxtın axırında ayaq üstə namaz qıla biləcəyinə ümidi varsa, vaxtın əvvəlində namaz qılsa, vaxtın axırında ayaq üstə durmağa qüdrət hasil etsə, gərək namazı ikinci dəfə qılsın. Amma namazı ayaq üstə qıla biləcəyinə ümid etməsə, əgər vaxtın əvvəlində namazı qılsa və sonra ayaq üstə durmağa qüdrət tapsa, namazı .yenidən qılmaq lazım deyil

Məsələ ۹۶۳: Müstəhəbdir ki, ayaq üstə duran halda bədəni düz saxlasın, çiyinlərini aşağı salsın, əllərini budlarının üstünə qoysun, barmaqlarını bir-birinə yapışdırsın, səcdə etdiyi yerə baxsın, bədənin ağırlığını ayaqlarına bərabər halda salsın, xüzu və xüşu halında olsun, ayaqlarını önə-arxaya qoymasın; əgər kişidirsə ayaqlarını üç barmaqdan bir qarışa qədər aralı qoysun; əgər qadındırsa, ayaqlarını bir-birinə .yapışdırsın

## QİRAƏT

Məsələ ۹۶۴: Gündəlik vacib namazların ۱-ci və ۲-ci rəkətlərində gərək insan, əvvəl Həmdi və sonra ehtiyata əsasən bir surəni tamam oxusun. Ehtiyata əsasən «Vəz-zuha» .və «Ələm nəşrəh» və həmçinin «Fil» və «Li-iylaf» surəsi namazda bir surə hesab olunur

Məsələ ۹۶۵: Əgər namaz vaxtı dar olsa və ya insan surəni oxumamaq məcburiyyətində qalarsa, məsələn; surəni oxuduğu təqdirdə, oğru, yırtıcı heyvan və ya başqa bir şeyin ona zərər verəcəyindən qorxarsa, ya da zəruri bir işi olarsa, surəni oxumaya bilər. .Hətta vaxtın azlığı və bəzi qorxu olmayan hallarda da surəni oxumamalıdır

Məsələ ۹۶۶: Əgər bilərəkdən surəni, Həmd surəsindən qabaq oxusa, namazı batildir. Əgər səhvən surəni, Həmd surəsindən qabaq oxusa və bu əsnada yadına düşsə, gərək onu boşlayaraq Həmd surəsini oxuduqdan sonra yenidən surəni əvvəldən .oxusun

Məsələ ۹۶۷: Əgər Həmd və surəni və ya onlardan birini unudarsa və rükuya çatandan .sonra başa düşsə, namazı səhihdir

Məsələ ۹۶۸: Əgər rükuya əyilməzdən qabaq Həmd və surəni oxumadığını anlayarsa, onları oxumalıdır. Əgər yalnız surəni oxumadığını anlayarsa, bu zaman yalnız surəni oxumalıdır. Amma yalnız Həmdi oxumadığını anlayarsa, əvvəl Həmdi, sonra da ikinci dəfə olaraq surəni oxumalıdır. Həmçinin əgər rükuya əyilərsə, lakin rüku həddinə çatmazdan qabaq Həmd və surəni və ya yalnız surəni, ya da yalnız Həmdi oxumadığını ,anlayarsa

.ayağa qalxıb, yuxarıda izah edilən göstərişə əsasən onları oxumalıdır

Məsələ ۹۶۹: Əgər vacib namazda ۳۵۴-cü məsələdə deyilən, vacib səcdəsi olan dörd surədən birini qəsdən oxuyarsa, səcdə ayəsini oxuduqdan sonra səcdə etməsi vacibdir. Amma əgər səcdəni yerinə yetirərsə, ehtiyata əsasən namazı batil olar və onu yenidən qılması gərəkdir. Amma əgər səhvən səcdə etsə, batil olmaz. Əgər səcdəni yerinə yetirməzsə, səcdəni tərk etməkdə günah etməsinə baxmayaraq, .namazına davam edə bilər

Məsələ ۹۷۰: Əgər vacib səcdəsi olan bir surə oxusa istər səhvən olsun, istərsə qəsdən belə ki, səcdə ayəsinə çatmamışdan qabaq başa düşsə, gərək o surəni tərk edib, başqa surə oxusun. Əgər səcdə ayəsini oxuyandan sonra başa düşsə, gərək əvvəlki .məsələdə deyildiyi kimi əməl etsin

Məsələ ۹۷۱: Əgər namaz əsnasında səcdə ayəsini eşitsə, namazı səhihdir. Amma vacib namazda olarsa, ehtiyat-vacibə əsasən səcdəyə işarə etməli və namazdan sonra .səcdəni yerinə yetirməlidir

Məsələ ۹۷۲: Müstəhəbb namazda surə oxumaq lazım deyildir. Hətta o namaz nəzir vasitəsilə vacib olsa da belə. Amma vəhşət namazı kimi, özünə məxsus surəsi olan bəzi müstəhəbb namazlarda, əgər o namazın göstərişinə əsasən əməl etmək .istəyərsə, həmin surəni oxumalıdır

Məsələ ۹۷۳: Cümə namazında və cümə günü sübh, zöhr və əsr namazında və cümə axşamı günü işa namazında birinci rəkətdə Həmddən sonra «Cümə» surəsini, ikinci rəkətdə də, Həmddən sonra

Munafiqun» surəsini oxumaq müstəhəbbdir. Əgər cümə gününün namazlarında» bunlardan birini oxumağa başlayarsa, ehtiyat-vacibə əsasən onu tərk edib başqa surə .oxuya bilməz

Məsələ ۹۷۴: Əgər Həmddən sonra «Tövhid» və ya «Kafirun» surəsini oxumağa başlasa, onu buraxıb başqa surə oxuya bilməz. Amma cümə namazında yaxud cümə gününün namazlarında, unutduğuna görə, «Cümə» və ya «Munafiqun» surəsinin yerinə bu iki surədən birini oxusa, onu tərk edib, «Cümə» və ya «Munafiqun» surəsini oxuya bilər. .Ehtiyat-vacib budur ki, yarıya çatandan sonra, tərk etməsin

Məsələ ۹۷۵: Əgər cümə namazında, yaxud cümə gününün namazlarında qəsdən «Tövhid» və ya «Kafirun» surəsini oxuyarsa, yarıya çatmasa da belə, ehtiyat-vacibə .görə tərk edib «Cümə» və «Munafiqun» surəsini oxuya bilməz

Məsələ ۹۷۶: Əgər namazda, «Tövhid» və ya «Kafirun» surəsindən başqa, digər surəni oxusa və yarıya çatmasa, onu tərk edib, başqa surəni oxuya bilər. Ehtiyata əsasən, yarıya çatandan sonra, onu tərk edib, başqa surə oxuması mütləq şəkildə icazəli .deyildir

Məsələ ۹۷۷: Əgər oxuduğu surənin bir miqdarını unudarsa və ya vaxtın darlığı, ya da başqa bir səbəbdən başladığı surəni bitirməsi mümkün olmazsa, o surənin yarısına çatmış olsa belə və ya oxuduğu surə İxlas və ya Kafirun surəsi olsa belə, onu tərk edib .başqa bir surə oxuya bilər. Unutduğu təqdirdə isə oxuduğu miqdarla kifayətlənə bilər

Məsələ ۹۷۸: Ehtiyata əsasən kişinin sübh, məğrib və işa namazlarında, Həmd və surəni ucadan oxuması vacibdir. Ehtiyata əsasən, kişi və qadının zöhr və əsr namazlarında .isə, Həmd və surəni alçaqdan oxuması vacibdir

Məsələ ۹۷۹: Ehtiyat-vacibə əsasən, kişi sübh, məğrib və işa namazlarında Həmd və surənin bütün kəlmələrini, hətta onların son hərfini belə ucadan oxumağa diqqət .etməlidir

Məsələ ۹۸۰: Qadın sübh, məğrib və işa namazlarının Həmd və surəsini həm ucadan,

həm də alçaqdan oxuya bilər. Amma əgər naməhrəm onun səsini eşitsə və bir surətdə ki, səsini naməhrəmə eşitdirmək ona haram olsa, gərək alçaqdan oxusun. Əgər qəsdən ucadan oxusa, ehtiyat-vacibə əsasən namazı batildir.

Məsələ ۹۸۱: Əgər bir şəxs, ucadan oxuyacağı yerdə qəsdən namazı alçaqdan oxuyarsa və ya alçaqdan oxuyacağı yerdə qəsdən ucadan oxuyarsa, ehtiyat-vacibə əsasən namazı batildir. Amma əgər unutqanlıq və ya şəri-hökmü bilməməsi üzündən olarsa, namazı səhihdir. Əgər Həmd və surəni oxuyarkən səhvən

ucadan və ya alçaqdan oxuduğunu anlayarsa, oxuduğu miqdarı ikinci dəfə oxuması .lazım deyildir

Məsələ ۹۸۲: Əgər namaz qılan şəxs Həmd-surəni oxuduğu zaman səsini adi haldan .ucaya qaldırsa; məsələn: qışqıra-qışqıra oxusa namazı batildir

Məsələ ۹۸۳: İnsan namazın qiraətini gərək səhih oxusun. Heç bir şəkildə Həmd surəsini oxuya bilməyən bir şəxs gərək bacardığı şəkildə oxusun. Əgər səhih oxuduğu hissə etina olunacaq qədər olsa, amma əgər o miqdar az olarsa, ehtiyat-vacib görə, Quranın qalan qismindən səhih oxuya bildiyi qədərini öyrənib ona əlavə etməlidir. Əgər bunu bacarmasa, ona təsbih əlavə etməlidir. Amma surəni ümumiyyətlə səhih oxumağa imkanı olmayan şəxsin, onun yerinə bir şey oxuması vacib deyildir. Ehtiyat-.müstəhəbə əsasən bütün bu hallarda namazı camaatla qılsın

Məsələ ۹۸۴: Həmdi yaxşı bilməyən şəxs öz vəzifəsini yerinə yetirməyə səy etməlidir, istər öyrənməklə, istər təlqin etməklə, istərsə də camaat namazına iqtida etməklə və ya şəkk etdiyi yeri təkrar etməklə. Əgər vaxt dar olsa, əvvəlki məsələdə izah olunduğu şəkildə qılarsa, namazı səhihdir. Amma öyrənməkdə səhlənkarlığa yol verdiyi təqdirdə, mümkün olarsa, (İlahi) əzabdan uzaq qalmaq üçün, namazını camaatla .qılmalıdır

Məsələ ۹۸۵: Ehtiyata əsasən namazın vacibatını öyrətmək üçün muzd almaq haramdır. .Amma onun müstəhəbbatını öyrətmək üçün muzd almaq caizdir

Məsələ ۹۸۶: Əgər Həmd və surənin kəlmələrindən birini, ya qəsdən və ya təqsiri cəhl zad hərfinin (ض) ,üzündən deməsə, ya bir hərfin yerinə başqa bir hərf desə, məsələn hərfi desə, yaxud «kəsrə», «fəthəsi»-nə riayət etməsə, belə ki, səhv (ز) və ya (ذ) yerinə .sayılsa və ya təşdidi deməsə, namazı batildir

Məsələ ۹۸۷: Əgər insan öyrəndiyi bir kəlmənin düzgün olduğunu bilsə və namazda da o .cür oxusa və sonra səhv olduğunu başa düşsə, namazı təkrar qılmaq lazım deyildir

( -ه ) Məsələ ۹۸۸: Əgər bir kəlmənin « kəsrə » və « fəthə »-sini bilməzsə və ya bir kəlmənin

bilmirsə, gərək öz vəzifəsini müəyyən yolla yerinə yetirsin. Məsələn, öyrənsin, yaxud namazı camaatla qılsın. Amma bu zaman namazı o surətdə səhihdir ki, o səhv cümlə .də Quran və zikrdən hesab olunsun

vav varsa və o kəlmədə (و) Məsələ ۹۸۹: Təcvid alimləri demişlər ki, əgər bir kəlmədə həmzə ( ء ) «vav»dan əvvəlki hərfin hərəkəsi ( ُ ) zəmmə olub «vav»dan sonrakı hərf isə su` kəlməsində olduğu kimi) gərək o vava mədd versin, yəni bir qədər ) سوء ) ,olarsa əlif » hərfi olarsa və o kəlmədə «əlif»dən «الف» ) uzatsın və həmçinin, əgər bir kəlməd ) ,həmzə» olarsa» ( ء ) əvvəlki hərəkə ( َ ) «fəthə» olsa və o kəlmədə «əlif»-dən sonrakı hərf ya » ( ی ) caə» kəlməsində olduğu kimi), əlif uzadılmalıdır, habelə əgər bir kəlmədə») ( جاء » hərfi olsa və ondan əvvəlki hərfin hərəkəsi ( ِ ) «kəsrə» olsa və o kəlmədə «ya» dan ciə» sözündə olduğu kimi) «ya» məddli, yəni») ( جِیء ) ,sonrakı hərf « həmzə » olsa uzadaraq oxunar. Həmçinin əgər bu « vav », « əlif » və « ya » hərflərindən sonra « həmzə » hərfi yerinə « sakin », yəni « kəsrə », « fəthə » və « zəmmə »- si olmayan bir hərf olsa da bu üç hərfi məddli, yəni uzadaraq oxumağı məsləhət bilmişlər. Lakin, zahirən belə yerlərdə kəlmənin qiraətinin düzgünlüyü onu məddli olaraq oxumağa bağlı deyildir. Başqa sözlə, belə yerlərdə yuxarıda izah olunan qaydaya əməl etməsə belə, namazı səhihdir. Amma, « vələzzallin »də olduğu kimi yerlərdə « təşdid » və « əlif »- i birlikdə tələffüz etmək, bir az məddli olaraq oxumağa bağlı olduğundan bu miqdarda, « əlif » -in .mədli oxunması lazımdır

Məsələ ۹۹۰: Ehtiyat-müstəhəb budur ki, namazda hərəkə ilə vəqf, sükun ilə vəsl etməsin. Hərəkə ilə vəqf etməyin mənası budur ki, kəlmənin axırıncı hərfinin fəthə, kəsrə və ya zəmməsini deyib, o kəlmə ilə sonrakı kəlmə arasında fasilə salsın; məsələn: “Ər-rəhmanir-rəhim” deyib, “rəhim” kəlməsinin mim hərfinə kəsrə versin, sonra bir az fasilə salıb “Maliki yəvmiddin” desin. Sükun ilə vəsl etməyin mənası budur ki, bir kəlmənin fəthə, kəsrə və zəmməsini demədən, həmin

kəlməni sonrakı kəlməyə birləşdirsin; məsələn: “Ər-rəhmanir-rəhim” deyib, “rəhim” .kəlməsinin mim hərfinə kəsrə vermədən, dərhal “Maliki yəvmiddin” desin

Məsələ ۹۹۱: Namazın ۳-cü və ۴-cü rəkətində təkcə bir Həmd oxumaq və yə bir dəfə :«Təsbihati-ərbəə» demək olar, yəni bir dəfə

سُبْحَانَ اللهِ وَالْحَمْدُ لِلَّهِ وَلاَ إِلَهَ إِلاَّ اللهُ وَاللهُ أَكْبَرُ

.Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu, vəllahu əkbər» demək olar»

Daha yaxşısı odur ki, üç dəfə desin. Bir rəkətdə Həmdi və o biri rəkətdə «təsbihat»-ı .deyə bilər. Yaxşı olar ki, hər iki rəkətdə təsbihat oxusun

Məsələ ۹۹۲: Vaxt dar olduqda, təsbihati-ərbəəni bir dəfə oxumaq lazımdır. Hətta əgər .ona yetəcək qədər vaxtı olmazsa, bir dəfə «Subhanəllah» deməsi kifayətdir

Məsələ ۹۹۳: Kişi və qadın, ehtiyat-vacibə əsasən ۳-cü və ۴-cü rəkətdə, Fatihəni və ya .təsbihati-ərbəəni ahəstə oxumalıdır

Məsələ ۹۹۴: Əgər namazın üçüncü və dördüncü rəkətində «Həmd»i oxuyarsa, onun Bismillahını alçaqdan oxuması vacib deyildir. Amma əgər məmum olarsa, ehtiyat-.vacibə əsasən Bismillahı ahəstə oxusun

Məsələ ۹۹۵: Təsbihatı öyrənə bilməyən, yaxud düzgün deyə bilməyən şəxs, gərək .üçüncü və dördüncü rəkətdə Həmd surəsini oxusun

Məsələ ۹۹۶: Əgər namazın ilk iki rəkətində, son iki rəkətolması gumani ilə təsbihatı oxuyarsa, rükuya getməzdən əvvəl başa düşdüyü təqdirdə, Fatihə və surəni .oxumalıdır. Amma əgər rükuda və ya rükudan sonra başa düşərsə, namazı səhihdir

Məsələ ۹۹۷: Əgər namazın son iki rəkətində, namazın ilk iki rəkəti olduğu gumani ilə Həmd oxuyarsa və ya ilk iki rəkətində, namazın son iki rəkəti olduğunu guman etdiyi halda Həmdi oxuyarsa, istər rükudan qabaq başa düşsün, istərsə sonra, namazı .səhihdir

Məsələ ۹۹۸: Əgər üçüncü və dördüncü rəkətdə Həmdi oxumaq istədikdə dilinə təsbihat gəlsə, yaxud təsbihat oxumaq istədikdə dilinə Həmd gələrsə, əgər namaz qəsdi ilə olmasa, hətta özündən xəbərsiz olaraq oxusa, gərək onu buraxıb, ikinci dəfə Həmd və ya təsbihatı oxusun. Amma əgər qəsd etməyibsə və məsələn adəti üzrə dilinə gəlmiş .bir şeyi oxusa, onu tamam edə bilər, namazı da səhihdir

Məsələ ۹۹۹: Üçüncü və dördüncü rəkətdə adəti təsbihat oxumaq olan şəxs, əgər öz adətinin xilafına hərəkət etsə (yaddan çıxarsa), vəzifəsini əda etmək qəsdilə Həmd oxumağa məşğul olsa, kifayət edər. Yenidən Həmd və ya təsbihatı oxuması lazım .deyildir

Məsələ ۱۰۰۰: Üçüncü və dördüncü rəkətdə təsbihatdan sonra, məsələn; «Əstəğfirullahə rəbbi və ətubu iləyh» və yaxud «Əllahumməğfir li» deyərək istiğfar .etməsi müstəhəbdir

Əgər namaz qılan bir şəxs, istiğfar edib rükuya əyilməzdən qabaq, Həmd və ya təsbihatı oxuyub-oxumadığı barədə şəkk edərsə, Həmd və təsbihatı oxuması lazımdır. Əgər istiğfar deyən zaman, ya ondan sonra şəkk edərsə, yenə də ehtiyat-vacib görə .Həmdi və ya təsbihatı gərək yenidən oxusun

Məsələ ۱۰۰۱: Əgər üçüncü və dördüncü rəkətin rükusunda və ya rükuya gedən halda, Həmd və ya təsbihatı oxuyub-oxumadığı barədə şəkk edərsə, şəkkinə etina .etməməlidir

Məsələ ۱۰۰۲: Əgər bir ayə və ya kəlməni düz oxuyub-oxumadığı barədə şəkk edərsə, məsələn; «Qul huvəllahu əhəd»i düzgün oxuyub-oxumadığı barədə şəkk edərsə, şəkkinə etina etməyə bilər. Əgər ehtiyata əsasən o ayə və ya kəlməni yenidən səhih bir şəkildə oxuyarsa da eybi yoxdur. Əgər bir neçə dəfə şəkk edərsə, yenə də bir neçə dəfə düz şəkildə deyə bilər. Amma vəsvəsə dərəcəsinə çatarsa, yaxşı olar ki, təkrar .etməsin

Məsələ ۱۰۰۳: Müstəhəbdir ki, birinci rəkətdə Həmdi oxumamışdan əvvəl «Əuzu billahi

minəş-şəytanir-rəcim» desin. Günorta və ikindi (zöhr və əsr) namazının birinci və ikinci rəkətlərində də «Bismillahir-rəhmanir-rəhimi» ucadan, habelə müstəhəbdir ki, həmd və surəni açıq-aydın desin, Həmd və surənin sonunda vəqf etsin, yəni onu sonrakı ayəyə

yapışdırmasın, Həmd və surəni oxuyan vaxtda onun mənasına diqqət yetirsin və əgər namazı camaatla qılırsa, imamın Həmdindən sonra və əgər tək qılırsa, öz Həmdindən sonra «Əlhəmdu lillahi rəbbil-aləmin» desin və Tovhid surəsini oxuyandan sonra bir, iki və ya üç dəfə «Kəzalikəllahu rəbbi», yaxud üç dəfə «Kəzalikəllahu rəbbuna» desin, surəni oxuyandan sonra bir az səbr edib sonra rükudan əvvəlki təkbiri desin və ya qunut .tutsun

Məsələ ۱۰۰۴: Bütün namazların birinci rəkətində «Qədr» və ikinci rəkətində «İxlas» .surəsini oxumaq müstəhəbbdir

Məsələ ۱۰۰۵: İnsanın gündəlik namazlarının heç birində «İxlas» surəsini oxumaması .məkruhdur

.Məsələ ۱۰۰۶: «Tövhid» surəsini bir nəfəsə oxumaq məkruhdur

Məsələ ۱۰۰۷: Birinci rəkətdə oxuduğu surəni ikinci rəkətdə oxumaq məkruhdur. Amma .əgər «Tövhid» surəsini hər iki rəkətdə oxusa, məkruh deyil

## RÜKU

Məsələ ۱۰۰۸: Namaz qılan, hər rəkətdə qiraətdən sonra bütün barmaqlarının ucunu o cümlədən baş barmağının ucunu dizlərinin üzərinə qoya biləcək qədər əyilməlidir. Bu .əmələ rüku deyilir

Məsələ ۱۰۰۹: Əgər insan rüku ölçüsündə əyilsə, amma əllərini dizlərinə qoymasa, eybi .yoxdur

Məsələ ۱۰۱۰: Əgər rükunu qeyri-adi şəkildə yerinə yetirsə; məsələn; sola və ya sağa .əyilsə, ya dizlərini qabağa gətirsə, əllərini dizlərinə qoysa da, səhih deyildir

Məsələ ۱۰۱۱: Rükuya əyilmək, gərək rüku niyyəti ilə olsun. Deməli, başqa iş üçün; məsələn: hər hansı həşəratı öldürmək niyyəti ilə) əyilsə onu rüku hesab etmək olmaz; gərək ayağa qalxıb yenidən rükuya getsin və bu əməl vasitəsi ilə rükn artırılmamışdır, .namaz da batil deyildir

Məsələ ۱۰۱۲: Əl və ya dizləri başqalarının əl və dizlərindən fərqli olan şəxs, məsələn; qolu çox uzun olsa və azacıq əyildikdə dizlərinə çatarsa və ya dizləri normal insanlardakından daha aşağıda olsa və əllərini dizlərinə çatdırması üçün çox əyilməsi .lazım gəlirsə, normal səviyyədə əyilməlidir

Məsələ ۱۰۱۳: Oturan halda namaz qılan şəxs rüku üçün gərək o qədər əyilməlidir ki, üzü dizlərinin müqabilinə çatsın. Daha yaxşı olar ki, o qədər əyilsin ki, üzü səcdə etdiyi .yerin yaxınlığına çatsın

Məsələ ۱۰۱۴: İxtiyar halında, rükuda hər hansı zikrin kifayət etməsinə baxmayaraq üç dəfə «Subhanəllah» və ya bir dəfə «Subhanə rəbbiyəl-əzimi və bihəmdih» deməsi daha yaxşıdır. Ehtiyat-vacibə görə rüku zamanı, bu miqdarı söyləmək kifayətdir. Amma əgər vaxt dar olsa və ya məcburiyyət qarşısında qalsa, bir dəfə «Subhanəllah» deməsi kifayətdir. Sübhanə rəbbiyəl-əzimi və bihəmdihi yaxşı deyə bilməyən bir kəs başqa bir .zikri, məsələn ۳ dəfə subhanəllah deməlidir

Məsələ ۱۰۱۵: Rükunun zikri bir-birinin ardınca (yəni fasiləsiz ) və ərəbcə səhih .deyilməlidir. Müstəhəbdir ki, ۳, ۵, ۷ dəfə və hətta daha artıq deyilsin

Məsələ ۱۰۱۶: Rüku halında namaz qılanın bədəni gərək aram (hərəkətsiz) olsun, o gərək öz bədəninə ixtiyar halında o cür hərəkət verməsin ki, aram olan haldan xaric olsun. Hətta ehtiyata əsasən əgər vacib zikrə məşğul olmasa da. Əgər bu hərəkətsizliyə qəsdən riayət etməsə zikri aram olan halda yenidən təkararlasa belə, .namaz ehtiyata əsasən batil olur

Məsələ ۱۰۱۷: Əgər rükunun vacib zikrini dediyi halda səhvən, ya ixtiyarsız olaraq bir qədər hərəkət etsə və bədəni aramlıq halından çıxsa, bədəni aram olandan sonra, zikri ikinci dəfə deməsi yaxşıdır. Amma əgər azacıq hərəkət etsə və bədəni aramlıq .halından çıxmasa, yaxud barmaqlara hərəkət versə, zərəri yoxdur

Məsələ ۱۰۱۸: Əgər rüku həddinə əyilməzdən və bədəni aram tutmazdan əvvəl, qəsdən rükunun zikrini desə, namazı batildir. Amma əgər zikri yenidən, bədənin aram olan



.halında desə, batil olmaz. Əgər səhvən olsa, onu yenidən deməsi lazım deyil

Məsələ ۱۰۱۹: Əgər vacib zikr qurtarmamışdan əvvəl başını qəsdən rükudan qaldırsa, .namazı batildir və əgər səhvən başını qaldırsa, zikri yenidən deməsi lazım deyil

Məsələ ۱۰۲۰: Əgər zikr demək miqdarında hətta bir dəfə sübhanəllah demək qədər hərçənd bədəni aram olmadıqda belə, rükuda qala bilmirsə, vacib deyil amma ehtiyat-müstəhəb budur ki, zikrin qalanını qalxdığı halda «mütləq qürbət» qəsdi ilə olsa belə .desin və ya ondan əvvəl başlasın

Məsələ ۱۰۲۱: Əgər xəstəlik və bu kimi səbəblərə görə rükuda aram ola bilmirsə, namazı səhihdir. Amma rüku halından çıxmamış, gərək vacib zikri keçən məsələdəki kimi .desin

Məsələ ۱۰۲۲: Əgər rüku miqdarında əyilə bilməsə, gərək bir şeyə söykənsin və rüku etsin. Əgər söykənərkən də adi qaydada rükuya gedə bilmirsə, gərək nə qədər bacarır əyilsin ki, ürfün nəzərində ona rüku desinlər. Əgər bu miqdarda da əyilə bilməsə, .gərək rüku üçün başı ilə işarə etsin

Məsələ ۱۰۲۳: Rüku üçün başı ilə işarə etməli olan şəxs, əgər başı ilə işarə etməyi bacarmasa, gərək rüku niyyəti ilə gözlərini yumsun və onun zikrini desin və rükudan qalxmaq niyyəti ilə gözlərini açsın. Bundan da acizdirsə, ehtiyat-vacibə əsasən öz qəlbində rüku niyyəti etsin, öz əli ilə rükuya işarə etsin onun zikrini desin. Bu halda mümkün olsa, ehtiyat-vacibə əsasən həm bunu etməlidir, həm də oturan halda .rükuya işarə etməlidir

Məsələ ۱۰۲۴: Ayaq üstə rüku edə bilməyən şəxs, oturan yerdə rüku üçün əyilə bilirsə, gərək ayaq üstə namaz qılsın və rüku üçün başı ilə işarə etsin. Ehtiyat-müstəhəb budur ki, başqa bir namaz da qılıb rüku vaxtında otursun və bacardığı qədər rükuya .əyilsin

Məsələ ۱۰۲۵: Əgər rüku həddinə çatdıqdan sonra qəsdən başını qaldırıb və ikinci dəfə .rüku ölçüsündə əyilsə, namazı batildir

Məsələ ۱۰۲۶: Rükunun zikri qurtardıqdan sonra gərək qalxıb düz dursun və ehtiyat-

vacibə görə bədəni aram olandan sonra səcdəyə getsin. Əgər qəsdən durmamışdan əvvəl səcdəyə getsə, namazı batildir. Həmçinin ehtiyat-vacibə görə bədəni aram .olmamışdan əvvəl səcdəyə getsə, hökm eynidir

Məsələ ۱۰۲۷: Əgər rükunu unutsa və səcdəyə çatmamışdan əvvəl yadına düşsə, gərək ayaq üstə dursun, sonra rükuya getsin, əyilmiş halda rükuya qayıtmaq kifayət etmir.

Məsələ ۱۰۲۸: Əgər alnı yerə çatandan sonra rüku etmədiyi yadına düşərsə qayıdaraq, qiyamdan sonra rükunu yerinə yetirsin. İkinci səcdədə yadına düşsə, ehtiyat-lazıma əsasən namazı batildir.

Məsələ ۱۰۲۹: Müstəhəbdir ki, rükuya getməzdən əvvəl, bədən düz olan halda təkbir desin, rüku halında dizlərini arxaya tərəf versin, kürəyini düz saxlasın, boynunu çəkib kürəyi ilə bir səviyyədə saxlasın, ayaqlarının arasına baxsın; zikrdən əvvəl və ya sonra salavat desin. Rükudan qalxıb düz durduqdan və bədəni aramlaşdıqdan sonra "Səmiəllahu limən həmidəh" desin.

Məsələ ۱۰۳۰: Müstəhəbdir ki, qadın rükuda əllərini dizlərindən yuxarı qoysun və dizlərini geriyə verməsin.

## Səcdə

### Point

Məsələ ۱۰۳۱: Namaz qılan şəxs, müstəhəb və vacib namazların hər rəkətində rükudan sonra gərək iki səcdə etsin. Səcdə odur ki, alnı xüsusi formada xüzu qəsdi ilə yerə qoysun. Namazın səcdəsində vacibdir ki, iki əlin içi, iki diz, iki ayağın baş barmaqları yerə qoyulsun. Alın dedikdə ehtiyat-vacibə əsasən alnın ortasıdır ki, iki qaşın arasında, (alının ortasında) tük çıxan yerə qədər iki xəyali xətt çəkməklə alınan dördbucaqdır.

Məsələ ۱۰۳۲: İki səcdə birlikdə bir rükndür. Əgər bir kəs vacib namazda hərçənd yaddan çıxmış olsa da, ya məsələni bilmədiyinə görə olsa da, bir rəkətdə hər ikisini tərk etsə, namazı batildir. Həmçinin ehtiyat-lazıma əsasən, əgər bir rəkətdə iki səcdə unutqanlıq ya qasir cəhalət üzündən artırılmış olsa da, hökm eynidir. (Qasir cahil budur ki, cahil öz cəhlində üzrlü olsun).

Məsələ ۱۰۳۳: Əgər bilərəkdən bir səcdə az və ya çox etsə, namazı batildir. Əgər səhvən

batil olmaz və az etdiyi surətdə hökmü səcdeyi səhvin hökmlərində deyiləcəyi kimi .olar

Məsələ ۱۰۳۴: Bir şəxs alnını yerə qoymağı bacarırsa, gərək yerə qoysun, əgər bilərəkdən və ya səhvən yerə qoymasa, başqa üzvlərini yerə çatdırsa da, səcdə etməmişdir. Amma əgər alnını yerə qoysa və səhvən başqa üzvlərini yerə çatdırmasa .və ya səhvən zikr deməsə, səcdə səhihdir

Məsələ ۱۰۳۵: Ən yaxşısı budur ki, ixtiyar halında, səcdədə üç dəfə «Subhanəllah», yaxud bir dəfə «Subhanə rəbbiyəl-ə`la və bihəmdih» desin. Gərək bu kəlmələr ardıcıl və ərəbcə düz deyilsin. Hər bir zikri demək kifayət edər, amma ehtiyat-lazıma əsasən, gərək bu miqdarda olsun. Müstəhəbdir ki, «Subhanə rəbbiyəl-ə`la və bihəmdih» üç, .beş, yeddi və ya da daha çox deyilsin

Məsələ ۱۰۳۶: Səcdə halında gərək namaz qılanın bədəni aram, (hərəkətsiz) olsun, o, gərək öz bədəninə ixtiyar halında hətta ehtiyat-vacibə əsasən, əgər vacib zikrə .məşğul olmasa da, o cür hərəkət verməsin ki, aram haldan çıxsın

Məsələ ۱۰۳۷: Əgər alnı yerə çatmamışdan və bədəni aram olmamışdan əvvəl bilərəkdən səcdənin zikrini desə, namazı batildir. Amma zikri yenidən, bədən aram olan halda desə, batil olmaz. Əgər zikri tamam etməzdən qabaq bilərəkdən başını .səcdədən götürsə, namaz batildir

Məsələ ۱۰۳۸: Əgər alnı yerə çatmazdan əvvəl səhvən səcdənin zikrini desə, başını səcdədən götürməzdən qabaq səhv etdiyini bilsə, gərək bədəni aram olduqdan sonra ikinci dəfə zikri desin. Amma əgər alnı yerə çatandan sonra, bədən aram olmamışdan .əvvəl səhvən zikri desə, təkrar etmək lazım deyil

Məsələ ۱۰۳۹: Əgər başı səcdədən götürəndən sonra başa düşsə ki, səcdənin zikri .tamam olmazdan qabaq başını qaldırıb, namazı səhihdir

Məsələ ۱۰۴۰: Əgər səcdənin zikrini dediyi vaxt yeddi üzvündən birini bilərəkdən yerdən götürsə, səcdədə şərt olan istiqrar (bədənin aram olması) ilə zidd olsa, namaz batil

.olar. Həmçinin ehtiyat-vacibə əsasən zikr deməyə məşğul deyilsə də hökm eynidir

Məsələ ۱۰۴۱: Əgər səcdənin zikri tamam olmamışdan qabaq səhvən alnını yerdən qaldırsa, yenidən yerə qoya bilməz və gərək onu bir səcdə hesab etsin. Amma sair .səcdə üzvlərini səhvən yerdən qaldırsa, gərək yenidən yerə qoyub zikri desin

Məsələ ۱۰۴۲: Birinci səcdənin zikri qurtardıqdan sonra gərək otursun, bədəni aram .olduqdan sonra ikinci dəfə səcdəyə getsin

Məsələ ۱۰۴۳: Namaz qılanın alnının yeri, gərək dizlərinin və ayağının baş barmaqlarının yerindən dörd bağlı barmaqdan alçaq və ya uca olmasın. Hətta ehtiyat-vacib budur ki, .alnının yeri, dayandığı yerdən dörd bağlı barmaqdan alçaq və ya uca olmasın

Məsələ ۱۰۴۴: Başı aşağı yerdə (hərçənd ki, onun başı aşağı olması düzgün məlum olmasa da belə) əgər namaz qılanın alın yeri, dizlərindən və ayaq barmaqlarından, .dörd bağlı barmaqdan alçaq və ya uca olsa, namazı işkallıdır

Məsələ ۱۰۴۵: Əgər alnını səhvən dizlərinin və ayaq barmaqlarının yerindən dörd bağlı barmaqdan yüksək olan bir şeyin üzərinə qoyarsa, əgər onun hündürlüyü «səcdə halındadır» deyilməyəcək qədər çox olarsa, başını onun üzərindən qaldırıb, hündürlüyü dörd bağlı barmaqdan çox olmayan bir şeyin üzərinə qoymalıdır. Amma əgər onun hündürlüyü «səcdə halındadır» deyiləcək qədərdirsə, vacib zikri dedikdən sonra fərqinə varsa, başını səcdədən qaldırıb namazı tamamlaya bilər; əgər vacib zikri oxumamışdan əvvəl fərqinə varsa, alnını onun üzərindən hündürlüyü dörd bağlı barmaq qədər və ya daha az olan bir şeyin üzərinə çəkməli və vacib zikri oxumalıdır. Əgər alnını çəkməsi mümkün deyilsə, o halda vacib zikri oxuyaraq namazını .tamamlaya bilər. Namazını yenidən qılması da lazım deyil

Məsələ ۱۰۴۶: Gərək alın ilə üzərinə səcdə edilməsi səhih olan şeyin arasında başqa bir şey fasilə olmasın. Demək əgər möhür, alnı möhürün özünə dəyməyəcək qədər çirk .olsa, səcdə batildir, amma məsələn, möhürün rəngi dəyişsə eybi yoxdur

Məsələ ۱۰۴۷: Səcdədə gərək əllərin içi yerə qoyulsun. Ehtiyat-vacibə əsasən mümkün olan təqdirdə əlin içinin hər yerini yerə qoysun. Amma çarəsizlik üzündən əllərin

arxasının da qoyulmasının maneəsi yoxdur. Əgər əlin arxasını da qoymaq mümkün olmasa, ehtiyat-vacibə əsasən, əlin biləyini yerə

qoymalıdır. Onu da bacarmasa, dirsəyə qədər, hər yeri mümkünsə yerə qoysun, o da .mümkün deyildirsə, qolu yerə qoymaq kifayətdir

Məsələ ۱۰۴۸: Səcdədə gərək ayaqların iki baş barmaqlarını yerə qoysun, amma lazım deyildir ki, iki barmağın başını yerə qoysun, hətta onların altını və ya üstünü qoymaq kifayət edər. Əgər ayağın baş barmaqlarını deyil başqa barmaqlarını, yaxud ayağın üstünü yerə qoysa, ya dırnağın uzunluğu səbəbindən (baş barmaq) yerə çatmasa, namaz batildir. Təqsir (səhv) və ya məsələni bilmədiyinə görə, namazlarını bu cür qılan .şəxs, gərək namazlarını ikinci dəfə qılsın

Məsələ ۱۰۴۹: Ayağının baş barmağından bir qədəri kəsilən şəxs, gərək onun qalanını yerə qoysun və əgər ondan bir şey qalmamışdırsa və ya qalmış olsa da qalan hissə çox azdırsa və onu heç cür yerin üstünə və ya başqa bir şeyin üstünə qoymaq mümkün deyilsə, ehtiyat-vacibə əsasən, gərək qalan barmaqları qoysun. Lakin barmağı .yoxdursa, nə qədər ayağında yer qalıbsa, onu yerə qoysun

Məsələ ۱۰۵۰: Əgər bir şəxs qeyri adi halda səcdə etsə, məsələn, sinə və qarnını yerə yapışdırsa, yaxud ayaqlarını bir qədər uzatsa, bu halda «səcdə edir» deyilərsə, namazı səhihdir. Amma əgər «uzanıb və düzgün səcdə etmir» desələr, səcdə adlana bilməsə, .onun namazı batildir

Məsələ ۱۰۵۱: Möhür və ya səcdə edilən başqa şeylərin səcdə etdiyi miqdarı gərək pak olsun. Amma əgər məsələn, möhürü, nəcis xalçanın üzərinə qoysa və ya möhürün bir tərəfi nəcis olsa, alnını onun pak tərəfinə qoysa, yaxud möhürün üstünün bir hissəsi .pak, bir hissəsi nəcis olsa, əgər alnı nəcis etməsə eybi yoxdur

Məsələ ۱۰۵۲: Əgər alnında çiban, yara və ona oxşar şeylər olsa, alnını hərçənd sıxmadan olsa belə yerə qoya bilməsə, bu halda o çiban, məsələn, alnının bütün yerini tutmasa, gərək alnın sağlam yeri ilə səcdə etsin. Əgər alnın sağlam yeri ilə səcdə etmək, yeri qazıb çibanı deşiyə qoyaraq, alının sağlam tərəfindən səcdəyə yetəcək qədərini yerə qoymasına bağlı olarsa, bunu

etməsi lazımdır. (Alın dedikdə nəzərdə tutulan hissə səcdə fəslinin əvvəlində qeyd .olundu

Məsələ ۱۰۵۳: Əgər çiban və ya yara alnı (əvvəldə qeyd olunan mənada) tamamilə bürüsə, gərək ehtiyat-vacibə əsasən alnın qalan yeri olan iki tərəfini və ya onlardan birini bacardığı hər yolla yerə qoysun. Əgər bunu da edə bilməsə sifətinin bəzi üzvləri ilə səcdə etsin və ehtiyat-lazım budur ki, əgər bacarırsa çənə ilə səcdə etsin, bacarmırsa, alnın iki tərəfinin biri ilə səcdə etsin və əgər sifətlə səcdə etmək heç cür .mümkün deyilsə, gərək səcdə üçün işarə etsin

Məsələ ۱۰۵۴: Əgər bir kəs otura bilir, amma alnını yerə çatdıra bilmirsə, gərək ürfən səcdə adlana biləcək qədər əyilsin və möhür, ya səcdə edilməsi səhih olan başqa bir şeyi, hündür şeyin üstünə qoyaraq, alnını onun üzərinə qoysun. Amma gərək əllərin içi, .dizlər və ayağın barmaqlarını adi qaydada yerə qoysun

Məsələ ۱۰۵۵: Əgər qeyd olunan halda möhürü və ya səcdə edilməsi səhih olan başqa bir şeyi, üzərinə qoymaq üçün, yüksək bir şey tapılmazsa və onun səcdə etməsi üçün, möhürü yüksəkdə tutan bir şəxs də tapılmazsa, gərək möhürü qaldırsın və onun .üzərinə səcdə etsin

Məsələ ۱۰۵۶: Səcdə edə bilməyən şəxs və əyildiyi miqdara da səcdə deyilməzsə gərək səcdə üçün başı ilə işarə etsin. Əgər bacarmasa, gərək gözləri ilə işarə etsin, bunu da bacarmasa, gərək qəlbdə səcdə niyyəti edib, ehtiyat-lazıma əsasən, əl və bu kimi .şeylərlə səcdə üçün işarə etsin və vacib zikri desin

Məsələ ۱۰۵۷: Əgər alın ixtiyarsız olaraq səcdə yerindən qalxsa, mümkün olduğu təqdirdə səcdənin zikrini desə də, deməsə də, gərək ikinci dəfə alnı səcdəyə çatmağa qoymasın və bu bir səcdə hesab olunur. Əgər başı saxlaya bilməsə, ixtiyarsız olaraq ikinci dəfə səcdə yerinə çatsa, o da bir səcdə hesab olunur. Amma əgər zikri deməmiş olsa ehtiyat-vacib budur ki, onu «mütləq qürbət» qəsdilə desin və cüz olmaq qəsdi .etməsin

Məsələ ١٠۵٨: İnsan təqiyyə saxlaması lazım olan yerdə xalça və bu kimi şeylərin ,üzərinə səcdə edə bilər. Lazım deyildir ki

namaz üçün başqa yerə getsin və ya təqiyyə səbəbi aradan gedəndən sonra həmin yerdə namazı qılmaq üçün namazı təxirə salsın. Amma əgər həmin yerdə həsirə və ya üzərinə səcdə səhih olan başqa bir şeyə, təqiyyəyə xilaf olmamış şəkildə səcdə edə .bilsə, xalçaya və onun kimi şeylərə səcdə etməməlidir

Məsələ ۱۰۵۹: İçi dolu döşək və bu kimi şeylərin üzərində (dayanaraq) səcdə etmək, .bədən onun üzərində aram olmayan surətdə batildir

Məsələ ۱۰۶۰: Əgər insan əlacsız olub, palçıq yerdə namaz qılsa, belə ki, bədən və ya paltarının bulaşması onun üçün əziyyət olmasa, gərək səcdə və təşəhhüdü adi qaydada əmələ gətirsin. Əgər əziyyəti olsa, ayaq üstə dayanmış halda başı ilə səcdəyə .işarə etməli, təşəhhüdü də ayaq üstə oxumalıdır. Bu cür namaz səhih olar

Məsələ ۱۰۶۱: Birinci və üçüncü rəkətdə təşəhüd yoxdur (zöhr, əsr və işa namazlarının üçüncü rəkəti kimi). Ehtiyat-vacibə görə gərək ikinci səcdədən sonra bir az hərəkətsiz .oturub, sonra qalxsın

## SƏCDƏ ETMƏYİN SƏHİH OLDUĞU ŞEYLƏR

Məsələ ۱۰۶۲: Yerə və yerdə bitən şeylərə, yeyiləcək və geyiləcək şeylərdən başqa məsələn, ağac və ağac yarpağının üzərinə səcdə caizdir. Arpa, buğda kimi yeyilən, pambıq kimi geyilən, habelə yeyilməyən və geyilməyən, amma yerdən hesab olunan qızıl, gümüş və bu kimi şeylərə səcdə səhih deyildir. Amma əlacsız qaldıqda qır və zəft (qırın pis bir növüdür) kimi şeylərin üzərinə səcdə etmək, üzərində səcdə səhih .olmayan digər şeylərdən daha üstündür

Məsələ ۱۰۶۳: Üzüm yarpağının üzərinə lətif (yumşaq) vaxtında və yeyilməsi adi olan .vaxtında səcdə icazəli deyildir. Bu haldan başqa ona səcdə etməyin eybi yoxdur

Məsələ ۱۰۶۴: Ot və saman kimi heyvanların yemi olan, yerdən bitən şeylərin üzərinə .səcdə səhihdir

Məsələ ۱۰۶۵: Yeməli olmayan güllərin üzərinə səcdə səhihdir. Hətta yeməli dərmanların, yerdən göyərən qaynadılaraq suyu içilən, dərman kimi istifadə olunan .bənövşə və mal dili gülünün üzərinə səcdə səhihdir

Məsələ ۱۰۶۶: Bəzi məntəqələrdə yeyilməsi adət olan, bəzi şəhərlərdə isə, yeyilən bitkilərdən sayılmasına baxmayaraq, yeyilməsi adət olmayan bitkilər üzərinə və .həmçinin yetişməmiş meyvə üzərinə səcdə etmək ehtiyata əsasən icazəli deyildir

Məsələ ۱۰۶۷: Əhəng daşı və təbaşir üzərinə səcdə etmək səhihdir. Bişmiş təbaşirə, .əhəngə, kərpicə və palçıqdan düzəlmiş kuzəyə səcdə etməyin işkalı yoxdur

Məsələ ۱۰۶۸: Səcdəsi səhih olan şeylərdən, məsələn, ağac və samandan düzəldilmiş kağız üzərinə səcdə etmək olar. Kağız pambıq və kətandan düzəldilmiş olsa da, hökm eynidir. Amma əgər ipəkdən və bu kimi şeylərdən düzəldilmiş olsa, onun üzərinə səcdə icazəli deyildir. Amma kağız dəsmala (salfetkaya) o halda səcdə etmək olar ki, üzərinə .səcdə etməyin səhih olduğu şeylərdən düzəldilmiş olduğu məlum olsun

Məsələ ۱۰۶۹: Səcdə üçün hər şeydən yaxşı Həzrət Seyyidüş-Şühədanın (əleyhis-səlam) .türbətidir. Ondan sonra adi torpaq, sonra daş və daha sonra bitkilərdir

Məsələ ۱۰۷۰: Səcdə səhih olan şey olmasa, yaxud əgər olsa da, soyuq və ya istiliyin şiddətindən onun üzərinə səcdə edə bilmirsə, qıra və zəftə səcdə, o birilərinə səcdədən irəlidir. Amma əgər onların üzərinə səcdə mümkün olmasa, gərək paltarına və yaxud adi halda üzərinə səcdə etmək caiz olmayan hər bir şeyə səcdə edə bilər. Amma ehtiyat-müstəhəb budur ki, paltarına səcdə etmək mümkün olsa, başqa .şeylərə səcdə etməsin

.Məsələ ۱۰۷۱: Üzərində alnın aramlaşmadığı palçıq və yumşaq torpağa səcdə batildir

Məsələ ۱۰۷۲: Əgər birinci səcdədə, möhür alına yapışsa, gərək ikinci səcdə üçün .möhürü götürsün

Məsələ ۱۰۷۳: Əgər namaz əsnasında səcdə etdiyi şey itsə və səcdəsi səhih olan bir şeyi

tərtibə əməl edə bilər istər vaxt az olsun, istərsə namazı pozub yenidən qılmaq qədər .geniş olsun

Məsələ ۱۰۷۴: Əgər səcdə halında ikən, alnını səcdənin batil olduğu bir şey üzərinə qoyduğunu anlasa, vacib zikri söylədikdən sonra fərqinə varmışsa, səcdədən başını qaldırıb namazına davam edə bilər. Amma əgər vacib zikri söyləməmişdən əvvəl fərqinə varmışsa, alnını üzərinə səcdənin səhih olduğu bir şey üstünə çəkərək vacib zikri deməlidir. Əgər alnını çəkməsi mümkün deyilsə, elə o halda vacib zikri söyləyə .bilər. Hər iki halda namazı səhihdir

Məsələ ۱۰۷۵: Əgər səcdədən sonra başa düşsə ki, alnını səcdəsi batil olan şeyin üzərinə .qoymuşdur, eybi yoxdur

Məsələ ۱۰۷۶: Allahdan başqasına səcdə etmək haramdır. Avam camaatdan bəziləri, imamların (ələyhimus-səlam) qəbrlərinin qarşısında alnını yerə qoyurlar; əgər Allahın .şükrünü yerinə yetirmək niyyəti ilə olarsa işkalı yoxdur, əks halda haramdır

## SƏCDƏNİN MÜSTƏHƏB VƏ MƏKRUHATI

:Məsələ ۱۰۷۷: Səcdədə bir neçə şey müstəhəbbdir

Ayaq üstə namaz qılan şəxs, rükudan qalxdıqdan və bədəni tam aram olduqdan-۱ sonra; oturan halda namaz qılan şəxs isə tam düz oturduqdan sonra səcdəyə getmək ;üçün təkbir desin

;Kişi, səcdəyə gedəndə, əvvəl əllərini; qadın isə əvvəl dizlərini yerə qoysun-۲

;Burnu möhürün, yaxud səcdənin səhih olduğu şeyin üstünə qoysun-۳

Səcdə halında əlin barmaqlarını bir-birinə yapışdırsın və əllərini qulaqlarının-۴ ;müqabilində yerə elə qoysun ki, barmaqların ucu qibləyə tərəf olsun

Səcdədə dua edib Allahdan hacətlərini istəsin. Səcdədə münasib olan dualardan biri-۵ :budur

يَاخَيْرَ الْمَسْؤُلِينَ وَيَا خَيْرَ الْمُعْطِينَ اُرْزُقْنِى وَارْزُقْ عِيَالِى مِنْ فَضْلِکَ فَإِنَّکَ ذُوالْفَضْلِ الْعَظِيمِ

Ya xəyrəl-məsulinə və ya xəyrəl-mutinə urzuqni vərzuq əyali min fəzlikə fə innəkə “ ”zul-fəzlil-əzim

Ey hacət istənilənlərin ən yaxşısı və ey əta edənlərin ən yaxşısı! Mənə və mənim əhl-“ ”.əyalıma Öz fəzlindən ruzi əta et. Çünki Sən, həqiqətən böyük fəzl və kərəm sahibisən

Səcdədən sonra sol budunun üstündə otursun, sağ ayağını sol ayağın üstünə-۶ ;qoysun

;Hər səcdədən sonra qalxıb otursun və bədəni aram olduqdan sonra təkbir desin-۷

Birinci səcdədən sonra, bədəni aram olduğu vaxt (ikinci səcdəyə getməzdən əvvəl)-۸ ;“Əstəğfirullahə Rəbbi və ətubu iləyh” desin

;Səcdəni uzatsın, oturanda isə əllərini budlarının üstünə qoysun-۹

;İkinci səcdəyə getmək üçün bədən aram olan halda “Əllahu əkbər” desin-۱۰

;Səcdələrdə salavat desin-۱۱

;Qalxanda əlləri dizlərdən sonra yerdən götürsün-۱۲

Kişilər dirsəyi və qarnı yerə yapışdırmasınlar və qollarını bədəndən aralı saxlasınlar-۱۳ (qabırğalara yapışdırmasınlar); qadınlar isə dirsək və qarınlarını yerə qoysunlar, bədən üzvlərini bir-birinə yapışdırsınlar. Səcdənin sair müstəhəb əməlləri müfəssəl kitablarda .bəyan olunmuşdur

Məsələ ۱۰۷۸: Səcdədə Quran oxumaq, habelə toz-torpağı aradan qaldırmaq üçün üfürmək məkruhdur. Əgər üfürməyin təsirindən, ağızdan iki hərf qəsdən çıxsa, namaz ehtiyata əsasən batildir. Bunlardan başqa məkruhlar da vardır ki, müfəssəl kitablarda .deyilmişdir

## QURANIN VACİB SƏCDƏLƏRİ

Məsələ ۱۰۷۹: Dörd surənin hər birində: «Vənnəcm», «İqrə», «Əlif-lam-mim tənzil» və «Ha-mim Səcdə» surəsində bir səcdə ayəsi vardır ki, əgər insan oxusa, yaxud qulaq assa, o ayəni tamam edəndən sonra, gərək dərhal səcdə etsin. Əgər yaddan çıxartsa, yadına düşdüyü vaxt səcdə etməlidir. İxtiyarsız eşitsə, səcdə etməsinin yaxşı olmasına .baxmayaraq səcdə vacib deyildir

Məsələ ۱۰۸۰: Əgər insan səcdə ayəsinə qulaq asan vaxt, özü də oxusa gərək iki səcdə .etsin

Məsələ ۱۰۸۱: Namazdan başqa hallarda əgər səcdə halında səcdə ayəsini oxusa və ya .eşitsə, gərək səcdədən baş qaldırıb, ikinci dəfə səcdə etsin

Məsələ ۱۰۸۲: Əgər insan yuxulu şəxsdən, dəlidən və ya Quranı müəyyən edə bilməyən uşaqdan səcdə ayəsini eşitsə və ya dinləsə, səcdə vacibdir. Amma əgər qramafon və ya kasetdən eşitsə, səcdə vacib deyildir. Həmçinin radiodan efirə buraxılan lent yazısından dinləsə, hökm eynidir. Amma əgər bir şəxs radiostudiyasında səcdə ayəsini .oxusa və insan da ona radiodan qulaq asarsa səcdə vacibdir

Məsələ ۱۰۸۳: Quranın vacib səcdəsində ehtiyat-vacibə əsasən, gərək insanın yeri qəsbi olmasın, ehtiyat-müstəhəb əsasən, alnının yeri dizlərinin, baş barmaqlarının yerindən dörd bağlı barmaqdan hündür və ya alçaq olmasın. Amma lazım deyildir ki, dəstəmazlı və ya qüsl etmiş və üzü qibləyə olsun və övrətini örtsün, yaxud bədən və alnının yeri .pak olsun və habelə namaz qılanın paltarında olan şərtlər onun paltarında şərt deyildir

Məsələ ۱۰۸۴: Ehtiyat-vacib budur ki, Quranın vacib səcdəsində alnı möhürə, yaxud səcdəsi səhih olan şeyə qoysun və ehtiyat-müstəhəb görə, namaz səcdəsində .deyilənə əsasən, bədənin başqa üzvlərini də yerə qoysun

Məsələ ۱۰۸۵: Əgər Quranın vacibi səcdələrində alın, səcdə niyyəti ilə yerə qoyulsa .hətta zikr deyilməsə də, kifayətdir

:Amma zikri demək müstəhəbdir. Daha yaxşı olar ki, bu zikr deyilsin

لاَـإِلَهَ إِلاَّـ اللهُ حَقًّا حقًّا، لاَـ إِلَهَ إِلاَّـ اللهُ إِيمَانًا وَتَصْـدِيقًا، لاَإِلَهَ إِلاَّ اللهُ عُبُودِيَّةً وَرِقًّا سَـجَدْتُ لَكَ يَارَبِّ تَعَبُّداً وَرِقًّا لاَ مُسْـتَنْكِفًا وَلاَ مُسْتَكْبِراً بَلْ أَنَا عَبْدٌ ذَلِيلٌ ضَعِيفٌ خَائِفٌ مُسْتَجِيرٌ

La ilahə illəllahu həqqən həqqa. La ilahə illəllahu iymanən və təsdiqa. La ilahə illəllahu“ ubudiyyətən və riqqa. Səcədtu ləkə ya Rəbbi, təəbbudən və riqqa. La mustənkifən və ”.la mustəkbirən bəl ənə əbdun zəlilun, zəifun, xaifun, mustəcir

## TƏŞƏHHÜD

Məsələ ١٠٨٦: Bütün vacib və müstəhəb namazların ikinci rəkətində, məğrib namazının üçüncü rəkətində, zöhr, əsr və işa namazlarının dördüncü rəkətində gərək insan ikinci :səcdədən sonra oturub bədəni aram olan vaxt təşəhhüd desin, yəni

أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَشَرِيكَ لَهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ أَللَّهُمَّ صَلِّ عَلىَ مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ

Əşhədu ən la ilahə illəllah, vəhdəhu la şərikə ləh və əşhədu ənnə Muhəmmədən“ .əbduhu və Rəsuluh. Əllahummə səlli əla Muhəmmədin və Ali-Muhəmməd.” desin

Əgər «Əşhədu ən la ilahə illəllahu və əşhədu ənnə Muhəmmədən səlləllahu ələyhi və alih əbduhu və rəsuluh» desə, kifayət edər, həmçinin «Vitr» namazında təşəhhüd .lazımdır

Məsələ ١٠٨٧: Təşəhüdün kəlmələri gərək ərəbcə səhih və adi qaydada, bir-birinin .ardınca deyilsin

Məsələ ١٠٨٨: Əgər təşəhhüdü unutsa və ayaq üstə dursa, rükudan əvvəl yadına düşsə ki, təşəhhüdü deməmişdir, gərək otursun və təşəhhüdü desin, ikinci dəfə ayağa qalxıb o rəkətdə oxuyacağını oxusun və namazı tamam etsin. Ehtiyat-müstəhəbə

əsasən, namazdan sonra yersiz ayaq üstə durduğuna görə, iki səcdeyi-səhv yerinə yetirsin. Əgər rükuda və rükudan sonra yadına düşsə, gərək namazı qurtarsın və namazın salamından sonra ehtiyat-müstəhəbə əsasən təşəhhüdü qəza etsin. Bundan .sonra gərək yaddan çıxmış təşəhhüd üçün iki səcdeyi-səhv yerinə yetirsin

Məsələ ۱۰۸۹: Müstəhəbdir ki, namaz qılan şəxs təşəhhüd deyən halda sol budunun üstünə oturub, sağ ayağı sol ayağın üstünə qoysun. Təşəhüddən qabaq, "Əlhəmdu lillah" və ya "Bismillahi və billahi vəlhəmdu lillahi və xəyrul-əsmai lilllah" deyilsin. Həmçinin, müstəhəbdir ki, əlləri dizlərinin üstünə qoysun, barmaqlarını bir-birinə yapışdırıb, ətəyinə baxsın. Təşəhhüdün salavatından sonra isə "Vətəqəbbəl şəfaətəhu .vərfə dərəcətəh" desin

Məsələ ۱۰۹۰: Müstəhəbdir ki, qadınlar təşəhhüd oxuyanda budlarını bir-birinə .yapışdırsınlar

## NAMAZIN SALAMI

Məsələ ۱۰۹۱: Namazın axırıncı rəkətinin təşəhhüdündən sonra müstəhəbdir ki, oturan :və bədənin aram olduğu halda deyilsin

أَلسَّلاَمُ عَلَيْكَ أَيُهَاالنَّبِيُّ وَرَحْمَهُاللهِ وَبَرَكَاتُهُ

Əssəlamu ələkə əyyuhən-Nəbiyyu və rəhmətullahu və bərəkatuh

:Ondan sonra gərək desin

أَلسَّلاَمُ عَلَيْكُمْ

.Əssəlamu ələykum

:Ehtiyat-müstəhəb budur ki, əlavə edərək desin

وَرَحْمَهُاللهِ وَبَرَكَاتُهُ

,və rəhmətullahi və bərəkatuh

:Yaxud desin

أَلسَّلَامُ عَلَيْنَا وَعَلَى عِبَادِاللهِ الصَّالِحِينَ

Əssəlamu ələyna və əla ibadillahis-salihin desin. Amma bu salamı desə, ehtiyat-vacib budur ki, ondan sonra

أَلسَّلَامُ عَلَيْكُمْ

.Əssəlamu ələykkum da desin

Məsələ ۱۰۹۲: Əgər bir şəxs namazın salamını unutsa və namazın surəti pozulmamış yadına düşsə, qəsdən və səhvən olması ilə namazı batil edən iş etməyibsə, qibləyə .arxa çevirmək kimi, gərək salamı desin, namazı da səhihdir

Məsələ ۱۰۹۳: Əgər namazın salamını unutsa və namazın şəkli pozulduqdan sonra yadına düşsə, yaxud namazı səhvən və ya qəsdən, batil edən bir iş görmüşdürsə .məsələn; arxasını qibləyə çevirmişdirsə, namazı səhihdir

**TƏRTİB**

Məsələ ۱۰۹۴: Əgər insan, namazın tərtibini bilərəkdən pozsa; məsələn: surəni .Həmddən qabaq oxusa, yaxud səcdəlri rükudan qabaq etsə namazı batildir

Məsələ ۱۰۹۵: Əgər namazın bir rüknünü unutsa və ondan sonrakı rüknü yerinə yetirsə, .məsələn, rüku etməmişdən iki səcdə etsə, ehtiyat-vacibə əsasən namaz batildir

Məsələ ۱۰۹۶: Əgər bir rüknü unutsa və ondan sonrakı rükn olmayan əməli yerinə yetirsə, məsələn, iki səcdəni yerinə yetirmədən təşəhhüd desə, gərək iki səcdəni .yerinə yetirsin və ondan əvvəl səhvən oxuduğunu ikinci dəfə oxusun

Məsələ ۱۰۹۷: Əgər rükn olmayan bir əməli unutsa və ondan sonrakı rüknü yerinə .yetirsə, məsələn, Həmdi unudub rükuya getsə, namazı səhihdir

Məsələ ۱۰۹۸: Əgər rükn olmayan bir əməli unutsa, belə ki, ondan sonra gələn və rükn olmayan bir əməli yerinə yetirsə, məsələn, Həmdi unudub, surəni oxumağa başlayarsa, gərək yaddan çıxan əməli yerinə yetirsin və ondan sonra səhvən qabaqca .oxuduğunu, ikinci dəfə oxusun

Məsələ ۱۰۹۹: Əgər birinci səcdəni ikinci səcdədir gümanı ilə və ya ikinci səcdəni birinci səcdə gümanı ilə yerinə yetirsə, namazı səhihdir. Onun birinci səcdəsi birinci, ikinci .səcdəsi də ikinci səcdə hesab olunur

## MÜVALAT

Məsələ ۱۱۰۰: İnsan gərək namazı muvalat ilə qılsın, yəni namazın ruku, səcdələr və təşəhhüd kimi əməllərini ardıcıl, fasiləsiz yerinə yetirməlidir. Namazda oxuduğu şeyləri də adi qaydada fasiləsiz oxumalıdır. Əgər onların arasında uzun fasilə versə və buna, .«namaz qılır» deməsələr namazı batildir

Məsələ ۱۱۰۱: Əgər namazda səhvən hərflərin və kəlmələrin arasında fasilə versə və fasilə namazın şəklini dəyişəcək qədər olmasa, sonrakı röknə məşğul olmamış, gərək o hərfləri və kəlmələri adi qayda üzrə oxusun. Səhv oxuduğu hərflərdən sonra, .oxuduqlarını təkrar etməlidir. Əgər sonrakı röknə məşğul olubsa, namazı səhihdir

Məsələ ۱۱۰۲: Rüku və səcdəni uzatmaq və böyük surələri oxumaq, namazın müvalatını .pozmur

## QUNUT

Məsələ ۱۱۰۳: Bütün vacib və müstəhəb namazlarda ikinci rəkətin rükusundan əvvəl, müstəhəbdir ki, qunut tutulsun. Amma «Şəf` » namazında gərək rəcaən əmələ gətirsin. «Vitr» namazında bir rəkətdə olduğuna baxmayaraq, rükudan qabaq, qunut tutmaq müstəhəbdir. «Cümə» namazında hər rəkətdə bir qunut vardır. «Ayət» namazında beş qunut vardır. «Fitr» və

.Qurban» bayramının namazında isə bir neçə qutut var ki, öz yerində qeyd olunacaq»

Məsələ ۱۱۰۴: Müstəhəbdir ki, qunutda əlləri üzün müqabilinə tutsun, onların içini göyə tərəf, bir-birinə yaxın saxlasın, baş barmaqdan başqa, o biri barmaqları bir-birinə birləşdirsin və əllərin içinə baxsın. Ehtiyat-vacibə əsasən, zərurət halı istisna olmaqla, .əlləri qaldırmadan qunut səhih deyil

Məsələ ۱۱۰۵: Qunutda hər zikri, hətta bir dəfə subhanəllah desə kifayətdir. Amma daha :yaxşı olar ki, bu dua oxunsun

لاَ إِلَهَ إِلاَّ اللهُ الْحَلِيمُ الْكَرِيمُ لاَ إِلَهَ إِلاَّ اللهُ الْعَلِيُّ الْعَظِيمُ سُبْحَانَ اللهِ رَبِّ السَّمَاوَاتِ السَّبْعِ وَرَبِّ الْأَرَضِينَ السَّبْعِ وَمَا فِيهِنَّ وَمَابَيْنَهُنَّ وَرَبِّ الْعَرْشِ الْعَظِيمِ وَالْحَمْدُلِلهِ رَبِّ الْعَالَمِينَ

La ilahə illəllahul-həlimul-kərim. La ilahə illəllahul-əliyyul-əzim. Subhanəllahi Rəbbis-səmavatis-səbi və Rəbbil-ərəzinəs-səbi və ma fihinnə və ma bəynəhunnə və Rəbbil-.ərşil-əzim. Vəlhəmdu lilahi Rəbbil-aləmin

Məsələ ۱۱۰۶: Müstəhəbdir ki, insan qunutu ucadan oxusun. Amma namazı camaatla qılan şəxs əgər imam camaat onun səsini eşidərsə, qunutu ucadan oxuması müstəhəb .deyildir

Məsələ ۱۱۰۷: Əgər qəsdən qunut tutmasa, qəzası yoxdur və əgər unutsa, rüku qədərinə əyilməmişdən əvvəl yadına düşsə, qalxıb oxuması müstəhəbbdir. Əgər rükuda yadına düşsə, müstəhəbdir ki, rükudan sonra qəza etsin. Amma əgər səcdədə .yadına düşərsə, namazın salamından sonra qəza etməsi müstəhəbdir

## NAMAZIN TƏRCÜMƏSİ

### HƏMD" SURƏSİNİN TƏRCÜMƏSİ" – ۱

بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيم

".Bismillahir-rəhmanir-rəhim"

Bismillah: Başlayıram Allahın adı ilə ki, bütün kəmallara sahib olan və hər nöqsandan .pakdır

اَلرَّحْمَنِ

"Ərrəhman"

.Rəhməti genişdir, sonsuzdur

الرَّحِيمِ

"Ərrəhim"

.Rəhməti zati, əzəli və əbədidir

أَلْحَمْدُ لِلّهِ رَبِّ الْعَالَمِينَ

"Əlhəmdu lillahi Rəbbil-aləmin"

.Tərif, bütün yaranmışlara pərvəriş verən Allaha məxsusdur

اَلرَّحْمَنِ الرَّحِيمِ

"Ərrəhmənir-rəhim"

Bunun mənası yuxarıda zikr olundu

مَالِكِ يَوْمِ الدِّينِ

"Maliki yəvmiddin"

.Bir qüdrətli zatdır ki, cəza gününün hökmranlığı Onunladır

إِيَّاكَ نَعْبُدُ وإِيَّاكَ نَسْتَعِينُ

"İyyakə nə`budu və iyyakə nəstəin"

.Yalnız Sənə ibadət edir və yalnız Səndən kömək istəyirik

اِهْدِنَا الصِّرَاطَ الْمُسْتَقِيمَ

"İhdinəs-siratəl müstəqim"

.Bizi doğru yola hidayət et ki, o, İslam dinidir

صِرَاطَ الَّذِينَ أَنعَمْتَ عَلَيهِمْ

"Siratəl-ləzinə ənəmtə ələhim"

Nemət verdiyin şəxslərin yoluna ki, onlar peyğəmbərlər və peyğəmbərlərin .canişinləridir

غَيرِ المَغضُوبِ عَلَيهِمْ وَلاَ الضَّالِّينَ

"Ğəyril-məğzubi ələyhim vələzzallin"

.Qəzəbin tutmuş və yoldan azmış adamların yoluna yox

## QUL HUVƏLLAH" SURƏSİNİN TƏRCÜMƏSİ" – ۲

بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيمِ

".Bismillahir-rəhmanir-rəhim"

.Onun mənası deyildi

قُلْ هُوَ اللَّهُ أَحَدٌ

"Qul huvəllahu əhəd"

.Ey Peyğəmbər,) de ki: Allah, yeganə olan Allahdır)

اللَّهُ الصَّمَدُ

"Əllahus-səməd"

O Allah ki, bütün mövcudatlardan ehtiyacsızdır.

لَمْ يَلِدْ وَلَمْ يُولَدْ

"Ləm yəlid və ləm yuləd"

Övladı yoxdur və heç şəxsin də övladı deyil.

وَلَمْ يَكُن لَّهُ كُفُوًا أَحَدٌ

"Və ləm yəkun ləhu kufuvən əhəd"

.Məxluqlardan heç bir şəxs, Onun misli, tayı-bərabəri deyil

## RÜKU VƏ SƏCDƏ ZİKRLƏRİNİN TƏRCÜMƏSİ – ۳

سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ وَ بِحَمْدِهِ

,Subhanə Rəbbiyəl-əzimi və bihəmdih

Mənim böyük Rəbbim, hər eyb və nöqsandan pak və münəzzəhdir və mən də Ona .həmd-sitayiş etməyə məşğulam

سُبْحَانَ رَبِّيَ الْأَعْلَى وَ بِحَمْدِهِ

Subhanə Rəbbiyəl-əla və bihəmdih

Mənim hamıdan uca məqamlı Pərvərdigarım hər eyb və nöqsandan pak və .münəzzəhdir, mən də Ona həmd-sitayiş etməyə məşğulam

سَمِعَ اللهُ لِمَنْ حَمِدَهُ

Səmi əllahu limən həmidəh

!Allah, Ona sitayiş edənlərin həmd-sənasını eşitsin və qəbul etsin

أَسْتَغْفِرُ اللهَ رَبِّي وَأَتُوبُ إِلَيْهِ

Əstəğfirullahə Rəbbi və ətubu iləyh

Bağışlanmaq və məğfirət tələb edirəm O Allahdan ki, məni bəsləyib və mən Ona .tərəfin qaydıram

بِحَوْلِ اللهِ وَقُوَّتِهِ أَقُومُ وَأَقْعُد

Bihəvlillahi və quvvətihi əqumu və əqud

.Mütəal Allahın köməyi və hövl-qüvvəsi ilə oturub-dururam

## QUNUTUN TƏRCÜMƏSİ – ۴

لَا إِلَهَ إِلَّا اللهُ الْحَلِيمُ الْكَرِيمُ

La ilahə illəllahul-həlimul-kərim

.Kərəm və helm sahibi olan Allahdan başqa bir məbud, ibadətə layiq olan kimsə yoxdur

لَا إِلَهَ إِلَّاللهُ الْعَلِيُّ الْعَظِيمُ

La ilahə illəllahu-əliyyul-əzim

Böyük, uca mərtəbə əzəmətli olan Allahdan başqa ibadətə layiq olan bir məbud .yoxdur

سُبْحَانَ رَبِّ السَّمَاوَاتِ السَّبْعِ وَرَبِّ الْأَرَضِينَ السَّبْعِ وَمَا فِيهِنَّ وَمَابَيْنَهُنَّ وَرَبِّ الْعَرْشِ الْعَظِيمِ

Subhanəllahi Rəbbis-səmavatis-səbi və Rəbbil-ərəzinəs-səbi və ma fihinnə və ma bəynəhunnə və Rəbbil-ərşil-əzim

Pak və münəzzəhdir O Allah ki, yeddi qat göylərin, yeddi qat yerlərin və onların .arasında olanların, əzəmətli ərşin Rəbbidir

وَالْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ

Vəlhəmdu lillahi Rəbbil-aləmin

Həmd və səna, aləmlərə pərvəriş verən, bütün mövcudları bəsləyən, Allaha .məxsusdur

## TƏSBİHATİ–ƏRBƏƏNİN TƏRCÜMƏSİ – ۵

سُبحَانَ اللهِ وَالْحَمْدُ لِلَّهِ وَلاَ إِلَهَ إِلاَّ اللهُ وَاللهُ أَكْبَر

Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu

vəllahu əkbər

Pak və münəzzəhdir Allah-təala, həmd yalnız Allaha məxsusdur, sitayişə layiq olan bir məbud yoxdur, tayı olmayan Allahdan başqa. Allah, Onu vəsf edənlərin vəsfindən .daha böyükdür

## TƏŞƏHHÜD VƏ SALAMIN TƏRCÜMƏSİ – ۶

أَلْحَمْدُ لِلهِ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَشَرِيكَ لَهُ

Əlhəmdu lillah, əşhədu ənla ilahə illəllahu vəhdəhu la şərikə ləh

Sitayiş və həmd Allaha məxsusdur. Şəhadət verirəm ki, Allahdan başqa heç bir, .pərəstişə layiq məbud yoxdur. Yeganədir, şəriki yoxdur

وَأَشْهَدُ أَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ

Və əşhədu ənnə Muhəmmədən əbduhu və Rəsuluh

Şəhadət verirəm ki, Məhəmməd (səlləllahu ələyhi və alihi və sәlləm) Allahın bəndəsi və .Onun Rəsulu, göndərdiyidir

أَللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ

Əllahumə səlli əla Muhəmmədin və Ali-Muhəmməd

.Ey Allah! Rəhmət göndər Məhəmmədə və onun Əhi-beytinə

وَتَقَبَّلْ شَفَاعَتَهُ وَارْفَعْ دَرَجَتَهُ

Və təqəbbəl şəfaətəhu vərfə dərəcətəh

!Peyğəmbərin şəfaətini qəbul et, o Həzrətin dərəcəsini Öz yanında ucalt

أَلسَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ

Əssəlamu ələykə əyyuhən-Nəbiyyu və rəhmətullahi və bərəkatuh

!Salam olsun Sənə ey Peyğəmbər! Allahın rəhmət və bərəkəti Sənə olsun

أَلسَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبادِ اللهِ الصَّالِحِينَ

Əssəlamu ələyna və əla ibadillahis-salihin

!Allah tərəfindən salam biz namaz qılanlara və bütün yaxşı bəndələrə olsun

أَسَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ

Əssəlamu ələykum və rəhmətullahi və bərəkatuh

!Allahın salam, rəhmət və bərəkəti siz möminlərə olsun

**NAMAZIN TƏQİBATI**

Məsələ ۱۱۰۸: Müstəhəbdir ki, insan namazdan sonra müəyyən qədər təqibatla məşğul olsun. Yəni zikr etsin, dua və Quran oxusun. Daha yaxşı olar ki, öz yerindən hərəkət etməmiş, dəstəmaz, qüsl və ya təyəmmümü batil olmamış, üzü qibləyə durub təqibatı oxusun. Təqibatın ərəbcə olması lazım deyil. Amma daha yaxşı olar ki, dua kitablarında qeyd olunanları oxusun. Daha çox tövsiyə olunan təqibatlardan biri, həzrəti Zəhranın (salamullahi ələyha) zikridir ki, bu tərtiblə deyilməlidir: ۳۴ dəfə Əllahu Əkbər, ۳۳ dəfə əlhəmdu lillah, ۳۳ dəfə subhanəllah. Subhanəllahı əlhəmdu lillahdan qabaq da demək .olar, amma daha yaxşı olar ki, sonra deyilsin

Məsələ ۱۱۰۹: Müstəhəbdir ki, namazdan sonra şükür səcdəsi edilsin. Əgər alnı şükr etmək məqsədi ilə yerə qoysalar kifayətdir. Amma daha yaxşı olar ki, ۱۰۰ dəfə, yaxud üç dəfə və ya bir dəfə şükrən lillah yaxud şükrən yaxud da əfvən deyilsin. Həmçinin, müstəhəbdir ki, insana hər vaxt nemət yetişsə, yaxud hər hansı bəla ondan uzaqlaşsa .şükür səcdəsi etsin

## PEYĞƏMBƏRƏ (SƏLLƏLLAHU ƏLƏYHİ VƏ ALİHİ VƏ SƏLLƏM) SALAVAT

Məsələ ١١١٠: Hər vaxt insan, Həzrət Rəsul-Əkrəmin (səlləllahu ələyhi və alihi və səlləm) mübarək adını, məsələn, Muhəmməd, Əhməd (səlləllahu ələyhi və alihi və səlləm), yaxud ləqəb və ya künyəsini, məsələn, Mustəfa, Əbul-Qasim (səlləllahu ələyhi və alihi və səlləm) desə, yaxud eşitsə, namazda olsa da belə, müstəhəbdir ki, salavat desin.

Məsələ ١١١١: Həzrət Rəsulun (səlləllahu ələyhi və alihi və səlləm) mübarək adını yazanda, salavatı da yazmaq müstəhəbbdir. Həmçinin daha yaxşı odur ki, hər zaman o Həzrəti yad etsə, salavat göndərsin.

## NAMAZI BATİL EDƏN ŞEYLƏR

Məsələ ١١١٢: On iki şey namazı batil edir və onlara mübtilat deyilir:

١. Namazın əsnasında onun şərtlərindən biri pozulsun. Məsələn, namaz əsnasında başa düşsə ki, libası nəcisdir.

٢. Namazda ikən qəsdən, səhvən və ya çarəsizlikdən dəstəmaz və ya qüslü batil edən bir şeylə qarşılaşarsa; məsələn, ondan bövl gələrsə; Belə ki, bu səhvən və ya çarəsizlikdən, namazın son səcdəsindən sonra meydana gəlsə belə, ehtiyat-vacibə əsasən namazı batil olur. Lakin, bövl və ya ğaitinin qarşısını ala bilməyən bir şəxsdən namaz əsnasında bövl və ya ğait xaric olarsa, əgər dəstəmaz hökmlərində söylənən qaydalara görə əməl edərsə, namazı batil olmur. Həmçinin namaz əsnasında istihazəli qadından qan xaric olsa, əgər istihazənin göstərişinə əməl etsə, namazı səhihdir.

Məsələ ١١١٣: İxtiyarsız şəkildə yatmış olan bir şəxs, namaz əsnasında, yaxud namazdan sonra yatdığını bilməzsə, qılmış olduğu miqdara ürfün nəzərində namaz söylənilərsə, namazı yenidən qılması lazım deyildir.

Məsələ ۱۱۱۴: Əgər ixtiyari şəkildə yatdığını bilsə, lakin namazdan sonra, yoxsa namaz əsnasında namazda olduğunu unudaraq, yatdığında şəkk edərsə, əvvəlki məsələdə .açıqlanan şərtlə namazı səhihdir

Məsələ ۱۱۱۵: Əgər səcdə halında yuxudan ayılsa və şəkk etsə ki, namazın axır səcdəsindədir, ya şükr səcdəsində, istər ixtiyarsız yuxuya getmiş olmasını istərsə ixtiyar üzündən yatmış olduğunu bilsə, namazın səhih olmasına hökm olunur və .yenidən qılmaq lazım deyil

Təvazö və ədəb qəsdilə əlləri bir-birinin üzərinə qoymaq namazı batil edir. Amma .۳ namazın bu işlə batil olması ehtiyata əsasəndir. Hərçənd şəriət qanunu kimi yerinə .yetirmək qəsdilə olsa, onun haram olmasında şəkk yoxdur

Məsələ ۱۱۱۶: Əgər unutqanlıqdan, çarəsizlikdən, təqiyyə, yaxud da əl qaşımaq və bu .kimi başqa işlər üçün əlləri bir-birinin üstünə qoysa, eybi yoxdur

Namazı batil edənlərdən biri Həmdi oxuyandan sonra «Amin» deməkdir. Bunun .۴ namazı batil etməyi, məmumdan başqasında ehtiyata əsasəndir. Hərçənd şəriət qanunu kimi yerinə yetirmək qəsdilə olsa, haramlığında şəkk yoxdur. Amma «Amini» .səhvən və ya təqiyyə üzündən desə, namazının eybi yoxdur

Namazı batil edən şey, üzrsüz olaraq qiblədən dönməkdir. Amma əgər üzrlü olsa, .۵ məsələn, unutqanlıq, ya məcburi olaraq (şiddətli küləyin onu qiblədən döndərməsi kimi) qiblədən əyilsə, amma sağ və sol tərəfə çatmasa, onun namazı səhihdir, amma lazımdır ki, üzrü aradan qalxan kimi dərhal üzünü qibləyə çevirsin. Əgər sağ və sol tərəfə çatsa, ya arxası qibləyə olsa, əgər unutqanlıq üzündən və qəflətdən olsa, qibləni düz tapmamış olsa və elə bir vaxt yadına düşsə ki, namazı sındırar və ikinci dəfə üzü qibləyə qıla bilər, hərçənd ona bir rəkəti vaxt daxilində qılınmış olsa da, gərək namazı əvvəldən başlasın. Əks təqdirdə, o namazla kifayətlənər və qəza etməsi də lazım deyildir. Habelə onun qiblədən dönməsi məcburi olsa, gərək bacardığı qədər qiblədən dönmədən namazı ikinci dəfə qılsın, hərçənd bir rəkəti vaxt daxilində olsa da gərək namazı əvvəldən başlasın. Əks

təqdirdə həmin namazı tamam etsin. Ona, namazı yenidən qılmaq və qəza etmək .lazım deyildir

Məsələ ۱۱۱۷: Əgər yalnız üzü qiblədən dönsə, amma bədəni qibləyə tərəf olsa, belə ki, arxasından bir miqdar görə biləcək qədər başını geriyə döndərmişdirsə, bu da əvvəldə zikr olunan qiblədən dönmə hökmünü daşıyır. Amma onun çevrilməsi bu qədər olmasa ürfən çox olsa ehtiyat-vacibə əsasən gərək yenidən qılsın. Əgər, boynunu az bir .miqdarda çevirsə bu işin məkruh olmasına baxmayaraq, namazı batil olmaz

Namazı batil edənlərdən biri də, qəsdən danışmaqdır. Danışan zaman kəlmə bir .۶ hərfli belə olsa, əgər ərəb dilində «qoru» mənasını verən «qi» hərfi kimi və ya əlifba hərflərindən ikincisi olan və sual edən şəxsin cavabında söylənilən «b» hərfi kimi, ayrı bir kəlmənin mənasını ifadə edərsə, namazı batil olur. Hər hansı bir mənanı ifadə etməyən, iki və ya daha çox hərfdən ibarət olarsa, yenə də ehtiyata əsasən, namazı .batil edər

Məsələ ۱۱۱۸: Əgər namaz əsnasında bir və ya daha çox hərfdən ibarət olan bir kəlmə səhvən ifadə edilərsə və o kəlmənin də mənası olsa, namazı batil olmaz. Amma .ehtiyata əsasən, namazdan sonra səcdeyi-səhv yerinə yetirməlidir

Məsələ ۱۱۱۹: Namazda öskürmək və ya gəyirməyin eybi yoxdur. Ehtiyat-lazım budur ki, namazda ixtiyar halında «ah» çəkməsin və nalə etməsin. Amma “ah”, “ax” kimi .kəlmələri qəsdən deyərsə, namaz batildir

Məsələ ۱۱۲۰: Əgər zikr məqsədi ilə, məsələn, «Əllahu əkbər» desə və onu deyərkən başqasına bir şeyi başa salmaq üçün səsini ucaltsa, eybi yoxdur. Həmçinin zikr məqsədi ilə bir kəlmə desə, belə ki, bu iş bir mətləbə diqqət yetirməyə səbəb olsa, eybi yoxdur. Amma əgər zikr məqsədi olmasa və ya hər iki işi etmək məqsədi olsa, belə ki, sözü hər iki mənada işlətsə, namazı batildir. Amma əgər zikr qəsdi etsə və bu zikri .deməkdə məqsədi başqasına bir şeyi anlatmaq olsa, namazı səhihdir

Məsələ ۱۱۲۱: Namazda Quran oxumaq (vacib səcdəsi olan dörd ayənin hökmü ۹۷۰-ci

məsələdə «qiraətin» hökmlərində deyilmişdir) və həmçinin namazda dua etməyin eybi .yoxdur. Amma ehtiyat-müstəhəb budur ki, dua ərəbcə olsun

Məsələ ۱۱۲۲: Əgər Həmdin, surənin və ya namazın zikrlərindən bir şeyi qəsdən və ya .ehtiyatən bir neçə dəfə desə, eybi yoxdur

Məsələ ۱۱۲۳: Namaz halında insan gərək başqasına salam verməsin. Əgər başqası ona salam versə, gərək cavab versin. Amma cavab gərək salam mislində olsun, yəni salamın əslinə əlavə olunmasın, məsələn, gərək cavabda «Salamun ələykum və rəhmətullahi və bərəkatuh» deməsin. Hətta ehtiyat-lazıma əsasən, gərək «ələykum və ya ələykə» sözlərini, cavabda «salam» sözündən qabağa salmasın. Əgər salam verən kəs bu cür etməmiş olsa da, hətta ehtiyat-müstəhəb budur ki, cavabı bütünlüklə onun verdiyi kimi versin. Məsələn, əgər desə «səlam-ələykum», cavabda desin «salam ələykum» və əgər desə «əs-səlamu-ələykum», desin «əs-səlamu-ələykum» və əgər desə «səlam-ələykə», «səlam-ələykə» deməlidir. Amma «ələykumus-səlam»-ın cavabını hər hansı formada (yəni qrammatik formada) istəsə deyə bilər ələykumussəlam, .əssəlamu ələykum, və ya salamun ələykum kimi

Məsələ ۱۱۲۴: İnsan gərək salamın cavabını istər namazda, istərsə də başqa vaxtda, dərhal versin. Əgər qəsdən və ya unutqanlıq üzündən salamın cavabını, o salamın cavabı hesab olunmayacaq qədər gecikdirsə, əgər namaz halındadırsa, cavab .verməlidir və əgər namaz halında olmasa, cavab verməsi vacib deyildir

Məsələ ۱۱۲۵: Gərək salamın cavabını elə deyə ki, salam verən eşidə. Amma salam verən kar olsa, ya salam verib, tez ötüb keçsə, onda mümkün olsa salamın cavabını işarə və onun başa düşdüyü kimi vermək lazımdır. Əks təqdirdə, namazda deyilsə, .cavab verməsi lazım deyil. Namazda olarsa da, cavab verməsi icazəli deyildir

Məsələ ۱۱۲۶: Vacibdir ki, namaz qılan salamın cavabını, salamlamaq məqsədi ilə desin. Dua məqsədilə deməyin də maneəsi yoxdur, yəni Allah-təaladan salam verən, kəs .üçün salamatlıq istəsin

Məsələ ۱۱۲۷: Əgər qadın, naməhrəm kişi və ya ağlıkəsən uşaq, namaz qılana salam versə, namaz qılan gərək onun

cavabını versin. Əgər qadın salamı «salam ələyk» desə, cavabında «salam ələyki» deyə .bilər, yəni «kaf» hərfinə «kəsrə» əlavə edərək cavab verə bilər

Məsələ ۱۱۲۸: Əgər namaz qılan salamın cavabını verməsə, günah etməsinə .baxmayaraq namazı səhihdir

Məsələ ۱۱۲۹: Əgər bir kəs, namaz qılana səhv salam versə, ehtiyat-vacibə əsasən .onun cavabını səhih verməlidir

Məsələ ۱۱۳۰: Məsxərə, ya zarafat üçün salam verən kəsin cavabını, həmçinin, müsəlman olmayan kişi və qadının salamının cavabını vermək, zimmi olmasalar vacib deyil. Əgər zimmi olsalar, ehtiyat-vacibə əsasən «ələyk» kəlməsi ilə kifayətlənmək .lazımdır

Məsələ ۱۱۳۱: Əgər bir kəs bir yerdə olan bir neçə nəfərə salam versə, onun salamının .cavabı onların hamısına vacibdir, amma onlardan biri cavab versə, kifayətdir

Məsələ ۱۱۳۲: Əgər bir şəxs, bir dəstəyə salam versə və salam verənin qəsd etmədiyi .bir şəxs ona cavab versə, onun salamının cavabı yenə də o dəstəyə vacibdir

Məsələ ۱۱۳۳: Əgər bir şəxs bir dəstəyə salam versə, onların arasında namaza məşğul olan şəxs, salam verənin ona da salam verib-verməməsinə şəkk etsə, gərək cavab verməsin və habelə ehtiyat-vacibə əsasən bilsə ki, salam verənin məqsədi o şəxsə də salam vermək olub, lakin başqası onun salamının cavabını vermişdirsə, cavab verməsin. Amma əgər bilsə ki, məqsədi o da olmuşdur, lakin başqası cavab verməyib, yaxud cavabının verilib-verilməməsində şəkk etsə, gərək namaz qılan onun cavabını .versin

Məsələ ۱۱۳۴: Salam vermək müstəhəbbdir, çox tövsiyələr olub ki, süvari piyadaya, .duran oturana və kiçik böyüyə salam versin

Məsələ ۱۱۳۵: Əgər iki nəfər eyni zamanda bir-birinə salam versə, ehtiyat-vacibə .əsasən, gərək hər biri digərinin salamının cavabını versin

Məsələ ١١٣۶: Qeyri-namaz halında, salamın cavabını, salamdan yaxşı almaq müstəhəbbdir. Məsələn, əgər desə

.«salamun ələykum», cavabında desin: «salamun ələykum və rəhmətullah»

Namazda qəsdən səslə gülmək namazı batil edən işlərdəndir. Hərçənd ixtiyarsız olsa .۷ da; əgər müqəddiməsi ixtiyari olsa da, hətta ehtiyat-vacibə əsasən müqəddiməsi ixtiyari olmasa da, belə ki namazı yenidən qılmağa vaxt olsa gərək yenidən qılsın. .Amma əgər qəsdən səssiz və ya səhvən ucadan gülsə, namazının işkalı yoxdur

Məsələ ۱۱۳۷: Əgər ucadan gülməyin qarşısını almaq nəticəsində halı dəyişsə, məsələn, .rəngi qızarsa, ehtiyat-vacib budur ki, namazını ikinci dəfə qılsın

Ehtiyat-vacibə əsasən namazı pozan şeylərdən biri də, dünya işləri üçün qəsdən .۸ ucadan və ya səssiz olaraq ağlamaqdır; amma əgər Allah qorxusundan ona şövq bəsləməkdən və ya axirət üçün ucadan və ya səssiz olaraq ağlasa, maneəsi yoxdur, üstəlik əməllərin də ən yaxşılarından sayılır. Hətta əgər Allahdan özünün dünyəvi .hacətlərini istəmək üçün onun dərgahında zəlillik göstərib ağlasa, işkalı yoxdur

Namazı batil edən işlərdən biri, namazın surətini pozmaqdır. Məsələn, havaya . ۹ tullanmaq və ya bu kimi hərəkətlər etmiş olsa, istər qəsdən olsun və yaxud unutqanlıq üzündən, namazı batil edər. Amma əl ilə işarə etmək kimi, namazın surətini pozmayan .hərəkətlərin işkalı yoxdur

Məsələ ۱۱۳۸: Əgər namaz əsnasında, "namaz qılmır" deyilə biləcək qədər sakit qalsa, .namaz batildir

Məsələ ۱۱۳۹: Əgər namaz əsnasında bir iş görə, yaxud bir müddət sakit dayana və şəkk edə ki, namazı pozulub ya yox, gərək namazı təzələsin. Amma daha yaxşı odur ki, .onu tamam etsin və sonra təzələsin

Namazı batil edənlərdən biri, yemək və içməkdir. Əgər namaz əsnasında «namaz .۱۰ qılmır» deyiləcək şəkildə, bir şey yeyərsə və ya içərsə, istər qəsdən olsun, istərsə də unutduğuna görə, namaz batil olur. Amma oruc tutmaq istəyən şəxs, əgər sübh azanından əvvəl müstəhəbb bir namaz qıldığı halda susuz olarsa, belə ki, namazı tamamladığı təqdirdə, sübh azanının olacağından qorxarsa və su onun qarşısında bir

olarsa, namaz arasında su içə bilər. Amma üzü qiblədən çevirmək kimi namazı batil edən bir şey etməməlidir.

Məsələ ۱۱۴۰: Qəsdən yemək və ya içmək, hətta namazın şəklini pozmasa belə; istər namazın ardıcıllığı pozulsun, istər pozulmasın, ehtiyat-vacibə əsasən o namazı yenidən qılmalıdır.

Məsələ ۱۱۴۱: Əgər namaz arasında ağzında, yaxud dişinin dibində qalan yeməyi udsa, namazı batil olmaz. Həmçinin əgər ağızda qənd, şəkər və bu kimi şeylər qalmış olsa və namaz halında az-az əridikcə onu udsa, eybi yoxdur.

۱۱. Namazı batil edənlərdən biri də, iki rəkətli və üç rəkətli namazların rəkətində, yaxud dörd rəkətli namazların iki əvvəl rəkətlərində şəkk etməkdir. Bu hökm namaz qılanın şəkk halında qaldığı hala aiddir.

۱۲. Namazı batil edən şeylərdən biri də, namazın rüknünü qəsdən və ya səhvən azaltmaq, yaxud rükn olmayan bir şeyi qəsdən azaltmaq və ya bir şeyi namazda qəsdən artırmaqdır. Həmçinin rüknü, məsələn, rüku və ya iki səcdəni bir rəkətdə səhvən artırsa, namazı ehtiyat-vacibə əsasən, batil olar. Amma səhvən «təkbirətül-ehramı» artırmaq namazı batil etməz.

Məsələ ۱۱۴۲: Əgər namazdan sonra şəkk etsə ki, namaz əsnasında namazı batil edən işlərdən edib ya yox, namazı səhihdir.

## NAMAZDA MƏKRUH OLAN ŞEYLƏR

Məsələ ۱۱۴۳: Namazda əvvəl deyildiyi kimi, «qiblədən dönmüşdür» deyilməyəcək şəkildə, üzünü bir az sağa və ya sola çevirmək məkruhdur, belə ki, arxasından bir miqdarını görə bilməyəcək qədər dönərsə; Əks təqdirdə namaz batil olur. Həmçinin, namazda gözləri yummaq, ya sağa-sola döndərmək, əli və sağ qolu ilə oynamaq, barmaqlarını bir-birinə keçirtmək, ağzının suyunu çölə atmaq, Quranın, ya kitabın, ya da üzüyün yazısına baxmaq, Həmd, surə və zikr deyən vaxt bir nəfərin sözünü eşitmək üçün, sakit olmaq məkruhdur. Ümumiyyətlə xüzu və xüşunu aradan aparan

Məsələ ۱۱۴۴: İnsanın yuxusu gəldiyi, habelə bövl və qaitin qarşısını aldığı vaxt namaz qılması məkruhdur. Həmçinin, ayağı sıxan dar corab geymək də məkruhdur. Bundan .başqa sair məkruhatlar da vardır ki, müfəssəl kitablarda qeyd olunmuşdur

## VACİB NAMAZI POZMAĞIN MÜMKÜN OLDUĞU HALLAR

Məsələ ۱۱۴۵: İxtiyar üzündən vacib namazı pozmaq, ehtiyat-vacibə görə icazəli deyil. Amma malı qorumaq, mala və ya bədənə olan zərərin qarşısını almaq üçün maneəsi yoxdur. Hətta namaz qılanın dünya və axirəti üçün əhəmiyyətli olan hər işə görə olsa .belə, maneəsi yoxdur

Məsələ ۱۱۴۶: Əgər öz canını, yaxud canının qorunması vacib olan bir şəxsi, yaxud qorunub-saxlanması vacib olan əmlakı (malı) hifz etmək, namazı pozmadan mümkün .olmazsa, gərək namazı pozsun

Məsələ ۱۱۴۷: Əgər vaxt geniş olanda namaz qılsa və tələbkar öz tələbini ondan istəsə, belə ki, namaz əsnasında onun istədiyini verə bilərsə, gərək həmin halda ödəsin. Əgər namazı sındırmadan onu vermək mümkün deyilsə, gərək namazı sındırsın, onun .istədiyini versin və sonra namazı qılsın

Məsələ ۱۱۴۸: Əgər namazda başa düşsə ki, məscid nəcisdir, belə ki, vaxt dar olsa, gərək namazı tamam etsin. Əgər vaxt genişdirsə və məscidi pak etmək namazı pozmursa, gərək namaz əsnasında pak etsin, sonra namazın ardını qılsın. Əgər bu iş namazı pozacaqsa, namazdan sonra məscidi təmizləmək mümkündürsə, məscidi təmizləmək üçün namazı pozması caizdir. Əgər namazdan sonra məscidi pak etmək .mümkün olmasa, gərək namazı sındırsın, məscidi pak etsin və sonra namazı qılsın

Məsələ ۱۱۴۹: Namazı sındırmalı olan şəxs, namazı tamamlayarsa, günah etməsinə .baxmayaraq, namazı səhihdir. Ehtiyat-müstəhəb budur ki, o namazı yenidən qılsın

Məsələ ۱۱۵۰: Əgər qiraətdən qabaq və yaxud rükuya əyilməmişdən qabaq, yadına düşsə ki, azan və iqaməni və ya təkcə iqaməni yaddan çıxarıb, belə ki, namazın vaxtı genişdirsə, müstəhəbdir, onları demək üçün namazı sındırsın. Hətta əgər namazı tamam olmamışdan qabaq, yadına düşsə ki, onları yaddan çıxarıb, müstəhəbbdir ki, .onları demək üçün namazı sındırsın

## ŞƏKKİYYAT

Namazın şəkkiyyatı ۲۳ qismdir ki, onlardan səkkizi namazı batil edir, altısına etina .olunmamalıdır, doqquzunda isə namaz səhihdir

## NAMAZI BATİL EDƏN ŞƏKLƏR

:Məsələ ۱۱۵۱: Namazı batil edən şəklər aşağıdakılardan ibarətdir

İki rəkətli namazların rəkətlərinin sayındakı şək; (sübh namazı və səfərdə olan-۱ şəxsin namazı kimi). Amma iki rəkətli müstəhəb namazların və ehtiyat namazlarının .rəkətlərinin sayındakı şəkk, namazı batil etmir

;Üç rəkətli namazın rəkətlərinin sayındakı şəkk-۲

;Dörd rəkətli namazda bir rəkət və ya daha artıq qılınmasındakı şəkk-۳

Dörd rəkətli namazlarda, ikinci səcdəyə daxil olmazdan qabaq, iki rəkətlə daha artıq-۴ .arasındakı şəkk

;İki və beş, yaxud, iki və beşdən artıq rəkət arasındakı şəkk-۵

;Üç rəkətlə altı rəkət və ya üç rəkətlə altı rəkətdən artıq arasındakı şəkk-۶

;Neçə rəkət qıldığını bilmədiyi namazlardakı şəkk-۷

Dörd rəkətlə altı və ya dörd rəkətlə altıdan artıq rəkətlərdəki şəkk, (sonra izah-۸ .۷ .(olunacaqdır

Məsələ ۱۱۵۲: İnsan batil edən şəkklərlə qarşılaşarsa, şəkki bərpa olana qədər namazını pozmaması, namazın surəti pozuluncaya və ya yəqin və guman hasil etməkdən .ümidsiz oluncaya qədər fikirləşməsi daha yaxşıdır

## ETİNA OLUNMAYAN ŞƏKKLƏR

### Point

:Məsələ ۱۱۵۳: Etina olunmayan şəkklər bunlardır

Yerinə yetirilmə məhəlli keçmiş olan şeylərdəki şəkk; məsələn: rükuda Həmdi . ۱ .oxuyub-oxumamasında şəkk etsə

;Namazın salamından sonrakı şəkk .۲

;Namazın vaxtı keçəndən sonrakı şəkk .۳

;Kəsirüş-şəkk, yəni çox şəkk edən şəxsin şəkki .۴

Camaat namazında məmum rəkətlərin sayını bilirsə, imamın, yaxud imam rəkətlərin .۵ ;sayını bilirsə, məmumun rəkətlərin sayında etdiyi şəkk

.Müstəhəb və ehtiyat namazlarındakı şəkk .۶

### YERİNƏ YETİRİLMƏ MƏHƏLLİ KEÇMİŞ OLAN ŞEYLƏRDƏKİ ŞƏKK – ۱

Məsələ ۱۱۵۴: Namazda ikən namazın vacibatından hər hansı birini edib-etmədiyində şəkk edərsə, məsələn, Həmdi oxuyub-oxumadığında şəkk edərsə, əgər şəri nəzərdən əvvəlki işi qəsdən tərk etdiyi təqdirdə, buna başlaması caiz olmayan bir işə başlamışsa, məsələn surəni oxuyarkən Həmdi oxuyub-oxumadığına şəkk edərsə, şəkkinə etina etməməlidir. Əks təqdirdə edib-etmədiyində şəkk etdiyi işi yerinə .yetirməlidir

Məsələ ۱۱۵۵: Əgər hər hansı ayəni oxuyanda, ondan qabaqkı ayəni oxuyub-oxumamasında şəkk etsə, yaxud ayənin axırını oxuyanda onun əvvəlini oxuyub-

Məsələ ۱۱۵۶: Əgər rüku, yaxud səcdədən sonra onun vacibi işlərini (zikr, bədənin aram olması kimi) yerinə yetirib-yetirməməsində şəkk etsə, öz şəkkinə etina etməməlidir.

Məsələ ۱۱۵۷: Əgər səcdəyə gedən halda rüku edib-etməməsində, yaxud rükudan sonra ayağa qalxıb-qalxmamasında şəkk etsə, öz şəkkinə etina etməməlidir.

Məsələ ۱۱۵۸: Əgər qalxan halda səcdə və ya təşəhhüdü yerinə yetirib-yetirməməsində şəkk etsə, gərək öz şəkkinə etina etməsin.

Məsələ ۱۱۵۹: Oturduğu, yaxud uzandığı yerdə namaz qılan şəxs, Həmd və ya təsbihatı oxuyan yerdə şəkk etsə ki, səcdə və ya təşəhhüdü yerinə yetirmişdir ya yox, gərək öz şəkkinə etina etməsin. Əgər Həmdi və ya təsbihatı deməmişdən əvvəl şəkk etsə ki, səcdə və ya təşəhhüdü demişdir ya yox, gərək yerinə yetirsin.

Məsələ ۱۱۶۰: Əgər namazın rüknlərinin birini yerinə yetirib-yetirmədiyi barədə şəkk edərsə, belə ki, ondan sonrakı işlə məşğul olmasa, gərək onu yerinə yetirsin. Məsələn, əgər təşəhhüdü oxumamışdan qabaq şəkk etsə ki, iki səcdəni əmələ gətirmişdir ya yox, gərək yerinə yetirsin. Sonradan yadına düşsə ki, o rüknü əmələ gətiribmiş, rükn artıq olduğuna görə, namazı ehtiyat-lazıma əsasən batildir.

Məsələ ۱۱۶۱: Əgər rükn olmayan bir əməli yerinə yetirib-yetirmədiyində şəkk edərsə, belə ki, ondan sonrakı işlə mə üşğul olmayıbdırsa, gərək onu yerinə yetirsin. Məsələn, surəni oxumazdan qabaq Həmdi oxuyub-oxumadığına şəkk edərsə, gərək Həmdi oxusun. Əgər onu yerinə yetirəndən sonra yadına düşsə ki, onu yerinə yetiribmiş, rükn artıq olmadığı üçün namazı səhihdir.

Məsələ ۱۱۶۲: Əgər hər hansı rüknü yerinə yetirib-yetirməməsində şəkk etsə, məsələn, təşəhhüdə məşğuldursa və iki səcdəni yerinə yetitirib-yetirməməsində şəkk etsə, öz şəkkinə etina etməməlidir. Amma, o rüknü yerinə yetirmədiyi yadına düşsə, bu halda sonrakı rüknə başlamayıbsa onu yerinə yetirməldir; əgər sonrakı rüknə başlayıbsa, ehtiyat-lazıma əsasən namazı batildir; məsələn: rükudan qabaq, əvvəlki iki səcdəni

yerinə yetirmədiyi yadına düşsə, onu yerinə yetirməlidir. Amma rükuda, yaxud ondan .sonra yadına düşsə, deyildiyi kimi namazı batildir

Məsələ ۱۱۶۳: Əgər şəkk etsə ki, rükn olmayan bir əməli yerinə yetirib ya yox, belə ki, ondan sonrakı işə məşğul olsa, gərək öz şəkkinə etina etməsin. Məsələn, surə oxumağa məşğul olarkən şəkk etsə ki, Həmdi oxuyubdur ya yox, gərək öz şəkkinə etina etməsin. Əgər sonradan yadına düşsə ki, onu yerinə yetirməyib, belə ki, sonrakı rüknə məşğul olmamışdırsa, gərək onu və ondan sonrakıları yerinə yetirsin. Əgər sonrakı rüknə məşğul olmuşdursa, namazı səhihdir. Buna əsasən əgər qunutda yadına düşsə ki, Həmdi oxumamışdır, gərək oxusun və əgər rükuda yadına düşsə, namazı .səhihdir

Məsələ ۱۱۶۴: Namazın salamını deyib-demədiyində şəkk edərsə, əgər namazdan sonra, təqibə və ya başqa bir namaza başlamışdırsa, yaxud namazı pozacaq bir iş görərək, namaz halından çıxmışdırsa, şəkkinə etina etməməlidir. Amma əgər bunlardan əvvəl şəkk edərsə, salamı deməlidir. Lakin, salamı düzgün deyib-.demədiyində şəkk edərsə, hər hansı halda olsa belə, şəkkinə etina etməməlidir

### SALAMDAN SONRAKI ŞƏKK – ۲

Məsələ ۱۱۶۵: Əgər salamlardan sonra namazın səhih olub-olmamasında şəkk etsə; məsələn: rüku edib-etməməsində şəkk etsə, yaxud dörd rəkətli namazın salamından sonra dörd rəkət, yaxud beş rəkət qılmasında şəkk etsə, öz şəkkinə etina etməməlidir. Amma şəkkinin hər iki tərəfi batil olsa; məsələn: dörd rəkətli namazın salamından .sonra üç rəkət, yaxud beş rəkət qılmasında şəkk etsə namazı batildir

### VAXT KEÇƏNDƏN SONRAKI ŞƏKK – ۳

Məsələ ۱۱۶۶: Namazın vaxtı keçdikdən sonra, namazı qılıb-qılmadığında şəkk edərsə və ya qılmadığını guman edərsə, qılması lazım deyil. Amma vaxt keçməzdən qabaq, namazı qılıb-qılmadığında şəkk edərsə, qıldığını guman etsə belə, o namazı yenidən .qılmalıdır

Məsələ ۱۱۶۷: Əgər namazın vaxtı keçdikdən sonra, onu düzgün qılmadığında şəkk .edərsə, şəkkinə etina etməməlidir

Məsələ ۱۱۶۸: Əgər zöhr və əsr namazının vaxtı keçəndən sonra dörd rəkət namaz qılıb, lakin onu zöhr, yoxsa əsr niyyəti ilə qıldığını bilməzsə, ona vacib olan namazın qəzası .niyyəti ilə bir dörd rəkətli namaz qılmalıdır

Məsələ ۱۱۶۹: Əgər məğrib və işa namazının vaxtı keçəndən sonra bir namaz qıldığnı bilsə, amma üç, yoxsa dörd rəkət qıldığını bilməsə, gərək məğrib və işa namazlarının .qəzasını qılsın

### (KƏSİRÜŞ–ŞƏKK (ÇOX ŞƏKK EDƏN – ۴

Məsələ ۱۱۷۰: Kəsirüş-şəkk, çox şəkk edən şəxsdir. Belə ki, hiss orqanlarının iğtişaş səbəbi olması və ya olmaması baxımından onu, onun kimi olan şəxslərlə müqayisə etdikdə adi qaydadan çox şəkk edirlər və bu təkcə çox şəkk etmək adəti olan şəxsə .məxsus deyil. Əksinə şəkkin çoxluğu adət ərəfəsində olması kifayətdir

Məsələ ۱۱۷۱: Çox şəkk edən şəxs, əgər namazın hissələrindən birini yerinə yetirib-yetirmədiyində şəkk edərsə, onu yerinə yetirdiyini qəbul etməlidir. Məsələn; əgər rüku edib-etmədiyində şəkk edərsə, etdiyini qəbul etməlidir. Amma əgər yerinə yetirilməsi namazı batil edən bir şeyi yerinə yetirib-yetirmədiyində şəkk edərsə, məsələn; sübh namazını iki rəkət və

.ya üç rəkət qılmış olduğunda şəkk edərsə, doğru tərəfi qəbul etməlidir

Məsələ ۱۱۷۲: Namazın bir şeyində çox şəkk edən şəxsin şəkkləri, o şeyə məxsus hesab olarsa, belə ki, namazın başqa şeylərində şəkk etsə, gərək onun göstərişinə əməl etsin, məsələn, səcdə edib-etməməsində çox şəkk edən şəxs, əgər rükunun yerinə yetirilməsində şəkk etsə, gərək onun göstərişinə əməl etsin. Yəni əgər səcdəyə .getməyibsə, rükunu yerinə yetirsin, əgər səcdəyə getmişdirsə, etina etməsin

Məsələ ۱۱۷۳: Müəyyən bir namazda, məsələn; zöhr namazında çox şəkk edən şəxs, belə ki şəkk çoxluğu onun xüsusiyyətlərindən sayılsa, əgər başqa bir namazda, .məsələn; əsr namazında şəkk edərsə, şəkk qaydalarına əsasən əməl etməlidir

Məsələ ۱۱۷۴: Əgər bir kəs namazı məxsusi yerdə qılan zaman çox şəkk edirsə, əgər ondan başqa yerdə namaz qılsa və onun qarşısına şəkk çıxsa, gərək şəkkin .göstərişinə əməl etsin

Məsələ ۱۱۷۵: Kəsirüş-şəkk olub-olmadığında şəkk edən bir şəxs, şəkkin qaydalarına əsasən əməl etməlidir. Kəsirüş-şəkk olan şəxs isə, normal şəkk edən insanların halına çevrildiyinə yəqin edincəyə qədər, onun şəkkinin mənşəyi kəsiruş-şəkk mənasına olan .şəkk deyil, öz halının dəyişməsində olsa, şəkkinə e`tina etməməlidir

Məsələ ۱۱۷۶: Çox şəkk edən şəxs, əgər bir rüknü yerinə yetirib-yetirmədiyi barədə şəkk edib ona etina etməzsə, sonra da onu yerinə yetirmədiyini xatırlayarsa, belə ki, sonrakı rüknə başlamamışdırsa, onu yerinə yetirməlidir. Əgər sonrakı rüknə başlamışdırsa, ehtiyata əsasən namazı batildir. Məsələn; rüku edib-etmədiyi barədə şəkk edib buna etina etməzsə, ikinci səcdədən qabaq rüku etmədiyini xatırlayarsa, geri qayıdıb rüku etməlidir. Əgər ikinci səcdədə xatırlayarsa, ehtiyata əsasən namazı .batildir

Məsələ ۱۱۷۷: Çox şəkk edən bir şəxs, rükn olmayan bir əməli yerinə yetirib-yetirmədiyində şəkk edərsə və şəkkinə etina etməzsə, belə ki, sonradan da onu yerinə yetirmədiyini xatırlayarsa, onu yerinə yetirmə məhəlli keçməmişdirsə, onu və ondan

keçmişdirsə, namazı səhihdir. Məsələn; Həmdi oxuyub-oxumadığında şəkk edərsə və buna etina etməzsə və qunut oxuyarkən, Həmdi oxumadığını xatırlayarsa, oxumalıdır. .Əgər rükuda xatırlayarsa, namazı səhihdir

### İMAM VƏ MƏMUMUN ŞƏKKİ – ۵

Məsələ ۱۱۷۸: Əgər imam, namazın rəkətlərinin sayında şəkk edərsə, məsələn; üç və ya dörd rəkətqıldığında şəkk edərsə, bu halda əgər məmum yəqin və ya gumani olaraq dörd rəkətqıldığını bilsə və dörd rəkətqıldığını imama başa sala bilərsə, imam namazı tamamlamalıdır və ehtiyat namazı qılması da lazım deyildir. Həmçinin imam, neçə rəkət qıldığını yəqin və ya gumani olaraq bilib, məmum namazın rəkətlərinin sayında şəkk edərsə, şəkkinə etina etməməlidir. Onların hər biri, səcdənin sayı kimi namazın .işlərində də şəkk edərsə hökm eynidir

### MÜSTƏHƏB NAMAZDAKI ŞƏKK – ۶

Məsələ ۱۱۷۹: Müstəhəb namazların rəkətinin sayında şəkk edərsə, şəkkinin çox tərəfi namazı batil edərsə, az tərəfə qərar verməlidir. Məsələn; əgər sübh namazının nafiləsində, iki rəkət, yoxsa üç rəkətqıldığı barədə şəkk edərsə, iki rəkətqıldığına qərar verməlidir. Əgər şəkkinin çox tərəfi namazı batil etmirsə, məsələn; bir rəkət, yoxsa iki rəkətqıldığında şəkk edərsə, şəkkinin hansı tərəfinə görə əməl edərsə, namazı .səhihdir

Məsələ ۱۱۸۰: Rüknün az olması nafiləni batil edər, amma rüknün çox olması onu batil etməz. Belə ki, əgər nafilənin işlərindən birini unutsa və sonrakı rüknə məşğul olan vaxtda yadına düşsə, gərək o işi yerinə yetirsin və ikinci dəfə olaraq o rüknü yerinə yetirsin. Məsələn; əgər rükuda Həmdi oxumadığını xatırlayarsa, qalxıb Həmdi oxumalı, .sonra da rükunu yerinə yetirməlidir

Məsələ ۱۱۸۱: Əgər nafilənin işlərindən birində şəkk etsə, istər rükn olsun, istərsə də qeyri-rükn, əgər məhəlli keçməyibdirsə, gərək yerinə yetirsin və əgər məhəlli keçmişdirsə, öz şəkkinə etina etməməlidir.

Məsələ ۱۱۸۲: Əgər iki rəkətli müstəhəb namazda gümanı üç, yaxud çox rəkətə getsə, gərək etina etməsin və namazı səhihdir. Əgər gümanı iki və ya az rəkətə getsə, ehtiyat-vacibə əsasən, gərək həmin gümana əməl etsin. Məsələn, bir rəkət qıldığını güman etsə, gərək ehtiyat-vacibə görə, bir rəkətdə qılsın.

Məsələ ۱۱۸۳: Əgər nafilə namazında, vacib namazlarda səcdeyi-səhvni vacib edən bir iş görərsə ya da bir səcdəni unudarsa, namazdan sonra səcdeyi-səhvni və ya səcdənin qəzasını yerinə yetirməsi lazım deyildir.

Məsələ ۱۱۸۴: Əgər müstəhəb bir namazı qılıb-qılmadığına şəkk edərsə, bu namaz Cəfəri-Təyyar namazı kimi müəyyən vaxtı olmayan bir namazdırsa, qılmadığını qəbul etməlidir. Amma əgər gündəlik nafilə namazları kimi, müəyyən vaxtları vardırsa, belə ki, vaxtı keçməzdən qabaq onu yerinə yetirib-yetirmədiyində şəkk edərsə, yenə də eyni hökmü daşıyır. Amma vaxtı keçdikdən sonra, belə bir şəkkə düşən şəxs, şəkkinə e`tina etməməlidir.

## SƏHİH ŞƏKKLƏR

Məsələ ۱۱۸۵: Doqquz halda əgər namaz qılan şəxs, dörd rəkətli namazın rəkətlərinin sayında şəkk etsə, gərək fikirləşsin; əgər şəkkin bir tərəfinə yəqin və ya güman hasil olsa, həmin tərəfi əsas tutub namazı qurtarmalıdır. Əks halda isə, deyiləcək göstərişlərə əməl etməlidir. Bu doqquz hal aşağıdakılardan ibarətdir:

۱. İkinci səcdəyə getdikdən sonra, iki rəkət, yaxud üç rəkət qıldığı barədə şəkk edərsə, üç rəkət qıldığını əsas götürməli və əlavə olaraq bir rəkətdə qılıb, namazı tamamlamalıdır. Namazdan sonra da ayaq üstə bir rəkət ehtiyat namazı qılmalıdır, ehtiyat-vacibə əsasən oturan halda iki rəkət kifayət deyil.

İkinci səcdəyə daxil olandan sonra iki və dörd arasında şəkk etsə, gərək dörd .۲ rəkətqıldığını əsas götürsün və namazdan sonra ayaq üstə iki rəkətehtiyat namazı .qılsın

İkinci səcdəyə daxil olandan sonra, iki, üç və dörd arasında şəkk etsə, gərək dörd .۳ rəkət qıldığını əsas götürsün və namazdan sonra iki rəkət ayaq üstə və sonra iki .rəkətdə oturan yerdə ehtiyat namazı qılsın

İkinci səcdəyə başladıqdan sonra dörd və beş arasında şəkk edərsə, dördü qəbul .۴ edib, namazı tamamlamalıdır. Namazdan sonra isə iki səcdeyi-səhv yerinə yetirməlidir. Dördlə altı arasında şəkk etmək kimi, az tərəfi dörd rəkət olan hər şəkkdə habelə, ikinci səcdəyə başladıqdan sonra, dörd rəkətlə, ondan az və ya daha çox qıldığında şəkk etdiyi zaman dörd rəkət qıldığını qəbul edib, hər iki şəkkin vəzifəsini yerinə yetirə bilər. Yəni dörd rəkətdən az qıldığı ehtimalı olduğundan, ehtiyat namazı qılar və dörd rəkətdən çox kimi ehtimalı olduğundan iki səcdeyi-səhv yerinə yetirər. Hər bir halda birinci səcdədən sonra və ikinci səcdəyə başlamamışdan əvvəl, yuxarıda .deyilən dörd şəkkdən birisi ilə qarşılaşsa, namazı batildir

Üç və dörd arasında namazın hər hansı yerində olursa-olsun, gərək dörd rəkət .۵ qıldığını əsas götürsün və namazı tamam edib, namazdan sonra bir rəkət ayaq üstə, .yaxud iki rəkət oturduğu yerdə ehtiyat namazı qılsın

Ayaq üstə dörd və beş rəkət arasında şəkk etsə, gərək otursun və təşəhhüdü .۶ oxusun və namazın salamını versin. Bundan sonra bir rəkət ayaq üstə, yaxud iki rəkət .oturan yerdə ehtiyat namazı qılsın

Ayaq üstə üç və beş rəkət arasında şəkk etsə, gərək oturub təşəhhüdü oxusun və .۷ .namazın salamını versin. Sonra ayaq üstə iki rəkət ehtiyat namazı qılsın

Ayaq üstə üç, dörd və beş rəkət arasında şəkk etsə, gərək otursun, təşəhhüdü .۸ oxusun və namazın salamını versin. İki rəkət ayaq üstə və sonra iki rəkət oturan yerdə .ehtiyat namazı qılsın

۹. Ayaq üstə beş və altı rəkət arasında şəkk etsə, gərək otursun, təşəhhüdü oxusun və namazın salamını versin. Sonra iki səcdeyi-səhv yerinə yetirsin.

Məsələ ۱۱۸۶: Əgər insanın qarşısına səhih olan şəkklərdən biri çıxsa, belə ki, namazın vaxtı dar olsa da, namazı başdan başlaya bilməsə, namazı sındırmamalı və deyilən göstərişə əməl etməlidir. Amma əgər namazın vaxtı geniş olarsa, namazı sındırıb .yenidən başlaya bilər

Məsələ ۱۱۸۷: Əgər insan namazda, ehtiyat namazı vacib olan şəkklərdən birilə qarşılaşarsa və bu halda namazı tamamlayarsa, ehtiyat-müstəhəb budur ki, ehtiyat namazı qılsın və ehtiyat namazını qılmadan namazı təzədən qılmasın. Əgər namazı batil edən işlərdən birini görmədən namazı başlasa, ikinci namazı da ehtiyat-vacibə əsasən batildir. Amma namazı batil edən işlərdən sonra ikinci namaza məşğul olsa, .ikinci namazı səhihdir

Məsələ ۱۱۸۸: İnsan batil şəkklərdən biri ilə qarşılaşdıqda, əgər sonrakı hala keçdiyi təqdirdə, yəqin və ya guman hasil olacağını bilirsə, onun batil şəkki namazın birinci iki rəkətindəndirsə, şəkk halı ilə namazına davam etməsi icazəli deyildir. Məsələn; əgər qiyam halında ikən bir rəkət və ya daha çox qıldığında şəkk edərsə və rükuya getdiyi təqdirdə, bir tərəfə yəqin ya guman edəcəyini bilirsə, bu halla rükuya getməsi icazəli deyildir. Amma qalan batil şəkklərdə yəqin və ya guman əldə etmək məqsədi ilə .namazına davam edə bilər

Məsələ ۱۱۸۹: Əgər əvvəl gümanı bir tərəfə çox olsa və sonradan nəzərində hər iki tərəf eyni olsa, gərək şəkkin göstərişinə əməl etsin. Əgər əvvəl nəzərində hər iki tərəf eyni olsa, vəzifəsi hansı tərəfədirsə, o tərəfə hesab etsin və sonra onun gümanı digər .tərəfə getsə, gərək həmin tərəfi əsas tutsun və namazı tamam etsin

Məsələ ۱۱۹۰: Gumaninin bir tərəfə çox, yoxsa hər iki tərəfə də bərabər olduğunu .bilməyən şəxs, şəkkin göstərişinə əsasən əməl etməlidir

Məsələ ۱۱۹۱: Əgər namazdan sonra, namazda ikən, məsələn; iki rəkət və ya üç rəkət qıldığına dair tərəddüd edib, bənanı üçüncü rəkətə qoyub, amma üç rəkət qıldığını guman etdiyini, yoxsa hər iki tərəfin (iki və ya üç rəkət) nəzərində bərabər olduğunu .bilməzsə, ehtiyat namazı qılması lazım deyildir

Məsələ ۱۱۹۲: Əgər ayağa qalxdıqdan sonra, iki səcdəni yerinə yetirib-yetirmədiyində şəkk edərsə və o halda iki səcdənin tamamlanmasından sonra, səhih olan şəkklərdən biri ilə qarşılaşarsa, məsələn; iki rəkət, yoxsa üç rəkət qıldığında şəkk edərsə, o şəkkin hökmünə görə əməl edərsə, namazı səhihdir. Amma əgər təşəhhüdü oxuduğu zaman bu şəkklərdən biri ilə qarşılaşarsa, əgər şəkki iki ilə üç arasındadırsa, namazı batildir. Əgər iki ilə dörd ya iki üç və dörd arasında olsa, namazı səhihdir və gərək şəkkin .göstərişlərinə əməl etsin

Məsələ ۱۱۹۳: Əgər təşəhhüdə başlamazdan əvvəl və ya təşəhhüdü olmayan rəkətlərdə ayağa qalxmazdan əvvəl, bir və ya iki səcdəni yerinə yetirib-yetirmədiyində şəkk edərsə və həmin zamanda iki səcdəni yerinə yetirdikdən sonra .səhih olan şəkklərdən biri ilə qarşılaşarsa, namazı batildir

Məsələ ۱۱۹۴: Əgər qiyamda ikən, üç ilə dörd və ya üç, dörd və beş rəkətlər arasında şəkk edərsə və həmin zamanda əvvəlki rəkətin bir və ya iki səcdəsini yerinə .yeirmədiyini xatırlayarsa, namazı batildir

Məsələ ۱۱۹۵: Bir şəkki aradan gedən şəxs, digər bir şəkk ilə qarşılaşarsa, məsələn; qabaqcadan iki, yoxsa üç rəkət qıldığında şəkk edən şəxs, daha sonra üç, yoxsa dörd .rəkət qıldığında şəkk edərsə, ikinci şəkkinin hökmünə görə əməl etməlidir

Məsələ ۱۱۹۶: Əgər namazdan sonra şəkk etsə ki, namazda, məsələn, iki ilə dörd rəkət arasında şəkk edib, yoxsa üç ilə dörd arasında, hər iki şəkkin göstərişinə əməl edə .bilər və həmçinin namazı batil edən işlərdən sonra onu ikinci dəfə qılsın

Məsələ ۱۱۹۷: Namazdan sonra, namazda bir şəkk ilə qarşılaşdığını bilərsə, lakin səhih şəkklərdən, yoxsa batil şəkklərdən olduğunu bilməsə gərək namazını yenidən qılsın. Əgər səhih şəkklərdən olsa da, onların hansı qismindən olduğunu bilməzsə, o namazı, .yenidən qılması caizdir

Məsələ ۱۱۹۸: Oturan halda namaz qılan bir şəxs, bir rəkət ayaq üstə və ya iki rəkət oturaq halda ehtiyat namazı qılmasını lazım edəcək şəkk ilə qarşılaşarsa, bir rəkət

oturaq halda qılmalıdır. İki rəkət ayaq üstə ehtiyat namazı qılmasını lazım edən bir .şəkk etdiyi təqdirdə də, iki rəkət oturaq halda qılmalıdır

Məsələ ۱۱۹۹: Ayaq üstə namaz qılan bir şəxs, ehtiyat namazı qılındığı halda ayaq üstə dura bilməsə, namazı oturan halda qılan şəxslər kimi (hökmü əvvəlki məsələdə deyildi) .ehtiyat namazını qılmalıdır

Məsələ ۱۲۰۰: Oturan halda namaz qılan bir şəxs, ehtiyat namazı qılan zaman ayaq üstə dura bilsə, gərək namazı, ayaq üstə qılan şəxslərin vəzifəsinə əməl edərək yerinə .yetirsin

## EHTİYAT NAMAZININ GÖSTƏRİŞİ

Məsələ ۱۲۰۱: Ehtiyat namazı vacib olan bir şəxs, namazın salamından sonra dərhal ehtiyat namazı niyyəti edib təkbir deməli, Həmdi oxuyub rüku və səcdəni etməlidir. Əgər bir rəkət ehtiyat namazı vacibdirsə, iki səcdədən sonra təşəhhüdü oxumalı, salamları deməlidir. İki rəkət ehtiyat namazı vacibdirsə, iki səcdədən sonra bir rəkət .də (əvvəlki kimi) qılıb sonra təşəhhüdü və salamları deməlidir

Məsələ ۱۲۰۲: Ehtiyat namazının surə və qunutu yoxdur. Ehtiyat-lazıma əsasən, onun Həmdi ahəstə oxunmalıdır. Onun niyyəti dillə deməməlidir. Ehtiyat-müstəhəb budur ki, .«Bismillahı» da ahəstə deyilsin

Məsələ ۱۲۰۳: Əgər ehtiyat namazını qılmazdan əvvəl namazını düzgün qıldığını anlayarsa, ehtiyat namazı qılması lazım deyil və əgər ehtiyat namazı qılarkən .anlayarsa, onu tamamlaması lazım deyildir

Məsələ ۱۲۰۴: Ehtiyat namazını qılmazdan qabaq namazın rəkətlərinin əskik olduğunu anlayarsa, belə ki, əgər namazı batil edən bir iş görməmişdirsə, namazda qılmadığı qismi qılmalı və yersiz salam verdiyi üçün ehtiyat-lazıma əsasən, iki səcdeyi-səhv yerinə yetirməlidir. Əgər namazı batil edən bir iş görmüşdürsə, məsələn; arxasını .qibləyə çevirmişdirsə, namazı yenidən qılmalıdır

Məsələ ۱۲۰۵: Ehtiyat namazını qıldıqdan sonra, namazdan əskik qalan rəkətlərin, qıldığı ehtiyat namazı qədər olduğunu anlayarsa, məsələn; üç ilə dörd arasındakı şəkkdə, bir rəkət

ehtiyat namazı qılıb, sonradan namazı üç rəkət qılmış olduğunu anlayarsa, namazı .səhihdir

Məsələ ۱۲۰۶: Ehtiyat namazını qıldıqdan sonra, namazından əskik qalan rəkətlərin, ehtiyat namazından az olduğunu anlayarsa, məsələn; iki ilə dörd arasındakı şəkkdə, iki rəkət ehtiyat namazı qılıb, sonradan namazı üç rəkət qılmış olduğunu anlayarsa, .namazı yenidən qılmalıdır

Məsələ ۱۲۰۷: Ehtiyat namazını qıldıqdan sonra, namazın nöqsanının ehtiyat namazından çox olduğunu anlayarsa, məsələn; üç ilə dörd arasında şəkk edən şəxs, bir rəkət ehtiyat namazı qılıb, sonra da namazı iki rəkət qıldığını anlayarsa, bu surətdə ehtiyat namazından sonra, namazı batil edən bir iş etmişdirsə (arxasını qibləyə çevirmək kimi), namazı yenidən qılmalıdır. Amma əgər namazı batil edən bir iş görməmişdirsə, ehtiyat-lazıma əsasən bu təqdirdə də, namazı yenidən qılmalı və .namazdan nöqsan qalan rəkəti əlavə etməklə kifayətlənməməlidir

Məsələ ۱۲۰۸: İki, üç və dörd arasında şəkk edən şəxs, iki rəkətayaq üstə ehtiyat namazı qıldıqdan sonra, namazı iki rəkətqıldığını xatırlayarsa, iki rəkətdə oturaraq .ehtiyat namazı qılması lazım deyildir

Məsələ ۱۲۰۹: Əgər üç və dörd rəkət arasında şəkk etsə və bir rəkət ayaq üstə ehtiyat namazı qılarkən yadına düşsə ki, namazı üç rəkətqılmışdır, gərək ehtiyat namazını buraxsın, belə ki, rükuya daxil olmazdan əvvəl yadına düşsə, bir rəkəti ona bitişik qılsın, namazı səhihdir. Artıq salam üçün ehtiyat-lazıma əsasən iki səcdeyi-səhv etsin. Amma əgər rükuya gedəndən sonra yadına düşmüş olsa, namazı ikinci dəfə qılmalı və .ehtiyata əsasən əvvəlki rəkətə əlavə etməklə kifayətlənməməlidir

Məsələ ۱۲۱۰: Əgər iki, üç və dörd rəkət arasında şəkk etsə, ayaq üstə iki rəkət ehtiyat namazı qılarkən, namazı üç rəkət qıldığı yadına düşsə, keçən məsələdə deyilən, .burada da icra olunur

Məsələ ۱۲۱۱: Ehtiyat namazını qılarkən, namazın nöqsanlı qisminin ehtiyat namazından

.cu məsələdə söylənən hökmün bənzəri burada da keçərlidir-۱۲۱۰

Məsələ ۱۲۱۲: Boynuna vacib olan ehtiyat namazını yerinə yetirib-yetirmədiyində şəkk edərsə, əgər namaz vaxtı keçmişdirsə, şəkkinə etina etməməlidir. Əgər vaxt vardırsa, şəkki ilə namaz arasında çox bir zaman keçməmişdirsə başqa bir işə başlayıbsa və qiblədən üzünü çevirmək kimi, namazı batil edən bir iş də etməmişdirsə, ehtiyat namazını qılmalıdır. Amma əgər namazı batil edən bir iş görmüşdürsə və ya başqa bir işə başlayıbsa yaxud namazla onun şəkki arasında uzun bir vaxt keçmişdirsə, ehtiyat-.lazıma əsasən namazı yenidən qılmalıdır

Məsələ ۱۲۱۳: Əgər ehtiyat namazında, bir rəkətin əvəzinə iki rəkət qılsa, ehtiyat namazı batil olar və gərək ikinci dəfə namazın əslini qılsın. Ehtiyat-lazıma əsasən, ehtiyat .namazında bir rüknü artırsa da hökm eynidir

Məsələ ۱۲۱۴: Ehtiyat namazı qılarkən onun işlərinin birində şəkk etsə, əgər məhəlli (yeri) keçməyibdirsə, gərək yerinə yetirsin və əgər məhəlli keçibdirsə, gərək öz şəkkinə etina etməsin. Məsələn; Həmdi oxuyub-oxumadığında şəkk edərsə, əgər rükuya getməmişdirsə, oxumalıdır. Əgər rükuya getmişdirsə, şəkkinə etina .etməməlidir

Məsələ ۱۲۱۵: Əgər ehtiyat namazının rəkətlərinin sayında şəkk edərsə, şəkkinin çox tərəfi namazı batil edərsə, az tərəfə qərar verməlidir. Əgər şəkkinin çox tərəfi namazı batil etmirsə, çox tərəfə qərar verməlidir. Məsələn; iki rəkət ehtiyat namazı qılarkən, iki rəkət, yoxsa üç rəkət qılmış olduğunda şəkk edərsə, şəkkinin çox tərəfi namazı batil etdiyinə görə, iki rəkət qıldığına qərar verməlidir. Amma əgər bir rəkət, yoxsa iki rəkət qıldığında şəkk edərsə, şəkkinin çox tərəfi namazı batil etmədiyinə görə, iki rəkət .qılmış olduğuna qərar verməlidir

Məsələ ۱۲۱۶: Əgər ehtiyat namazında rükn olmayan şeyi səhvən çoxaltsa və ya .azaltsa, səcdeyi-səhv yoxdur

Məsələ ۱۲۱۷: Ehtiyat namazının salamından sonra, onun hissələrindən və ya

şərtlərindən birini yerinə yetirib-yetirmədiyində şəkk edərsə, şəkkinə etina etməməlidir.

Məsələ ۱۲۱۸: Əgər ehtiyat namazında təşəhhüd, yaxud səcdənin birini yaddan çıxartsa və öz yerində tədarük görə bilməsə, Ehtiyat-vacib budur ki, namazın salamından sonra səcdəni qəza etsin. Lakin təşəhhüdün qəzası lazım deyil.

Məsələ ۱۲۱۹: Əgər ehtiyat namazı və iki səcdeyi-səhv ona vacib olsa, gərək əvvəl ehtiyat namazını qılsın. Həmçinin ehtiyat-vacibə görə əgər ehtiyat namazı və səcdənin qəzası da ona vacib olsa, hökm eynidir.

Məsələ ۱۲۲۰: Namazda rəkətlərə nisbətən gümanın hökmü, yəqinin hökmü kimidir. Məsələn; bir və ya iki rəkət qıldığını bilmədikdə, iki rəkət qıldığını guman edərsə, iki rəkət qıldığına qərar verməlidir. Əgər dörd rəkətli bir namazda dörd rəkət qıldığını guman edərsə, ehtiyat namazı yoxdur. Amma əməllərə nisbətən gumanin, şəkk hökmü vardır. Belə ki, əgər rüku etməsini guman edərsə, səcdəyə daxil olmayıbsa, onu yerinə yetirməlidir. Yaxud; əgər Həmd oxumadığını guman edərsə, əgər surəyə başlamışdırsa, gumanına etina etməməlidir və namazı səhihdir.

Məsələ ۱۲۲۱: Şəkk, səhv və gumanın hökmündə, gündəlik vacib namazlarla, digər namazlar arasında bir fərq yoxdur. Məsələn; ayət namazında, bir rəkət və ya iki rəkət qıldığında şəkk edərsə, şəkki iki rəkətli namazda olduğu üçün, namazı batildir. Əgər bir rəkət və ya iki rəkət olduğunu guman edərsə, o gumanına əsasən namazı tamamlamalıdır.

## SƏCDEYİ–SƏHV

Məsələ ۱۲۲۲: İki halda namazın salamından sonra insan gərək iki səcdeyi-səhv sonradan deyiləcək göstərişlə yerinə yetirsin:

۱. Təşəhhüdü unutsa.

۲. Səhih şəkklərin dördüncü qismində deyildiyi kimi, dörd rəkətli namazda ikinci səcdəyə getdikdən sonra, dörd ilə beş və ya dörd ilə altı rəkət qıldığında şəkk edərsə.

Üç halda isə, ehtiyat-vacibə əsasən səcdeyi-səhv lazımdır:

Namazdan sonra, namazın səhih olmasına hökm olunmasına baxmayaraq, ümumi .۱ .halda namazda bir şeyin səhvən əskik və ya artıq yerinə yetirildiyini bilirsə

.Namaz əsnasında səhvən danışsa .۲

Namazın salamını verməli olmadığı yerdə məsələn birinci rəkətdə səhvən salam .۳ versə. Əgər bir səcdəni unudarsa və ayağa qalxması lazım olan yerdə, məsələn; Həmd və surəni oxuması lazım olan yerdə səhvən oturarsa, yaxud oturması lazım olan yerdə, məsələn; təşəhhüd oxuması lazım olan yerdə səhvən ayağa qalxarsa, ehtiyat-müstəhəb budur ki, iki səcdeyi-səhv etsin. Hətta namazda səhvən yerinə yetirdiyi çoxluq və azlıq üçün iki səcdeyi-səhv etməsin. Bu bir neçə surətin hökmləri gələcək .məsələlərdə izah olunacaq

Məsələ ۱۲۲۳: Əgər insan səhvən və ya namazın qurtardığını xəyal edib danışsa, gərək .ehtiyata əsasən iki səcdeyi-səhv yerinə yetirsin

Məsələ ۱۲۲۴: Öskürəkdən yaranan səs üçün, səcdeyi-səhv vacib deyil. Amma səhvən nalə çəksə, ya «ah» çəksə və ya «ah» desə, gərək ehtiyat-vacibə əsasən səcdeyi-səhv .etsin

Məsələ ۱۲۲۵: Əgər bir şeyi səhv oxuduqdan sonra, ikinci dəfə səhih oxusa, ikinci dəfə .oxumaq üçün səcdeyi-səhv vacib deyildir

Məsələ ۱۲۲۶: Əgər namazda səhvən bir neçə kəlmə danışsa və onların hamısının .mənşəyi bir səhv olsa, namazın salamından sonra bir cüt səcdeyi-səhv kifayətdir

Məsələ ۱۲۲۷: Əgər səhvən təsbihati-ərbəəni deməsə, ehtiyat-müstəhəb budur ki, .namazdan sonra iki səcdeyi-səhv etsin

Məsələ ۱۲۲۸: Namazın salamının verilməməli olduğu bir yerdə səhvən «Əssəlamu ələyna və əla ibadillahis-salihin» və ya «Əssəlamu ələykum» deyərsə, hərçənd «Və rəhmətullahi və bərəkatuh» deməsə də, ehtiyat-lazıma əsasən iki səcdeyi-səhv etməsi lazımdır. Amma əgər səhvən «Əssəlamu ələykə əyyuhən-nəbiyyu və rəhmətullahi və

bərəkatuh» deyərsə, ehtiyat-müstəhəbə əsasən, iki səcdeyi-səhv yerinə yetirməlidir. Amma əgər iki hərf yaxud salamdan artıq deyərsə, ehtiyat-vacibə əsasən iki səcdeyi .səhv etsin

Məsələ ۱۲۲۹: Əgər salam verməməli olduğu yerdə, səhvən hər üç salamı desə, iki .səcdeyi-səhv kifayətdir

Məsələ ۱۲۳۰: Əgər bir səcdə, yaxud təşəhhüdünü unutsa və sonrakı rəkətin rükusundan əvvəl yadına düşsə, gərək qayıdıb yerinə yetirsin və namazdan sonra .ehtiyat-müstəhəbə əsasən yersiz qiyam üçün bir cüt səcdeyi-səhv yerinə yetirsin

Məsələ ۱۲۳۱: Rükuda və ya rükudan sonra, əvvəlki rəkətin təşəhhüdünü və ya səcdəsinin birini unutduğunu xatırlayarsa, namazın salamından sonra səcdəni qəza .etməlidir. Təşəhhüd üçün isə iki səcdeyi-səhv yerinə yetirməlidir

Məsələ ۱۲۳۲: Əgər səcdeyi-səhvni namazın salamından sonra qəsdən yerinə yetirməsə, günah etmişdir. Ehtiyat-vacibə əsasən, gərək nə qədər tez olsa əmələ gətirsin, əgər səhvən əmələ gətirməsə, hər vaxt yadına düşsə, gərək təcili yerinə .yetirsin. Namazı yenidən qılması lazım deyil

Məsələ ۱۲۳۳: Əgər səcdeyi-səhvin vacib olub-olmamasında şəkk etsə, yerinə yetirməsi .lazım deyil

Məsələ ۱۲۳۴: Əgər insan, ona iki, yaxud dörd səcdeyi-səhv vacib olmasında şəkk etsə, .ikisi kifayətdir

Məsələ ۱۲۳۵: Əgər səcdeyi-səhvndən birini yerinə yetirmədiyini bilərsə və onu düzəltməsi aradan çox vaxt keçdiyinə görə mümkün olmasa ya bilə ki, səhvən üç .səcdə yerinə yetirib, yenidən iki səcdeyi-səhv yerinə yetirməlidir

## SƏCDEYİ-SƏHVİN QAYDASI

Məsələ ۱۲۳۶: Səcdeyi-səhvin göstərişi belədir ki, namazın salamından sonra dərhal səcdeyi-səhv niyyəti etsin və alnını ehtiyat-lazıma əsasən səcdəsi səhih olan bir şeyin üzərinə qoysun. Ehtiyat-müstəhəb budur ki, səcdədə zikr deyilsin. Daha yaxşı olar bu zikr deyilsin: «Bismillahi və billahi. Əssəlamu ələykə əyyuhənnəbiyyu və rəhmətullahi və bərəkatuh». Sonra oturmalı və təkrarən səcdəyə gedib, dediyi zikri yenidən

Əssəlamu ələykum» deməlidir. Buna «Və rəhmətullahi və bərəkatuh»-u da əlavə» .etməsi daha yaxşıdır

## UNUDULMUŞ TƏŞƏHHÜD VƏ SƏCDƏNİN QƏZASI

Məsələ ۱۲۳۷: İnsan, unutduğu səcdənin qəzasını namazdan sonra edərkən, bədən və libasının pak olması, üzü qibləyə olmaq kimi, namazın bütün şərtlərinə sahib olması .lazımdır

Məsələ ۱۲۳۸: Əgər səcdəni bir neçə dəfə yaddan çıxarsa, məsələn, birinci rəkətdən bir səcdə yaddan çıxarsa və ikinci rəkətdən də bir səcdə yaddan çıxarsa, gərək namazdan sonra hər ikisinin qəzasını yerinə yetirsin və ehtiyat-müstəhəb budur ki, .yaddan çıxan hər səcdə üçün iki səcdeyi-səhv yerinə yetirsin

Məsələ ۱۲۳۹: Əgər bir səcdə və təşəhhüdü yaddan çıxarsa, unudulmuş təşəhhüd üçün iki səcdeyi-səhv yerinə yetirsin. Amma unudulmuş səcdə üçün yaxşı olmasına .baxmayaraq, lazım deyil

Məsələ ۱۲۴۰: Əgər iki rəkətdən iki səcdə yaddan çıxarsa, qəza edən zaman tərtibə .riayət etməsi lazım deyil

Məsələ ۱۲۴۱: Namazın salamının və səcdənin qəzasının əsnasında, qəsdən və ya unutqanlıq üzündən namazı batil edən bir iş görərsə, məsələn; arxasını qibləyə çevirərsə, ehtiyat-müstəhəb budur ki, səcdənin qəzasını etdikdən sonra o namazı .yenidən qılsın

Məsələ ۱۲۴۲: Əgər namazın salamından sonra, son rəkətin bir səcdəsini unutduğunu xatırlayarsa, əgər hədəs kimi namazı pozan bir iş baş verməyibsə, onu və ondan sonra olan təşəhhüd və salamı yerinə yetirsin və ehtiyat-vacibə əsasən yersiz olan salam .üçün iki səcdeyi-səhv yerinə yetirsin

Məsələ ۱۲۴۳: Əgər namazın salamı ilə səcdənin qəzası arasında səcdeyi-səhv vacib olan bir iş görsə, məsələn, səhvən danışsa, ehtiyat-vacibə əsasən, gərək əvvəlcə

.səcdənin qəzasını etsin və sonra bir cüt səcdeyi-səhv etsin

Məsələ ۱۲۴۴: Əgər namaz əsnasında səcdəni, yoxsa təşəhhüdü unutduğunu bilməzsə, səcdənin qəzasını etməli və iki səcdeyi-səhv yerinə yetirməlidir. Ehtiyat-müstəhəb .budur ki, təşəhhüdü də qəza etsin

Məsələ ۱۲۴۵: Səcdə və ya təşəhhüdü unudub-unutmadığında şəkk edərsə, qəza və ya .səcdeyi-səhv vacib olmaz

Məsələ ۱۲۴۶: Səcdəni unutduğunu bilib, sonrakı rəkətin rükusundan qabaq onu xatırlayıb və yerinə yetirib-yetirmədiyində şəkk edərsə, ehtiyat-müstəhəb budur ki, .qəza etsin

Məsələ ۱۲۴۷: Səcdəni qəza etməsi vacib olan bir şəxsə, başqa bir əməl səbəbindən də səcdeyi-səhv vacib olarsa, ehtiyat-vacibə əsasən namazdan sonra, əvvəl səcdəni .qəza etməli və sonra səcdeyi-səhvi yerinə yetirməlidir

Məsələ ۱۲۴۸: Namazdan sonra, unutmuş olduğu səcdənin qəzasını yerinə yetirib-yetirmədiyində şəkk edərsə, namazın vaxtı keçməmişdirsə, səcdəni qəza etməlidir. .Hətta namazın vaxtı keçmiş olsa belə, ehtiyat-vacibə əsasən qəza etməlidir

## NAMAZIN HİSSƏLƏRİNİ VƏ ŞƏRTLƏRİNİ ARTIRIB–AZALTMAQ

Məsələ ۱۲۴۹: Əgər namazın vacibatından qəsdən bir şeyi azaltsa və ya çoxaltsa, bir .hərf də olsa belə, namaz batildir

Məsələ ۱۲۵۰: Əgər məsələni bilmədiyindən, namazın rükn olan vacibatından, bir şey azaltsa, namaz batildir. Amma qasir cahilin (etimad edilən bir şəxsin dediyinə, yaxud mötəbər risaləyə etimad edən sonra isə onun xətası, ya risalənin düz olmadığı məlum olan bir şəxs kimi) rükn olmayan vacibləri azaltması namazı batil etməz. Belə ki, məsələni bilmədiyindən, hərçənd təqsir üzündən olsa belə, sübh, məğrib və işa namazlarının Həmd və surəsini alçaqdan oxusa, yaxud zöhr və əsr namazlarının Həmd və surəsini hündürdən oxusa və ya

.səfərdə zöhr, əsr və işa namazını dörd rəkət qılsa, namazı səhihdir

Məsələ ۱۲۵۱: Əgər namaz əsnasında yaxud namazdan sonra başa düşsə ki, dəstəmaz və ya qüslü batil imiş və yaxud qüslsüz və dəstəmazsız namaza məşğul olubmuş, .namazı ikinci dəfə dəstəmaz və ya qüsllə qılmalıdır. Əgər vaxt keçibsə, qəza etsin

Məsələ ۱۲۵۲: Əgər rükuya çatdıqdan sonra əvvəlki rəkətdən hər iki səcdəni yerinə yetirmədiyini xatırlayarsa, ehtiyata əsasən namazı batildir. Əgər rükuya çatmazdan qabaq yadına düşərsə, qayıdıb iki səcdəni yerinə yetirməli, sonra da qalxıb Həmd və surəni və ya təsbihatı oxuyaraq namazı tamamlamalıdır. Namazdan sonra da ehtiyat-.müstəhəbə əsasən yersiz qiyam üçün iki səcdeyi-səhv yerinə yetirməlidir

Məsələ ۱۲۵۳: Əgər «Əssəlamu ələyna» və «Əssəlamu ələykum» deməmişdən əvvəl yadına düşsə ki, son rəkətin iki səcdəsini yerinə yetirməyib, gərək iki səcdəni yerinə .yetirsin və ikinci dəfə təşəhhüdü və namazın salamını versin

Məsələ ۱۲۵۴: Namazın salamından qabaq, namazın sonundan bir rəkət və ya daha çox .qılmadığını xatırlayarsa, unutduğu miqdarı yerinə yetirməlidir

Məsələ ۱۲۵۵: Namazın salamından sonra namazın sonundan bir rəkətvə ya daha çox qılmadığını anlayarsa, əgər namazda unudaraq və ya qəsdən edildikdə namazı batil edən bir iş (arxasını qibləyə çevirmək kimi) görərsə, namazı batildir. Əgər unudaraq və ya qəsdən edildikdə namazı batil edən bir iş görməyibsə, dərhal unutduğu miqdarı yerinə yetirməlidir. Ehtiyat-lazım budur ki, artıq salam verdiyi üçün iki səcdeyi-səhv .etsin

Məsələ ۱۲۵۶: Əgər namazın salamından sonra, namazda ikən unudaraq və ya qəsdən edildikdə namazı batil edən bir iş (arxasını qibləyə çevirmək kimi) gördükdən sonra, son iki səcdəni etmədiyini xatırlayarsa, namazı batildir. Əgər namazı pozan bir iş görmədən xatırlayarsa, unutduğu iki səcdəni yerinə yetirib təkrarən təşəhhüd oxuyaraq namazın salamını verməli və ehtiyat-vacib əsasən əvvəl verdiyi salam üçün .iki səcdeyi-səhv yerinə yetirməlidir

Məsələ ۱۲۵۷: Əgər namazı vaxtından qabaq qıldığını bilərsə, onu yenidən qılmalı, əgər vaxt keçmişdirsə də, qəza etməlidir. Əgər namazını qiblənin əksinə qıldığını, yaxud ۹۰ dərəcədən artıq inhirafla qıldığını anlayarsa, vaxt keçməmişdirsə, yenidən qılmalıdır. Əgər vaxt keçmişdirsə, onda qiblənin o tərəfə olduğu xüsusunda şəkkli və ya cahil idisə, qəza etməlidir. Amma əgər şəkkli deyildisə, qəza etməsi lazım deyildir. Əgər qiblənin inhirafının ۹۰ dərəcədən az olduğunu bilərsə, qiblədən dönməsində üzrlü olmasa, məsələn; qiblənin hansı tərəfə olduğunu araşdırmaq xüsusunda və ya məsələni bilmədiyində səhlənkarlıq etmişsə, ehtiyata əsasən, istər vaxtı keçsin, istərsə keçməsin o namazı yenidən qılması lazımdır. Əgər üzürlü olubsa, yenidən .qılması lazım deyil

## MÜSAFİRİN NAMAZI

Müsafir gərək zöhr, əsr və işa namazını səkkiz şərt daxilində şikəstə, yəni iki rəkət :qılmalıdır

.Onun səfəri səkkiz şəri fərsəxdən (təqribən ۴۴ km-dən) az olmasın .۱

Məsələ ۱۲۵۸: Gedib-qayıtması birlikdə səkkiz fərsəx olan şəxs, istər gedişi və ya gəlişi dörd fərsəxdən az olsun, ya olmasın, gərək namazı şikəstə qılsın. Buna əsasən əgər gedişi üç fərsəx və qayıdışı beş fərsəx və ya əksinə olsa, gərək namazı şikəstə, yəni iki .rəkət qılsın

Məsələ ۱۲۵۹: Əgər gediş və qayıdışı səkkiz fərsəx olarsa, getdiyi gündə və ya o günün gecəsi qayıtmasa belə, namazını şikəstə qılmalıdır. Amma bu təqdirdə, ehtiyat edərək, .namazını tam da qılması daha yaxşıdır

Məsələ ۱۲۶۰: Səfəri səkkiz fərsəxdən bir qədər az olarsa və ya insan getdiyi yolun səkkiz fərsəx olub-olmadığını bilməzsə, namazını şikəstə qılmamalıdır. Əgər səfərinin səkkiz fərsəxə çatıb-çatmadığında şəkk edərsə, araşdırması lazım deyil və namazı .tam qılmalıdır

Məsələ ۱۲۶۱: Əgər bir adil və ya inanılmış bir şəxs xəbər verə ki, insanın səfəri səkkiz .fərsəxdir, onun sözündən xatircəm olsa, gərək namazı şikəstə qılsın

Məsələ ۱۲۶۲: Səfərinin səkkiz fərsəx olmasına yəqini olan kəs namazı şikəstə qılıb, sonra başa düşsə ki, səkkiz fərsəx olmayıb, gərək onu dörd rəkətli namaz kimi yerinə .yetirsin. Əgər vaxtı keçibsə, qəza etsin

Məsələ ۱۲۶۳: İstədiyi bir yerə səfərə çıxmaq əzmində olan şəxsin öz səfərinin səkkiz fərsəx olmamasına yəqinliyi olsa yaxud səkkiz fərsəx olub-olmamasında şəkk etsə, belə ki, yolda ikən başa düşsə ki, onun səfəri səkkiz fərsəx imiş, yolu bir az qalsa da, gərək namazı şikəstə qılsın və əgər tamam qılıbsa, gərək ikinci dəfə şikəstə qılsın. .Amma vaxtı keçibsə qəza etmək lazım deyil

Məsələ ۱۲۶۴: Ara məsafəsi dörd fərsəxdən az olan iki məhəllənin arasında bir neçə .dəfə gedib-gəlməklə hamısı səkkiz fərsəx olsa da, namazını bütöv qılmalıdır

Məsələ ۱۲۶۵: Əgər bir yerə iki yol olsa, biri səkkiz fərsəxdən az və o biri də səkkiz fərsəx və ya ondan çox olsa, insan səkkiz fərsəx olan yoldan oraya getsə, gərək .namazı şikəstə qılsın və əgər səkkiz fərsəx olmayan yoldan getsə, gərək tamam qılsın

Məsələ ۱۲۶۶: Səkkiz fərsəxin başlanğıcı, şəxsin müsafir sayılacağı bir yeri keçdikdən etibarən hesab edilməlidir. Belə ki, bu yer, əksər hallarda şəhərin sonu hesab olunan yerdir. Amma bəzi böyük şəhərlərdə məhəllənin son yerindən də hesab oluna bilər ki, .onun axırı məqsəddir

Səfərinin əvvəlindən etibarən qəsdi səkkiz fərsəx olmalıdır. Yəni səkkiz fərsəx . ۲ gedəcəyini bilməlidir. Deməli əgər, səkkiz fərsəxdən az olan bir yerə səfər edərsə və oraya çatdıqdan sonra, gəldiyi yolla birlikdə səkkiz fərsəx olacaq bir yerə getməyə niyyət edərsə, əvvəlcədən qəsdi səkkiz fərsəx olmadığına görə, namazı tam qılmalıdır. Amma əgər oradan səkkiz fərsəx getmək istəyərsə və ya məsələn; bir yerə getsə ki .qayıtmağı ilə birlikdə səkkiz fərsəx olacaq, namazını şikəstə qılmalıdır

Məsələ ۱۲۶۷: Səfərinin neçə fərsəx olacağını bilməyən şəxs, məsələn; bir itkini tapmaq

üçün nə qədər yol gedəcəyini bilmirsə, gərək namazı tamam qılsın. Amma qayıdanda əgər vətəninə və ya on gün qalacağı yerə qədər səkkiz fərsəx, yaxud çox olsa, gərək namazı şikəstə qılsın. Əgər getdiyi zaman gedib-qayıtmağı ilə birlikdə səkkiz fərsəx .yolu getməyi niyyət edərsə, namazını şikəstə qılmalıdır

Məsələ ۱۲۶۸: Müsafir, səkkiz fərsəx yol gedəcəyinə qərarı olduğu təqdirdə, namazını şikəstə qılmalıdır. Deməli, əgər bir şəxs şəhərdən ayrılarsa və məsələn; dost tapacağı təqdirdə, səkkiz fərsəxlik səfərə çıxmağı qəsd edərsə, dost tapacağına əmin olarsa, .namazı şikəstə qılmalıdır. Əgər əmin deyilsə, tam qılmalıdır

Məsələ ۱۲۶۹: Səkkiz fərsəxlik səfərə geməyi niyyət edən bir şəxs, hər gün az miqdarda yol getsə belə, həddi-tərəxxüsə (mənası ۱۳۰۵-ci məsələdə deyiləcəyi kimi) çatanda namazını şikəstə qılmalıdır. Amma hər gün çox az bir miqdarda yol gedərsə, ehtiyat-.lazım budur ki, namazını həm şikəstə, həm də tam qılsın

Məsələ ۱۲۷۰: Səfərdə başqasının ixtiyarında olan qadın, övlad, nökər və məhbus kimi bir şəxs, səfərinin səkkiz fərsəx olduğunu bilərsə, namazını şikəstə qılmalıdır. Əgər .bilməzsə, namazını tam qılmalıdır və soruşması lazım deyildir

Məsələ ۱۲۷۱: Səfərdə başqasının ixtiyarında olan bir şəxs, əgər dörd fərsəxlik yerə çatmamış ondan ayrılıb səfər etməyəcəyini bilərsə və ya guman edərsə, namazını .tamam qılmalıdır

Məsələ ۱۲۷۲: Səfərdə başqasının ixtiyarında olan bir şəxs, dörd fərsəxlik bir yerə çatmazdan qabaq ondan ayrılmayacağına xatircəmliyi yoxdursa, namazını tam .qılmalıdır. Amma əgər buna xatircəmliyi olarsa, namazını şikəstə qılmalıdır

Yolda öz qəsdindən dönməsin. Deməli, əgər dörd fərsəxə çatmazdan əvvəl öz . ۳ qəsdindən dönsə, yaxud tərəddüd etsə (şəkkə düşsə), getdiyi məsafə qayıtması ilə .birlikdə səkkiz fərsəxdən az olsa, gərək namazı tamam qılsın

Məsələ ۱۲۷۳: Yoldan bir qədər gedəndən sonra, qayıtmağı ilə birgə səkkiz fərsəx olsa ,və səfərdən daşınsa, belə qərara alsa ki

orada qalsın və ya on gündən sonra qayıtsın və ya qayıtmağı ilə qalmağında .tərəddüdü olsa, gərək namazı tamam qılsın

Məsələ ۱۲۷۴: Yoldan bir qədər gedəndən sonra, qayıtmağı ilə birgə səkkiz fərsəx olsa və səfərdən daşınsa və qərara alsa ki, qayıtsın, on gündən az orada qalmaq istəsə də, .gərək namazı şikəstə qılsın

Məsələ ۱۲۷۵: Əgər səkkiz fərsəxlik səfərə getmək məqsədi ilə bir yerə doğru hərəkət edərsə və bir miqdar yol getdikdən sonra başqa bir yerə getmək istəyərsə, əgər birinci hərəkət etdiyi yerdən getmək istədiyi yerə qədər səkkiz fərsəx olarsa, namazını .şikəstə qılmalıdır

Məsələ ۱۲۷۶: Səkkiz fərsəxlik yerə çatmazdan qabaq, yolun qalan qismini gedib-getməməkdə tərəddüdə düşərsə, tərəddüdlü olduğu zaman yol getməzsə və sonra qalan qismi də getməyi qərara alarsa, səfərin sonuna qədər namazını şikəstə .qılmalıdır

Məsələ ۱۲۷۷: Səkkiz fərsəxlik yerə çatmadan, yolun qalan qismini gedib-getməməkdə tərəddüd edərsə, tərəddüdlü olduğu zaman bir miqdar yol gedərsə və sonradan, əlavə olaraq səkkiz fərsəx də getməyə və ya gediş-gəlişi səkkiz fərsəx olan bir yerə .getməyi qərara alarsa, səfərin sonuna qədər namazını şikəstə qılmalıdır

Məsələ ۱۲۷۸: Səkkiz fərsəxlik yerə çatmazdan qabaq, yolun qalan qismini gedib-getməməkdə tərəddüd edib tərəddüd edən zaman bir miqdar yol gedərsə və sonradan, qalan qismi getməyi qərara alarsa, əgər tərəddüdlə getdiyi məsafəni çıxmaqla, gedib-gəlməyin məcmusu səkkiz fərsəxdən az olarsa, namazı tamam .qılmalıdır. Amma əgər ondan az olmasa, namazını şikəstə qılmalıdır

Səkkiz fərsəxə çatmamış öz vətənindən keçib orada, ya da on gün və ya daha çox .۴ bir yerdə qalmağa qərar verməməsi lazımdır; o halda bir şəxs səkkiz fərsəxə yetişməmişdən vətəninə qayıdıb orada qalmaq (dayanmaq) istərsə, ya da on gün bir yerdə qalmaq istərsə, namazı bütöv qılmalıdır. Əgər vətənindən, dayanmadan

.keçərsə, ehtiyatən həm şikəstə, həm də bütöv qılmalıdır

Məsələ ۱۲۷۹: Səkkiz fərsəxə çatmadan vətənindən keçib-getməyəcəyini və ya bir yerdə on gün qalıb-qalmayacağını bilməyən şəxs, namazını tamam qılmalıdır.

Məsələ ۱۲۸۰: Səkkiz fərsəxə çatmadan vətənindən keçərək və ya bir yerdə on gün qalmaq istəyən və həmçinin bir yerdə on gün qalmaq və ya vətənindən keçməyində tərəddüdlü olan bir şəxs, əgər on gün qalmaqdan və ya vətənindən keçmək fikrindən dönərsə, yenə də namazını tamam qılmalıdır. Amma qalan yol, qayıdışla birlikdə səkkiz fərsəx olarsa, belə namazını şikəstə qılmalıdır.

۵. Səfəri haram bir iş üçün olmamalıdır; əgər oğurluq kimi haram bir iş üçün səfər edərsə, namazı tamam qılmalıdır. Həmçinin əgər səfərin özü haram olarsa məsələn; səfər onun ölməsinə, ya hər hansı üzvünün nöqsanlı olmasına səbəb olan bir zərəri olarsa və ya qadın, ərindən icazəsiz olaraq ona vacib olmayan bir səfərə gedərsə, hökm eynidir. Amma əgər həcc səfəri kimi vacib səfər olarsa, namazı şikəstə qılmalıdır.

Məsələ ۱۲۸۱: Vacib olmayan səfər, əgər ata-ananın mehribanlıq səbəbindən əziyyət çəkməsinə səbəb olarsa, haramdır. İnsan belə bir səfərdə namazını tamam qılmalı və orucunu da tutmalıdır.

Məsələ ۱۲۸۲: Səfəri haram olmayan və haram iş üçün səfər etməyən bir şəxs, səfərdə günah bir iş görsə də; məsələn: qeybət etsə və ya şərab içsə namazı şikəstə qılmalıdır.

Məsələ ۱۲۸۳: Əgər vacib olan bir işi tərk etmək üçün səfərə çıxarsa, istər səfərdə başqa məqsədi də olsun və ya olmasın, namazını tamam qılmalıdır. Buna görə, borclu olub borcunu verə biləcək halda olan şəxsin borcunu borc verən istəyərsə və o da səfər zamanı borcunu qaytarmağa imkanı olmadığından, borcu qaytarmaqdan boyun qaçırmaq üçün səfərə çıxarsa, namazını tamam qılmalıdır. Amma əgər səfəri başqa bir iş üçün olarsa, səfərdə vacib bir işi tərk etsə belə, namazını şikəstə qılmalıdır.

Məsələ ۱۲۸۴: Əgər səfərdə mindiyi heyvan, yaxud başqa bir minik qəsbi olsa və ya sahibindən qaçmaq üçün səfər etsə, yaxud qəsbi yerdə səfər etsə, gərək namazı

Məsələ ۱۲۸۵: Zalım şəxs ilə səfər edən kəs əgər naçar olmasa və onun səfəri zalıma kömək olsa, gərək namazı tamam qılsın. Əgər naçar olsa, yaxud məsələn, məzluma .nicat vermək üçün onunla səfər etsə, namazı şikəstədir

Məsələ ۱۲۸۶: Əgər əylənmək, ya gəzmək üçün səfər etsə, onun səfəri haram deyil və .gərək namazı şikəstə qılsın

Məsələ ۱۲۸۷: Xoş güzəran keçirib ləhv və əylənmək məqsədi ilə ova gedərsə, baxmayaraq ki, haram deyil amma gedən vaxt namazını tamam qılmalıdır. Qayıtdıqda isə, yolu şikəstə sayılmalı olan miqdarda olsa və gedişi kimi, məqsədi ovçuluq olmazsa, namazını şikəstə qılmalıdır. Amma əgər dolanışığını tə`min etmək üçün ova gedərsə, namazını şikəstə qılmalıdır. Həmçinin, malını çoxaltmaq və ticarət üçün ova gedərsə də hökm eynidir. Yalnız bu halda, ehtiyat-müstəhəb budur ki, namazını həm şikəstə, .həm də tamam qılsın

Məsələ ۱۲۸۸: Günah iş üçün səfərə gedən şəxs qayıdan zaman əgər təkcə qayıtmağı səkkiz fərsəxdirsə, gərək namazı şikəstə qılsın. Ehtiyat-müstəhəb budur ki, tövbə .etməyibsə, həm şikəstə və həm də tamam qılsın

Məsələ ۱۲۸۹: Səfəri günah olan şəxs, əgər yolda günah qəsdindən dönsə, yolun qalanı istər tənha, istərsə oradan gedib-gəlməyin cəmi səkkiz fərsəx olsa da, olmasa da, .gərək namazı şikəstə qılsın

Məsələ ۱۲۹۰: Günah iş üçün səfər etməyən şəxs, əgər yolda ikən yolun qalanını günah .məqsədi ilə getsə, gərək namazı tamam qılsın. Amma şikəstə qıldığı namazlar səhihdir

Səhrada səfər edib özləri və heyvanları üçün harada yemək və su tapılarsa, orada .۶ qalıb, bir müddət sonra başqa bir yerə gedən köçərilər kimi, müəyyən bir məkanları olmayan şəxslərdən olmamalıdır. Belə ki, bu kimi insanlar, bu səfərlərində namazlarını .tamam qılmalıdırlar

Məsələ ۱۲۹۱: Köçəri olan bir şəxs, mənzil və heyvanları üçün otlaq yeri tapmaq üçün səfər edərsə, onun bu səfəri çadır və digər vəsaitlərlə birlikdə olarsa, və «evi özü ilədir»

deyilsə namazını tamam qılmalıdır. Əks təqdirdə, səfəri səkkiz fərsəxdirsə, namazını .şikəstə qılmalıdır

Məsələ ۱۲۹۲: Əgər səhranişin, yəni köçəri bir şəxs ziyarət, həcc, ticarət və bu kimi işlər üçün səfərə çıxsa, «evi özü ilədir» ünvanı ilə adlana bilməsə, gərək namazı şikəstə .qılsın. Əgər adlana bilsə, tamam qılmalıdır

Kəsirüs-səfər olmasın. Amma işi səfərlə bağlı olanlar, sürücü, gəmiçi, postçu, çoban, .۷ çox səfər edən şəxslərin işi ona bağlı olmasa belə, məsələn, həftədə üç gün səfər edənlər kimi, hərçənd əylənmək və ya səyahət üçün səfər etsələr belə, namazı .tamam qılmalıdır

Məsələ ۱۲۹۳: İşi səfərdə olan bir şəxs,, həcc və ya ziyarət kimi başqa bir iş üçün səfər edərsə, namazını şikəstə qılmalıdır. Amma əgər ona ürfdə kəsirüs-səfər desələr belə (yəni çox səfər edən) məsələn, hər həftədə üç səfər edən şəxs kimi, gərək namazını tamam qılsın. Amma əgər sürücü öz maşınını ziyarət üçün kirayə verərsə və özü də .onunla ziyarətə gedərsə, gərək namazını tamam qılsın

Məsələ ۱۲۹۴: Karvanbaşı, yəni o şəxs ki, hacıları Məkkəyə aparmaq üçün səfər edir, əgər səfər onun işi olarsa, namazı tamam qılmalıdır. Amma səfər onun işi olmazsa və təkcə Həcc mövsümündə karvanbaşılıq üçün səfər edirsə, onun səfər müddəti az olsa, (məsələn, ۲-۳ həftə) namazı şikəstədir. Əgər çox olsa (۳ ay kimi), namazı tamamdır. Əgər ona «kəsirüs-səfər» deyilib-deyilməməsində şəkk edərsə, ehtiyatən həm tamam, .həm də şikəstə qılmalıdır

Məsələ ۱۲۹۵: Sürücü və bu kimi ünvanın deyilə bilməsində şərtdir ki, sürücülüyü davam etdirmək qərarında olsun və onun istirahət zamanı, sürücülərin adi istirahət müddətindən uzun olmasın. Deməli, misal üçün, həftədə bir gün səfər edən şəxsə, sürücü deyilməz. Amma «kəsirüs-səfər» ünvanı heç olmazsa həftədə üç gün, ya ayda on gün səfər edən şəxsə deyilə bilər, belə ki, heç olmazsa ildə altı ay, ya iki ildən artıqda üç ay bu vəziyyəti davam etdirmək qərarında olsun. (Əlbəttə, birinci ayda ehtiyatən həm şikəstə, həm də tamam qılmalıdır). Amma kəsirüs-səfər ünvanı həftədə bir gün səfərdə olana deyilməz. Əgər həftədə iki gün səfərdə olsa, ehtiyat-vacibə görə .həm şikəstə, həm də tamam qılmalıdır

Məsələ ۱۲۹۶: Avtomobilini yalnız yaz və ya qış mövsümündə kirayəyə verən sürücü kimi, ilin bir qismində işi səfər olan bir şəxs, bu səfərində namazını tam qılmalıdır. .Amma ehtiyat-müstəhəb budur ki, həm şikəstə, həm də tamam qılsın

Məsələ ۱۲۹۷: Şəhərin ətrafında iki-üç fərsəxlik yolda gediş-gəliş edən sürücü və marşrut, bir səfərində təsadüfən səkkiz fərsəxlik yol gedərsə, namazını şikəstə .qılmalıdır

Məsələ ۱۲۹۸: Peşəsi səfər etmək olan şəxs, istər on gün və ya çox öz vətənində qalsın və əvvəldən qəsdi on gün qalmaq olsun, yaxud qəsdi olmadan qalsın, gərək həmən birinci səfərdə ki, on gündən sonra gedəcək, namazı tamam qılsın. Həmçinin əgər vətənindən başqa yerdə on gün qəsdilə və ya qəsdsiz qalsa da belə, hökm eynidir. Amma çarvadar (mal-qara alverçisi) və ya avtomobilini kirayə verən şəxsin xüsusunda, belə olarsa ehtiyat-müstəhəb budur ki, on gündən sonra getdiyi ilk .səfərdə həm şikəstə, həm də bütöv qılsın

Məsələ ۱۲۹۹: İşi səfər olan şəxsin namazının tamam olması üçün üç dəfə səfər etməsi, şərt deyil; elə sürücü və bu kimi ünvan ona deyilə bilsə hərçənd ilk səfərində olsa belə, .namazı tamamdır

Məsələ ۱۳۰۰: Mal-qara alverçisi və sariban kimi işi səfər olan şəxslərin normadan artıq səfər etmələri, onların çətinliyə düşmələrinə və yorğunluqlarına səbəb olarsa, .namazlarını şikəstə qılmaları gərəkdir

Məsələ ۱۳۰۱: Şəhərlərdə gəzməkdə olan və özü üçün vətən seçməyən şəxs, namazı .tamam qılmalıdır

Məsələ ۱۳۰۲: İşi səfər olmayan şəxs, əgər məsələn; bir şəhər və ya kənddə olan malını daşımaq üçün ardıcıl səfər edərsə, namazını şikəstə qılmalıdır. Amma əgər onun səfərləri xalq arasında «kəsirüs-səfər» deyiləcək qədər çox olarsa, namazını tamam .(qılmalıdır (ki, bunun meyarı ۱۲۹۵-cı məsələdə deyildi

Məsələ ۱۳۰۳: Vətənindən əl çəkib özü üçün başqa yerdə vətən seçmək istəyən şəxsin,

əgər ona namazın tamam qılınmasına səbəb olacaq ünvan (kəsirüs-səfər, köçəri kimi)
.deyilməzsə, gərək öz səfərində namazı şikəstə qılsın

Əgər vətənindən hərəkət edirsə, həddi-tərəxxüsə yetişməsidir. Amma vətəndən .۸ başqa yerdə həddi-tərəxxüsə etibar yoxdur. İqamət yerindən xaric olan kimi, namazı .qəsrdir

Məsələ ۱۳۰۴: Həddi-tərəxxüs, şəhər əhlinin, hətta şəhərin ətrafında olanların müsafiri .görmədiyi yerdir və onun nişanəsi isə, onun şəhər əhlini görməməsidir

Məsələ ۱۳۰۵: Vətəninə qayıdan müsafir, vətəninə çatana qədər namazını şikəstə qılmalıdır. Həmçinin bir yerdə on gün qalmaq istəyən şəxs, oraya çatmayana qədər .namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۰۶: Əgər şəhər hündürlükdə olsa, oranın əhli uzaqdan görünərsə və ya çuxurluqda olsa, azacıq uzaqlaşdıqca oranın əhli görünməzsə, belə bir şəhərdən səfərə çıxan şəxs, əgər oradan, «o şəhər düz yerdə olsaydı, artıq oranın xalqı görünməzdi» deyiləcək qədər uzaqlaşdığı zaman, namazını şikəstə qılmalıdır. Həmçinin əgər yolun alçaq-ucalığı adi qaydadan çox olsa, adi halda olanlar nəzərdə .saxlanılmalıdır

Məsələ ۱۳۰۷: Gəmi və ya qatarda olub həddi-tərəxxüsə yetişmədən, tam qılmaq niyyəti ilə namaza başlayan şəxs, əgər üçüncü rəkətin rükusundan qabaq həddi-tərəxxüsə .çatarsa, namazını şikəstə olaraq tamamlamalıdır

Məsələ ۱۳۰۸: Yuxarıdakı məsələdə izah olunduğu kimi, əgər üçüncü rəkətin rükusundan sonra tərəxxüs həddinə çatsa, başqa bir namazı şikəstə qılmalıdır və .birinci namazı tamamlamaq lazım deyil

Məsələ ۱۳۰۹: Əgər bir şəxs həddi-tərəxxüsə yetişdiyinə əmin olub, namazını şikəstə qılarsa və sonra da namaz qılarkən həddi-tərəxxüsə yetişmədiyi anlaşılarsa, o namazı yenidən qılması gərəkdir. Əgər bu halda həddi-tərəxxüsə çatmamışdırsa, namazını tamam qılmalıdır. Əgər həddi-tərəxxüsdən keçmişdirsə, namazını şikəstə qılmalıdır. Əgər vaxt keçmişdirsə, namazını qəzaya getdiyi zamandakı vəzifəsinə əsasən qəza .etməlidir

Məsələ ۱۳۱۰: Gözü adi vəziyyətdə deyilsə, adi gözün şəhərin əhlini görmədiyi bir yerdə .namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۱۱: Səfərə getdiyi zamanı həddi-tərəxxüsə yetişib-yetişmədiyində şəkk .edərsə, namazını tam qılmalıdır

Məsələ ۱۳۱۲: Səfər zamanı vətənindən keçən bir müsafir, orada dayanarsa, namazını tam qılmalıdır. Əks təqdirdə, ehtiyat-lazıma əsasən, namazını həm şikəstə, həm də .tam qılmalıdır

Məsələ ۱۳۱۳: Səfər zamanı vətəninə çatıb orada dayanan şəxs, orada olduğu müddətdə namazını tam qılmalıdır. Amma əgər oradan səkkiz fərsəxlik bir yola getmək istəyərsə və ya dörd fərsəxə gedib-qayıtmaq istəyərsə, (qayıdan baş) həddi-.tərəxxüsə çatdığı zaman namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۱۴: İnsanın yaşamaq və daimi qalmaq üçün seçdiyi yer onun vətənidir, istər orada dünyaya gəlsin və ata-anasının vətəni olsun, istərsə də özü oranı yaşamaq .üçün qərar versin

Məsələ ۱۳۱۵: Əgər məqsədi bir müddət əsil vətəni olmayan yerdə qalıb sonra başqa .yerə getmək olsa, ora onun vətəni hesab olunmaz

Məsələ ۱۳۱۶: İnsanın öz yaşayışı üçün seçdiyi yerdə daimi məskunlaşmaq niyyəti olmasa belə, əgər xalq arasında o, orada müsafir qəbul edilməzsə, belə ki, müvəqqəti olaraq on gün və ya daha çox bir müddət üçün başqa bir yerdə qalmağı qərara alsa .birinci yeri onun yaşayış yeri olaraq görürsə, ora onun üçün vətən hökmünü daşıyır

Məsələ ۱۳۱۷: İki yerdə yaşayan şəxs, məsələn, altı ay bir yerdə və altı ay da başqa yerdə qalsa, hər ikisi ona vətəndir. Habelə əgər iki yerdən artıq özünə yaşayış yeri .seçsə, onların hamısı ona vətən hesab olunar

Məsələ ۱۳۱۸: Fəqihlərin (müctəhidlərin) bəzisi, demişlər ki, əgər bir şəxsin bir yerdə məskunlaşdığı evi olsa və qalmağı qəsd edərək, ardıcıl altı ay orada qalarsa, o ev onun malı olduğu müddətə qədər, o yer onun vətəni hökmündədir belə ki, səfərdə oraya .çatdığı hər vaxt namazını tamam qılmalıdır. Lakin bu hökm sübut olunmamışdır

Məsələ ١٣١٩: Əvvəllər vətəni olub, fikrindən daşındığı bir yerə çatdıqda, özünə başqa .bir vətən seçməmiş olsa belə, namazını tam qılmamalıdır

Məsələ ۱۳۲۰: Bir yerdə ardıcıl on gün qalmağı qəsd edən və ya ixtiyarsız halda bir yerdə .on gün qalacağını bilən bir müsafir, orada namazını tamam qılmalıdır

Məsələ ۱۳۲۱: Bir yerdə on gün qalmaq istəyən müsafirin, birinci və ya on birinci günün gecəsini də orada qalmağı qəsd etməsi lazım deyildir. Əgər birinci günün sübh azanından, onuncu günün günəş batmasına qədər orada qalmağı qəsd edərsə, namazı tam qılmalıdır. Birinci günün zöhründən on birinci günün zöhrünə qədər orada .qalmağı qəsd edərsə də, hökm eynidir

Məsələ ۱۳۲۲: On gün bir yerdə qalmaq istəyən müsafir, əgər bütün on günü bir yerdə qalmaq istəyərsə, namazını tam qılmalıdır. Belə ki, on gün Nəcəflə Kufədə, yaxud Bakı .və Sumqayıtda qalmaq istəyərsə, namazı şikəstə qılmalıdır

Məsələ ۱۳۲۳: On gün bir yerdə qalmaq istəyən müsafir, qalacağı on gün ərzində o yerin camaat arasında ayrı bir yer hesab olunan və fasiləsi dörd fərsəxdən az olan ətrafına getməyi əvvəldən qəsd etmişdirsə, əgər gedib-gəlmək müddəti ürfün nəzərində on gün qalması ilə zidd olmayacaq miqdardadırsa, namazını tam qılmalıdır. Əgər on gün qalmaqla zidd olarsa, şikəstə qılmalıdır. Məsələn; əgər əvvəldən bir gündüzü və ya bir gecəni oradan ayrılmaq istəyərsə, bu onun iqamət məqsədi ilə ziddir və namazını şikəstə qılmalıdır. Amma əgər onun qəsdi bu olsa ki, məsələn, günün yarısını xaric olsun və sonra qayıtsın, hərçənd qayıtması gecə olduqdan sonra olsa belə, gərək namazı tamam qılsın. Amma əgər onun bu cür ayrılması, ürfdə «iki və ya daha çox .yerdə iqamət edir» deyiləcək qədər təkrarlanırsa, namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۲۴: Bir yerdə on gün qalmağı qərara almayıb, məsələn; əgər dostu gələrsə və ya yaxşı mənzil tapsa, on gün orada qalacağını qəsd edən müsafir, namazını şikəstə .qılmalıdır

Məsələ ۱۳۲۵: Bir yerdə on gün qalmağı qərara alan bir şəxs, əgər orada qalmasına bir şeyin mane olmasına ehtimal verirsə və bu ehtimal aqil şəxslərin nəzərində qəbul .olunan bir ehtimal olarsa, namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۲۶: Ayın sonuna on gün və ya daha çox qaldığını bilən şəxs, ayın sonuna qədər bir yerdə qalmağı qərara alarsa, namazını tam qılmalıdır. Amma əgər ayın sonuna bir neçə gün qaldığını bilməz və ayın sonuna qədər bir yerdə qalmağı qərara alarsa, hərçənd qərarlaşdırdığı zamandan ayın sonuna qədər on gün və ya daha çox .qalmış olsa belə, namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۲۷: Bir yerdə on gün qalmağı qərara alan müsafir, əgər dörd rəkətli bir namaz qılmadan qərarından dönərsə və ya orada qalmaqda və ya başqa bir yerə getməkdə tərəddüdə düşərsə, namazını şikəstə qılmalıdır. Amma əgər dörd rəkətli bir namaz qıldıqdan sonra qərarından dönərsə və ya tərəddüdə düşərsə, orada qaldığı .müddətə qədər namazlarını tam qılmalıdır

Məsələ ۱۳۲۸: Bir yerdə on gün qalmağı qərara alan bir müsafir, oruc tutarsa və zöhrdən sonra orada qalmaq fikrindən dönərsə, əgər dörd rəkətli bir namaz qılmışdırsa, orada qaldığı müddətə qədər orucları səhihdir və namazlarını tam qılmalıdır. Amma əgər dörd rəkətli bir namaz qılmamışdırsa, ehtiyata əsasən, o günün orucunu tamamlayıb sonradan qəza etməli, namazlarını da şikəstə qılmalıdır. Sonrakı .günlərdə də oruc tuta bilməz

Məsələ ۱۳۲۹: On gün bir yerdə qalmağı qərara alan bir müsafir, qərarından dönərsə və qərarından dönməzdən qabaq dörd rəkətli bir namaz qılıb-qılmadığında şəkk edərsə, .namazlarını şikəstə qılmalıdır

Məsələ ۱۳۳۰: Əgər müsafir şikəstə qılmaq niyyəti ilə namaza başlayarsa və namaz əsnasında on gün və ya daha çox qalmağı qərarlaşdırarsa, namazını dörd rəkətli .olaraq tamamlamalıdır

Məsələ ۱۳۳۱: On gün bir yerdə qalmağı qəsd edən müsafir, əgər birinci dörd rəkətli namazın əsnasında öz qəsdindən dönsə, əgər üçüncü rəkətə məşğul deyilsə, gərək namazı iki rəkətli tamam etsin və digər namazlarını şikəstə qılsın. Həmçinin əgər üçüncü rəkətə məşğul olsa və rükuya getməmiş olsa, gərək otursun və namazı şikəstə sona çatdırsın. Əgər rükuya getmişdirsə, namazını poza və ya tamamlaya bilər və

Məsələ ۱۳۳۲: On gün bir yerdə qalmağı qərara alan bir şəxs, orada on gündən çox qalarsa, səfərə çıxana qədər namazını tam qılmalıdır. İkinci dəfə on gün qəsd etməsi .lazım deyildir

Məsələ ۱۳۳۳: On gün bir yerdə qalmağı qərara alan bir müsafir, vacib orucu tutmalıdır. .Müstəhəb oruc da tuta bilər və zöhr, əsr və işa namazlarının nafiləsini də qıla bilər

Məsələ ۱۳۳۴: On gün bir yerdə qalmağı qərara alan bir müsafir, əgər əda olan dörd rəkətli bir namaz qıldıqdan sonra və ya dörd rəkətli bir namazı tam olaraq qılmasa belə bir yerdə on gün qaldıqdan sonra, dörd fərsəxdən az olan bir yerə gedib-qayıdıb, təkrarən əvvəl qaldığı yerdə on gün və ya daha az bir müddət qalmaq istəyərsə, getdiyi zamandan qayıdacağı zamana qədər və qayıtdıqdan sonra namazını tam qılmalıdır. Amma əgər əvvəl qaldığı yerə qayıtması, yalnız səfərinin yolunda olmasına görə olsa və şəri bir məsafəyə səfər etmək istəyərsə, gedib-qayıtdıqda və qaldığı .yerdə namazlarını şikəstə qılmalıdır

Məsələ ۱۳۳۵: On gün bir yerdə qalmağı qərar alan bir müsafir, əda olan dörd rəkətli bir namaz qıldıqdan sonra, səkkiz fərsəxdən az olan başqa bir yerə gedib orada on gün qalmaq istəyərsə, səfəri zamanında və on gün qalmaq istədiyi yerdə namazını tam qılmalıdır. Amma əgər gedəcəyi yer səkkiz fərsəx və ya daha çox olarsa, səfər zamanı namazlarını şikəstə qılmalıdır. Əgər orada on gün qalmaq istəməzsə, orada qaldığı .müddətdə də namazlarını şikəstə qılmalıdır

Məsələ ۱۳۳۶: On gün bir yerdə qalmağı qərara alan bir müsafir, əgər əda olan dörd rəkətli bir namaz qıldıqdan sonra, dörd fərsəxdən az olan bir yerə getmək istəyərsə, əgər əvvəlki yerinə qayıdıb-qayıtmayacağında tərəddüdlü olarsa və ya oraya qayıtmaqdan tamamilə qafil olarsa, yaxud qayıtmaq istədiyi halda, orada on gün qalıb-qalmayacağında tərəddüdlü olarsa, ya da orada on gün qalmaqdan və ya səfər etməkdən qafil olarsa, getdiyi vaxtdan qayıdana qədər və qayıtdıqdan sonra .namazlarını tamam qılmalıdır

Məsələ ۱۳۳۷: Dostlarının da on gün qalacağını xəyal edərək bir yerdə on gün qalmağı

qərara alan və əda olan dörd rəkətli bir namaz qıldıqdan sonra, dostlarının qalmaq qərarına

gəlmədiklərini anlayarsa, özü də qalmaq fikrindən dönsə belə, orada qaldığı müddətə .qədər namazlarını tam qılmalıdır

Məsələ ۱۳۳۸: Əgər müsafir təsadüfən otuz gün bir yerdə qalsa, məsələn, otuz günün tamamında getmək ilə qalmağa tərəddüd edərsə otuz gün keçəndən sonra, hərçənd .orada az bir müddət qalsa belə, gərək namazı tamam qılsın

Məsələ ۱۳۳۹: Doqquz gün və ya daha az bir müddət üçün bir yerdə qalmaq istəyən müsafir, doquqz gün və ya daha az orada qaldıqdan sonra, yenidən orada doqquz gün və ya daha az qalsa və bu şəkildə orada otuz günə qədər qalarsa, otuz birinci gündən .etibarən, namazlarını tam qılmalıdır

Məsələ ۱۳۴۰: Müsafir bir yerdə otuz gün qalandan sonra gərək namazı tamam qılsın. Deməli otuz günün bəzisini bir yerdə, bəzisini başqa yerdə qalsa, otuz gündən sonra .da namazı şikəstə qılmalıdır

## MÜXTƏLİF MƏSƏLƏLƏR

Məsələ ۱۳۴۱: Müsafir Məkkə, Mədinə, Kufə şəhərlərinin hər yerində eləcə də Həzrət Seyyidüş-şühədanın (əleyhissəlam) hərəmində qəbri-müqəddəsin ۱۱,۵ metr .məsafəsinə qədər namazını tamam qıla bilər

Məsələ ۱۳۴۲: Müsafir olduğunu və namazı şikəstə qılmalı olduğunu bilən bir şəxs, əvvəlki məsələdə deyilən dörd məkandan başqa yerlərdə, namazını qəsdən bütöv qılarsa, namazı batildir. Həmçinin əgər müsafirin namazının şikəstə olduğunu unudaraq bütöv qılarsa da, hökm eynidir. Amma unutduğu təqdirdə, vaxt keçdikdən .sonra xatırlayarsa, qəza etməsi lazım deyildir

Məsələ ۱۳۴۳: Müsafir olduğunu və namazı şikəstə qılmalı olduğunu bilən bir müsafir, əgər səhvən namazını bütöv qılarsa və vaxt daxilində yadına düşərsə, namazını yenidən qılması lazımdır. Əgər vaxt keçdikdən sonra yadına düşərsə, ehtiyata əsasən .onu qəza etməlidir

Məsələ ۱۳۴۴: Səfərdə namazını şikəstə qılmalı olduğunu bilməyən bir müsafir, əgər bütöv qılarsa, namazı səhihdir.

Məsələ ۱۳۴۵: Namazının şikəstə qılınmalı olduğunu bilən bir müsafir, əgər onun xüsusiyyətlərindən bəzisini bilməsə, məsələn; səkkiz fərsəxlik yolda şikəstə qılmalı olduğunu bilməzsə və bütöv qılarsa, vaxt keçmədən hökmü bilərsə, ehtiyat-lazıma əsasən namazını yenidən qılmalıdır. Əgər qılmasa, qəza etməlidir. Amma əgər vaxt keçdikdən sonra bilərsə, qəza etməsi lazım deyildir.

Məsələ ۱۳۴۶: Namazını şikəstə qılmalı olduğunu bilən bir müsafir, yolunun səkkiz fərsəxdən az olduğunu guman edərək bütöv qılarsa, yolun səkkiz fərsəx olduğunu anladığı zaman, bütöv qıldığı namazı təkrarən şikəstə qılmalıdır. Amma əgər vaxt keçdikdən sonra başa düşərsə, qəza etməsi lazım deyildir.

Məsələ ۱۳۴۷: Müsafir olduğunu unudub namazı bütöv qılarsa, belə ki, namaz vaxtı əsnasında xatırlayarsa, şikəstə qılmalıdır. Əgər vaxtı keçəndən sonra xatırlayarsa, o namazın qəzası ona vacib deyildir.

Məsələ ۱۳۴۸: Namazını tam qılmalı olan bir şəxs, namazını şikəstə qılarsa, hər hansı halda namazı batildir. Hətta bir yerdə on gün qalmağı qərara alan və məsələnin hökmünü bilmədiyindən namazını şikəstə qılmış olan bir müsafir olsa belə, ehtiyat-vacibə əsasən namazı batildir.

Məsələ ۱۳۴۹: Dörd rəkətli bir namazı qılarkən, müsafir olduğunu xatırlayarsa və ya səfərinin səkkiz fərsəx olduğunu bilərsə, belə ki, üçüncü rəkətin rükusuna getməmişdirsə, namazı iki rəkətli tamamlamalıdır. Əgər üçüncü rəkəti tamamlayıbsa, namazı batildir. Əgər üçüncü rəkətin rükusuna getmişdirsə, ehtiyata əsasən namazı batildir. Buna görə də, bir rəkət namaz qılınacaq qədər vaxt qalmış olsa belə, namazını yenidən şikəstə qılmalıdır. Əgər vaxt yoxdursa, qəzasını şikəstə qılmalıdır.

Məsələ ۱۳۵۰: Əgər müsafir, müsafir namazının bəzi xüsusiyyətlərini bilməsə məsələn; dörd fərsəxlik bir yola gedib-qayıdacağı təqdirdə, namazını şikəstə qılmalı olduğunu

bilməsə, dörd rəkətli namaz niyyəti ilə namaza məşğul olsa və üçüncü rəkətin rükusundan əvvəl məsələni başa düşsə, gərək namazını

iki rəkətlə tamam etsin. Əgər rükuda anlayarsa, ehtiyata əsasən namazı batildir. Bir .rəkət qılınacaq qədər vaxt qalsa belə, namazı yenidən şikəstə qılmalıdır

Məsələ ۱۳۵۱: Namazını bütöv qılmalı olan bir müsafir, məsələni bilməməsi səbəbindən, iki rəkət qılmaq niyyəti ilə namaza başlayar və namazda ikən başa düşərsə, namazı dörd rəkətli tamamlamalıdır. Ehtiyat-müstəhəb budur ki, o namazı tamamladıqdan .sonra, onu yenidən dörd rəkətli qılsın

Məsələ ۱۳۵۲: Namazını qılmamış olan bir müsafir, vaxt keçmədən vətəninə və ya on gün qalacağı bir yerə çatarsa, namazını bütöv qılmalıdır. Müsafir olmayan bir şəxs də, .vaxtın əvvəlində namaz qılmayıb səfərə çıxarsa, yolda namazını şikəstə qılmalıdır

Məsələ ۱۳۵۳: Səfərdə ikən namazını şikəstə qılmalı olan bir müsafirin zöhr, əsr və ya işa namazı qəza olarsa, onları səfərdə olmasa belə qəza etmək lazım gəlirsə, iki rəkətli qəza etməlidir. Əgər müsafir olmayan bir şəxsdən də, bu üç namazdan biri qəzaya .qalarsa, səfərdə ikən qəzasını qılmaq istəyərsə, dörd rəkətli qəza etməlidir

Məsələ ۱۳۵۴: Müstəhəbbdir ki, müsafir şikəstə qıldığı hər bir namazdan sonra otuz dəfə desin: «Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər». Bu zikrin hər vacib namazdan sonra müstəhəb olmasına baxmayaraq qeyd olunan hallarda daha .çox göstəriş verilmişdir. Daha yaxşı budur ki, bu yerlərdə bunu altmış dəfə desin

## QƏZA NAMAZI

Məsələ ۱۳۵۵: Gündəlik namazını, namazın bütün vaxtı ərzində hətta yuxuda olmaq və ya sərxoşluq səbəbindən olsa belə, vaxtında qıla bilməyən şəxs, qəza etməlidir. Öz vaxtında qılınmamış olan digər hər vacib namaz da eyni hökmü daşıyır. Hətta ehtiyat-lazıma əsasən, nəzr etməklə müəyyən bir vaxtda vacib olan namaz da eyni hökmdədir. Amma Fitr və Qurban bayramı namazlarının qəzası yoxdur. Habelə, istər gündəlik

namaz olsun, istərsə də başqa bir namaz olsun, qadının heyz və nifas halında qılmadığı .namazların da qəzası yoxdur. Ayət namazının qəzasının hökmü sonradan deyiləcək

Məsələ ۱۳۵۶: Əgər namazın vaxtından sonra, qıldığı namazın batil olduğunu başa .düşsə, gərək onun qəzasını qılsın

Məsələ ۱۳۵۷: Boynunda qəza namazı olan bir şəxs, onu qılmaqda səhlənkarlıq .etməməlidir. Amma dərhal yerinə yetirməsi də vacib deyildir

.Məsələ ۱۳۵۸: Qəza namazı olan bir şəxs müstəhəb namazı qıla bilər

Məsələ ۱۳۵۹: Boynunda qəza namazı olduğuna və ya qıldığı namazların səhih .olmadığına ehtimal verən bir insanın, ehtiyata əsasən onları qəza etməsi müstəhəbdir

Məsələ ۱۳۶۰: Bir günün zöhr və əsr namazları ilə, bir gecənin məğrib və işa namazları kimi, tərtiblə yerinə yetirilməsi vacib olan namazlardan başqa, gündəlik namazların .qəzasını tərtibə əsasən yerinə yetirmək vacib deyildir

Məsələ ۱۳۶۱: Ayət namazı kimi gündəlik olmayan bir neçə namazı və ya bir gündəlik və bir neçə gündəlik olmayan namazları qəza etmək istəyən şəxsin, onları tərtib üzrə .qılması lazım deyildir

Məsələ ۱۳۶۲: Bir dörd rəkətli namazı qılmadığını, amma onun zöhr, və ya işa namazı olduğunu bilməyən bir şəxs, qılmamış olduğu namazın qəzası niyyəti ilə bir dörd rəkətli namaz qılarsa, kifayətdir. Namazı ucadan və ya alçaqdan oxumasında isə ixtiyar .sahibidir

Məsələ ۱۳۶۳: Əgər bir şəxsdən, məsələn; bir neçə sübh namazı və ya bir neçə zöhr namazı qəza olarsa və onların sayını bilməzsə və ya unutmuş olarsa, məsələn; üç, dörd, ya beş namaz olduğunu bilməzsə, az miqdarı yerinə yetirərsə, kifayətdir. Amma hamısını qıldığına əmin oluncaya qədər namaz qılması daha yaxşıdır. Məsələn; əgər özündən bir neçə sübh namazının qəzaya qaldığını unutmuş olsa və eyni zamanda on .namazdan artıq olmadığına əmindirsə, ehtiyata əsasən on sübh namazı qılsın

Məsələ ۱۳۶۴: Keçmiş günlərdən yalnız bir qəza namazı boynunda olan şəxsin, əgər o günün namazının fəzilət vaxtı keçmirsə, əvvəl qəza edib, sonra o günün namazına başlaması daha yaxşıdır. Həmçinin əgər keçmiş günlərdən qəza namazı olmadığı halda, ondan həmin günə aid bir namaz və ya daha çox namaz qəzaya qalmışdırsa, əgər o günün namazının fəzilət vaxtı keçmirsə, o günün qəza namazını əda .namazından əvvəl qılması daha yaxşıdır

Məsələ ۱۳۶۵: Əgər namaz qılarkən həmin gündən bir və ya daha çox namazının qəzaya qaldığını və ya keçmiş günlərdən yalnız bir qəza namazının boynunda olduğunu xatırlayarsa, vaxt genişdirsə və niyyətini qəza namazına çevirməsi mümkündürsə, o günün namazının fəzilət vaxtı keçmədiyi təqdirdə, niyyətini qəza namazına çevirməsi daha yaxşıdır. Məsələn; zöhr namazını qılarkən, üçüncü rəkətin rükusundan qabaq, həmin günün sübh namazının qəzaya qaldığını xatırlayarsa, zöhr namazının fəzilət vaxtı daralmamışdırsa, niyyəti sübh namazına çevirib o namazı iki rəkətli tamamlaması və sonra zöhr namazını qılması daha yaxşıdır. Amma əgər fəzilət vaxtı dar olsa və ya niyyətini qəza namazına çevirməsi mümkün olmazsa, məsələn; üçüncü rəkətin rükusunda sübh namazını qılmadığını xatırlayarsa, niyyətini sübh namazına çevirdiyi təqdirdə, rükn hesab edilən bir rüku artıq olduğuna görə, niyyətini sübh .namazının qəzasına çevirə bilməz

Məsələ ۱۳۶۶: Əgər keçmiş günlərdən qəza namazları vardırsa və bir və ya daha çox namaz həmin gündən qəza olmuşdursa, əgər onların hamısını qəza etməyə vaxtı olmasa və ya hamısını o gündə qılmaq istəmirsə, müstəhəbdir ki, o günün qəza .namazını əda namazından əvvəl qılsın

Məsələ ۱۳۶۷: İnsan həyatda ikən öz qəza namazlarını qılmaqdan aciz olsa belə, başqası .onun namazlarının qəzasını qıla bilməz

Məsələ ۱۳۶۸: İstər imamın namazı əda olsun, istərsə qəza olsun, qəza namazını camaatla qılmaq mümkündür. Hər ikisinin eyni

namazları qılmaları da lazım deyildir. Məsələn; sübh namazının qəzasını, imamın zöhr .və ya əsr namazı ilə qılmasının eybi yoxdur

Məsələ ۱۳۶۹: Müməyyiz olan, yəni yaxşını və pisi anlayan uşağı namaz qılmağa və digər ibadətlər etməyə adət etdirmək müstəhəbdir. Hətta onu, qılmadığı namazları qəza .etməyə vadar etmək belə, müstəhəbbdir

## ATANIN BÖYÜK OĞULA VACİB OLAN QƏZA NAMAZI

Məsələ ۱۳۷۰: Əgər ata öz namazını qılmamış olsa, və qəza edə bilərmişsə, bu Allahın əmrinə itaətsizlik ucbatından deyilmişsə, onun ölümündən sonra böyük oğul ehtiyat-vacibə əsasən bunları yerinə yetirməli və ya onun üçün əcir tutmalıdır. Ananın namazlarının qəzasını yerinə yetirmək daha yaxşı olduğuna baxmayaraq ona vacib .deyildir

Məsələ ۱۳۷۱: Əgər böyük oğul atasının qəza namazının olub olmamasında şəkk edərsə, .ona bir şey vacib deyildir

Məsələ ۱۳۷۲: Əgər böyük oğul atasının qəza namazları olduğunu bilib, onları yerinə .yetirib-yetirmədiyində şəkk edərsə, ehtiyata əsasən onları qəza etməsi vacibdir

Məsələ ۱۳۷۳: Əgər oğullardan hansının böyük oğul olduğu məlum olmasa, atanın namazını qəza etmək oğullardan heç birinə vacib deyil. Amma ehtiyat-müstəhəb budur ki, onun namazlarını öz aralarında bölüşdürsünlər, yaxud da onları yerinə .yetirəni təyin etmək üçün, aralarında püşk atsınlar

Məsələ ۱۳۷۴: Əgər meyyit, namazlarının qəzası üçün əcir tutulmasını vəsiyyət etmişdirsə, əgər onun vəsiyyəti nüfuzludursa, (qanuni, keçərlidirsə) onların qəzası .böyük oğula vacib olmaz

Məsələ ۱۳۷۵: Əgər böyük oğul anasının qəza namazlarını qılmaq istəyərsə, namazı ucadan və ya alçaqdan oxumaqda öz təklifinə əməl etməlidir. Deməli anasının sübh, .məğrib və işa namazlarının qəzasını gərək ucadan qılsın

Məsələ ۱۳۷۶: Özünün də qəza namazı olan şəxs, əgər ata-anasının da namazlarını .qəza etmək istəyərsə, hansını əvvəl yerinə yetirsə səhihdir

Məsələ ۱۳۷۷: Əgər böyük oğul atası ölən vaxt nabaliğ (yəni həddi-büluğa çatmamış), ya .dəli olsa, baliğ ya ağıllı olandan sonra, atanın qəza namazı ona vacib deyildir

Məsələ ۱۳۷۸: Əgər böyük oğul atasının namazını qəza etməmişdən qabaq ölsə, ikinci .oğula heç nə vacib deyil

## CAMAAT NAMAZI

Məsələ ۱۳۷۹: Gündəlik namazları camaat ilə qılmaq müstəhəbdir. Sübh, məğrib və işa namazlarını xüsusilə məscid qonşuluğunda olanlara və məsciddə verilən azanın səsini eşidənlərə daha çox aidiyyəti var. Həmçinin sair vacib namazları da camaatla qılmaq müstəhəbdir. Amma təvaf namazı və gün və ay tutulması istisna olmaqla sair ayət namazlarının camaat namazı şəklində qılınmasının məşruiyyəti (şəri, qanuni olması) .sübuta yetməyib

Məsələ ۱۳۸۰: Mötəbər rəvayətlərdə vardır ki, camaat ilə qılınan namaz, fərdi namazdan .iyirmi beş dərəcə fəzilətlidir

Məsələ ۱۳۸۱: Etinasızlıq üzündən camaat namazına hazır olmamaq icazəli deyildir. .İnsanın üzrsüz olaraq camaat namazını tərk etməsi də düzgün deyildir

Məsələ ۱۳۸۲: İnsanın səbr edib, camaatla namaz qılması müstəhəbdir. Müxtəsər qılınan camaat namazı, uzun qılınan fürada namazdan daha üstündür. Həmçinin camaat namazı, vaxtın əvvəlində fürada qılınan namazdan daha üstündür. Amma fəzilətli vaxtdan qeyri-vaxtda qılınan camaat namazının, fəzilətli vaxtda qılınan fürada .namazdan daha üstün olması məlum deyil

Məsələ ۱۳۸۳: Camaat namazı başladığı zaman, namazını fərdi qılmış olan şəxsin, ikinci dəfə namazını camaatla qılması müstəhəbdir. Əgər sonradan, fərdi qılmış olduğu .namazın batil olduğunu anlayarsa, ikinci dəfə qıldığı namaz kifayətdir

Məsələ ۱۳۸۴: Əgər imam və ya məmum camaatla qıldığı namazı təkrarən camaatla qılmaq istəyərsə, bunun müstəhəbliyi sübut olmasa da, savab ümidilə (yəni rəcaən) .yerinə yetirilməsinin maneəsi yoxdur

Məsələ ۱۳۸۵: Namazının batil olmasına səbəb olacaq qədər vəsvəsəyə düşən şəxs, əgər namazı yalnız camaatla qıldığı zaman vəsvəsədən rahat olarsa, namazı camaatla .qılmalıdır

Məsələ ۱۳۸۶: Əgər ata və ya ana öz uşağına namazı camaatla qılmasını əmr edərsə, ehtiyat-müstəhəb budur ki, namazını camaatla qılsın. Əlbəttə əgər atanın və ya ananın ona etdiyi əmr və nəhyi uşağına olan məhəbbətdən irəli gəlirsə, və ona qarşı .çıxmaq onlara əziyyət olmasına səbəb olursa, uşağın ona qarşı çıxması, haramdır

Məsələ ۱۳۸۷: Müstəhəb namaz ehtiyata əsasən heç bir şəkildə camaatla qılına bilməz. Amma yağış yağması üçün qılınan istisqa namazı camaatla qılına bilər. Həmçinin vacib olub, sonradan başqa bir səbəbə görə müstəhəb olan bir namazı məsələn; Həzrət İmamın (əleyhis-səlam) dövründə vacib olub, o Həzrət qeyb olduqdan sonra .müstəhəb olan Fitr və Qurban bayramı namazlarını camaatla qılmaq caizdir

Məsələ ۱۳۸۸: İmam camaat, gündəlik namazını qılanda, gündəlik namazlardan hər .birini ona iqtida etmək olar

Məsələ ۱۳۸۹: Əgər imam camaat, özünün və ya namazının qəzaya getməsi yəqin olan ölmüş bir şəxsin gündəlik namazlarının qəzasını qılırsa, ona iqtida etmək olar. Amma əgər öz namazını və ya başqasının namazını ehtiyatən yenidən qılırsa, ona iqtida etmək icazəli deyil. Amma əgər məmum da namazını ehtiyatən yenidən qılırsa və imamın ehtiyat etməsinin səbəbi, məmumun ehtiyat etməsinin səbəbi ilə eynidirsə, ona iqtida edə bilər. Amma məmumun ehtiyat etməsinə digər səbəbin olmaması lazım .deyildir

Məsələ ۱۳۹۰: Əgər insan imamın qıldığı namazın gündəlik vacib ya müstəhəb namaz .olduğunu bilməsə, ona iqtida edə bilməz

Məsələ ۱۳۹۱: Camaat namazının səhih olması üçün, imamla məmum arasında və eyni zamanda, imamla başqa məmumlar

arasında vasitə olan məmumla o biri məmumlar arasında bir şeyin fasilə olmaması şərtdir. Fasilədən məqsəd, onları bir-birindən ayıran bir şeydir. İstər pərdə, divar və ya bu kimi görməyə mane olan bir şey olsun, istər şüşə kimi görməyə mane olmayan bir şey olsun, fərq etməz. Belə ki, əgər namazın bütün və ya bəzi hallarında imamla məmum arasında və ya bağlantı (müttəsil olma) vasitəsi olan məmumla o biri məmumlar arasında bir fasilə olarsa, camaat namazı batildir. Amma irəlidə izah .olunacağı kimi, qadın bu hökmdən müstəsnadır

Məsələ ۱۳۹۲: Birinci cərgənin uzun olması səbəbilə cərgənin iki tərəfində duran şəxslər imamı görməsələr də, ona iqtida edə bilərlər. Həmçinin əgər (birinci cərgədən başqa) sair cərgələrdən birinin də uzun olması səbəbilə, onun iki tərəfində duran şəxslər, öz .önlərində olan cərgəni görməsələr, iqtida edə bilərlər

Məsələ ۱۳۹۳: Əgər camaat namazının cərgələri məscidin qapısına çatsa, qapının müqabilindəki cərgənin arxasında duran şəxsin namazı səhihdir. Həmçinin onun arxasında durub iqtida edən şəxslərin də namazı səhihdir. Hətta iki tərəfdə olub, .başqa məmum vasitəsi ilə camaatla bitişik olan şəxslərin də namazları səhihdir

Məsələ ۱۳۹۴: Sütunun arxasında duran şəxs sağ və ya sol tərəfdən başqa bir .məmumun vasitəsilə imamla birləşməsə, iqtida edə bilməz

Məsələ ۱۳۹۵: İmamın durduğu yer məmumun durduğu yerdən gərək hündür olmasın. Amma əgər imamın yeri çox az miqdarda hündür olsa, eybi yoxdur. Həmçinin əgər bir yer mayili vəziyyətdə olarsa, belə ki, imam da onun yüksək tərəfində dayandıqda yer .çox mayili olmasa, eybi yoxdur

Məsələ ۱۳۹۶: Məmumun yeri imamın yerindən hündür olarsa, eybi yoxdur. Amma, ."camaat ictima edib" deyilməyəcək qədər hündür olsa, camaat namazı səhih deyil

Məsələ ۱۳۹۷: Bir sırada duranların arasında müməyyiz bir uşaq fasilə olarsa, onun namazının batil olduğu bilinməyənə qədər, iqtida edilə bilər. Həmçinin o, on iki imam .şiəsi olmasa, belə ki, onun namazı öz məzhəbinə görə səhih olsa, hökm eynidir

Məsələ ۱۳۹۸: İmamın təkbirindən sonra qabaqdakı cərgə, namaza hazır olsa və onların təkbir deməlёri yaxın olsa, sonrakı cərgədə dayanan şəxslər təkbir deyə bilər. Amma .ehtiyat-müstəhəb budur ki, birinci cərgənin təkbiri qurtarana qədər gözləsin

Məsələ ۱۳۹۹: Əgər öndəki cərgələrdən hər hansı birinin namazının batil olduğu məlum olsa, sonrakı cərgələr iqtida edə bilməz. Amma onların namazlarının səhih olub-.olmaması məlum olmasa, iqtida edə bilərlər

Məsələ ۱۴۰۰: Əgər bir şəxs, imamın namazının batil olmasını bilsə məsələn: onun dəstəmazsız olduğunu bilsə, hətta imamın özü bu işdən agah olmasa da, ona iqtida .edə bilməz

Məsələ ۱۴۰۱: Məmum, namazdan sonra imamın adil olmadığını və ya kafir olduğunu, yaxud başqa bir səbəbdən namazının batil olduğunu, məsələn; dəstəmazsız namaz .qıldığını bilərsə, namazı səhihdir

Məsələ ۱۴۰۲: Namazda ikən imama iqtida edib-etmədiyində şəkk edərsə, əgər bəzi nişanələr vasitəsilə iqtida etdiyinə xatircəm olarsa, namazını camaatla .tamamlamalıdır. Əks təqdirdə, namazını fürada niyyəti ilə tamamlamalıdır

Məsələ ۱۴۰۳: Əgər məmum namaz əsnasında üzrsüz olaraq, fürada niyyəti edərsə, onun camaat namazının səhih olması işkallı, lakin təklikdə qıldığı namazı səhihdir. Amma əgər fərdi namaz qılanın da vəzifəsinə görə əməl etməsə, ehtiyat-vacibə görə namazı yenidən qılmalıdır. Amma əgər üzrlü olduğu halda namazı batil etməyən bir şeyi artırsa və ya əskiltsə yenidən qılması lazım deyil. Məsələn, əgər namazın əvvəlindən fürada qəsdi olmasa, qiraət etməsə, amma rükuda olduğu zaman bu qəsdə düşərsə, bu təqdirdə namazını fərdi qəsdi ilə tamamlaya bilər və onu yenidən .qılması lazım deyil. Həmçinin imama tabe olmaq üçün bir səcdəni artırsa hökm eynidir

Məsələ ۱۴۰۴: Əgər imam Həmd və surəni oxuduqdan sonra, məmum bir üzr səbəbindən fürada niyyəti edərsə, Həmd və surəni oxuması lazım deyil. Amma əgər üzrsüz olsa və ya Həmd və surə tamamlanmazdan qabaq fürada niyyəti edərsə,

Məsələ ۱۴۰۵: Əgər camaat namazı əsnasında fürada niyyəti etsə, ikinci dəfə (həmin namazda) camaat namazı niyyət edə bilməz. Həmçinin ehtiyat-vacib görə, əgər fürada niyyəti edib-etməməsində tərəddüd etsə və sonra namazı camaatla bitirmək .qərarına gəlsə, hökm eynidir

Məsələ ۱۴۰۶: İnsan namaz əsnasında fürada niyyəti edib-etmədiyində şəkk edərsə, .fürada niyyəti etmədiyinə qərar verməlidir

Məsələ ۱۴۰۷: Əgər imam rükuda olan vaxt iqtida etsə və imamın rükusuna çatsa, imamın zikri tamam olsa da, namazı səhihdir və bir rəkət hesab olunur. Əgər rüku qədər əyilsə və imamın rükusuna çatmasa, namazını fərdi niyyəti ilə tamam edə bilər, .həm də sonrakı rəkətə çatmaq üçün namazı kəsə bilər

Məsələ ۱۴۰۸: İmam rükuda ikən, iqtida edib, rükuya qədər əyilərsə və imama rükuda yetişib-yetişmədiyində şəkk edərsə, əgər bu şəkki rükunun tamam olmasından sonra olsa, qıldığı camaat namazı səhihdir. Əks təqdirdə, namazı fürada niyyəti ilə .tamamlaya bilər, həm də sonrakı rəkətə çatmaq üçün namazın kəsə bilər

Məsələ ۱۴۰۹: İmam rükuda ikən iqtida edərsə və rüku miqdarı qədər əyilməzdən qabaq, imam rükudan başını qaldırarsa, fürada niyyəti edib namazı tamamlamaq və ya imamla birlikdə mütləq qürbət qəsdi ilə səcdəyə gedib, sonra ayağa qalxdığı zaman, təkbirətül-ehram və ya mütləq zikrdən daha ümumi olan bir qəsd ilə təkbiri yenidən deyərsə, namazını camaatla tamamlamaq və ya sonrakı rəkətə çatmaq üçün .namazı kəsmək arasında ixtiyar sahibidir

Məsələ ۱۴۱۰: Əgər bir şəxs namazın əvvəlində, ya Həmd və surə əsnasında iqtida etsə və təsadüfən rükuya getməzdən əvvəl imam rükudan baş qaldırsa, onun namazı .səhihdir

Məsələ ۱۴۱۱: İmam, namazın son təşəhhüdünü oxuyarkən, camaat namazının savabına çatmaq istəyən şəxs, gərək niyyət və təkbirətül-ehramdan sonra otursun və təşəhhüdü mütləq qürbət qəsdi ilə imamla oxusun, amma salamı ehtiyat-vacibə

qalxsın və təzədən niyyət və təkbir demədən Həmd və surəni oxusun və onu .namazının əvvəlinci rəkəti hesab etsin

Məsələ ۱۴۱۲: Məmum gərək imamdan qabaqda dayanmasın. Hətta ehtiyat-vacib budur ki, əgər məmum çox olsa, imamla bir sırada dayanmasınlar. Amma əgər .məmum bir nəfər kişi olsa, onun imamla bərabər dayanmasının eybi yoxdur

Məsələ ۱۴۱۳: Əgər imam kişi, məmum isə qadın olsa, onda qadınla imamın arasında və ya o qadınla imama bitişik olan digər bir kişi məmumun arasında pərdə və ya pərdəyə .bənzər bir şeyin olmasının eybi yoxdur

Məsələ ۱۴۱۴: Namaza başladıqdan sonra, imam və məmum arasında və ya məmumla, onun vasitəsi ilə imama bağlı olan başqa bir məmum arasında pərdə və ya başqa bir şey fasilə olarsa, camaat namazı batil olur və məmum fərdi vəzifəsinə görə əməl .etməlidir

Məsələ ۱۴۱۵: Ehtiyat-vacib budur ki, məmumun səcdə yeri ilə imamın durduğu yerin arasında ən iri bir addımdan artıq fasilə olmasın. Həmçinin, əgər insan qabağında duran məmum vasitəsilə imamla bağlansa da; ehtiyat-müstəhəb odur ki, məmumun dayandığı yer, yaxud onun qarşısında dayanan şəxsin yeri ilə, səcdə halında olan .insanın bədəninin ölçüsündən artıq olmasın

Məsələ ۱۴۱۶: Əgər məmum sağ və sol tərəfində duran şəxsin vasitəsilə imamla bağlansa və qabaqdan imama bağlı olmasa, ehtiyat-vacibə əsasən gərək sol və ya .sağ tərəfində iqtida etdiyi şəxslə iri bir addımdan artıq fasilə olmasın

Məsələ ۱۴۱۷: Əgər namazda imam ilə məmum arasında, yaxud imama bağlı olan məmum arasında bir addımdan artıq fasilə qalsa, o şəxs namazını fərdi qəsdi ilə .davam edə bilər

Məsələ ۱۴۱۸: Əgər birinci sırada dayananların hamısının namazı başa çatsa və dərhal başqa bir namaz üçün imama iqtida etməsələr, sonrakı sıranın camaat namazı batil .olur, hətta dərhal iqtida etsələr də, sonrakı sıranın camaat namazının düzlüyü işkallıdır

Məsələ ۱۴۱۹: Əgər şəxs ikinci rəkətdə iqtida etsə, Həmd və surəni oxumaq lazım deyildir, amma qunut və təşəhhüdü imamla

oxumalıdır. Ehtiyat-müstəhəb budur ki, təşəhhüd oxuyanda əl barmaqlarını və ayağın pəncəsini yerə qoyub dizlərini qaldırsın və gərək təşəhhüddən sonra imamla qalxıb, həmd-surəni oxusun. Əgər surəni oxumağa vaxtı yoxdursa, Həmdi tamam edib özünü rükuda imama çatdırsın. Əgər Həmdin hamısını deməyə vaxtı yoxdursa, Həmdi kəsib imamla birlikdə rükuya gedə bilər. Amma bu surətdə ehtiyat-müstəhəb budur ki, .namazı fürada niyyəti ilə tamamlasın

Məsələ ۱۴۲۰: Əgər imam dörd rəkətli namazın ikinci rəkətində olarkən bir şəxs ona iqtida etsə, namazın ikinci rəkətində (bu zaman imam üçüncü rəkətdə olur) iki səcdədən sonra oturmalı və təşəhhüdü vacib miqdarında deyib qalxmalıdır. Əgər şəxsin üç dəfə təsbihat deməyə vaxtı yoxdursa, gərək bir dəfə desin və rükuda özünü .imama çatdırsın

Məsələ ۱۴۲۱: Əgər imam üçüncü və ya dördüncü rəkətdə olsa və məmum, iqtida etdiyi təqdirdə, Həmdi oxuyub rükuda imama çata bilməyəcəyini bilərsə, ehtiyat-vacib .əsasən səbr etməli və imam rükuya gedəndən sonra iqtida etməlidir

Məsələ ۱۴۲۲: Əgər üçüncü ya dördüncü rəkətdə imam qiyam halında ikən iqtida etsə, gərək Həmd və surəni oxusun. Əgər surə üçün vaxt yoxdursa, gərək Həmdi tamam etsin və rükuda özünü imama çatdırsın. Əgər Həmdi də tamamlamağa vaxtı yoxdursa, onu kəsib imamla birlikdə rükuya gedə bilər. Amma ehtiyat-müstəhəb budur ki, bu .surətdə fürada qəsdi edərək, namazını tamamlasın

Məsələ ۱۴۲۳: Surə və ya qunutu tamamladığı təqdirdə, rükuda imama çata bilməyəcəyini bilən bir şəxs, qəsdən surə və ya qunutu oxusa və rükuda imama çata .bilməsə, onun camaat namazı batil olur və fürada vəzifəsinə uyğun əməl etməlidir

Məsələ ۱۴۲۴: Surəni oxumağa başladığı və ya tamamladığı halda rükuda imama çatacağına əmin olan bir şəxsin, çox çəkməyəcəyi təqdirdə surəyə başlaması və ya başlamışdırsa, tamamlaması daha yaxşıdır. Amma əgər «imama uyğunlaşır» deyilməyəcək qədər çox çəkərsə, başlamamalı və başlamışdırsa, tamamlamamalıdır. ,Əks halda onun camaat namazı batildir

amma əgər ۱۴۰۴-cü məsələdə deyildiyi kimi, öz fürada vəzifəsinə əməl etsə namazı .səhihdir

Məsələ ۱۴۲۵: Surəni oxuyub, imamın rükusuna çata biləcəyinə və imama tabeçiliyi aradan getməyəcəyinə yəqini olan şəxs surəni oxuyub rükuya yetişməzsə, onun .camaat namazı səhihdir

Məsələ ۱۴۲۶: İmam qiyamda ikən, məmum onun hansı rəkətdə olduğunu bilməsə, ona iqtida edə bilər. Amma ehtiyat-vacibə görə imamın sonradan birinci və ya ikinci rəkətdə olduğunu anlasa belə, qürbət (Allaha yaxınlıq) qəsdi ilə Həmd və surəni .oxumalıdır

Məsələ ۱۴۲۷: İmamın birinci və ya ikinci rəkətdə olduğu gumani ilə Həmd və surəni oxumazsa və rükudan sonra üçüncü və ya dördüncü rəkətdə olduğunu bilərsə, namazı səhihdir. Amma əgər rükudan qabaq bilərsə, Həmd və surəni oxumalı və əgər vaxt .yoxdursa, ۱۴۲۲-ci məsələdə deyilən göstərişə əsasən əməl etməlidir

Məsələ ۱۴۲۸: İmamın üçüncü və ya dördüncü rəkətdə olduğunu hesab edərək Həmd və surəni oxumasa, belə ki, rükudan qabaq və ya sonra, birinci və ya ikinci rəkətdə olduğunu bilərsə, namazı səhihdir. Əgər Həmd və surəni oxuduğu zaman bilərsə, .onları tamamlaması lazım deyildir

Məsələ ۱۴۲۹: Müstəhəb bir namazı qılarkən, camaat namazı bərqərar olarsa, namazı tamamladıqda camaat namazına çatacağına əmin deyildirsə, müstəhəbb namazı tərk edib, hətta camaat namazının birinci rəkətinə çatması üçün belə camaat namazına .məşğul olması müstəhəbbdir

Məsələ ۱۴۳۰: Əgər üç rəkətli, yaxud dörd rəkətli namazı qılan zaman camaat namazı bərqərar olsa, üçüncü rəkətin rükusuna getməyibsə və namazı tamam qılıb camaata çatacağına arxayın deyilsə, müstəhəbdir ki, müstəhəbbi namaz niyyəti ilə namazını iki .rəkətli qurtarsın və özünü camaat namazına çatdırsın

Məsələ ۱۴۳۱: Əgər imam namazı bitiribsə və məmum təşəhhüdə, yaxud birinci salama

Məsələ ۱۴۳۲: İmamdan bir rəkət geriyə qalan bir şəxs, imam son rəkətin təşəhhüdünü oxuyarkən, əllərinin barmaqlarını və ayaqlarının pəncəsini yerə qoyub, dizlərini qaldıraraq, imam namazın salamını verincəyə qədər səbr edib, sonra qalxması daha .yaxşıdır. Əgər bu halda fürada qılmaq niyyəti etmək istəyərsə, maneəsi yoxdur

## İMAM CAMAATIN ŞƏRTLƏRİ

Məsələ ۱۴۳۳: İmam camaat gərək baliğ, aqil, on iki imam şiəsi, adil, halalzadə və namazı düz qılan olsun. Əgər məmum kişidirsə, onun imamı da gərək kişi olsun. On yaşlı uşağa iqtida etməyin səhihliyi, yaxşı nəzər olsa da, işkalsız da deyil. Ədalət də budur ki vacibatı yerinə yetirib, haramları tərk etsin. Onun da nişanəsi, əgər insan .onun əksi barədə məlumatlı olmasa zahirdə yaxşı olmasıdır

Məsələ ۱۴۳۴: Adil bildiyi bir imamın indi də adil olub-olmadığında şəkk etsə, ona iqtida .edə bilər

Məsələ ۱۴۳۵: Ayaq üstə namaz qılan bir şəxs, oturan və ya uzanan halda namaz qılan şəxsə iqtida edə bilməz. Oturan halda namaz qılan bir şəxs də, uzanaraq namaz qılan .şəxsə iqtida edə bilməz

Məsələ ۱۴۳۶: Oturan halda namaz qılan şəxs, oturan halda namaz qılana iqtida edə bilər. Amma uzanan halda namaz qılanın iqtida etməsi mütləq şəkildə işkallıdır, istər .imam ayaq üstə olsun istər oturan halda istərsə də uzanan halda

Məsələ ۱۴۳۷: Əgər imam camaat bir üzrə görə nəcis libas ilə, yaxud təyəmmüm ilə və .ya cəbirə dəstəmazı ilə namaz qılsa, ona iqtida etmək olar

Məsələ ۱۴۳۸: Əgər imamın sidiyin və ğaitin xaric olmasının qarşısını ala bilməmək kimi xəstəliyi varsa, ona iqtida etmək olar. Həmçinin istihazəsi olmayan bir qadın da .istihazəli qadına iqtida edə bilər

Məsələ ۱۴۳۹: Cüzam və xora xəstəliyi olan bir şəxsin imam olmaması daha yaxşıdır. Ehtiyat-vacibə əsasən, üzərinə şəri hədd

.cəza qanunu) icra edilən və sonradan tövbə edən bir şəxsə də iqtida edilməməlidir)

## CAMAAT NAMAZININ HÖKMLƏRİ

Məsələ ۱۴۴۰: Məmum niyyət edərkən gərək imamını müəyyən etsin. Amma adını bilməsi lazım deyil; məsələn: “bu hazır olan imama iqdtida edirəm” deyərək niyyət .etsə, namazı səhihdir

Məsələ ۱۴۴۱: Məmum gərək Həmd və surədən başqa namazın bütün hissələrini özü oxusun. Amma əgər məmumun birinci, yaxud ikinci rəkəti, imamın isə üçüncü və ya .dördüncü rəkəti olsa, gərək Həmd və surəni oxusun

Məsələ ۱۴۴۲: Əgər məmum sübh, məğrib və işa namazının birinci və ikinci rəkətində imamın Həmd və surəsinin səsini eşitsə, kəlmələri ayırd edə bilməsə də, gərək Həmd və surəni oxumasın. Əgər imamın səsini eşitməsə, müstəhəbdir ki, Həmd və surəni .oxusun, amma gərək yavaşdan oxusun, əgər səhvən ucadan oxusa, eybi yoxdur

Məsələ ۱۴۴۳: Əgər məmum imamın Həmd və surəsinin bəzi kəlmələrini eşitsə, .eşitmədiyi hissəni oxuya bilər

Məsələ ۱۴۴۴: Məmum səhvən Həmd və surəni oxusa və ya eşitdiyi səsin imamın səsi olmadığını guman edərək Həmd və surə oxusa və sonradan eşitdiyi səsin imamın .olduğunu anlasa, namazı səhihdir

Məsələ ۱۴۴۵: İmamın səsini eşidib-eşitmədiyində və ya səsin imamın, yoxsa başqasının .səsi olub-olmadığında şəkk edən bir məmum Həmd və surəni oxuya bilər

Məsələ ۱۴۴۶: Məmum zöhr və əsr namazının birinci və ikinci rəkətində ehtiyata əsasən .gərək Həmd və surəni oxumasın və müstəhəbdir ki, onun yerinə zikr desin

Məsələ ۱۴۴۷: Məmum təkbirətül-ehramı imamdan qabaq deməməlidir. Hətta ehtiyat-.müstəhəb budur ki, imamın təkbiri tamam olmamış təkbir deməsin

Məsələ ۱۴۴۸: Əgər məmum səhvən imamdan qabaq salam versə, namazı səhihdir və yenidən imam ilə salam verməsi lazım deyil. Əgər qəsdən də imamdan qabaq salam .versə, eybi yoxdur

Məsələ ۱۴۴۹: Məmumun təkbirətül-ehramdan başqa, digər hissələri imamdan qabaq deməsinin eybi yoxdur. Amma onları eşidib, imamın nə vaxt dediyini bilərsə, ehtiyat-.müstəhəb budur ki, imamdan qabaq deməsin

Məsələ ۱۴۵۰: Məmum gərək namazda oxunan hissələrdən başqa sair əməlləri, məsələn; rüku və səcdələri imamla eyni vaxtda və ya imamdan bir az sonra yerinə yetirsin. Əgər qəsdən imamdan qabaq və ya bir müddət imamdan sonra yerinə yetirsə, belə ki, imama tabe olmaq sayılmasa onun camaat namazı batil olur, amma .(fürada vəzifəsinə əməl etsə, namazı səhihdir (۱۴۰۳-cü məsələdə qeyd olunduğu kimi

Məsələ ۱۴۵۱: Əgər məmum səhvən imamdan qabaq başını rükudan qaldırıb imamın hələ də rükuda olduğunu görərsə, ehtiyata əsasən rükuya qayıdıb, imamla bərabər qalxmalıdır. Bu zaman rükn olan rükunun artıq olması namazı batil etməz. Əgər qəsdən rükuya qayıtmasa, onun camaat namazı ehtiyata görə batil olur, amma (fürada) namazı ۱۴۰۳-cü məsələdə qeyd olunana əsasən səhihdir. Amma əgər rükuya .qayıtsa və rükuda imama çatmamış imam qalxsa, namazı ehtiyata əsasən batildir

Məsələ ۱۴۵۲: Əgər səhvən başını qaldırıb imamın hələ də səcdədə olduğunu görərsə, ehtiyata əsasən səcdəyə qayıtmalıdır. Əgər səcdələrin hər ikisində də bu hal baş .versə, rükn olan iki səcdənin artıq olmasına görə namaz batil olmaz

Məsələ ۱۴۵۳: Səhvən imamdan qabaq başını səcdədən qaldırmış olan bir şəxs, əgər səcdəyə qayıdarsa, belə ki, bu zaman imamın daha qabaq başını səcdədən qaldırmış olduğu məlum olarsa, namazı səhihdir. Amma əgər hər iki səcdədə də bu hal baş .verərsə, ehtiyata əsasən namazı batildir

Məsələ ۱۴۵۴: Səhvən rüku və ya səcdədən başını qaldırsa və səhvən yaxud imama yetişə bilməyəcəyi düşüncəsi ilə rüku və ya səcdəyə getməzsə, namazı və camaat

.namazı səhihdir

Məsələ ١۴۵۵: Əgər səcdədən başını qaldırıb, imamın səcdədə olduğunu görsə və imamın birinci səcdədə olduğunu hesab

edərək, imamla birlikdə səcdə etmək qəsdi ilə səcdəyə gedərsə və imamın ikinci səcdədə olduğunu anlayarsa, onun ikinci səcdəsi sayılır. Əgər imamın ikinci səcdədə olduğunu hesab edərək səcdəyə gedər və imamın birinci səcdəsi olduğunu anlayarsa, o səcdəni imamla birlikdə, səcdə etmək qəsdi ilə tamamlayıb ikinci dəfə imamla birlikdə səcdəyə getməlidir. Hər iki təqdirdə, namazı camaatla tamamlayıb yenidən .qılması daha yaxşıdır

Məsələ ۱۴۵۶: Əgər səhvən imamdan əvvəl rükuya getsə və başını qaldıracağı təqdirdə, imamın qiraətinin bir miqdarına çatarsa, əgər başını qaldırıb imamla bərabər rükuya getsə, namazı səhihdir və əgər qəsdən qayıtmasa camaat namazının səhih olması .işkallıdır, amma (fürada) namazı ۱۴۰۳-cü məsələdə deyilən tərzdə səhihdir

Məsələ ۱۴۵۷: Əgər məmum imamdan əvvəl səhvən rükuya getsə və başını qaldıranda imamın qiraətinin heç bir miqdarına yetişə bilməsə, gərək rükunun zikrini desin. Əgər zikr deməsi imama rükuda tabe olmamasına səbəb olarsa gərək rükudan qalxıb imamla birlikdə rüku etsin, bu halda onun camaatı və namazı səhihdir və əgər qəsdən qayıtmasa, onun camaat namazının səhih olması məhəlli işkaldır, amma (fürada) .namazı ۱۴۰۳-cü məsələdə deyilən tərzdə səhihdir

Məsələ ۱۴۵۸: Əgər səhvən imamdan əvvəl səcdəyə getsə, gərək səcdənin zikrini desin. Əgər zikrin deyilməsi səcdədə imama tabe olmağın tərk edilməsinə səbəb olsa, gərək səcdədən qalxıb imamla birlikdə səcdə etsin. Bu halda onun camaatı və namazı səhihdir və əgər qəsdən qayıtmasa, camaat namazı məhəlli işkaldır, amma onun .(fürada) namazı ۱۴۰۳-cü məsələdə deyilən tərzdə səhihdir

Məsələ ۱۴۵۹: Əgər imam qunut olmayan rəkətdə səhvən qunut oxusa, yaxud təşəhhüd olmayan rəkətdə səhvən təşəhhüd oxumağa məşğul olsa, məmum gərək qunut və təşəhhüdü deməsin, amma imamdan qabaq rükuya gedə bilməz və ya imamdan qabaq ayağa dura bilməz. İmamın qunut və ya təşəhhüdünün bitməsini gözləyib, .sonra namazın qalan qismini imamla qılmalıdır

## CAMAAT NAMAZINDA İMAM VƏ MƏMUMUN VƏZİFƏSİ

Məsələ ۱۴۶۰: Məmum bir kişi olarsa, imamın sağında dayanması müstəhəbdir. Əgər bir qadın da olsa, yenə imamın sağ tərəfində dayanması müstəhəbdir. Amma ondan geridə dayanmalıdır. Ən azı onun səcdə edəcəyi yer, imamın səcdə halında ikən dizlərinin müqabilinə gələcək qədər, imamdan geridə dayanmalıdır. Amma əgər bir kişi və bir qadın və ya bir kişi və bir neçə qadın olarsa, kişinin imamın sağında və bir qadın, yaxud bir neçə qadının da, imamın arxasında dayanması müstəhəbbdir. Əgər bir neçə kişi və bir və ya neçə qadın olarsa, kişilərin imamın arxasında və qadınların da kişilərin .arxasında durmaları müstəhəbdir

Məsələ ۱۴۶۱: Əgər imam və məmum hər ikisi qadın olsa, ehtiyat-vacib budur ki, hamısı .bir sırada dayansın və imam o birilərindən qabaqda dayanmasın

Məsələ ۱۴۶۲: Müstəhəbdir ki, imam sıranın ortasında dayansın və elm, kamal və təqva .əhli birinci sırada dayansın

Məsələ ۱۴۶۳: Camaat səflərinin nizam-intizamlı olması, hər səfdə duranların arasında .məsafə olmayıb, çiyinlərinin bir sırada olması müstəhəbdir

Məsələ ۱۴۶۴: Müstəhəbdir ki, "qəd-qamətis-salat" deyiləndən sonra, məmumlar ayağa .qalxsınlar

Məsələ ۱۴۶۵: Müstəhəbdir ki, imam, məmumların arasında halı başqalarına nisbətən zəif olanları nəzərə alsın. Qunut, rüku və səcdələri uzatmasın. Amma ona iqtida .edənlərin hamısının, buna meylli olduqlarını bildiyi hal isə istisnadır

Məsələ ۱۴۶۶: Müstəhəbdir ki, imam-camaat, Həmd-surədə və ucadan oxunmalı .zikrlərdə, səsini hamı eşidəcəyi qədər ucaltsın. Amma həddindən artıq ucaltmamalıdır

Məsələ ۱۴۶۷: Əgər imam rükuda olanda, təzə gələnlərin ona iqtida etmək istədiklərini başa düşsə, müstəhəbdir ki, rükunu

həmişəkindən ikiqat artırsın və sonra qalxsın. Hətta, daha başqa birinin də iqtida .(etməsini başa düşərsə (eyni qayda ilə

## CAMAAT NAMAZINDA MƏKRUH OLAN ŞEYLƏR

Məsələ ۱۴۶۸: Əgər camaat namazının cərgələrində yer olsa, insanın təklikdə .dayanması məkruhdur

.Məsələ ۱۴۶۹: Məkruhdur ki, məmum namazın zikrlərini, imamın eşidəcəyi tərzdə desin

Məsələ ۱۴۷۰: Zöhr, əsr və işa namazlarını iki rəkət qılan bir müsafirin, bu namazlarda müsafir olmayan imama iqtida etməsi məkruhdur. Müsafir olmayanın da, bu .namazlarda müsafirə iqtida etməsi məkruhdur

## AYƏT NAMAZI

.Məsələ ۱۴۷۱: Qaydası sonradan deyiləcək ayət namazı, üç şey vasitəsilə vacib olur

;Günəşin tutulması .۱

;Ayın tutulması, hətta onlar azacıq tutulsa və bir şəxs də qorxmasa .۲

;(Zəlzələ (ehtiyat-vacibə əsasən hətta bir şəxs qorxmasa da .۳

Amma göy gurultusu və ildırım, qara, qırmızı küləklər və s. kimi səma hadisələri baş versə və camaatın çoxu qorxsa, habelə yer batsa, dağlar uçmağa başlasa və bu, camaatın çoxunun qorxmasına səbəb olsa, ehtiyat-müstəhəbə əsasən, ayət namazı .tərk olunmamalıdır

Məsələ ۱۴۷۲: Əgər ayət namazını vacib edən şeylərdən bir neçəsi baş versə, insan gərək onların hər biri üçün bir ayət namazı qılsın. Məsələn; əgər günəş tutularsa və .zəlzələ olarsa, gərək iki ayət namazı qılınsın

Məsələ ۱۴۷۳: Bir şəxsin boynuna bir neçə ayət namazının qəzası vacib olarsa, istər onların hamısı eyni səbəbdən onun boynuna vacib olsun (məsələn; üç dəfə günəş

ayət namazını qılmamış olarsa) istər bir neçə səbəbdən boynuna vacib olmuş olsunlar (məslən; günəş tutulması, ay tutulması və zəlzələ olması səbəbindən onun boynuna vacib olmuş olarlarsa) bunları qəza edərkən, səbəblərdən hansı biri üçün ayət namazı .qıldığını müəyyən etməsi vacib deyildir

Məsələ ۱۴۷۴: Ayət namazı vacib olan şeylər harda baş versə və hiss olunsa, ancaq o .yerin camaatı gərək ayət namazı qılsın və başqa yerin camaatı üçün bu vacib deyil

Məsələ ۱۴۷۵: Ayət namazına başlama zamanı, günəşin və ayın tutulmağa başladığı andan başlayıb, onların təbii hala dönmə zamanlarına qədər davam edər. (Amma onların açılmağa başladıqları zamana qədər təxirə salınmaması yaxşıdır). Lakin ayət namazının tamamlanması, günəş və ayın açılmasından sonraya qədər təxirə salına .bilər

Məsələ ۱۴۷۶: Əgər ayət namazını günəş və ayın açılmağa başladığı zamana qədər təxirə salarsa, onu əda niyyəti ilə qılmağın eybi yoxdur. Amma əgər tamamilə .açılmalarından sonra ayət namazını qılarsa, onu qəza niyyəti ilə qılmalıdır

Məsələ ۱۴۷۷: Əgər Günəş və Ayın tutulması müddəti bir rəkət namaz qılmaq müddətində və ya az olsa, qıldığı namaz ədadır. Həmçinin onların tutulması çox olsa, (eyni qayda ilə). Amma insan namazı qılmasa və onun axırına bir rəkət namaz qılmaq .qədər vaxt qalsa da, ayət namazı vacib və əda qılınmalıdır

Məsələ ۱۴۷۸: Zəlzələ, göy gurultusu, şimşək çaxması və bu kimi hadisələr baş verdiyi zaman ehtiyat edərsə və əgər bunlar uzun müddət davam edəcəkdirsə, ayət namazını dərhal qılması lazım deyildir. Əks təqdirdə, zəlzələ kimi hallarda xalqın nəzərində təxirə salmaq sayılmayacaq şəkildə dərhal qılması gərəkdir. Əgər təxirə salarsa, .ehtiyat-müstəhəb budur ki, onu sonradan əda və ya qəza niyyəti etmədən qılsın

Məsələ ۱۴۷۹: Əgər Ay və ya Günəşin tutulduğunu bilməsə və onun açılmasından sonra, Günəş və ya Ayın bütünlüklə tutulmuş olduğunu bilərsə, ayət namazının qəzasını qılması lazımdır. Amma əgər onun bir miqdarının tutulmuş olduğunu anlayarsa, ayət

Məsələ ۱۴۸۰: Əgər bir dəstə adam, Ayın və ya Günəşin tutulduğunu söylədikləri halda, onların sözündən yəqinlik və ya xatircəmlik hasil etmədiyinə görə ayət namazını qılmasa, belə ki, sonradan doğru söyləmiş olduqlarını anlayarsa, Günəşin və ya Ayın tamam tutulmuş olduğu təqdirdə, ayət namazını qılmalıdır. Amma bir miqdarı tutulubmuşsa, ayət namazı qılmaq ona vacib deyildir. Günəş və Ayın tutulduğunu xəbər verən iki nəfərin adil olması məlum olmasa və sonradan onların adil olduqları .məlum olarsa, bu zaman şəxs ayət namazı qılmalıdır

Məsələ ۱۴۸۱: İnsan, elmi qaydalar yolu ilə Günəş və Ayın tutulma vaxtını bilən şəxslərin sözündən Günəş və ya Ayın tutulmasına xatircəm olarsa, ayət namazı qılmalıdır. Həmçinin əgər, «filan vaxt Günəş və ya Ay tutulacaq və bu, filan müddətə qədər çəkəcək» desələr və insan onların sözlərinə əmin olsa, gərək onların sözlərinə əsasən .əməl etsin

Məsələ ۱۴۸۲: Günəş və ya Ay tutulması üçün qıldığı ayət namazının batil olduğunu bilən .bir şəxs, onu yenidən qılmalıdır. Əgər vaxt keçmiş olarsa, qəza etməlidir

Məsələ ۱۴۸۳: Əgər gündəlik namaz vaxtında ayət namazı da insana vacib olsa, belə ki, hər iki namaz üçün vaxt varsa, hər hansını əvvəl qılsa, eybi yoxdur. Əks halda, hansının vaxtı dardırsa, əvvəl onu qılsın. Əgər hər ikisinin vaxtı dardırsa, gərək əvvəl .gündəlik namazını qılsın

Məsələ ۱۴۸۴: Gündəlik namazlardan birini qılarkən, ayət namazının vaxtının dar olduğunu bilərsə, bu halda gündəlik namazının da vaxtı dardırsa, onu tamamlayıb sonra ayət namazını qılmalıdır. Amma əgər gündəlik namazının vaxtı dar deyilsə, onu .pozub əvvəl ayət namazını, sonra da gündəlik namazını qılmalıdır

Məsələ ۱۴۸۵: Əgər ayət namazının əsnasında gündəlik namazın vaxtının dar olmasını başa düşərsə, gərək ayət namazını buraxıb, gündəlik namazını qılmağa məşğul olsun və namazı bitirəndən sonra namazı pozan bir iş görməzdən əvvəl, ayət namazının .qalanını tərk etdiyi yerdən qılsın

Məsələ ۱۴۸۶: Əgər qadın heyz və nifas halında olsa, Günəş və ya Ay tutulsa yaxud .zəlzələ baş verərsə, ona ayət namazı vacib deyil və qəzası da yoxdur

## AYƏT NAMAZININ QILINMA QAYDASI

Məsələ ۱۴۸۷: Ayət namazı iki rəkətdir və hər rəkətdə beş rüku vardır. Onun qaydası budur ki, insan niyyətdən sonra təkbir desin və bir Həmd və bir surəni tamam oxusun, rükuya getsin, rükudan qalxsın və təzədən bir Həmd və bir surə oxusun, sonra yenə rükuya getsin. Beləliklə, bunu beş dəfə təkrarlasın, beşinci rükudan qalxandan sonra iki səcdə etsin və qalxsın, ikinci rəkəti də birinci rəkətkimi yerinə yetirsin, təşəhhüd .oxusun və salam versin

Məsələ ۱۴۸۸: Ayət namazında mümkündür ki, insan niyyət, təkbir və Həmddən sonra, bir surənin ayələrini beş yerə bölsün və bir ayə, ya çox oxusun. Bir ayədən az da oxuya bilər, amma ehtiyata əsasən gərək cümlə tamam olsun və surənin əvvəlindən başlasın, bismillah deməklə kifayətlənməsin və sonra rükuya getsin və rükudan qalxsın. Həmd oxumadan həmin surədən ikinci hissəni oxusun və rükuya getsin. Bu qayda üzrə beşinci rükudan əvvəl surəni tamam etsin, məsələn; «Fələq» surəsində birinci «Bismillahir-rəhmanir-rəhim». «Qul əuzu birəbbil-fələq» desin və rükuya getsin, sonra qalxsın və desin: «Min şərri ma xələq» təzədən rükuya getsin və rükudan sonra qalxsın və desin: «Və min şərri ğasiqin iza vəqəb». Yenidən rükuya getsin və qalxıb desin: «Və min şərrin-nəffasati fil-uqəd». Rükuya gedib, yenə də qalxıb desin: «Və min şərri hasidin iza həsəd». Ondan sonra beşinci rükuya getsin və qalxandan sonra iki səcdə etsin və ikinci rəkəti də birinci rəkətkimi yerinə yetirsin. İkinci səcdədən sonra təşəhhüd oxusun və sonra namazın salamını versin. Həmçinin, beşdən az hissəyə bölməsi də caizdir. Lakin, nə vaxt surəni tamam etsə, sonrakı rükudan qabaq Həmdi .oxuması lazımdır

Məsələ ۱۴۸۹: Əgər ayət namazının bir rəkətində, beş dəfə Həmd-surə oxusa, o biri rəkətində isə Həmd oxuyub surəni beş yerə bölsə, eybi yoxdur.

Məsələ ۱۴۹۰: Gündəlik namazlarda vacib və ya müstəhəb olan şeylər ayət namazında da vacib və ya müstəhəbdir. Lakin ayət namazı camaatla qılınsa azan və iqamə əvəzinə qəbul olunma ümidi ilə üç dəfə «Əssalat» demək olar. Amma camaatla qılınmadıqda bu lazım deyil. Amma Günəş və Ay tutulması istisna olmaqla sair işlər üçün ayət namazının camaatla qılınmasının şəri sübut olunmayıb.

Məsələ ۱۴۹۱: Müstəhəbdir ki, rükudan qabaq və sonra təkbir desin. Beşinci və onuncu rükudan sonra təkbir müstəhəbb deyil, əksinə «Səmiəllahu limən həmidəh» demək müstəhəbdir.

Məsələ ۱۴۹۲: İkinci, dördüncü, altıncı, səkkizinci, onuncu rükudan qabaq qunut tutmaq müstəhəbdir. Əgər qunutu yalnız onuncu rükudan qabaq da oxusa, kifayətdir.

Məsələ ۱۴۹۳: Əgər ayət namazında neçə rəkət qıldığına şəkk etsə və fikrində də bir qənaətə yetişə bilməsə, namazı batildir.

Məsələ ۱۴۹۴: Əgər birinci rəkətin axırıncı rükusunda, yaxud ikinci rəkətin birinci rükusunda olmasında şəkk etsə və fikri də bir yerə çatmasa namaz batildir. Amma, misal üçün; dörd və ya beş rüku etməsində şəkk etsə, səcdəyə getmək üçün əyilməyibsə, şəkk etdiyi rükunu yerinə yetirməlidir. Amma səcdə üçün əyilmiş olsa, öz şəkkinə etina etməməlidir.

Məsələ ۱۴۹۵: Ayət namazının rükularının hər biri rükndür. Əgər qəsdən azaltsa və ya çoxaltsa, namaz batildir. Həmçinin əgər səhvən azaltsa və ehtiyata əsasən çoxaltsa namaz batildir.

## FİTR VƏ QURBAN BAYRAMLARININ NAMAZI

Məsələ ۱۴۹۶: Fitr və Qurban bayramı namazları İmamın (əleyhis-səlam) hazır olduğu (qeybdə olmadığı) vaxt vacibdir və gərək camaatla qılınsın. İmamın (əleyhis-səlam)

qaib olduğu (bizim zəmanəmizdə) isə müstəhəbdir. Onu camaatla da, fürada da qılmaq olar.

Məsələ ۱۴۹۷: Fitr və Qurban bayramlarının namazının vaxtı bayram günü Günəş çıxandan günortaya qədərdir.

Məsələ ۱۴۹۸: Qurban bayramı namazını Günəşin yüksəlməsindən sonra qılmaq müstəhəbdir. Fitr bayramında isə, Günəşin yüksəlməsindən sonra iftar edib, fitrəni verdikdən sonra bayram namazını qılmaq müstəhəbdir.

Məsələ ۱۴۹۹: Fitr və Qurban bayramı namazları iki rəkətdir. Belə ki, hər rəkətdə Həmd və surəni oxuduqdan sonra, üç dəfə təkbir demək lazımdır. Yaxşı olar ki, birinci rəkətdə beş təkbir deyilsin və hər iki təkbirin arasında bir qunut oxuyar və beşinci təkbirdən sonra başqa bir təkbir də deyib, rükuya gedər, iki səcdə etdikdən sonra təkrarən ayağa qalxar, ikinci rəkətdə isə dörd təkbir deyər və hər iki təkbirin arasında bir qunut oxuyar və dördüncü təkbirdən sonra, başqa bir təkbir də deyərək rükuya gedər, rükudan sonra iki səcdə edib təşəhhüdü oxuyar və namazın salamını verər.

Məsələ ۱۵۰۰: Fitr və Qurban bayramlarının namazının qunutunda hər hansı bir dua və zikri oxusa kifayətdir. Amma yaxşıdır ki, bu duanı oxusun:

أَللَّهُمَّ أَهلَ الْكِبْرِياءِ وَالْعَظَمهِ وَأَهْلَ الْجُودِ وَالْجَبَرُوتِ وَأَهْلَ الْعَفْوِ وَالرَّحْمهِ وَأَهْلَ التَّقْوى وَالْمَغْفِرهِ أَسْأَلُكَ بَحَقِّ هذَا الْيَوْمِ الَّذِى جَعَلتَهُ لِلْمُسْلِمِينَ عِيداً وَلِمُحَمَّدٍ صَلىَّ اللهُ عَلَيْهِ وَآلِهِ ذُخْراً وَشَرَفًا وَكَرَامَهً وَمَزِيداً أَنْ تُصَلِّىَ عَلى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ وَأَنْ تُدْخِلَنى فِى كُلِّ خَيْرٍ أَدْخَلْتَ فِيهِ مُحَمَّداً وَآلَ مُحَمَّدٍ وَأَنْ تُخْرِجَنِى مِنْ كُلِّ سُوءٍ أَخْرَجْتَ مِنهُ مُحَمَّداً وَآلَ مُحَمَّدٍ صَلَوَاتُكَ عَلَيْهِ وَ عَلَيْهِمْ أَللَّهُمَّ إِنِّى أَسْأَلُكَ خَيْرَ مَا سَأَلَكَ بِهِ عِبَادُكَ الصَّالِحُونَ وَأَعُوذُ بِكَ مِمَّا اسْتَعَاذَ مِنهُ عِبَادُكَ الْمُخْلَصُونَ.

Əllahummə əhləl-kibriya`i, vəl-əzəməti və əhləl-əfvi vər-rəhməti və əhlət-təqva vəl-məğfirəti əs`ələukə bihəqqi hazəl-yəvm, əlləzi cəəltəhu lil-musliminə iydən və liMuhəmmədin səlləllahu ələyhi və alihi zuxrən və şərəfən və kəramətən və məzida, ən tusəlliyə əla Muhəmmədin və ali Muhəmməd və ən tudxiləni fi kulli xəyrin ədxəltə fihi Muhəmmədən və alə

Muhəmməd, və ən tuxricəni min kulli su`in əxrəctə minhu Muhəmmədən və alə Muhəmməd, sələvatukə ələyhi və ələyhim. Əllahummə inni əs`ələukə xəyrə ma .səələkə bihi ibadukəssalihun və əuzu bikə mimməstəazə minhu ibadukəl-muxləsun

Məsələ ۱۵۰۱: İmam (ələyhis-salam) qayib olan zamanda, əgər Fitr və Qurban bayramlarının namazı camaatla qılınsa, ehtiyat-lazım budur ki, ondan sonra iki xütbə oxunsun. Yaxşı olar ki, Fitr bayramının xütbəsində fitrə zəkatının hökmləri, Qurban .bayramının xütbəsində isə qurbanlığın hökmləri şərh olunsun

Məsələ ۱۵۰۲: Bayram namazının xüsusi surəsi yoxdur. Amma yaxşı olar ki, onun birinci rəkətində «Şəms» (۹۱-ci surə) surəsini və ikinci rəkətində «Ğaşiyə» (۸۸-ci surə) surəsini oxusun və yaxud birinci rəkətdə «Səbbihismə» (۸۷-ci surə) surəsini və ikinci rəkətdə .«Şəms» (۹۱-ci surə) surəsini oxunsun

Məsələ ۱۵۰۳: Müstəhəbdir ki, bayram namazı səhrada qılınsın. Məkkədə isə .müstəhəbdir ki, Məscidül-Həramda qılınsın

Məsələ ۱۵۰۴: Müstəhəbdir ki, bayram namazına piyada, ayaqyalın və vüqar ilə getsinlər .və namazdan qabaq qüsl edib, başlarına ağ əmmamə qoysunlar

Məsələ ۱۵۰۵: Bayram namazında yerə (torpağa) səcdə etmələri, təkbir deyərkən əllərini qaldırmaları və bayram namazı qılan şəxsin, istər imam-camaat olsun, istər .fürada qılsın, həmd-surəni uca səslə oxuması müstəhəbdir

Məsələ ۱۵۰۶: Fitr bayramı axşamının məğrib və işa namazından, sübh namazından və .Fitr bayramının namazından sonra bu təkbirləri demək müstəhəbdir

أَللّهُ أَكْبَرُ أَللّهُ أَكبَرُ لاَ إِلَهَ الاَّ اللّهُ وَاللّهُ أَكْبَرُ أَللّهُ أَكبَرُ وَلِلّهِ الْحَمْدُ أَللّهُ أَكْبَرُ عَلَى مَا هَدَانَا

Əllahu əkbər, əllahu əkbər, la ilahə illəllah, vallahu əkbər, əllahu əkbər və lillahil-həmd, .əllahu əkbər, əla ma hədana

Məsələ ۱۵۰۷: Müstəhəbdir ki, insan Qurban bayramında, əvvəlincisi bayram gününün zöhr namazı və axrıncısı isə, ayın

ci günündə olan sübh namazından ibarət olan on namazdan sonra əvvəlki-۱۲ :məsələdə deyilən təkbirləri deyib sonra isə bunları desin

أَللهُ أَكْبَرُ عَلَى ماَ رَزَقَنَا مِنْ بَهِيمَهِ الْأَنْعَامِ وَالْحَمْدُ لِلَّهِ عَلَى مَاأَبْلَانَا

.Əllahu əkbər, əla ma rəzəqəna min bəhimətil ən`am vəlhəmdu lillahi əla ma əblana

Amma bir şəxs Qurban bayramında Minada olsa, müstəhəbdir ki, bu təkbirləri, əvvəli Qurban bayram gününün zöhr namazı və axırı isə Zil-həccənin on üçüncü gününün .sübh namazıdan ibarət olan ۱۵ namazdan sonra, desin

Məsələ ۱۵۰۸: Ehtiyat-müstəhəb budur ki, qadınların bayram namazına getməkdən .çəkinsinlər. Amma bu ehtiyat, qoca qadınlara aid deyil

Məsələ ۱۵۰۹: Bayram namazlarında məmum, gərək digər namazlar kimi, Həmd və .surədən başqa namazın bütün zikrlərini özü oxusun

Məsələ ۱۵۱۰: Əgər məmum, imam təkbirlərdən bir neçəsini dedikdən sonra özünü çatdırarsa, imam rükuya əyildikdən sonra, imamla birlikdə söyləmədiyi təkbir və qunutları özü deməlidir. Əgər hər qunutda bir «Subhanəllah», ya bir «Əlhəmdu lillah» desə kifayətdir. Əgər buna da fürsət olmasa, təkcə təkbirləri desin. Əgər buna da .fürsət olmasa, kifayətdir ki, imama qoşulub rükuya getsin

Məsələ ۱۵۱۱: Əgər bayram namazında bir şəxs namaza yetişərkən, imamın rükuda .olduğunu görərsə, niyyət edib, namazın birinci təkbirini deyərək rükuya gedə bilər

Məsələ ۱۵۱۲: Əgər bayram namazında bir səcdəni unudarsa, namazdan sonra onu yerinə yetirməsi lazımdır. Həmçinin, əgər gündəlik namazda səcdeyi-səhvi vacib edən .bir əməl qarşısına çıxarsa, iki səcdeyi-səhv etməsi lazımdır

## NAMAZ ÜÇÜN ƏCİR TUTMAQ

Məsələ ۱۵۱۳: İnsan öləndən sonra, onun sağlığında yerinə yetirmədiyi namaz və başqa ibadətlər üçün başqasını əcir tutmaq olar. Əgər bir kəs muzd almadan özü onları .yerinə yetirsə, səhihdir

Məsələ ۱۵۱۴: İnsan bəzi müstəhəbb işlər üçün məsələn; Həcc, Ümrə, Peyğəmbər və imamların (ələyhimus-səlam) qəbirlərini ziyarət etmək üçün diri adamlar tərəfindən əcir ola bilər. Habelə müstəhəbb iş görüb onun savabını dirilərə və ölülərə hədiyyə edə .bilər

Məsələ ۱۵۱۵: Meyyitin qəza namazları üçün əcir olunmuş şəxs, gərək müctəhid olsun və ya namazı təqlid edilməsi səhih olan müctəhidin fətvasına uyğun olaraq yerinə .yetirsin, yaxud ehtiyatın əsaslarını kamil bilərsə ehtiyata əməl etsin

Məsələ ۱۵۱۶: Əcir tutulan şəxs, gərək niyyət etdiyi vaxt, meyyiti müəyyən etsin. Meyyitin adını bilməsi lazım deyil. Əgər "məni əcir edən şəxs tərəfindən namaz qılıram" .deyə niyyət etsə, kifayətdir

Məsələ ۱۵۱۷: Əcir gərək meyyitin öhdəsində olanı, onun tərəfdən yerinə yetirməyini .niyyət etsin. Əgər bir əməli yerinə yetirib savabını meyyitə hədiyyə etsə, kifayət deyil

Məsələ ۱۵۱۸: Əməli yerinə yetirəcəyinə əmin olduqları və səhih yerinə yetirməsinə .ehtimal verdikləri bir şəxsi əcir tutmalıdırlar

Məsələ ۱۵۱۹: Meyyitin namazları üçün əcir tutmuş olduqları şəxsin onları yerinə .yetirmədiyini və ya batil yerinə yetirdiyini anlayarlarsa, gərək ikinci dəfə əcir tutsunlar

Məsələ ۱۵۲۰: Əgər əcrin əməlləri yerinə yetirib-yetirmədiyində şəkk edərsə, əcir əməlini yerinə yetirdiyini etiraf etsə belə, onun sözünə xatircəmliyi olmazsa, gərək yenidən əcir tutsunlar. Amma əgər onun əməlinin düzgün olub-olmadığında şəkk .edərsə, düzgün olduğunu qəbul edə bilər

Məsələ ۱۵۲۱: Üzrü olub, məsələn; təyəmmümlə və ya oturaq halda namaz qılan bir

olmuş olsa belə, ehtiyata əsasən mütləq şəkildə meyyitin namazlarını qəza etmək üçün əcir tutula bilməz. Amma cəbirə dəstəmaz və ya qüsl ilə namaz qılan şəxsin əcir .tutulmasının eybi yoxdur. Əli, ya ayağı kəsilmiş olan şəxsin əcir tutulması da belədir

Məsələ ۱۵۲۲: Qadın kişi üçün, kişi də qadın üçün əcir ola bilər. Namazı ucadan, yaxud .astadan qılmaqda isə, əcir olan şəxs öz vəzifəsinə əməl etməlidir

Məsələ ۱۵۲۳: Bir günün zöhr ilə əsr və məğrib ilə işa namazları kimi, tərtiblə qılınması lazım olan namazlardan başqa, meyyitin namazlarının tərtiblə qəza edilməsi lazım deyil. Amma əgər onu əcir etsələr ki, meyyitin mərcəsinin fətvasına uyğun, ya vəlisinin .dediyi kimi yerinə yetirsin, əgər o mərcə tərtibi lazım bilərsə, gərək tərtibə riayət etsin

Məsələ ۱۵۲۴: Əgər əcir olan ilə, əməli xüsusi bir şəkildə yerinə yetirməsini şərt etsələr, o şəkildə yerinə yetirməlidir. Amma əgər həmin şəkildə edilən əməlin batil olmasına yəqinləri olsa, bu istisnadır. Əgər şərt etməmişlərsə, o əməldə öz təklifinə görə əməl etməlidir. Amma özünün və ya meyyitin vəzifəsindən hansı biri ehtiyata daha uyğundursa, ona görə əməl etməsi ehtiyat-müstəhəbdir. Məsələn; meyyitin vəzifəsi təsbihati ərbəəni üç dəfə oxumaq olduğu halda, öz vəzifəsi yalnız bir dəfə oxumaq .olarsa, üç dəfə oxuyar

Məsələ ۱۵۲۵: Əgər əcir tutulan şəxs ilə müstəhəb əməllərin nə qədər yerinə yetirəcəyi barədə şərt etməsələr, onun müstəhəbbatını adi qaydada olduğu qədər yerinə .yetirməlidir

Məsələ ۱۵۲۶: Əgər insan bir neçə nəfəri meyyitin qəza namazı üçün əcir tutsa, ۱۵۲۳-cü məsələdə deyilənlərə əsasən onların hər biri üçün bir vaxt müəyyən etməsi lazım .deyil

Məsələ ۱۵۲۷: Əgər bir şəxs məsələn; bir il müddətində meyyitin namazlarını qılmağa əcir olsa və həmin müddət tamamlanmadan ölərsə, onun yerinə yetirmədiyi məlum olan namazlar üçün gərək başqasını əcir tutsunlar. Ehtiyat-vacib budur ki, yerinə .yetirmədiyinə ehtimal verdikləri üçün də əcir tutsunlar

Məsələ ۱۵۲۸: Bir meyyitin namazları üçün əcir tutulan şəxs onların hamısının zəhmət haqqını alsa və namazları qılıb qurtarmamış ölərsə, bütün namazları özü qılmasını şərt etmişdirlərsə, qılınmayan namazların qarşılığını ala bilərlər və ya icarəni pozub və məbləğin qalanını qaytara bilərlər. Əgər bütün namazları özü qılmasını şərt etməmişdirlərsə, vərəsələri gərək onun malından əcir tutsunlar. Amma əgər meyyitin .malı olmasa vərəsələrə bir şey vacib deyil

Məsələ ۱۵۲۹: Əgər əcir, meyyitin namazları qılıb qurtarmamış ölərsə, özünün də qəza namazı olsa, əvvəlki məsələdə deyilən göstərişə əməl etdikdən sonra, əgər meyyitin malı artıq olsa, belə ki, vəsiyyət etmiş olsa və vərəsələr icazə versə onun bütün namazları üçün əcir tutmaları gərəkdir. Əgər icazə verməsələr, onun üçdə birini .namazına sərf etməlidirlər

## ORUCUN HÖKMLƏRİ

### Point

Oruc, insanın Allah-təalaya bəndəçilik edib Onun əmrini yerinə yetirmək məqsədilə sübh azanından məğrib azanına qədər, sonradan izah olunacağı kimi, səkkiz şeydən .çəkinməsidir

### NİYYƏT

Məsələ ۱۵۳۰: İnsanın orucun niyyətini qəlbindən keçirməsi və ya məsələn; «sabah oruc tutacağam» deyərək niyyət etməsi şərt deyildir. Sadəcə olaraq Allah-təalaya bəndəçilik və Onun əmrinə itaət etmək üçün, sübh azanından məğrib azanına qədər orucu pozan şeylərdən özünü qoruma qərarında olması kifayətdir. Bu müddət ərzində oruc olduğuna yəqin etmək üçün, gərək sübh azanından bir az qabaq və məğrib .azanından bir az sonraya qədər orucu batil edən işlərdən özünü saxlasın

.Məsələ ۱۵۳۱: İnsan Ramazan ayının hər gecəsində sabahkı orucunu niyyət edə bilər

Məsələ ۱۵۳۲: Ramazan ayı orucunun ən son niyyət vaxtı, anlayan şəxs üçün, sübh azanı vaxtıdır. Yəni ehtiyat-vacibə görə hər nə qədər öz niyyətindən xəbərdar olmasa belə, sübh azanından qabaq batil edən işlərdən çəkinməklə yanaşı, oruca niyyət etmiş .olmalıdır

Məsələ ۱۵۳۳: Orucu batil edən işləri görməyən şəxs, məğrib azanına az bir vaxt qalmış .olsa belə, günün hər hansı vaxtında müstəhəbb bir oruc niyyət edərsə, orucu səhihdir

Məsələ ۱۵۳۴: Ramazan ayı orucunda və həmçinin müəyyən bir zamanı olan vacib orucda, sübh azanından qabaq oruc üçün niyyət etmədən yatan bir şəxs, əgər zöhrdən qabaq oyanıb niyyət

edərsə, orucu səhihdir. Amma zöhrdən sonra oyanarsa, ehtiyata əsasən «mütləq qürbət» niyyəti ilə günün qalanını orucu batil edən şeylərdən çəkinməli və o günün .orucunu da qəza etməlidir

Məsələ ۱۵۳۵: Qəza və ya kəffarə orucu tutmaq istəyən şəxs, onu niyyətində müəyyən etməlidir. Məsələn; «qəza orucu və ya kəffarə orucunu tuturam» deyə niyyət etməlidir. Amma Ramazan ayında «Ramazan ayının orucunu tuturam» deyə niyyət etməsi lazım deyildir. Hətta Ramazan ayı olduğunu bilməsə və ya unudub başqa bir oruc niyyəti edərsə, onun orucu Ramazan ayının orucundan hesab edilir. Nəzir və bu kimi .oruclarda nəzir qəsdi etmək lazım deyil

Məsələ ۱۵۳۶: Əgər Ramazan ayının olduğunu bilsə və qəsdən Ramazan ayından qeyri bir orucun niyyətini etsə, qəsd etdiyi oruc hesaba alınmır və həmçinin Ramazan ayının orucu kimi də sayılmır əgər o qəsd qürbət (yəni Allaha yaxınlaşmaq) qəsdi ilə zidd olsa; hətta ziddiyyətli olmasa belə, ehtiyata əsasən Ramazan ayının orucundan hesab .olunmur

Məsələ ۱۵۳۷: Əgər məsələn; ayın birinci gününün niyyəti ilə oruc tutsa, sonra ayın .ikinci, yaxud üçüncü günü olduğunu başa düşsə, orucu səhihdir

Məsələ ۱۵۳۸: Əgər sübh azanından əvvəl niyyət etsə və bihuş olsa və günün əsnasındaayılsa, ehtiyat-vacibə əsasən o günün orucunu tamam etməlidir və əgər .tamam etməsə, onun qəzasını yerinə yetirməlidir

Məsələ ۱۵۳۹: Əgər sübh azanından qabaq niyyət edib, sonra məst olarsa və həmin gün ərzində ayılarsa, vacib-ehtiyata əsasən o günün orucunu tamamlamalı və onun .qəzasını da yerinə yetirməlidir

Məsələ ۱۵۴۰: Əgər sübh azanından əvvəl niyyət edib yatsa və məğribdən sonra ayılsa, .orucu səhihdir

Məsələ ۱۵۴۱: Ramazan ayı olduğunu bilməsə və ya unudarsa, belə ki, zöhrdən qabaq Ramazan ayı olduğunu bilərsə, əgər orucu batil edən bir iş görmüşdürsə, orucu

batildir. Amma məğrib azanına qədər orucu batil edən işlərdən çəkinməli və Ramazandan sonra da, o günün orucunu qəza etməlidir. Ehtiyat-vacibə əsasən, əgər zöhrdən sonra da Ramazan olduğunu

anlayarsa, rəcaən oruc niyyəti etməli, Ramazandan sonra qəzasını etməlidir. Amma əgər zöhrdən əvvəl başa düşsə və orucu batil edən bir iş görməsə, gərək oruc niyyəti .etsin və orucu səhihdir

Məsələ ۱۵۴۲: Əgər uşaq Ramazan ayında sübh azanından əvvəl həddi-büluğa çatsa, gərək oruc tutsun. Əgər azandan sonra həddi-büluğa çatsa, o günün orucu ona vacib deyil. Amma əgər müstəhəbb oruc tutmaq qəsdi etsə, ehtiyat-müstəhəbə əsasən bu .təqdirdə o günün orucunu tamamlaması lazımdır

Məsələ ۱۵۴۳: Meyyitin orucunu tutmaq üçün əcir olan və ya boynunda kəffarə orucu olan bir şəxs, müstəhəbb bir oruc tutarsa, eybi yoxdur. Amma boynunda Ramazan ayının qəza orucu olan bir şəxs, müstəhəbb oruc tuta bilməz. Əgər unudaraq müstəhəbb bir oruc niyyəti edərsə və zöhrdən qabaq xatırlayarsa, müstəhəbb orucu pozular, lakin niyyətini qəza orucuna çevirə bilər. Amma əgər zöhrdən sonra anlayarsa, ehtiyata əsasən orucu batildir. Əgər məğrib azanından sonra xatırlayarsa, .orucu səhihdir

Məsələ ۱۵۴۴: Əgər Ramazan ayının orucundan başqa, vaxtı müəyyən olan bir oruc insana vacib olsa, məsələn, müəyyən bir günü oruc tutmasına dair nəzr etmiş olsa, əgər sübh azanına kimi qəsdən niyyət etməsə, orucu batildir. Əgər o günün orucunun ona vacib olmasını bilməsə, ya unutsa və zöhrdən əvvəl yadına düşsə, orucu batil edən bir iş görməmiş olsa və niyyət etsə, onun orucu səhihdir. Əgər zöhrdən sonra .yadına düşsə, Ramazan ayının orucunda deyilən ehtiyata riayət etməlidir

Məsələ ۱۵۴۵: Əgər vacib olan, lakin günü müəyyən olmayan oruc üçün, məsələn; kəffarə orucu kimi, qəsdən zöhr yaxınlaşana qədər niyyət etməsə, eybi yoxdur. Hətta əgər niyyətdən əvvəl oruc tutmamaq qərarına gəlsə, yaxud oruc tutub-tutmamaq barədə müəyyən qərara gəlməsə (tərəddüd etsə), belə ki, orucu batil edən işlərdən .görməmişsə və zöhrdən əvvəl niyyət etsə, orucu səhihdir

Məsələ ۱۵۴۶: Əgər kafir Ramazan ayında, zöhrdən əvvəl müsəlman olsa və sübh azanından o vaxta kimi, orucu batil edən bir iş eyməyibsə, ehtiyat-vacibə əsasən

.niyyəti ilə orucu tamam etsin. Əgər belə etməsə, gərək onun qəzasını yerinə yetirsin

Məsələ ۱۵۴۷: Əgər xəstə olan bir şəxs, Ramazan ayı günündə zöhrdən qabaq sağalsa və o vaxta qədər orucu batil edən bir şey etməmiş olarsa, ehtiyat-vacibə əsasən oruc üçün niyyət edib o günün orucunu tutmalıdır. Amma əgər zöhrdən sonra sağalarsa, o .günün orucu (həmin gün) ona vacib deyildir, gərək sonradan qəza etsin

Məsələ ۱۵۴۸: İnsanın, Şəbanın son günü və ya Ramazanın əvvəl günü olduğunda şəkk etdiyi gün oruc tutması vacib deyil. Əgər oruc tutmaq istəsə, Ramazan ayı orucunun niyyətini edə bilməz. Amma əgər «Ramazan ayı olduğu təqdirdə, Ramazandan və Ramazan ayı olmadığı təqdirdə, qəza və bunun kimilərdən sayılsın» deyə niyyət edərsə, orucunun səhih olması uzaq nəzər deyil, amma qəza və bu kimi oruc niyyəti etməsi daha yaxşıdır. Əgər sonradan Ramazan ayı olduğu məlum olarsa, Ramazandan hesab olunur. Əgər mütləq oruc niyyəti edərsə və sonradan Ramazan .ayı olduğu məlum olarsa, yenə də kifayətdir

Məsələ ۱۵۴۹: Şəbanın axırı, yaxud Ramazanın əvvəli olmasında şəkk etdiyi halda qəza, müstəhəb və bu kimi sair oruc tutub, gün əsnasında Ramazan olduğunu başa düşsə, .gərək Ramazan ayının orucunu niyyət etsin

Məsələ ۱۵۵۰: Əgər vaxtı müəyyən olan vacib bir orucda (Ramazan ayının orucu kimi) «orucumu batil edim, yoxsa etməyim» deyə tərəddüddə olsa və müəyyən qərara gələ bilməsə, yaxud orucunu batil etməsinə dair qəsd etsə, əgər yenidən oruc qəsdi etməsə orucu batildir. Əgər yenidən oruc niyyəti etsə ehtiyat-vacib budur ki, o günün .orucunu tamamlayıb sonradan da qəzasını tutsun

Məsələ ۱۵۵۱: Müstəhəb olan və ya kəffarə orucu kimi vaxtı müəyyən olmayan vacib bir orucda, əgər orucu batil edən bir iş görməyi qəsd edərsə və ya belə bir işi görüb-görməmək xüsusunda tərəddüdə düşərsə, əgər həmin işi görməsə və vacib orucda zöhrdən əvvələ qədər və müstəhəbb orucda, məğrib azanından əvvələ qədər .təkrarən oruc üçün niyyət edərsə, orucu səhihdir

## ORUCU BATİL EDƏN ŞEYLƏR

### Point

:Məsələ ۱۵۵۲: Səkkiz şey orucu batil edir

.Yemək və içmək .۱

.Cima .۲

İstimna. İstimna, yəni özü ilə məninin xaric olmasına səbəb olan bir iş görsə və ya .۳ başqası ilə cimadan geyri bir iş etməklə məni xaric etməsinə deyilir. Onun qadında .gerçəkləşməsi isə ۳۴۵-ci məsələdə qeyd olundu

Ehtiyat-vacibə əsasən Allaha, Peyğəmbərə (səlləllahu ələyhi və alihi və səlləm) və .۴ Peyğəmbərin canişinlərinə (ələyhimus-salam) yalan isnad vermək (onların adından .(yalandan bir söz demək

.Ehtiyat-vacibə görə tozu boğaza yetişdirmək .۵

.Sübh azanına kimi cənabət, heyz və nifas halında qalmaq .۶

.Axıcı şeylərlə imalə etmək .۷

.Qəsdən qusmaq .۸

.Bunların hökmləri aşağıdakı məsələlərdə şərh olunacaqdır

### YEMƏK VƏ İÇMƏK .۱

Məsələ ۱۵۵۳: Əgər oruc tutan şəxs oruc tutduğunu bilə-bilə qəsdən bir şey yesə və ya içsə orucu batil olur, istər çörək və su kimi yeyilməsi adət olan şeylərdən olsun, istərsə də torpaq və ağac şirəsi kimi yeyilməsi adət olmayan şeylərdən olsun; istər az olsun, istərsə də çox, hətta əgər diş fırçasını ağızdan çıxarıb yenə ağızına daxil etsə və onun rütubətini udsa, oruc batil olur. Amma əgər fırçanın rütubəti «xarici rütubətdir» .deyilməyəcək şəkildə ağızın suyunda aradan gedərsə, onu udmağın eybi yoxdur

Məsələ ۱۵۵۴: Yeməyə məşğul olarkən, sübh olduğunu bilsə, gərək ağzından tikəni çıxartsın, əgər qəsdən udsa, orucu batildir və sonradan deyiləcək göstərişə görə ona .kəffarə də vacib olur

.Məsələ ۱۵۵۵: Əgər oruc tutan kəs bir şeyi səhvən yesə, ya içsə, orucu batil olmaz

Məsələ ۱۵۵۶: İynə və sistem orucu batil etmir, hərçənd iynə bədəni gücləndirmək üçün, yaxud sistem qəndli-duzlu olsa belə. Həmçinin təngənəfəslik üçün istifadə olunan isperi də eynilə; əgər dərmanı təkcə ağ ciyərə daxil etsə, orucu batil etməz. Eləcə də gözə və ya qulağa dərman tökülməsi də orucu batil etməz, hətta onun dadı boğaza .çatsa belə. Əgər dərmanı buruna töksələr və o, boğaza çatmasa orucu batil etmir

Məsələ ۱۵۵۷: Əgər oruc tutan dişinin arasında qalan bir şeyi qəsdən udsa, orucu batil .olar

Məsələ ۱۵۵۸: Oruc tutmaq istəyən şəxsə azandan əvvəl dişlərini təmizləmək lazım deyildir. Amma əgər dişlərinin arasında qalan yemək qırıntısının, gündüz boğazına .gedəcəyini bilirsə, gərək təmizləsin

Məsələ ۱۵۵۹: Ağız suyunu udmaq, (hətta əgər turş və digər şeyləri xəyala gətirməklə .ağıza yığılsa da), orucu batil etmir

Məsələ ۱۵۶۰: Sinə və başdan gələn ağız boşluğuna çatmamış bəlğəmi udmağın eybi .yoxdur. Amma ehtiyat-müstəhəb budur ki, ağız boşluğuna daxil olsa, onu udmasınlar

Məsələ ۱۵۶۱: Əgər oruc tutan şəxs susdayarsa və su içmədiyi təqdirdə, öləcəyindən və ya ona bir zərər dəyəcəyindən, ya da dözülməyən bir çətinliyə düşəcəyindən qorxarsa, bu işlərin qorxusunu aradan aparacaq qədər su içə bilər. Hətta ölüm və sair kimi qorxu olan yerlərdə içməsi vacibdir. Amma bu halda onun orucu batil olur. Əgər Ramazan ayıdırsa, ehtiyat-lazıma əsasən gərək ondan artıq içməsin və günün .qalanında orucu batil edən işlərdən çəkinsin

Məsələ ۱۵۶۲: Adətən yeməyin boğaza yetişməsinə səbəb olmayan uşaq və quş üçün yeyintini çeynəmək və ya yeməyin dadına baxmaq (təsadüfən boğaza yetişsə belə) orucu batil etməz. Amma əgər insan, əvvəlcədən yeməyin boğaza çatacağını bilirsə, .orucu batil olur və qəzasının tutması, həmçinin kəffarə də verməsi ona vacibdir

Məsələ ۱۵۶۳: İnsan zəifliyi üzündən orucunu yeyə bilməz. Amma əgər onun zəifliyi .adətən dözülməsi mümkün olmayacaq dərəcədədirsə, orucu yeməsinin eybi yoxdur

## CİMA .۲

Məsələ ۱۵۶۴: Cima orucu batil edir; hətta əgər təkcə sünnət yeri miqdarında daxil olsa .və məni gəlməsə belə

Məsələ ۱۵۶۵: Əgər sünnət yerindən az miqdarı daxil olsa və məni gəlməsə, oruc batil olmaz. Amma sünnət yeri olmayan şəxsdə sünnət yerindən az miqdarı daxil olsa belə, .orucu batil olur

Məsələ ۱۵۶۶: Əgər qəsdən cima etmək istəsə və sünnət yeri qədər daxil olub-olmadığında şəkk edərsə, bunun hökmü ۱۵۵۰-ci məsələyə müraciət etməklə aydın .olar. Əgər batil edən bir iş etməyibsə ona kəffarə vacib deyil

Məsələ ۱۵۶۷: Əgər şəxs oruc olduğunu unudub yaxınlıq etsə, yaxud onu cima etməyə məcbur etsələr, belə ki, bu iş onun ixtiyarından kənar olsa, onun orucu batil olmaz. Amma əgər cima halında yadına düşsə, yaxud məcburiyyət onun üzərindən .götürülərsə, gərək dərhal cima halından çıxsın, əgər çıxmasa, onun orucu batildir

## İSTİMNA .۳

Məsələ ۱۵۶۸: Əgər oruc tutan istimna etsə (istimnanın mənası ۱۵۵۲-cü məsələdə .deyilmişdir) orucu batil olar

.Məsələ ۱۵۶۹: Əgər insandan ixtiyarsız məni xaric olsa, orucu batil deyildir

Məsələ ۱۵۷۰: Oruc tutan şəxs, gündüz yatacağı təqdirdə, mühtəlim olacağını (yəni yuxuda ondan məni gələcəyini) bilirsə, yatmamaqla əziyyətə düşməsə belə, yatması .caizdir. Əgər yataraq mühtəlim olarsa, orucu batil olmaz

Məsələ ۱۵۷۱: Əgər oruc tutan, məni xaric olarkən yuxudan ayılsa, məninin xaric .olmasının qarşısını alması vacib deyildir

Məsələ ۱۵۷۲: Oruc tutub mühtəlim olan şəxs bövl etmək vasitəsilə məninin qalanının .məcradan xaric olacağını bilirsə belə, bövl edə bilər

Məsələ ۱۵۷۳: Oruc tutan şəxs möhtəlim olsa və məninin kanalda qaldığını bilib, qüsldən qabaq bövl etmədiyi təqdirdə qüsldən sonra məni gələcəksə, ehtiyat-müstəhəbə .əsasən, gərək qüsldən əvvəl bövl etsin

Məsələ ۱۵۷۴: Məni xaricə çıxarmaq məqsədi ilə zarafat edən, yaxud özü ilə oynayan şəxsdən məni gəlməsə, yenidən oruc niyyəti etməsə orucu batildir. Əgər oruc niyyəti .etsə, ehtiyat-lazıma əsasən o orucu tamamlayıb sonra qəzasını da tutmalıdır

Məsələ ۱۵۷۵: Əgər oruc tutan bir şəxs, məni çıxarmaq məqsədi olmadan, məsələn; öz qadını ilə mazaqlaşarsa, ya zarafatlaşsa, özündən məni gəlməyəcəyindən əmindirsə, təsadüfən ondan məni gəlsə belə, orucu səhihdir. Amma əgər məninin .gəlməyəcəyindən əmin deyilsə, məni gəldiyi təqdirdə orucu batil olur

### ALLAH VƏ PEYĞƏMBƏRƏ (s) YALAN İSNAD VERMƏK . ۴

Məsələ ۱۵۷۶: Oruc tutan şəxs danışmaq, yazmaq, işarə etmək və buna bənzər hər hansı bir yolla Allaha, Peyğəmbərə (səlləllahu ələyhi və alihi və səlləm) və on iki imamlardan (ələyhimus-salam) birinə qəsdən yalan olan bir şeyi nisbət verərsə, hətta sonra dərhal «yalan dedim» deyərək tövbə etsə belə, ehtiyat-lazıma əsasən orucu batil olur. Həmçinin həzrət Zəhraya (səlamullahi ələyha), digər peyğəmbərlərə və onların vəsilərinə də yalan bir şeyi nisbət vermək, ehtiyat-müstəhəbə əsasən eyni hökmü .daşıyır

Məsələ ۱۵۷۷: Əgər bir şəxs doğru və ya yalan olduğunu bilmədiyi və hüccət olmasına dəlili olmayan bir rəvayəti nəql etmək istəsə, ehtiyat-vacibə əsasən gərək o rəvayəti birbaşa Peyğəmbərə (səlləllahu əleyhi və alihi və səlləm) və imamlara (əleyhimus-salam) nisbət verməsin.

Məsələ ۱۵۷۸: Əgər bir şeyin düzlüyünə etiqad bəsləyərək Allahın və ya Peyğəmbərin (səlləllahu əleyhi və alihi və səlləm) adından nəql etsə, sonra isə yalan olduğunu başa düşsə, orucu batil olmaz.

Məsələ ۱۵۷۹: Əgər bir şeyin yalan olduğunu bilərək, onu Allaha və Peyğəmbərə nisbət versə və sonra dediyinin düzgün olduğunu başa düşsə, bu halda əgər bu işin orucu batil etdiyinə bilirmişsə ehtiyat-lazıma əsasən gərək orucu tamam etsin və qəzasını da əmələ gətirsin.

Məsələ ۱۵۸۰: Əgər başqasının uydurduğu yalanı qəsdən Allaha, Peyğəmbərə (səlləllahu əleyhi və alihi və səlləm) və Peyğəmbərin canişinlərinə (əleyhimus-salam) nisbət versə, ehtiyat-lazıma əsasən orucu batil olur. Amma əgər o yalanı uyduran şəxsin dilindən nəql edərsə, eybi yoxdur.

Məsələ ۱۵۸۱: Əgər oruc tutandan «Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) belə bir söz buyurmuşdurmu» deyə soruşsalar «yox» əvəzinə qəsdən «bəli» desə, yaxud «bəli» əvəzinə qəsdən «yox» desə, ehtiyat-lazıma əsasən orucu batil olur.

Məsələ ۱۵۸۲: Əgər Allahın və Peyğəmbərin (səlləllahu əleyhi və alihi və səlləm) adından düz sözü desə də, sonra «yalan demişəm» desə, ya gecə onlara bir yalanı isnad verib sabahkı gün oruc olub desə ki, «dünən gecə dediyim söz düzdür» ehtiyata əsasən, orucu batil olur. Amma əgər məqsədi verdiyi xəbərin təfsilatını bəyan etmək olsa orucu batil olmur.

## TOZU BOĞAZA ÇATDIRMAQ .۵

Məsələ ۱۵۸۳: Ehtiyat-vacibə əsasən, qatı tozu boğaza çatdırmaq orucu batil edir. İstər un kimi yeyilməsi halal olan bir şeyin tozu olsun, istərsə də torpaq kimi yeyilməsi .haram olan şeyin tozu olsun

.Məsələ ۱۵۸۴: Qatı olmayan tozu boğaza çatdırmaq orucu batil etmir

Məsələ ۱۵۸۵: Əgər külək vasitəsilə qatı toz əmələ gəlsə, insan bundan bildiyi və bacardığı halda qorunmasa və həmin toz boğaza yetişsə, ehtiyat-vacibə əsasən orucu .batil olar

Məsələ ۱۵۸۶: Ehtiyat-vacib budur ki, oruc tutan, siqaret, tənbəki tüstüsünü və bu kimi .şeyləri boğaza çatdırmasın

Məsələ ۱۵۸۷: Əgər diqqətsizlik səbəbindən toz, tüstü və bu kimi şeylər oruc tutanın boğazına yetişərsə, boğazına yetişməyəcəyinə yəqin və ya xatircəmliyi olmuşdursa, orucu səhihdir. Amma əgər boğazına yetişməyəcəyini guman etmişdirsə, o günün .orucunu qəza etməsi daha yaxşıdır

Məsələ ۱۵۸۸: Əgər oruc olduğunu unudub, diqqətsizlik edərsə və ya özündən asılı .olmayaraq toz və bu kimi şeylər onun boğazına çatarsa, orucu batil olmaz

Məsələ ۱۵۸۹: Başın hər yerini bütünlüklə suya salmaq orucu batil etmir, lakin şiddətli .kərahəti var

## SÜBH AZANINA QƏDƏR CƏNABƏT, HEYZ VƏ NİFAS HALINDA QALMAQ .۶

Məsələ ۱۵۹۰: Əgər cünub olan şəxs, Ramazan ayında qəsdən sübh azanına qədər qüsl etməsə və ya vəzifəsi təyəmmüm olan halda qəsdən təyəmmüm etməzsə, gərək o günün orucunu tamamlasın, başqa bir günü də oruc tutsun. Həmin günün də qəza, yaxud üqubət (cəza) orucu olması məlum olmadığından həm o günün orucunu Ramazan ayından, həm də o günün yerinə

.tutacaq orucu mafizzimmə qəsdi ilə tutmalı, qəza niyyəti də etməməlidir

Məsələ ۱۵۹۱: Ramazan ayının orucunun qəzasını tutmaq istəyən bir kəs sübh azanına qədər qəsdən cünub halda qalsa o günü oruc tuta bilməz. Əgər qəsdən olmasa, o gün .oruc tuta bilər, baxmayaraq ki, ehtiyat onu tərk etməkdədir

Məsələ ۱۵۹۲: Ramazan ayı orucu və onun qəzasından başqa, digər vacib və müstəhəb orucda, cünub insan qəsdən sübh azanına qədər cənabətli qalsa, o günü oruc tuta .bilər

Məsələ ۱۵۹۳: Ramazan ayı gecəsində cünub olan bir şəxs, əgər qəsdən vaxt .daralıncaya qədər qüsl etməzsə, gərək təyəmmüm edib oruc tutsun və orucu səhihdir

Məsələ ۱۵۹۴: Əgər cünub Ramazan ayında qüslünü unutsa və bir gündən sonra yadına düşsə, gərək o günün orucunun qəzasını tutsun. Əgər bir neçə gündən sonra yadına düşsə, cünub olduğunu yəqin bildiyi bütün günlər üçün qəza etsin, məsələn; əgər üç, .ya dörd gün cünub olmasını bilməsə, gərək üç günün orucunu qəza etsin

Məsələ ۱۵۹۵: Ramazan ayı gecəsində qüsl və təyəmmümdən heç biri üçün vaxtı .olmayan şəxs, özünü cünub edərsə, orucu batildir, qəza və kəffarə də ona vacibdir

Məsələ ۱۵۹۶: Əgər qüsl üçün vaxt olmadığını bilsə və özünü cünub etsə, yaxud vaxt ola-ola qəsdən vaxt daralıncaya qədər qüslü təxirə salsa, günahkar olmasına .baxmayaraq təyəmmüm etsə, orucu səhihdir

Məsələ ۱۵۹۷: Ramazan ayı gecəsində cünub olan şəxs, yatdığı təqdirdə, sübhə qədər oyana bilməyəcəyini bilərsə, ehtiyat-vacibə görə qüsl etmədən yatmamalıdır. Əgər qüsl etməzdən qabaq ixtiyari olaraq yatsa və sübhə qədər oyanmasa, o günün .orucunu tamamlamalıdır, qəza və kəffarə də ona vacib olur

Məsələ ۱۵۹۸: Cünub olan bir şəxs, Ramazan ayı gecəsində yatıb sonra oyanarsa, əgər yenidən yatdığı təqdirdə, sübh azanından qabaq oyanacağına ehtimal versə, yata .bilər

Məsələ ١٥٩٩: Ramazan ayı gecəsində cünub olan bir şəxs, yatdığı təqdirdə, sübh ,azanından qabaq oyanacağına yəqini olsa

yaxud əmin olarsa, əgər oyandıqdan sonra qüsl etmə qərarında olub, bu qərarla .yatarsa və sübhə qədər yuxudan ayılmazsa, orucu səhihdir

Məsələ ۱۶۰۰: Ramazan ayı gecəsində cünub olan və yatacağı təqdirdə sübh azanından qabaq oyanacağına əmin olmayan şəxs oyandıqdan sonra qüsl etməli olduğundan qəflətdə olarsa, əgər yatarsa və sübh azanına qədər oyanmazsa, ehtiyata əsasən o .orucun qəzası ona vacib olur

Məsələ ۱۶۰۱: Ramazan ayı gecəsində cünub olan və yatarsa, sübh azanından qabaq oyanacağına əmin olan və ya ehtimal verən bir şəxs, oyanacağından sonra qüsl etmək istəməzsə, əgər yatarsa və sonra oyanmazsa, o günün orucunu tamamlamalıdır, qəza etməsi və kəffarə də verməsi lazımdır. Oyanacağından sonra qüsl edib-etməmək .barəsində tərəddüdü olduğu təqdirdə də ehtiyat-lazım əsasən eyni hökmü daşıyır

Məsələ ۱۶۰۲: Cünub olan bir şəxs, Ramazan ayı gecəsində (bir dəfə) yatıb-oyandıqdan sonra ikinci dəfə yatacağı təqdirdə, sübh azanından qabaq oyanacağına əmin olarsa və ya ehtimal verərsə, habelə, oyandıqdan sonra qüsl etmək qərarında olarsa, belə ki, yenidən yatsa və sübh azanına qədər oyanmasa, o günün orucunu qəza etməlidir. Əgər ikinci yuxudan oyandıqdan sonra üçüncü dəfə yatıb, sübh azanına qədər oyanmazsa, o günün orucunu qəza etməlidir və ehtiyat-müstəhəb budur ki, kəffarə .də versin

Məsələ ۱۶۰۳: İnsanın möhtəlim olması baş verən yuxu, birinci yuxu hesab olunur. Buna əsasən, əgər oyandıqdan sonra yenidən yatsa və sübh azanına qədər oyanmasa, .əvvəlki məsələdə deyildiyi kimi, gərək o günün orucunu qəza etsin

.Məsələ ۱۶۰۴: Əgər oruc tutan gündüz möhtəlim olsa, dərhal qüsl etməsi vacib deyil

Məsələ ۱۶۰۵: Ramazan ayında, sübh azanından sonra oyanıb möhtəlim olduğunu .görərsə, azandan qabaq möhtəlim olduğunu anlasa belə, orucu səhihdir

Məsələ ۱۶۰۶: Ramazan ayının orucunun qəzasını tutmaq istəyən bir şəxs, əgər sübh azanından sonra oyanıb, möhtəlim olduğunu görərsə və sübh azanından qabaq

.anlayarsa, o günü Ramazan ayı orucunun qəzası niyyəti ilə oruc tuta bilər

Məsələ ۱۶۰۷: Əgər qadın sübh azanından əvvəl heyz, yaxud nifasdan pak olsa və qəsdən qüsl etməsə və ya vəzifəsi təyəmmüm olduğu halda təyəmmüm etməsə, gərək o günün orucunu tamamlasın, qəzasını da tutsun. Ramazan ayının qəzasında da .qəsdən qüsl və ya təyəmmüm etməsə, ehtiyat-vacibə görə o günü oruc tuta bilməz

Məsələ ۱۶۰۸: Ramazan ayı gecəsində heyz və ya nifasdan pak olsa, vaxt daralıncaya .qədər qəsdən qüsl etməsə, gərək təyəmmüm etsin, (bu halda) o günün orucu səhihdir

Məsələ ۱۶۰۹: Əgər qadın, sübh azanından əvvəl Ramazan ayında heyz, yaxud nifasdan pak olsa və qüsl etməyə vaxtı olmasa, gərək təyəmmüm etsin, amma sübh azanına .kimi oyaq qalmaq lazım deyil. Vəzifəsi təyəmmüm olan cünubun da hökmü eynidir

Məsələ ۱۶۱۰: Əgər qadın Ramazan ayında sübh azanına yaxın heyz və nifas qanından .pak olsa və qüsl və təyəmmümdən heç biri üçün vaxtı olmazsa, orucu səhihdir

Məsələ ۱۶۱۱: Əgər qadın, sübh azanından sonra heyz və nifas qanından pak olsa, .yaxud gün arasında heyz ya nifas qanı görsə, axşama yaxın olsa da orucu batildir

Məsələ ۱۶۱۲: Əgər qadın, heyz, yaxud nifas qüslünü unutsa, bir, ya bir neçə gündən .sonra yadına düşsə, tutduğu oruclar səhihdir

Məsələ ۱۶۱۳: Əgər qadın Ramazan ayında sübh azanından qabaq heyz və ya nifas qanından pak olsa və qüsl etməkdə səhlənkarlıq edib, sübh azanına qədər qüsl etməzsə və vaxt daraldığı zaman təyəmmüm də etməzsə, o günün orucunu tamamlamalı, qəzasını da etməlidir. Amma əgər səhlənkarlıq etməzsə və məsələn; qadınlar hamamının açılmasını gözləyərsə, üç dəfə yatıb azana qədər qüsl etməsə .belə, təyəmmüm etməkdə də səhlənkarlıq etməzsə, orucu səhihdir

Məsələ ۱۶۱۴: Kəsirə istihazəli olan qadın, hərçənd boynuna vacib olan qüslləri istihazə hökmlərinə, ۳۹۳-cü məsələsində

deyildiyi şəkildə əməl etməsə də belə, orucu səhihdir. Həmçinin mütəvəssitə istihazəli .qadın qüsl etməsə belə, orucu səhihdir

Məsələ ۱۶۱۵: Məss-meyyit edən şəxs, yəni bədəninin bir yerini meyyitin bədəninə toxunduran məssi-meyyit qüslü etmədən oruc tuta bilər, əgər oruc halında meyyitə .məss etsə də, orucu batil olmaz

### (İMALƏ ETMƏK (KLİZMA .۷

Məsələ ۱۶۱۶: Axıcı şeylə imalə etmək, çarəsizlik və müalicə üzündən də olsa, orucu batil .edir

### QUSMAQ .۸

Məsələ ۱۶۱۷: Əgər oruc tutan şəxs qəsdən qussa, hətta xəstəlik və s. səbəb üzündən qusmağa naçar olsa, orucu batildir. Amma səhvən, yaxud ixtiyarsız olaraq qussa, eybi .yoxdur

Məsələ ۱۶۱۸: Əgər gecə, gündüz qusacağına səbəb olmasını bildiyi bir şeyi yeyərsə, .orucu səhihdir

Məsələ ۱۶۱۹: Əgər oruc tutan qusmasının qarşısını alsa, vəziyyəti dəyişib öz normal .halından çıxarsa qarşısını alması lazım deyil

Məsələ ۱۶۲۰: Oruc tutan şəxsin boğazına milçək düşərsə, əgər onun qarnına getməyi yemək deyilməyəcək qədər boğazdan aşağı enmişsə, onu xaricə çıxarmaq lazım deyil və orucu da səhihdir. Amma əgər bu qədər aşağı getməmişsə, qusmaq belə lazımsa, onu xaricə çıxarmalıdır. Amma əgər qusmanın ona zərəri və ya artıq məşəqqəti olsa, xaricə çıxarması lazım deyil. Bu halda əgər onu qusaraq çıxarmazsa və udarsa orucu .batil olur. Əgər onu qusaraq çıxarsa da orucu batil olur

Məsələ ۱۶۲۱: Əgər oruc tutan səhvən bir şeyi udsa və mədəsinə çatmamışdan əvvəl oruc olduğunu yadına salsa, onu mədəsinə daxil edəcəyi təqdirdə artıq yeyilmək adlanmayacaq

.qədər aşağı enmişsə, onu bayıra çıxarması lazım deyil və orucu da səhihdir

Məsələ ۱۶۲۲: Əgər gəyirməklə bir şeyin boğazından çıxacağına yəqin etsə, bu, qusmaq adlanacaq tərzdədirsə, gərək qəsdən gəyirməsin, amma əgər yəqini olmasa, eybi .yoxdur

Məsələ ۱۶۲۳: Əgər oruc tutan bir şəxs, gəyirdiyi zaman boğazına və ya ağzına bir şey .gələrsə, onu çölə tökməlidir. Əgər ixtiyarsız udarsa, orucu səhihdir

## ORUCU BATİL EDƏN ŞEYLƏRİN HÖKMLƏRİ

Məsələ ۱۶۲۴: Əgər insan qəsdən və ixtiyari olaraq orucu batil edən bir iş görərsə, orucu batildir. Əgər qəsdən olmasa, eybi yoxdur. Amma cünub olan şəxs, əgər ۱۶۰۲-ci məsələdə deyildiyi kimi, yatıb sübh azanına qədər qüsl etməsə, orucu batil olar. Amma əgər insan, orucu batil edən şeylərdən bəzisinin orucu batil etdiyini bilməzsə, bu bilməməzlikdə səhlənkarlıq etməzsə və bu barədə bir şübhəsi də olmasa ya da, şəri bir dəlilə istinadı olsa və o işi edərsə, yemək, içmək və cimadan başqa şeylərdə orucu .batil olmaz

Məsələ ۱۶۲۵: Əgər oruc tutan səhvən orucu batil edən işlərdən birini etsə və belə xəyal etsə ki, orucu batil olubdur və qəsdən ikinci dəfə o işlərdən etsə, keçən məsələdəki .hökm ona da aid olur

Məsələ ۱۶۲۶: Əgər oruc tutan bir şəxsin boğazına zorla bir şey töksələr, orucu batil olmaz. Amma əgər onu, orucunu yemək, içmək və ya cima ilə pozmağa məcbur etsələr, məsələn; əgər ona «yemək yemədiyin təqdirdə, malına və canına zərər verəcəyik» desələr, o da zərərin qarşısını almaq üçün bir şey yeyərsə, orucu batil olar. .Bu üç şeydən başqalarında da ehtiyat-vacibə görə batil olur

Məsələ ۱۶۲۷: Oruc tutan, kiminsə bir şeyi onun boğazına tökəcəyini və ya özünün orucunu batil edəcəyinə məcbur olunacağını bildiyi yerə gərək getməsin. Əgər getsə .və çarəsizlik üzündən orucu batil edən işlərdən etsə, onun orucu batil olar

.Əgər boğazına zorla bir şey tökərlərsə, ehtiyat-lazıma əsasən, eyni hökmü daşıyır

## ORUC TUTANA MƏKRUH OLAN ŞEYLƏR

:Məsələ ۱۶۲۸: Bir neçə şey oruc tutan üçün məkruhdur. Bunlar aşağıdakılardır

.(Gözə dərman tökmək, sürmə çəkmək (əgər dadı, iyi boğaza çatarsa .۱

.(Zəifliyə səbəb olan iş görmək (qan almaq, hamama getmək kimi .۲

Buruna dərman tökmək, əgər boğazına çatmasını bilməsə; və əgər boğaza . ۳ .çatacağını bilsə, icazəli deyildir

.Ətirli bitkiləri iyləmək .۴

.Qadının suda oturması .۵

.Fitil işlətmək .۶

.Bədəndəki paltarı islatmaq .۷

.Diş çəkdirmək və ağızdan qan gəlməyə səbəb olan hər hansı bir işi görmək .۸

.Yaş çöplə dişləri təmizləmək .۹

.Lüzumsuz olaraq ağıza su, ya bu kimi axan şey almaq .۱۰

Həmçinin məkruhdur ki, insan məni gəlməsi məqsədi olmadan öz arvadını öpsün, ya .şəhvətini qaldıran hər hansı bir iş görsün

## QƏZA VƏ KƏFFARƏ VACİB OLAN YERLƏR

Məsələ ۱۶۲۹: Əgər bir şəxs Ramazan ayı orucunu yemək, içmək, cima, istimna və ya (sübh azanına qədər) cünub qalması ilə batil edərsə, bunu öz ixtiyarı və iradəsi ilə qəsdən edib, məcburiyyət və çarəsizlik üzündən olmasa, qəza etməyə əlavə olaraq kəffarə də ona vacib olur. Ehtiyat-müstəhəb budur ki, bu söylənənlərdən qeyrisi ilə

.batil edərsə, qəza etməyə əlavə olaraq kəffarə də verməlidir

Məsələ ۱۶۳۰: Əgər bir şəxs, bu söylənənlərdən birini, onun orucu pozmadığına qəti olaraq etiqadı olduğu halda edərsə, ona kəffarə də vacib olmaz. Həmçinin, həddi-büluğun əvvəllərində olan uşaqlar kimi, orucun onlara vacib olduğunu bilməyənlərin .də hökmü eynidir

## ORUCUN KƏFFARƏSİ

Məsələ ۱۶۳۱: Ramazan ayında orucu yediyinə görə kəffarəsi boynuna vacib olan şəxs, ya bir qul azad etməli və ya sonrakı məsələdə söylənəcək göstərişə əsasən, iki ay oruc tutmalı, yaxud altmış fəqiri doyuzdurmalı, ya da hər birisinə bir müdd (təqribən ۷۵۰ qram) təam yəni buğda, arpa, çörək və bu kimi şey verməlidir. Əgər bunlar onun üçün mümkün olmasa, mümkün olduğu qədər sədəqə verməli, bu da mümkün olmasa, istiğfar etməlidir. Amma ehtiyat-vacibə əsasən hər vaxt imkanı olsa, kəffarəni .ödəməlidir

Məsələ ۱۶۳۲: Ramazan ayının iki ay kəffarəsini tutmaq istəyən şəxs, gərək bir ayı bütün və sonrakı ayın bir gününü ardıcıl tutsun. Əgər onun davamı ardıcıl olmasa, eybi .yoxdur

Məsələ ۱۶۳۳: İki ay Ramazan ayının kəffarəsini tutmaq istəyən bir şəxs, ardıcıl tutmalı olduğu otuz bir günün ərzində Qurban bayramı kimi, oruc tutulması haram olan bir .günün olacağı zamanda kəffarə orucunu tutmağa başlamamalıdır

Məsələ ۱۶۳۴: Ardıcıl olaraq oruc tutmalı olan bir şəxs, əgər onların arasında üzrsüz .olaraq bir gün oruc tutmazsa, orucları yenidən ardıcıl tutmalıdır

Məsələ ۱۶۳۵: Əgər ardıcıl olaraq oruc tutmalı olduğu günlər arasında heyz, nifas və ya məcburi səfərə çıxmaq kimi, qeyri-ixtiyari bir üzrlə qarşılaşarsa, o üzrün aradan qalxmasından sonra orucları yenidən tutması vacib deyildir. Üzrün aradan .qalxmasından sonra orucların qalanını yerinə yetirər

Məsələ ۱۶۳۶: Əgər orucunu haram şeylə batil etmişsə, istər o şey şərab və zina kimi əslində (zatən) haram olsun, istərsə də insana külli zərər yetirən halal xörəyi yemək və

heyz halında yaxınlıq etmək kimi müəyyən bir səbəb üzündən haram olsun, bir kəffarə kifayətdir, amma ehtiyat-müstəhəb budur ki, cəm kəffarəsi versin, yəni bir qul azad etsin, iki ay oruc tutsun və altmış fəqiri doydursun, yaxud onların hər birinə bir müdd miqdarında buğda, arpa, çörək və bu kimi şeylər versin. Əgər hər üçü ona mümkün .olmasa, onların hər hansı biri mümkündürsə, onu da yerinə yetirsin

Məsələ ۱۶۳۷: Əgər oruc tutan, Allaha və Peyğəmbərə (səlləllahu ələyhi və alihi və səlləm) qəsdən yalan nisbət versə kəffarəsi yoxdur, amma ehtiyat-müstəhəb budur .ki, kəffarə versin

Məsələ ۱۶۳۸: Əgər oruc tutan Ramazan ayının bir günündə bir neçə dəfə yeyib içə və .ya cima, yaxud istimna etsə, onların hamısı üçün bir kəffarə vacibdir

Məsələ ۱۶۳۹: Əgər oruc tutan cima və istimnadan başqa, orucu batil edən işlərdən .birini görsə, sonra isə öz halalı ilə yaxınlıq etsə, hər ikisi üçün bir kəffarə kifayətdir

Məsələ ۱۶۴۰: Əgər oruc tutan, orucu batil edən halal işlərdən birini görsə, məsələn su içə və sonra orucu batil edən haram bir işi görsə, məsələn, haram yemək yesə, (hər .ikisi üçün) bir kəffarə kifayətdir

Məsələ ۱۶۴۱: Əgər oruc tutan şəxs, gəyirmək vasitəsilə ağzına gələn bir şeyi qəsdən udarsa, ehtiyat-vacibə görə orucu batil olur. Onun qəzasını tutacağı kimi, kəffarə də ona vacib olur. Əgər o şey yeyilməsi haram olan bir şeydirsə, məsələn, gəyirdiyi zaman ağzına qan və ya yemək halından çıxmış bir yemək maddəsi gələrsə və o, onu .udarsa, yaxşı olar ki, cəm kəffarəsi versin

Məsələ ۱۶۴۲: Müəyyən bir gündə oruc olacağını nəzr etsə, əgər o günün orucunu qəsdən batil etsə, gərək kəffarə versin. Bu kəffarə nəzrin pozması kəffarəsində izah .olunacaq

Məsələ ۱۶۴۳: Əgər oruc tutan, sözünə əmin olmadığı bir şəxsin «iftar oldu» deməsi ilə orucunu yeyərsə, sonra da iftar olmadığını bilərsə və ya iftar olub-olmadığında şəkk edərsə, qəza və kəffarə ona vacib olur. Əgər onun sözünün höccət olmasına etiqadı

Məsələ ۱۶۴۴: Qəsdən orucunu batil edən şəxs, əgər zöhrdən sonra səfərə çıxsa, yaxud kəffarədən boyun qaçırmaq üçün zöhrdən əvvəl səfərə çıxsa, onun boynundan kəffarə götürülmür, hətta əgər günortadan əvvəl bir müsafirət onun qarşısına çıxsa, .ona kəffarə yenə də vacibdir

Məsələ ۱۶۴۵: Oruc tutan şəxs, qəsdən orucunu pozduqdan sonra heyz, nifas və ya xəstəlik kimi bir üzrlə qarşılaşarsa, ehtiyat-müstəhəb budur ki, kəffarə versin, xüsüsilə .dərman vasitəsilə heyz, yaxud xəstəliyi icad etmiş olarsa

Məsələ ۱۶۴۶: Əgər Ramazan ayının birinci günü olduğunu yəqin edib, qəsdən orucunu .batil etsə, sonra Şəbanın son günü olması məlum olsa, ona kəffarə vacib deyildir

Məsələ ۱۶۴۷: Əgər insan, Ramazanın son günü və ya Şəvval ayının əvvəl günü olduğunda şəkk etdiyi bir gündə, qəsdən orucunu pozarsa, əgər sonradan Şəvvalın .əvvəl günü olduğu məlum olarsa, ona kəffarə vacib deyil

Məsələ ۱۶۴۸: Oruc tutan şəxs, Ramazan ayında oruc olan xanımı ilə cima edərsə, əgər xanımını bu işə məcbur etmişdirsə, həm özünün kəffarəsini, həm də ehtiyata əsasən xanımının kəffarəsini verməlidir. Əgər xanımı cimaya razı olmuşdursa, hər birinə bir .kəffarə vacib olur

Məsələ ۱۶۴۹: Əgər bir qadın oruc tutan ərini özü ilə cimaya məcbur etsə, ərinin .orucunun kəffarəsini vermək ona vacib deyil

Məsələ ۱۶۵۰: Əgər oruc tutan Ramazan ayında öz arvadını cimaya məcbur etsə və cimanın arasında arvadı razı olsa, hər birinə bir kəffarə vacib olur. Ehtiyat-müstəhəb .budur ki, kişi iki kəffarə versin

Məsələ ۱۶۵۱: Əgər oruc tutan, Mübarək Ramazan ayında oruc tutmuş və yatmış arvadı ilə cima etsə, bir kəffarə ona vacibdir və arvadın orucu səhihdir, kəffarə də ona vacib .deyildir

Məsələ ۱۶۵۲: Əgər kişi öz arvadını, yaxud arvad öz kişisini cimadan başqa orucu batil

.edən işlərdən birini görməyə məcbur etsə, onların heç birinə kəffarə vacib deyildir

Məsələ ۱۶۵۳: Səfər, yaxud xəstəlik səbəbi ilə oruc tutmayan şəxs, öz oruc tutmuş .arvadını cimaya vadar edə bilməz. Amma onu məcbur etsə, kişiyə kəffarə vacib deyil

Məsələ ۱۶۵۴: İnsan kəffarəni verməkdə səhlənkarlıq etməməlidir. Amma onu dərhal verməsi lazım deyil.

Məsələ ۱۶۵۵: Əgər bir şəxsə kəffarə vacib olsa və bir neçə il onu verməsə, üstünə bir şey əlavə olunmur.

Məsələ ۱۶۵۶: Bir günün kəffarəsi üçün altmış fəqirə təam verməli olan bir şəxs, əgər altmış fəqirin hamısını tapmağa imkanı olarsa, onların sayını azaldıb həmin qədər kəffarəni onlara verə bilməz, məsələn, otuz fəqirin hər birinə iki müdd təam verərək buna kifayət edə bilməz. Lakin, fəqirin hər bir əhli-əyalı üçün, səğir (kiçik) olsalar da, bir müdd təam o fəqirə verə bilər. Fəqir şəxs də ailənin vəkaləti və ya onlara (səğir olsa) vilayət (qəyyumluq) haqqına əsasən, qəbul edə bilər. Əgər altmış nəfər fəqir tapa bilməsə, məsələn, əgər təkcə otuz nəfər fəqir tapsa, hər birinə iki müdd təam verə bilər. Amma ehtiyat-vacibə görə hər vaxt imkanı olsa, digər otuz fəqir də hər birinə bir müdd təam versin.

Məsələ ۱۶۵۷: Ramazan ayının orucunun qəzasını tutan şəxs, əgər zöhrdən sonra qəsdən orucu batil edən işlərdən birini görsə, gərək on fəqirin hər birinə bir müdd təam versin və əgər verə bilməsə, üç gün oruc tutsun.

## ORUCUN TƏKCƏ QƏZASI VACİB OLAN YERLƏR

Məsələ ۱۶۵۸: Bir neçə yerdə (əvvəldə işarə edilən yerlərdən başqa) təkcə orucun qəzası insana vacibdir və kəffarə vacib deyildir:

۱. Ramazan ayı gecəsində cünub olan şəxsə, ۱۶۰۲-ci məsələdə deyildiyi kimi, sübh azanına qədər ikinci yuxudan durmasa.

۲. Orucu batil edən bir iş görməsin, amma oruc niyyəti də etməsin, ya riya etsin, ya oruc olmamasını qəsd etsin və həmçinin əgər orucu batil edən işlərdən bir işi görməsini qəsd etsə, ۱۵۵۱-ci məsələdə izah olundu;

۳. Ramazan ayında cənabət qüslünü unudub cənabət halında bir gün, yaxud bir neçə

Ramazan ayında sübh olub-olmadığını araşdırmadan orucu pozan bir işi etdikdən .۴ ;sonra sübh olduğu məlum olarsa

Sübh olmayıb» deyən bir şəxsin sözünə əsasən, orucu batil edən işlərdən birini» .۵ ;etdikdən sonra, sübh olduğu məlum olarsa

Ona «sübh oldu» deyən şəxsin sözünə əmin olmayıb və ya zarafat etdiyini xəyal etdiyi .۶ halda, özü də araşdırmadan orucu batil edən bir işi etdikdən sonra sübh olduğu məlum ;olarsa

Sözü onun üçün şərən höccət olan, yaxud səhvən onun verdiyi xəbərin höccət .۷ olmasına inanan bir şəxsin sözünə əsasən iftar edərsə və sonra məğrib olmadığı ;məlum olarsa

İftar vaxtı olduğunu yəqin edərək və əmin olaraq iftar edərsə, sonra da hələ məğrib .۸ olmadığı məlum olarsa; amma əgər buludlu və bu kimi bir havada axşam olduğunu guman edib iftar edərsə, sonradan məğrib olmadığını anlayarsa, o orucun qəzasının .vacib olması ehtiyata əsasəndir

Susuzluq cəhətindən məzməzə edərsə, yəni, ağzında suyu dolandırarsa və bu .۹ əsnada ixtiyarsız olaraq udarsa, amma əgər oruc olduğunu unudaraq suyu udarsa və ya susuzluqdan qeyri bir şey üçün məzməzə edərsə, məsələn; dəstəmaz kimi məzməzə etməyin müstəhəbb olduğu bir yerdə məzməzə edərsə və ixtiyarsız olaraq .suyu udarsa, qəzası yoxdur

Bir kəs ikrah, zərurət və ya təqiyyə üzündən iftar etsə əgər ikrah və təqiyyə .۱۰ üzündən yemək, içmək və ya cima olsa; həmçinin bunlardan qeyrisində ehtiyat-vacibə .(əsasən (qəza vacibdir

Məsələ ۱۶۵۹: Əgər sudan başqa bir şey ağzına alsa və ixtiyarsız udsa, yaxud suyu .burnuna çəksə və ixtiyarsız udsa, qəza ona vacib deyildir

Məsələ ۱۶۶۰: Çox məzməzə etmək, oruc olan şəxs üçün məkruhdur. Əgər məzməzə

etdikdən sonra ağzının suyunu udmaq istəyərsə, ağzının suyunu üç dəfə çölə tökməsi .daha yaxşıdır

Məsələ ۱۶۶۱: Əgər insan məzməzə etdiyi zaman ixtiyarsız olaraq, yaxud unutduğuna ,görə boğazına su gedəcəyini bilsə

məzməzə etməməlidir, amma əgər bu halda məzməzə etsə, su boğazına getməsə, ehtiyat-vacibə görə onun qəzası lazımdır.

Məsələ ۱۶۶۲: Əgər Ramazan ayında, araşdırdıqdan sonra sübhün olması onun üçün məlum olmasa və orucu batil edən bir iş görsə, sonra sübh olması məlum olsa, qəza lazım deyildir.

Məsələ ۱۶۶۳: İnsan məğrib olub-olmadığında şəkk edərsə, iftar edə bilməz. Amma əgər sübh olub-olmadığında şəkk edərsə, araşdırma aparmadan qabaq da orucu batil edən bir iş görə bilər.

## QƏZA ORUCUNUN HÖKMLƏRİ

Məsələ ۱۶۶۴: Əgər dəli ağıllansa, dəli olduğu vaxtlardakı orucların qəzasını tutması vacib deyil.

Məsələ ۱۶۶۵: Əgər kafir müsəlman olsa, kafir olduğu vaxtlardakı orucların qəzasını tutması vacib deyil. Əgər müsəlman kafir olsa və yenidən müsəlman olsa, kafir olduğu günlərin orucunun qəzası vacibdir.

Məsələ ۱۶۶۶: Sərxoşluq səbəbindən tutulmayan oruc, qəza edilməlidir. (Hətta məstedici olan şey müalicə üçün qəbul olunsa belə.)

Məsələ ۱۶۶۷: Üzrlü olduğu üçün bir neçə gün oruc tuta bilməyən şəxs, sonradan üzrünün nə zaman aradan qalxdığında şəkk edərsə, ehtimal verdiyi çox miqdarın qəzasını etməsi vacib deyildir. Məsələn; Ramazandan qabaq səfərə çıxıb, Ramazanın beşinci günü və ya altıncı günü səfərdən qayıtdığını bilməzsə və ya məsələn; Ramazanın sonunda səfərə çıxıb, Ramazandan sonra müsafirətdən qayıdarsa, amma Ramazanın iyirmi beşində, yaxud iyirmi altısında səfərə çıxdığını bilməzsə, hərçənd çox miqdarı, yəni altı günü qəza etmək ehtiyat-müstəhəb olsa belə, hər iki təqdirdə, ən azı, yəni beş günü qəza edə bilər.

Məsələ ۱۶۶۸: Əgər bir neçə Ramazan ayından qəza orucu qalsa, hansının qəzasını

əvvəl tutsa, maneəsi yoxdur. Amma əgər sonuncu Ramazanın qəzasının vaxtı dar olsa, məsələn; sonuncu Ramazan ayından beş gün qəzası qalmış olsa və beş gün də

Ramazan ayına qalarsa, daha yaxşısı budur ki, əvvəl sonuncu Ramazanın qəzasını .tutsun

Məsələ ۱۶۶۹: Boynunda bir neçə Ramazan ayı orucunun qəzası vacib olan bir şəxs, tutduğu orucun hansı Ramazan ayının qəzası olduğunu niyyətində müəyyən etməzsə, son ilin Ramazan ayının qəza orucu hesab olunmur ki, təxir kəffarəsi ondan .götürülsün

Məsələ ۱۶۷۰: Ramazan ayı orucunun qəzasını tutan şəxs zöhrdən qabaq orucunu batil edə bilər, amma əgər orucunun qəzasının vaxtı dar olsa, daha yaxşı odur ki, batil .etməsin

Məsələ ۱۶۷۱: Daha yaxşı olar ki, meyyitin qəza orucunu tutmuş olan şəxs zöhrdən .sonra orucunu batil etməsin

Məsələ ۱۶۷۲: Əgər şəxs xəstəlik, heyz, yaxud nifas səbəbindən Ramazan ayının orucunu tutmasa və tutmadığı orucları qəza edə biləcək bir zaman keçməmişdən .əvvəl ölərsə, o orucların qəzası yoxdur

Məsələ ۱۶۷۳: Əgər şəxs, bir xəstəlik üzündən Ramazan orucunu tutmasa və onun xəstəliyi gələn ilin Ramazanına qədər uzansa, tutmadığı orucların qəzası ona vacib deyil və gərək hər gününə bir müdd təam, yəni buğda, arpa, çörək və bu kimi şeylər fəqirə versin. Amma başqa bir üzrə görə, məsələn; səfərə çıxdığı üçün oruc tutmasa və onun üzrü gələn orucluğa kimi qalsa, tutmadığı orucları qəza etməlidir və ehtiyat-.vacib budur ki, hər bir gün üçün də fəqirə bir müdd təam versin

Məsələ ۱۶۷۴: Xəstəlik səbəbindən Ramazan orucunu tutmayan bir şəxsin xəstəliyi, Ramazandan sonra sağalsa, amma sonra başqa bir üzrün çıxması nəticəsində sonrakı Ramazana qədər qəzasını tuta bilməzsə, tutmadığı orucları qəza etməlidir və ehtiyat-vacibə əsasən hər gün üçün bir müdd təam da fəqirə verməlidir. Həmçinin əgər Ramazan ayında xəstəlikdən qeyri bir üzrü olsa və Ramazandan sonra o üzr aradan qalxarsa, xəstəlik səbəbindən bu orucların qəzasını gələcək Ramazana qədər tuta

.bilməzsə, hökm eynidir

Məsələ ۱۶۷۵: Əgər Ramazan ayında bir üzrə görə oruc tutmasa, Ramazandan sonra üzrü aradan getsə və gələn

Ramazana kimi qəsdən qəza orucunu tutmasa, gərək orucunu qəza etsin və hər bir gün üçün də fəqirə bir müdd təam versin.

Məsələ ۱۶۷۶: Əgər orucun qəzasında səhlənkarlıq etsə və vaxt dar olsa və vaxt darlığında bir üzr peyda olsa, gərək qəzasını tutsun və ehtiyat-vacibə əsasən, hər bir gün üçün fəqirə bir müdd təam versin. Üzrü aradan gedəndən sonra oruclarını qəza etməyi qərara alan, amma qəza etməzdən qabaq vaxt darlığında üzr peyda olanın da hökmü belədir.

Məsələ ۱۶۷۷: Əgər insanın xəstəliyi bir neçə il davam etsə, sağaldıqdan sonra axırıncı Ramazanın qəzasını tutmalı və əvvəlki illərin hər bir günü üçün fəqirə bir müdd təam verməlidir.

Məsələ ۱۶۷۸: Hər gün üçün fəqirə bir müdd təam verməli olan şəxs, bir neçə günün kəffarəsini bir fəqirə verə bilər.

Məsələ ۱۶۷۹: Ramazan orucunu bir neçə il təxirə salsa, gərək qəza etsin. Əvvəlki illərin təxirinə görə, hər bir gün üçün fəqirə bir müdd təam verməlidir. Amma sonrakı neçə illərin təxiri üçün ona heç bir şey vacib deyil.

Məsələ ۱۶۸۰: Əgər Ramazan orucunu qəsdən tutmasa, gərək onun qəzasını yerinə yetirsin və hər bir günü üçün iki ay oruc tutsun ya altmış fəqirə təam versin, yaxud bir qul azad etsin. Əgər gələn Ramazana kimi o orucun qəzasını yerinə yetirməsə, ehtiyat-lazıma əsasən, hər gün üçün bir müdd təam kəffarə fəqirə verməlidir.

Məsələ ۱۶۸۱: Əgər Ramazan orucunu qəsdən tutmasa və gündə neçə dəfə cima, ya istimna etsə, kəffarə təkrar olunmayacaq. Həmçinin əgər orucu batil edən digər işlərdən bir neçə dəfə görsə, məsələn; bir neçə dəfə xörək yesə, bir kəffarə kifayətdir.

Məsələ ۱۶۸۲: Ata vəfat edəndən sonra ən böyük oğul, gərək ehtiyat-lazıma əsasən onun qəza orucunu, namaz hökmündə (۱۳۷۰-ci məsələdə) deyilən qayda ilə yerinə yetirsin və əgər vərəsələr razı olsa, hətta meyyitin malından olsa belə, hər gün üçün bir müdd (۷۵۰ qram) təam fəqirə versin.

Məsələ ۱۶۸۳: Əgər ata Ramazan orucundan başqa digər vacib orucu tutmasa, yaxud .əcir olub tutmasa, onun qəzası böyük oğula lazım deyildir

## MÜSAFİRİN ORUCUNUN HÖKMLƏRİ

Məsələ ۱۶۸۴: Səfərdə dörd rəkətli namazları iki rəkət qılmalı olan müsafir gərək oruc tutmasın. Namazını tamam qılan müsafir, işi səfər olan və ya səfəri günah səfəri olan .şəxs kimi gərək səfərdə oruc tutsun

Məsələ ۱۶۸۵: Ramazan ayında səfərə çıxmağın eybi yoxdur, amma bu, orucdan boyun qaçırtmaq üçün olsa, məkruhdur və həmçinin Ramazan ayında mütləq səfər həmin .hökümdədir. Həcc, ümrə və digər zəruriyyət səbəbindən olan səfərlər istisnadır

Məsələ ۱۶۸۶: Əgər Ramazan ayının orucundan başqa, vaxtı müəyyən olan bir oruc insana vacib olsa, belə ki, icarə və ya bu kimi şeylə vacib olmuş olsa, yaxud etikafın üçüncü günü olsa, o gündə səfər edə bilməz və əgər səfərdə olsa, belə ki, mümkündürsə, gərək on gün bir yerdə qalmaq qəsdi etsin və o günü oruc tutsun. Amma əgər o günün orucu, nəzirlə vacib olmuş olsa, zahir budur ki, o gün səfər etməyi caizdir və qəsdi-iqamət (on gün dayanmaq məqsədi) vacib deyildir. Hərçənd daha yaxşı budur ki, əlacsız olmayana kimi səfər etməsin və əgər səfərdədirsə, qəsdi-iqamət etsin. Amma əgər and içmək və ya əhd etməklə vacib olubsa, ehtiyat-vacibə .görə gərək səfər etməsin, əgər səfərdə olsa, qəsdi-iqamət etsin

Məsələ ۱۶۸۷: Əgər şəxs müstəhəbb oruc tutmasını nəzir etsə və gününü müəyyən etməsə, onu səfərdə yerinə yetirə bilməz. Amma səfərdə müəyyən bir gündə oruc olacağını nəzir etsə, gərək onu səfərdə yerinə yetirsin, həmçinin, müəyyən bir gündə, istər səfərdə olsun, ya olmasın, oruc tutacağını nəzir etsə, gərək o gün səfərdə də .olsa, oruc tutsun

Məsələ ۱۶۸۸: Müsafir hacət istəmək üçün Mədineyi-təyyibədə üç gün müstəhəb oruc tuta bilər, əhvət budur ki, bu üç gün çərşənbə, cümə axşamı və cümə günləri olsun.

Məsələ ۱۶۸۹: Müsafirin orucunun batil olduğunu bilməyən bir şəxs, əgər səfərdə oruc tutsa və gün əsnasında məsələni başa düşsə, orucu batil olar. Əgər məğribə qədər başa düşməsə, orucu səhihdir.

Məsələ ۱۶۹۰: Əgər müsafir, müsafir olduğunu unutsa və ya müsafir orucunun batil olmasını unutsa və səfərdə oruc tutsa, orucu ehtiyata əsasən batildir.

Məsələ ۱۶۹۱: Əgər oruc tutan zöhrdən sonra səfər etsə, gərək ehtiyata əsasən orucunu tamamlasın, bu halda onun qəzası lazım deyil. Əgər zöhrdən qabaq səfər etsə, ehtiyat-vacibə görə xüsusilə gecədən səfər niyyəti olsa, o günü oruc tuta bilməz. Amma bütün hallarda gərək, həddi-tərəxxüsə yetişməzdən əvvəl orucu batil edən bir iş görməsin. Əks təqdirdə, ona kəffarə vacib olar.

Məsələ ۱۶۹۲: Müsafir, zöhrdən əvvəl vətəninə və ya on gün qalmaq istədiyi bir yerə yetişərsə, istər fəcrdən əvvəl səfərə çıxsın, istərsə də oruc tutub səfərə çıxmış olsun, əgər orucu batil edən bir iş görməmişdirsə, ehtiyat-vacəbə əsasən o gün oruc tutmalıdır, bu halda onun qəzası yoxdur. Əgər orucu batil edən bir iş görmüşdürsə, o günün orucu ona vacib deyildir, gərək (sonradan) onu qəza etsin.

Məsələ ۱۶۹۳: Əgər müsafir zöhrdən sonra öz vətəninə və ya on gün qalmaq istədiyi bir yerə çatsa, ehtiyat-vacibə görə orucu batildir və gərək onu qəza etsin.

Məsələ ۱۶۹۴: Müsafir və oruc tutmaqda üzrü olan bir şəxsin, Ramazan ayının gündüzlərində cima etməsi habelə, doyunca yeyib-içməsi məkruhdur.

## ORUC VACİB OLMAYAN ŞƏXSLƏR

Məsələ ۱۶۹۵: Qocalığına görə oruc tuta bilməyən və ya oruc tutmaq ona əziyyətli olan şəxsə oruc tutmaq vacib deyildir.

Amma ikinci halda gərək fəqirə hər gün üçün bir müdd təam (buğda, arpa, ya çörək və ya bu kimi şeylər) versin.

Məsələ ۱۶۹۶: Qocalığa görə oruc tutmayan şəxs, əgər Ramazan ayından sonra oruc tuta bilsə, ehtiyat-müstəhəb budur ki, tutmadığı orucların qəzasını yerinə yetirsin.

Məsələ ۱۶۹۷: Əgər insanda susuzluq xəstəliyi olsa və bu susuzluğa dözə bilməsə, yaxud ona çox çətin olsa, oruc ona vacib deyildir. Amma ikinci surətdə gərək hər gün üçün yoxsula bir müdd təam versin. Əgər sonradan tuta bilsə, qəza etməsi vacib deyil.

Məsələ ۱۶۹۸: Doğum vaxtı yaxınlaşan və oruc tutmağın özünə və ya bətnindəki uşağa zərəri olan qadına oruc vacib deyil, gərək hər gün üçün fəqirə bir müdd təam versin və gərək hər iki halda tutmadığı orucların qəzasını tutsun.

Məsələ ۱۶۹۹: Uşağa süd verən qadının, istər uşağın anası olsun, istər dayəsi və istərsə ücrətsiz süd versin, südü az olsa və oruc tutması özünə və ya əmizdirdiyi uşağa zərər verərsə, oruc tutmaq ona vacib deyildir. Hər gün üçün bir müdd təam fəqirə verməlidir. Hər iki halda tutmadığı orucları gərək qəza etsin. Amma ehtiyat-vacibə əsasən bu hökm, uşağa ancaq bu yol ilə süd verməyə aiddir, amma uşağa başqa yol ilə süd vermək mümkündürsə, məsələn; uşağa süd verməkdə bir neçə qadın iştirak etsə, yaxud əmzik və şüşə qab ilə süd vermək mümkün olsa, bu hökmün sübut olunması işkallıdır.

## AYIN ƏVVƏLİNİN SÜBUT OLMA YOLU

Məsələ ۱۷۰۰: Ayın əvvəli dörd yolla sübut olunur:

۱. İnsan özü Ayı görsün.

۲. Sözlərindən yəqinlik və ya xatircəmlik hasil edilən bir dəstə şəxsin «ayı gördük» deməsi ilə və ya hər hansı bir şeylə insana üqəlayi mənşəyi olan yəqin ya da xatircəmliyin hasil olması ilə.

۳. İki adil kişinin, «gecə Ayı gördük» demələri ilə; Amma ayın xüsusiyyətini bir-birinin

sübut olunmur. Həmçinin əgər insan onların səhvə yol verdiklərinə yəqin edərsə və ya xatircəm olarsa yaxud onların verdiyi şəhadət zidd, yaxud hökmündə olan bir məsələ ilə qarşılaşarsa ayın əvvəli sübut olunmaz məsələn; əgər şəhər əhalisnin çox hissəsi Ayı görmək üçün baxdıqları halda iki adil kişidən başqa heç bir şəxs Ayı gördüyünü iddia etməzsə və ya bir dəstə Ayı görmək üçün baxdıqları halda onların arasından yalnız iki adil şəxs Ayı gördüyünü iddia edərsə, başqaları isə görməzsə, belə ki, Ayın yerini bilmək və yaxşı görmə və digər xüsusiyyətlərdə birinci iki adil şəxs kimi olan iki ayrı adil şəxs onların arasında olarsa, hava da açıq-aydın olsa, o iki nəfərin görməsinə ehtimal olunan bir maneə də olmasa, bu halda ayın əvvəli iki nəfər adil şəxsin şəhadəti .ilə sübut olunmaz

Şəban ayının əvvəlindən ۳۰ gün keçmiş olsa; bunun vasitəsi ilə Ramazan ayının .۴ əvvəli olması sübuta yetir. Yaxud, Ramazan ayının əvvəlindən ۳۰ gün keçsə, bu halda .Şəvval ayının olması sübut olunur

Məsələ ۱۷۰۱: Şəriət hakiminin hökm etməsi ilə ayın əvvəli sübut edilməz. Amma əgər onun hökmündən və ya ayın (əvvəli) olmasını sübut edilməsi ilə ayın görünməsinə .(xatircəmlik hasil olsa, (ayın əvvəli sübut olunar

Məsələ ۱۷۰۲: Ayın əvvəli astronomların deməyi ilə sübut olmur, amma əgər insan onların dediklərindən yəqinlik hasil edərsə yaxud əmin olarsa, onların sözünə əməl .etməlidir

Məsələ ۱۷۰۳: Ayın yüksəkdə olması və ya gec batması, qabaqkı gecənin ayın ilk gecəsi olmağına dəlil deyil; həmçinin əgər ayın kənarında şəfəqin olması ayın ikinci gecəsi .olmasına dəlil deyildir

Məsələ ۱۷۰۴: Əgər bir şəxs üçün Ramazan ayının əvvəli olması sübuta yetməsə və oruc tutmasa sonradan qabaqkı gecənin ayın əvvəli olduğunu anlayarsa, o günün orucunu .qəza etməlidir

Məsələ ۱۷۰۵: Əgər bir şəhərdə ayın əvvəli sübut edilsə, bu, üfüqü həmin şəhərlə eyni

olan digər şəhərlərə də aid olar. Burada üfüqün müttəhid olmasından məqsəd odur ki, əgər birinci şəhərdə ay görünsə, ikinci şəhərdə də bulud kimi maneə

olmasa, görünəcəkdir. Bu da o zaman gerçəkləşər ki, ikinci şəhər birinci şəhərin qərbində yerləşərsə, en xəttində ona yaxın olsun. Əgər onun şərqində yerləşərsə, en .xəttinin yaxın olmasından ələvə üfüq xəttindən çox fərqi olmasın

Məsələ ۱۷۰۶: Ramazanın axırı, yaxud Şəvvalın əvvəl günü olduğunu bilməyən şəxs gərək oruc tutsun. Amma əgər gün ərzində Şəvvalın əvvəl günü olduğunu anlayarsa, .orucu açmalıdır

Məsələ ۱۷۰۷: Əgər həbs olunan şəxs, Ramazan ayı olmasını yəqin edə bilməsə, gərək gümanına əməl etsin. Amma əgər daha güclü güman tapa bilsə, zəif gümana əməl edə bilməz. Ən güclü ehtimalı əldə etmək üçün bacardığı qədər çalışmalıdır. Əgər heç bir yolla mümkün olmasa, püşk atmaqdan axırıncı yol kimi istifadə etməlidir (əgər ehtimalın qüvvətlənməsinə səbəb olarsa). Əgər öz gümanına əməl etməsi mümkün deyilsə, Ramazan ayı olduğunu ehtimal verdiyi bir ayı oruc tutmalıdır. Amma o ayı nəzərində saxlamalıdır, belə ki, əgər sonradan o ayın Ramazan ayı və ya ondan sonra olduğu məlum olarsa, ona bir şey vacib olmaz. Amma əgər Ramazan ayından qabaq .olduğu məlum olarsa, gərək qəzasını etsin

## HARAM VƏ MƏKRUH ORUCLAR

Məsələ ۱۷۰۸: Fitr və Qurban bayramları günündə oruc tutmaq haramdır. Həmçinin, Şəbanın axırı ilə Ramazanın əvvəli olması məlum olmayan gündə, Ramazan ayının .əvvəli niyyəti ilə oruc tutmaq haramdır

Məsələ ۱۷۰۹: Əgər qadının müstəhəb oruc tutması vasitəsilə ərinin ondan ləzzət almaq haqqı aradan getsə, oruc o qadına haramdır. Həmçinin, vacib olan, amma vaxtı müəyyən olmayan orucda, məsələn vaxtı müəyyən olmayan nəzir orucu kimi, bu halda da ehtiyat-vacibə görə (ərin haqqı aradan gedərsə) orucu batildir; tutarsa da, nəzir orucunun əvəzini verməz. Habelə, ehtiyat-vacibə görə, əgər əri onun müstəhəbb, yaxud vaxtı müəyyən olmayan vacib orucu tutmasını qadağan edərsə, hətta

ərinin haqqı ilə ziddiyyəti olmasa belə, hökm eynidir. Ehtiyat-müstəhəb budur ki, ərinin .icazəsi olmadan müstəhəb oruc tutmasın

Məsələ ۱۷۱۰: Övladın müstəhəb oruc tutması, əgər ata-ananın (övlada şəfqət və ürəyi .yananlıq üzündən) əziyyətinə səbəb olsa, haramdır

Məsələ ۱۷۱۱: Əgər oğul, atanın və ya ananın icazəsi olmadan müstəhəbb oruc tutsa və gün ərzində atası ona icazə verməsə, əgər onlarla müxalifət etmək şəfqətdən .(yaranan əziyyətinə səbəb olacaqsa, gərək iftar etsin (orucunu açsın

Məsələ ۱۷۱۲: Orucun etina ediləcək bir zərər verməyəcəyini bilən şəxsə, həkim «sənə orucun zərəri vardır» desə belə, oruc tutmamalıdır. Əgər bir şəxs, orucun ona etina ediləcək bir zərər verəcəyinə yəqin və ya guman edərsə, həkimin «zərəri yoxdur» .deməsinə baxmayaraq, oruc tutması vacib deyil

Məsələ ۱۷۱۳: Əgər insan orucun ona etina ediləcək bir zərər yetirəcəyini yəqin etsə və ya xatircəmlik olsa yaxud ehtimal versə və o ehtimaldan qorxu hasil olsa, belə ki, onun ehtimalı əql sahiblərinin nəzərində haqlı olsa, oruc tutması vacib deyil. Hətta o zərər şəxsin həlak olmasına, yaxud hər hansı üzvünün nöqsanlı olmasına səbəb olarsa, oruc tutması haramdır. Bundan başqa hallarda əgər rəcaən oruc tutsa və sonradan etina .ediləcək bir zərəri olmadığı məlum olsa, orucu səhihdir

Məsələ ۱۷۱۴: Orucun ona zərəri olmadığına inanan şəxs, oruc tutarsa və axşamdan sonra orucun ona etina ediləcək dərəcədə zərər verdiyini başa düşsə, ehtiyat-vacibə .əsasən, gərək onun qəzasını yerinə yetirsin

Məsələ ۱۷۱۵: Qeyd olunan oruclardan başqa, digər haram oruclar da vardır ki, izahı .müfəssəl kitablarda deyilmişdir

Məsələ ۱۷۱۶: Aşura gününün orucu və «Ərəfə», və ya Qurban bayramı olmasına şəkk .edilən gününün orucu məkruhdur

## MÜSTƏHƏB ORUCLAR

Məsələ ۱۷۱۷: İlin bütün günlərinin orucu, deyilmiş olduğu haram və məkruh olan günlərdən başqa, müstəhəbdir. Aşağıda sadalayacağımız günlərdə oruc tutmaq daha :çox tövsiyə olunmuşdur

Hər ayın birinci və sonuncu cümə axşamı günü və ayın onundan sonra birinci . ۱ çərşənbə günü. Bu günlərdə oruc tuta bilməyən şəxsin həmin günlərin orucunu qəza etməsi müstəhəbdir. Əgər insan əsla oruc tuta bilmirsə, müstəhəbbdir ki, hər bir günü .üçün fəqirə bir müdd təam, və ya ۱۲/۶ noxud sikkəli gümüş versin

.Hər ayın ۱۳, ۱۴ və ۱۵-ci günləri .۲

;Rəcəb və Şəban ayı tamamilə, ya bu iki ayın bir qədərini, hətta bir gün də olsa belə .۳

.Novruz bayramı günü .۴

.Şəvvalı ayının dördündən doqquzuna qədər .۵

.Zilqədənin ۲۵-ci və ۲۹-cu günü .۶

Zilhiccənin ۱-dən ۹-cu gününə (Ərəfə gününə) qədər. Amma əgər zəiflik səbəbindən .۷ .Ərəfə gününün dualarını oxuya bilməsə, o günün orucu məkruhdur

.(Qədir bayramı günü (Zilhiccənin ۱۸-ci günü .۸

.(Mübahilə günü (Zilhiccənin ۲۴-cü günü .۹

.Məhərrəm ayının ۱-ci, ۳-cü və ۷-ci günü .۱۰

Peyğəmbəri-Əkrəmin, (səlləllahu ələyhi və alihi və səlləm) mövlud günü (Rəbiul- .۱۱ .(əvvəlin ۱۷-si

;Cəmadiyul-əvvəlin on beşinci günü .۱۲

(Həmçinin Həzrət Peyğəmbərin besət günü (۲۷ Rəcəb -۱۳

Müstəhəb oruc tutan şəxsin, onu sona çatdırması vacib deyil. Hətta əgər mömin qardaşı onu yeməyə dəvət edərsə, dəvəti qəbul edib gün ərzində zöhrdən sonra olsa .belə, iftar etməsi müstəhəbdir

## İNSANIN ORUCU BATİL EDƏN İŞLƏRDƏN ÇƏKİNMƏSİ MÜSTƏHƏB OLAN YERLƏR

Məsələ ۱۷۱۸: Beş nəfər üçün, Ramazan ayında oruc tutmasalar da orucu batil edən :işlərdən çəkinmələri müstəhəbdir

۱. Səfərdə orucu batil edən işlərdən edib zöhrdən əvvəl vətəninə, yaxud on gün ;qalmaq istədiyi yerə çatan müsafir

۲. ;Zöhrdən sonra vətəninə, yaxud on gün qalmaq istədiyi bir yerə çatan müsafir

۳. Zöhrdən sonra sağalan xəstə və həmçinin zöhrdən əvvəl sağalıb, hərçənd, orucu batil edən bir iş görübsə də; Amma əgər orucu batil edən bir iş görməyibsə, ehtiyat-vacibə görə oruc tutmalıdır.

۴. .Gün ərzində heyz və nifas qanından təmizlənən qadın

۵. .Əvvəlcə orucu batil edən bir iş görüb sonra müsəlman olan kafir

Məsələ ۱۷۱۹: Oruc tutan şəxsin məğrib və işa namazlarını iftardan əvvəl qılması müstəhəbdir. Amma əgər bir şəxs onu gözləyərsə və ya yeməyə meyli çox olduğundan hüzuri-qəlblə namaz qıla bilmirsə, əvvəlcə iftar etməsi daha yaxşıdır. .Ancaq mümkün olan qədər namazı fəzilətli vaxtında qılması daha yaxşıdır

## XÜMSÜN HÖKMLƏRİ

### Point

:Məsələ ۱۷۲۰: Yeddi şeydə xüms vacib olur

.Qazanc .۱

.Mədən .۲

.Xəzinə .۳

.Harama qarışmış halal mal .۴

.Üzgüçülüklə (yəni dənizə batmaq vasitəsi ilə) əldə edilən cəvahirat .۵

.Müharibə qəniməti .۶

Məşhura əsasən, zimmi kafirin müsəlmanlardan satın aldığı yer. Bunların hər birinin .۷ .hökmü müfəssəl deyiləcək

### QAZANC MƏNFƏƏTİ .۱

Məsələ ۱۷۲۱: Əgər insan ticarət, sənət və ya digər kəsb qazanc yolları ilə mal əldə edərsə, hətta əgər bir meyyitin oruc və namazını yerinə yetirərək muzd alıb bir mal əldə etsə belə, bu, onun özünün və ailəsinin illik xərclərindən çox olarsa, çox olan .qismin xümsü (beşdən biri) aşağıda deyiləcək üsulla verilməlidir

Məsələ ۱۷۲۲: Əgər qazancdan qeyri bir yol ilə mal əldə edərsə, növbəti məsələdə istisna olunan hallardan başqa məsələn; ona bir şey bağışlanarsa, illik xərcindən artıq .qaldığı təqdirdə, onun xümsünü verməlidir

Məsələ ۱۷۲۳: Qadının aldığı mehriyyənin və kişinin xül talaqın əvəzində aldığı malın xümsü yoxdur. Həmçinin, alınan diyənin (qan pulunun) da xümsü yoxdur. Həmçinin irs bəhsində mötəbər olan qanunlara əsasən, insana yetişən miras da eyni hökmü daşıyır. Amma şiə olan bir müsəlmana, bu deyilən

yoldan əlavə, məsələn; təsib yolu ilə miras olaraq bir mal yetişərsə, o mal mənfəətdən hesab olunur və onun xümsünü verməsi gərəkdir. Həmçinin əgər ona, ata və oğuldan qeyri, ümidi olmayan bir yerdən irs çatarsa, ehtiyat-vacibə əsasən, illik xərcindən artıq .qaldığı təqdirdə, o malın xümsünü verməlidir

Məsələ ۱۷۲۴: Əgər bir şəxsin əlinə irs yolu ilə bir mal yetişsə və insan irs qoyan şəxsin o malın xümsünü vermədiyini bilərsə, gərək onun xümsünü versin. Həmçinin əgər o malın özündə xümsü yoxdursa, amma irs qoyan şəxsin xümsdan borcu olduğunu bilərsə, irsdən onun borclu olduğu xümsü verməlidir. Lakin hər iki təqdirdə, əgər irs qoyan şəxsin xüms verməyə əqidəsi yoxmuşsa və ya əsla xüms vermirsə, varisin .onun boynunda vacib olan xümsü verməsi lazım deyil

Məsələ ۱۷۲۵: Əgər insan qənaət yolu ilə illik xərcindən bir şey artırarsa, gərək onun .xümsünü versin

Məsələ ۱۷۲۶: Bütün xərcləri başqası tərəfindən verilən şəxs, əldə etdiyi bütün malların .xümsünü verməlidir

Məsələ ۱۷۲۷: Əgər bir şəxs, bir mülkü müəyyən şəxslərə, məsələn; öz övladlarına vəqf edərsə, əgər onlar o mülkdə ağac əkmək və ya əkinçilik yolu ilə bir mal əldə etsələr və illik xərclərindən artıq qalsa, gərək onun xümsünü versinlər. Həmçinin əgər o mülkdən icarə haqqı almaq kimi, başqa şəkildə faydalanarlarsa, illik xərclərindən artıq qalanının .xümsünü verməlidir

Məsələ ۱۷۲۸: Fəqirin kəffarə, məzalim qaytarılması kimi vacib, eləcə də müstəhəb sədəqə olaraq aldığı mal, onun illik xərclərindən artıq qalarsa və ya ona verilən maldan bir mənfəət əldə etsə, məsələn; ona verilən bir ağacdan meyvə əldə etsə və illik xərclərindən artıq qalsa, ehtiyat-vacibə əsasən onun xümsünü verməlidir. Amma ona zəkat və ya xüms olaraq müstəhəqq olduğuna görə verilən malın özünün xümsünü vermək lazım deyildir. Amma əgər onların mənfəəti illik xərclərindən artıq qalsa xüms .düşür

Məsələ ۱۷۲۹: Əgər bir şəxs xümsü verilməmiş pul ilə bir şey alarsa, yəni satıcıya «Mən malı bu pulla alıram», deyərsə və satıcı da ۱۲ imam şiəsi olan bir müsəlman olarsa, bütün mala olan nisbətdəki müamilə səhihdir və bu pulla alınan malın üzərinə xüms gəlir. (Bu müamilələrin səhih olmasında) şəriət hakiminin icazə və imzasına ehtiyac .yoxdur

Məsələ ۱۷۳۰: Əgər bir şəxs, bir malı alıb müamilədən sonra, onun qiymətini xümsü verilməmiş puldan versə, etdiyi müamilə səhihdir. Satıcıya verdiyi pulun xümsünü .xüms sahiblərinə borclu qalır

Məsələ ۱۷۳۱: Əgər on iki imam şiəsi olan bir müsəlman, xümsü verilməmiş bir malı alsa, .onun xümsü satıcının boynundadır və alıcının üzərinə heç nə düşmür

Məsələ ۱۷۳۲: Əgər xümsü verilməmiş bir şeyi, ۱۲ imam şiəsi olan bir müsəlmana bağışlayarsa, onun xümsü bağışlayanın öz üzərindədir. Malın bağışlandığı şəxsin .üzərinə bir şey gəlməz

Məsələ ۱۷۳۳: Əgər kafirdən və ya xümsa əqidəsi olmayan, yaxud xüms verməyən bir .şəxsdən insanın əlinə bir mal gələrsə, onun xümsünü verməsi vacib deyil

Məsələ ۱۷۳۴: Tacir, işçi, sənətkar, dövlət qulluqçusu və bu kimi şəxslər işə başladıqları tarixdən bir il keçdikdən sonra, illik xərclərindən artıq qalan qazanclarının xümsünü verməlidirlər. Həmçinin, mənbərçi (təbliğçi) və bu kimi şəxslərin qazancları ilin məxsus vaxtlarında olsa belə, əgər ilin əksər hissəsini təmin edərsə, həmçinin, məişət xərclərini təmin edə biləcək bir işi, sənəti olmayan, dövlət və ya camaatın yardımından istifadə edən, yaxud təsadüfi olaraq müəyyən gəlir əldə edən şəxslər də bir mənfəət əldə edərsə, fayda götürdüyü vaxtdan bir il keçdikdən sonra, illik xərcindən artıq qalan qazancının xümsünü verməlidir. Deməli, hər bir mənfəət üçün ayrıca olaraq bir il .hesab edə bilər

Məsələ ۱۷۳۵: İnsan, ilin ortasında hər zaman qazanc əldə edərsə, onun xümsünü verə bilər, onun xümsünü ilin sonuna qədər təxirə salması da mümkündür. Amma əgər ilin

onun xümsünü gərək dərhal versin. Xüms vermək üçün şəmsi (günəş) ilini ölçü qərar .verirsə, bir maneəsi yoxdur

Məsələ ۱۷۳۶: Əgər qazanc əldə etdikdən sonra, ilin ortasında ölərsə, ölüm zamanına .qədərki xərcini qazancından götürüb, yerdə qalanının xümsünü verməlidirlər

Məsələ ۱۷۳۷: Əgər ticarət üçün aldığı bir malın qiyməti qalxarsa və onu satmazsa və ilin .ortasında qiyməti düşərsə, yüksələn miqdarın xümsü ona vacib deyildir

Məsələ ۱۷۳۸: Əgər ticarət üçün aldığı malın qiyməti qalxdığı halda daha da qalxma ümidi ilə il bitdikdən sonraya qədər onu satmazsa və onun qiyməti düşərsə, qalxan .miqdarın xümsü ehtiyata əsasən ona vacib olar

Məsələ ۱۷۳۹: Əgər ticarət malından başqa bir malı satın alarsa və ya bu kimi bir yolla əldə edərsə və xümsünü verərsə, sonra da onun qiyməti yüksələrsə, onu satdığı təqdirdə, qiymətinə əlavə və illik xərcindən artıq qalmış olan miqdarın xümsünü verməlidir. Həmçinin, əgər məsələn; ağac meyvə verərsə və ya ətindən istifadə etmək .üçün saxlanılan qoyun kökələrsə, gərək artan miqdarın xümsünü versin

Məsələ ۱۷۴۰: Əgər xümsünü verdiyi, yaxud xüms düşməyən bir pul ilə qiyməti yüksəldikdən sonra satmaq niyyəti ilə bir bağ salarsa, meyvələrin, ağacların və əkilən, yaxud öz-özünə əmələ gələn cavan ağacların, (tinglərin), kəsilib istifadə olunmağa yararlı olan quru budaqların, eləcə də bağın qiymətinin artan hissəsinin xümsünü verməlidir. Amma əgər məqsədi o ağacların meyvələrini sataraq faydalanmaq olsa, qiymətin artan miqdarına xüms vacib deyil, amma yerdə qalanların xümsünü .verməlidir

Məsələ ۱۷۴۱: Əgər bir şəxs söyüd, çinar və bu kimi başqa ağaclar əkərsə, hər il onun artan hissəsinin xümsün verməlidir. Həmçinin, əgər adətən hər il budanan budaqların .da illik xərclərindən çox olarsa, gərək onun xümsünü versin

Məsələ ۱۷۴۲: Bir neçə ticarət sahəsi olan, məsələn; öz sərmayəsi ilə bir qədər qənd, bir qədər də düyü alan şəxs, əgər o ticarət işlərinin hamısı mədaxil-məxaric, hesabdarlıq,

qazanc və ziyan kimi ticarət işlərində bir olsa, ilin sonunda onun xərclərindən artıq qalan qismin xümsünü verməlidir. Bu

təqdirdə, əgər bir bölümdən mənfəət, digər bölümdən isə zərər edərsə, bir bölümün zərərini o biri bölümün mənfəəti ilə bərpa edə bilər. Amma əgər iki müxtəlif işdə çalışırsa, məsələn; ticarət və əkinçilik edirsə, yaxud bir sahədə də olsa, mədaxil-məxaric hesabları bir-birindən ayrıdırsa, bu iki təqdirdə, ehtiyat-vacibə əsasən, bir .bölümün zərərini o biri bölümün mənfəəti ilə bərpa edə bilməz

Məsələ ۱۷۴۳: İnsan qazanc əldə etmək üçün xərclədiyi kommersiya və daşıma xərci kimi məsrəfləri, həmçinin onun iş vasitələrinə dəyən xəsarəti qazancdan çıxa bilər və o .miqdarın xümsünü vermək lazım deyildir

Məsələ ۱۷۴۴: İnsanın qazanclarından il əsnasında yemək, geyim, ev və ev əşyaları, oğlunu evləndirmə, qızın cehizi, ziyarət və bu kimi işlər üçün etdiyi xərclərin, öz .mövqeyindən (şənindən) yüksək olmadığı təqdirdə xümsü yoxdur

Məsələ ۱۷۴۵: İnsanın nəzir və kəffarə üçün xərclədiyi məsrəflər, onun illik məxaricindən hesab olunur. Həmçinin, başqasına hədiyyə etdiyi və ya mükafat olaraq verdiyi bir mal onun ictimai mövqeyindən yuxarı olmadığı təqdirdə onun illik .məxaricindən hesab olunur

Məsələ ۱۷۴۶: El arasında olan adətə görə qızın cehizliyini bir neçə ilə, tədricən hazırlayarsa və bu halda qızı üçün cehizlik tədarükü görməməsi onun ictimai mövqeyi (şəni) ilə zidd olarsa, hətta vaxtında hazırlaya bilmədiyinə görə olsa belə, əgər il boyu həmin ilin qazancından, öz şənindən artıq olmamaq şərti ilə bir miqdar cehizlik alsa və camaat arasında o miqdarın bir ildə tədarük görülməsi onun adətən illik xərclərindən sayılsa onun xümsünü vermək lazım deyildir. Amma əgər şənindən yuxarı olsa və ya .bu ilin qazancından sonrakı ildə cehiz alarsa, gərək onun xümsünü versin

Məsələ ۱۷۴۷: İnsanın həcc səfəri və digər ziyarətlər üçün xərclədiyi mal, o il xərclədiyi, illik xərcindən hesab edilir, amma əgər onun səfəri, sonrakı ildən bir müddətə qədər .davam edərsə, sonrakı ildə xərclədiyi miqdarın xümsünü verməlidir

Məsələ ۱۷۴۸: Ticarət, iş və ya bu kimi yolla mənfəət əldə edən bir şəxsin, xümsü vacib olmayan başqa bir malı da olsa, illik xərclərini, yalnız əldə etdiyi mənfəətlərdən hesab .edə bilər

Məsələ ۱۷۴۹: İllik məsrəfi üçün qazancından aldığı yeyinti maddələri ilin sonunda artıq qalsa, gərək onun xümsünü versin və əgər onların qiymətini vermək istərsə, əgər satın aldığı zamana nisbətlə qiymətləri artıq qalarsa, gərək il sonundakı qiymətini .hesablasın

Məsələ ۱۷۵۰: Əgər qazancından, xümsü verməzdən əvvəl evi üçün əşya alarsa, mənfəət ili keçdikdən sonra ehtiyacı qalmazsa, onun xümsünü vermək lazım deyildir. Həmçinin əgər ilin ortasında ehtiyacı aradan qalxsa, amma o şey qışlıq və yaylıq paltarı kimi adətən sonarkı illər üçün saxlanan bir şey olsa, bu təqdirdə xümsü yoxdur. Bu kimi şeylərdən başqasında il boyu ona ehtiyacı aradan qalxsa, ehtiyat-vacib budur ki, xümsünü versin. Qadınların zinət əşyaları da, qadının onlardan zinət kimi istifadə .etməsi zamanı keçdiyi təqdirdə, xümsü yoxdur

Məsələ ۱۷۵۱: Əgər bir il qazanc mənfəəti götürülməzsə, o ilin məsrəfini gələn ilin .qazancından çıxıla bilməz

Məsələ ۱۷۵۲: Əgər ilin əvvəlində mənfəət götürməyib sərmayədən xərcləyərsə və il tamam olmazdan əvvəl qazanc əldə edərsə, sərmayədən xərcləmiş olduğu miqdarı .qazancdan çıxa bilər

Məsələ ۱۷۵۳: Əgər sərmayənin bir miqdarı ticarət və bu kimi şeylərdə aradan gedərsə, .sərmayədən azalan miqdarı həmin ilin mənfəətindən çıxa bilər

Məsələ ۱۷۵۴: Əgər sərmayədən qeyri mallarından başqa bir şey əlindən çıxsa, həmin il boyunca o şeyə ehtiyacı olarsa, qazancdan il ortasında onu təmin edə bilər və xümsü .də yoxdur

Məsələ ۱۷۵۵: Əgər il boyunca qazanc əldə edə bilməsə və məsrəfləri üçün borc edərsə, borcunu gələcək illərin mənfəətindən çıxaraq onun xümsünü verməyə bilməz. Amma il

boyu xərcləri üçün borc etsə və il tamam olmazdan əvvəl qazanc əldə edərsə, borcunu o qazancdan çıxa bilər. Həmçinin, birinci təqdirdə də, borcunu il boyu əldə etdiyi .mənfəətlərdən ödəyə bilər və o miqdarın xümsü yoxdur

Məsələ ۱۷۵۶: Malını çoxaltmaq və ya ehtiyacı olmayan bir mülkü almaq üçün borc edərsə, əgər il ərzində əldə etdiyi qazancdan xümsünü verməzdən o borcu ödəsə, gərək xüms ili gəlib çatandan sonra o malın xümsünü versin. Amma əgər borc aldığı .(mal və ya borcla aldığı bir şey il boyunda əlindən gedərsə, (xümsü yoxdur

Məsələ ۱۷۵۷: İnsan, xümsü vacib olan şeylərin xümsünü o şeylərdən, eləcə də vacib olan xümsün qiyməti miqdarında xümsü verilmiş pul da verə bilər. Amma əgər üzərinə xüms vacib olmayan bir mal vermək istəsə, bu şəriət hakiminin icazəsilə olmadığı .təqdirdə işkallıdır

Məsələ ۱۷۵۸: Malının üzərinə xums gəlib və üzərindən bir il keçdiyi halda, xümsünü .verməyincəyə qədər o maldan istifadə edə bilməz

Məsələ ۱۷۵۹: Xüms borcu olan şəxs, onu öz öhdəsinə götürə bilməz, yəni özünü xüms əhlinə borclu qəbul edib, malın hamısından istifadə edə bilməz. Əgər istifadə edərsə və .mal tələf olarsa, gərək onun xümsünü versin

Məsələ ۱۷۶۰: Xüms borcu olan şəxs, şəriət hakimi ilə əldən-ələ dolandırsa və xümsü öz öhdəsinə götürsə, malın hamısından istifadə edə bilər, əldən-ələ dolandırdıqdan sonra o maldan əldə edilən qazanclar da onun özünündür. Borcunu da tədrici olaraq, .səhlənkarlıq sayılmayacaq şəkildə qaytarmalıdır

Məsələ ۱۷۶۱: Bir kəslə şərik olan bir şəxs, əgər öz qazancının xümsünü versə və onun şəriki öz xümsünü verməsə və gələn il üçün xümsünü vermədiyi maldan şirkətə sərmayə qoyarsa, birinci şəxs on iki imam şiəsi olan müsəlmandırsa, şərikli maldan .istifadə edə bilər

Məsələ ۱۷۶۲: Həddi-büluğa çatmamış (səğir) uşaq üçün bir qazanc əldə edilsə, hərçənd hədiyyə olsa belə, əgər il boyunda onun məişət xərclərinə sərf olunsa onun üzərinə xüms gəlir və o uşağın vəlisinə (qəyyumuna) onun xümsünü verməsi vacibdir. Əgər verməsə, uşağın özünə həddi-büluğa çatdıqdan sonra, onun xümsünü verməsi .vacibdir

Məsələ ۱۷۶۳: Başqa şəxsdən, xümsünü verib-vermədiyində şəkk etdiyi bir mal əldə .edən şəxs, o maldan istifadə edə bilər

Hətta əgər onun xümsünü vermədiyinə yəqini olsa da, o, xüms verən adam deyilsə, .alan şəxs də on iki imam şiəsi olan müsəlmandırsa, o maldan istifadə edə bilər

Məsələ ۱۷۶۴: Əgər bir şəxs il arasında qazancından illik vəsait və xərclərindən sayılmayan bir şey alarsa, il tamam olandan sonra onun xümsünü verməsi vacibdir. Əgər o şeyin xümsünü verməsə və qiyməti yüksələrsə, onun hal-hazırdakı qiymətinə .görə xümsü ödənilməlidir

Məsələ ۱۷۶۵: Əgər bir şəxs bir şey alıb onun pulunu, üstündən bir il keçdiyi və xümsünü vermədiyi puldan versə, və onun qiyməti qalxsa, əgər onun məqsədi qiyməti qalxandan sonra satmaq deyilsə, məsələn; əkin əkmək üçün almış olsa və onu almaq üçün verdiyi pulun xümsünü verməlidir. Amma əgər məsələn; xümsü verilməmiş pulu satıcıya verərək və ona «bu mülkü bu pulla alıram» deyərsə, gərək o mülkün hal-.hazırdakı dəyərinin xümsünü versin

Məsələ ۱۷۶۶: Təklifinin əvvəlindən, yaxud müəyyən müddət, məsələn bir neçə il xüms verməyən şəxs, əgər il arasında qazancından ehtiyacı olmayan bir şeyi satın almış olsa və o ticarətdən bir il vaxt keçsə, əgər ticarətçi deyilsə, qazanc əldə etdiyi vaxtdan bir il keçsə, gərək onun xümsünü versin. Amma əgər ictimai mövqeyinə uyğun olaraq ev əşyaları və ehtiyacı olan şeyləri alıbsa, bu şəraitdə əgər onları qazandığı ilin ərzində və o ilin qazancından aldığını, elə o ildə də ondan istifadə etdiyini bilirsə, onların xümsünü vermək lazım deyildir. Əgər bunu bilmirsə, ehtiyat-vacibə əsasən ehtimal verdiyi nisbətdə şəriət hakimi ilə razılaşmalıdır. Yəni əgər, misal üçün onun xümsünün vacib .olmasına ۵۰ faiz ehtimal versə, onun ۵۰ faizinin xümsünü versin

## MƏDƏN .۲

Məsələ ۱۷۶۷: Qızıl, gümüş, qurğuşun, mis, dəmir, neft, daş kömür, firuzə, əqiq, kükürd, duz və digər mədən əşyaları ənfaldan sayılır, yəni Məsum İmamındır (əleyhis-səlam). Amma

əgər bir şəxs, onlardan bir şey istixrac edərsə, şəri bir maneə olmadığı təqdirdə, onu öz mülkiyyətinə daxil edə bilər. Əgər nisab miqdarında olarsa, gərək onun xümsünü .versin

Məsələ ۱۷۶۸: Mədəndən çıxarılan şeylərin nisabı, on beş misqal normal sikkəli qızıldır. Yəni mədəndən çıxarılan şeyin qiyməti, onun təmizlənməsi kimi işlərinə çəkilən xərclər çıxıldıqdan sonra, on beş misqal sikkəli qızıla çatarsa, gərək yerdə qalanın xümsünü .versin

Məsələ ۱۷۶۹: Mədəndən əldə etdiyi şeyin dəyəri ۱۵ misqal sikkəli qızıla çatmazsa, yalnız onun özü və digər qazanclarıyla birlikdə illik xərclərindən artıq qalarsa, onun xümsünü .vermək lazımdır

Məsələ ۱۷۷۰: Ehtiyat-lazıma əsasən əhəng və gəc, mədən hökmündədir. Əgər nisab .həddinə çatarsa, illik xərclərini çıxmadan gərək onun xümsünü versin

Məsələ ۱۷۷۱: Mədəndən bir şey əldə edən şəxs, istər mədən torpağın altında olsun, istər üstündə, istər öz mülkü olan bir yerdə olsun, istər sahibi olmayan bir yerdə, gərək .onun xümsünü versin

Məsələ ۱۷۷۲: Mədəndən əldə etdiyi şeyin qiymətinin on beş misqal sikkəli qızıla yetişib-yetişmədiyini bilməzsə, ehtiyat-lazıma əsasən, çəkməklə və ya başqa bir yolla onun .qiymətini məlum etməlidir. Əgər bu da mümkün olmasa, ona xüms vacib deyil

Məsələ ۱۷۷۳: Əgər bir neçə nəfərin mədəndən çıxardıqları şeyin qiyməti ۱۵ misqal sikkəli qızıla yetişərsə, amma onlardan hər birinin payı bu qədər olmazsa, xümsü .yoxdur

Məsələ ۱۷۷۴: Əgər bir şəxs, başqasının mülkündə olan mədəni onun icazəsi olmadan yeri qazaraq çıxararsa, məşhur nəzərə əsasən, hər nə əldə edilmişsə, yer sahibinindir. Amma bu hökm işkalsız deyildir. Ehtiyat budur ki, bir-birləri ilə razılaşsınlar. Əgər sazişə (müsalihəyə) razı olmasalar, onların mübahisəsini həll etmək üçün şəriət .hakiminə müraciət etməlidirlər

## xəzinə .۳

Məsələ ۱۷۷۵: Xəzinə adət üzrə olmayan yerdə (torpaqda), ağacda, dağda və ya divarda .saxlanan mənqul (daşına bilən) və bir kəsin asanlıqla tapa bilmədiyi maldır

Məsələ ۱۷۷۶: İnsan, bir şəxsin mülkü olmayan, yaxud istifadəsiz (ölü) olan və özünün becərməsi ilə sahib olduğu bir yerdə xəzinə taparsa, onu özünə götürə bilər. Amma .onun xümsünü verməlidir

Məsələ ۱۷۷۷: Xəzinənin nisabı, yüz beş misqal sikkəli gümüş və ya on beş misqal sikkəli qızıldır. Yəni xəzinədən əldə etdiyi şeyin qiyməti, bu ikisindən birisinin qiymətinə .bərabər olarsa, onun xümsünü vermək vacibdir

Məsələ ۱۷۷۸: Başqasından satın aldığı, yaxud icarə və s. yolla təsərrüf etdiyi mülkdə şərən hər hansı bir müsəlman və ya zimmi kafirə aid olmayan bir mülkdə, yaxud əgər aid olsa da, çox qədim zamanlarda aid olsa, belə ki, çox qədim olması onun üçün bir varisin olmadığına səbəb olsa, orada xəzinə tapsa xəzinəni özünə götürə bilər. Amma gərək onun xümsünü versin. Lakin, əvvəlki sahibinə aid olduğuna ağıl kəsən bir ehtimal verirsə, əgər mülkə, yaxud xəzinəyə və ya onun olduğu yerə (torpaq sahəsinə) sahiblik hüququ çatırsa, ona xəbər verməlidir. Əgər onun öz malı olduğunu iddia etsə, ona təhvil verməlidir. Əgər onun malı olmasını iddia etməzsə, ondan əvvəlki yerin sahibi olub, ona sahiblik hüququ çatan şəxsə xəbər verməlidir. Bu qayda ilə ondan əvvəl o yerin sahibi olub, o yerdə əli olan şəxslərin hamısına xəbər verməlidir. Əgər onların heç birisi onun malı olmasını iddia etməzsə, onun bir müsəlmana və ya zimmiyə aid olmasını da bilməsə, onu özünə götürə bilər. Amma gərək onun xümsünü .versin

Məsələ ۱۷۷۹: Əgər eyni zamanda bir neçə yerdə basdırılmış bir neçə qab xəzinə tapılarsa və birlikdə qiymətləri yüz beş misqal gümüş və ya on beş misqal qızıla çatarsa, gərək onun xümsünü versin. Amma əgər bir neçə vaxtda xəzinə taparsa, onların arasında çox zaman fasiləsi olmazsa, birlikdə

hesablanmalıdır. Əgər zaman fasiləsi çox olsa, hər biri ayrılıqda hesablanmalıdır (və qiyməti bu miqdara çatan hər birinin xümsünü vermək vacibdir. Qiyməti bu miqdara .(çatmayan xəzinənin isə xümsü yoxdur

Məsələ ۱۷۸۰: Əgər iki şəxs bir xəzinə tapsalar və onun qiyməti yüz beş misqal gümüş və ya ۱۵ misqal qızıla yetişsə, amma hər birisinin payı bu qiymətə yetişməsə, onun .xümsünü vermək lazım deyildir

Məsələ ۱۷۸۱: Əgər bir şəxs bir heyvan alıb, qarnından mal tapsa, əgər o malın, satıcının və ya heyvanın əvvəlki sahibinin malı olduğuna ehtimal verib və onların da heyvana və qarnından tapılan malda əli (mülkiyyət hüququ) olarsa, onlara xəbər verməlidir. Əgər onun üçün bir sahib tapmasa, o, xəzinə nisab miqdarına yetişsə, onun xümsünü verməlidir. Ehtiyat-vacibə budur ki, əgər ondan az da olsa, xümsünü versin və yerdə qalanı onun malı olur. Bu hökm xas bir yerdə yetişdirilən bir şəxsin onların yeməyini öhdəsinə aldığı balıq və bu kimi heyvanlara da aiddir. Amma əgər dəniz və ya çaydan .tutulmuş olsa, heç bir şəxsə xəbər vermək lazım deyildir

**HARAMA QARIŞAN HALAL MAL . ۴**

Məsələ ۱۷۸۲: Əgər halal mal, haram mala, ayrıd edilə bilinməyəcəyi tərzdə qarışsa və haram malın sahibi və miqdarının heç biri məlum olmasa, eləcə də haram malın miqdarının xümsdan az və ya çox olduğu da bilinməzsə, malın xümsünü verdikdən sonra, qalan hissəsi halal olur. Ehtiyat-vacibə görə, (onun xümsünü) xümsa və .məzalim verilməsinə müstəhəqq olan şəxsə verməlidirlər

Məsələ ۱۷۸۳: Əgər halal mal harama qarışsa və insan haram malın miqdarını, xümsdən az və ya çox olduğunu bilsə, ancaq sahibini tanımasa, o miqdarı sahibinin niyyəti ilə .sədəqə verməlidir. Ehtiyat-vacib budur ki, şəriət hakimindən də icazə alsın

Məsələ ۱۷۸۴: Əgər halal mal haramla qarışsa və insan haram miqdarını bilməsə, amma sahibini tanısa, bir-birlərini razı sala bilməsələr, gərək o şəxsin malı olduğunu yəqin etdiyi miqdarı ona versin. Hətta əgər o iki malın halal və haramın qarışmasında özü günahkardırsa, ehtiyata əsasən onun malı olduğunu ehtimal etdiyi artıq miqdarı da .ona verməlidir

Məsələ ۱۷۸۵: Harama qarışmış halal malın xümsünü verdikdən sonra, haramın miqdarının xümsdən çox olduğunu başa düşərsə, gərək çox olduğunu bildiyi miqdarı .da sahibinin adından sədəqə versin

Məsələ ۱۷۸۶: Əgər harama qarışmış halal malın xümsünü versə və ya sahibini tanımadığı təqdirdə malı onun niyyətilə sədəqə verərsə və sahibi tapıldıqdan sonra .buna razı olmasa, ehtiyat-lazıma əsasən gərək onun malının miqdarını özünə versin

Məsələ ۱۷۸۷: Əgər halal mal haramla qarışsa və haramın miqdarı məlum olsa, insan onun sahibinin bir neçə nəfərdən başqası olmadığını bilərsə, lakin kimin olduğunu bilməsə, gərək onlara xəbər versin. Belə ki, onlardan biri «mənim malımdır» deyərsə və o biriləri isə onların malı olmadığını desələr və ya birincinin sözünü təsdiq etsələr, onu «mənim malımdır» deyən şəxsə verməlidirlər. Amma iki və daha çox adam «mənim malımdır» deyərlərsə, onların mübahisəsi razılaşma və bu kimi yolla həll olunmazsa, mübahisələrinin həll edilməsi üçün, şəriət hakiminə müraciət etsinlər. Əgər onların hamısı məsələdən xəbərsiz olduğunu bildirib razılaşmaya hazır olmasalar, zahirə əsasən o malın sahibi püşk ilə təyin edilər. Ehtiyat budur ki, şəriət hakimi və ya onun .nümayəndəsi püşk işini icra etsin

## ÜZGÜÇÜLÜK VASİTƏSİLƏ DƏNİZDƏN ÇIXARILAN CƏVAHİRAT .۵

Məsələ ۱۷۸۸: Əgər üzgüçülük, yəni dənizə girmək vasitəsilə mirvari, mərcan və bu kimi cəvahirat əldə edilərsə, istər göyərən, istərsə də mədəni olsun, onun qiyməti ۱۸ noxud ,qızıla çatarsa

onun xümsü verilməlidir. Onun bir dəfəyə və ya neçə dəfəyə çıxarılması arasında bir fərq yoxdur. Amma birinci dəfə ilə ikinci dəfə arasında zaman fasiləsi çox olmamalıdır. Əgər iki dəfə arasında çox fasilə olarsa, məsələn, iki fəsildə suyun altına girərsə, hansının qiyməti ۱۸ noxud qızıla yetişməsə, onun xümsünü vermək vacib deyildir. Həmçinin üzgüçülükdə iştirak edən bir neçə şəxsdən hansının payı ۱۸ noxud qızıla .çatmazsa, onun xümsünü vermək vacib deyildir

Məsələ ۱۷۸۹: Əgər dənizə girmədən başqa müəyyən vasitələrlə cəvahirat əldə edilərsə, ehtiyata əsasən onun xümsü vacibdir. Amma əgər dənizin suyu üzündən və ya dənizin kənarından cəvahirat əldə edilərsə, yalnız o təklikdə və ya başqa qazancları .ilə birlikdə, illik xərclərindən artıq qalarsa, gərək onun xümsü verilsin

Məsələ ۱۷۹۰: İnsanın, dənizə girməyərək əldə etdiyi balıq və s. heyvanların xümsü, o vaxt vacibdir ki, təklikdə, yaxud sair qazanc mənfəətləri ilə birlikdə, illik xərclərindən .çox olsun

Məsələ ۱۷۹۱: Əgər insan dənizdən bir şey çıxarmaq məqsədi olmadan dənizin dibinə girib, təsadüfən cəvahirat əldə edib, ona sahib olmağı qəsd edərsə, gərək onun .xümsünü versin. Hətta ehtiyat-vacib budur ki, hər təqdirdə onun xümsünü versin

Məsələ ۱۷۹۲: Əgər insan dənizin dibinə girib bir heyvan çıxarıb, onun qarnından cəvahirat tapsa (sədəf kimi heyvan bunlara aiddir, çünki adətən onun qarnında cəvahir olur), əgər nisab həddinə yetişərsə, gərək onun xümsünü versin. Amma əgər təsadüfən cəvahiri udmuşsa, ehtiyat-lazım budur ki, onun nisab miqdarına çatmasa .da, xümsü verilsin

Məsələ ۱۷۹۳: Əgər Dəclə və Fərat kimi böyük çayların dibinə girib cəvahirat çıxartsa, .gərək onun xümsünü versin

Məsələ ۱۷۹۴: Əgər suya girib qiyməti ۱۸ noxud qızıl və ya daha çox olan bir ənbər çıxartsa, gərək onun xümsünü versin. Hətta əgər suyun üzündən və ya dəniz .kənarından da ələ gətirsə, eyni hökmü daşıyır

Məsələ ١٧٩٥: Əgər bir şəxsin qazancı üzgüçülük, yaxud mədən şeyləri çıxarmaqla təmin olursa, onların xümsünü versə

.və illik xərclərindən artıq qalsa, yenidən onların xümsünü verməsi lazım deyil

Məsələ ۱۷۹۶: Əgər bir uşaq mədən çıxarsa və ya bir xəzinə tapsa, yaxud da dənizə girməklə bir cəvahir əldə edərsə, gərək vəlisi onun xümsünü versin. Əgər vəlisi verməsə, özü həddi-büluğa çatdıqdan sonra onun xümsünü verməlidir. Həmçinin əgər uşağın harama qarışmış bir halal malı varsa, gərək vəlisi qarışıq malda deyilən hökmə .əməl etsin

## QƏNİMƏT .۶

Məsələ ۱۷۹۷: Əgər müsəlmanlar, İmamın (ələyhis-səlam) əmri ilə kafirlərlə müharibə etsələr, o müharibədən ələ gələn şeylərə "qənimət" deyilir. Qənimətdən, İmama (ələyhis-səlam) məxsus olan əşyalar ayrıldıqdan sonra yerdə qalanının xümsü verilməlidir. Qənimətə xümsün vacib olması xususunda, onun mənqul və qeyri-mənqul olması arasında bir fərq yoxdur. Amma ənfaldan olmayan ərazilər, döyüş İmamın .(ələyhis-səlam) əmrilə olmasa da, müsəlmanların hamısına aiddir

Məsələ ۱۷۹۸: Əgər müsəlmanlar, İmamın (ələyhis-səlam) icazəsi olmadan kafirlərlə döyüşüb, onlardan qənimət ələ keçirsələr, ələ gətirdikləri qənimətlərin hamısı .İmamındır (ələyhis-səlam) və döyüşə gedənlərin onda heç bir haqqı yoxdur

Məsələ ۱۷۹۹: Kafirlərin əllərində olan malların sahibləri, malının qorunması lazım olan şəxslərdən olarsa, yəni müsəlmanın, yaxud İslamın zimməsində olan bir kafirin, yaxud .əhd (müqavilə) bağlanan kafirin malı olsa, o mallara qənimət hökmü cari deyildir

Məsələ ۱۸۰۰: Hərbi kafirin malını oğurluq və bu kimi yolla əldə etmək, xəyanət və amannaməni pozma sayılarsa, haramdır. Bu yollarla onlardan alınan əşyalar da, .ehtiyata əsasən gərək qaytarılsın

Məsələ ۱۸۰۱: Məşhur nəzərə əsasən, mömin olan bir şəxs, nasibi olan (Əhli-beytlə düşmənlik edənlər) şəxslərin malını

.özünə götürüb xümsünü verə bilər. Amma bu hökm işkalsız deyildir

## ZİMMİ–KAFİRİN MÜSƏLMANDAN ALDIĞI TORPAQ .۷

Məsələ ۱۸۰۲: Əgər zimmi kafir, müsəlmandan bir yeri alsa, məşhur nəzərə əsasən, onun xümsünü həmin yerdən və ya başqa malından verməlidir. Amma xümsün .(məşhur mənasıyla) bu yerdə vacib olması işkallıdır

## XÜMSÜN SƏRF OLUNMA YERLƏRİ

Məsələ ۱۸۰۳: Xüms iki yerə bölünməlidir: Bir qismi seyyidlərindir. Gərək fəqir, yetim, yaxud da səfər zamanı yolda qalmış seyyidlərə verilsin. Digər yarısı isə İmamın (əleyhis-salam) payıdır ki, bu zəmanəmizdə cameüş-şərait müctəhidə verilməli, yaxud onun icazə verdiyi yerlərdə sərf olunmalıdır. Ehtiyat-lazıma əsasən o müctəhid, ümumi .cəhətləri bilən ələm müctəhid olmalıdır

Məsələ ۱۸۰۴: Xüms verilən yetim seyyid, fəqir olmalıdır; ancaq səfərdə yolda qalan .seyyid, hətta öz vətənində fəqir olmasa da, ona xüms vermək olar

Məsələ ۱۸۰۵: Səfərdə çətinliyə düşmüş seyyidin səfəri, günah olan bir səfər olarsa, .ehtiyat-vacibə əsasən, gərək ona xüms verilməsin

Məsələ ۱۸۰۶: Ədalətli olmayan seyyidə xüms vermək olar. Amma on iki imama (ə) .inanmayan seyyidə gərək xums verilməsin

Məsələ ۱۸۰۷: Xümsu günah işdə sərf edən seyyidə xüms vermək olmaz, hətta, xüms vermək onun günah etməsinə kömək edərsə, ehtiyat-vacibə görə gərək ona xüms verməsinlər, hətta onu günaha sərf etməyəcəksə belə. Həmçinin ehtiyat-vacib

budur ki, şərab içən, namaz qılmayan və ya aşkar günah edən bir seyyidə xüms .verməsinlər

Məsələ ۱۸۰۸: «Seyyidəm» deyən şəxsə, bu sözünə əsasən, xüms verilə bilməz. Amma əgər iki adil şəxs onun seyyid olduğunu təsdiq edərsə və ya insan onun seyyid .olmasına yəqin və ya əmin olarsa, ona xüms verilə bilər

Məsələ ۱۸۰۹: Öz şəhərində seyyid olması ilə məşhur olan şəxsə, əgər insan onun .seyyid olmamasına xatircəmliyi və ya yəqinliyi olmasa da, xüms verə bilər

Məsələ ۱۸۱۰: Xanımı seyyidə olan bir şəxs, ehtiyat-vacibə əsasən, öz xümsünü onun özünün xərcləməsi üçün ona verə bilməz. Amma əgər başqalarının xərcini ödəmək o qadına vacib olsa, o da onların xərcini ödəyə bilməsə, onlara xərcləməsi üçün, əri ona xüms verə bilər. Həmçinin vacibdən qeyri-nəfəqələrə sərf etməkdən ötəri ona xüms .verilə bilər

Məsələ ۱۸۱۱: Əgər bir kişi seyyidin və ya insanın öz arvadı olmayan bir qadın seyyidin xərclərini təmin etmək insana vacib olsa, ehtiyat-vacibə əsasən onun yeməyini, paltarını və digər vacib xərclərini xümsdan verə bilməz. Amma vacib olmayan .məsrəflərinə xərcləməsi üçün ona bir miqdar xüms verməsinin maneəsi yoxdur

Məsələ ۱۸۱۲: Xərci başqasının üzərinə vacib olan bir fəqir seyyidə, əgər o şəxs xərcini vermə gücünə sahib olmasa və ya vermə gücünə sahib olduğu halda verməsə, ona .xüms vermək olar

Məsələ ۱۸۱۳: Ehtiyat-vacib budur ki, bir fəqir seyyidə, bir illik xərclərindən artıq .miqdarda xüms verilməsin

Məsələ ۱۸۱۴: Əgər insan, yaşadığı şəhərdə müstəhəqq bir seyyid tapmasa gərək başqa şəhərə aparsın. Hətta əgər öz məntəqəsində müstəhəqq olsa da, başqa şəhərə apara bilər, bu şərtlə ki, xümsu verməkdə səhlənkarlığa yol verməsin. Hər halda, əgər tələf olsa, hərçənd onu qoruyub saxlamaqda səhlənkarlıq etməsə belə, zamindir və .onu aparmaq xərcini xümsdan götürə bilməz

Məsələ ١٨١٥: Əgər şəriət hakiminin və ya onun vəkilinin tərəfindən vəkil olaraq xümsü alsa, onun öhdəsindən götürülür.

Əgər ikisindən birinin əmri ilə xümsü alıb bir şəhərdən başqa şəhərə aparsa və .səhlənkarlıq olmadan tələf olsa, zamin deyil

Məsələ ۱۸۱۶: Malı həqiqi qiymətindən artıq hesab edib xüms olaraq vermək icazəli deyildir. ۱۷۵۷-ci məsələdə də qeyd olunduğu kimi, şəriət hakiminin icazəsi olmadan .puldan başqa, digər bir malı xüms olaraq vermək mütləqən işkallıdır

Məsələ ۱۸۱۷: Müstəhəqqdən tələbkar olan, (ona borc vermiş olan şəxs) öz tələbini xums əvəzi hesab etmək istəsə, ehtiyat-vacibə əsasən, ya gərək şəriət hakimindən icazə alsın, yaxud xümsü müstəhəqqinə verməli və sonra müstəhəqq olan şəxs onu öz borcunun əvəzinə ona geri qaytarmalıdır. Müstəhəqq olan şəxsdən vəkaləti olaraq .xümsü onun tərəfindən götürüb, borcun əvəzinə geri də ala bilər

Məsələ ۱۸۱۸: Mal sahibi, xümsu müstəhəqqinə verib ona, xümsü özünə qaytarmasını .şərt qoya bilməz

## ƏMR BİL–MƏRUF VƏ NƏHY ƏNİL–MÜNKƏR

(YAXŞILIQLARA ƏMR ETMƏK VƏ PİSLİKLƏRDƏN ÇƏKİNDİRMƏK)

Əmr bil-məruf və nəhy ənil-münkər dinin ən böyük vaciblərindəndir. Allah-təala :Qurani-kərimdə buyurur

وَ لْتَكُنْ مِنْكُمْ أُمَّةٌ يَدْعُونَ إِلَى الْخَيْرِ وَ يَأْمُرُونَ بِالْمَعْرُوفِ وَ يَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَ أُولَئِكَ هُمُ الْمُفْلِحُونَ.

Ey müsəlmanlar!) İçərinizdə (insanları) yaxşılığa çağıran, xeyirli işlər görməyi əmr) edən və pis əməlləri qadağan edən bir camaat olsun! Bunlar (bu camaat), həqiqətən . nicat tapmış şəxslərdir

Həzrət peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) buyurmuşdur: Mənim ümmətim nə qədər ki, əmir bil-məruf və nəhy ənil-münkər edir, bir-birlərini yxşılıqa dəvət edirlər, yaxşı yaşayacaqlar. Əgər belə olmazsa bərəkət onlardan götürüləcək .və onlardan bəziləri bəzilərinə zülm ilə hökümranlıq edəcək

Həzrət Əmirəl-möminin Əlidən (ələyhis-səlam) belə nəql olunur: Əmir bil-məruf və nəhy ənil-münkəri tərk etməyin. Əgər tərk etsəniz ən pis insanlar sizə hökumət .edəcəklər və sizin dualarınız qəbul olmayacaq

Məsələ ۱: Əmir bil-məruf və nəhy ənil-münkər, mərufu və münkəri yerinə yetirmək haram olduğu halda vacibdir. Belə olan surətdə əmr bil-məruf və nəhy ənil-münkər vacibi-kifaidir. Əgər bir şəxs bu vəzifəyə əməl etsə, başqalarının boynundan götürülür. Amma hər bir şəxs haram bir iş və ya vacib bir işin tərk olunması ilə üzləşərsə öz .narahatlığını söz və ya rəftarı ilə bildirməlidir. Bu miqdar vacibi-eynidir

:Həzrət Əmirəl-möminin Əlidən (ələyhis-səlam) belə nəql olunur

Həzrət Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm) bizə belə buyurdu: Günah əhli ilə qaşqabaqla rəftar edək.

Mərufu yerinə yetirmək vacib deyil, müstəhəb olduğu yerlərdə və münkəri etmək haram deyil məkruh olduğu yerlərdə, əmir bil-məruf və nəhy ənil-münkər də müstəhəbdir.

Əmir bil-məruf və nəhy ənil-münkərdə gərək səhv edən şəxsin şəxsiyyəti nəzərə alınsın ki, ona əziyyət və hörmətsizlik olmasın. Həmçinin çox pis rəftar etmək olmaz ki, din və dinin proqramlarından inciyər.

:Məsələ ۲: Əmr bil-məruf və nəhy ənil-münkərdə gərək aşağadakı şərtlər olsun

۱. Məruf və münkəri müxtəsər şəkildə olsa da, tanımaq; Deməli məruf və münkəri tanımayan və onları bir-birindən seçə bilməyən şəxsə əmr bil-məruf və nəhy ənil-münkər vacib deyil. Bəli bəzi vaxtlar əmr bil-məruf və nəhy ənil-münkəri öyrənmək və tanımaq vacibdir.

۲. Əmr və nəhyinin təsirli olacağına ehtimal versin; Deməli, onun sözünün təsirli olmayacağını bilsə fəqihlərin arasında məşhur budur ki, onun öhdəsində bir təklif yoxdur və əmr bil-məruf və nəhy ənil-münkər ona vacib deyil. Amma ehtiyat-vacib budur ki, öz narahat və incidiyini hər bir mümkün olan vasitə ilə hətta onda təsir etmədiyini bilsədə, günhkara bildirsin.

۳. Günahkarın pis işləri davam etdirməsinə qəsdi olsun; Deməli günahkar pis işləri davam etdirmək istəməsə əmr bil-məruf və nəhy ənil-münkəri etmək vacib deyil.

۴. Günahkar pis və xilaf işlərdə üzürlü olmasın; Bu etiqadla ki, etdiyi pis iş haram deyil bəlkə mübah və ya tərk etdiyi yaxşı iş vacib deyildi.

Bəli əgər münkər müqədəs Şarinin edilməsinə razı olmadığı işlərdən olsa ehtiramı olan şəxsin öldürülməsi kimi, hətta işi edən üzürlü olub və mükəlləf olmasa da onun

.qarşısını almaq vacibdir

Can, abır və mali zərər (əhəmiyyət verici dərəcədə) olsa; Bir şəxs əmr bil-məruf və .۵ nəhy ənil-münkər edəni təhdid

etməsin. Çətinlik və məşəqqət dözülməz dərəcədə olmasın. Əgər yaxşı və pis iş müqədəs Şarinin yanında çox əhəmiyyətli olsa gərək onun yolunda zərər və .çətinliklərə dözülsün

Əgər əmr bil-məruf və nəhy ənil-münkər edənə zərər olmasa amma digər müsəlmanlara can, abır və mali zərər (əhəmiyyət verici dərəcədə) olsa əmr bil-məruf və nəhy ənil-münkər vacib deyil. Belə olan surətdə zərər və o, işin əhəmiyyəti müqaisə olunur ki, bəzi vaxlar zərər olan halda da əmr bil-məruf və nəhy ənil-münkər tərk .olunmur

:Məsələ ۳: Əmr bil-məruf və nəhy ənil-münkərin bir neçə mərhələsi var

Qəlbən incidiyini və narahat olduğunu bildirmək. Günah edən şəxslə danışmamaq və .۱ .üz çevirmək kimi

.Sözlə moizə və nəsihət etmək .۲

.Əməli mərhələ, vurmq və həbs etmək kimi .۳

İlk dəfə birinci və ya ikinci mərhələdən başlamaq lazımdır. Əvəl əziyyəti az və təsiri çox olanı sekmək lazımdır. Əgər nəticəsi olmasa sonrakı çətin və əziyyətli olan mərhələlərə əl atıb və sonrakı dərəcələri seçsin. Əgər qəlbən və dillə inciməyi bildirmək birinci və ikinci mərhələlərdə təsir etməsə növbə əməli mərhələyə çatır. Ehtiyat-vacib budur ki, üçüncü mərhələni (əməli) seçməkdə şəriət hakimindən icazə alsın. Əməli əziyyət və narahatlıq az olan yerdən başlasın. Əgər nəticəsi olmasa şiddətli və ağır əməllərdən etsin. Amma gərək bədən üzvünün sınıb və ya yaralanması .ilə nəticələnməsin

Məsələ ۴: Əmr bil-məruf və nəhy ənil-münkərin vacib olması hər bir mükəlləfə nisbətən öz yaxınlarına şiddətli olmalıdır. Deməli əgər bir şəxs öz ailə və qohumlarında dini vaciblərə nisbətən namaz, oruc, xüms və s... diqqətsizlik və yüngül saymaq hiss etsə və günah etməyə qeybət, yalan və pis rəftarlar görsə gərək çox əhəmiyyət verib əmr bil-məruf və nəhy ənil-münkərin üç mərhələsinə riayət etməklə onların qarşısını

alsın və onları yaxşı işlər görməyə dəvət etsin. Amma ata və anaya nisbətən ehtiyat-vacib budur ki, gözəl əxlaq və rəftarla onlara yol göstərsin. Heç vaxt ədəbsizcəsinə .onlarla rəftar etməsin

## ZƏKATIN HÖKMLƏRİ

**Point**

:Məsələ ۱۸۱۹: On şeyə zəkat vacibdir

۱) Buğda;

۲) Arpa;

۳) Xurma;

۴) Kişmiş;

۵) Qızıl;

۶) Gümüş;

۷) Dəvə;

۸) İnək;

۹) Qoyun;

۱۰) sərmayə (ticarət malı (Ehtiyat-lazıma əsasən;

Əgər bir şəxs, bu on şeydən hər hansına sahib olsa, gərək sonradan deyiləcək şərtlər daxilində, müəyyən olunan miqdarını, müəyyən olunan yerlərə sərf etsin.

### ZƏKATIN VACİB OLMASININ ŞƏRTLƏRİ

Məsələ ۱۸۲۰: Zəkat əvvəldə deyilən on şeydə, ancaq malın sonradan deyiləcək nisab (ölçü) miqdarına çatdığı, insanın şəxsi malı olduğu və sahibinin azad olduğu təqdirdə vacib olur.

Məsələ ۱۸۲۱: Əgər insan ۱۱ ay müddətində inək, qoyun, dəvə, qızıl və gümüş sahibi olsa, ۱۲-ci ayın əvvəlində onun zəkatını verməlidir. Amma sonrakı ilin əvvəlini ۱۲-ci ay

.tamam olandan sonra hesab etməlidir

Məsələ ١٨٢٢: Zəkatın qızıl, gümüş və ticarət malında vacib olması onun sahibinin bütün il boyu ağıllı və həddi-büluğa yetmiş olması ilə şərtlənir. Amma buğda, arpa, xurma, ,kişmiş

dəvə, inək və qoyunda onların sahibinin həddi-büluğa çatması və ağıllı olması şərt .deyildir

Məsələ ۱۸۲۳: Buğda və arpaya zəkat o vaxt vacib olur ki, onlara buğda və arpa deyilsin. Kişmişin zəkatı isə, onun üzüm olduğu zaman vacib olur. Xurmanın zəkatı da, ərəb ona «təmr» dediyi vaxt vacib olur. Amma onun nisabını nəzərə almaq (və zəkatını vermək) zamanı quruduğu vaxtdır; buğda və arpanın zəkatının vacib olması xərməndə samandan ayrıldığı vaxtdır; xurma və kişmişdə isə onları dərmə zamanıdır. Əgər bu vaxtda üzürlü səbəb olmadan, eləcə də müstəhəqq ola-ola zəkatı verməyi təxirə salsa .və tələf olsa, malik ona zamindir

Məsələ ۱۸۲۴: Əvvəlki məsələdə deyilən buğda, arpa, kişmiş və xurmaya zəkatın vacib olmasında, onların sahibinin onlardan istifadə (təsərrüf) edə bilməsi şərt deyildir. Deməli, əgər mal sahibinin, yaxud onun vəkilinin əlində olmasa da, məsələn; bir şəxs .onları qəsb etmiş olsa, hər vaxt əlinə çatsa, zəkatı vacib olar

Məsələ ۱۸۲۵: İnək, qoyun, dəvə, qızıl və gümüşün sahibi, ilin bir hissəsində sərxoş və ya bihuş olarsa, zəkat ondan saqit olmaz. Həmçinin əgər buğda, arpa, xurma və kişmiş .zəkatının vacib olduğu zaman sərxoş və ya bihuş olarsa da, hökm eynidir

Məsələ ۱۸۲۶: Buğda, arpa, xurma və kişmişdən başqa şeylərə zəkatın vacib olmasında, sahibinin şərən və təkvinən onda təsərrüf etməyə qüdrətli olması şərtdir. Deməli, əgər bir şəxs onu etina olunacaq bir zaman ərzində qəsb etmiş olsa və sahibi şərən onu .təsərrüf etməkdən məhrum edilərsə, onun zəkatı yoxdur

Məsələ ۱۸۲۷: Əgər qızıl, gümüş və ya bunlar kimi zəkat vacib olan bir şeyi borc alsa və bir il saxlayarsa, gərək onun zəkatını versin. Borc verən şəxsə isə bir şey vacib deyildir. .Amma əgər borc verən şəxs onun zəkatını versə, borc alanın üzərindən götürülür

## BUĞDA, ARPA, XURMA VƏ KİŞMİŞİN ZƏKATI

Məsələ ۱۸۲۸: Buğda, arpa, xurma və kişmişin zəkatı nisab həddinə çatdıqları vaxt vacib olur. Onların nisabı üç yüz sadır. Bəzilərinin dediklərinə əsasən, təqribən ۸۴۷ .kiloqramdır

Məsələ ۱۸۲۹: Zəkatı vacib olmuş buğda, arpa, xurma və üzümün zəkatını verməzdən əvvəl, ondan bir miqdarını özü və ailəsi yeyərsə və ya zəkat niyyəti olmadan fəqirə .verərsə, sərf etdiyi miqdarın da zəkatını verməlidir

Məsələ ۱۸۳۰: Əgər buğda, arpa, xurma və kişmişin zəkatı vacib olduqdan sonra onun sahibi ölərsə, onun malından zəkat miqdarı verilməlidir. Amma əgər zəkat vacib olmazdan əvvəl ölərsə, varislərdən hansı birinin hissəsi nisab miqdarında olarsa, o öz .payının miqdarını verməlidir

Məsələ ۱۸۳۱: Şəriət hakiminin tərəfindən zəkatı toplamağa məsul edilən şəxs, buğda və arpanın samandan ayrıldığı xərmən zamanı, xurma və üzümün də quruduğu vaxt zəkatı tələb edilə bilər. Bu təqdirdə əgər bunların sahibi zəkat verməsə və zəkatı vacib .olan şey tələf olub aradan gedərsə, onun əvəzini verməyə borcludur

Məsələ ۱۸۳۲: Əgər xurma və üzüm ağacına və ya buğda və ya arpa əkininə sahib .olduqdan sonra, onların zəkatı vacib olarsa, onun zəkatını verməlidir

Məsələ ۱۸۳۳: Əgər buğda, arpa, xurma və üzümün zəkatı vacib olduqdan sonra, əkini və ya ağacı satarsa, gərək satıcı onların zəkatını versin. O, zəkatı verərsə, alıcıya bir .şey vacib deyil

Məsələ ۱۸۳۴: Əgər insan buğda, arpa, xurma və ya kişmiş alıb satanın onların zəkatını verdiyini bilsə və ya verib-vermədiyində şəkk edərsə, ona bir şey vacib deyildir. Amma əgər onların zəkatını vermədiyini bilərsə, gərək özü onların zəkatını versin. Amma əgər .satıcı onu aldadarsa, zəkatı verdikdən sonra, zəkatın miqdarını ondan tələb edə bilər

Məsələ ۱۸۳۵: Əgər buğda, arpa, xurma və kişmişin yaş olan vaxtdakı çəkisi nisab .həddinə çatsa, amma quruyandan sonra bu miqdardan az olsa, zəkat vacib deyil

Məsələ ۱۸۳۶: Buğda, arpa və xurma qurumazdan əvvəl sərf edilərsə, onların .qurusunun ölçüsü nisab miqdarında olarsa, gərək onları zəkatı verilsin

:Məsələ ۱۸۳۷: Xurma üç qismdir

.Qurudulan xurma; onunla bağlı zəkat hökmü əvvəldə deyildi .۱

.Yaş ikən istifadə edilə bilən xurma .۲

.Yetişməzdən əvvəl yeyilən xurma .۳

İkinci qism xurmanın qurusu nisab miqdarına yetişəcək miqdarda olarsa, ehtiyat-müstəhəb budur ki, onun zəkatı verilsin. Zahir budur ki, üçüncü qismin zəkatı vacib .deyil

Məsələ ۱۸۳۸: Zəkatı verilmiş buğda, arpa, xurma və kişmiş insanın yanında bir neçə il .qalarsa, zəkatı yoxdur

Məsələ ۱۸۳۹: Əgər buğda, arpa, xurma və kişmiş yağış, yaxud çay suyu ilə suvarılarsa və ya Misirdəki tarlalar (əkin sahələri) kimi, yerin rütubətindən istifadə edərsə, onun zəkatı onda birdir. Amma əgər vedrə və bu kimi şeylərlə suvarılarsa, onun zəkatı .iyirmidə birdir

Məsələ ۱۸۴۰: Əgər buğda, arpa, xurma və üzüm həm yağış suyu ilə, həm də vedrə və bu kimi şeylərlə suvarılarsa, bu təqdirdə, ürfün nəzərində «vedrə və bu kimi şeylərlə suvarıldığı» sayılarsa, onun zəkatı iyirmidə birdir. Əgər «çay və yağışla suvarıldı» deyərlərsə, onun zəkatı onda birdir. Əgər «hər ikisilə də suvarılırdı» deyərlərsə, onun .zəkatı qırxda üçdür

Məsələ ۱۸۴۱: Əgər camaatın sözündən onların nə söylədiyində şəkk edərsə və suvarma işini, xalqın hər ikisilə də suvarılmışdır və ya məsələn; yağışla suvarılmışdır

.dediyi şəkildə olduğunu bilməzsə, qırxda üç verməsi kifayətdir

Məsələ ۱۸۴۲: Əgər bir nəfər ürfün nəzərində hər ikisilə suvarılıb və ya vedrə və bu kimi şeylərlə suvarılmasında, şəkk edərsə və bilməzsə, iyirmidə birini zəkat olaraq verərsə, kifayətdir. Həmçinin əgər camaat nəzərində «yağış suyu ilə sulanmışdır» deyildiyinə .ehtimal verilirsə, hökm eynidir

Məsələ ۱۸۴۳: Əgər buğda, arpa, xurma və kişmiş yağış və çay suyu ilə suvarılarsa, vedrə və bu kimi şeylərlə suvarılmaya ehtiyacı olmadığı halda onlarla da suvarılarsa, amma vedrə və bu kimi şeylərlə edilən suvarma onun məhsulunun çoxalmasına kömək etməzsə, onun zəkatı onda birdir. Əgər adı çəkilən məhsullar vedrə və bu kimi şeylərlə suvarılarsa, yağış və çay suyuna ehtiyacı olmadığı halda onlarla da suvarılarsa, amma onlarla edilən suvarmanın onun məhsulunun çoxalmasına bir .köməyi olmasa, zəkatı iyirmidə birdir

Məsələ ۱۸۴۴: Vedrə və bu kimi şeylərlə suvarılan tarlanın yanında başqa bir əkin olarsa və onun rütubətindən istifadə edib ayrıca suvarmaya ehtiyac qalmasa, vedrə ilə suvarılan əkinin zəkatı iyirmidə birdir, onun yanında olub rütubətindən istifadə edən .əkin yerinin zəkatı isə, ehtiyata əsasən onda birdir

Məsələ ۱۸۴۵: Buğda, arpa, xurma və üzüm üçün sərf etdiyi xərcləri məhsuldan çıxıb, sonra nisab mülahizə edə bilməz. Bununla belə, əgər onlardan biri xərclənən .məsrəflər mülahizə edilməzdən əvvəl nisaba çatarsa, gərək onun zəkatını versin

Məsələ ۱۸۴۶: İnsan, əvvəl tarlaya əkdiyi toxumu (istər özündən olsun, istər almış olsun) məhsuldan götürüb sonra nisabı mülahizə edə bilməz, əksinə nisabı məhsulun .məcmusuna nisbətən mülahizə etməlidir

Məsələ ۱۸۴۷: Dövlətin malın əslindən aldığı şeyə zəkat vacib olmaz. Məsələn; əgər əkinin məhsulu ۲۰۰۰ kq olsa və dövlət onun ۱۰۰ kq-nı vergi olaraq alarsa, yalnız ۱۹۰۰ kq-.nın zəkatı vacib olar

Məsələ ۱۸۴۸: İnsan, ehtiyat-vacibə əsasən, zəkatın vacib olmasından əvvəl etdiyi .xərcləri məhsuldan götürüb, fəqət yerdə qalanının zəkatını verə bilməz

Məsələ ۱۸۴۹: Zəkat vacib olandan sonra etdiyi xərclərdən zəkat miqdarı üçün xərclədiyini onu xərcləməkdə şəriət hakimi və ya onun nümayəndəsindən icazə almış .olsa da, ehtiyata əsasən məhsuldan götürə bilməz

Məsələ ۱۸۵۰: Buğda və arpanın xərmən həddinə yetişməsini, üzüm və xurmanın

quruma vaxtına yetişməsini gözləyib sonra zəkat verməsi vacib deyildir. Zəkat vacib olan vaxt zəkat

.miqdarının qiymətini məlum edib, qiymətini zəkat olaraq, vermək caizdir

Məsələ ۱۸۵۱: Zəkat vacib olandan sonra, əkini dərmədən və ya xurma və üzümü toplamadan müstəhəqq olan şəxsə, yaxud şəriət hakiminə ya da onların nümayəndəsinə müşaən (müştərək) təslim edə bilər. Təslim edərsə, ondan sonra .edilən xərclərdə ortaqdırlar

Məsələ ۱۸۵۲: Mal sahibi əkinin və ya xurma və üzümün özünü şəriət hakiminə və ya zəkata müstəhəqq olan şəxsə, ya da onların vəkilinə təslim etdikdə, onları başqa mallar ilə birlikdə pulsuz və müşaən öz tarlasında saxlaması lazım deyildir. Onların .yığılma və ya quruma vaxtına qədər tarlasında qalması üçün muzd istəyə bilər

Məsələ ۱۸۵۳: Əgər bir insanın iqlimləri dəyişkən olub, əkin və meyvələri eyni zamanda yetişməyən bir neçə şəhərdə buğda, arpa, xurma, üzüm kimi məhsulları olsa və onların hamısı bir ilin məhsulu sayılırsa, əvvəl yetişənin miqdarı nisab miqdarına çatarsa, onun zəkatını yetişdiyi an verməlidir. Qalanlarını isə yetişdiyi vaxt verməlidir. Amma əgər əvvəl yetişənin ölçüsü nisaba çatmazsa, məhsulun sonrakı qismləri yetişənə qədər səbr edər. Əgər hamısı birlikdə nisab miqdarına yetişərsə, onun zəkatı .vacib olar, nisab miqdarına yetişməzsə, vacib olmaz

Məsələ ۱۸۵۴: Əgər üzüm və ya xurma ağacı bir ildə iki dəfə meyvə versə, birlikdə nisab .həddinə çatsa, ehtuyata əsasən, onun zəkatı vacibdir

Məsələ ۱۸۵۵: Quruduğu vaxt nisab miqdarına yetişəcək qədər təzə xurma və ya üzümü olarsa, əgər onun təzəsindən quruduğu vaxt ona vacib olan zəkat miqdarı zəkat .qəsdilə verilərsə, eybi yoxdur

Məsələ ۱۸۵۶: Quru xurma və ya üzümün zəkatı vacib olan şəxs, onların zəkatını təzə xurma və ya təzə üzümdən verə bilməz. Hətta onun qiymətini müəyyən edib, təzə olan ayrı bir üzüm və ya quru xurmanı zəkatın qiyməti olaraq verərsə də, işkallıdır. Həmçinin üzərinə təzə xurma və ya təzə üzüm zəkatı vacib olsa, onun zəkatını quru xurmadan və ya kişmişdən verə

bilməz. Hətta zəkatın qiyməti olaraq başqa bir xurma və üzümü verərsə, hərçənd təzə .olsa da, işkallıdır

Məsələ ۱۸۵۷: Borclu olan şəxs, üzərinə zəkat vacib olan mal olduğu halda ölərsə, əvvəlcə zəkata vacib olan maldan onun zəkatı bütünlüklə verilməli, sonra da onun borcu ödənilməlidir. Amma əgər zəkat onun zimməsində vacib olmuşsa, sair borcları .kimidir

Məsələ ۱۸۵۸: Borclu olan bir şəxsin buğda, arpa, xurma və ya üzümü də olsa və o, ölsə və bunların zəkatı vacib olmazdan əvvəl, varisləri onun borcunu başqa mallarından ödəyərlərsə, hansının payı nisab miqdarına yetişərsə, gərək onun zəkatını versin. Amma əgər, bunların zəkatı vacib olmazdan əvvəl onun borcunu ödəməzlərsə, belə ki, ölən şəxsin malı yalnız borcuna çatarsa, bunların zəkatını vermək vacib deyildir. Əgər ölən şəxsin malı borcundan çox olarsa və əgər onun borcunu ödəmək istədikləri halda tələbkara buğda, arpa, xurma və üzümdən də bir miqdar verməli olsalar, tələbkara verilən miqdarın zəkatı yoxdur. Yerdə qalanında isə varislərin hansının payı nisab .miqdarına yetişərsə, gərək zəkatını versin

Məsələ ۱۸۵۹: Əgər zəkatı vacib olmuş buğda, arpa, xurma və kişmişin yaxşısı və pisi .vardırsa, ehtiyat-vacib budur ki, yaxşının zəkatını pisdən verməsinlər

## QIZILIN NİSABI

:Məsələ ۱۸۶۰: Qızılın iki nisabı var

Birincisi: ۲۰ şəri misqaldır ki, hər misqal ۱۸ noxuddur. Qızıl ۲۰ şəri misqala ۱۵ adi misqala çatarsa, deyilən başqa şərtlərə də sahib olarsa, insan onun qırxda birini ki, ۹ noxud .edər, zəkat olaraq verməlidir. Əgər bu miqdara çatmazsa, onun zəkatı vacib deyildir

İkincisi: Dörd şəri misqaldır ki, üç adi misqala bərabərdir. Deməli, əgər ۱۵ (adi) misqala üç (adi) misqal əlavə olunsa, ۱۸ misqalın hamısının zəkatını qırxda birini verməlidirlər. Əgər üç misqaldan az artsa, təkcə ۱۵ misqalın zəkatı verilməlidir. Onun

artıq qalan hissəsinin zəkatı yoxdur. Həmçinin, hər nə qədər yuxarı getsə, yəni üç misqal üç misqal artsa, onların hamısının zəkatı verməlidirlər. Əgər üç misqaldan az .əlavə olunsa, artan hissənin zəkatı yoxdur

**GÜMÜŞÜN NİSABI**

:Məsələ ۱۸۶۱: Gümüşün iki nisabı vardır

Birincisi: ۱۰۵ adi misqaldır. Əgər gümüş ۱۰۵ adi misqala çatsa, qadaqda deyilən sair şərtlər də mövcud olsa, insan onun qırxda birini (۲ misqal və ۱۵ noxud) zəkat .verməlidir. Əgər bu miqdara çatmasa, zəkatı vacib deyil

İkincisi: ۲۱ misqaldır, yəni əgər ۱۰۵ misqalın üzərinə ۲۱ misqal artarsa, gərək deyildiyi kimi tamamilə ۱۲۶ misqalın zəkatı verilsin və ۲۱ misqaldan az artarsa, fəqət ۱۰۵ misqalın zəkatını verməlidir, artığı üçün zəkat yoxdur. Həmçinin, nə qədər artarsa, hökm eynidir; yəni, əgər ۲۱ misqal artarsa, hamısının zəkatını verməlidir. Əgər az əlavə edilərsə, ۲۱ misqaldan az olan qismin zəkatı yoxdur. Əgər nisab həddinə çatıb-.çatmamasında şəkk edərsə, ehtiyat-vacibə görə axtarış etməlidir

Məsələ ۱۸۶۲: Nisab miqdarına çatan qızıl və gümüşü olan bir şəxs, onun zəkatını vermiş .olsa da, birinci nisabdan azalmayanadək, gərək hər il onun zəkatını versin

Məsələ ۱۸۶۳: Qızıl və gümüşün zəkatı, ancaq onlara sikkə vurulduğu və onlarla alverin rəvac olduğu təqdirdə, vacib olur. Əgər onların sikkəsi pozulmuş olsa, amma onunla alver rəvacdadırsa zəkatı verilməlidir. Amma əgər rəvacdan düşmüş olsa, sikkəsi .qalmış olsa belə, zəkatı yoxdur

Məsələ ۱۸۶۴: Qadınların bəzək olaraq işlətdikləri sikkəli qızıl və ya gümüş alverdə də işlədilirsə, yəni yenə də qızıl və gümüş pul olduğu qüvvədədirsə, ehtiyata əsasən onun .zəkatı vacib olur. Amma əgər daha onunla alver edilmirsə, zəkatı vacib olmaz

Məsələ ۱۸۶۵: Qızıl və gümüşü olan bir şəxsin, əgər onların heç biri ilk nisab miqdarında olmasa, məsələn; ۱۰۴ misqal gümüşü və ۱۴ misqal qızılı olarsa, zəkat ona vacib deyil.

Məsələ ۱۸۶۶: Əvvəldə deyildiyi kimi, qızıl və gümüşün zəkatının vacib olması üçün, onların nisab miqdarına çatdıqdan sonra, sahibinin əlində ۱۱ ay qalmalıdır. Əgər on bir ay ərzində qızıl və gümüş ilk nisab miqdarından aşağı düşərsə, zəkat vacib olmaz.

Məsələ ۱۸۶۷: Əgər on bir ay ərzində əlində olan qızıl və ya gümüşü, digər bir şeylə dəyişdirərsə yaxud onları əridərsə, ona zəkat vacib olmaz. Amma əgər, zəkat verməkdən qaçmaq üçün onları başqa bir qızıl ya gümüşlə dəyişdirərsə, yəni qızılı, qızıl və ya gümüşlə, gümüşü, gümüş və ya qızılla dəyişdirərsə, ehtiyat-vacib budur ki, onun zəkatını versin.

Məsələ ۱۸۶۸: Əgər on ikinci ayda qızıl və gümüş pulu əridərsə, gərək onların zəkatını versin. Ərimə vasitəsilə onların qiymət və ya çəkisi azalarsa, gərək əritməzdən əvvəl vacib olan zəkatı versin.

Məsələ ۱۸۶۹: Adi ölçüdən daha çox digər filiz qarışığı olan gümüş və qızıl pulu olsa, ona qızıl pul və ya gümüş pul deyilirsə, nisab miqdarına yetişənədək, onun saf (xalis) miqdarı nisab həddinə yetişməsə də, zəkatı vacib olur. Amma əgər, ona qızıl və gümüş pul deyilmirsə, onun saf (xalis) miqdarı nisab həddinə çatsa belə, zəkatı vacib deyil.

Məsələ ۱۸۷۰: Əlində olduğu qızıl və gümüş pulun adi miqdarda digər filiz qarışığı olursa, əgər onun zəkatını adi miqdardan daha çox başqa filizi olan pul ilə ya qızıl və gümüş puldan qeyri puldan versə eybi yoxdur, amma o pul ona zəkat vacib olan miqdarın qiymətində olmalıdır.

## DƏVƏ, İNƏK VƏ QOYUNUN ZƏKATI

Məsələ ۱۸۷۱: Dəvə, inək və qoyunun zəkatının, deyilən şərtlərdən başqa, bir başqa şərti də vardır. O da, bütün il boyu çöl otundan otlamasıdır; buna görə də əgər ilin tamamını və ya

bir qismini toplanmış otdan yeyərsə, yaxud sahibinin və ya başqasının mülkü olan əkindən otlarsa, zəkatı yoxdur. Amma əgər ilin bütün günlərində bir gün və ya iki gün sahibinin mülkü olan otdan yeyərsə, ürfün nəzərində «il boyu çöldə otlayıb» deyilsə, ona zəkat vacib olur. Dəvə, inək və qoyunun zəkatının vacib olmasında, onların il boyunca işləməyən bir heyvan olması şərt deyildir. Hətta əgər bu heyvanlardan suvarmada, şumlamada və bu kimi işlərdə işlədərlərsə də, ürfün nəzərində «işsizdirlər» deyilsə, onların zəkatını verməlidir. Hətta əgər «işsizdir» deyilməsə də, gərək ehtiyat-vacibə .əsasən gərək onların zəkatı verilsin

Məsələ ۱۸۷۲: Əgər insan özünün dəvə, inək və qoyunların otlaması üçün bir şəxsin əkmədiyi bir otlağı satın alarsa və ya icarəyə götürərsə, onların zəkatının vacib olması mübahisəlidir. Amma əhvət zəkatı verməkdir. Əgər orada otarmaq üçün vergi verirsə, .gərək zəkat versin

## DƏVƏNİN NİSABI

:Məsələ ۱۸۷۳: Dəvənin on iki nisabı vardır

.۱ ۵ dəvə: zəkatı bir qoyundur. Dəvənin sayı bu miqdara yetişməzsə, zəkatı yoxdur.

.۲ ۱۰ dəvə: zəkatı iki qoyundur.

.۳ ۱۵ dəvə: zəkatı ۳ qoyundur.

.۴ ۲۰ dəvə: zəkatı ۴ qoyundur.

.۵ ۲۵ dəvə: zəkatı ۵ qoyundur.

.۶ ۲۶ dəvə: zəkatı ۲-ci ilinə daxil olmuş ۱ dəvədir.

.۷ ۳۶ dəvə: zəkatı ۳-cü ilinə daxil olmuş ۱ dəvədir.

.۸ ۴۶ dəvə: zəkatı ۴-cü ilinə daxil olmuş ۱ dəvədir.

.۹ ۶۱ dəvə: zəkatı ۵-ci ilinə daxil olmuş ۱ dəvədir.

۱۰. ۷۶ dəvə: zəkatı ۳-cü ilinə daxil olmuş ۲ dəvədir.

۱۱. ۹۱ dəvə: zəkatı ۴-cü ilinə daxil olmuş ۲ dəvədir.

۱۲. ۱۲۱ və daha çox dəvə.

Bunların zəkatını ya ۴۰ - ۴۰ hesab edilib, hər ۴۰ dənə üçün ۳-cü ilinə daxil olmuş bir dəvə verməlidir ya da ۵۰ - ۵۰ hesab

edilib, hər ۵۰ dənə üçün ۴-cü ilinə daxil olmuş ۱ dəvə versin ya da ۴۰ və ۵۰ hesab etsin. Bəzi yerlərdə ۲۰۰ dəvəyə sahib olan hal kimi, ۴۰-۴۰, yaxud ۵۰-۵۰ hesab etməkdə ixtiyar sahibidir. Lakin hər iki halda gərək hesabı elə etsin ki, yerdə bir şey qalmasın, əgər qalsa da, ۹-dan artıq olmasın. Məsələn; əgər ۱۴۰ dəvəsi varsa, ۱۰۰ dəvəsi üçün ۴-cü ilinə daxil olmuş ۲ dəvə, ۴۰ dəvə üçün də ۳-cü ilinə daxil olmuş bir dəvə versin. Zəkat olaraq verilən dəvə dişi olmalıdır. Amma əgər altıncı nisabda iki yaşlı dişi dəvə tapmasa, üç yaşlı erkək dəvə kifayətdir. Əgər bu da olmasa, hər birini almaqda ixtiyar .sahibidir

Məsələ ۱۸۷۴: İki nisab arasında zəkat vacib deyildir. Deməli, əgər dəvələrinin sayı ۵ ədəd olan birinci ölçüdən keçsə, ۱۰ ədəd olan ۲-ci ölçüyə çatmasa, yalnız ۵-nin zəkatını .verməlidir. Həmçinin, sonrakı ölçülər də belədir

## İNƏYİN NİSABI

:Məsələ ۱۸۷۵: İnəyin iki nisabı var

Otuz inək üçün: İnəyin sayı otuza çatarsa, başqa şərtlərə də malik olarsa, insan, .۱ ikinci ilinə daxil olmuş bir ədəd dana zəkat verməlidir. Ehtiyat-vacib budur ki, gərək .dana erkək olsun

Qırx inək üçün: Zəkatı üçüncü ilə daxil olmuş dişi danadır. ۳۰ ilə ۴۰ arasında olan .۲ inəyin zəkatı vacib deyil. Məsələn: ۳۹ ədəd inəyi olan bir şəxs, yalnız bunların ۳۰-nun zəkatını verməlidir. Həmçinin əgər ۴۰-dan çox inəyi olarsa, ۶۰-a çatmayanadək, yalnız ۴۰-nın zəkatını verməlidir. ۶۰-a yetişdikdən sonra, birinci nisabın iki bərabəri olduğuna görə ۲-ci ilə girmiş iki dananı zəkat verməlidir. Hər nə qədər çoxalırsa, ya ۳۰-۳۰ hesab etməli, ya da ۴۰-۴۰ hesab etməli və ya ۳۰-۴۰ olaraq hesab etməli və göstərilmiş qaydaya əsasən, zəkatı verməlidir. Amma gərək elə hesab etsin ki, bir şey artıq qalmasın, ya əgər bir şey artıq qalsa da ۹-dan artıq olmasın. Məsələn; ۷۰ inəyi olan bir şəxs, onları ۳۰ və ۴۰ hesabı ilə hesablamalıdır. Çünki, əgər ۳۰ hesabıyla hesablarsa, on ədədin zəkatı verilməmiş olaraq

.qalar. Bəzi hallarda, ۱۲۰ inəyi olduğu hal kimi, necə hesablamaqda ixtiyar sahibidir

## QOYUNUN NİSABI

:Məsələ ۱۸۷۶: Qoyunun ۵ nisabı vardır

.Qırx qoyun: zəkatı bir qoyundur. Qoyunların sayı ۴۰-a çatmayanadək zəkatı yoxdur .۱

.qoyunun: zəkatı ۲ qoyundur ۱۲۱ .۲

.qoyunun: zəkatı ۳ qoyundur ۲۰۱ .۳

.qoyunun: zəkatı ۴ qoyundur ۳۰۱ .۴

ədəd və ondan yuxarı olanda gərək ۱۰۰ ədəd ۱۰۰ ədəd hesab etsin və onların hər ۴۰۰ .۵ bir ۱۰۰ ədədinə ۱ qoyun versin. Zəkatı qoyunların özündən vermək lazım deyil, hətta .əgər digər qoyun versə və ya qoyunun qiymətinə uyğun pul versə, kifayətdir

Məsələ ۱۸۷۷: İki nisab arasında zəkat vacib deyildir. Əgər birinin qoyunlarının sayı ۴۰ ədəd olan birinci ölçüdən çox olub, ۱۲۱ ədəd olan ikinci nisaba çatmayıbsa, yalnız ۴۰ .ədədinin zəkatını verməlidir. Artığının zəkatı isə yoxdur. Sonrakı ölçülərdə də belədir

Məsələ ۱۸۷۸: Nisab miqdarına çatmış dəvə, inək və qoyunun zəkatı vacibdir. İstər .hamısı erkək və ya dişi olsun yaxud bəzisi erkək, bəzisi dişi olsun

Məsələ ۱۸۷۹: Zəkatda inəklə camış, ərəb dəvəsi ilə qeyri-ərəb dəvəsi, keçi ilə qoç və .şişək zəkatda eyni cinsdən hesab olunur və bir-birilə fərqi yoxdur

Məsələ ۱۸۸۰: Əgər zəkat üçün qoyun versə, ehtiyat-vacibə görə, ən azı iki yaşlı, keçi .versə, ehtiyata görə üç yaşına daxil olmuş olmalıdır

Məsələ ۱۸۸۱: Zəkat kimi verilən qoyunun qiyməti, sair qoyunlardan azacıq az olsa, eybi yoxdur. Amma daha yaxşı olar ki, qiyməti sair qoyunların qiymətindən çox olanı zəkat .kimi versin. Həmçinin, inək və dəvədə də eyni qayda ilə

Məsələ ۱۸۸۲: Əgər bir neçə nəfər şərik olsalar, hər birinin payı birinci nisab həddinə .çatsa, zəkatını verməlidir. Payı birinci nisab həddindən az olan şəxsə, zəkat vacib deyil

Məsələ ۱۸۸۳: Əgər bir nəfərin bir neçə yerdə inəyi, dəvəsi, yaxud qoyunu olsa və üst-.üstə nisab həddinə çatsalar, gərək onların zəkatını versin

Məsələ ۱۸۸۴: Əgər inək, qoyun və dəvəsi xəstə və eybli olsalar da, gərək onların .zəkatını versin

Məsələ ۱۸۸۵: Əgər xəstə və ya eybli yaxud qoca inəyi, qoyunu və dəvəsi varsa, zəkatını onların özündən verə bilər. Lakin onların hamısı sağlam, eybsiz və cavan olsa, xəstə, eybli və ya qocasını verə bilməz. Hətta əgər onların bəzisi sağlam, bəzisi xəstə, bir dəstəsi eybli, başqa dəstəsi eybsiz, bir miqdarı qoca və bir miqdarı cavan olsa, ehtiyat-.vacib budur ki, onların zəkatı sağlam, eybsiz və cavan heyvandan verilsin

Məsələ ۱۸۸۶: On bir ay tamam olmazdan əvvəl sahibi olduğu inəyi, qoyununu və dəvəni başqa şeylə əvəz etsə, yaxud nisabı olanı nisab miqdarı ilə həmən cinsdən əvəz etsə, məsələn; ۴۰ qoyun verib və başqa ۴۰ qoyun alsa, əgər bu iş zəkatdan boyun qaçırmaq məqsədilə olmasa, ona zəkat vacib olmaz. Amma əgər bu məqsədlə olmuş olarsa, belə ki, hər ikisinin də mənfəəti bir çeşiddə olarsa, məsələn; hər iki qoyun süd verən .qoyun olarsa, ehtiyat-lazım budur ki, onun zəkatını versin

Məsələ ۱۸۸۷: İnək, dəvə və qoyunun zəkatını verməli olan şəxs onların zəkatını başqa malından versə, onların sayı nisabdan az olmayana qədər, gərək hər il zəkatını versin. Əgər onların özündən versə və birinci ölçüdən az olsa, zəkatı vacib deyil. Məsələn; ۴۰ qoyunu olan əgər başqa malından onların zəkatını versə, qoyunları ۴۰-dan azalmayana qədər hər il gərək bir qoyun versin. Əgər onların özündən versə, ۴۰-a .çatmayana qədər ona zəkat vacib deyildir

## TİCARƏT MALININ ZƏKATI

İnsan müavizə (qarşılıqlı olaraq dəyişdirmə) əqdi ilə sahib olduğu və ticarət və qazanc əldə etmək üçün saxladığı malın ehtiyat-vacibə əsasən bir neçə şərtlə zəkatını .verməlidir. Onun zəkatı isə qırxda birdir

.Sahibi ağıllı və həddi-büluğa çatmış olmalıdır .۱

Mal ən azı ۱۵ misqal sikkəli qızıl, yaxud ۱۰۵ misqal sikkəli gümüş qədərində . ۲ .(dəyərində) olmalıdır

.Onunla ticarət etməyi qəsd etdiyi vaxtdan bir il keçməlidir .۳

Bir il boyunca ondan mənfəət götürmək niyətində qalmalıdır. Buna əsasən əgər ilin .۴ ortasında məqsədindən dönərsə və məsələn; onu xərcləri üçün sərf etmək istərsə, .onun zəkatını vermək lazım deyildir

.O malın sahibi bütün il boyunda onda təsərrüf etmək imkanına qadir olsun .۵

İlin tamamında, sərmayənin miqdarına və ya daha artıq bir miqdarla müştərisi . ۶ olmalıdır; buna əsasən əgər ilin bir qismində onun sərmayədən az müştərisi olarsa, .onun zəkatını vermək vacib deyildir

## ZƏKATIN SƏRF OLUNMA YERLƏRİ

:Məsələ ۱۸۸۸: Zəkat səkkiz yerdə sərf olunur

Fəqirə. (Fəqir özünün və ailəsinin illik xərclərini təmin edə bilməyən kəsdir. Sənət və .۱ ya mülk yaxud da sərmayəsi olan şəxs, sərmayənin mənfəətlərindən öz illik xərclərini .(təmin edə bilirsə, fəqir deyil

.(Miskinə. (Miskin, vəziyyəti fəqirdən də ağır olan kəsdir .۲

İmamın (əleyhis-səlam), yaxud onun naibinin tərəfindən zəkatı yığıb saxlamağa . ۳ onun mühasibəçisinə, onu İmama (əleyhis-səlam), yaxud onun naibinə və ya fəqirlərə

Zəkat verildiyi təqdirdə, İslama meyl edən və ya döyüşdə və digər işlərdə .۴ müsəlmanlara yardım edən kafirlər. Həmçinin, Rəsulullahın (səlləllahu ələyhi və alihi vəs-səlləm) gətirdiyi şəriətin bəzisinə imanları zəif olan müsəlmanlar, onlara zəkat vermək imanlarının güclənməsinə yol açarsa, vermək olar. Yaxud həzrət Əmirəl-möminin Əlinin (ələyhis-səlam) vilayətinə imanı olmayan müsəlmanlara zəkat vermək, onların vilayətə inanmağa rəğbətlərini artırıb inamlarına səbəb olarsa, zəkat vermək .olar

.(Qulları satın alıb azad etmək üçün; (təfsilatı ilə öz yerində deyilibdir .۵

;Borcunu verə bilməyən borcluya .۶

Allah yolunda xərcləmək. Məsələn; məscid tikmək, dini elmlər oxunan mədrəsə .۷ tikmək, şəhər təmizləmək və yolları asfalt edib genişləndirmək kimi, faydası ümumi .müsəlmanlara aid olan işlərdə xərcləmək

.İbni-səbil; yəni səfərdə çətinliyə düşmüş müsafir .۸

Bunlar zəkatın sərf edildiyi yerlərdir. Amma mal sahibi zəkatı İmamın (ələyhis-səlam) və ya onun nümayəndəsinin icazəsi olmadan ۳-cü və ۴-cü yerə sərf edə bilməz. Ehtiyat-lazıma əsasən ۷-ci yerə xərcləməkdə də şəriət hakimindən icazə almalıdır. Bu .yerlərə aid hökmlər sonrakı məsələlərdə deyiləcək

Məsələ ۱۸۸۹: Ehtiyat-vacib budur ki, fəqir və ya miskin özünün və əhl-əyalının illik xərclərindən çox zəkat almasın. Əgər bir miqdar pulu və malı olsa, yalnız bir illik .xərcinin miqdarına yetişmədiyi qədəri zəkat alsın

Məsələ ۱۸۹۰: İllik xərci olan şəxs, əgər ondan bir miqdarını xərcləyib, qaldığı miqdarın il .xərclərinə çatası olub-olmamasına şəkk etsə, zəkat ala bilməz

Məsələ ۱۸۹۱: Gəliri illik xərclərindən az olan sənətkar, malik və ya tacir xərclərinin çatışmayan hissəsi üçün zəkat ala bilər və iş alətlərini, ya mülk yaxud sərmayəsini .xərclərinə sərf etməsi lazım deyil

Məsələ ١٨٩٢: Özünün və ailə fərdlərinin illik məsrəflərinə sahib olmayan bir fəqirin, əgər içərisində oturduğu və mülkiyyətində olduğu bir evi və ya bir minik vasitəsi olarsa, belə

ki, onlarsız yaşaya bilməzsə, abrını qorumaqdan ötrü olsa da zəkat ala bilər. Ev əşyaları, qab-qacaq, qış və yay paltarı və ehtiyacı olduğu şeylər də bu kimidir. Bunlara .sahib olmayan fəqir, bunlara ehtiyacı olmuş olsa, bu şeyləri zəkatla ala bilər

Məsələ ۱۸۹۳: Kəsb (ticarət) edərək özünün və ailəsinin xərclərini təmin edə bilən bir fəqir tənbəllik üzündən bu işləri etməzsə, zəkat alması icazəli deyil. Kəsb-ticarət elm öyrənməsinə mane olan bir dini tələbə heç bir halda fəqirlərin səhmindən zəkat ala bilməz. Amma əgər təhsil almaq ona vacibi-eyni olarsa, onda ala bilər və onun təhsil alması ümumi mənfəətə malik olsa, ehtiyat-lazıma əsasən şəriət hakiminin icazəsi ilə səbilullah səhmindən alması caizdir. Sənət öyrənməsi çətin olmayan bir fəqir, ehtiyat-vacibə əsasən, zəkat almaqla yaşaya bilməz. Lakin sənət öyrənməklə məşğul olduğu .müddətdə zəkat ala bilər

Məsələ ۱۸۹۴: Əvvəli fəqir olmuş, indi «fəqirəm» deyən şəxsə, insana onun sözündən xatircəmlik gəlməsə də, zəkat verə bilər. Amma ehtiyata əsasən, əvvəldən fəqir olub-olmadığı bir şəxsə məlum olmasa, fəqir olduğuna xatircəm olmayanadək, zəkat verə .bilməz

Məsələ ۱۸۹۵: Əvvəli fəqir olmamış, indi «fəqirəm» deyən şəxsin sözündən xatircəmlik .hasil olmasa, ona zəkat vermək olmaz

Məsələ ۱۸۹۶: Zəkat verən şəxs, əgər bir fəqirdən tələbkardırsa, öz tələbini həmin .fəqirdən zəkat əvəzi hesab edə bilər

Məsələ ۱۸۹۷: Əgər bir fəqir ölsə və onun malı borcuna çatmasa, insan onda olan alacağını zəkat olaraq hesab edə bilər. Hətta, əgər onun malı borcu miqdarınca olsa, varisləri onun borcunu verməsələr və ya başqa cəhətə görə insan öz alacağını ala .bilməsə, onda olan alacağını zəkat olaraq hesab edə bilər

Məsələ ۱۸۹۸: İnsanın fəqirə zəkat olaraq verdiyi şeyin zəkat olmasını ona deməsi lazım deyil. Hətta əgər fəqir xəcalət çəkərsə, zəkat məqsədilə verilən malın zəkat olduğunu .aşkar etməməsi müstəhəbbdir

Məsələ ۱۸۹۹: Bir şəxsi fəqir hesab edərək, ona zəkat verib, sonra onun fəqir olmadığını anlayarsa və ya şəri hökmü bilmədiyindən fəqir olmayan bir şəxsə zəkat verərsə, kifayət deyildir. Bu halda əgər verilən şey qalırsa, ondan alıb müstəhəqqə verməlidir. Əgər verilən şey yox olub aradan getmişdirsə, onu alan şəxs, onun zəkat olduğunu bilirdisə, onun əvəzini ondan alıb müstəhəqq olana verə bilər. Amma əgər zəkat olduğunu bilmirdisə, ondan heç bir şey ala bilməz. Öz malından zəkatın əvəzini müstəhəqq olana verməlidir. Hətta ehtiyat-vacibə əsasən, fəqiri tanımaqda təhqiqat .aparmış olsa, yaxud şəri höccətə istinad etmiş olsa belə hökm eynidir

Məsələ ۱۹۰۰: Borclu olub, borcunu verə bilməyən şəxs, özünün illik xərclərinə malik olmasına baxmayaraq, borcunu ödəmək üçün zəkat ala bilər. Lakin o, borc aldığı malı .gərək günah işlərdə xərc etməmiş olsun

Məsələ ۱۹۰۱: Borclu olub, borcunu verə bilməyən şəxsə zəkat versə, sonra o borcu, günah işlərdə xərclədiyini bilsə, əgər o borclu fəqir olsa, ona verdiyini fəqirlərə verilən .qismindən hesab edə bilər

Məsələ ۱۹۰۲: Borclu olub borcunu ödəyə bilməyən şəxsin fəqir olmamasına .baxmayaraq insan ondan olan öz tələbini zəkat əvəzi hesab edə bilər

Məsələ ۱۹۰۳: Xərci qurtarmış, yaxud miniyi işdən düşmüş müsafir belə ki, onun səfəri günah iş üçün olmasa və borc almaqla, ya bir şeyini satmaqla məqsədə çata bilməsə, öz vətənində fəqir olmasa belə, zəkat ala bilər. Amma əgər başqa yerdə borc almaqla, yaxud bir şey satmaqla səfər xərcini təmin edə bilirsə, yalnız ora çatmaq miqdarında zəkat ala bilər. Ehtiyat-vacibə görə, əgər öz vətənində olan bir malı satmaq və ya .icarəyə verməklə yol xərcini hazırlaya bilərsə, gərək zəkat almasın

Məsələ ۱۹۰۴: Səfərdə əlacsız qalmış və zəkat almış müsafir vətəninə çatdıqdan sonra zəkatdan bir şey artıq qalmış olsa, əgər onu zəkat verən şəxsə qaytarmaq mümkün .deyilsə, gərək onu şəriət hakiminə verib, zəkat olmasını da desin

## ZƏKATA MÜSTƏHƏQ OLAN ŞƏXSLƏRİN ŞƏRTLƏRİ

Məsələ ۱۹۰۵: Mal sahibinin zəkatını verə bilən şəxs, gərək on iki imam şiəsi olsun. Əgər insan bir şəxsi, on iki imam şiəsi bilib, ona zəkat versə və sonra da şiə olmadığı məlum olsa, gərək ikinci dəfə zəkat versin. Hətta ehtiyat-vacibə görə əgər bu barədə təhqiqat .aparmış olsa və ya şəri höccətə istinad etmiş olsa belə, hökm eynidir

Məsələ ۱۹۰۶: Əgər şiə olan uşaq, ya bir dəli fəqir olsa, insan onun vəlisinə zəkat versin, bu məqsədlə ki, verilmiş zəkat, uşaq və dəlinin mülkiyyətində olsun. Həmçinin özü və ya əmin bir şəxsin vasitəsi ilə zəkatı, fəqir uşaq və ya dəliyə sərf edə bilər. Zəkatın .onlara sərf edildiyi zaman, zəkat niyyəti edilməlidir

Məsələ ۱۹۰۷: Dilənçilik edən fəqirə, fəqir olması sübut olunsa, zəkat vermək olar. Lakin zəkatı günah işlərdə xərcləyənə zəkat vermək olmaz. Hətta verilən zəkatın özünü günah işdə xərcləməsə də, zəkat verilməsi onu günah işlətməyə rəğbətləndirərsə, .ehtiyat-vacibə əsasən, həmin şəxsə zəkat vermək olmaz

Məsələ ۱۹۰۸: Şərab içən, ya namaz qılmayan və həmçinin aşkarda böyük günah edən .şəxsə, ehtiyat-vacib budur ki, zəkat verilməsin

Məsələ ۱۹۰۹: Borclu olub borcunu verə bilməyən şəxsə, onun xərcləri insana vacib olsa .da, insan onun borcunu zəkatdan verə bilər

Məsələ ۱۹۱۰: İnsan, xərcləri ona vacib olan övlad kimi şəxslərin xərclərini zəkatdan verə bilməz. Lakin əgər onların xərclərini verməsə, başqaları onlara zəkat verə bilər. Əgər xərcləri ona vacib olan şəxslərin xərclərini verməyə qadir deyilsə, zəkat da ona .vacib olsa, onların nəfəqəsini (xərclərini) zəkatdan verə bilər

Məsələ ۱۹۱۱: Əgər insan öz oğluna zəkat versə ki, (o da öz növbəsində) özünün həyat .yoldaşına, nökərinə və külfətinə xərcləsin, eybi yoxdur

Məsələ ۱۹۱۲: Ata, zəkatın Allah yolunda olan qismindən oğlunun möhtac olduğu elmi və dini kitabları alaraq ona verə bilməz. Amma əgər ümumi məsləhət bunu tələb edirsə o .halda bunu edə bilər və ehtiyata əsasən gərək şəriət hakimindən icazə alsın

Məsələ ۱۹۱۳: Ata zəkatını öz fəqir oğluna verə bilər ki, özü üçün arvad alsın, oğul da .atasının arvad alması üçün öz zəkatını ona verə bilər

Məsələ ۱۹۱۴: Xərci əri tərəfindən verilən qadına habelə əri, xərclərini verməyən, amma hərçənd onun xərclərini verməyə məcbur etmək üçün şəriət hakiminə müraciət .etməklə xərclərini ala bilən qadına zəkat vermək olmaz

Məsələ ۱۹۱۵: Siğə olunmuş bir qadın, fəqir olarsa, əri və başqaları ona zəkat verə bilər. Lakin əri ilə əqd zamanı onun xərclərini verməyə şərt edərsə, ya başqa cəhətdən onun .xərcləri ərinə vacib olsa, əri onun xərclərini verdiyi təqdirdə, ona zəkat vermək olmaz

Məsələ ۱۹۱۶: Qadın öz fəqir ərinə, hərçənd, ər zəkatı o qadının xərclərinə sərf etsə .belə, zəkat verə bilər

Məsələ ۱۹۱۷: Seyyid, seyyid olmayandan zəkat ala bilməz. Amma zərurət halı istisnadır. Ehtiyat-vacibə görə zərurət də elə bir həddə olmalıdır ki, xüms və sair vücuhatdan xərclərini təmin edə bilməsin. Həmçinin ehtiyat-vacibə görə imkan olan surətdə hər .gün o günün xərclərinə kifayət edəcək qədər almaqla o kifayətlənməlidir

Məsələ ۱۹۱۸: Seyyid olub-olmadığı məlum olmayan şəxsə zəkat vermək olar. Amma əgər özü seyyid olmasını iddia etsə və mal sahibi zəkatını ona versə, onun öhdəsindən .(zəkat vermək) götürülməz

## ZƏKATIN NİYYƏTİ

Məsələ ۱۹۱۹: İnsan, zəkatı qürbət qəsdi ilə, yəni Allah-təalaya bəndəçilik və Onun əmrini yerinə yetirmək məqsədi ilə verməlidir. Əgər qürbət qəsdi olmadan versə günah etməsinə baxmayaraq kifayətdir. Niyyətində verdiyi şeyin mal zəkatı və

ya fitrə zəkatı olduğunu da müəyyən etməlidir. Hətta əgər məsələn; buğda və arpanın zəkatı ona vacib olarsa və pulu zəkatın qiymət ünvanında vermək istəsə gərək arpa və .ya buğda zəkatının olduğunu müəyyən etsin

Məsələ ۱۹۲۰: Bir neçə malın zəkatı ona vacib olan şəxs, əgər bir miqdar zəkat verib, onların heç birisi üçün niyyət etməsə, əgər verdiyi şey onlardan birinin cinsindən olarsa, o cinsin zəkatı sayılır. Məsələn; ۴۰ qoyun və ۱۵ misqal qızılın zəkatı ona vacib olan şəxs, zəkat olaraq bir qoyun verib, onlardan heç birisinə niyyət etməzsə, qoyunların zəkatı hesab olunur. Amma əgər onların heç birinin cinsindən olmayan bir miqdar gümüş və ya əskinas pul verərsə, alimlərdən bəzisi onun, onların hamısına bölündüyünü demişlər. Lakin bu hökm işkalsız deyildir. Onun heç birisinə hesab .olmayıb, mal sahibinin mülkiyyətində qalmağı ehtimalı da vardır

Məsələ ۱۹۲۱: Əgər zəkat vermək üçün birini vəkil etsə, zəkatı o vəkilə verən vaxt gərək niyyət etsin. Ehtiyat müstəhəbb budur ki, onun niyyəti zəkatın fəqirə yetişən zamanına .qədər davam etsin

## ZƏKATIN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۱۹۲۲: İnsan, buğda və arpanın samandan ayrıldığı vaxt və xurma ilə üzümün quruduğu vaxt, gərək zəkatı fəqirə versin və ya malından ayırsın. Qızıl, gümüş, inək, qoyun və dəvənin zəkatını isə ۱۱-ci ay tamam olandan sonra, ya fəqirə verməli, ya da .malından ayırmalıdır

Məsələ ۱۹۲۳: Zəkatı ayırandan sonra, onu müstəhəqqə dərhal verməsi lazım deyil. .Əgər əql sahiblərinin nəzərində düzgün sayılan bir məqsədlə təxirə salsa, eybi yoxdur

Məsələ ۱۹۲۴: Zəkatı müstəhəqqə çatdırmaq imkanı olan şəxs, əgər onu çatdırmasa və .səhlənkarlıq üzündən aradan gedərsə, gərək onun əvəzini versin

Məsələ ۱۹۲۵: Zəkatı müstəhəqqə çatdırmaq imkanı olan şəxs, əgər zəkatı verməsə və mühafizəsində səhlənkarlıq etdiyi halda

aradan gedərsə, zəkatı gecikdirməkdə səhih bir məqsədi yoxdursa, gərək onun əvəzini versin. Hətta əgər səhih bir məqsədi olsa, məsələn; müəyyən bir fəqiri nəzərə .alıbsa və ya tədricən fəqirlərə çatdırmaq istəyirsə, ehtiyat vacibə görə zamindir

Məsələ ۱۹۲۶: Əgər zəkatı malın özündən ayırsa, qalan malı işlədə bilər və əgər başqa .maldan kənara qoysa, bütün malı işlədə bilər

Məsələ ۱۹۲۷: İnsan ayırıb kənara qoyduğu zəkatı özü üçün götürüb yerinə başqa şey .qoya bilməz

Məsələ ۱۹۲۸: Əgər ayırıb kənara qoyduğu zəkatdan mənfəət hasil olsa, məsələn; zəkat .üçün kənara qoyduğu qoyun doğsa, zəkat hökmündədir

Məsələ ۱۹۲۹: Əgər zəkatı ayırıb kənara qoyan vaxt bir müstəhəqq hazır olsa, yaxşı olar ki, zəkatı ona versin. Amma əgər başqa bir nəfər nəzərdə tutmuş olsa və zəkatı ona vermək müəyyən bir cəhətdən daha yaxşı olsa, gərək zəkatı nəzərdə tutduğu şəxsə .versin

Məsələ ۱۹۳۰: Əgər şəriət hakiminin icazəsi olmadan, zəkat üçün ayırıb kənara qoyduğu mal ilə ticarət edərsə və zərər etsə, zərər adı ilə zəkatdan çıxa bilməz, amma əgər .mənfəət etsə, ehtiyat-lazıma əsasən, gərək onu müstəhəqqə versin

Məsələ ۱۹۳۱: Əgər zəkat ona vacib olmazdan əvvəl, zəkat əvəzi fəqirə bir şey versə, zəkat hesab edilmir və zəkat ona vacib olandan sonra fəqirə verdiyi şey aradan .getməyibsə və o fəqir də öz fəqirliyində qalıbsa, ona verdiyini zəkat hesab edə bilər

Məsələ ۱۹۳۲: Zəkatın bir adama vacib olmadığını bilən fəqir, əgər o adamdan bir şeyi zəkat adı ilə alsa və o şey yanında məhv olsa, zamindir. Belə ki, insana zəkat vacib olan vaxtda, əgər o fəqir öz fəqirliyində qalmış olsa, ona verdiyi şeyi zəkat əvəzində hesab .edə bilər

Məsələ ۱۹۳۳: Zəkatın bir adama vacib olmadığını bilməyən fəqir, əgər o zəkat olaraq bir şey alsa və onun yanında tələf olarsa, zamin deyil və insan onun əvəzini zəkat hesab

Məsələ ۱۹۳۴: Müstəhəbdir ki, inək, qoyun və dəvənin zəkatını abırlı fəqirlərə versin və zəkat verməkdə öz qohumlarını başqalarından, elm-kamal əhlini, elm-kamala sahib olmayanlardan, dilənçi olmayanları, dilənçilərdən üstün tutsun. Amma ola bilsin ki, bir .fəqirə zəkatı vermək müəyyən bir cəhətdən daha yaxşı olsun

.Məsələ ۱۹۳۵: Yaxşı olar ki, zəkatı aşkar, müstəhəbbi sədəqə isə gizli verilsin

Məsələ ۱۹۳۶: Zəkat vermək istəyən şəxsin şəhərində bir müstəhəqq olmasa və zəkatı müəyyən olunmuş digər yerlərdə sərf edə bilməsə, onu başqa bir yerə apara bilər. Bu halda əgər onun saxlanmasında səhlənkarlıq etməsə və tələf olsa, zamin deyil. O, şəriət hakimindən vəkalət alıb, onun vəkili adı ilə zəkatı götürərək onun icazəsi ilə başqa şəhərə apara bilər. Əgər zəkat tələf olsa, zamin deyildir. Aparma xərcini .zəkatdan götürə bilər

Məsələ ۱۹۳۷: Əgər öz şəhərində müstəhəqq tapılsa, zəkatı başqa şəhərə apara bilər. Amma o şəhərə aparmaq xərclərini özündən verməlidir və əgər zəkat məhv olsa, .zamindir. Şəriət hakiminin icazəsi olsa, bu hal istisnadır

Məsələ ۱۹۳۸: Zəkat kimi verilən buğda, arpa, kişmiş və xurmanın ölçülməsində alınan .muzd, (zəkat verənin) özünün öhdəsinədir

Məsələ ۱۹۳۹: İnsan verdiyi zəkatı müstəhəqqindən ona geri satmağını istəməyi məkruhdur, amma əgər müstəhəqq götürdüyü şeyi satmaq istəsə, o şeyə qiymət .qoyandan sonra, o kəs ki, zəkatı ona vermişdir, onu almaqda başqalarından irəlidir

Məsələ ۱۹۴۰: Əgər bir şəxs vacib olan zəkatı verib-vermədiyində şəkk edetsə, zəkat vacib olan mal mövcuddursa, onun şəkki keçmiş illərin zəkatı xüsusunda olsa belə, zəkatı verməlidir. Amma əgər o malın eyni tələf olmuşdursa, həmin ilin zəkatı olsa .belə, ona heç bir şey vacib deyildir

Məsələ ۱۹۴۱: Fəqir zəkatı almamışdan qabaq onu miqdarından az qiymətə sülh edə (razılaşa) bilməz, ya bir şeyi onu qiymətindən bahasına zəkat əvəzi qəbul edə bilməz. Həmçinin malik verdiyi zəkata, geri qaytarmaq şərtini qoya

bilməz, amma əgər müstəhəqq zəkatı aldıqdan sonra onu malikə qaytarmağına razı olsa maneəsi yoxdur. Məsələn; bir kəs çox zəkat verməyi borcludur, özü də fəqir olub və zəkatı verə bilmir, hal-hazırda da tövbə etmişdir. Əgər fəqir razı olsa ki, onu .götürsün və ona bağışlasın, işkalı yoxdur

Məsələ ۱۹۴۲: İnsan, zəkatın Allah yolunda xərclənən qismindən Quran, dini və dua kitabları alıb vəqf edə bilməz. Amma əgər ümumun məsləhəti bunu lazım bilirsə ala .bilər və ehtiyat-lazıma əsasən, gərək şəriət hakimdən icazə alsın

Məsələ ۱۹۴۳: İnsan zəkatdan müəyyən əmlak alıb öz övladına, yaxud xərclərinin ona vacib olduğu şəxslərə, “onun gəlirini öz xərclərinə istifadə etsinlər” deyə, vəqf edə .bilməz

Məsələ ۱۹۴۴: İnsan fəqir olmasa da və ya illik xərcləri miqdarında zəkat almış olsa da, həccə, ziyarətə və bu kimi yerlərə getmək üçün zəkatın Allah yolunda xərclənən qismindən zəkat ala bilər. Amma bu, onun həccə, ziyarətə və bu kimi yerlərə getməsi ümumi bir mənfəət olduğu təqdirdədir. Ehtiyata əsasən, zəkatın bu kimi işlərdə .xərclənməsi üçün şəriət hakimindən icazə alınmalıdır

Məsələ ۱۹۴۵: Əgər malik müəyyən bir fəqiri, onun malının zəkatını verməyə vəkil etsə, bu halda fəqir, malikin qəsdinin o fəqirin həmin zəkatdan götürməməsi olduğunu ehtimal versə, ondan özü üçün götürə bilməz. Amma malikin məqsədinin bu .olmadığına yəqin etsə, özünə götürə bilər

Məsələ ۱۹۴۶: Əgər fəqir zəkat olaraq dəvə, inək, qoyun, qızıl və gümüşü alsa və zəkatın .vacib olması üçün deyilən şərtlər onlarda mövcud olsa, onun zəkatını verməlidir

Məsələ ۱۹۴۷: Əgər zəkatı vacib olmuş bir malda iki nəfər şərik olsa, onlardan biri öz payının zəkatını verib, sonra malı bölsələr, belə ki, şərikinin öz payının zəkatını vermədiyini və həmçinin, sonradan da verməyəcəyini bilsə də onun öz payında .təsərrüf etməsinin maneəsi yoxdur

Məsələ ۱۹۴۸: Xüms və ya zəkat borcu olanın üzərinə kəffarə, nəzr kimi şeylər də vacib

olsa, həm də başqa bir borcu olsa, belə ki, hamısını verə bilməsə, əgər xüms, ya zəkat vacib olan mal aradan getməmiş olsa, gərək xüms və zəkatını versin. Əgər

aradan getmiş olsa, zəkat, xüms və borcu vermək, kəffarə və nəzri verməkdən .əvvəldir

Məsələ ۱۹۴۹: Xüms, ya zəkat borcu olan və İslam həcci ona vacib olan şəxs, həm də borcu olub ölsə və onun qalan malı bu borcların hamısına kifayət etməsə, belə ki, xüms və zəkatı vacib olmuş mal aradan getməmiş olsa, xüms və zəkatını verməli və qalan malını da borcuna sərf etməlidir. Amma əgər xüms və zəkatı vacib olan mal aradan getmişsə, onun malını borclarının ödənməsinə sərf etməlidirlər. Əgər bir şey qalarsa, həcc üçün sərf etməlidirlər. Əgər başqa bir şey də qalarsa, xüms ilə zəkatın arasında .bölməlidirlər

Məsələ ۱۹۵۰: Elm öyrənməyə məşğul olan bir şəxs, əgər təhsil almasa, dolanışığı üçün işləyə bilərdisə, belə ki, o elmi öyrənmək vacibi-eyni olsa, ona fəqirlərin səhmindən zəkat vermək olar. Əgər təhsil aldığı elm, ümumi məsləhət olarsa, ehtiyata əsasən şəriət hakiminin icazəsilə zəkatın Allah yolunda xərclənən (səbilillah) paydan ona .vermək caizdir. Bu iki surətdən başqa hallarda ona zəkat vermək icazəli deyil

## FİTRƏ ZƏKATI

Məsələ ۱۹۵۱: Fitr bayramının axşamı, günəş batdığı vaxt həddi-büluğa çatan və ağıllı olub, bihuş, fəqir və başqasının qulu olmayan şəxsə, özü və onun çörək yeyəni sayılan şəxslərin hər biri üçün, bir «sa`» təqribən ۳ kiloqram öz şəhərində normal olan yeməklərdən, məsələn; buğda, arpa, xurma, kişmiş düyü və qarğıdalı kimi, müstəhəqqə verməlidir. Bunun əvəzinə pul verərsə, kifayətdir. Ehtiyat-lazım budur ki, öz şəhərində adi olmayan yeməklərdən, buğda, arpa, xurma və kişmiş də olsa, .verməsin

Məsələ ۱۹۵۲: Özünün və ailəsinin illik xərclərinə sahib olmayan və onun və ailəsinin xərclərini təmin edəcək bir kəsbi də olmayan bir şəxs, fəqirdir. O şəxsin fitrə zəkatı .verməsi vacib deyildir

Məsələ ۱۹۵۳: İnsan, fitr bayramı gecəsinin gün batan vaxtı onun çörəyini yeyən hesab olunan şəxslərin fitrəsini gərək versin. İstər kiçik olsun və ya böyük, istər müsəlman olsunlar, istərsə kafir, istər onların xərclərini vermək ona vacib olsun, istərsə olmasın, .istər onun şəhərində, istərsə başqa şəhərdə olmuş olsalar da, gərək fitrələrini versin

Məsələ ۱۹۵۴: Başqa şəhərdə olub, çörək yeyəni hesab edilən şəxsin onun öz malından özünün fitrəsini verməyə vəkil etsə, belə ki, fitrəsini verəcəyinə xatircəm olsa özünün, .onun fitrəsini verməsi lazım deyildir

Məsələ ۱۹۵۵: Fitr bayramı gecəsi, gün batmazdan əvvəl gəlib onun çörəyini yeyən .(müvəqqəti olsa da) hesab olunan qonağın fitrə zəkatı ev sahibinə vacib olur

Məsələ ۱۹۵۶: Fitr bayramı axşamı günəş batdıqdan sonra gələn qonağın fitrəsini vermək, onun çörəyini yeyən hesab olunursa, ehtiyata əsasən, onun fitrəsini vermək vacibdir. Əks təqdirdə, vacib deyildir. Bayram gecəsi iftara çağırdığı şəxs ev sahibinin .çörəyini yeyən hesab olunmur və onun fitrəsi ev sahibinə vacib deyil

Məsələ ۱۹۵۷: Fitr bayramı axşamı, gün batdığı vaxt, dəli olan şəxsin dəliliyi bayram gününün zöhrünə qədər qalarsa, ona fitrə zəkatı vermək vacib deyildir. Əks təqdirdə .ehtiyat-vacibə əsasən fitrəni verməsi lazımdır

Məsələ ۱۹۵۸: Əgər gün batmazdan əvvəl, uşaq həddi-büluğa çatarsa, dəli ağıllanarsa və ya fəqir dövlətli olarsa, fitrənin vacib olma şərtlərinə malik olduğu təqdirdə gərək .fitrə zəkatı versin

Məsələ ۱۹۵۹: Fitr bayaramı axşamı, gün batdığı vaxt, fitrə zəkatı vacib olmayan şəxs, əgər bayram gününün zöhrünə qədər, fitrənin vacib olma şərtləri onda mövcud olsa, .ehtiyat-vacib budur ki, fitrə zəkatını versin

Məsələ ۱۹۶۰: Fitr bayramı gecəsi, gün batandan sonra müsəlman olmuş kafirə fitrə vacib deyil, amma şiə olmayan müsəlman Ayı gördükdən sonra şiə olsa, gərək fitrə .zəkatını versin

Məsələ ١٩۶١: Fəqət bir sa (təqribən ٣ kq) buğda və bu kimi şeylərə malik olan şəxsə, .müstəhəbbdir ki, fitrə zəkatı versin

Ailəsi olub, onların da fitrə zəkatını vermək istəsə, o bir sa`nı fitrə niyyəti ilə ailə üzvlərindən birinə verər, o da bu niyyətlə bir başqasına verib, bu qayda ilə ailəsinin axırıncı üzvünə qədər dolandırar. Axırıncı şəxsin də aldığı şeyi özlərindən olmayan bir başqasına verməsi daha yaxşıdır. Əgər onlardan biri dəli, yaxud səğir uşaqdırsa, uşağın vəlisi onun yerinə ala bilər. Amma ehtiyat-müstəhəb budur ki, onun niyyətinə .deyil, özü üçün götürsün

Məsələ ۱۹۶۲: Fitr bayramı gecəsi, gün batandan sonra bir şəxs uşaq sahibi olarsa, onun fitrə zəkatını vermək vacib deyil. Əgər gün batandan əvvəl uşağı doğulsa, yaxud izdivac etsə, əgər onun çörək yeyəni sayılsa, gərək onların da fitrəsini versin. Əgər başqasının çörək yeyəni olsalar, ona vacib deyil. Əgər başqa bir kəsin çörək yeyəni .deyillərsə, qadının fitrəsi onun özünə vacibdir, uşağa isə bir şey vacib deyil

Məsələ ۱۹۶۳: Əgər insan birinin çörək yeyəni olub, gün batmazdan əvvəl başqasının çörək yeyəni olsa, onun fitrəsi sonrakı şəxsə vacibdir. Məsələn; əgər qız, gün .batmazdan əvvəl ər evinə getsə, gərək əri onun fitrəsini versin

Məsələ ۱۹۶۴: Fitrəsinin başqası tərəfindən verilməsi lazım olan şəxsin öz fitrəsini verməsi vacib deyil. Amma əgər o fitrəni verməsə və ya verə bilməsə, ehtiyat-vacibə görə onun özünə vacib olur. Əgər ۱۹۵۱-ci məsələdə deyilən şərtlərə malik olsa, gərək .öz fitrəsini versin

Məsələ ۱۹۶۵: Fitrəsi başqasına vacib olan şəxs, öz fitrəsini versə, onun fitrəsi başqasına .vacib olan şəxsin boynundan saqit olmur

Məsələ ۱۹۶۶: Seyyid olmayan şəxs, seyyidə fitrə verə bilməz. Hətta əgər bir seyyid .onun çörək yeyəni olsa, onun fitrəsini başqa seyyidə verə bilməz

Məsələ ۱۹۶۷: Ana və ya dayədən süd əmən uşağın fitrəsi, ana, yaxud dayənin xərclərini verən şəxsə aiddir. Lakin əgər ana və ya dayə öz xərclərini uşağın malından .götürsələr, uşağın fitrəsi heç kəsə vacib deyil

Məsələ ۱۹۶۸: İnsan ailəsinin xərclərini haram maldan versə də, gərək onların fitrəsini

Məsələ ۱۹۶۹: Əgər insan bənna, xərrat və xidmətçi kimi əcir tutduğu şəxsin, onun çörəyini yeyən hesab olunacaq şəkildə xərclərini verərsə, gərək onun fitrəsini də versin. Amma əgər, fəqət onun işinin ücrətini verərsə, onun fitrəsini vermək ona vacib .deyildir

Məsələ ۱۹۷۰: Əgər bir şəxs, Fitr bayramı gecəsi, gün batmazdan əvvəl ölərsə, onun və ailə üzvlərinin fitrəsini onun malından vermələri vacib deyildir. Amma əgər gün batandan sonra ölərsə, üləmanın çoxu, buyurmuşlar ki, gərək onun və ailə üzvlərinin fitrəsini onun malından versinlər. Amma bu hökm işkalsız deyildir. Ehtiyatın tələbi .gərək tərk edilməsin

## FİTRƏ ZƏKATININ İSTİFADƏSİ

Məsələ ۱۹۷۱: Fitrə zəkatı ehtiyat-vacibə əsasən, yalnız fəqirə verilməlidir. Məqsəd budur ki, fitrə zəkatı mal zəkatına müstəhəqq olanların şərtlərini özündə cəm edən şiə fəqirlərə verilməlidir. Amma əgər onun şəhərində şiə fəqir yoxdursa, başqa müsəlmanların fəqirlərinə də verə bilər. Amma hər təqdirdə gərək nasibiyə (Əhli-.Beytlə düşmənlik edənə) verilməsin

Məsələ ۱۹۷۲: Əgər bir şiə uşağı fəqir olsa, insan fitrəni ona xərcləyə və ya uşağın .vəlisinə verməklə uşağın mülkü edə bilər

Məsələ ۱۹۷۳: Fitrə verilən fəqirin adil olması lazım deyildir. Lakin ehtiyat-vacibə əsasən, .şərab içən, namaz qılmayan və aşkara günah edənə fitrə verilməsin

.Məsələ ۱۹۷۴: Fitrəni günah işlərdə xərcləyən şəxsə, gərək fitrə verilməsin

Məsələ ۱۹۷۵: Ehtiyat-müstəhəb budur ki, bir fəqirə bir sadan (təqribən ۳ kq) az fitrə verilməsin, cəm olan fəqirlərə çatmasa, bu hal istisnadır. Amma çox verilsə, eybi .yoxdur

Məsələ ۱۹۷۶: Qiyməti adi qiymətdən iki dəfə artıq olan maldan, məsələn; adi buğda qiymətindən iki dəfə artıq olan buğdadan yarım sa versə, kifayət deyildir. Hətta əgər

.onu fitrə qiyməti məqsədi ilə də versə, kifayət deyildir

Məsələ ۱۹۷۷: İnsan yarım sanı bir cinsdən, məsələn; buğdadan və onun başqa yarısını .isə arpadan verə bilməz, əgər onu fitrə qiyməti məqsədilə də versə, kifayət deyildir

Məsələ ۱۹۷۸: Fitrə zəkatını verdikdə öz fəqir qohumlarını və qonşularını başqalarından üstün tutmaq müstəhəbdir. Elm, din və fəzilət əhli olan fəqirləri başqalarından üstün .tutmaq daha yaxşıdır

Məsələ ۱۹۷۹: Əgər insan birinin fəqir olmasını xəyal edib ona fitrə versə, sonra fəqir olmadığını başa düşsə, belə ki, ona verdiyi mal aradan getməmiş olsa, gərək geri alıb müstəhəqqə versin, əgər ala bilməsə, öz malından fitrənin əvəzini verməlidir. Əgər verdiyi şey aradan getmişdirsə, fitrəni alan şəxs aldığı şeyin fitrə olduğunu bilirdisə, onun əvəzini verməsi lazımdır. Əgər bilmirdisə onun əvəzini vermək ona (fəqirə) vacib .deyil və insan gərək fitrəni yenidən versin

Məsələ ۱۹۸۰: Bir şəxsin «mən fəqirəm» deməsi ilə ona fitrə vermək olmaz. Amma onun sözündən insana xatircəmlik hasil olarsa və ya əvvəllər onun fəqir olduğunu bilirdisə, .ona fitrə verilə bilər

## FİTRƏ ZƏKATININ MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۱۹۸۱: İnsan gərək fitrə zəkatını qürbət məqsədilə, yəni Allah-təalanın əmrini yerinə yetirmək və bəndəçilik məqsədilə versin və onu verən zaman fitrə vermək .niyyətini etsin

Məsələ ۱۹۸۲: Əgər Ramazan ayından əvvəl fitrə versə, səhih deyildir və yaxşısı odur ki, Ramazan ayında da fitrəni verməsin. Lakin əgər Ramazandan əvvəl bir fəqirə borc versə və ondan sonra fitrə ona vacib olsa, öz borcunu fitrə əvəzi hesab etsə, maneəsi .yoxdur

Məsələ ۱۹۸۳: Fitrə üçün verdiyi buğda və ya başqa bir şey, başqa bir malla, yaxud torpaqla qarışıq olmamalıdır. Əgər qarışıbsa, onun safı bir sa olsa və ayırmadan istifadəsi mümkün olsa və ya ayırmaq fövqəladə artıq bir zəhmət istəməzsə, yaxud

.da qarışıq olan şey etina edilməyəcək qədər az olarsa, eybi yoxdur

.Məsələ ۱۹۸۴: Əgər fitrəni eybli bir şeydən versə, ehtiyat-vacibə əsasən, kifayət deyil

Məsələ ۱۹۸۵: Bir neçə nəfərin fitrəsini verən adamın hamısının bir maldan verməsi lazım deyildir. Məsələn; bəzisinin fitrəsini buğdadan və bəzisinin fitrəsini arpadan .versə, kifayətdir

Məsələ ۱۹۸۶: Fitr bayramı namazını qılan, ehtiyat-vacibə əsasən, gərək bayram namazından əvvəl fitrəni versin. Lakin əgər bayram namazı qılmasa, fitrəni zöhrə .qədər gecikdirə bilər

Məsələ ۱۹۸۷: Əgər fitrə niyyəti ilə malından bir miqdarını kənara qoyub, bayram günü zöhrə qədər müstəhəqqə verməsə, onu hər vaxt versə, fitrə niyyəti etsin. Əgər təxirə .salmaq ağıllı bir məqsəd üçün olsa, eybi yoxdur

Məsələ ۱۹۸۸: Əgər bayram günü zöhrə qədər fitrəni verməsə və kənara da qoymasa, .ehtiyat-vacibə əsasən sonradan əda və qəza niyyəti etmədən fitrəni versin

Məsələ ۱۹۸۹: Əgər fitrəni ayırıb kənara qoysa, onu özü üçün götürə bilməz və başqa .malı fitrə üçün onun yerinə qoya bilməz

Məsələ ۱۹۹۰: İnsanın fitrəsinin qiymətindən artıq olan bir malı olsa, fitrə verməyib, bu .malın bir qisminin fitrə üçün olmasını niyyət edərsə, ehtiyat-vacibə görə kifayət deyil

Məsələ ۱۹۹۱: Əgər fitrə üçün ayırıb qoyduğu malı aradan getsə, belə ki, fəqir tapıbsa və o fitrəni gecikdiribsə və ya qorumaqda səhlənkarlıq edibsə, gərək əvəzini versin. Əgər .fəqirə əli çatmamışsa və ya qorumaqda səhlənkarlıq etməyibsə, zamin deyil

Məsələ ۱۹۹۲: Əgər öz yerində müstəhəqq tapsa, ehtiyat-vacib budur ki, fitrəni başqa yerə aparmasın, əgər başqa yerə aparıb müstəhəqqə versə kifayətdir. Əgər başqa .yerə aparsa və tələf olsa, gərək onun əvəzini versin

## HƏCCİN HÖKMLƏRİ

Məsələ ۱۹۹۳: Həcc, Allah evinin ziyarəti və orada göstəriş verilmiş əməllərin yerinə yetirilməsindən ibarətdir. Bütün ömür boyu, aşağıdakı şərtlərə malik olan bir şəxsə, :Həcc bir dəfə vacib olur

.Hədd-büluğa çatmış olsun .۱

.Aqil və azad olsun .۲

Həccə getməsi vasitəsilə tərk edilməsi şəriətdə həccdən daha böyük olan haram bir .۳ işi etmək məcburiyyətində qalmamalı və ya həccdən daha mühüm olan vacib bir əməli tərk etmək məcburiyyətində qalmamalıdır. Amma əgər bu halda həccə getsə, günah .etməsinə baxmayaraq, həcci səhih olur

:Müstəti olsun; Müstəti olmaq, bir neçə şeylədir .۴

Yol azuqəsi və ehtiyacı olan surətdə miniyi olsa və ya bunları əldə etməyə imkan (۱ ;verən malı olarsa

Məkkəyə getməyə və çox əziyyət çəkmədən həcci yerinə yetirməyə sağlamlığı və (۲ qüvvəsi olsun. Bu şərt həcci şəxsin özünün yerinə yetirməsində şərtdir. Bir kəsin maddi imkanı olsa, amma şəxsən özü həccə getmək üçün fiziki qüdrəti olmasa, yaxud şəxsən getməsi çox çətin olsa, (fiziki) vəziyyətinin də yaxşılaşmasına ümidi olmasa, gərək .başqasını bu işə naib tutsun

Yolda getməyə mane olan bir şey olmasın; əgər yol bağlı olsa və ya yolda insanın (۳ canının, yaxud namusunun aradan getməsindən, ya malının aparılmasından qorxusu olsa, həcc ona vacib olmur. Lakin əgər başqa yol ilə gedə bilsə, uzaq olmağına baxmayaraq gərək o yol ilə getsin, amma o yol, «həcc yolu bağlıdır» deyiləcək dərəcədə .uzaq və qeyri-adi olsa, gərək o yolla getməsin

Sair cəhətlərdən imkanı olsun ki, həcc əməllərini yerinə yetirə biləcək qədər vaxtı (۴
.olmalıdır

Xanımı və uşaqları kimi xərclərini təmin etmək ona vacib olan şəxslərin və ya ( ۵
.xərcliyin tərk olunması şəxs üçün çətin olan şəxslərin xərclərini təmin etmiş olmalıdır

Geri qayıtdıqdan sonra yaşayışını qazanc, əkinçilik, mülk gəliri və ya başqa bir yolla (۶
təmin edə bilməlidir. Belə ki, həccdən qayıtdıqdan sonra, həccə xərc etdiyi üçün
.çətinliklə yaşamağa məcbur qalmamalıdır

Məsələ ۱۹۹۴: Özünə məxsus evi olmadan ehtiyacını ödəməkdə çətinliyə düşən bir
.şəxsə, həcc, yalnız evin puluna sahib olduğu təqdirdə, vacibdir

Məsələ ۱۹۹۵: Məkkəyə gedə bilən qadın, qayıdandan sonra özünün malı olmasa və əri
də məsələn, fəqir olub onun xərcini verə bilməsə və çətinliklə yaşamağa məcbur olsa,
.həcc ona vacib deyildir

Məsələ ۱۹۹۶: Yol azuqəsi və miniyi olmayan bir şəxsə, başqa birisi «sən həccə get, sənin
həcc səfərində olduğun müddətdə sənin və ailənin təminatını mən ödəyəcəyəm»
.deyərsə, onun bu sözünə əmin oluna bilərsə, həcc ona vacib olar

Məsələ ۱۹۹۷: Bir şəxsə həccə getməsi üçün, həccə gediş-qayıdış məsrəflərini və bu
müddət ərzində ailəsinin yaşayışını təmin edəcək qədər mal bağışlanarsa, hərçənd
borclu olsa və həccdən qayıtdıqdan sonra yaşayışını təmin edəcək qədər malı olmasa
da, həcc ona vacib olar. Amma əgər həcc günləri onun qazanc və iş günləri ilə eyni
günlərə təsadüf olunarsa, belə ki, həccə getdiyi təqdirdə borcunu vaxtında qaytara
bilməzsə və ilin digər günlərində məişət xərclərini, təmin edə bilməzsə, ona həcc vacib
.deyildir

Məsələ ۱۹۹۸: Əgər Məkkəyə gedib-gəlmə müddətində gedib-gəlməsinin və ailəsinin
xərcini ona verib, ona «həccə get» desələr, lakin onun mülkü etməsələr, əgər geri
.almayacaqlarına xatircəm olarsa, həcc ona vacib olur

Məsələ ١٩٩٩: Əgər bir şəxsə həccə kifayət edəcək qədər mal verilsə və Məkkə yolunda malı verənə xidmət etməsini şərt edərlərsə, həcc o şəxsə vacib olmur.

Məsələ ۲۰۰۰: Əgər bir şəxsə müəyyən qədər mal versələr və həcc ona vacib olsa, bu halda həccə getsə, hətta sonradan özünün malı olsa da yenidən həcc ona vacib olmur.

Məsələ ۲۰۰۱: Ticarət üçün, məsələn; Cəddəyə qədər gedib orada bir miqdar mal əldə etsə, istədiyi təqdirdə, oradan Məkkəyə getməyə müstəti olarsa, həcc etməlidir. Bu şəkildə həcc etdikdən sonra vətənindən Məkkəyə gedəcək qədər malı olsa belə, ona artıq həcc vacib deyil.

Məsələ ۲۰۰۲: Əgər insan başqası tərəfindən şəxsən həccə getməyə əcir olunsa, bu halda özü gedə bilməyib başqasını öz tərəfindən göndərmək istəsə, onu əcir edən şəxsdən icazə almalıdır.

Məsələ ۲۰۰۳: Əgər bir şəxs müstəti olsa və Məkkəyə getsə və göstərilmiş müəyyən vaxtda Ərəfata və Məşərül-harama çatmasa, belə ki, əgər sonrakı illərdə müstəti olmasa, həcc ona vacib deyil, lakin əgər qabaqkı illər müstəti olub və həccə getməyibsə, bu halda əgər zəhmət olsa belə, gərək həccə getsin.

Məsələ ۲۰۰۴: Əgər müstəti olan bir şəxs həccə getməsə və sonra qocalığına, ya xəstəliyinə, ya zəifliyinə görə həccə gedə bilməsə və bundan sonra həccə getməsinə ümidi olmasa, gərək başqasını öz tərəfindən həccə göndərsin. Sonradan əgər qüdrəti olsa, özü də həccə getsin. Həmçinin birinci ildə həccə getməyə çatan qədər malı olduğu halda qocalıq, xəstəlik və ya gücsüzlük üzündən həccə gedə bilməzsə və sonradan qüdrətli olmasından da ümidsiz olsa, hökm eynidir. Bu təqdirlərin hamısında öz tərəfindən naib tutulan şəxs kişidirsə, ehtiyat-müstəhəb budur ki, naib «sərurə» olsun. Yəni ilk dəfə həccə gedən şəxs olsun.

Məsələ ۲۰۰۵: Başqası tərəfindən həccə getməyə əcir olunmuş şəxs, gərək onun tərəfindən nisa təvafını da yerinə yetirsin və əgər yerinə yetirməsə, qadın o əcirə haram olur.

Məsələ ۲۰۰۶: Əgər nisa təvafını düzgün yerinə yetirməsə, və ya unutsa, belə ki, bir neçə gündən sonra yadına düşsə və yarı yoldan qayıdıb yerinə yetirsə səhihdir, amma

## AL–VERİN HÖKMLƏRİ

### Point

Məsələ ۲۰۰۷: Kəsb edən (alver edən) şəxs, gərək al-verin, gündəlik qarşıya çıxan halların hökmlərini öyrənsin. Hətta əgər öyrənmədiyinə görə harama düşməsi, yaxud vacibi tərk etməsi gözlənilirsə, hökmü öyrənmək lazımdır. Həzrət İmam Sadiqdən (əleyhis-səlam) rəvayət olunur: Al-ver etmək istəyən şəxs, gərək onun hökmlərini öyrənsin və əgər onun hökmlərini öyrənməzdən əvvəl al-ver etsə, batil və şübhəli .müamilələrin vasitəsilə həlakətə düşər

Məsələ ۲۰۰۸: İnsan bir məsələni bilmədiyi üçün etdiyi al-verin düzgün, yaxud batil olduğunu bilməsə, nə aldığı nə də təhvil verdiyi maldan istifadə edə bilməz. Üstəlik məsələni öyrənməli, ya da hətta razılaşma yolu ilə olsa belə, ehtiyat etməlidir. Amma hərçənd müamilə batil olsa belə tərəfin onun o malı istifadə etməsinə razı olduğunu .bilərsə, istifadə etməsi caizdir

Məsələ ۲۰۰۹: Malı olmayan və vacib xərcləri olan şəxs (ailə və uşağının xərcləri kimi), işləyib qazanc əldə etməsi lazımdır. Ailənin yaşayışını daha da firavan etmək və .fəqirlərə əl tutmaq və bu kimi müstəhəb işlər üçün, kəsb etmək müstəhəbdir

### AL–VERDƏ MÜSTƏHƏB OLAN ŞEYLƏR

:Bir neçə şey alqı-satqıda müstəhəbb sayılmışdır

Gərək şəxs malın qiymətində müştərilər arasında fərq qoymasın. Lakin fəqir və .۱ .yoxsullar istisnadır

Ticarət üçün oturmasının əvvəlində kəlmeyi-şəhadəti, müamilə etdikdə isə təkbir .۲ .desin

.Satdığı şeyi artıq versin, aldığını az götürsün .۳

Müamilə etdiyi adam peşman olduqda və müamiləni pozmaq istədikdə, müamiləni .۴ .pozmağa hazır olsun

## MƏKRUH MÜAMİLƏLƏR

:Məsələ ۲۰۱۰: Müamilə də bir neçə şey məkruhdur. Onların bəziləri bunlardır

;Mülk satmaq; onun pulu ilə başqa bir mülk alıdığı təqdirdə məkruh deyil.۱

;(Qəssablıq (heyvan başı kəsməyi özü üçün sənəd seçmək.۲

;Kəfən satmaq .۳

;Şəxsiyyətsiz adamlarla al-ver etmək .۴

;Sübh azanından gün çıxan vaxtadək olan al-ver .۵

;Buğda, arpa və s. kimi şeylərin al-veri ilə məşğul olmaq .۶

.Başqasının almaq istədiyi bir şeyi almaq üçün müamiləyə daxil olmaq .۷

## HARAM MÜAMİLƏLƏR

:Məsələ ۲۰۱۱: Haram müamilələr çoxdur. Bunlardan bəziləri aşağıdakılardır

Kefləndirici içkiləri, ov iti olmayan it, donuz və həmçinin nəcisin murdarını alıb- .۱ satmaq ehtiyat-vacibə əsasən haramdır; Bundan qeyri hallarda əgər eyni nəcisdə halal istifadə etmək mümkün olarsa, məsələn; nəcis ğaitin gübrə kimi alqı-satqısı .caizdir

;Qəsbi malın al-veri; əgər onda təhvil verib təhvil almaq kimi təsərrüf olsa .۲

Müqabil tərəfin nəzəri cəlb olunmadığı halda etibardan düşmüş, yaxud qəlp (saxta) .۳ pullarla al-ver etmək; Amma əgər saxta və ya etibarsız olduğunu bilsə, müamilə .caizdir

Büt, xaç, haram musiqi və qumar alətləri kimi müəyyən formada hazırlanan və .۴
adətən yalnız haram yolda istifadə olunan və dəyəri onun haram istifadəsi səbəbi ilə
;olan bir şeyin al-veri

Tərkibində ğəşş (aldatma) olan müamilə; Həzrət Rəsulullah (səlləllahu ələyhi və alihi .۵ və səlləm) buyurmuşdur: «Müamilə edərkən müsəlmanlara ğəşş edən (onları aldadan), şəxs bizdən deyildir. Kim öz müsəlman qardaşı ilə ğəşş etsə, Allah-təala onun ruzisinin .«bərəkətini çəkər, onun qazanc yolunu bağlayar və onu öz ixtiyarına buraxar

:Ğəşşin bir neçə müxtəlif növləri var

.Yaxşı malı pis mala, yaxud başqa bir şeyə qatmaq, məsələn, südə su qatmaq-۱

Olduğunun əksinə olaraq zahirini gözəl cilvələndirmək, məsələn, köhnəlmiş-۲ .göyərtilərə su vurub təzə göstərmək

Bir malı başqa mal kimi göstərmək; məsələn, müştərinin xəbəri olmadan bir şeyin-۳ .yalnız üzünə qızıl çəkmək

Müştərinin, satıcının ondan heç nəyi gizlətməməsinə arxayın olduğu halda malın - ۴ .eybini gizlətmək

Məsələ ۲۰۱۲: Yuyulması mümkün olan, nəcis olmuş pak bir şeyi satmağın eybi yoxdur, palaz-xalça və qab kimi. Həmçinin yuyulması mümkün olmasa da, amma onun halal və adi olan mənfəəti neft kimi pak olmaqla şərtlənməməlidir, hətta əgər pak olmasına .bağlı olsa da, əgər halal və etina olunacaq mənfəəti olsa, yenə də satmaq caizdir

Məsələ ۲۰۱۳: Əgər bir şəxs nəcis bir şeyi satmaq istəsə, gərək onun nəcis olduğunu alıcıya o halda desin ki, əgər deməsə, alıcı harama düşə, yaxud vacibi tərk edə bilər, məsələn; nəcis suyu, dəstəmaz və qüsl almaqda işlədər, onunla vacib namazını qılar və ya nəcis şeydən yemək və içməkdə istifadə edər. Əlbəttə deməyin faydası olmadığı şəxslərə; məsələn, nəcasət və paklığa riayət etməyən laqeyd bir şəxs olsa bildirməsi .lazım deyildir

Məsələ ۲۰۱۴: İçməli olan və içməli olmayan nəcis dərmanları alıb-satmağın caiz olduğuna baxmayaraq, onun nəcis olduğunu əvvəlki məsələdə verildiyi kimi, gərək müştəriyə desinlər

Məsələ ٢٠١٥: Qeyri islami ölkələrdən gətirilən yağların nəcis olduğu məlum olmazsa, alınıb-satılmaların eybi yoxdur. Amma heyvanın ölməsindən sonra ondan alınan yağ, jelatin kimi və sair maddələr kafirin əlindən alınsa və ya qeyri-islami ölkələrdən gətirilsə, əgər şəri üsullara əsasən kəsilmiş olan bir heyvana aid

olduğuna ehtimal verilərsə, alqı-satqısı caiz və pakdır. Amma yeyilməsi haramdır və satıcının müştəriyə onun keyfiyyətini deməsi lazımdır. Əgər deməsə, ۲۰۱۳-ci məsələdə deyildiyi kimi, onun harama düşməsi, ya vacibi tərk etməsi ehtimalı vardırsa, satıcı .vəziyyəti ona söyləməlidir

Məsələ ۲۰۱۶: Şəriətdə təyin edilən göstərişə görə kəsilməyən və ya özü ölmüş olan tülkü və buna bənzər heyvanın dərisinin alqı-satqısı ehtiyata əsasən icazəli deyildir. .Amma əgər şəkk olunsa, işkalı yoxdur

Məsələ ۲۰۱۷: Qeyri islami ölkələrdən gətirilən və ya kafirin əlindən alınan dərinin, şəri göstərişə görə kəsilmiş olan bir heyvana aid olduğuna ehtimal verilirsə, onun al-veri .caizdir. Həmçinin onda namaz qılmaq da səhihdir

Məsələ ۲۰۱۸: Heyvanın ölməsindən sonra ondan əldə edilən yağ və sair maddələr və ya dəri müsəlmanın əlindən alınıbsa və insan onun, şəri göstərişə görə kəsilmiş olan heyvana aid olub-olmadığını araşdırmadan bir kafirdən aldığını bilirsə, hərçənd onun paklığına və alqı-satqısının caiz olmasına hökm olsa da, o yağı və bu kimi şeyləri .yemək icazəli deyil

.Məsələ ۲۰۱۹: Şərab və sair məstedici içkilərin müamiləsi haram və batildir

Məsələ ۲۰۲۰: Qəsbi malı satmaq batildir, amma sahibi icazə versə, düzdür və satıcı .gərək alıcıdan aldığı pulu ona (sahibinə) qaytarsın

Məsələ ۲۰۲۱: Əgər alıcı ciddi müamilə etmək qəsdi olduğu halda, aldığı şeyin pulunu verməmək niyyətində olarsa, onun bu niyyəti müamilənin səhih olmasına bir zərər .yetirməz, amma o şeyin pulunu satıcıya verməsi gərəkdir

Məsələ ۲۰۲۲: Əgər alıcı zimmə ilə aldığı malın pulunu sonradan haram maldan vermək istəsə, müamilə səhihdir. Amma ona borclu borcunu halal maldan verməlidir ki, borcu .ödənmiş olsun

Məsələ ۲۰۲۳: Haram əyləncə alətlərinin al-veri, icazəli deyil. Amma müştərək alətlər,

məsələn; radio, maqnitofon, video kimi əşyaların alıb-satmağın maneəsi yoxdur. Özü və ailəsinin

onlardan haram yolda istifadə etməyəcəyinə əmin olan şəxs üçün onları saxlamaq .caizdir

Məsələ ۲۰۲۴: Əgər halal istifadəsi mümkün olan bir şeyi haramda işlətmək qəsdi ilə satsa, məsələn, üzümü, şərab istehsal etmək üçün satsa, istər müamilə zamanı bunu qərara almış olsun, istərsə ondan əvvəl və müamiləni də o əsasda yerinə yetirsələr, bu müamilə haramdır. Amma bu qəsd ilə satmasa, sadəcə bilsə ki, müştəri üzümdən .şərab düzəldəcək, müamilənin eybi yoxdur

Məsələ ۲۰۲۵: Canlıların heykəlini düzəltmək ehtiyata əsasən, haramdır, amma onları .alıb-satmağın maneəsi yoxdur. Canlıların şəklini çəkmək caizdir

Məsələ ۲۰۲۶: Qumardan, oğurluqdan və ya batil müamilədən əldə edilmiş şeyi, onda təsərrüf etməyi tələb edirsə, almaq haramdır və bir kəs onu satandan alsa, gərək onu .əsl sahibinə qaytarsın

Məsələ ۲۰۲۷: Piy ilə qarışdırılmış bir yağı satan şəxs, əgər onu müəyyən edərsə, məsələn; «bu iki batman yağı satıram» deyərsə, onda olan piy ona yağ deyilməyəcək qədər çoxdursa, müamilə batildir və əgər onda olan piy, ona piy ilə qarışdırılmış yağ deyiləcək qədər azdırsa, müamilə səhihdir. Amma müştəri, nöqsanlığa görə müamiləni ləğv etmə haqqına sahibdir və öz pulunu geri ala bilər. Amma əgər yağ piydən ayrılsa (seçilirsə), yağın tərkibindəki piyin miqdarına mütənasib olaraq müamilə batil olur və satıcı o piy üçün aldığı pul müştərinin malı və piy satıcının malıdır və müştəri onun tərkibində olan xalis yağın müamiləsini də poza bilər. Amma əgər onu müəyyən etməsə və zimməsində olan iki batman yağı satsa, sonra piy ilə qarışmış yağı versə, .müştəri o yağı geri qaytarıb və xalis yağı tələb edə bilər

Məsələ ۲۰۲۸: Əgər malın bir miqdarını, çəki ya peymanə ilə satsalar, həmin maldan daha çox miqdarına satarsa, məsələn; bir batman buğdanı bir batman yarım buğdaya satsa, riba və haramdır. Hətta əgər iki maldan biri salim, o biri eybli, ya malın biri yaxşı, o biri pis olsa, ya qiymətdə bir-biri ilə fərqli olsalar, belə ki, verdiyi miqdardan çox alsa, yenə də riba və haramdır. Əgər sınıq olmayan misi verib və ondan çox sınıq mis alsa,

uzun düyünü verib, ondan çox yumru düyü alsa, ya düzəlmiş qızılı verib, ondan çox .düzəlməmiş qızıl alsa, riba və haramdır

Məsələ ۲۰۲۹: Əgər artıq aldığı şey satdığından başqa bir şey olsa, məsələn; bir batman buğdanı, bir batman buğdaya və bir qəpik (riyal) pula satsa, yenə də riba və haramdır. Hətta artıq bir şey almasa, amma şərt etsə ki, alıcı onun üçün bir iş görsün, riba və .haramdır

Məsələ ۲۰۳۰: Əgər miqdarı az verən şəxs bir şey əlavə etsə, məsələn; iki batman buğda və bir dəsmalı iki batman yarım buğdaya satsa, eybi yoxdur. Belə ki, onların qəsdi bu olsa ki, dəsmal o çox miqdarın müqabilində olsun və həm də müamilə nəqd olsun. Həmçinin hər iki tərəfdən bir şey artırsalar, məsələn; bir batman buğdanı və bir dəsmalı bir batman yarım buğdaya və bir dəsmala satsa, belə ki, qəsdləri bu ola ki, birinci tərəfdə dəsmal və yarım batman buğda, ikinci tərəfdəki dəsmalın müqabilində .olsa, eybi yoxdur

Məsələ ۲۰۳۱: Parça kimi metrə və zira ilə satılan bir şeyi və ya qoz və ya toyuq yumurtası kimi ədədlə satılan bir şeyi satıb müqabilində daha artıq alarsa, eybi yoxdur. Amma hər ikisi də eyni cinsdən olarsa və müamilə də müddətli olarsa, onun səhih olması bu halda işkallıdır. Məsələn, on ədəd qozu nağd verib bir aydan sonra on iki qoz alarsa. Kağız pulu da satmaq bunun kimidir, məsələn; manatı digər cinsdən olan dinar, ya dollar kimi kağız pula nəqd, yaxud müddətlə satsa, maneəsi yoxdur. Amma əgər istəsə ki, öz cinsinə satsın və çox götürsün, gərək müamilə müddətli olmasın və belə olmadıqda onun səhih olması işkallıdır. Məsələn; ۱۰۰ manat nəqd verib, altı aydan .sonra ۱۱۰ manat alması kimi

Məsələ ۲۰۳۲: Şəhərlərin çoxunda və ya bir şəhərdə çəki və peymanə ilə, bəzi şəhərlərdə isə ədəd ilə satılan malların, ədəd ilə müamilə olunan şəhərdə artığına .satmağı caizdir

Məsələ ۲۰۳۳: Çəki ya peymanə ilə satılan şeylərdə, əgər bir şeyi satarsa və əvəzini bir maldan olmayan şeydən götürsə və müamilə nəqd olsa, çox götürməyin eybi yoxdur,

amma müamilə müddətli olsa, işkallıdır. Deməli, əgər bir batman düyünü iki

.batman buğdaya bir aya qədər satsa, o müamilənin səhihliyi işkalsız deyil

Məsələ ۲۰۳۴: Yetişmiş meyvəni, yetişməmiş meyvə ilə artığına müamilə etmək icazəli .deyil. Əgər bərabər olsalar və nəqdi olsa, məkruhdur. Əgər nisyə olsa, işkallıdır

Məsələ ۲۰۳۵: Arpa və buğda, faiz (riba) xüsusunda bir cinsdən hesab edilir; Belə ki, bir batman buğda verib əvəzində bir batman iki yüz əlli qram arpa alarsa, riba və haramdır. Həmçinin xərmən vaxtı on batman buğda vermək qəsdi ilə on batman arpa satın alarsa, arpanı nəqd alıb, buğdanı bir müddət sonra verdiyi üçün çox almış kimi .olur və haramdır

Məsələ ۲۰۳۶: Ata və oğul, qadın və əri bir-birlərindən faiz (riba) ala bilərlər. Həmçinin müsəlman bir şəxs İslamın mühafizəsi altında olmayan bir kafirdən faiz ala bilər; amma İslamın mühafizəsi altında olan kafirlə faizli müamilə etmək haramdır. Müamilə tamam olduqdan sonra əgər faiz vermək onun şəriətində caizdirsə, ondan faiz ala .bilər

Məsələ ۲۰۳۷: Ehtiyat-vacibə görə, üzü (dibdən) qırxmaq və buna görə zəhmət haqqı almaq icazəli deyil. Zərurət (çıxılmaz) halı, eləcə də onun tərk edilməsi (qırxılmaması) adətən dözüləsi olmayan bir çətinlik və ya zərər törədərsə, hərçənd başqalarının .istehza və təhqir etməsi cəhətində olsa belə, bu iki hal istisnadır

Məsələ ۲۰۳۸: Ğina haramdır. Ğina dedikdə məqsəd, ləhv-ləəb (kef) məclislərinə məxsus olan tərzdə avazla oxunan batil mətləblərdir. Həmçinin, Quran, dua və bu kimi şeyləri də o cür oxumaq icazəli deyil. Ehtiyat-vacibə görə qeyd olunanlardan başqa sözlər də gərək bu səslə (ğina ilə) oxunmasın. Həmçinin ğinaya qulaq asmaq da, eləcə də ğina üçün əmək haqqı (ücrət) almaq da haramdır. O, alsa belə, alanın mülkü olmur. Onu öyrətmək və öyrənmək də icazəli deyil. Musiqi də, yəni xüsusi musiqi alətlərində çalmaq da əgər ləhv-ləəb məclislərinə məxsus olacaq tərzdədirsə, haram, əks təqdirdə haram deyil. Haram musiqi çalmaqla ücrət almaq da haramdır, alanın mülkü .olmur, onu öyrənib öyrətmək də haramdır

## SATICININ VƏ ALICININ ŞƏRTLƏRİ

:Məsələ ۲۰۳۹: Satıcı və alıcı üçün altı şərt vardır

;Baliğ olsunlar .۱

;Aqil olsunlar .۲

;Səfeh olmasınlar; yəni öz mallarını lazımsız yerə xərc etməsinlər .۳

Al-ver niyyətləri olsun (deməli, əgər; məsələn: zarafatyana öz malımı "satdım" desə, .۴ ;(müamilə batildir

;Bir şəxs onları məcbur etməsin .۵

;Satdıqları və əvəzində verdikləri mala malik olmalıdırlar .۶

.Bu şərtlərlə bağlı hökmlər sonrakı məsələlərdə izah olunacaqdır

Məsələ ۲۰۴۰: Özü alış-verişdə müstəqil olan həddi-büluğa çatmamış bir uşqla edilən müamilə batildir. Lakin həddi-büluğa yetməmiş ağlı kəsən uşaqların adətən qiyməti az bir şeyin müamiləsini etməsinin eybi yoxdur. Amma əgər uşağın vəlisi ilə müamilə edilsə və həddi-büluğa yetməmiş ağlı kəsən uşaq sadəcə olaraq müamilənin əqdini oxusa, bütün hallarda müamilə səhihdir; hətta əgər satılan mal və ya pul başqasının olsa və o uşaq yalnız sahibinin vəkili olaraq o malı satarsa və ya o pulla bir şey alarsa, zahir budur ki, ağlı kəsən uşaq təsərrüf etməkdə müstəqil belə olsa, müamilə səhihdir. Həmçinin əgər uşaq pulu satıcıya verib, malı alıcıya çatdırmaqda və ya malı alıcıya verib, pulu satıcıya çatdırmaqda yalnız bir vasitəçi olsa, uşaq ağlı kəsən belə olmasa .müamilə səhihdir. Çünki, həqiqətdə iki baliğ şəxs bir-birilə müamilə etmişlər

Məsələ ۲۰۴۱: Baliğ olmayan bir uşaqdan onunla müamilənin səhih olmadığı təqdirdə bir şey satın alsa və ya ona bir şey satarsa, o uşaqdan aldığı malı və ya pulu, o uşağın öz malıdırsa, onun vəlisinə verməlidir. Başqasının malıdırsa, o malı sahibinə verməli, ya da onu razı salmalıdır. Əgər onun sahibini tanımırsa və ya onu tanımaq üçün bir imkanı

yoxdursa, uşaqdan aldığı şeyi sahibi tərəfindən məzalim haqqı olaraq fəqirlərə .verməlidir

.Ehtiyat-lazıma əsasən bu işi görmək üçün şəriət hakimindən icazə alması da lazımdır

Məsələ ۲۰۴۲: Bir şəxs ağlı kəsən uşaqla onunla müamilənin səhih olmadığı təqdirdə müamilə edərsə və uşağa verdiyi mal və ya pul tələf olarsa, o uşağın həddi-büluğa yetişməsindən sonra onun özündən və ya vəlisindən tələb edə bilər. Amma əgər uşaq ağlı kəsən olmazsa, yaxud ağlıkəsən olsa da, malı özü tələf etməmiş olsa, əksinə, onun .yanında özü tələf olmuş olsa, hərçənd təfrit və ifrat nəticəsində olsa belə zamin deyil

Məsələ ۲۰۴۳: Alıcı və ya satıcının bir müamiləyə məcbur edildiyi zaman əgər müamilədən sonra müamiləyə razı olarsa və razı olduğunu söyləرsə, müamilə .səhihdir; amma ehtiyat-müstəhəb budur ki, müamilə əqdini yenidən oxusunlar

Məsələ ۲۰۴۴: Bir şəxs başqa birinin malını sahibinin icazəsi olmadan satarsa, mal sahibi .onun satmasına razı olmayıb və icazə verməzsə, müamilə batildir

Məsələ ۲۰۴۵: Uşağın atası və ata tərəfdən olan babası, həmçinin atasının və ya ata tərəfdən olan babasının uşağın işləri ilə bağlı təyin etdiyi vəsisi uşağın malını sata bilər. Onların heç biri olmadıqda isə, adil müctəhid də, məsləhət tələb etdikdə dəlinin, yetim .uşağın və ya qaib olan bir şəxsin malını sata bilər

Məsələ ۲۰۴۶: Bir şəxs bir malı qəsb edərək satarsa və müamilədən sonra mal sahibi müamiləni imzalarsa, müamilə səhihdir; qəsb edən şəxsin müştəriyə verdiyi şey və onun mənfəətləri, müamilə etdiyi andan etibarən müştərinin malı, müştərinin də verdiyi şey və onun mənfəətləri müamilə anından etibarən malı qəsb edilən şəxsin .malı olur

Məsələ ۲۰۴۷: Bir şəxs qəsb etdiyi malı, pulu özünün olmaq qəsdilə satarsa, mal sahibi bu müamiləni imzalarsa, müamilə səhihdir; amma pul qəsb edənin deyil, mal sahibinin .olar

## MAL VƏ ONUN ƏVƏZİNİN ŞƏRTLƏRİ

:Məsələ ۲۰۴۸: Satılan və onun əvəzində alınan malın beş şərti var

.Onun miqdarı çəki, peymanə, say və bu kimi şeylərlə məlum olsun .۱

Təhvil verilməsi mümkün olmalıdır; Amma əgər onu təslim etməsi mümkün olan .۲ başqa bir şeylə satarsa, müamilə səhihdir. Amma alıcının özünün satın aldığı şeyi ələ gətirməsi mümkünsə, hərçənd satıcının satdığı şeyi ona təslim etmə imkanı olmasa da, müamilə səhihdir. Məsələn; alıcının tapmaq imkanı olan qaçmış bir atı satarsa, müamilənin bir eybi yoxdur və səhihdir. Bu halda zəmiməyə (yəni bir malın o biri malın .üstündə əlavə satışına), ehtiyac yoxdur

Satılan və əvəzində alınan şeydəki camaatın müamiləyə meyllərinin dəyişməsinə .۳ .səbəb olan xüsusiyyətlər göstərilməlidir

Sahibinin mülkiyyətindən çıxarkən tərəfin haqqı zay olacaq şəkildə başqa bir şəxs .۴ .onun üzərində haqq sahibi olmamalıdır

Malın qazancını deyil özünü sastsın. Deməli; məsələn: evin bir illik gəlirini satsa, səhih .۵ deyil. Əgər alıcı pul yerinə, mülkünün qazancini versə; məsələn: bir kəsdən xalça alıb .əvəzində evinin bir illik qazancını oun ixtiyarına versə, eybi yoxdur

.Bunların hökmləri gələcək məsələlərdə deyiləcək

Məsələ ۲۰۴۹: İnsan bir şəhərdə çəki və peymanə ilə satılan malı həmin şəhərdə gərək çəki və peymanə ilə alsın. O malı görməklə (ölçmədən) müamilə edilən şəhərdə isə .görməklə almalıdır

Məsələ ۲۰۵۰: Alqı və satqısı çəki ilə edilən bir mal ölçü ilə də müamilə edilə bilər. Belə ki, məsələn; on batman buğda satmaq istəyən bir şəxs, bir batman buğda tutan bir ölçü .qabı ilə on qab buğda verə bilər

Məsələ ۲۰۵۱: Əgər müamilə dördüncü şərtdən başqa söylənən şərtlərdən birisinin mövcud olmaması üzündən batil olarsa, amma satıcı və alıcı bir-birilərinin malından .istifadə etməyə razı olarlarsa, istifadə etmələrinin eybi yoxdur

Məsələ ۲۱۵۲: Vəqf olunmuş bir şeyin müamiləsi batildir. Amma vəqf edildiyi cəhətdə istifadə olunma imkanı qalmayacaq qədər xarab olmuşsa və ya bu həddə yetişmək üzrədirsə, məsələn; məscidin həsiri üzərində namaz qılına bilməyəcək şəkildə xarab olmuşsa, məscid mütəvəllisinin və ya onun hökmündə olan şəxsin onu satmasının eybi yoxdur. Amma ehtiyat-müstəhəb budur ki, gərək mümkün olan surətdə onu həmin .məscidə, vəqf edənin məqsədinə daha yaxın olan işlərə sərf etsinlər

Məsələ ۲۰۵۳: Əgər özlərinə mal vəqf edilən şəxslər arasında, vəqf edilən malı satmasalar, mal və ya can tələfatına yol açacaq şəkildə ixtilaf meydana çıxarsa, o vəqfi satmaq işkallıdır. Lakin vəqf edən şəxs, vəqf edilən şeyin satılmasını məsləhət lazım etdiyi təqdirdə satılmağı şərt qoymuşsa, bu təqdirdə onun satılmasının bir .maneçiliyi yoxdur

Məsələ ۲۱۵۴: Başqasına kirayə verilmiş olan bir mülkün al-verinin eybi yoxdur; ancaq o mülkün mənfəəti kirədə olduğu müddətdə kirayəçiyə aiddir. Əgər alıcı o mülkün kirayə verildiyini bilməzsə və ya kirayə müddətinin az olduğunu güman edərək almışsa, .vəziyyətdən xəbərdar olduqdan sonra müamiləni poza bilər

## AL-VER ƏQDİ

Məsələ ۲۰۵۵: Al-ver işlərində əqdi ərəbcə oxumaq lazım deyil. Məsələn; satıcı öz dilində, «bu malı bu pula satdım» desə və alıcı da, «qəbul etdim» deyirsə, müamilə səhihdir. Amma alıcı və satıcının bu iki cümləni söyləməkdə məqsədləri inşa qəsdi .olmalıdır. Yəni bu iki cümləni dedikdə qəsdləri al-ver olmalıdır

Məsələ ۲۰۵۶: Əgər müamilə zamanı əqd oxunmazsa, amma satıcı alıcıdan aldığı mal əvəzində öz malını onun mülkü edərsə, müamilə səhihdir və hər ikisi aldığı şeyin sahibi .olur

## MEYVƏLƏRİN AL–VERİ

Məsələ ۲۰۵۷: Çiçəyini töküb, dənə bağlamış meyvənin əgər məlum olsa ki, xəsarət görmə müddəti keçmişdir ya yox, o ağacın məhsulunun miqdarı təxminən bilinərsə yığılmamışdan əvvəl də satılması səhihdir. Hətta əgər məlum olmasa ki, meyvənin xəsarət görmə müddəti keçmişdir ya yox, əgər iki il və ya daha çox müddətin meyvələri satılırsa, ya da indi çıxmış olan miqdarı (etina edilən mali dəyəri olmaq şərti ilə) satarlarsa, müamilə səhihdir. Həmçinin əgər tarlanın məhsulundan bir şeyi ya da ayrı bir şeyi onunla birlikdə satarlarsa, müamilə səhihdir. Amma ehtiyat-lazıma əsasən, bu təqdirdə elə bir şey əlavə edilməlidir ki, tumurcuqlar meyvə olmasa belə, .alıcının sərmayəsini qorumalıdır

Məsələ ۲۰۵۸: Ağacda olan meyvə dənə bağlamamışdan və çiçəyini tökmədən əvvəl satılması caizdir. Amma, ya əvvəlki məsələdə izah olunduğu şəkildə bir şeylə birlikdə .satılmalıdır, ya da bir ildən çoxun meyvəsi satılmalıdır

Məsələ ۲۰۵۹: Ağac üstündə istər yetişmiş, istərsə yetişməmiş olan xurmanı satmağın eybi yoxdur. Amma onun əvəzini istər o ağacdan olsun və ya başqasından, xurma təyin etməmələri lazımdır. Amma əgər onu yetişmiş, ya hələ xurma sayılmayan rütəblə birlikdə satsalar, işkalı yoxdur. Lakin bir şəxsin, başqa birisinin bağçasında bir dənə xurma ağacı varsa, onu becərmək o şəxs üçün çətindirsə, bu halda əgər onun miqdarını təxmin edərək ev sahibinə satarsa və əvəzini xurma qərar verərsə, heç bir .maneəsi yoxdur

Məsələ ۲۰۶۰: İldə bir neçə dəfə toplanan xiyar, badımcan, göyərti və buna bənzər bitkilərin satılması onların məhsulunun aşkar, zahir olduqları və alıcının il ərzində bir neçə dəfə onu toplayacağı təyin edildiyi təqdirdə maneəsi yoxdur. Amma əgər

.məhsul aşkar görüləcək hala gəlməmişdirsə, satılmaları işkallıdır

Məsələ ۲۰۶۱: Buğdanın sünbülünü, dən bağladıqdan sonra özündən və ya başqa bir .sünbüldən ələ gələn buğda əvəzində satarlarsa, müamilə səhih deyildir

## NƏQD VƏ NİSYƏ

Məsələ ۲۰۶۲: Əgər bir mal nəqd satılmışsa, alıcı və satıcı müamilədən sonra bir-birlərindən malı və pulu istəyib ala bilərlər. Döşənəcək və libas kimi daşına bilən və tarla və ev kimi daşınmaz şeylərin verilməsi mal sahibinin onlardan əlini çəkib, tərəfin istədiyi zaman onlardan istifadə edə biləcəyi şəkildə onun ixtiyarında qoyması ilə ola .bilər. Bu isə şərait dəyişdikcə müxtəlif cür ola bilər

Məsələ ۲۰۶۳: Nisyə müamilələrdə zamanın tam dəqiq şəkildə təyin edilməsi lazımdır. Deməli, pulunu xırman zamanı almaq üzrə bir mal satılarsa, vaxt tamamilə müəyyən .edilmədiyindən müamilə də batil olur

Məsələ ۲۰۶۴: Bir malı nisyə satarsa, satıcı onun əvəzini qərarlaşdırılan vaxt tamamlanmamış alıcıdan istəyə bilməz. Amma əgər alıcı ölərsə və özünə aid malı da .olarsa, satıcı vaxt çatmamış alacağını onun varislərindən istəyə bilər

Məsələ ۲۰۶۵: Nisyə satdığı bir mal üçün qərarlaşdırılan müddət tamam olduqdan sonra satıcı alacağını istəyə bilər, amma alıcı ödəyə bilməzsə ona möhlət verər və ya .müamiləni pozaraq satılan şey mövcuddursa, onu geri ala bilər

Məsələ ۲۰۶۶: Malın qiymətini bilməyən şəxsə bir miqdar nisyə verərsə və qiymətini də söyləməzsə, müamilə batildir. Amma nəqd satış qiymətini bilən bir şəxsə malı nisyə verib dəyərini çox hesablarsa, məsələn; «sənə nisyə verdiyim malı nəqd qiymətindən hər manatına bir qəpik daha çox hesablayıram» deyərsə, o da qəbul edərsə, maneəsi .yoxdur

Məsələ ۲۰۶۷: Bir malı nisyə satıb, pulunu almaq üçün bir müddət müəyyən etmiş olan şəxs məsələn, müddətin yarısı

keçdikdən sonra alacağından bir miqdar keçib qalan qismi də nəqdə alarsa, maneəsi .yoxdur

## SƏLƏF MÜAMİLƏSİ VƏ ONUN ŞƏRTLƏRİ

Məsələ ۲۰۶۸: Sələf müamiləsi budur ki, satılan şey külli olsun, müştəri də pulu verib müəyyən müddətdən sonra malı təhvil alsın. Əgər "bu pulu verirəm ki, altı aydan sonra filan malı alam" desə, satıcı da "qəbul etdim" desə və yaxud satıcı pulu alıb "filan malı .satdım ki, altı aydan sonra təhvil verəm" desə, müamilə səhihdir

Məsələ ۲۰۶۹: Əgər qızıl və ya gümüşdən olan bir pulu sələf olaraq satarsa və əvəzində də qızıl və ya gümüşdən olan pul alarsa, müamilə batildir. Amma əgər bir malı və ya qızıl və ya gümüşdən olmayan bir pulu satarsa və əvəzində ayrı bir mal və ya qızıl və gümüşdən olan pul alarsa, müamilə (gələcək məsələnin ۷-ci şərtində izah olunacaq şəkildə) səhihdir. Amma ehtiyat-müstəhəb budur ki, satdığı malın əvəzində pul alsın .başqa mal almasın

:Məsələ ۲۰۷۰: Sələf müamiləsinin yeddi şərti vardır

Malın qiymətinin fərqlənməsinə səbəb olan xüsusiyyətləri müəyyən etsinlər. Amma .۱ həddindən artıq diqqət etmək lazım deyil: camaat "bunun xüsusiyyəti məlumdur" .desə, kifayətdir

Satıcı və alıcı bir-birindən ayrılmamışdan qabaq alıcı pulun hamısını satıcıya versin, .۲ yaxud müəyyən bir miqdar satıcıda borcu olsa, pulun bir miqdarını satıcıya nağd verib və öz borcunu malın qiymətindən hesab edə bilər, o da qəbul etməlidir. Əgər onun qiymətinin müəyyən miqdarını versə, müamilənin həmin miqdarda səhih olmasına .baxmayaraq, satıcı həmin miqdarın müamiləsini poza bilər

Müddət dəqiq şəkildə müəyyən olsun; məsələn: "xərmənin əvvəlinədək malı təhvil .۳ .verəcəyəm" desə, müddət dəqiq məlum olmadığından, müamilə batildir

Malın təhvil verilməsi üçün vaxt təyin olmalıdır ki, satıcı malı təhvil versin istər o mal .۴ .həmin vaxt az tapılan şeylərdən olsun və ya olmasın

Ehtiyat-vacibə əsasən, malın alıcıya veriləcəyi yer dəqiq şəkildə müəyyən .۵ edilməlidir. Amma onların danışığından onun yeri bəlli olarsa, ayrıca o yerin adını .çəkmələrinə ehtiyac yoxdur

Malın çəkisini, peymanəsini, yaxud sayını müəyyən etsinlər. Adətən görməklə .۶ müamilə olunan malı sələf kimi satsalar, eybi yoxdur. Amma gərək qoz və yumurtanın (bəzi qismlərində olduğu kimi) onun növlərinin fərqi, camaat arasında ona əhəmiyyət .verilməyəcək dərəcədə az olsun

Satılan şey çəki və ya ölçü ilə satılan mallardandırsa, onun əvəzi eyni mallardan .۷ olmamalıdır. Hətta ehtiyat-lazıma əsasən, onun cinsi ölçü və ya çəki ilə satılan, başqa bir maldan da olmamalıdır. Əgər satılan şey ədədlə satılan şeylərdəndirsə, ehtiyat-.vacibə əsaənonun əvəzini öz cinsindən çox təyin etmək icazəli deyildir

## SƏLƏF MÜAMİLƏSİNİN HÖKMLƏRİ

Məsələ ۲۰۷۱: İnsan sələf olaraq satın aldığı bir malı müddəti qurtarmamışdan əvvəl satıcısından başqasına sata bilməz. Amma müddəti qurtardıqdan sonra malı təhvil almasa belə, satmasına maneəsi yoxdur. Amma meyvələrdən başqa, çəki və ya ölçü ilə satılan digər malları təhvil almamışdan əvvəl satmaq icazəli deyildir. Lakin onları .mal olduqları sərmayələrinə və ya daha azına satarsa, caizdir

Məsələ ۲۰۷۲: Sələf müamiləsində satıcı malı qərarlaşdırılan zamanda verərsə, qərarlaşdırılan zamandakı vəziyyətdə olsa, gərək qəbul etsin. Əgər şərt edilən şeydən daha yaxşı olsa belə, alıcının qəbul etməsi gərəkdir. Amma əgər şərtləşməkdə məqsədləri qərarlaşdırılan haldakı vəziyyətdən daha yaxşısını qəbul etməmək olsa, bu .hal istisnadır

Məsələ ۲۰۷۳: Əgər satıcının verdiyi mal qərara aldıqlarından pis olsa, müştəri qəbul .etməyə bilər

Məsələ ۲۰۷۴: Əgər satıcı qərarlaşdırılan mal əvəzinə bir mal verərsə, alıcı razı olduğu .təqdirdə eybi yoxdur

Məsələ ۲۰۷۵: Sələf olaraq satdığı şeyi alıcıya verəcəyi zaman o malı satıcı hazırlaya bilməzsə, alıcı istəsə, hazırlanıncaya qədər səbr edə, bilər ya da müamiləni pozub vermiş olduğu şeyi, yaxud onun əvəzini geri ala bilər. Amma ehtiyat-vacibə görə onu .satıcıya, yuxarı bir qiymətlə sata bilməz

Məsələ ۲۰۷۶: Əgər müəyyən malı satıb və bir müddətdən sonra təhvil verib pulunu da .bir müddətdən sonra alacağını qərar qoysa, müamilə batildir

## QIZIL–GÜMÜŞÜN QIZIL–GÜMÜŞƏ SATILMASI

Məsələ ۲۰۷۷: Əgər qızılı qızıla, gümüşü də gümüşə satsalar; istər sikkəli olsun, istərsə .də sikkəsiz, onlardan birinin çəkisi o birisindən artıq olsa, müamilə haram və batildir

Məsələ ۲۰۷۸: Qızılı gümüşə, gümüşü qızıla nağd satsalar müamilə səhihdir; çəkilərinin .də bərabər olması ilzami deyil. Amma əgər müamilə müddətli olsa, batildir

Məsələ ۲۰۷۹: Əgər qızılı gümüşə və ya gümüşü qızıla satarlarsa, alıcı və satıcı bir-birlərindən ayrılmamış satılanı və əvəzində veriləni bir-birlərinə təhvil verməlidirlər. Əgər qərarlaşdırdıqlarından heç bir miqdarını təslim etməzlərsə, müamilə batildir. .Əgər onların bir hissəsini təhvil versələr, müamilə həmin miqdarda səhihdir

Məsələ ۲۰۸۰: Əgər satıcı və ya alıcı qərar qoyduğu şeyin hamısını, digəri isə bir miqdarını təhvil verib bir-birindən ayrılsalar, müamilənin həmin miqdarda səhih .olmasına baxmayaraq, malın hamısı əlinə çatmayan tərəf müamiləni poza bilər

Məsələ ۲۰۸۱: Əgər bir az gümüş mədəni torpağını saf gümüşə və ya bir az qızıl mədəni torpağını saf qızıla satsalar, müamilə batildir. Amma əgər məsələn; gümüş mədəni torpağında olan gümüşün saf gümüş miqdarında olduğunu bilirsə, eybi yoxdur. Lakin, gümüş mədəni torpağını qızıla, qızıl

.mədəni torpağını isə gümüşə satmağın əvvəldə deyildiyi kimi, maneəsi yoxdur

## MÜAMİLƏNİ POZMAĞIN MÜMKÜN OLDUĞU YERLƏR

Məsələ ۲۰۸۲: Bir müamiləni pozma haqqına «fəsx etmə haqqı» deyilir. Alıcı və satıcı on bir yerdə müamiləni poza bilərlər.

۱. Hərçənd müamilə məclisini tərk etmiş olsalar belə, bir-birindən ayrılmamış olsunlar və bu fəsx etmə haqqına «məclis fəsx etmə haqqı» deyilir.

۲. Alış-verişdə, alıcı və ya satıcı və digər müamilələrdə iki tərəfdən biri aldadılmış olarsa, bu fəsx etmə haqqına (ğəbn) «aldatma fəsx etmə haqqı» deyilir. Bu cür fəsx etmə haqqının sübut olması camaatın zehnində olan bir şərtdən qaynaqlanır. Yəni hər müamilədə hər iki tərəfin zehnində bu şərt var ki, aldığı mal maliyyət baxımından verdiyi maldan çox aşağı olmamalı və əgər belə olarsa, müamiləni pozma haqqına sahib olsun. Amma əgər bəzi yerlərdə xüsusi qaydada zehnlərdə olan şərt ayrı bir şəkildə olarsa, məsələn; şərt aldığı maliyyət baxımından verdiyi maldan az olduğu təqdirdə aradakı fərqini tərəfdən istəmə haqqına və bu mümkün olmazsa, müamiləni pozma haqqına sahib olmaq olarsa, belə yerlərdə xüsusi qaydaların şərtinə əməl edilməlidir.

۳. Müamilədə müəyyən bir müddətə qədər hər ikisinin və ya birinin müamiləni pozma haqqına sahib olmaları şərt edilmişsə, bu haqqa «şərti fəsx etmə haqqı» deyilir.

۴. İki tərəfdən biri tərəfin ona rəğbət etməsini saxlayacaq və ya ona olan rəğbətinin çoxalmasına səbəb olacaq şəkildə öz malını olduğundan daha yaxşı göstərərsə, buna «tədlis qüsuru (gizlətmə səbəbilə olan) fəsx etmə haqqı» deyilir.

۵. Müamilə tərəflərindən biri qarşı tərəfin onun üçün bir iş görməsini şərt qoymuş olarsa və o da o şərtə əməl etməzsə və ya onun verəcəyi müəyyən bir malda bir xüsusiyyətin olmasını şərt

qoyarsa və o malda o xüsusiyyət olmazsa, bu halda şərt edən şəxs müamiləni poza .bilər və buna «şərtə uyğun gəlməyən təxəllüf fəsx etmə haqqı» deyilir

Malda və ya onun əvəzində qüsur olarsa, buna «qüsurdan ötrü fəsx etmə haqqı» .۶ .deyilir

Müamilə edilən malın bir miqdarının başqasının malı olduğu anlaşılırsa, bu halda əgər .۷ onun sahibi bu müamiləyə razı olmazsa, alıcı müamiləni poza bilər və ya o miqdarın pulunu əgər vermişsə, digər tərəfdən ala bilər. Buna «şəriklikdən doğan fəsx etmə .haqqı» deyilir

Satıcı, müştərinin görmədiyi müəyyən olunmuş malın xüsusiyyətlərini ona deyəndən .۸ sonra, dediyi kimi olmadığı məlum olsa; bu halda müştəri müamiləni poza bilər. Həmçinin, əgər müştəri (verəcəyi) müəyyən olunmuş əvəzin xüsusiyyətlərini desə, sonradan dediyi kimi olmadığı məlum olsa, satıcı müamiləni poza bilər. Həmçinin, əgər əvvəlcə görülməklə müamilə olunub sonradan gördükləri malın, yaxud onun əvəzinin nöqsan (azalmaq) tərəfə dəyişdiyi məlum olsa, birinci halda alıcı, ikinci halda isə satıcı .müamiləni poza bilər. Buna «görmədən əmələ gələn fəsx etmə haqqı» deyilir

Alıcı aldığı malın pulunu üç günə qədər satıcıya verməzsə və satıcı da malı təhvil .۹ verməmiş olsa, satıcı müamiləni poza bilər. Əlbəttə bu, satıcının alıcıya pulu verməsində möhlət verib, müddət bildirilmədiyi haldadır. Amma əgər möhlət verilməmiş olsa, pulu verməyi azacıq gecikdirməklə də müamiləni poza bilər. Amma əgər ona üç gündən çox möhlət vermişsə, bu möhlət tamam olmamışdan əvvəl müamiləni poza bilməz. Buradan aydınlaşır ki, əgər satdığı şey bəzi göyərti və meyvələr kimi bir gün qalmaqla xarab olan bir şeydirsə, onun müddəti az olacaq. Buna .«gecikdirildiyinə görə fəsx etmə haqqı» deyilir

Bir heyvan satın almış olan alıcı, üç günə qədər müamiləni poza bilər. Həmçinin .۱۰ satdığı şeyin əvəzində bir heyvan alan satıcı üç günə qədər müamiləni poza bilər. Buna .«heyvan alış-satışı fəsx etmə haqqı» deyilir

Məsələ ٢٠٨٣: Əgər alıcı malın qiymətini bilməzsə və ya aldığı zaman qafil olaraq adi qiymətdən daha baha bir qiymətə

alarsa, etina edilən dərəcədə baha almışsa, müamiləni poza bilər. Əlbəttə, müamiləni pozma zamanında malın özü mövcud olmalıdır, əks təqdirdə müamiləni poza bilmə haqqının olması işkallıdır. Həmçinin əgər satıcı malın qiymətini bilməzsə və ya müamilə zamanı yaddan çıxaraq qiymətindən aşağı satarsa, etina edilən miqdarda ucuz .satmışdırsa, yuxarıda deyilən şərtlə müamiləni poza bilər

Məsələ ۲۰۸۴: Şərtli satış müamiləsindəki məsələn; bir milyonluq evi beş yüz min manata satıb, satıcının müəyyən olunmuş vaxt daxilində pulu verdiyi təqdirdə müamiləni poza bilmə haqqına sahib olması qərarlaşdırılırsa, satıcı və alıcının .həqiqətən alqı-satqı qəsdləri olarsa, müamilə səhihdir

Məsələ ۲۰۸۵: Şərtli satış müamiləsində satıcı pulu vaxtında vermədiyi halda onun mülkünü geri verə biləcəyindən əmin olsa belə, müamilə səhihdir. Amma pulu vaxtında verməzsə, alıcıdan mülkü istəməyə haqqı yoxdur. Əgər alıcı ölərsə, onun varislərindən .mülkü tələb edə bilməz

Məsələ ۲۰۸۶: Əgər keyfiyyətli çayı keyfiyyəti aşağı olan çayla qarışdırıb, keyfiyyətli çay .adına satarsa, alıcı müamiləni poza bilər

Məsələ ۲۰۸۷: Əgər alıcı aldığı malın bir qüsuru olduğunu başa düşərsə, məsələn; bir heyvan alıb, sonra onun gözünün birinin kor olduğunu görərsə, əgər bu qüsur müamilədən əvvəl heyvanda olduğu halda o bilmirdisə, müamiləni pozaraq onu satıcıya qaytara bilər. Əgər onu qaytarması mümkün olmazsa, məsələn; o malda bir dəyişmə meydana gəlmiş olarsa və ya onda geri qaytarmağa mane olan bir təsərrüf etmişsə, məsələn, onu satıb, yaxud icarəyə veribsə, yaxud da parçanı kəsib, ya tikmişsə, bu halda sağlam ilə qüsurlu arasında qiymət fərqini müəyyənləşdirib satıcıya verdiyi puldan həmin miqdarını geri ala bilər. Məsələn; dörd manata aldığı bir malın qüsuru olduğunu başa düşərsə, əgər onun qüsursuzunun qiyməti səkkiz manat, qüsurlunun qiyməti isə altı manatdırsa, qüsursuzla qüsurlu arasındakı qiymət fərqi .dörddə bir olduğundan satıcıya verdiyi pulun dörddə biri olan bir manatı geri ala bilər

Məsələ ۲۰۸۸: Satıcı satdığı malın əvəzində aldığı müəyyən bir şeydə eyb olduğunu görərsə, əgər o eyb müamilədən əvvəl göründüyü halda o bilməmişdirsə, satıcı müamiləni pozaraq onu sahibinə qaytara bilər. Amma əgər o şeydə meydana gələn bir dəyişmə və təsərrüf etmə üzündən qaytara bilməzsə, əvvəlki məsələdə söylənən .qaydaya görə eyibsiz ilə eyibli arasındakı qiymət fərqini ala bilər

Məsələ ۲۰۸۹: Əgər müamilədən sonra və malı alıcıya verməmişdən əvvəl onda bir qüsur ortaya çıxarsa, alıcı müamiləni poza bilər. Həmçinin malın əvəzi olan bir şeydə müamilədən sonra, verilməmişdən qabaq bir eyb tapılsa, satıcı müamiləni poza bilər. Əgər qiymət fərqini almaq istərlərsə də geri qaytarmaq imkanı olmadığı təqdirdə .caizdir

Məsələ ۲۰۹۰: Müamilədən sonra malın eybi olduğunu anlarsa, müamiləni pozmaq istərsə, dərhal pozmalıdır. Əks təqdirdə (halların müxtəlifliyini nəzərə almaqla) əgər .adi qaydadan çox vaxt keçənə qədər təxirə salsa artıq müamiləni poza bilməz

Məsələ ۲۰۹۱: Əgər müamilədən sonra aldığı malın eybi olduğunu başa düşərsə, satıcı hazır olmasa belə, müamiləni poza bilər. Başqa fəsx etmə haqqlarında da hökm .eynidir

Məsələ ۲۰۹۲: İki yerdə alıcı, malda üzə çıxan eyib səbəbi ilə müamiləni poza bilməz və .ya qiymət fərqini ala bilməz

;Malı alarkən eyibli olduğunu bilirdisə .۱

Müamilə vaxtı satıcı «bu malı bütün eyibləri ilə bərabər satıram» demişsə, amma bir .۲ eyibi göstərib və «bu eyiblə satıram» demişsə və sonradan onda başqa bir eyibin də olduğunu anlamışsa, alıcı satıcının göstərmədiyi eyibə görə malı geri qaytara bilər və .geri qaytara bilmədiyi təqdirdə də qiymət fərqini ala bilər

Məsələ ۲۰۹۳: Əgər alıcı aldığı malın eyibli olduğunu başa düşərsə və aldıqdan sonra onda ayrı bir eyb tapılsa, müamiləni poza bilməz. Amma eyibsiz ilə eyibli arasındakı qiymət fərqini ala bilər. Lakin aldığı heyvan qüsurlu olsa, fəsx etmə haqqına sahib

olduğu üç gün keçməmişdən əvvəl başqa bir qüsur meydana gələrsə, onu təhvil almış olsa belə, yenə də geri qaytara

bilər. Həmçinin yalnız alıcının müəyyən müddətə qədər fəsx etmə haqqına sahib olsa, o müddət ərzində malda başqa bir qüsur meydana gələrsə, onu təhvil almış olsa belə, .müamiləni poza bilər

Məsələ ۲۰۹۴: Əgər insanın özünün görmədiyi bir malı olarsa və digəri ona malın xüsusiyyətlərini başa salarsa, o da başqasının ona anlatdığı xüsusiyyətləri alıcıya söyləyərək onu satarsa, sonra da onun dediklərindən daha yaxşı olduğunu başa .düşərsə, müamiləni poza bilər

## MÜXTƏLİF MƏSƏLƏLƏR

Məsələ ۲۰۹۵: Əgər satıcı malın alış qiymətini alıcıya söyləyərsə, həmin qiymətə, ya da daha aşağı qiymətdən satsa belə, qiymətin azalmasına və ya artmasına səbəb olan digər bütün şeyləri də söyləməlidir. Məsələn; nəqd və ya nisyə aldığını da deməlidir. Əgər o xüsusiyyətlərin bəzisini söyləməsə və alıcı sonradan başa düşsə müamiləni .poza bilər

Məsələ ۲۰۹۶: Bir şəxs başqa birinə bir mal verib onun qiymətini müəyyən edərək «bu malı bu qiymətdən sat, nə qədər baha sata bilirsən artığı sənin satma haqqın olacaq» deyərsə, bu halda nə qədər bahaya satarsa, mal sahibinindir və satıcı yalnız öz zəhmət haqqını sahibindən ala bilər. Amma əgər cüalə şəklində olarsa və «əgər bu malı .bu qiymətdən artığına sata bilsən, artığı sənin olsun» deyərsə, heç bir maneəsi yoxdur

Məsələ ۲۰۹۷: Əgər bir qəssab erkək heyvan əti satarsa və yerinə dişi heyvan əti verərsə, günah işlətmiş olur. Bu halda əgər onun müəyyən edib «bu erkək heyvan ətini satıram» demişsə, alıcı müamiləni poza bilər. Əgər onu bildirməmişsə, müştəri aldığı .ətə razı olmazsa, qəssabın ona erkək heyvan əti verməsi lazımdır

Məsələ ۲۰۹۸: Alıcı parça satıcısından rəngi solmayan bir parça istəyərsə, satıcı isə ona .rəngi solan bir parça verərsə, alıcı müamiləni poza bilər

Məsələ ۲۰۹۹: Əgər satıcı satdığı malı təhvil verə bilməsə, məsələn, satdığı at qaçarsa, .bu halda müamilə batil olur, müştəri də öz pulunu tələb edə bilər

## ŞƏRİKLİK HÖKMLƏRİ

Məsələ ۲۱۰۰: Əgər iki nəfər, şərikli olan malları ilə ticarət edib əldə etdikləri qazancları aralarında bölməyi qərara alarlarsa və ərəbcə və ya başqa bir dildə şəriklik əqdini oxuyar, ya da bir-birləri ilə şərik olmaq istədiklərini müəyyən edən bir iş görərlərsə, .onların şərikliyi səhihdir

Məsələ ۲۱۰۱: Əgər bir neçə nəfər öz işlərindən aldıqları pullarda şərik olsalar, məsələn; bir neçə dəllək bir-birləri ilə razılaşarlar ki, hər nə qədər gəlir götürsələr, birlikdə bölsünlər, bu şəriklik səhih deyildir. Amma əgər məsələn; müəyyən bir müddətə qədər hər birinin zəhmət haqqının yarısının əvvəlkinin zəhmət haqqının yarısı əvəzində müəyyən müddətə qədər onun olması üzrə bir-birilə razılaşarlarsa, bu razılaşma .səhihdir və hər biri əvvəlki ilə onun aldığı qazancda şərik olurlar

Məsələ ۲۱۰۲: Əgər iki nəfər şərik olsalar ki, hər birinin öz hesabına alıb, əvəzini özü borclu olduğu bir malda bir-birləri ilə hər birisinin aldığı maldan əldə edilən qazancda şərik olmalarını qərarlaşdırarlarsa, bu şəriklik səhih deyildir. Amma əgər hər biri digərinin borc olaraq aldığı şeydə onu da şərik etməyə vəkil edər, yəni hər ikisi də borclu olmaq üzrə o malı həm özü, həm də şəriki üçün alırsa, hər ikisi də o malda şərik .olurlar

Məsələ ۲۱۰۳: Şəriklik siğəsi oxuyaraq bir-birləri ilə ortaq olan şəxslərin ağıllı və baliğ olmaları, öz qəsd və ixtiyarları ilə şərik olmaları və həmçinin öz malından istifadə haqqına sahib olmaları gərəkdir. Deməli, səfeh (malını boş işlərə xərcləyən şəxs) öz .malından istifadə etmə haqqına sahib olmadığından şərik olsa, səhih deyil

Məsələ ۲۱۰۴: Əgər şəriklik əqdində işləyən və ya digər şəriki ilə müqayisədə daha çox işləyən, ya da işi o birinə görə daha əhəmiyyətli olan şəxsin daha çox qazanc .götürməsini şərt qoyarlarsa, şərt qoyduqları miqdarı ona verməkləri gərəkdir

Həmçinin əgər işləməyən və ya çox işləməyən, ya da işi o biri ilə müqayisədə daha əhəmiyyətli olmayan şəxsin daha çox qazanc almasını şərt qoyarlarsa, yenə də şərt .səhihdir və şərt qoyduqları miqdarı ona verməlidir

Məsələ ۲۱۰۵: Əgər qazancın hamısını sadəcə birisinin götürməsini və ya zərərin hamısını onlardan birinin üzərinə qoymalarını qərarlaşdırsalar, bu şərikliyin səhih .olması işkallıdır

Məsələ ۲۱۰۶: Əgər şəriklərdən birinin, mənfəətdən çox xeyir götürməsini şərt qoymamışlarsa, belə ki, şəriklərin sərmayələri bərabərdirsə xeyir və zərəri eyni miqdarda paylaşmalıdırlar. Amma əgər sərmayələri eyni ölçüdə olmazsa, xeyir və zərəri də sərmayələrinə mütənasib olaraq bölməlidirlər. Məsələn; şərik olan iki nəfərin birinin sərmayəsi digərinin sərmayəsindən iki qat çox olsa, ona düşən xeyir və zərər payı istər hər ikisi eyni miqdarda işləsin və ya biri az işləsin, yaxud əsla işləməsin, o .birinin payının iki qatı olur

Məsələ ۲۱۰۷: Əgər şəriklik əqdində hər ikisinin birlikdə al-ver etmələrini və ya hər birinin tək başına müamilə etməsini, yaxud tək birinin müamilə etməsini, ya da müamilə etmək üçün üçüncü bir şəxsin əcir tutulmasını şərt qoymuşlarsa, gərək .qərarlarına əməl etsinlər

:Məsələ ۲۱۰۸: Şəriklik iki cür ola bilər

İzni şəriklik. O da bundan ibarətdir ki, şərikli müamilədən əvvəl ticarət malı şəriklərin -۱ .arasında müşa şəklində olsun

Müavizi (dəyişmək) şəriklik. O da bundan ibarətdir ki, şəriklərdən hər biri öz malını -۲ şirkət üçün hazır edir, nəticədə hər biri öz malının yarısını digərinin malının yarısı ilə dəyişir. Əgər sərmayə ilə hansının al-ver edəcəyini müəyyənləşdirməmişlərsə, izni şəriklikdə onlardan heç biri digərinin icazəsi olmadan o sərmayə ilə müamilə edə bilməz. Amma müavizi şəriklikdə onların hər biri şirkətə zərər vurmadan müamilə edə .bilər

Məsələ ٢١٠٩: Şirkətin sərmayəsinin ixtiyarı əlində olan şərik, şərikliyin şərtinə görə hərəkət etməlidir. Məsələn; əgər onunla nisyə alması, ya nəqd satması və ya malı müəyyən bir yerdən

alması qərarlaşdırılmışdırsa, bu şərtə görə əməl etməlidir. Amma əgər onunla bir qərar qoyulmamışsa, adi qaydada müamilə etməli və şirkətin zərər etməyəcəyi al-.verləri etməlidirlər

Məsələ ۲۱۱۰: Şirkətin sərmayəsi ilə al-ver edən şəxs, əgər onunla edilən şərtə zidd al-ver edərsə və ya onunla şərt kəsilməmiş olarsa və adi qaydanın əksinə müamilə edərsə, bu iki halda əqva nəzərə görə müamilənin səhih olmasına baxmayaraq, bu müamilədən zərər edərsə və ya şirkətin malının bir miqdarı tələf olarsa, şərtləşmənin .və ya normanın əksinə hərəkət etmiş olan şərik buna zamindir

Məsələ ۲۱۱۱: Şirkətin sərmayəsi ilə müamilə edən şərik, əgər sərmayəni saxlamaqda ifrat və səhlənkarlıq etməsə və onun bir qismi, yaxud hamısı təsadüfən tələf olsa, .zamin deyil

Məsələ ۲۱۱۲: Şirkətin sərmayəsi ilə müamilə edən şərik sərmayənin tələf olduğunu söyləyərsə, digər şəriklər yanında inanılmış bir şəxsdirsə, onun sözünü qəbul etmələri lazımdır. Amma əgər belə deyilsə, şəriət qazilik üsullarına görə mübahisələrini həll .etmələri üçün şəriət hakiminə müraciət edə bilərlər

Məsələ ۲۱۱۳: Əgər izni şəriklikdə şəriklərin hamısı bir-birlərinə verdikləri istifadə icazəsindən imtina edərlərsə, artıq heç birisi şirkətin malından istifadə edə bilməzlər. Amma əgər onlardan biri icazəni geri götürərsə, digərlərinin istifadə haqqı yoxdur. Amma icazəsini geri götürən şəxs, şirkətin malından istifadə edə bilər. Hər bir halda .onların sərmayədə iştirakları öz halında qalır

Məsələ ۲۱۱۴: İzni şəriklikdə şəriklərin biri sərmayənin bölünməsini istərsə, şəriklik müddəti bitməmiş olsa belə, gərək digər şəriklər qəbul etsinlər. Amma əgər qisməti rədd şəklində olsa yəni bəzi şəriklərin xərcə düşmələri ilə nəticələnərsə və ya şəriklərə .çox bir zərəri olarsa, bölgü qəbul edilməyə bilər

Məsələ ۲۱۱۵: Əgər izni şəriklikdə şəriklərin birisi ölərsə, ya dəli və ya bihuş olarsa, digər ortaqlar şirkətin malından istifadə edə bilməzlər. Həmçinin onlardan biri səfeh olarsa,

Məsələ ۲۱۱۶: Əgər şəriklərdən biri, özü üçün nisyə bir mal alarsa, xeyir və zərəri onun özünə aiddir. Amma əgər şirkət üçün alarsa və şəriklik şərti nisyə müamiləni də əhatə .edirsə, xeyir və zərəri hər ikisinə aiddir

Məsələ ۲۱۱۷: Şirkətin sərmayəsi ilə bir müamilə etdikdən sonra şərikliklərinin batil olduğunu başa düşərlərsə, bu halda əgər müamiləyə icazə vermək şərikliyin doğruluğuna bağlı deyildirsə (bu mənada ki, şərikliyin doğru olmadığını bildikləri halda yenə də bir-birlərinin istifadəsinə razı olsaydılar), müamilə səhihdir və o müamilədən hər nə əldə edilərsə, hamısının malıdır. Əgər belə deyilsə, o birilərin istifadəsinə razı olmayan şərik yoldaşları «bu müamiləyə razıyıq» deyərlərsə, müamilə səhihdir. Əks təqdirdə batil olur. Hər iki təqdirdə də onlardan hansı biri şirkət üçün işləmişsə, əgər pulsuz olaraq işləmək qəsdi olmayıbsa, zəhmətinin əvəzini normal bir şəkildə digər şəriklərdən sərmayə qaydasına görə ala bilər. Amma əgər normal zəhmət haqqı şərikliyin səhih olduğu fərz olunan halda, bu müamilədən ələ gələn qazancdan çox .olarsa, ancaq o, qazanc götürə bilər

## (SÜLH (RAZILAŞMANIN HÖKMLƏRİ

Məsələ ۲۱۱۸: Sülh odur ki, insan başqası ilə razılaşa ki, öz malının və ya malının mənfəətinin bir miqdarını onun mülkü etsin, ya öz tələb və ya haqqından keçsin ki, onun tərəf müqabili də bunun əvəzində öz malını, ya malının mənfəətinin bir miqdarını buna tapşırsın, ya öz haqqından və ya tələbindən keçsin. Əgər əvəz almadan, razılaşsa ki, öz malından, ya malının mənfəətindən bir qədərini ona tapşırsın, ya öz tələbindən, ya haqqından keçsin, bu halda yenə də sülh səhihdir.

Məsələ ۲۱۱۹: Öz malını başqası ilə sülh edən şəxs həddi-büluğa çatmış, aqil olmalı, sülh etmə qəsdi olmalı bir kəs onu bu işə məcbur etməməlidir. Həmçinin səfeh və müflisləşmə səbəbi ilə öz malında təsərrüf etmə haqqından məhrum edilməməlidir.

Məsələ ۲۱۲۰: Sülhün siğəsinin ərəbcə oxunması lazım deyil; əksinə bir-biri ilə razılaşmalarını çatdıran hər bir kəlmə ilə və ya iş ilə də olsa səhihdir.

Məsələ ۲۱۲۱: Əgər bir nəfər öz qoyunlarını, misal üçün bir il saxlayaraq onun südündən istifadə edib bir qədər də ona yağ verməsi əsasında çobanla sülh edərsə, bu halda əgər qoyunların südünü çobanın çəkdiyi zəhmətlər və o yağ müqabilində sülh edərsə, səhihdir. Hətta əgər qoyunları bir illik çobana icarəyə versə və südündən istifadə edərək əvəzində bir qədər yağ verməsini desə, amma o qoyunların süd və yağı olmasını qeyd etməsə də, səhihdir.

Məsələ ۲۱۲۲: Əgər bir şəxs alacağını və ya haqqını başqa birisi ilə sülh etmək istərsə, qarşı tərəf qəbul etdiyi təqdirdə

səhihdir. Amma əgər öz haqq və ya alacağından keçmək istərsə, qarşı tərəfin qəbul etməsi lazım deyil.

Məsələ ۲۱۲۳: Əgər insan öz borcunun miqdarını bilsə, amma borclu olduğu şəxs miqdarını bilməsə, bu halda borc sahibi öz borcunu olduğu miqdardan az miqdarla razılığa gəlsə məsələn; əlli manat almalıykən, on manatla sülh edərsə, qalan miqdar borclu üçün halal deyildir. Amma əgər borcunun miqdarını ona deyərsə və onu razı salarsa, yaxud alacaqlı, alacığı miqdarı bilsəydi, yenə də o miqdara sülh edərdisə, bu halda halal olur.

Məsələ ۲۱۲۴: Əgər iki nəfərin bir-birlərinin əlində və ya zimmətində malları olsa və bunlardan birinin digərindən çox olduğu bilinərsə, o malların bir-biri əvəzində alqı-satqısı ribaya (faizə) yol açdığı üçün haram olursa, onların bir-biri ilə sülh etməsi də haramdır. Hətta onların birisinin malı digərindən çox olduğu bilinməzsə, amma birinin çox olduğuna ehtimal verilərsə, ehtiyat-lazıma əsasən, o iki malı bir-birilə sülh edə bilməzlər.

Məsələ ۲۱۲۵: Əgər iki nəfər bir adamdan alacaqlı olsa və ya iki kişi digər iki kişidən alacaqlıdırsa və öz alacaqları barədə bir-birilə sülh etmək istərlərsə, əvvəlki məsələdə söylənildiyi kimi, bu ribaya yol açmazsa, maneəsi yoxdur. Məsələn; hər ikisi (biri keyfiyyətli, digəri orta keyfiyyətli olan) on batman buğda alacaqlı olsa və hər ikisinin müddəti sona çatmışsa, onların sülh etməsi səhihdir.

Məsələ ۲۱۲۶: Əgər bir şəxsdən bir müddət sonra alması lazım gələn alacağının qalanını nəqd almaq məqsədi ilə bir miqdarından keçərək qalan az miqdarı üçün onunla sülh edərsə, maneçiliyi yoxdur. Əlbəttə bu hökm alacağın qızıl və ya gümüş yaxud çəki və ya ölçü ilə satılan bir mal olduğu təqdirdədir. Bunlardan kənar qalan mallarda ۲۲۴۸-ci məsələdə izah olunduğu kimi, alacaqlının alacağını borclu olan şəxsə və ya başqası ilə alacağından daha az miqdar üçün sülh etməsi və ya satması caizdir.

Məsələ ۲۱۲۷: Bir şey üçün sülh edən iki nəfər, hər ikisi razı olduğu təqdirdə sülhü poza bilərlər. Həmçinin əgər müamilə zamanı hər ikisi üçün və ya birisi üçün müamiləni ləğv

Məsələ ۲۱۲۸: Satıcı və alıcı müamilə məclisindən ayrılmamış müamiləni poza bilərlər. Həmçinin heyvan alan bir müştərinin üç günə qədər müamiləni pozma haqqı vardır. Aldığı bir malın pulunu üç günə qədər verməzsə və malı götürməzsə, ۲۰۸۲-ci məsələdə izah olunduğu kimi, satıcının müamiləni pozma haqqı vardır. Amma malı sülh edən bir şəxsin bu üç halda sülh pozma haqqı yoxdur. Lakin əgər tərəf müsalihə olunan şeyi verməyi normadan artıq gecikdirərsə və ya məsələn; müsalihə olunan malı nəqd verməsi şərt qoyulmuş olarsa və tərəf şərtə əməl etməzsə, razılaşmanı poza bilər. Həmçinin alış-verişin sair hökmlərində izah olunan müamiləni ləğv etmə haqqı olan digər hallarda da sülhü ləğv edə bilər. Amma əgər sülh edən tərəflərin biri uduzarsa; bu təqdirdə sülh münaqişəni aradan qaldırmaq üçün olarsa, razılaşmanı poza bilməz. Hətta bundan başqa hallarda da ehtiyat-vacibə görə uduzan şəxs müamiləni .pozmamalıdır

Məsələ ۲۱۲۹: Razılaşma yolu ilə aldığı şey qüsurlu çıxarsa, razılaşmanı poza bilərlər. .Amma qüsursuz ilə qüsurlu arasında olan qiymət fərqini almaq istərsə, bu, işkallıdır

Məsələ ۲۱۳۰: Əgər öz malını başqa birisi ilə sülh edərsə və «mən öldükdən sonra səninlə sülh etdiyim şeyi, məsələn; vəqf edəcəksən» deyə, şərt qoyarsa və o da bu şərti qəbul .edərsə, şərtə əməl etməlidir

## İCARƏNİN HÖKMLƏRİ

**Point**

Məsələ ۲۱۳۱: İcarə verən və icarəyə götürən şəxslərin ağıllı və baliğ olmaları, öz ixtiyarı ilə icarə qurmaları gərəkdir. Həmçinin onlar öz mallarından istifadə haqqına sahib olmalıdırlar. Deməli, səfeh olan şəxs öz malından istifadə haqqına sahib olmadığından bir şeyi icarəyə götürə bilməz və ya icarəyə verə bilməz. Həmçinin iflasa uğramış olan bir şəxs istifadə haqqı olmadığı mallardan bir şeyi icarəyə verə bilməz və ya onunla bir .şeyi icarəyə götürə bilməz. Amma özünü (iş qüvvəsini) başqasına əcir edə bilər

Məsələ ۲۱۳۲: İnsan başqası tərəfindən vəkil olub, onun malını icarəyə verə bilər və ya .onun üçün bir malı icarəyə götürə bilər

Məsələ ۲۱۳۳: Uşağın vəlisi və ya qəyyumu uşağının malını icarəyə versələr, ya uşağın özünü başqasına əcir versələr, maneəsi yoxdur. Əgər uşağın həddi-büluğa yetişmə müddətindən bir qismini də əcir olma müddəti qərar versələr, uşaq həddi-büluğa çatdıqdan sonra icarənin qalanını poza bilər, baxmayaraq ki, əgər uşağın həddi-büluğa çatma zamanını, icarənin müddətindən hesab etməsəydi, uşağın məsləhətinin xilafına olardı. Bəli, əgər şərən lazım olan məsləhətə xilaf olsa, yəni müqəddəs şəriət onun tərk olunmasına razı olmadığı bir məsləhət olsa, bu halda əgər icarə, şəriət .hakiminin izni ilə olsa, uşaq həddi-büluğa çatandan sonra, icarəni poza bilməz

Məsələ ۲۱۳۴: Vəlisi olmayan səğir bir uşaq müctəhidin icazəsi olmadan əcir tutula bilməz. Əgər müctəhid olmazsa, adil bir mö`minin icazəsi alınaraq o uşaq əcir tutula .bilər

Məsələ ۲۱۳۵: İcarə verənin və ya icarəyə götürənin icarə əqdini ərəbcə oxumaları lazım (vacib) deyil. Sadəcə olaraq

mülkün sahibi bir şəxsə «bu malı sənə icarəyə verdim» deyərsə, o da «qəbul etdim» deyərsə, icarə səhihdir. Hətta heç bir danışıq olmadan mal sahibi icarəyə vermək qəsdi ilə malı icarəyə götürənə verirsə və o da icarəyə götürmək qəsdi ilə alırsa, icarə .səhihdir

Məsələ ۲۱۳۶: Əgər insan icarə əqdi oxumadan bir iş görmək üçün əcir olmaq istərsə, o .işə başladığı təqdirdə icarə səhihdir

Məsələ ۲۱۳۷: Danışa bilməyən şəxs, əgər işarə ilə mülkü icarəyə verdiyini və ya icarəyə .götürdüyünü başa salarsa, icarə səhihdir

Məsələ ۲۱۳۸: Bir ev, dükan, gəmi və ya otağı icarəyə götürdüyü zaman, mülk sahibi onlardan sadəcə icarəçinin özünün istifadə etməsini şərt qoyarsa, icarəçi onları başqasına icarəyə verə bilməz. Amma əgər icarə özünə məxsus olsa, məsələn; bir ev və ya otağı icarəyə götürmüş olan qadının ərə gedib sonra o ev və ya otağı özünün qalması üçün ərinə icarəyə verməsi kimi. Amma əgər mülk sahibi belə bir şərt qoymamışsa, onu başqasına icarəyə verə bilər (əlbəttə, mülkü ikinci icarəçiyə vermək üçün ehtiyata əsasən mülk sahibindən icazə almalıdır). Əgər icarəyə aldığı mülkü icarə etdiyi haqqdan çox icarəyə vermək istəsə, hərçənd icarə başqa cinsdən olsa belə, əgər ev, dükan, gəmi olsa, onda təmir və ya ağartma kimi işlər görməlidir, ya da onu .mühafizə etmək üçün bir xəsarət vermiş olmalıdır

Məsələ ۲۱۳۹: Əgər əcir olunan sadəcə əcir olduğu şəxsə işləyəcəyini şərt qoymuşsa, əvvəlki məsələdə izah olunan haldan başqa, əcir tutan onu başqasına əcir verə bilməz. Amma belə bir şərt qoymamışsa, onu başqasına əcir verə bilər. Amma ona ücrət olaraq təyin etdiyi şey qiymət baxımından əcir olan şəxsə verdiyi haqqdan çox olmamalıdır. Həmçinin əgər özü başqasına əcir olmuşsa və o işi görmək üçün başqa birini öz ücrətindən daha az bir miqdara əcir tutmaq istərsə, hökm eynidir. Lakin əgər .o işin bir miqdarını özü görmüş olsa, başqasını öz ücrətindən daha aza əcir tuta bilər

Məsələ ۲۱۴۰: Əgər ev, dükan, otaq, gəmidən başqa bir şeyi, məsələn; bir yeri icarələyərsə və mülkün sahibi də «sadəcə özün

istifadə etməlisən» deyə bir şərt qoymamışsa, onu öz icarələdiyindən çox icarəyə .verərsə, bu icarənin səhih olması məhəlli işkaldır

Məsələ ۲۱۴۱: Əgər ev və ya bir dükanı, məsələn; illik yüz manata icarəyə götürərsə, onun yarısından özü istifadə edib, yarısını da yüz manata icarəyə verə bilər. Amma əgər onun yarısını icarəyə götürdüyündən daha çox qiymətə, məsələn yüz iyirmi .manata kirayəyə vermək istərsə, onda orada tə`mir işi kimi bir iş görməlidir

## İCARƏYƏ VERİLƏN MALIN ŞƏRTLƏRİ

:Məsələ ۲۱۴۲: İcarəyə verilən malın bir neçə şərti vardır

Müəyyən olmalıdır; başqa sözlə, əgər «evlərimdən birini sənə icarəyə verdim». ۱ .deyərsə, səhih deyil

İcarəçi onu görməli, əgər orada hazır olmasa yaxud külli olsa, icarəyə verən onun .۲ icarəyə verilməsinə meyl etməkdə təsirli olan xüsusiyyətlərinin hamısını aydın şəkildə .söyləməlidir

Onun təhvil verilməsi mümkün olmalıdır. Buna görə qaçmış olan bir atı icarəyə .۳ vermək, icarəçinin onu tuta bilmək imkanı olmazsa, batildir və tuta bilmək imkanı .varsa, səhihdir

İstifadə olunarkən tələf edilib aradan aparılan bir şey olmamalıdır. Buna görə çörək, .۴ .meyvə və digər yeməkləri icarəyə vermək səhih deyil

Mal hansı məqsədlə icarə verilibsə, həmin istiqamətdə istifadə mümkün olmalıdır. .۵ Buna görə əkin üçün icarəyə verilən bir tarlanın suvarılmasına yağış suyu yetişmirsə, .çay suyu da çatmazsa, icarə səhih deyil

İcarəyə verdiyi şey, hansı məqsədlə icarəyə verirsə, onun mənfəatinə sahib .۶ olmalıdır. Əgər nə onun maliki, nə qəyyumu nə də vəkili olmazsa, (başqa birinin malını .icarəyə verirsə) onun sahibinin razılığı olduğu vaxt səhih sayılır

Məsələ ۲۱۴۳: Meyvəsindən istifadə etmək üçün ağacını icarəyə vermək ağacın meyvəsi ,hal-hazırda mövcud olmasa da

.səhihdir. Bir heyvanı südündən istifadə üçün icarəyə vermək də eyni hökmü daşıyır

Məsələ ۲۱۴۴: . Qadın, öz südündən istifadə olunmaq üçün əcir tutula bilər. Öz ərindən də icazə alması lazım deyil. Lakin süd vermək vasitəsilə ərinin haqqı aradan gedərsə, .onun icazəsi olmadan əcir oluna bilməz

## İCARƏYƏ VERİLƏN MALDAN İSTİFADƏNİN ŞƏRTLƏRİ

:Məsələ ۲۱۴۵: Malın icarəsindən istifadənin dörd şərti vardır

Halal olmalıdır; deməli, yalnız haram mənfəəti olan, yaxud haram işdə istifadə .۱ olunması şərt olunan, yaxud müamilədən əvvəl haram istifadəni müəyyənləşdirib müamiləni o əsasda qursalar, müamilə batildir. Buna görə də dükanı şərab satışı və ya onun saxlanması üçün icarəyə vermək və ya heyvanı şərab daşımaq üçün icarəyə .vermək batildir

O iş şəriət nəzərində havayı olaraq vacib olmamalıdır; ehtiyat-vacibə görə halal və .۲ haram hökmlərini öyrətmək gündəlik qarşıya çıxan halda, eləcə də ölünün kəfən və difn işlərinin vacib miqdarı bu belədir. Başqa sözlə bu işlər üçün əcir olmaq icazəli deyil. Ehtiyat-vacibə görə o istifadəyə pul vermək camaatın nəzərində hədər yerə gedən pul .kimi sayılmamalıdır

İcarəyə verilən şeyin bir neçə istifadəsi olarsa, icarəyə götürən onun hansı .۳ cəhətindən istifadə edəcəyini bildirməlidir; məsələn, həm minilən, həm də yük daşınılan bir heyvan icarəyə verilirsə, icarə etmə zamanında minilməsinin və ya yük daşınmasının yaxud bütünlüklə hər iki cəhətinin icarəyə götürənə aid olduğu .bildirilməlidir

İstifadəsinin miqdarı bildirilməlidir. Bu isə icarənin müddətini bildirməklə olur. Ev və .۴ dükanın icarə verilməsində olduğu kimi ya da işin aydınlaşdırılması ilə olar. Məsələn; .dərzi ilə müəyyən olan libası, məxsus bir tərzdə tikməsi qərarlaşdırılır

Məsələ ۲۱۴۶: Əgər icarə müddətinin başlanğıcını müəyyən etməzlərsə, onun başlanğıcı .icarə əqdinin bitməsindən etibarən başlayar

Məsələ ۲۱۴۷: Əgər bir evi, məsələn; bir illiyə icarəyə verib və onun başlanğıcını icarə əqdinin oxunmasından sonra bir ay sonraya müəyyənləşdirsələr, əqd oxunduğu .zaman ev digəri tərəfindən icarəyə götürülmüş olsa belə, icarə səhihdir

Məsələ ۲۱۴۸: Əgər icarə müddətini bildirməyib və «evdə yaşadığım müddət, məsələn; .icarəsi ayda min manatdır» deyərsə, icarə səhih deyil

Məsələ ۲۱۴۹: Əgər icarəçiyə «evi sənə ayı min manatdan icarəyə verdim» deyərsə və ya «evi sənə bir aylığına min manat icarəyə verdim, ondan sonra da hər nə qədər qalsan, onun icarəsinin ayı min manatdır» deyərsə, icarə müddətinin başlanğıcı məlum olarsa, .ilk ayın icarəsi səhihdir

Məsələ ۲۱۵۰: Müsafir və ziyarətçilərin nə qədər qalacaqları məlum olmayan bir evin hər gecəsinə yüz manat verməyi qərarlaşdırarlarsa və ev sahibi də buna razı olarsa, o evdən istifadə etməyin maneçiliyi yoxdur. Amma icarə müddətini müəyyənləşdirmədikləri üçün ilk gecədən sonraya icarə səhih deyildir. Ev sahibi də ilk .gecədən sonra istədiyi vaxt onları evdən çıxara bilər

## İCARƏNİN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۲۱۵۱: İcarəçinin icarə əvəzi olaraq verdiyi malın müəyyən edilməsi lazımdır. O halda əgər bu, buğda kimi çəki və ya ölçü ilə müamilə edilən şeydirsə, çəkisinin bilinməsi və əgər mütədavil pullar kimi sayılaraq müamilə edilən şeydirsə, sayının bilinməsi və əgər at, qoyun kimi bir şeydirsə, icarəyə verənin onu görməsi, yaxud .icarəçinin onun xüsusiyyətlərini deməsi lazımdır

Məsələ ۲۱۵۲: Əgər bir tarlanı əkin üçün icarə versə və icarə əvəzini də hal-hazırda mövcud olmayan o tarlanın və ya başqa bir yerin məhsulunu təyin edərsə və ya o tarlanın öz

məhsulundan verilməsi şərti ilə əsaslı olaraq zimməsinə alarsa, icarə səhih deyil. .Amma əgər yerin məhsulu hal-hazırda mövcud olarsa, bir maneəsi yoxdur

Məsələ ۲۱۵۳: Bir şeyi icarəyə verən şəxsin o şeyi təhvil verməyincə onun kirəsini istəməyə haqqı yoxdur. Həmçinin bir işi görmək üçün əcir olan şəxsin də o işi görməyənə qədər haqqını istəməyə hüququ yoxdur. Amma həcc üçün əcir olmaq kimi .adətən haqqı əvvəlcədən alınan bir iş üçün əcir olmuşsa, ala bilər

Məsələ ۲۱۵۴: Əgər icarəyə verdiyi şeyi təhvil verərsə, icarəçi təhvil almasa belə, ya da təhvil alıb, amma icarə müddətinin sonuna qədər istifadə etməsə belə, onun icarə .pulunu verməlidir

Məsələ ۲۱۵۵: Əgər insan müəyyən bir gündə bir işi görmək məqsədilə əcir olarsa və həmin gündə hazır olarsa, əcir tutan işi ona gördürməsə belə, haqqını verməlidir. Məsələn; bir dərzini müəyyən bir gündə paltar tikmək üçün əcir tutarsa, dərzi də o gün tikmək üçün hazır olarsa, ona tikiləcək parçanı verməsə belə, dərzi istər boş dayansın .və istərsə özü və başqası üçün işləsin, haqqını verməlidir

Məsələ ۲۱۵۶: İcarə müddəti tamam olduqdan sonra, icarənin batil olduğu məlum olarsa, icarəçinin normal miqdarda icarə əvəzini (ücrətül-misl) mülk sahibinə verməsi lazımdır. Məsələn; bir evi, ili yüz manata kirayələmişsə, sonradan kirayənin batil olduğunu başa düşmüşsə, o ilin illik kirəsi əvəzi normal qiymətlərlə əlli manatdırsa, əlli manat verməlidir. Əgər iki yüz manatdırsa, o evi kirayəyə verən onun sahibi və ya mütləq vəkil olduğu və o evi normal kirə əvəzindən xəbəri olub kirəyə verdiyi təqdirdə yüz manatdan artığının verməsi lazım deyil. Belə olmadığı təqdirdə gərək iki yüz manat versin. Həmçinin icarə müddətindən bir miqdar keçdikdən sonra icarənin batil olduğu .aydınlaşarsa, keçən müddətin kirəsi üçün də eyni hökm qüvvədədir

Məsələ ۲۱۵۷: Əgər icarəyə götürdüyü bir şey xarab olub aradan gedərsə, onu qorumaqda səhlənkarlıq etməmişdirsə və ondan istifadədə ifrata varmamışsa, zamin deyil. Həmçinin bir

dərziyə verdiyi bir parça zay olarsa, əgər dərzi ifrata varmamışsa və parçanın .qorunmasında səhlənkarlıq etməmişsə, zamin deyil

Məsələ ۲۱۵۸: Əgər icarəyə alan şəxsin malında müəyyən iş görmək istəyən sənətkar, .dərzi və s. aldığı şeyi zay edərsə, zamindir

Məsələ ۲۱۵۹: Əgər qəssab, heyvanın başını kəsib onu haram (murdar) etsə, istər muzd .almış olsun, istərsə də pulsuz kəsmiş olsun, pulunu sahibinə verməlidir

Məsələ ۲۱۶۰: Nə qədər yük vuracağını bildirərək bir heyvanı və ya başqa bir vəsaiti icarəyə götürən şəxs, o miqdardan daha çox yükləyərsə və heyvan ya vəsait bunun nəticəsində tələf olarsa və ya eybli olarsa, zamindir. Həmçinin daşıyacağı yükün miqdarını bildirməyib, normadan çox yükləsə, yenə də zamindir. Hər iki təqdirdə artıq .yükün zəhmət haqqını da normal şəkildə ödəməlidir

Məsələ ۲۱۶۱: Bir heyvanı sına bilən yükü daşımaq üçün icarəyə verərsə və heyvanın sürüşməsi və ya hürkməsi nəticəsində yük sınarsa, heyvan sahibi zamin deyil. Amma əgər adi miqdardan artıq vurma (döymə) və ya buna bənzər bir vasitə ilə bir iş görə ki, .heyvan yerə yıxılıb yükü sındırsa, zamindir

Məsələ ۲۱۶۲: Əgər şəxs bir uşağı sünnət edərkən işində səhlənkarlıq və ya səhv edərsə, məsələn; normadan artıq kəsərsə və o uşaq həmin səbəbdən ölərsə və ya ona bir zərər dəyərsə, zamindir. Amma əgər səhlənkarlıq və ya yanlışlıq etməzsə və uşaq da sünnət edilmənin nəticəsində ölərsə və ya ona bir zərər yetişərsə, uşağa bir zərər gəlib-gəlməyəcəyini ayırd etmə xüsusunda ona müraciət edilməmişsə, o da .uşağa zərər gələcəyini bilmirdisə, zamin deyildir

Məsələ ۲۱۶۳: Əgər həkim öz əli ilə xəstəyə dərman verərsə və ya ona bir dərmanı məsləhət görərsə və o dərmanı qəbul etdikdən sonra xəstəyə bir zərər yetişərsə və .ya xəstə ölərsə, həkim onun müalicəsində səhlənkarlıq etməsə də zamindir

Məsələ ۲۱۶۴: Əgər həkim xəstəyə «sənə zərər yetişsə mən zamin deyiləm» deyərsə və diqqətlə və ehtiyatla ona yanaşarsa, amma yenə də xəstə bundan zərər görüb və ya

Məsələ ۲۱۶۵: İcarəçi və icarəyə verən şəxs qarşılıqlı razılıqla müamiləni poza bilərlər. Həmçinin icarədə hər ikisi üçün və ya onların biri üçün müamiləni pozma haqqını şərt .qoyublarsa, danışığa uyğun olaraq icarəni poza bilərlər

Məsələ ۲۱۶۶: İcarə verən və ya icarəçi zərər gördüyünü başa düşərsə, əgər icarə əqdi bağlandığı zaman zərər görəcəyindən agah olmasa, ۲۰۸۳-cı məsələdə izah olunan şərtlərə görə icarəni poza bilər. Amma icarə əqdi bağlayarkən şərtləşsələr ki, zərərə .düşsə belə, əqdi pozmaq haqqı olmayacaq, icarə əqdini poza bilməzlər

Məsələ ۲۱۶۷: İcarəyə verdiyi bir şeyi icarəçiyə təhvil verməmişdən əvvəl birisi onu qəsb etsə, icarəçi icarəni poza bilər və icarəyə verən şəxsdən verdiyi şeyi geri ala bilər və ya icarəni pozmayıb qəsb edənin əlində qaldığı müddətin normal miqdarda icarə pulunu qəsb edəndən ala bilər. Əgər bir heyvanı bir aylıq on manata icarəyə götürərsə və o bir ay içərisində birisi onu on gün qəsb edərsə, onun on günlük normal icarəsi on beş .manat olarsa, o on beş manatı qəsb edəndən almalıdır

Məsələ ۲۱۶۸: Əgər icarəyə götürdüyü bir şeyi başqa biri təhvil almağa qoymazsa və ya təhvil aldıqdan sonra başqası onu qəsb edərsə, ya da ondan istifadə etməsinə mane .olarsa, icarəni poza bilməz və yalnız onun normal icarə pulunu qəsb edəndən ala bilər

Məsələ ۲۱۶۹: İcarə müddəti tamamlanmamış mülkü icarəçiyə satarsa, icarə pozulmaz və icarəçi pulunu satana verməlidir. Həmçinin əgər onu başqa birisinə satarsa, hökm .eynidir

Məsələ ۲۱۷۰: İcarə müddəti başlamamışdan əvvəl icarə edilən şey icarə edən şəxs üçün müəyyən edilən istifadəni vermə qabiliyyətini itirərsə, icarə batildir. İcarəçinin mülk sahibinə verdiyi pul da geri qaytarılmalıdır. Əgər ondan az bir istifadə etmə .imkanı ola biləcək haldadırsa, icarəni poza bilər

Məsələ ۲۱۷۱: İcarəyə götürdüyü bir mülk icarə müddətindən bir müddət keçdikdən sonra icarəçi üçün təyin edilən istifadə qabiliyyətini itirərsə, icarənin qalan müddəti batil olur. Bu halda icarəçi keçmiş müddətin icarəsini pozub onun adi qiymətini verə

Məsələ ۲۱۷۲: İcarəyə verdiyi iki otaqlı evin bir otağı xarab olsa, əgər onu adi şəkildə düzəltsələr əvvəlkindən çoxlu fərqi olacaqsa, bu əvvəlki məsələdə izah olunan hal ilə eyni hökmü daşıyır. Amma belə olmazsa, bu halda əgər kirayə verən onu istifadədən heç bir miqdarı zay olmamış dərhal düzəldərsə, icarə batil olmaz. İcarəçi də icarəni poza bilməz. Amma onun təmiri icarəçinin istifadəsindən bir miqdarı zay olacaq qədər uzanarsa, o miqdarın icarəsi batil olur. İcarəçi müddətin hamısının icarəsini pozaraq, .istifadə etdiyi müddətin haqqını normal qiymətlə verə bilər

Məsələ ۲۱۷۳: İcarəyə verən və ya icarəçi ölərsə, icarə batil olmur. Amma evin mənfəəti yalnız həyatı boyunca ona aiddirsə, məsələn; başqa birisi onun diri olduğu müddətdə evin istifadəsindən ona aid olduğunu vəsiyyət etmişsə, belə bir evi icarəyə verib, icarə müddəti tamam olmamışdan qabaq ölsə, öldüyü vaxtdan etibarən icarə batil olur və əgər hal-hazırdakı sahib o icarəyə imza qoyarsa, icarə səhihdir. İcarə verənin .ölümündən sonrakı müddətin icarə əvəzi isə hal-hazırdakı sahibinindir

Məsələ ۲۱۷۴: İş sahibi (sahibkar) bənnanı fəhlə tutmaq üçün vəkil edərsə, əgər bənna işçilərə iş sahibindən aldığı miqdardan az verərsə, özünə götürdüyü artıq hissə haramdır və onu iş sahibinə verməlidir. Amma əgər bir binanı tikmək üçün əcir olsa və işi özünün görməsi, yaxud başqasına verməsində səlahiyyət alarsa, bir miqdar özü işlədikdən sonra qalanını özü üçün aldığı puldan az miqdara başqasına verərsə, artıq .miqdarı ona halaldır

Məsələ ۲۱۷۵: Əgər rəngsazlar, parçanı lil ilə rəngləməsini qərara alsalar və o, başqa .şeylə rəngləsə, bir şey almağa haqqı yoxdur

## MÜZARİBƏNİN HÖKMLƏRİ

Məsələ ۲۱۷۶: Müzaribə, iki nəfər arasında yerinə yetirilən bir sözləşmədir. Onlardan biri sərmayə qoyur (malikdir), amil adlanan digəri isə həmin sərmayə ilə bir işi yerinə .yetirir. Onun qazancını, öz aralarında bölürlər

.Bu müamilə aşağadakı şərtlərdən ibarətdir

.İcab və qəbul; Bunuları icra eləyəndə hər söz və iş bu məzmunu çatdırsa kifayətdir .۱

Sözləşmədə hər ikisi şəri həddi-büluğa çatmış, aqil, bitkinləşmiş və iki tərəfin öz .۲ ixtiyarları ilə olsun. Xüsusi ilə sərmayə qoyan (malik) haqda şərtdir ki, müflis halına düşdüyünə görə şəri hakim tərəfdən malından istifadə etməkdən qadağan olmasın. .Amma bu icraçı üçün şərt deyil. O surətdə şərtdir ki, öz malında təsərrüf edə bilsin

Onların hər birinin gəlirdən olan payları müəyyən olunmalıdır. Ələ gəlmiş qazancın .۳ yarısı və ya üçdə biri yaxud digər bir ölçüdə müəyyən olunmalıdır. Əgər camaat arsında hər birinin payı müəyyən olsa və camaat arasında bu şərti deməyə ehtiyac olmasa bu şərtə ehtiyac yoxdur. Hər birinin payını məbləğlə təyin etmək yüz min manat kimi kifayət deyil. Amma onlardan biri, qazanc ələ gəldikdən sonra öz payını bir .miqdar malla razılaşa bilər

Qazanc gərək təkcə sərmayə qoyan və icraçının olsun. Əgər qazancın bir miqdarını .۴ başqa bir şəxsə verməyi şərt etsələr müzaribə batildir. Əgər ticarətə aid olan bir işin .qarşısında olarsa müzaribə batil deyil

Əgər icraçının bir başa ticarətdə olması şərt olunsa gərək icraçı ticarət edə bilsin. .۵ Məsələn; bu pulu sənə verirəm şəxsən özün ticarət edəsən deyilərsə və icraçınında qüdrəti olmazsa qərardad batil olur. Əgər icraçının şəxsən ticarətdə olması qərardad da qeyd olunarsa məsələn; bu pulu sənə verirəm şəxsən

özün ticarət edəsən deyilərsə bu fərziyyədə icraçı aciz olsa müamilə batil deyil. Amma .sahib (sərmayə qoyan) təxəllüf olan halda fəsx etmə ixtiyarı var

Əgər qeyd və şərt olunmasa amma icraçının ticarət etməyə qüdrəti olmasa hətta digərini öz yerinə təyin etməklə, qərardad batil olur. Əgər əvvəldə qüdrəti olub sonra .aciz olarsa aciz olduğu müddətdən qərardad batil olur

Məsələ ۲۱۷۷: İcraçı əmin hesab olunur. Deməli mal xarab və ya tələf olub aradan gedərsə əgər qərardadda olan şərtlərdən kənara çıxmazsa və ya saxlamaqda səhlənkarlıq etməzsə zamin deyil. Həmçinin xəsarət dəyərsə zamin deyil. Hətta mala xəsarət dəyərsə xəsarət mal sahibinindir. Əgər sahib şərt etmək istəsə ki, bu xəsarət .təkcə ona aid olmasın bu şərt üç şəkildə inşa ola bilər

Əgər müamilədə icraçının qazanca şərik olduğu kimi, dəymiş zərərə də şərik olması .۱ .şərt olunsa bu şərt batildir. Amma müamilə səhihdir

Dəymiş xəsarətin hamısının icraçının olması şərt olunsa. Bu surətdə şərt səhihdir, .۲ .amma qazancında hamısı icraçının olacaq. Sərmayə qoyana bir şey çatmır

Sərmayiyə xəsarət dəyəcəyi surətdə icraçı onun hamısını və ya bir miqdarını öz .۳ .malından ödəməyi şərt edərsə bu şərt səhihdir və icraçı şərtə əməl etməlidir

Məsələ ۲۱۷۸: Müzaribədə izn əqdi lazım deyil. Deməli malik, icraçıya verdiyi mallarında təsərrüf izninə müraciət edə bilər və icraçının da onun sərmayəsi ilə işi davam etməsi lazımlı deyil. Hər zaman istəsə işdən çəkinə bilər istər işə başlamazdan qabaq olsun istərsədə sonra, və ya qazanc ələ gəldikdən qabaq olsun və ya sonra, istər qərardad zaman cəhətdən mütləq olsun istərsədə vaxt təyin olunsun. Amma müəyyən bir zamana qədər qərardadın pozulmamasını şərt etsələr şərt səhihdir və o şərtə əməl etmək vacibdir. Buna baxmayaraq onlardan biri fəsx etsə, fəsx olunur. Amma öz .əhdinə əməl etmədiyinə görə günah edir

Məsələ ۲۱۷۹: Əgər müzaribə əqdi mütləq şəkildə olsa və heç bir xüsusi qeyd olmasa icraçı, satıcının kimliyi və malın hansı cins olması haqda öz məsləhətinə uyğun

Amma cinsi o, şəhərdən başqa şəhərə apara bilməz. Əgər bu iş (başqa şəhərə aparmaq) camaat arasında çox məlum olarsa və əqd camaat arasında ona aid olarsa və ya sahib özü icazə verərsə (bu halda aparmaq olar). Əgər sahibinin (sərmayə qoyanın) icazəsi olmadan başqa yerə aparsa və mal tələf olsa və xəsarət dəysə .zamindir

Məsələ ۲۱۸۰: İzinli müzaribə müqaviləsi sahib və ya icraçının dünyadan köçməsi ilə batil olur. Çünki sahibin ölməsi ilə onun əmvalı vərəsələrə çatır və malın icraçının əlində qalması yeni müzaribəyə ehtiyacı var. İcraçının da ölməsi ilə izn aradan gedir çünki .sahibin izni ona məxsus idi

Məsələ ۲۱۸۱: Sahib və icraçı hər birinin digəri üçün bir iş görməsini və ya bir malı ona ödəməsini müzaribə əqdində şərt edə bilər. Əqd tamam olmayana qədər istər qazanc .ələ gəlsin və ya gəlməsin o, şərtə əməl etmək vacibdir

Məsələ ۲۱۸۲: Yanğın və ya oğurluq kimi mala dəyən xəsarət və ya malın tələf olması və bu kimi, ziyanlar əldə olunan qazancla aradan qaldırılmalıdır, qazanc istər xəsarətdən qabaq olsun istərsədə sonra. Deməli icraçının malikiyyəti öz payına xəsarət və tələf olmayan haldadır. Malikiyyətinin yəqini olması müzaribə müqaviləsi sona çatdıqdan və ya fəsx olduqdan sonradır. Amma icraçı müqavilədə sərmayə qoyan ilə qabaqcadan və ya sonradan əldə olunan qazanc ilə xəsarəti aradan qaldırmağı şərt etsə şərt .səhihdir və gərək ona əməl olunsun

Məsələ ۲۱۸۳: Sahib (sərmayə qoyan) cüalə şəkildə şəri yerlərdə sərmayə qoya bilər ki, nəticəsi müzaribə olsun. Belə ki, bir malı bir şəxsə verər və məsələn; onu ticarət və ya .hər bir gəlirli işdə işlət qazancı yarı olsun deyərsə

## CÜALƏNİN HÖKMLƏRİ

Məsələ ۲۱۸۴: Cüalə odur ki, insan onun üçün görülən işin əvəzində bir şey verməyi qərar qoysun. Məsələn; desə: «mənim itirdiyimi tapan şəxsə on manat verəcəyəm», bu qərarı qoyan şəxsə «cail» və işi yerinə yetirən şəxsə «amil» deyilir. Cüalə ilə icarə arsında fərqdən biri odur ki, icarədə siğə oxunduqdan sonra əcir olunan şəxs gərək işi icra etsin və onu əcir edən şəxs onun muzdunu borclu olur, lakin cüalədə amil müəyyən bir .şəxs olsa da, işi icra etməyə bilər və o işi icra etməyincəyə qədər cail ona borclu olmaz

Məsələ ۲۱۸۵: Cail gərək aqil və baliğ olsun, qəsd və ixtiyar üzündən qərar qoysun, şərən öz malından istifadə edə bilmək hüququnda olsun. Deməli, öz malını boş və bihudə yerlərə sərf edən səfeh adamın cüaləsi səhih deyil. Həmçinin müflis olmuş .şəxsin, öz malının istifadəyə haqqı olmadığı hissəsindən cüaləsi səhih deyil

Məsələ ۲۱۸۶: Cailin özü üçün edilməsini istədiyi iş haram, faydasız və ya şərən pulsuz icra edilməsi lazım olan vacibatlardan olmamalıdır. Əgər cail, «hər kəs şərab içsə, ya gecə ağıllı məqsəd olmadan qaranlıq yerə getsə və ya öz vacibi namazını qılsa, ona on .manat verərəm» desə, cüalə səhih deyildir

Məsələ ۲۱۸۷: Qərarlaşdırdıqları malın bütün xüsusiyyətləri ilə müəyyən olması lazım deyildir. Hətta, əgər amilə, o işi icra etmək səfehlik hesab edilməyəcək qədər məlum olsa kifayətdir. Məsələn; əgər cail «bu malı on manatdan nə qədər artıq satsan onun gəliri sənin olsun» desə, cüalə səhihdir. Həmçinin əgər «hər kim mənim atımı tapsa; onun yarısını özünə verəcəyəm və ya ona on batman buğda verəcəyəm» desə, yenə .də cüalə səhihdir

Məsələ ۲۱۸۸: Əgər cail, iş üçün müəyyən bir muzd təyin etməsə; məsələn: “hər kəs mənim uşağımı tapsa pul verəcəyəm” deyib, miqdarını müəyyən etməsə, bir kəs o işi yerinə yetirəcəyi təqdirdə, o işin camaat arasında dəyəri miqdarında həmin şəxsə .muzd verməlidir

Məsələ ۲۱۸۹: Əgər amil qərardan qabaq işi icra etsə və ya qərardan sonra pul .almamaq məqsədi ilə işi icra etsə, muzd almağa haqqı yoxdur

.Məsələ ۲۱۹۰: Amil işə başlamazdan qabaq cail cüaləni poza bilər

Məsələ ۲۱۹۱: Amil işə başladıqdan sonra cail əgər cüaləni pozmaq istəsə, işkalı var. .Amma əgər amil ilə razılaşsa, eybi yoxdur

Məsələ ۲۱۹۲: Amil işi tamamlamaya bilər. Lakin işi tamamlamamaq cailə və ya işin aid olduğu şəxsə zərər yetməsinə səbəb olarsa, gərək işi tamamlasın. Məsələn; əgər bir kəs, «kim mənim gözümdə cərrahiyyə əməliyyatı aparsa ona filan qədər pul verəcəyəm» desə və bir cərrah da işə başlasa, əgər əməlliyyatı yarıda saxlasa, gözü .eybli olacaqsa, gərək onu tamamlasın

Məsələ ۲۱۹۳: Əgər amil işi tamamlamasa, caildən bir şey tələb edə bilməz. Əgər cail muzdu, işin tamamlanması şərtiylə qərarlaşdırsa, məsələn; «libasımı kim tikərsə ona on manat verəcəyəm» desə, eyni hökmdədir. Amma əgər məqsədi işdən hər miqdarın .muzdunu edildikcə verməkdirsə, cail edilən işin miqdarının muzdunu amilə verməlidir

## MÜZARİƏNİN HÖKMLƏRİ

Məsələ ۲۱۹۴: Müzariə, mülk sahibinin əkinçi ilə onun tarlasında əkin əkib, məhsulunun bir hissəsini mülk sahibinə verməsi, ittifaqının bağlanması deməkdir.

Məsələ ۲۱۹۵: Müzariənin bir neçə şərti vardır:

۱. Gərək o iki şəxsin arasında əqd və qərar bağlansın. Məsələn, əkin sahibi «tarlanı əkinçilik üçün sənə tapşırdım» və əkinçi də «qəbul etdim» desin. Ya da heç bir söz demədən yer sahibi tarlanı əkinçilik etmək niyyəti ilə əkinçiyə versin və əkinçi də (o niyyət ilə) qəbul etsin.

۲. Yer sahibi və əkinçi hər ikisi həddi-büluğa çatmış və ağıllı olsun, öz qəsd və ixtiyarı ilə müzariə etsinlər və səfeh, yəni öz malını bihudə işlərə istifadə edən olmasınlar və həmçinin gərək malik, müflis olmasın. Amma əgər əkinçi müflis olsa, o surətdə ki, muzariədə istifadə olunması qadağan olunmuş mallardan istifadə etməyi lazım tutmazsa, eybi yoxdur.

۳. Yer sahibi və əkinçi hər biri yarı və ya üçdə biri və bunun kimi yerin məhsulundan bir pay almalıdırlar. Əgər heç biri üçün pay təyin etməsələr və ya malik «bu tarlada əkin ək və hər nə qədər istəsən mənə ver» desə, səhih deyildir. Məhsuldan müəyyən bir hissənin məsələn; on batmanı yalnız sahib və ya əkinçi üçün təyin etsələr, hökm eynidir.

۴. Tarlanın, əkinçinin ixtiyarında olacaq müddətini təyin etsinlər və bu müddətin məhsulu ələ gətirmək mümkün olacağı qədər olması gərəkdir. Əgər müddətin əvvəlini müəyyən bir gün və müddətin sonunu məhsul yetişən vaxta qədər təyin etsələr, kifayətdir.

۵. Torpaq gərək əkinəcək üçün yararlı olsun. Əgər hal-hazırda əkinçiliyə münasib olmasa, amma bir işi görüb onda əkinçilik etmək mümkün olarsa, muzariə səhihdir.

۶. Əkinçinin əkəcəyini müəyyən etsinlər, məsələn; düyü və ya buğda əkəcəyini, əgər düyü əkəcəksə, onun hansı növünü əkəcəyini müəyyən etsinlər. Lakin, əgər müəyyən bir əkinəcəyi nəzərdə tutmasalar, onu təyin etmək lazım deyildir. Həmçinin əgər nəzərdə tutlan əkinəcək müəyyən olsa, onu dilə gətirmək lazım deyildir.

۷. Malik yeri müəyyən etməlidir. Bu hökm, əkinçilik cəhətindən bir-birindən fərqli olan bir neçə hissə yeri olduğu təqdirdədir. Amma əgər fərqli olmasalar müəyyən etmək lazım deyil. Deməli, əgər əkinçiyə desə ki, bu yerlərin birində əkin ək və onu müəyyən etməsə, muzariə səhihdir. Əqddən sonra təyin etmək malikin ixtiyarıdır.

۸. Hər biri, toxum, gübrə, əkinçilik vəsaitləri və s. kimi lazım olan işlərə çəkəcəkləri xərcləri müəyyən etməlidir. Amma əgər hər birinin çəkəcəkləri xərc məlum olsa, dilə gətirmək lazım deyil.

Məsələ ۲۱۹۶: Əgər tarla sahibi əkinçi ilə məhsulun bir hissəsinin birinə aid olmasını və qalan hissəsini öz aralarında bölünməsini şərt qoymuşdursa, o hissəsini götürdükdən sonra yerdə bir şey qalacağını bilsələr də, müzariə batildir. Bəli, əgər əkiləcək toxumun miqdarını və ya dövlətin alacağı vergini məhsuldan çıxdıqdan sonra yerdə qalan hissəni öz aralarında bölmələrini qərara alsalar, müzariə səhihdir.

Məsələ ۲۱۹۷: Əgər müzariə üçün müddət təyin etmiş olarlarsa ki, adətən məhsul o müddətdə ələ gəlir, amma təsadüfən müddət tamam olsa və məhsul ələ gəlməsə belə ki, müddətin təyin olunması bu hala da şamil olsa, yəni iki tərəf nəzərdə tutsa ki, məhsul ələ gəlməsə də müddətin tamam olmasıyla muzariə tamam olur, bu surətdə malik razı olsa ki, əkin icarə ilə, ya icarəsiz onun yerində qalsın və əkinçi də razı olsa, maneəsi yoxdur. Amma əgər malik razı olmasa, əkinçini vadar edə bilər ki, əkini biçsin, əgər əkini biçməkdə əkinçiyə zərər yetişsə, malikin onun əvəzini əkinçiyə verməsi lazım deyildir. Hərçənd malikə bir şey vermək istəsə də, maliki məcbur edə bilməz ki, əkin onun yerində qalsın.

Məsələ ۲۱۹۸: Əgər bir hadisənin baş verməsi ilə o torpaqda əkinçilik mümkün olmazsa, məsələn; əgər tarlanın suyu kəsilərsə, müzariə müqaviləsi pozulur. Amma əgər əkinçi bir üzr olmadan əkinçilik etməzsə, tarla da onun ixtiyarında olub və malik də ondan .istifadə etməyibsə, gərək adi miqdarda o müddətin icarəsini malikə versin

Məsələ ۲۱۹۹: Tarla sahibi və əkinçi bir-birinin razılığı olmadan muzariəni poza bilməzlər. Amma əgər muzariə müqaviləsində hər ikisinin və ya onlardan birinin müqaviləni pozmaqda ixtiyarlı olmasını şərt qoysalar, bu şərtə uyğun olaraq müqaviləni poza bilərlər. Həmçinin əgər, tərəflərindən biri ona qoyulan şərtlərin əksinə əməl edərsə, .digər tərəf müqaviləni poza bilər

Məsələ ۲۲۰۰: Müzariə qərarından sonra mülk sahibi və ya əkinçi ölərsə, müzariə pozulmaz və varislər onların yerinə keçər. Amma əgər əkinçi ölərsə və əkini şəxsən əkinçi yerinə yetirməyi qərar alsalar, müzariə pozular. Əgər əkinçi öhdəsində olan işləri tamamlamış olsa, muzariə pozulmaz və gərək onun payını varislərinə versinlər. Habelə əkinçinin digər haqqları da varislərinə irs keçir və varislər mülk sahibini əkinçilik .tamam olana qədər əkinin onun torpağında qalmasına məcbur edə bilərlər

Məsələ ۲۲۰۱: Əgər əkinçilikdən sonra muzariənin batil olduğunu anlasalar, bu halda toxum əgər mülk sahibinin malı olarsa, əldə edilən məhsul da onundur və mülk sahibi əkinçinin muzdunu, etdiyi xərcləri və o tarlada işlədilən əkinçiyə əkəcəyə aid inək və digər heyvanlarının kirəsini verməlidir. Amma toxum əkinçinin malı idisə, məhsul da onun malı olur və o yerin kirəsini, mülk sahibinin etdiyi xərcləri və o yerdə əkin üçün işlədilən və mülk sahibinə aid olan və digər heyvanların kirələrini ona vermək lazımdır. Hər iki halda, adətən haqqı olan miqdar razılaşılan miqdardan çox olarsa, tərəfin .ondan xəbəri varsa, artıq miqdarı vermək vacib deyil

Məsələ ۲۲۰۲: Toxum, əkinçinin malı olsa və əkindən sonra müzariənin batil olduğunu bilərlərsə, mülk sahibi ilə əkin sahibi ücrətli və ya ücrətsiz olaraq əkinin tarlada ,qalmasına razı olsalar

eybi yoxdur. Əgər tarla sahibi razı olmazsa, ehtiyat-vacibə görə mülk sahibi əkinçini əkin yetişməmişdən qabaq əkini biçməyə məcbur etməməlidir. Həmçinin, malik əkinçini məcbur edə bilməz ki, hərçənd yerin icarəsini ondan tələb etməsə belə, icarə .verib əkini onun sahəsində saxlasın

Məsələ ۲۲۰۳: Əgər məhsulu topladıqdan və muzariənin müddəti bitdikdən sonra əkinin kökləri yerdə qalsa və gələn il ikinci dəfə yenə yaşıllaşıb məhsul verirsə, tarla sahibi ilə əkinçi əkinin kökündə də şərik olmağı şərt qoymamışlarsa, ikinci ilin məhsulu toxum .sahibinindir

## MUSAQAT (SUVARMAQ) VƏ MUĞARİSƏNİN (AĞAC ƏKMƏK) HÖKMLƏRİ

Məsələ ۲۲۰۴: Əgər insan bir şəxs ilə belə qərar qoysa ki, meyvələri onun malı olan ya meyvələri onun ixtiyarında olan ağacları müəyyən bir müddətə qədər o şəxsə həvalə edə ki, onları bəsləsin, suvarsın və əvəzində meyvələrdən qərar qoyduqları qədərini .özü üçün götürsün, bu müamiləyə musaqat deyilir

Məsələ ۲۲۰۵: Musaqat muamiləsi, meyvə verməyən ağaclarda, o surətdə ki, başqa məhsulu olsa, yarpağından istifadə olunan xına ağacında olduğu kimi, yarpaq və .gülünün etina edilən dəyəri olsa, səhihdir

Məsələ ۲۲۰۶: Musaqat muamiləsində siğə oxumaq lazım deyil, hətta əgər ağacın sahibi musaqat qəsdi ilə ağacı həvalə etsə və işləyən kəs işə məşğul olmaq qəsdi ilə işləsə, .müamilə düzdür

Məsələ ۲۲۰۷: Malik və ağaclara qulluq etməyi öhdəsinə götürən kəs gərək baliğ və aqil olsunlar və bir kəs onları bu işə məcbur etməsin, həmçinin gərək səfeh olmasınlar, yəni öz malını bihudə yerdə xərcləməsinlər. Həmçinin malik müflis olmasın, amma əgər bağban müflis olsa, musaqat işi istifadəsinə icazə verilməyən mallardan istifadə .etməsini lazım tutmadığı halda eybi yoxdur

Məsələ ۲۲۰۸: Musaqatın müddəti gərək məlum olsun və gərək bu müddətdə məhsulun ələ gəlməsi mümkün olsun. Əgər onun əvvəlini müəyyən edib, sonunu da məhsulun .ələ gəldiyi zamanı qərarlaşdırarlarsa, səhihdir

Məsələ ۲۲۰۹: Gərək hər birinin payı məhsulun yarısı, üçdə biri və s. kimi olsun; məsələn: əgər meyvənin yüz batmanı

.malikin, qalanları isə işləyən şəxsin olmasını qərara alsalar, müamilə batildir

Məsələ ۲۲۱۰: Lazım deyil musaqat müamiləsinin qərarını məhsulun zahir olmasından qabaq qoysunlar, məhsulun zahir olmasından sonra belə qoyulsa, məhsulun artması və daha yaxşı olması, ya da bəlalardan sağlam qalması üçün görülməsi lazım olan bir iş qalmışsa, müamilə səhihdir. Amma əgər bu cür iş qalmayıbsa, baxmayaraq ki, ağaca lazım olan suvarma və ya meyvələri yığma, ya da onları saxlama işi kimi bir iş qalsa .belə, müamilənin səhih olması işkallıdır

Məsələ ۲۲۱۱: Əzhər nəzərə əsasən yemiş, xiyar və bunun kimi şeylərin kollarında .musaqat müamiləsi səhihdir

Məsələ ۲۲۱۲: Yağış suyundan, ya yerin rütubətindən istifadə edən və suvarılmağa da ehtiyacı yoxdursa, ۲۲۰۴-cü məsələdə deyilən işlər kimi digər işlərə ehtiyacı olarsa, .onun üzərində musaqat müamiləsi səhihdir

Məsələ ۲۲۱۳: Musaqat edən iki nəfər bir-birinin razılığı ilə müamiləni poza bilərlər. Həmçinin musaqat qərarında şərt etsələr ki, əgər ikisinin və ya birinin müamiləni pozmaq haqqı olsun, qərar qoyduqlarına uyğun müamiləni pozmağın eybi yoxdur. Əgər musaqat müamiləsində bir şərt etsələr və o şərtə əməl olunmasa, onun xeyrinə .şərt qoyulmuş şəxs müamiləni poza bilər

Məsələ ۲۲۱۴: Əgər malik ölsə musaqat müamiləsi pozulmur, vərəsələri onun yerinə .keçir

Məsələ ۲۲۱۵: Əgər ağacları becərməyi öhdəsinə alan kəs ölsə, belə ki, əqddə ancaq özü qulluq etməsini şərt etməsələr, vərəsəsi onun yerini tutur, belə ki, vərəsə o əməli yerinə yetirməsə və əcir tutmasa, şəriət hakimi meyyitin malından əcir tutar və məhsulu meyyitin vərəsəsi ilə malik arasında bölər. Əgər müamilədə qərar qoysalar ki, .ancaq o özü ağaclara qulluq etsin, o ölməklə müamilə pozulur

Məsələ ۲۲۱۶: Əgər məhsulun hamısının malikin malı olacağı şərt qoyulmuşdursa, musaqat batildir. Bu halda meyvə malikin malı olar və işləyən kəs ücrət tələb edə

başqa işlərin muzdunu adi miqdarda ağaclara qulluq edənə versin, amma əgər adi miqdar qərar qoyduqlarından çox olsa və onun da bundan xəbəri olmuş olsa, artıq .vermək lazım deyil

Məsələ ۲۲۱۷: Məhsulunda şərik olmaq məqsədilə tarlanı, ağac əkməsi üçün bir başqasına həvalə etmək işinə muğarisə deyilir və bu müamilə səhihdir. Hərçənd ki, ehtiyata əsasən tərk edilməlidir. Amma onun nəticəsinə çatmaq üçün elə bir müamilə edilə bilər ki, heç bir işkal olmadan səhih olsun. Məsələn; iki tərəf bu üsul ilə bir-biriylə sülh və saziş etsələr və yaxud tinglərdə şərik olsalar, sonra bağban özünü mülk sahibinə, onun da payını əkmək, bəsləmək, suvarmaqla müəyyən zaman müddətində .yerin mənfəətinin yarısının müqabilində icarəyə versin

## ÖZ MALLARININ İSTİFADƏSİNDƏN QADAĞAN EDİLMİŞ ŞƏXSLƏR

Məsələ ۲۲۱۸: Baliğ olmamış bir uşaq, kamilən muməyyiz olsa belə, şərən öz zimmətindən və ya malından istifadə haqqına malik deyildir. Bu halda vəlinin sabiq icazəsi də faydasızdır, sonrakı icazəsi də işkallıdır. Amma bununla belə, bir neçə halda uşağın istifadə etməsi səhihdir. Keçən ۲۰۴۰-ci məsələdə qiymətsiz əşyaları alıb-satma və gələcək ۲۶۶۲-ci məsələdə onun qohumlarına bir şey vəsiyyət etməsi bu cümlədəndir. Baliğ olmaq, qız uşağında qəməri tarixi ilə ۹ yaşı tamam olmaqla, oğlan uşağında isə bu üç şərtdən biriylə müəyyənləşir:

۱. Övrətinin yuxarısına qalın tüklərin çıxması;

۲. Məninin xaric olması;

۳. Qəməri ili ilə ۱۵ yaşın tamam olması.

Məsələ ۲۲۱۹: Üzdə və dodağın üstündə (bığ yerində) qalın tük çıxmasının baliğ olma nişanəsi olması uzaq deyildir, amma sinədə və qoltuq altında qalın tük çıxması, səsin qalınlaşması və buna bənzər şeylər, baliğ olma nişanəsi deyildir.

Məsələ ۲۲۲۰: Dəli insan öz malından istifadə edə bilməz. Müflis, yəni tələbkarların alacaq olduqları şeyi tələb etməklə şəriət hakimi tərəfindən öz malında istifadə etməkdən qadağan edilən şəxs də tələbkarların icazəsi olmazsa, ondan istifadə edə bilməz. Səfeh, yəni öz malını boş işlərə xərcləyən şəxs, vəlisinin icazəsi olmazsa, öz malından istifadə edə bilməz.

Məsələ ۲۲۲۱: Bəzən dəli, bəzən ağıllı olan bir şəxsin dəlilik zamanında malından etdiyi istifadə səhih deyildir.

Məsələ ۲۲۲۲: İnsan, ölməsinə səbəb olan bir xəstəliyə düçar olanda (ölüm xəstəliyində) malından istədiyi qədər özünə, uşaqlarına, qonaqlarına və israf sayılmayan işlərə xərcləyə bilər. Həmçinin əgər öz malını, öz qiymətinə satarsa və ya kirayə

verərsə, eybi yoxdur. Amma əgər məsələn; öz malını bir kəsə bağışlasa və ya normal qiymətdən ucuz qiymətə satarsa, bağışladığı və ya ucuz satdığı miqdar onun malının üçdə biri qədər, ya az olsa, onun istifadə etməsi səhihdir. Amma əgər üçdə birdən çox olarsa, varislər icazə verdiyi halda səhihdir. İcazə verməzlərsə, onun malının üçdə .birindən çoxlu olan miqdardakı istifadəsi batildir

## VƏKALƏTİN HÖKMLƏRİ

Vəkalət odur ki, insan özü görə bildiyi bir işi, məsələn; əqd (iki tərəfli) və ya iqaat (bir tərəfli) müamilə kimi, yaxud təhvil vermə və ya təhvil götürmə kimi, insanın öz haqqı olan bir işi başqa bir adama tapşıra ki, onun tərəfindən bu işi görsün, məsələn bir kəsi vəkil edər ki, onun evini satsın və ya bir qadını onun üçün əqd etsin. Lakin səfeh adam .öz malını istifadə edə bilmədiyindən öz malını satmaqdan ötrü bir kəsi vəkil edə bilməz

Məsələ ۲۲۲۳: Vəkalətdə siyğə oxunması lazım deyil. Əgər insan başqasını vəkil etdiyini, o da qəbul etdiyini başa salsa; məsələn: öz malını bir şəxsə satmaq üçün versə, o da .malı qəbul etsə vəkalət səhihdir

Məsələ ۲۲۲۴: Əgər insan başqa şəhərdə olan bir şəxsi vəkil edib onun üçün vəkalətnamə göndərsə və o da qəbul etsə, hətta vəkalətnamə müəyyən müddətdən .sonra çatsa da, vəkalət səhihdir

Məsələ ۲۲۲۵: Müvəkkilin yəni başqasını vəkil edənin və vəkil olanın aqil olmaları və öz qəsd və iradələriylə bu işi görmələri və müvvəkkilin də baliğ olması şərtdir. Amma .müməyyiz uşağa səhih olan şeylər istisnadır

Məsələ ۲۲۲۶: İnsan yerinə yetirə bilmədiyi və ya şərən etməməli olan işi başqası tərfindən onu yerinə yetirməyə vəkil ola bilməz, məsələn; həccin ehramında olan bir şəxs evlənmək əqdinin siğəsini oxuya bilmədiyindən, siğə oxumaqdan ötrü başqası .tərəfindən vəkil ola bilməz

Məsələ ۲۲۲۷: Əgər insan bir şəxsi özünün bütün işlərini görmək üçün vəkil etsə, səhihdir. Amma, işlərindən birini görmək üçün vəkil edib, onu müəyyənləşdirmədiyi təqdirdə, vəkalət səhih deyil. Amma onu bir neçə işdən birini onun özü

seçməklə yerinə yetirməkdə vəkil edərsə, məsələn; evini satmaq və ya kirayə vermək .üçün vəkil tutarsa, vəkalət səhihdir

Məsələ ۲۲۲۸: Əgər vəkili işdən kənar etsə, xəbər ona çatandan sonra o işi yerinə yetirə .bilməz, amma əgər xəbər çatmazdan qabaq o işi yerinə yetirmişdirsə, səhihdir

Məsələ ۲۲۲۹: Vəkil olan, vəkil tutanın ğaib olduğu bir zamanda belə olsa, vəkalətdən .çəkilə bilər

Məsələ ۲۲۳۰: Vəkil, ona tapşırılmış işi yerinə yetirməkdən ötrü başqasını vəkil edə bilməz. Amma müvəkkil, ona vəkil tutması üçün icazə vermişdirsə, ona göstəriş verildiyi kimi rəftar edə bilər. Belə ki, ona, «mənim üçün vəkil tut» demişdirsə, onun .tərəfindən vəkil tutması lazımdır. Öz tərəfindən isə vəkil tuta bilməz

Məsələ ۲۲۳۱: Əgər vəkil, müvəkkilin icazəsi ilə bir kəsi onun tərəfindən vəkil etsə, o vəkili vəkalətdən çıxara bilməz, əgər birinci vəkil ölsə və ya müvəkkil onu vəkalətdən .çıxarsa, ikincinin vəkaləti batil olmur

Məsələ ۲۲۳۲: Əgər vəkil müvəkkilin icazəsi ilə bir kəsi öz tərəfindən vəkil edərsə, müvəkkil və birinci vəkil o vəkili vəkalətdən çıxara bilərlər. Əgər birinci vəkil ölsə və ya .vəkalətdən çıxarılsa, ikincinin vəkaləti batil olur

Məsələ ۲۲۳۳: Əgər bir neçə nəfəri bir işi görməkdən ötrü vəkil etsə və onların təklikdə hər birinə o işə iqdam etməsinə icazə vermişdirsə, onlardan hər biri o işi əmələ gətirə bilər və əgər onlardan biri ölsə, başqalarının vəkaləti batil olmur. Amma əgər desə ki, birlikdə yerinə yetirsinlər, təklikdə yerinə yetirə bilməzlər və onlardan biri ölsə, .başqalarının vəkaləti batil olur

Məsələ ۲۲۳۴: Əgər vəkil ya müvəkkil ölsə, vəkalət batil olur. Həmçinin o şey ki, ondan istifadə etməkdən ötrü vəkil olub, aradan getsə, məsələn; bir qoyunu satmaqdan ötrü vəkil olsa və o qoyun ölsə, vəkaləti batil olur. Həmçinin əgər onlardan biri həmişə dəli, ya bihuş olsa, vəkalət batil olur. Amma əgər vaxtaşırı dəlilik və bihuşluq halları olarsa, nəinki onların aradan getdiyi vaxtda, hətta dəlilik və bihuşluq zamanında olan

Məsələ ۲۲۳۵: Əgər insan bir şəxsi bir işi görməkdən ötrü vəkil etsə və ondan ötrü bir şeyi qərar qoysa, o iş görüləndən sonra qərar qoyduğu şeyi ona verməlidir.

Məsələ ۲۲۳۶: Əgər vəkil onun ixtiyarındakı bir malın qorunmasında səhlənkarlıq etməsə və ona icazə verilmiş istifadədən başqa, istifadə etməsə və təsadüfən o mal aradan getsə, ona zamin deyildir.

Məsələ ۲۲۳۷: Əgər vəkil ixtiyarındakı malın qorunmasında səhlənkarlıq etsə, ya ona icazə verilmiş istifadədən başqa, ondan daha bir başqa cür istifadə də etsə və o mal aradan getsə, zamindir, əgər bir libasın satılmasını demişlərsə, onu geyinsə və o libas tələf olsa, gərək onun əvəzini versin.

Məsələ ۲۲۳۸: Əgər vəkil ona icazə verilmiş istifadədən başqa, maldan daha bir başqa cür istifadəni etsə, məsələn; satılması söylənilən bir libası geyinərsə və sonradan icazə verilmiş istifadəni etsə, o istifadə səhihdir.

## BORCUN HÖKMLƏRİ

Möminlərə, xüsusilə onlardan ehtiyacı olanlarına borc vermək rəvayətlərdə çox tövsiyə edilən müstəhəbb işlərdəndir. Həzrət Rəsuli-əkrəmdən (səlləllahu ələyhi və alihi və səlləm) rəvayət olunur ki: «Hər kəs öz müsəlman qardaşına borc versə, qaytarmağa imkanı olan vaxta qədər möhlət verə, onun malı artar, məlaikələr ona borcunu aldığı vaxta qədər rəhmət göndərərlər». İmam Sadiqdən (ələyhis-səlam) rəvayət olunur: «Hər mömin başqa möminə qürbət qəsdi ilə borc versə malını aldığı «.vaxta qədər Allah onun üçün sədəqə vermək savabını yazar

Məsələ ۲۲۳۹: Borcda siğənin oxunması lazım deyildir, hətta bir şeyi borc niyyəti ilə .verərsə və o da həmin qəsdlə alarsa, səhihdir

Məsələ ۲۲۴۰: Borcun ödənilməsi üçün tələbkarın və ya hər iki tərəfin də istədiyi ilə müəyyən bir zaman təyin etməmişlərsə, hər zaman borclu borcunu ödəsə, tələbkar qəbul etməlidir. Müəyyən bir zaman təyin etmişlərsə, o zaman qurtarmazdan qabaq .tələbkar öz borcunu almaqdan imtina edə bilər

Məsələ ۲۲۴۱: Borc əqdini oxuyarkən, onun ödənməsi üçün müəyyən bir zaman təyin etmişlərsə, əgər bu vaxtın təyin etmə işi borclunun və ya hər iki tərəfin istəyi ilə olmuşsa, bu zaman qurtarmazdan qabaq tələbkar tələbini istəyə bilməz. Amma əgər vaxtın təyin edilməsi tələbkarın öz istəyi ilə olsa və ya borcun ödənməsi üçün ümumiyyətlə bir vaxt təyin etməmişlərsə, tələbkar istədiyi zaman borcunu tələb edə .bilər

Məsələ ۲۲۴۲: Əgər vaxt təyin olunmayan, yaxud vaxtı çatan zaman tələbkar öz tələbini istəsə və borclu öz borcunu verə bilsə, gərək dərhal onu qaytarsın. Əgər təxirə .salarsa, günahkardır

Məsələ ۲۲۴۳: Əgər borclu şəxsin öz şəxsiyyətinə layiq olan və içində oturduğu ev, mənzil avadanlıqları və ehtiyacı olan sair

şeylərdən başqa heç nəyi olmasa, borc sahibi öz borcunu ondan tələb edə bilməz; öz .borcunu verməyə qadir olduğu vaxta qədər gözləməlidir

Məsələ ۲۲۴۴: Borclu olub borcunu ödəyə bilməyən şəxs, ticarətdə işləməsi onun üçün asandırsa və ya sənəti ticarətdirsə, o işləyib borcunu ödəməsi vacibdir. Hətta bu haldan başqa da şəninə layiq olan bir iş görə bilərsə, ehtiyat-vacib budur ki, işləyib .borcunu ödəsin

Məsələ ۲۲۴۵: Tələbkarına əli çatmayan şəxsin, əgər gələcəkdə onu və ya varislərini tapacağına ümidi yoxdursa, ona verəcəyi borcu sahibinin tərəfindən fəqirlərə verməsi lazımdır. Ehtiyat-vacibə əsasən bu iş üçün şəriət hakimindən icazə də almalıdır. Amma əgər onun sahibini və ya varislərini tapacağına ümidi vardırsa, səbr edib onu axtarmalı, əgər onu tapmazsa, öldüyü təqdirdə onun malından ondan alacaqlı olan .şəxsə və ya varisi tapılarsa, alacağını vermələrinə dair vəsiyyət etməlidir

Məsələ ۲۲۴۶: Əgər meyyitin malı, kəfən və dəfnin vacibatının xərclərindən və .borclarından artıq olmasa, həmin işlərə sərf edilməlidir. Varislərinə heç nə çatmır

Məsələ ۲۲۴۷: Əgər bir kəs bir qədər «misli» olan pul, buğda ya arpa və bu kimi şeylər borc etsə və onun qiyməti artsa, yaxud azalsa, aldığı həmin miqdarı o malın keyfiyyətində, camaatın rəğbətini cəlb etməkdə dəxaləti olan xüsusiyyətlərlə geri qaytarmalıdır və bu kifayətdir. Amma əgər borclu və tələbkar ondan başqasına razı olsalar, eybi yoxdur. Əgər borc aldığı şey qoyun kimi «qiyməti» olan şeydirsə, borc aldığı .qoyunun qiyməti ilə pulunu verməlidir

Məsələ ۲۲۴۸: Əgər borc olunmuş mal itməsə və mal sahibi onu tələb etsə, borclunun həmin malı ona qaytarması vacib deyil. Əgər borclu onu qaytarmaq istəsə, tələbkar .onu qəbul etməyə bilər

Məsələ ۲۲۴۹: Borc verən şəxs, borc verdiyi miqdardan daha artıq alacağını şərt qoymuşdursa, məsələn; bir kiloqram buğda borc verib, bir kiloqram yüz qram alacağını və ya on yumurta borc verib, on bir yumurta alacağını şərt qoymuşdursa,

riba və haramdır. Hətta əgər borclunun onun üçün bir iş görməsini və ya

borc verdiyi şeyə, bir miqdar da başqa bir şey əlavə edərək verməsinə şərt qoymuşdursa, məsələn; borc verdiyi bir manatı, bir kibrit də əlavə olaraq geri qaytarmasını şərt qoymuşdursa, riba və haramdır. Habelə, əgər borc verdiyi şeyi xüsusi formada geri qaytarmasını, məsələn; bir miqdar işlənməmiş qızıl verib, onu işlənmiş olaraq geri qaytaracağına şərt qoymuşdursa, yenə riba və haramdır. Amma bir şərt qoymamışdırsa və borclu özü borc aldığını artıqlaması ilə ödəyirsə, işkalı oxdur. .Hətta belə etməsi müstəhəbdir

Məsələ ۲۲۵۰: Riba vermək, riba almaq kimi haramdır, amma borcun əsli səhihdir və ribalı borc edən şəxs, aldığına malik olur. Amma borc verən aldığı artıq miqdara sahib olmur, onda təsərrüf etməsi haramdır. Əgər onun eyni ilə bir şey alsa, o şeyə də malik olmur. Əgər riba almayacağını qərara almış olsaydılar belə, borc alan borc verənin o puldan istifadə etməsinə razı olarmışsa, ondan istifadə etməsi caizdir. Həmçinin, əgər məsələni bilmədiyinə görə riba alsa, başa düşdükdən sonra tövbə etsə, bu halda cahil .olduğu (bilmədiyi) zaman aldığı pul ona halal olur

Məsələ ۲۲۵۱: Əgər buğda və ya onun kimi bir şeyi ribalı borc alıb və onun ilə əkinçilik .etsə, məhsuluna malik olur

Məsələ ۲۲۵۲: Əgər bir paltar alıb sonradan pulunu faiz olaraq aldığı puldan və ya faiz pul ilə qarışmış puldan verərsə, o paltara sahib olur və onu geyməyin və o paltarla namaz qılmağın eybi yoxdur. Amma əgər paltarı satana «bu paltarı bu pul ilə alıram» .deyərsə, o paltarın geyilməsi haramdır

Məsələ ۲۲۵۳: Əgər insan birinə bir qədər pul versə ki, başqa şəhərdə onun tərəfindən .az alsın eybi yoxdur və buna «sərfi-bərat» deyirlər

Məsələ ۲۲۵۴: Əgər insan başqa bir şəhərdə artıq almaq üçün bir şəxsə bir şey verərsə, o şeyin cinsi qızıl və ya gümüşdən olarsa, yaxud buğda və arpa kimi, ölçülən və çəkilən şeylərdən olsa, riba və haramdır. Amma əgər artıq alan şəxs, aldığı artıq miqdarın müqabilində bir şey verərsə və ya bir iş görərsə, işkalı yoxdur. İndiki eskinaslarda artıq almaq icazəli deyil. Əgər onu satsa və nəqd olsa, yaxud nisyə olsa, amma iki cinsdən

.yoxdur, amma əgər nisyə və bir cinsdən olsa, artıq almaq məhəlli işkaldır

Məsələ ۲۲۵۵: Əgər bir insanın digərindən ölçülən və ya çəkilən şeylərdən olmayan bir alacağı olsa, onu borclu olana və başqa bir şəxsə, daha ucuz satıb, əvəzini nəqd ala bilər. Buna görə indiki zamanlarda tələbkarın borcludan aldığı çek və e`tibarnaməni (səftəni) öz alacağından daha ucuz şəkildə (ki, ona xalq arasında qiyməti endirmək .deyərlər) banka və ya başqa birinə satıb, əvəzini nəqd ala bilər

## HƏVALƏ VERMƏYİN HÖKMLƏRİ

Məsələ ۲۲۵۶: Əgər insan öz tələbkarını, alacağını başqasından alması üçün həvalə edərsə və alacaqlı olan da qəbul edərsə, həvalə işi sonradan deyiləcək şərtlərə uyğun olaraq gördüyü təqdirdə, həvalə edilən şəxs borclu olur. Bu halda alacaqlı olan şəxs, .alacağını birinci borcludan istəyə bilməz

Məsələ ۲۲۵۷: Borclu, alacaqlı və həvalə olunmuş şəxslərin mükəlləf, ağıllı olmaları, məcbur olunmamaları və malını lazımsız yerlərə xərcləyən səfeh olmamaları lazımdır. Həmçinin borclu və tələbkarın müflis olmamaları şərtdir. Amma həvalə edənə borclu .olmayan şəxsdən başqa, bu halda əgər həvalə edən müflis olsa, eybi yoxdur

Məsələ ۲۲۵۸: Həvalə olunan bütün yerlərdə istər borclu olsun istərsədə olmasın həvalə .olunan şəxs həvaləni qəbul etməlidir

Məsələ ۲۲۵۹: İnsan həvalə verdiyi zaman borclu olmalıdır. Belə olan halda əgər bir şəxsdən borc almaq istəsə, ondan borc almayınca, o şəxsi sonradan borc olaraq .verəcəyi şeyi alması üçün başqa bir şəxsə həvalə edə bilməz

Məsələ ۲۲۶۰: Həvalənin miqdarı və onun cinsi məlum olmalıdır. Deməli, əgər bir kəs əgər məsələn; on batman buğda və on manat pul bir nəfərə borclu olsa və ona desə .ki, öz iki tələbindən birini filankəsdən al və onu müəyyən etməsə, həvalə düz deyildir

Məsələ ۲۲۶۱: Əgər borc həqiqətən müəyyən olsa, amma borclu və tələbkar həvalə verən anda onun miqdarını ya cinsini bilməsələr, həvalə düzdür. Məsələn; əgər bir kəsin tələbi dəftərdə yazılmış olsa və dəftəri görməzdən qabaq həvalə verərsə və .sonra dəftəri görər və tələbkar da öz tələbinin miqdarını deyərsə, həvalə düz olur

Məsələ ۲۲۶۲: Həvalə verilən adam varlı olsa və həvaləni qaytarmaqda səhlənkarlıq etməsə də, tələbkar həvaləni qəbul etməyə bilər.

Məsələ ۲۲۶۳: Əgər həvalə verənə borclu olmayan bir şəxs, həvaləni qəbul etsə, həvaləni qaytarmazdan qabaq da həvalənin miqdarını həvalə verəndən istəyə bilər. Amma əgər ona həvalə olunan borc müddətli olsa və onun vaxtı da hələ tamam olmamış olsa, bu halda onu ödəmiş olsa belə, vaxt tamam olmazdan qabaq həvalə miqdarını həvalə edəndən istəyə bilməz, hərçənd onu hazırlamış olsa belə. Əgər tələbkar tələbini az bir miqdar üzərindən həvalə olunanla sülh edərsə, o təkcə o qədəri həvalə edən şəxsdən tələb edə bilər.

Məsələ ۲۲۶۴: Həvalə işi tamamlandıqdan sonra, həvalə edən və həvalə olunmuş şəxs həvaləni poza bilməzlər. Əgər həvalə olunmuş şəxs, həvalə olunan vaxt fəqir olmazsa, sonradan fəqir olsa belə, alacaqlı da həvaləni poza bilməz. Həmçinin əgər həvalə olunan vaxt fəqir olsa, amma alacaqlı onun fəqir olduğunu bilərsə, yenə də həvaləni poza bilməz. Amma əgər fəqir olduğunu bilməzsə və sonradan öyrənərsə, əgər o zaman imkanlı olmuşdursa, həvaləni pozub alacağını həvalə verəndən ala bilər. Amma əgər o zaman imkanlı olmamışdırsa, müamiləni pozmaq haqqına sahib olması işkallıdır.

Məsələ ۲۲۶۵: Əgər borclu, tələbkar və həvalə olunan ya onlardan biri özü üçün həvaləni pozma haqqı olmasını qərar qoysa, qoyduqları qərara əsasən həvaləni poza bilərlər.

Məsələ ۲۲۶۶: Həvalə verən özü tələbkarın tələbini versə, belə ki, ona həvalə olunmuş şəxsin xahişi ilə olsa və həvalə verənin borclusu olsa, verdiyi şeyi ondan ala bilər. Amma əgər onun istəyi olmadan ödəyərsə və ya həvalə edənə borclu olmazsa, verdiyi şeyi ondan istəməyə haqqı yoxdur.

## RƏHNİN HÖKMLƏRİ

Məsələ ۲۲۶۷: Rəhn odur ki, insan bir malı borcunun əvəzinə və ya onun zamin olduğu malı başqasının yanında qalmasını qərar versin, belə ki, o borcu ya malı hazır etməsə, onun əvəzini o maldan götürə bilsin.

Məsələ ۲۲۶۸: Rəhndə siğə oxumaq lazım deyil. Girov verən öz malını girov qəsdi ilə alana versə və o da həmin qəsd ilə alsa, rəhn səhihdir.

Məsələ ۲۲۶۹: Girov verən və girov alan gərək həddi-büluğa çatmış və ağıllı olsunlar, onları bir kəs məcbur etməsin, həmçinin girov verən gərək müflis və səfeh olmasın (səfeh və müflisin mənası ۲۲۲۰-cü məsələdə deyildi) amma, əgər müflis olsa, girov qoyulan mal, onun malı olmasa və ya ondan istifadə etməyə qadağan olunmasa, eybi yoxdur.

Məsələ ۲۲۷۰: İnsan o malı girov qoya bilər ki, şərən o maldan istifadə edə bilsin, əgər başqa bir adamın malını onun icazəsiylə girov qoysa, düzdür.

Məsələ ۲۲۷۱: Girov qoyulan şeyin, gərək alış-verişi düz olsun, əgər şərab və onun kimi şeyi girov qoysalar, düzgün deyildir.

Məsələ ۲۲۷۲: Girov qoyulan malın mənfəəti, o malın sahibinə aiddir, istər girov qoyan olsun, istər başqası.

Məsələ ۲۲۷۳: Girov alan şəxs, mal sahibinin, istər girov verən olsun, istər başqası icazəsi olmadan girov qoyulan malı,

başqasına bağışlaya və sata bilməz. Amma əgər onu bağışlasa və ya satsa, sonra mal .sahibi ona icazə versə, eybi yoxdur

Məsələ ۲۲۷۴: Əgər girov götürən, girov götürdüyü şeyi sahibinin icazəsiylə satarsa, onun pulu da malın özü kimi girov olmur. Həmçinin, ondan icazəsiz satarsa və sonra malın sahibi imza etsə və ya girov verən o şeyi girov alanın icazəsi ilə satıb, onun əvəzini girov qərar verərsə, gərək həmin işi etsin. Amma bu razılaşmaya xilaf əməl .edərsə, müamilə batildir. Amma əgər girov götürən icazə verərsə, müamilə batil deyil

Məsələ ۲۲۷۵: Əgər borcun ödənməsi lazım olduğu bir vaxtda, tələbkar tələbini istəsə və o verməzsə, tələbkar girov aldığı malı satıb, tələbini onun pulundan götürməyə dair vəkaləti varsa, girov götürdüyünü sataraq tələbini ondan götürə bilər. Belə bir vəkaləti olmasa, borcludan icazə almalıdır. Əgər borclunu tapa bilməsə, ehtiyat-vacibə görə şəriət hakimindən icazə alması lazımdır. Hər iki halda əgər artıq qalarsa, gərək artığını .sahibinə versin

Məsələ ۲۲۷۶: Əgər borclunun, oturduğu evindən və ev əşyaları kimi, ehtiyacı olduğu ləvazimatdan başqa bir şeyi olmazsa, tələbkar öz alacağını ondan tələb edə bilməz. Amma əgər girov qoyduğu mal, ev və ləvazimatı olsa, tələbkar əvvəlki məsələdə .deyilən şərtlərə riayət etməklə onu satıb, öz tələbini götürə bilər

## ZAMİN OLMAĞIN HÖKMLƏRİ

Məsələ ۲۲۷۷: Əgər insan bir kəsin borcunu vermək üçün zamin olmaq istəsə, onun zəmanəti ancaq, ərəbcə olmasa belə, hər hansı dillə ya da başqa bir yolla tələbkara «sənin tələbini ödəmək üçün mən zaminəm» desə və tələbkar da razılığını bildirsə :səhihdir. Borclu olanın razı olması isə şərt deyil. Bu müamilənin iki halı vardır

Zamin, borclunun borcunu onun öhdəsindən öz öhdəsinə götürsün. Deməli əgər, o,-۱ borcu verməmiş vəfat etsə, sair borcları kimi irsdən irəlidir. Adətən, fəqihlərin zamin .deməkdə məqsədləri qeyd olunan mənadır

Zamin borcu ödəməyə dair iltizam versin, amma onun zimməsinə gəlməsin. Bu-۲ .halda əgər vəsiyyət etməzsə, ölümündən sonra, onun malından verilməz

Məsələ ۲۲۷۸: Zamin və tələbkar gərək həddi-buluğa çatmış və ağıllı olsunlar, bir kəs də onları məcbur etməsin və həm də gərək səfeh olmasınlar. Həmçinin tələbkar gərək müflis olmasın. Amma bu şərtlər borcluya aid deyil, məsələn; əgər bir kəs uşağın, .divanənin, ya səfehin borcunu verməyə zamin olsa, səhihdir

Məsələ ۲۲۷۹: Zamin olması üçün şərt qoyarsa, məsələn; «əgər borclu olan sənin borcunu verməzsə, mən verərəm» deyərsə, onun zamin olması ۲۲۷۷-cı məsələnin birinci bəndində deyilənə görə işkallıdır, amma, ikinci bəndində deyilənə görə eybi .yoxdur

Məsələ ۲۲۸۰: İnsan borcunu qaytarmasına zamin olduğu şəxs, borclu olmalıdır. Deməli, əgər bir şəxs başqasından borc etmək istəsə, borc etməyincə, insan ona zamin ola .bilməz. Bu şərt ikinci bənddə deyilən zəmanətdə yoxdur

Məsələ ۲۲۸۱: İnsan o surətdə zamin ola bilər ki, tələbkar, borclu və borcun cinsi həqiqətdə müəyyən olsunlar. Əgər iki nəfər bir adamdan tələbkar olsalar və insan desə: «mən zaminəm ki, sizdən birinin tələbini verəm», hansı birinin tələbini verməyi müəyyən etmədiyi üçün onun zəmanəti batildir. Əgər bir kəsin, iki nəfərdən tələbi (alacağı) olsa və insan «mən o iki nəfərdən birinin borcunu sənə ödəmək üçün zaminəm» desə, onlardan hansının borcunu ödəməyə zamin olduğunu müəyyən etmədiyi üçün zəmanət batildir. Həmçinin əgər bir kəsin, başqa birisindən on batman buğda və on manat pul alacağı olsa, insan «mən, sənin o iki tələbindən birini ödəmək üçün zaminəm» desə və müəyyən etməsə ki, buğdaya zamindir, ya pula, onun .zəmanəti səhih deyil

Məsələ ۲۲۸۲: Əgər bir kəs borcludan icazəsi olmadan onun borcunu verməyə zamin .olsa, ondan bir şey ala bilməz

Məsələ ۲۲۸۳: Əgər bir kəs borclunun icazəsi ilə onun borcunu verməyə zamin olsa, onu verməzdən əvvəl olsa belə, zamin olduğu miqdarı ondan tələb edə bilər. Amma əgər borclu olduğu bir malın yerinə başqa malı onun tələbkarına versə, verdiyi şeyi ondan tələb edə bilməz. Məsələn; əgər on batman buğda borclu olsa və zamin on batman düyü versə, düyünü ondan tələb edə bilməz, amma əgər özü düyü verməsinə razı .olsa, eybi yoxdur

Məsələ ۲۲۸۴: Əgər tələbkar öz tələbini zaminə bağışlasa, zamin borcludan bir şey ala bilməz və əgər ondan bir miqdarını bağışlasa, o miqdarı tələb edə bilməz. Amma əgər onun hamısını, ya bir hissəsini hibə etsə, ya xüms və ya zəkat və s. babətindən hesab .etsə, zamin onları borcludan istəyə bilər

Məsələ ۲۲۸۵: Əgər insan bir şəxsin borcunu qaytarmağa zamin olsa, zəmanətindən .geri çəkilə bilməz

Məsələ ۲۲۸۶: Zamin və tələbkar ehtiyat-vacibə əsasən, zəmanəti istədikləri vaxt poza .bilmədiklərini şərt qoya bilməzlər

Məsələ ٢٢٨٧: Əgər insan zamin olan vaxtda tələbkarın tələbini verməyə qadir olsa, sonradan fəqir olsa da, tələbkar onun zamin olmağını pozub öz tələbini əvvəlinci ,borcludan tələb edə bilməz. Həmçinin əgər o vaxtda onun tələbini verə bilməsə

amma tələbkar bilərsə və onun zamin olmasına razı olarsa, onun zaminliyini poza .bilməz

Məsələ ۲۲۸۸: Əgər insan, zamin olduğu zaman tələbkarın tələbini verməyə qadir olmasa, tələbkar bunu o zaman bilməsə və sonra onun zaminliyini pozmaq istəsə, ələlxüsus tələbkar işdən agah olmazdan qabaq zamin borcu ödəmək üçün qüdrət .taparsa, bu, işkallıdır

## KƏFALƏTİN HÖKMLƏRİ

Məsələ ۲۲۸۹: Kəfalət odur ki, insan öhdəsinə alsın ki, hər vaxt tələbkar borclunu istəsə, tapıb ona təhvil verəcəkdir, bu işə öhdəsinə götürən şəxsə “kəfil” deyilir.

Məsələ ۲۲۹۰: Kəfil, hətta ərəbcə olmayan hər hansı bir kəlmə və ya hər bir əməllə borc verənə “hər vaxt borclu olan şəxsi istəsən, onu sənə təhvil verəcəyimə zaminəm” anlatsa, borc verən də qəbul etsə kəfalət səhihdir. Ehtiyat-vacibə əsasən, kəfalətin səhih olmasında borclunun da buna razı olması şərtdir. Hətta ehtiyat-vacib budur ki, o da əqd tərəfində olsun, yəni borclu və tələbkar hər ikisi bunu qəbul etsin.

Məsələ ۲۲۹۱: Kəfil gərək həddi-büluğa çatmış və ağıllı olsun və onu kəfalətə məcbur etməsinlər və gərək kəfili olduğu adamı hazır edə bilsin. Həmçinin borclunu hazır etmək, malından istifadə etməyi lazım gətirdiyi təqdirdə, səfeh və müflis olmaması lazımdır.

Məsələ ۲۲۹۲: Kəfalət beş şeydən biri ilə pozulur.

۱) Kəfil olan şəxs borclu şəxsi haqq sahibinə qaytarsa və ya onun özü haqq sahibinə təslim olarsa;

۲) Haqq sahibinin haqqı ödənmiş olsa;

۳) Haqq sahibi öz haqqından keçsə və ya haqqını başqasına verərsə;

۴) Borclu və ya kəfil ölərsə;

۵) Haqq sahibi kəfili kəfalətdən azad edərsə;

Məsələ ۲۲۹۳: Əgər bir şəxs, borclu olan şəxsi haqq sahibinin əlindən zorla qaçırsa, əgər haqq sahibi onu tapa bilmirsə, borclunu qaçırdan onu borc sahibinə təhvil verməli yaxud da borc sahibinin haqqını ödəməlidir.

## VƏDİƏNİN (ƏMANƏTİN) HÖKMLƏRİ

Məsələ ۲۲۹۴: Bir şəxs malını başqa birisinə verib, ona «bu sənin yanında əmanət qalsın» deyərsə və o da qəbul edərsə, ya da mal sahibi heç bir şey söyləmədən malını saxlamaq üçün ona verdiyini başa salarsa, o da saxlamaq məqsədi ilə alarsa, sonra .söyləniləcək olan əmanət hökmlərinə görə hərəkət etməlidir

Məsələ ۲۲۹۵: Əmanətçi və malını əmanət verənin hər ikisi gərək ağıllı və baliğ olsunlar. Başqa birisi tərəfindən də məcbur edilməməlidirlər. Buna görə əgər insan bir malı dəlinin və ya uşağın yanına əmanət qoyarsa, yaxud dəli və ya uşaq malı bir şəxsin yanında əmanət qoyarsa, səhih deyildir. Lakin ağlıkəsən uşağın başqasının malını onun icazəsi ilə bir şəxsin yanında əmanət qoyması caizdir. Həmçinin əmanət qoyan şəxsin səfeh və ya müflis olmaması da lazımdır. Amma əgər müflis olmasına baxmayaraq, əmanət qoyduğu mal istifadəsi onun üçün qadağan olunmuş mallardan olmazsa, eybi yoxdur. Həmçinin əmanəti qorumaq əmanətçinin öz malından istifadə etməsini yaxud malın tələf olub aradan getməsini gərəkli etdiyi halda əmanətçinin də .səfeh və ya müflis olmaması gərəkdir

Məsələ ۲۲۹۶: Əgər bir uşaqdan mal sahibinin izni olmadan bir şeyi əmanət olaraq alarsa, o şeyi sahibinə verməlidir. Əgər əmanət aldığı o şey uşağın öz malıdırsa, onu uşağın vəlisinə çatdırmalıdır. Belə ki, o şey onlara təhvil verməzdən öncə tələf olarsa, əvəzini verməlidir. Amma əgər o malın xarab olub aradan getməsindən qorxduğu üçün onu sahibinə çatdırmaq qəsdi ilə uşaqdan alıb və onu qorumaq və çatdırmağa da səhlənkarlıq etməzsə və icazə verilməyən təsərrüf etməzsə, zamin deyildir. Əmanət .qoyan şəxs dəli olsa da, eyni hökmü daşıyır

Məsələ ۲۲۹۷: Əmanəti qorumağa qadir olmayan şəxs, əmanət qoymaq istəyən şəxsin ,onun vəziyyətindən xəbəri yoxdursa

.əmanəti qəbul etməməlidir. Əgər qəbul etsə və tələf olsa, zamindir

Məsələ ۲۲۹۸: İnsan, mal sahibinə onun malını qorumağa hazır olmadığını başa salsa və malı əmanətə götürmədiyi halda mal sahibi malı qoyub gedərsə və o mal tələf olarsa, əmanəti qəbul etməyən şəxs zamin deyildir. Amma ehtiyat-müstəhəb budur ki, .mümkün olduğu təqdirdə o malı qoruyub saxlasın

Məsələ ۲۲۹۹: Bir şeyi əmanət qoyan şəxs istədiyi vaxt əmanət qərarını poza bilər. .Həmçinin əmanəti qəbul edən şəxs istədiyi vaxt əmanət qərarını poza bilər

Məsələ ۲۳۰۰: Əgər insan əmanəti qorumaq fikrindən dönüb əmanət əqdini pozarsa, mümkün qədər tez bir zamanda o malı sahibinə, ya sahibinin vəkilinə, ya da vəlisinə çatdırmalıdır, yaxud malı qorumağa hazır olmadığını onlara xəbər verməlidir. Əgər üzrsüz olaraq malı onlara çatdırmazsa, xəbər də verməzsə, o mal tələf olduğu .təqdirdə əvəzini ödəməlidir

Məsələ ۲۳۰۱: Əmanəti qəbul edən şəxsin əmanəti qorumaq üçün münasib bir yer yoxdursa, münasib bir yer tapmalıdır və əmanəti camaatın onu qorumaqda «səhlənkar davrandı» deməyəcəyi bir şəkildə qorumalıdır. Əgər bu mövzuda qüsurlu davransa və .əmanət tələf olsa, əvəzini ödəməsi lazımdır

Məsələ ۲۳۰۲: Əmanəti qəbul edən bir şəxs onun qorunmasında səhlənkarlıq və israfçılıq (yəni icazə verilməyən istifadə) etmədiyi halda təsadüfən əmanət tələf olarsa, zamin deyildir. Amma əgər onu qorumaqda səhlənkarlıq etsə, məsələn; onu bir zalımın xəbərdar olub götürə biləcəyi yerə qoyarsa və ifrata vararsa, (yəni o maldan sahibinin icazə vermədiyi şəkildə istifadə edərsə) məsələn; paltarı geyərsə və ya .heyvana minərsə, tələf olduğu təqdirdə bunun əvəzini sahibinə verməlidir

Məsələ ۲۳۰۳: Əgər mal sahibi malının qorunması üçün müəyyən bir yer təyin edərsə və əmanəti qəbul edən şəxsə «bu malı burada saxlamalısan, tələf olacağına ehtimal versən belə, başqa bir yerə qoymamalısan» deyərsə, onu başqa bir yerə qoya bilməz. Əgər başqa bir yerə qoyarsa və zay olarsa, zamindir. Amma əgər malın orada tələf

.olacağına yəqin etsə, bu halda daha möhkəm yerə aparması caizdir

Məsələ ۲۳۰۴: Əgər mal sahibi malının qorunması üçün müəyyən bir yer təyin edərsə, amma sözündən o yeri təyin etməsinin o yerin onun nəzərində xüsusi əhəmiyyət daşıdığından deyil, sadəcə qoruma yerlərindən biri olduğu üçündürsə, əmanəti qəbul edən şəxs onu malından daha yaxşı olan və ya əvvəlkinin bənzəri olan başqa bir yerə .qoya bilər. Bu halda mal orada zay olsa da, zamin deyildir

Məsələ ۲۳۰۵: Əgər mal sahibi həmişəlik olaraq dəli və ya bihuş olarsa, əmanət əqdi batil olur və əmanəti qəbul edən şəxs dərhal əmanəti onun vəlisinə verməli və ya onu xəbərdar etməlidir. Bundan qeyri hallarda mal tələf olduğu halda onun əvəzini ödəməsi gərəkdir. Amma əgər mal sahibinin dəlilik və ya bihuşluğu hərdənbir olursa, .bu halda da ehtiyat-vacibə görə həmin işi etməlidir

Məsələ ۲۳۰۶: Əgər mal sahibi ölərsə, əmanət əqdi batil olur. Bu halda o mal başqasının bir haqqı deyilsə və meyyitin varislərinə keçirsə, əmanətçinin onun varislərinə verməsi, ya da xəbər çatdırması gərəkdir. Bundan qeyri halda əgər o mal tələf olarsa, zamindir. Amma əgər meyitin başqa varisinin olub-olmadığını, ya varisinin kim .olmasını öyrənmək üçün malı saxlasa bu səbəbdən də mal tələf olarsa, zamin deyildir

Məsələ ۲۳۰۷: Əgər mal sahibi ölərsə və mal onun varislərinə keçərsə, əmanəti qəbul edən şəxs, o malı meyyitin bütün varislərinə, ya da bütün varislərin vəkilinə verməlidir. Əgər o biri varislərin icazəsi olmadan malın hamısını varislərin birinə verərsə, .qalanların payına zamindir

Məsələ ۲۳۰۸: Əgər əmanəti qəbul edən şəxs ölərsə və ya həmişəlik olaraq dəli ya da bihuş olarsa, əmanət əqdi batil olur və onun varis və ya vəlisi mümkün qədər tez mal sahibinə vəziyyəti xəbər verməli, ya da əmanəti ona çatdırmalıdır. Amma əgər onun dəlilik və ya bihuşluğu hərdənbir olursa, bu halda da ehtiyat-vacibə görə həmin işi .etməlidir

Məsələ ۲۳۰۹: Əgər əmanəti qəbul edən şəxs, özündə ölüm əlamətləri görməyə başlarsa, mümkün olduğu halda ehtiyat-vacibə görə əmanəti ya onun sahibinə, ya vəli, ya da vəkilinə yetirməli, ya da xəbər verməlidir. Əgər mümkün deyilsə, onun

ölümündən sonra malı sahibinə çatdırılacağına əmin olduğu bir şəkildə əməl etməlidir. Məsələn; şahid tutub vəsiyyət etməli və vəsiyyət etdiyi şəxsə və şahidə mal sahibinin .adını, malın cinsini, xüsusiyyətlərini və yerini söyləməlidir

Məsələ ۲۳۱۰: Əgər əmanətçi üçün bir səfər qarşıya çıxsa, əmanəti öz əhl-əyalının yanında saxlaya bilər. Amma əgər onun qorunması həmin şəxsin onun yanında olmasına bağlıdırsa, bu halda ya səfərdən qalmalı, ya da onu sahibinin vəlisinə, ya .vəkilinə qaytarmalıdır, ya da vəziyyəti ona xəbər verməlidir

## ARİYƏNİN HÖKMLƏRİ

Məsələ ۲۳۱۱: Ariyə odur ki, insan öz malını digərinin istifadə etməsi üçün versin və əvəzində heç nə almasın.

Məsələ ۲۳۱۲: Ariyədə əqd oxumaq lazım deyil və əgər, məsələn; paltarını ariyə niyyəti ilə bir kəsə versə və o da həmin niyyətlə alsa, ariyə düzdür.

Məsələ ۲۳۱۳: Qəsb edilmiş bir şeyi və ya mənfəəti başqasına aid olan malı (məsələn; kirayə verdiyi bir şeyi) başqasına ariyə vermək, ancaq qəsb edilən şeyin sahibinin və ya o şeyi kirayəyə götürənin ariyəyə verməyə icazə verdiyi təqdirdə səhih olur.

Məsələ ۲۳۱۴: İnsan, mənfəəti özünə aid olan bir şeyi, məsələn; kirayələdiyi bir şeyi, ariyə verə bilər. Amma əgər icarə əqdində şərt edilsə ki, təkcə özü istifadə etsin, onda ariyə verə bilməz. Birinci halda ehtiyat-vacibə əsasən, onun sahibinin razılığı olmadan onu o şəxs ki, ariyə etmişdir, təhvil verə bilməz.

Məsələ ۲۳۱۵: Əgər uşaq, dəli, müflis və ya səfeh öz malını ariyə verirsə, düz deyildir, amma əgər vəlisi məsləhət bildiyi surətdə o kəsin malını ki, ona vilayəti var, ariyə versə, eybi yoxdur. Həmçinin uşağın, malı ariyə edənə çatdırmaqda vasitə olması, işkalsızdır.

Məsələ ۲۳۱۶: Əgər ariyə etdiyi bir şeyi qorumaqda səhlənkarlıq etməsə və ondan icazə verilməyən istifadə etməsə təsadüfən o şey xarab olsa, zamin deyil. Amma əgər şərt etsələr ki, əgər ariyə edilmiş şey xarab olsa, zamin olsun, ya ariyə edilmiş şey qızıl və gümüş olsa, gərək onun əvəzi verilsin.

Məsələ ۲۳۱۷: Əgər qızıl və gümüşü ariyə etsə və şərt etsə ki, əgər tələf olsa, zamin deyil, əgər tələf olarsa, zamin deyildir.

Məsələ ۲۳۱۸: Əgər ariyə verən ölərsə, ariyə alan şəxs (əmanət bölümünün) ۲۳۰۶-cü məsələdə mal sahibinin ölməsi barəsindəki əmanət hökmünün tərtibi ilə əməl etməlidir.

Məsələ ۲۳۱۹: Əgər ariyə verən, şərən öz malından istifadə edə bilməsə, məsələn; dəli və ya huşsuz olsa, ariyə edən şəxs (əmanət bölümünün) ۲۳۰۸-ci məsələdə açıqlanan .hökmə görə əməl etməlidir

Məsələ ۲۳۲۰: Bir şeyi ariyə verən adam istədiyi vaxt onu poza bilər və ariyə edən adam .da istədiyi vaxt ariyəni poza bilər

Məsələ ۲۳۲۱: Halal istifadəsi olmayan bir şeyi məsələn; əyləncə, qumar alətləri, yeməkdə və içməkdə istifadə olunan qızıl və gümüş qabların, hətta ehtiyat-lazıma əsasən, bütün istifadələrdə də, ariyəyə verilməyi batildir. Amma zinətdən ötrü ariyə .verilməsi caizdir

Məsələ ۲۳۲۲: Süd və dərisindən istifadə etməkdən ötrü qoyunu ariyə vermək və dişi .heyvanın mayalanmasından ötrü erkək heyvanı ariyə vermək səhihdir

Məsələ ۲۳۲۳: Əgər ariyə etdiyi bir şeyi sahibinə, ya onun vəkil və ya vəlisinə versə və sonra o şey tələf olsa, ariyə edən zamin deyildir. Amma əgər malın sahibindən, ya onun vəkil və ya vəlisindən icazəsiz olaraq hətta sahibinin adətən apardığı bir yerə apararsa, məsələn, atı sahibi at üçün düzəltdiyi tövləyə aparsa və sonra tələf olarsa .ya bir kəs onu tələf edərsə, zamindir

Məsələ ۲۳۲۴: Əgər nəcis bir şeyi ariyə versə, gərək ۲۰۱۴-cü məsələdə deyildiyi .vəziyyətdəki kimi, onun nəcis olduğunu ariyə edən şəxsə deməlidir

Məsələ ۲۳۲۵: Ariyə etdiyi bir şeyi sahibindən icazəsiz başqasına icarə və ya ariyəyə .verə bilməz

Məsələ ۲۳۲۶: Əgər ariyə etdiyi bir şeyi sahibinin icazəsi ilə başqasına ariyə versə, belə .ki, bir şəxs birinci şeyi ariyə etdikdən sonra ölsə və ya dəli olsa, ikinci ariyə batil olmur

Məsələ ۲۳۲۷: Əgər ariyə etdiyi malın qəsbi olduğunu bilsə, onu sahibinə çatdırması .lazımdır; ariyəyə verən şəxsə qaytara bilməz

Məsələ ۲۳۲۸: Əgər qəsbi olduğunu bildiyi bir malı ariyə edib, ondan istifadə etsə və

onun əlində tələf olsa, malın sahibi malın əvəzini və ariyə edənin etdiyi istifadənin əvəzini ondan və

ya malı qəsb edən adamdan tələb edə bilər və əgər ariyə edəndən alsa, o, sahibə .verdiyi şeyi ariyə verəndən tələb edə bilməz

Məsələ ۲۳۲۹: Əgər ariyə etdiyi malın qəsbi olmasını bilməsə və onun əlində tələf olsa, belə ki, mal sahibi əvəzini ondan alsa, o da mal sahibinə verdiyini ariyə verən şəxsdən tələb edə bilər. Amma əgər ariyə etdiyi şey qızıl və gümüş olsa, ya ariyə verən onun ilə şərt etmiş olsa ki, əgər o şey aradan getsə, onun əvəzini versin, malın sahibinə verdiyinin əvəzini ariyə verəndən tələb edə bilməz. Amma əgər malik ondan, bu .maldan istifadə etmək müqabilində bir şey alsa, ariyəyə verəndən ala bilər

## NİKAHIN HÖKMLƏRİ

### Point

Nigah əqdi ilə qadın və kişi bir-birinə halal olurlar. O iki qismdir: daimi və qeyri-daimi. Daimi əqd budur ki, onda evlənmənin müddəti müəyyən olunmasın (yəni, heç müddəti olmasın). Bu cür əqd olunan qadına daimə deyilir. Qeyri-daimi əqd budur ki, onda evlənmənin müddəti müəyyən olunsun; (məsələn: qadını bir saatlığa, bir günlüyə, bir aylığa, bir illiyə, yaxud daha artıq müddətə əqd etmək). Bu qayda ilə əqd oxunan .qadına mütə və siyğə deyilir

### ƏQDİN HÖKMLƏRİ

Məsələ ۲۳۳۰: İzdivacda, istər daimi olsun, istər qeyri-daimi, gərək siğə oxunsun və təkcə kişi və qadının razı olması və yazmaq ehtiyat-vacibə əsasən kifayət deyil. Əqd siğəsini, ya kişi ilə qadının, özləri oxuyurlar, ya başqasını vəkil edərlər ki, onların .tərəfindən oxusun

Məsələ ۲۳۳۱: Vəkilin kişi olması lazım deyil, qadın da əqd siğəsini oxumaq üçün .başqasının tərəfindən vəkil ola bilər

Məsələ ۲۳۳۲: Kişi və qadın vəkilin siğəni oxumasında xatircəmlik hasil etməyincə bir-birinə məhrəmcəsinə baxa bilməzlər. Vəkilin siğəni oxumasını güman etmək kifayət deyil. Hətta əgər vəkil desə ki, siğəni oxumuşam, amma onun sözlərindən xatircəmlik .hasil olmasa, ehtiyat-vacib budur ki, onun sözünə etibar etməsinlər

Məsələ ۲۳۳۳: Əgər bir qadın bir kəsi vəkil etsə ki, məsələn; on günlük onu bir kişiyə əqd etsin və on günün əvvəlini müəyyən etməsə, o vəkil istədiyi vaxt, onu on günlük o kişiyə

əqd edə bilər. Amma əgər məlum olsa ki, qadın müəyyən bir gün, ya saatı qəsd edib, .gərək siğəni qəsdə uyğun oxusun

Məsələ ۲۳۳۴: Bir nəfər iki nəfərin tərəfindən həm daimi, həm də qeyri-daimi əqdin siğəsini oxumaq üçün vəkil ola bilər. Həmçinin, insan qadının tərəfindən vəkil olaraq onu özü üçün daimi və ya qeyri-daimi əqd edə bilər. Amma ehtiyat-müstəhəb budur ki, .əqdi iki nəfər oxusun

## ƏQD OXUMAĞIN QAYDALARI

Məsələ ۲۳۳۵: Əgər daimi əqdin siğəsini kişi və qadının özləri oxusalar, mehriyyənin :miqdarını təyin etdikdən sonra, əvvəl qadın desin

زَوَّجْتُکَ نَفْسِی عَلَی الصّدَاقِ الْمَعْلُومِ

Zəvvəctukə nəfsi ələssidaqil-mə`lum» (yəni, özümü müəyyən olunmuş mehr» müqabilində sənə arvad etdim), ondan sonra kişi zaman fasiləsi olmadan

قَبِلْتُ التَّزْوِيجَ

.Qəbiltut-təzvicə» (yəni, bu izdivacı qəbul etdim) desə, əqd səhihdir»

Əgər təkcə «qəbiltu» da desə, səhihdir. Əgər başqasını vəkil etsələr ki, onların tərəfindən əqd siğəsini oxusun, belə ki, məsələn; kişinin adı Əhməd və qadının adı :Fatimə olsa, qadının vəkili desin

زَوَّجْتُ مُوَكِّلَکَ أَحْمَدَ مُوَكِّلَتِی فَاطِمَهَ عَلَی الصّدَاقِ الْمَعْلُومِ

.«Zəvvəctu muvəkkiləkə Əhmədə muvəkkiləti Fatimətə ələssidaqil-mə`lum»

:Sonra kişinin vəkili etina olunacaq fasilə olmadan

قَبِلْتُ التزويج لِمُوَكِّلِی أَحْمَدَ عَلَی الصَّدَاقِ

Qəbiltut-təzvicə limuvəkkili Əhmədə ələssidaqil-mə`lum» desələr, əqd səhihdir.» Ehtiyat-müstəhəb budur ki, kişi deyən kəlmə, qadın deyən kəlmə ilə uyğun olsun. Məsələn; əgər qadın «zəvvəctu» deyirsə, kişi də, «qəbiltut-təzvicə» desin, «qəbiltun-nikah» deməsin.

Məsələ ۲۳۳۶: Əgər kişi və qadın özləri qeyri-daimi əqdinin siğəsini oxumaq istəsələr, müddət və mehriyyəni təyin edəndən sonra, qadın desin:

زَوَّجْتُکَ نَفْسِی فِی الْمُدَّهِ الْمَعْلُومَهِ عَلَی الْمَهْرِ الْمَعْلُومِ

Zəvvəctukə nəfsi fil-muddətil-mə`luməti ələl-məhril-mə`lum». Ondan sonra etina» ediləcək fasilə olmadan kişi desin:

قَبِلْتُ

Qəbiltu» əqd səhihdir. Əgər başqasını vəkil etsələr, əvvəl qadının vəkili, kişinin vəkilinə» desin:

زَوَّجْتُ لِمُوَکِّلَتِی مُوَکِّلَکَ فِی المُدَّهِ المَعلُومَهِ عَلَی المَهرِ المَعلُومِ

«Zəvvəctu muvəkkiləti muvəkkiləkə fil-muddətil-mə`luməti ələl-məhril-mə`lum».

Sonra fasiləsiz kişinin vəkili desin:

قَبِلْتُ التَّزْوِیجَ لِمُوَکِّلِی هَکَذَا

Qəbiltut-təzvicə limuvəkkili hakəza» əqd səhih olar».

## ƏQDİN ŞƏRTLƏRİ

Məsələ ۲۳۳۷: İzdivac əqdinin bir neçə şərti var:

۱. Ehtiyat-vacibə görə ərəbcə oxunsun. Əgər kişi və qadın özləri siğəni ərəbcə oxuya bilməsələr, ərəb dilindən başqa dildə

də oxuya bilərlər və vəkil tutmaqları lazım deyil. Amma gərək elə bir kəlmə desinlər ki, .«zəvvəctu» və «qəbiltu» mənasını anlatsın

Kişi və qadın yaxud onların siğəsini oxuyan vəkilin inşa qəsdləri olsun, yəni kişi və .۲ qadın özləri siğəni oxuyurlarsa, qadın «zəvvəctukə nəfsi» deməklə qəsdi bu olsun ki, özünü ona arvad qərar verir və kişi «qəbiltut-təzvicə» deməklə, onu özü üçün arvad kimi qəbul etsin. Əgər kişi və qadının vəkili siğəni oxuyarlarsa, «zəvvəctu» və «qəbiltu» .deməklə qəsdləri bu olsun ki, onları vəkil etmiş kişi və qadın, ər-arvad olsunlar

Siğə oxuyan şəxs, gərək ağıllı olsun. Əgər özü üçün oxuyursa gərək baliğ də olsun. .۳ Hətta ehtiyat-vacib görə, həddi-büluğa çatmayan, amma müməyyiz (ağlıkəsən) uşağın başqası üçün əqd oxuması kifayət deyil; əgər oxusa, təlaq verilməli və ya .yenidən əqd oxunmalıdır

Əgər ər və arvadın vəkili, ya onların vəlisi siğəni oxusalar, əqd zamanı ər və arvadı .۴ müəyyən etsinlər, məsələn; onların adlarını çəksinlər, ya onlara işarə etsinlər. Deməli, bir kəsin neçə qızı olsa, əgər kişiyə desə ki, «zəvvəctukə ihda bənati» yəni, öz qızlarımdan birini sənə arvad etdim və kişi desə ki, «qəbiltu» yəni qəbul etdim, əqd .zamanı qızı müəyyən etmədiklərinə görə, əqd batildir

Kişi və qadın izdivaca razı olsunlar, amma zahirən kərahət ilə izn versələr və məlum .۵ .olsa ki, qəlbən razıdırlar, əqd səhihdir

Məsələ ۲۳۳۸: Əgər əqddə bir hərf yaxud daha çox səhv oxunsa, amma onun mənası .dəyişməsə, əqd səhihdir

Məsələ ۲۳۳۹: Əqd siğəsini oxuyan şəxs, əgər icmal (qısaca) olsa belə, onun mənasını bilsə və onu gerçəkləşdirmək qəsdi etsə, əqd səhihdir və siğənin mənasını geniş şəkildə bilməsi lazım deyildir, məsələn; ərəb dilinin qrammatikasına görə, fel və ya .failin hansı olduğunu bilməsi lazım deyil

Məsələ ۲۳۴۰: Əgər bir qadını, bir kişi üçün onların icazəsi olmadan əqd etsələr və sonradan kişi və qadın o əqdə icazə versələr, əqd düzdür. İcazə üçün də, razılıqlarına

.dəlalət edən bir söz demələri, yaxud bir iş etmələri kifayətdir

Məsələ ۲۳۴۱: Əgər kişi və qadını, ya ikisindən birini izdivaca məcbur etsələr və əqd oxuyandan sonra əvvəlki məsələdə deyildiyi kimi icazə versələr, əqd səhihdir. Yaxşısı .budur ki, əqdi təzədən oxusunlar

Məsələ ۲۳۴۲: Ata və ata tərəfdən olan baba öz nabaliğ oğlan ya qız övladını, ya dəli halda baliğ olan, dəli övladlarını evləndirə bilərlər və uşaq baliğ olandan sonra, ya dəli əqilli olandan sonra, əgər onun üçün olunan izdivacın ona bir zərəri olduğunu görərsə, ya qəbul, ya da rədd edə bilər. Amma bir zərəri olmasa, belə ki, həddi-büluğa çatmamış oğlan və ya qız öz izdivacının əqdini pozsa, ehtiyat-vacibə görə təlaq .verməli, ya təzədən əqd oxunmalıdır

Məsələ ۲۳۴۳: Həddi-büluğa çatmış və rəşidə, yəni öz məsləhətini tanıyna bir qız əgər ərə getmək istəsə, belə ki, bakirə olsa və özü öz məişət və yaşayışında ixtiyar sahibi olmasa, gərək atasından və ya ata tərəfdən olan babasından, icazə alsın. Ehtiyat-vacibə əsasən, əgər özü öz işlərinin ixtiyar sahibi olsa belə, yenə də icazə almalıdır. .Ana və qardaşın icazəsi lazım deyil

Məsələ ۲۳۴۴: Əgər qız bakirə olmasa, ya bakirə olsa, amma atası, ya ata-babası ona şərən və ürfən həmtay olan bir kişiylə evlənməsinə icazə verməsələr, ya da qızı evləndirmək işlərində iştirak etməyə əsla hazır olmasalar və yaxud dəlilik və ya ona bənzər səbəblərdən icazə vermək səlahiyyətinə malik olmazlarsa, bu kimi yerlərdə onların icazəsi lazım deyil. Həmçinin əgər onlardan icazə almaq ğaib olmaq, ya başqa səbəblərə görə mümkün olmasa və qızın həmin vaxtda ərə getməyə çox ehtiyacı olsa, .ata və babasının icazəsi lazım deyil

Məsələ ۲۳۴۵: Əgər ata və ya ata tərəfindən olan baba öz həddi-büluğa çatmamış oğlu üçün qız alsa, gərək oğlan həddi-büluğa çatdıqdan sonra o qadının xərcini versin. Hətta həddi-büluğa çatmamışdan əvvəl bir surətdə ki, ləzzət almaq yaşına çatmışsa və qız da əri ondan ləzzət almaq imkanı olmayacaq qədər kiçik deyilsə, o qadını nəfəqəsi (yaşayış xərci) oğlanın öhdəsindədir. Bundan başqa hallarda nəfəqə vacib .deyil

Məsələ ۲۳۴۶: Əgər ata və ya ata tərəfindən olan baba öz həddibüluğa çatmamış oğlu üçün qız alsa, belə ki, əqd vaxtı oğlanın malı olmasa, ata və ya ata tərəfindən olan baba gərək qadının mehrini versinlər. Həmçinin əgər malı olsa, amma ata və ya ata babası mehrə zamin olsalar, hökm eynidir. Bu iki haldan başqa əgər mehr, adi mehr miqdarından çox olmazsa və ya bir məsləhət o mehrin adi miqdardan çox olmasını tələb edirsə, ata və ya ata babası mehri, oğlanın malından ödəyə bilərlər. Əks təqdirdə oğlanın malından adi mehr miqdarından çox verə bilməzlər. Amma o həddi-büluğa .çatandan sonra onların işini qəbul etsə, verə bilərlər

**ƏR VƏ ARVADIN ƏQDİ POZA BİLƏCƏYİ YERLƏR**

Məsələ ۲۳۴۷: Əgər kişi əqddən sonra aşağıda deyiləcək altı eybdən birinin əqd halında .qadında olduğunu başa düşsə, o eybə görə əqdi poza bilər

.Dəlilik, ara-bir olsa belə .۱

;Xora xəstəliyi .۲

;Bərəs (alaca) xəstəliyi.۳

.Korluq .۴

.İflic olmaq, yerdə qalacaq şəkildə olmasa belə .۵

Onun bətnində ət, ya sümüyün olması ki, istər yaxınlıq etməyə və ya hamiləliyə .۶ mane olsun, istər olmasın. Əgər əqddən sonra kişi, qadının əqd vaxtı ifza, yəni bövl və heyz, ya heyz və ğait, ya da hər üçünün yolunun bir olduğunu başa düşərsə, əqdi poza .bilməsi işkallıdır. Bu halda əqdi pozsalar, ehtiyat-lazıma əsasən gərək təlaq da versin

Məsələ ۲۳۴۸: Əgər qadın əqddən sonra başa düşsə ki, onun ərinin kişilik aləti yoxdur, ya əqddən sonra yaxınlıqdan qabaq və ya ondan sonra onun aləti kəsilərsə, ya bir xəstəliyi var ki, yaxınlıq edə bilmir, hərçənd o xəstəlik əqddən sonra və yaxınlıqdan qabaq və ya ondan sonra ariz olsa (irəli gələrsə), bütün bu surətlərdən sonra qadın təlaqsız əqdi poza bilər. Əgər qadın əqddən sonra başa düşsə ki, əri əqddən əvvəl dəli

ya əqddən sonra, istər yaxınlıqdan sonra və ya ondan qabaq dəli olarsa və ya başa düşsə ki, əqd vaxtı onun kişilik yumurtalığı çıxarılmış və ya əzilibmiş, ya da bu vaxtda onun korluq, xora və ya alaca xəstəliyi var imiş, bütün bu hallarda ehtiyat-vacib budur ki, qadın əqdi pozmasın. Əgər belə etsə, ehtiyat-vacib budur ki, əgər ər-arvadlığı davam etdirmək istəsələr, yenidən əqd etsinlər. Əgər ayrılıb təlaq vermək istəsələr, o halda ki, kişi yaxınlıq edə bilməsə və qadın əqdi pozmaq istəsə, lazımdır ki, əvəl qadın şəriət hakiminə, ya onun vəkilinə müraciət etsin. Hakim ərə bir il möhlət verər, belə ki, .ər o qadın ilə ya başqa qadın ilə yaxınlıq edə bilməsə, ondan sonra əqdi poza bilər

Məsələ ۲۳۴۹: Əgər kişinin yaxınlıq edə bilmədiyinə görə qadın əqdi pozarsa, ər gərək mehrin yarısını versin, amma yuxarıda deyilmiş başqa eyblərdən birinə görə, kişi ya qadın əqdi pozsa, belə ki, kişi qadınla yaxınlıq etməyibsə, onun üçün bir şey vacib deyil, .əgər yaxınlıq edibsə, gərək mehrin hamısını versin

Məsələ ۲۳۵۰: Əgər onunla evlənməyə rəğbətlənməsi üçün, kişi ilə qadın qarşı tərəfə olduğundan daha yaxşı tanıdılarsa, istər əqd vaxtı olsun, istər ondan sonra, bir surətdə ki, əqd onun əsasında baş verərsə, belə ki, əqddən sonra bu iş digər tərəfə məlum olarsa, o əqdi poza bilər, bu məsələnin hökmləri «Minhacus-salihin» kimi başqa .kitablarda geniş açıqlanmışdır

## EVLƏNMƏSİ HARAM OLAN QADINLAR

Məsələ ۲۳۵۱: İnsanın ona məhrəm olan ana, bacı, öz qızı, bibi, xala, qardaş qızı, bacı .qızı, qaynana kimi qadınlarla izdivac etməsi haramdır

Məsələ ۲۳۵۲: Əgər bir kəs bir qadını özü üçün əqd etsə, onunla yaxınlıq etməsə də, onun anası, anasının anası, atasının anası və nə qədər yuxarı getsə, o kişiylə məhrəm .olurlar

Məsələ ۲۳۵۳: Əgər bir qadını əqd edib onunla yaxınlıq edərsə, qadının qızı, qız nəvəsi, oğlan nəvəsi və nə qədər aşağıya kimi getsə, istər əqd vaxtında olsun, istər sonradan .dünyaya gəlsin, o kişiylə məhrəm olurlar

Məsələ ۲۳۵۴: Əgər bir qadını özü üçün əqd edib, onunla yaxınlıq etməsə, nə qədər ki, o .qadın onun əqdindədir, ehtiyat-vacibə əsasən, onun qızı ilə izdivac edə bilməz

Məsələ ۲۳۵۵: İnsanın xala və bibisi, atasının xala və bibisi, atasının atasının xalası və bibisi, ya atasının anası, anasının xala və bibisi, anasının anasının xala və bibisi, ya .anasının atası və nə qədər yuxarı getsə, insana məhrəmdirlər

Məsələ ۲۳۵۶: Ərin atası və babası və nə qədər yuxarı getsə; və onun oğlu və qız və oğlan nəvəsi və nə qədərki aşağı gedir, istər əqd vaxtı olsalar, istər sonradan dünyaya .gəlsinlər, onun arvadına məhrəmdirlər

Məsələ ۲۳۵۷: Əgər bir qadını özü üçün əqd etsə, istər daimi olsun, istər siğə, nə qədər .ki, o qadın onun əqdindədir, o qadının bacısı ilə izdivac edə bilməz

Məsələ ۲۳۵۸: Əgər öz arvadına, təlaq kitabında deyiləcək tərtib ilə rici təlaqı versə, iddə arasında onun bacısını əqd edə bilməz. Amma bain təlaq iddəsində təlaq verən, onun .bacısı ilə izdivac edə bilər. Mütə iddəsində ehtiyat-vacib budur ki, izdivac etməsin

Məsələ ۲۳۵۹: İnsan öz arvadının icazəsi olmadan onun bacısı qızı və qardaşı qızı ilə izdivac edə bilməz. Amma əgər arvadının icazəsi olmadan onları əqd etsə və sonradan .arvadı icazə versə, eybi yoxdur

Məsələ ۲۳۶۰: Əgər qadın başa düşsə ki, əri onun bacısı qızı və ya qardaşı qızını əqd edib və bir söz deməsə, belə ki, sonradan razılıq versə, əqd səhihdir. Əks təqdirdə isə .onların əqdi batildir

Məsələ ۲۳۶۱: Əgər insan öz bibisi və xalası qızını almamışdan qabaq onun anası ilə zina .etsə, ehtiyat-vacibə əsasən, daha o, qızla izdivac edə bilməz

Məsələ ۲۳۶۲: Əgər öz bibisi qızı və xalası qızı ilə izdivac etsə, onlar ilə yaxınlıq edəndən .əvvəl və ya sonra onların anaları ilə zina etsə, onların ayrılmasına səbəb olmaz

Məsələ ۲۳۶۳: Əgər öz xalası və bibisi olmayan başqa qadın ilə zina etsə, ehtiyat-.müstəhəb budur ki, onun qızı ilə izdivac etməsin

Məsələ ۲۳۶۴: Müsəlman qadın kafirə əqd oluna bilməz, istər daim olsun, istər müvəqqəti, istər əhli-kitabdan olan kafir olsun, istərsə də onlardan qeyri kafir, müsəlman kişi də əhli-kitab olmayan kafir qadınlar ilə izdivac edə bilməz. Amma əhli-kitab olan yəhudi və xristian qadınları ilə siğə etməyin maneəsi yoxdur, ehtiyat-lazıma əsasən onlar ilə daimi əqd etməsinlər. Müsəlman kişi Məcusi qadınla ehtiyat-vacibə görə hətta müvəqqəti də əqd etməsin. Nəvasib kimi bəzi firqələr ki, özlərini müsəlman bilirlər, kafir hökmündədirlər və müsəlman kişi və qadın onlar ilə daimi, ya qeyri-daimi .izdivac edə bilməzlər. Mürtəddə də eyni hökmü daşıyır

Məsələ ۲۳۶۵: Əgər bir kəs rici təlaqın iddəsində olan qadın ilə zina etsə, o qadın ehtiyat-vacibə görə ona haram olur. Əgər mütə, bain təlaqı, ya vəfat iddəsində ya da vətyi-şübhə iddəsində olan qadın ilə zina etsə, sonradan onu əqd edə bilər. Rici və bain təlağının və həmçinin mütə, vəfat və vətyi-şübhə iddəsinin mənası təlaqın .hökmlərində deyiləcək

Məsələ ۲۴۶۶: Əgər əri olmayan və iddədə olmayan bir qadın ilə zina etsə, ehtiyat-vacibə əsasən tövbə etməzdən qabaq onunla evlənə bilməz. Əgər başqası o qadının tövbə etməsindən qabaq onunla evlənmək istəsə maneəsi yoxdur. Yalnız o surətdə ki, o qadın zina etməkdən məşhur olarsa, ehtiyat-vacibə əsasən tövbə etməzdən qabaq onunla izdivac icazəli deyildir. Həmçinin zina etməkdə məşhur olan bir kişi ilə onun tövbə etməmişdən əvvəl izdivac etməsi icazəli deyildir. Əgər bir şəxs zinakar bir qadınla evlənmək istəsə, istər onunla özü zina etmiş olsun, istər başqası, gərək səbr .edib o qadın heyz gördükdən sonra onunla əqd etməsi müstəhəbdir

Məsələ ۲۳۶۷: Əgər başqasının iddəsində olan qadını özü üçün əqd etsə, belə ki, kişi və qadın və ya onlardan biri, qadının iddəsi tamam olmadığını və iddədə olan qadını əqd etməyin haram olduğunu bilsələr, əqddən sonra o qadına yaxınlıq etməmiş olsa belə, o qadın, o kişiyə əbədi olaraq haram olur. Əgər hər ikisi iddə məsələsinin əslində, ya iddə əqd etməyin batil olması barədə cahil olsalar, əqd batildir. Əgər yaxınlıq

etmiş olsa, əbədi olaraq haram olur. Əks halda isə haram deyil və iddə qurtarandan .sonra yenidən əqd edə bilərlər

Məsələ ۲۳۶۸: Əgər insan bir qadının əri olduğunu bildiyi halda onunla izdivac etsə, gərək ondan ayrılsın və sonradan da onu özü üçün əqd etməsin. Həmçinin ehtiyat-vacibə əsasən o qadının əri olduğunu bilməsə, amma izdivacdan sonra onunla yaxınlıq .etmiş olsa, eyni hökmü daşıyır

Məsələ ۲۳۶۹: Əri olan qadın əgər zina etsə, zina edən kişiyə ehtiyat-vacibə görə əbədi haram olur. Amma öz ərinə haram olmur, belə ki, tövbə etməsə və öz əməlində qalsa, .daha yaxşısı odur ki, əri ona təlaq versin. Amma gərək mehrini də versin

Məsələ ۲۳۷۰: Təlaq verilmiş və siğə olunmuş bir qadın ki, əri onun siğə müddətini bağışlayıb, ya müddəti tamam olub, belə ki, bir müddətdən sonra ərə getsə və sonra şəkk etsə ki, ikinci ərini əqd zamanı birinci ərinin iddəsi tamam olub ya yox, öz şəkkinə .etina etməsin

Məsələ ۲۳۷۱: Ləvat verən oğlanın qızı, bacısı və anası, ləvat edənə baliğ olduğu surətdə, haramdır, hərçənd xütnəgahdan az daxil olmuşsa da. Həmçinin ləvat verən kişi olsa və ya ləvat edən baliğ olmasa da ehtiyat-lazıma əsasən, hökm eynidir. Amma daxil olduğunu guman edərsə və ya daxil olub-olmadığında şəkk edərsə, ona haram .olmurlar. Həmçinin livat edənin anası, bacısı, qızı ləvat verənə haram deyil

Məsələ ۲۳۷۲: Əgər şəxs bir qadınla izdivac edərsə və izdivacdan sonra onun atası, .qardaşı, ya oğlu ilə ləvat etsə, ehtiyat-vacibə əsasən, o qadın o kişiyə haram olur

Məsələ ۲۳۷۳: Əgər bir kəs, həcc əməllərindən biri olan ehram halında, bir qadınla izdivac etsə, hərçənd o qadın ehramda olmasa belə onun əqdi batildir, əgər bilsə ki, .arvad almaq ona haramdır, daha əbədi olaraq o qadını əqd edə bilməz

Məsələ ۲۳۷۴: Əgər ehram halında olan qadın, hərçənd ehram halında olmayan bir kişi ilə izdivac etsə, onun əqdi batildir. Əgər qadın bilsə ki, ehram halında izdivac etmək .haramdır, ehtiyat-vacib budur ki, sonra o kişi ilə heç vaxt izdivac etməsin

Məsələ ٢۴٧۵: Əgər kişi, ya arvad həcc və müfrədə ümrə əməllərindən biri olan Nisa təvafını yerinə yetirməsələr, Nisa

təvafını yerinə yetirməyənə qədər cinsi ləzzətlər onlara halal olmaz. Amma əgər izdivac etsə, həlq və ya təqsir ilə ehramdan çıxmış olsa, nisa təvafını yerinə yetirməsə .belə izdivacı səhihdir

Məsələ ۲۳۷۶: Əgər bir kəs baliğ olmayan qızı özü üçün əqd edərsə, qızın ۹ yaşı tamam olmamışdan qabaq onunla yaxınlıq etməsi haramdır. Amma əgər yaxınlıq etsə, onu ifza (ifzanın mənası ۲۳۴۷-cı məsələdə deyildi) etmiş olsa belə, qız baliğ olandan sonra onunla yaxınlıq etməsi haram deyil. Amma əgər ifza edibsə, gərək onun diyəsini bir insan öldürməyin qan pulunu versin, həmişəlik olaraq onun yaşayış xərclərini versin, hətta təlaqdan sonra. Üstəlik ehtiyat-vacibə görə, əgər o qız təlaqdan sonra başqası .ilə izdivac etsə də xərclərini verməlidir

Məsələ ۲۳۷۷: Arada iki dəfə rücu və ya əqd olmaqla üç dəfə təlaq verilən qadın ərinə haram olur. Amma əgər təlaq hökmlərində deyiləcək şərtlər ilə, başqa kişi ilə izdivac etsə və ikinci əri təlaq versə, ya ölsə, onun iddəsinin zamanı keçəndən sonra birinci ər .onu yenidən əqd edə bilər

## DAİMİ ƏQDİN HÖKMLƏRİ

Məsələ ۲۳۷۸: Daimi əqd olunan qadın, hərçənd ki, ərinin haqqı ilə ziddiyyəti olmasa belə, ərinin icazəsi olmadan evdən bayıra çıxması haramdır. Amma əgər zərurət bunu tələb etsə, ya onun evdə qalması ona çox çətin olsa, yaxud məskən ona münasib olmasa, icazəsiz çıxa bilər. Ərinin istədiyi hər vaxt cinsi ləzzətlər üçün özünü ona təslim etməsi və şəri bir üzr olmasa, ərinin onunla cima etməsinin qarşısını almamalıdır. Qadına yemək, libas, mənzil və başqa ehtiyaclarını təmin etmək ərinə vacibdir. Əgər təmin etməsə, istər imkanı olsun, istər olmasın, qadına borcludur. Həmçinin qadının hüququndan biri budur ki, əri ona əzab-əziyyət verməsin, şəri əsas olmadan onunla .kobud və tünd rəftar etməsin

Məsələ ۲۳۷۹: Əgər qadın ərinə qarşı evlilik vəzifələrinə heç əməl etmirsə, onun yanında qalsa belə, ərinin üzərində yemək, libas və mənzil haqqı yoxdur. Əgər bəzi vaxtlar onun şəri cinsi

istəkləri ilə əlaqədar öz vəzifəsinə əməl etməkdən imtina etsə, ehtiyat-vacibə görə nəfəqəsi saqit olmur. Amma qadın cinsi əlaqəyə icazə verməzsə, mehriyəsi saqit .olmur

.Məsələ ۲۳۸۰: Kişinin öz arvadını evdə xidmətçilik etməyə məcbur etmək haqqı yoxdur

Məsələ ۲۳۸۱: Qadının səfərinin xərci evdəki xərcindən çox olsa, belə ki, ərinin icazəsi ilə səfərə getsə, ərinin öhdəsindədir. Amma maşın və ya təyyarə pulu və səfərlə bağlı digər xərclər qadının öz öhdəsindədir. Amma əgər ərinin meyli olsa ki, arvadını səfərə aparsın, gərək onun səfərinin xərclərini versin. Həmçinin, əgər zəruri səfər müalicə .kimi məişət işləri baxımından olsa, hökm eynidir

Məsələ ۲۳۸۲: Xərci ərinin öhdəsində olan qadın öz xərcini, ər onun xərcini vermədiyi halda, icazəsiz onun malından götürə bilər. Əgər bu mümkün olmazsa və ərini onun xərclərini verməyə məcbur etmək üçün şəriət hakiminə də şikayət edə bilməyib öz dolanışığını təmin etmək üçün işləmək məcburiyyətində qalarsa, xərcini təmin etmək .üçün işlədiyi zaman ərinə itaət etmək ona vacib deyildir

Məsələ ۲۳۸۳: Əgər kişinin iki daimi arvadı olsa, birinin yanında bir gecə qalsa, vacibdir o birinin yanında da dörd gecə içərisində bir gecə qalsın. Bundan başqa surətdə qadının yanında qalmaq vacib deyil. Amma onu tamamilə tərk etməməsi lazımdır. Daha yaxşı .və ehtiyat budur ki, kişi hər dörd gecənin bir gecəsini daimi arvadının yanında qalsın

Məsələ ۲۳۸۴: Ər dörd aydan çox öz cavan arvadını tərk edə bilməz. Amma əgər yaxınlıq etməyin ona zərəri və ya çox çətinliyi olarsa, ya qadın özü onun tərk olunmasına razı olsa və ya izdivac əqdi vaxtı onu tərk etməsini qadına şərt qoysa, tərk edə bilər. Ehtiyat-vacibə əsasən, bu hökmdə kişinin vətəndə və ya səfərdə olmağının bir fərqi yoxdur. Deməli, ehtiyat-vacib görə, zəruri olmayan səfəri üzrlü səbəb olmadan və .arvadının razılığı olmadan dörd aydan artıq davam etdirməsi icazəli deyil

Məsələ ۲۳۸۵: Əgər daimi əqddə mehri təyin etməsələr, əqd səhihdir. Belə ki, kişi qadın ilə yaxınlıq etsə, gərək onun mehrini onun kimi olan qadınların mehri kimi versin.

.mehri təyin etməsələr, bu iş bilməməzlik, qəflət, ya unudaraq olsa belə əqd batil olur

Məsələ ۲۳۸۶: Əgər daimi əqd oxuyan vaxt mehri vermək üçün müddət təyin etməsələr, istər ərinin mehri verməyə qüdrəti olsun, istərsə də olmasın, qadın mehr almamışdan ərinin yaxınlıq etməsinin qarşısını ala bilər. Amma əgər mehr almamışdan qabaq yaxınlıq etməyə razı olsa və əri onunla yaxınlıq etsə, ondan sonra şəri üzrü olmadan .ərinin yaxınlıq etməsinin qarşısını ala bilməz

## (MÜTƏ(MÜVƏQQƏTİ İZDİVAC

Məsələ ۲۳۸۷: Qadına ləzzət aparmaq üçün olsa da, olmasa da siğə etmək səhihdir. .Amma qadının, kişinin ondan heç bir cinsi ləzzət almamasını şərt edə bilməz

Məsələ ۲۳۸۸: Ehtiyat-vacib budur ki, ər dörd aydan çox öz cavan olan siğə arvadı ilə .yaxınlıq etməyi tərk etməsin

Məsələ ۲۳۸۹: Siğə olan qadın əgər əqddə şərt etsə ki, əri onunla yaxınlıq etməsin, onun əqdi və şərti səhihdir və ər ondan ancaq başqa ləzzətləri apara bilər. Amma əgər sonradan yaxınlığa razı olsa, əri onunla yaxınlıq edə bilər. Daimi əqddə də hökm .eynidir

Məsələ ۲۳۹۰: Siyğə olunan qadın hətta hamilə olsa da, xərcliyini ərindən almaq haqqı .yoxdur

Məsələ ۲۳۹۱: Siğə olunmuş qadının (kişi ilə) birlikdə yatmaq (onun evində sakin olmaq) haqqı yoxdur və ərindən irs aparmır, əri də ondan irs aparmaz. Əgər bir tərəfdən və ya hər iki tərəfdən irs aparmaq şərt edilərsə, bu şərtin səhih olması işkallıdır. Amma .ehtiyata riayət etmək tərk olunmamalıdır

Məsələ ۲۳۹۲: Siyğə olunan qadın, xərclik və bir yerdə yatmaq haqqı olmadığını bilməsə, .əqdi səhihdir. Bu işi bilmədiyi üçün ərinin boynuna bir haqq gəlmir

Məsələ ۲۳۹۳: Siğə olunmuş qadın ərinin icazəsi olmadan evdən çıxa bilər, amma evdən çıxmaqla ərinin haqqı aradan

getsə, onun evdən çıxmağı haramdır. Ehtiyat-müstəhəbə görə, ərinin haqqı aradan .getməzsə də, onun icazəsi olmadan evdən çıxmasın

Məsələ ۲۳۹۴: Əgər bir qadın bir kişini vəkil etsə ki, onun müəyyən müddət və məbləğə özü üçün siğə etsin, belə ki, kişi onu öz daimi əqdinə gətirsə, ya müəyyən olunmuş müddət və ya məbləğə deyil, başqa bir müddət və məbləğə siğə etsə, qadın başa .düşən zaman əgər icazə versə, o əqd səhihdir, əgər icazə verməsə batildir

Məsələ ۲۳۹۵: Məhrəm olmaq üçün ata, ya ata tərəfindən olan baba öz nabaliğ qızını və ya oğlunu qısa müddət üçün bir kəsə əqd etsə, ondan bir zərər olmadığı təqdirdə əqd səhihdir. Amma əgər izdivac müddətində oğlan tamamilə ləzzət alma, qız da tamamilə .ləzzət alma qabiliyyətinə malik olmazlarsa, əqdin səhih olması işkallıdır

Məsələ ۲۳۹۶: Əgər ata, ya ata tərəfindən olan baba başqa yerdə olan öz qız uşaqlarını ölü və diri olduğunu bilmədikləri halda, məhrəm olmaq üçün bir kəsə əqd etsələr, zövciyyət müddəti əqd olunmuş qızla istimta (ləzzət alma) qabiliyyətinə malik olsa, zahirən onun məhrəm olması hasil olar. Belə ki, sonradan məlum olsa ki, əqd zamanı o qız diri olmayıb, əqd batildir və o kəs ki, əqd vasitəsilə zahirən məhrəm olmuş idilər, .naməhrəmdirlər

Məsələ ۲۳۹۷: Əgər kişi qadının siğəsinin müddətini bağışlasa, belə ki, onunla yaxınlıq edibsə, gərək onunla qərar qoyduqları mehrin hamısını, yaxınlıq etməyibsə, mehrinin .yarısını vermək vacibdir

Məsələ ۲۳۹۸: Kişi onun siğəsində olmuş və iddəsi hələ qurtarmamış qadını öz daimi əqdi edə bilər ya təzədən siğə edə bilər. Amma əgər müvəqqəti izdivacın müddəti qurtarmamış daim əqdinə keçirsə, əqd batildir. Amma əgər qalan müddəti ona .bağışlayandan sonra daimi əqdinə keçirsə, batil olmaz

## BAXMAĞIN HÖKMLƏRİ

Məsələ ۲۳۹۹: Kişinin naməhrəm qadının bədəninə və həmçinin onların saçlarına baxmağı istər ləzzət qəsdi ilə olsun, istərsə də ləzzət qəsdi olmasın, istər harama düşmə qorxusu olsun, istərsə də olmasın, haramdır. Onların üzünə və biləklərinə qədər əllərinə baxmaq isə ləzzət almaq qəsdi ilə olsa və ya harama düşmək qorxusu olsa, haramdır. Ehtiyat-müstəhəb budur ki, ləzzət almaq qəsdi və harama düşmək qorxusu olmasa da onlara baxmasın. Həmçinin, qadının naməhrəm kişinin bədəninə baxması ləzzət qəsdi ilə və harama düşmək qorxusu olsa haramdır. Hətta ehtiyat-vacibə görə bunlar olmasa da baxmasın. Amma qadının, kişinin bədəni, baş, qollar və ayaqlar kimi adətən kişilərin örtmədikləri yerlərinə baxmağın, ləzzət qəsdi və harama .düşmək qorxusu olmazsa, eybi yoxdur

Məsələ ۲۴۰۰: Bir şəxsin islami hicabla örtünməyi əmr etdiyi halda, əmrə etina etməyən, qorxusuz halda açıq-saçıq gəzən qadınların bədəninə baxmağın, ləzzət qəsdi və harama düşmək qorxusu olmamaq şərti ilə, eybi yoxdur. Bu hökmdə kafirlərin qadınlarıyla digər qadınlar arasında, habelə, əl və üzlə, adətən bədənin örtmədikləri .digər yerləri arasında bir fərq yoxdur

Məsələ ۲۴۰۱: Qadın gərək saçını və bədənini (üz və əllərindən başqa) naməhrəm kişidən örtsün və ehtiya-lazım budur ki, həddi-büluğa çatmamış, amma yaxşı-pisi başa düşən oğlan uşağından da, qadının bədəninə baxması onun şəhvətini hərəkətə gətirmək ehtimalı varsa, saç və bədənini örtməlidir. Amma qadın üz və biləklərinə qədər əllərini naməhrəm kişidən örtməyə bilər. Fəqət əgər harama düşmək qorxusu olsa və ya kişini haram bir baxışa mübtəla etmək niyyəti olsa, bu iki halda onları da .örtmək vacibdir

Məsələ ۲۴۰۲: Həddi-büluğa çatmış müsəlmanın övrətinə baxmaq, şüşə arxasından, ya saf sudan, ya güzgüdən və ya bunun kimi şeydən olsa belə, haramdır. Ehtiyat-lazıma əsasən, kafirin və yaxşı və pisi başa düşən nabaliğ uşağın övrətinə

baxmaq da eyni hökmdədir. Amma ər-arvad bir-birinin bütün bədənlərinə baxa .bilərlər

Məsələ ۲۴۰۳: Bir-birlərinə məhrəm olan kişi və qadın əgər ləzzət qəsdi olmasa və harama düşmək qorxusu olmasa, övrətindən başqa, bir-birinin bütün bədənlərinə .baxa bilərlər

Məsələ ۲۴۰۴: Kişi gərək ləzzət qəsdi ilə başqa kişinin bədəninə baxmasın. Qadının da başqa qadının bədəninə ləzzət qəsdi ilə baxması haramdır. Hər iki halda da əgər .harama düşmək qorxusu olsa, hökm eynidir

Məsələ ۲۴۰۵: Əgər bir kişi naməhrəm bir qadını tanıyırsa, açıq-saçıq qadınlardan olmadığı təqdirdə, ehtiyat-vacibə əsasən onun şəklinə baxmamalıdır. Üz və əllərindən başqa, belə ki, ləzzət qəsdi olmazsa və harama düşmək qorxusu da olmasa, bu iki .yerə baxmaq caizdir

Məsələ ۲۴۰۶: Əgər qadının başqa qadını və ərindən başqa kişini imalə etməsi və ya onun övrətini suya çəkməsi lazım gəlsə, gərək əlinə bir şey alsın, əli onun övrətinə dəyməsin. Həmçinin, əgər kişinin başqa kişini, ya arvadından başqa bir qadını imalə .etməsi və ya onun övrətini suya çəkməsi lazım gəlsə, bu halda da hökm eynidir

Məsələ ۲۴۰۷: Əgər qadın bir xəstəlikdən müalicə olunmağa naçar olarsa və naməhrəm kişi onu müalicə etmək üçün daha yaxşı olarsa, naməhrəm kişiyə müraciət edə bilər. Belə ki, o kişi müalicə etmək üçün ona baxmağa və onun bədəninə əl vurmağa məcbur olsa, eybi yoxdur. Amma əgər baxmaqla müalicə edə bilərsə, gərək əlini onun .bədəninə vurmasın. Əgər əl vurmaqla müalicə edə bilərsə, gərək ona baxmasın

Məsələ ۲۴۰۸: Əgər insan bir kəsi müalicə etmək üçün onun övrətinə baxmağa naçar olsa, ehtiyat-vacibə görə gərək aynanı qarşıya qoysun və aynadan baxsın. Amma əgər övrətə baxmaqdan başqa çarə olmazsa, eybi yoxdur. Həmçinin, əgər övrətə .baxmaq müddəti aynadan baxmaq müddətindən daha az olsa, hökm eynidir

## EVLƏNMƏNİN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

.Məsələ ۲۴۰۹: Zövcəsi olmaması səbəbi ilə harama düşən şəxsin evlənməsi vacibdir

Məsələ ۲۴۱۰: Əgər ər əqddə şərt etsə ki, qadın bakirə olsun və əqddən sonra bakirə olmadığı məlum olsa, əqdi poza bilər. Amma əgər əqdi pozmazsa, ya əvvəldən şərt etməmiş olsa, amma bakirə olmasına inandığı əsasda izdivac etmiş olsa, bakirə ilə qeyri-bakirənin mehrinin fərqini nəzərə alaraq qərar qoyduqları mehrdən azalda bilər. Əgər vermiş olsa, geri ala bilər, məsələn, əgər onun mehri ۱۰۰ manat olsa, onun kimi olan qadının bakirə olduğu təqdirdə mehri ۸۰ manat, bakirə olmadıqda isə ۶۰ manat .olarsa, ۱۰۰ manatdan dörddə bir nisbət fərqi olan miqdarı ۱۰۰-dən çıxıb azalda bilər

Məsələ ۲۴۱۱: Naməhrəm kişi və qadının heç bir kəsin olmadığı xəlvət bir yerdə tək qalmaları fəsada düşmək ehtimalı olduğu təqdirdə, başqa bir şəxsin oraya kirmək .imkanı olsa belə, haramdır. Amma əgər fəsada düşmək ehtimalı olmasa, eybi yoxdur

Məsələ ۲۴۱۲: Əgər kişi qadının mehrini əqddə müəyyən etsə və verməmək qəsdi .olarsa, əqd səhihdir, amma gərək mehri versin

Məsələ ۲۴۱۳: İslam dinindən çıxıb kafirliyi seçən bir müsəlmana mürtəd deyilir. Mürtəd iki qismdir: Fitri mürtəd və milli mürtəd. Fitri mürtəd o kafirdir ki, o, dünyaya gələn vaxt onun ata-anası və ya onlardan biri müsəlman olub, özü də yaxşı və pisi başa düşdüyü .vaxtda müsəlman olub, sonradan kafir olub. Milli mürtəd isə onun müqabilidir

Məsələ ۲۴۱۴: Əgər bir qadın izdivacdan sonra mürtəd olsa, istər milli, istərsə fitri onun əqdi batil olur. Belə ki, əri onunla yaxınlıq etməyibsə, iddəsi yoxdur. Həmçinin, əgər yaxınlıq edəndən sonra mürtəd olsa, qadın yaisə və ya səğirə olursa, hökm eynidir. Amma əgər qadın heyz görən qadınların yaşında olsa, gərək təlaq hökmlərində deyiləcək qayda ilə iddə saxlasın. Əgər iddə əsnasında müsəlman olsa, onun əqdi öz .halında qalır

Hərçənd yaxşısı budur ki, birlikdə yaşamaq istəsələr, yenidən əqd oxusunlar. Əgər ayrılmaq istəsələr, təlaq verilsin. Yaisə o qadındır ki, əlli yaşına çatmış və yaşının çox .olması ilə əlaqədar heyz qanı görmür və artıq heyz görəcəyinə ümidi yoxdur

Məsələ ۲۴۱۵: Əgər kişi əqddən sonra fitri mürtəd olarsa, arvadı ona haram olar və əgər yaxınlıq etmişsə və arvadı da yaisə və səğirə də deyilsə, gərək qadın təlağın hökmlərində deyiləcək olan vəfat iddəsi miqdarında iddə saxlasın. Ehtiyat-vacibə görə yaxınlıq etməyibsə və qadın səğirə və yaisə də olsa, yenə də vəfat iddəsi saxlasın. Əgər iddə əsnasında kişi tövbə etsə, ehtiyat-vacibə görə əgər birgə yaşamaq .istəsələr, yenidən əqd oxusunlar. Əgər ayrılmaq istəsələr, təlaq verilsin

Məsələ ۲۴۱۶: Əgər kişi əqddən sonra milli mürtəd olsa, belə ki, arvadı ilə yaxınlıq etməyibsə və arvadı yaisə olsa və ya səğirə olsa, onun əqdi batil olar iddəsi də yoxdur. Əgər yaxınlıq edəndən sonra mürtəd olsa və onun arvadı heyz görən qadınlar yaşında olsa, gərək o qadın təlaq hökmlərində deyildiyi kimi, təlaq iddəsi qədərində iddə saxlasın. Əgər iddə tamam olandan qabaq onun əri müsəlman olsa, onun əqdi öz .halında qalar

Məsələ ۲۴۱۷: Əgər qadın əqddə kişi ilə şərt etsə ki, onu şəhərdən çıxarmasın və kişi .qəbul etsə, o gərək qadının razılığı olmadan qadını şəhərdən çıxarmasın

Məsələ ۲۴۱۸: Əgər bir qadının keçmiş ərindən bir qızı olsa, sonrakı ər o qızı bu qadından olmayan oğlu üçün əqd edə bilər. Həmçinin, əgər bir qızı öz oğlu üçün əqd etsə, o qızın .anası ilə izdivac edə bilər

Məsələ ۲۴۱۹: Əgər bir qadın hətta zinadan belə hamilə olsa, onun üçün uşağı saldırmaq icazəli deyildir. Amma əgər uşağın onun bətnində qalması dözüləsi olmayan zərəri olsa, ya çox ağır çətinliyi olsa, bu halda ruh daxil olmamış siqt etdirmək (saldırmaq) caizdir, amma eyni zamanda diyəsi var. Amma uşağa ruh daxil olduqdan sonra heç bir .vəch ilə saldırması icazəli deyil

Məsələ ۲۴۲۰: Bir kəs əri olmayan və başqasının iddəsində olmayan qadınla zina etsə,

.uşağı olsa, o surətdə ki, bilməsələr halal nütfədəndir, ya haram, o uşaq halalzadədir

Məsələ ۲۴۲۱: Əgər kişi qadının iddədə olmasını bilməsə və onunla izdivac etsə, belə ki, qadın da bilməsə və onlardan uşaq olsa, halalzadədir, şərən də hər ikisinin uşağıdır. Amma əgər qadın iddədə olduğunu və iddədə izdivacın caiz olmadığını bilirdisə, şərən uşaq atanın övladıdır, hər iki halda onların əqdi batildir və əvvəldə deyildiyi kimi, bir-birlərinə əbədi olaraq haram olurlar.

Məsələ ۲۴۲۲: Əgər qadın desə ki, «yaisəyəm», gərək onun sözü qəbul olunmasın. Amma desə ki, ərim yoxdur, onun sözü qəbul olunar. Yalnız müttəhim olunarsa, bu halda ehtiyat-vacib budur ki, onun haqqında araşdırılma aparılsın.

Məsələ ۲۴۲۳: İnsan əri olmadığını deyən qadın ilə izdivac etsə və sonradan bir şəxs, o qadının onun arvadı olduğunu iddia edərsə, belə ki, şərən o şəxsin sözlərinin doğru olduğu isbat olunmazsa, gərək onun sözü qəbul olunmasın.

Məsələ ۲۴۲۴: Qız və oğlan uşağı iki yaşını tamamlayana qədər ata onu anasından ayıra bilməz, çünki uşağı saxlamaq ata ilə ananın müştərək haqqıdır. Uşağı yeddi yaşına qədər anasından ayırmamaq ehtiyata daha uyğun və daha üstündür.

Məsələ ۲۴۲۵: Əgər qızın elçiliyinə gələn şəxsin dinə bağlılığı və əxlaqı yaxşı olarsa, onun rədd olunmaması daha yaxşıdır. Həzrəti Rəsulullahdan (səlləllahu ələyhi və alihi və səlləm) rəvayət olunmuşdur ki: «Elçiliyə gələn şəxsin əxlaqı və dinə bağlılığından razı olsanız, qızınızı ona ərə verin. Əgər belə etməsəniz, yer üzərində böyük fitnə və fəsad doğar».

Məsələ ۲۴۲۶: Əgər qadın öz mehriyyəsini başqa arvad almasın deyə, ərinə bağışlasa, vacibdir ki, ər başqa arvad almasın və qadının da mehriyyəni almaq haqqı yoxdur.

Məsələ ۲۴۲۷: Zinadan dünyaya gələn bir şəxs arvad alsa və ondan uşağı olsa, uşaq halalzadədir.

Məsələ ۲۴۲۸: Əgər kişi, mübarək Ramazan ayının orucunda, yaxud qadın heyz olan

vaxt onunla yaxınlıq etsə, günah etmişdir. Amma ondan uşaq dünyaya gəlsə, .halalzadədir

Məsələ ۲۴۲۹: Ərinin səfərdə ölməyinə yəqini olan qadın vəfat iddəsindən sonra (onun müddəti təlaq hökmlərində deyiləcək) ərə getsə və birinci əri səfərdən qayıtsa, gərək ikinci ərindən ayrılsın və birinci ərinə halaldır. Amma əgər ikinci əri onunla yaxınlıq edibsə, gərək qadın vətyi-şübhə iddəsi saxlasın (elə təlaq iddəsi qədərincədir) İddə saxladığı dövrdə də birinci əri onunla yaxınlıq etməməlidir, amma sair ləzzətlər alması caizdir, xərcləri də birinci ərinin öhdəsinədir. İkinci ər gərək onun mehrini onun .mislində olan qadınlar kimi versin

## SÜD VERMƏNİN HÖKMLƏRİ

**Point**

Məsələ ۲۴۳۰: Əgər bir qadın bir uşağa ۲۴۴۰-cı məsələdə deyiləcək şərtlərlə süd versə, o uşaq oğlan olsa bu qadınlara və əgər qız olsa bu kişilərə məhrəm olur:

۱. O qadının özünə, ona süd anası deyilir;

۲. O qadının ərinə ki, süd ona məxsusdur və ona da süd atası deyilir;

۳. O qadının atası və anasına hər nə qədər yuxarı getsələr də; (hətta onun süd anası və süd atası da olsa.)

۴. O qadından dünyaya gəlmiş, yaxud dünyaya gələcək uşaqlara;

۵. O qadının övladlarının uşaqları; nə qədər aşağı getsə də; istər onun övladından dünyaya gəlsin, istərsə də onun övladı o uşaqlara süd vermiş olsun;

۶. O qadının bacı və qardaşına; hətta süd bacısı və qardaşı da olsa; (Yəni, süd əmizdirilməsi səbəbilə o qadınla bacı-qardaş olmuşlar).

۷. O qadının əmisi və bibisinə; hətta süd əmisi və ya süd bibisi də olsa;

۸. O qadının xalası və dayısına; hətta süd dayısı və süd xalası da olsa;

۹. O qadının ərinin övladlarına, (süd o ərin malıdır), nə qədər aşağı getsə, hətta onun süd övladları da olsa;

۱۰. O kişinin ata-anası və nə qədər yuxarı getsə.

۱۱. Süd ilə əlaqədar olan ərin bacı-qardaşı, süd bacı-qardaşı olsa da.

۱۲. Süd ilə əlaqədar olan ərin əmisi, bibisi, xalası, dayısı və nə qədər yuxarı getsə də. Süd əmməklə olsalar belə. Süd

.verməklə məhrəm olan başqa kəslər sonrakı məsələlərdə deyiləcək

Məsələ ۲۴۳۱: Əgər bir qadın bir uşağa ۲۴۴۰-ci məsələdə deyilən) şərtlərlə süd versə, o uşağın atası, o qadından dünyaya gələn qızlar ilə evlənə bilməz. Belə ki, onlardan biri hal-hazırda onun arvadı olsa, onun əqdi batil olur. Amma o qadının süd qızları ilə evlənməyi caizdir. Hərçənd, ehtiyat-müstəhəb budur ki, onlarla da evlənməsin. Həmçinin ehtiyat-vacibə görə süd onun malı olduğu ərin qızlarını və hətta süd qızları olsalar belə, özü üçün əqd edə bilməz və əgər onlardan biri arvadı olsa, onun əqdi .ehtiyat-vacibə görə batil olar

Məsələ ۲۴۳۲: Əgər bir qadın bir uşağa ۲۴۴۰-ci məsələdəki şərtlər ilə süd versə, o qadının əri ki, süd ona məxsusdur, o uşağın bacılarına məhrəm olmaz. Həmçinin, ərin .qohumları, o uşağın bacı və qardaşlarına məhrəm olmazlar

Məsələ ۲۴۳۳: Əgər bir qadın bir uşağa süd versə, o uşağın qardaşlarına məhrəm olmaz. .Həmçinin o qadının qohumları süd yemiş uşağın bacı-qardaşlarına məhrəm olmaz

Məsələ ۲۴۳۴: Əgər insan bir qıza kamil süd vermiş qadın ilə izdivac etsə və onunla .yaxınlıq etsə, sonradan o qızı özü üçün əqd edə bilməz

Məsələ ۲۴۳۵: Əgər insan bir qız ilə izdivac etsə, sonradan o qıza kamilən süd vermiş .qadın ilə izdivac edə bilməz

Məsələ ۲۴۳۶: İnsan anasının, ya nənəsinin kamil süd verdikləri qız ilə izdivac edə bilməz. Həmçinin, əgər insanın atasının arvadı, atasına məxsus olan süd ilə bir qıza süd versə, insan o qız ilə izdivac edə bilməz. Belə ki, süd əmən qızı özü üçün əqd etsə, sonra .anası, nənəsi və ya atasının arvadı o qıza süd versə, əqd batil olar

Məsələ ۲۴۳۷: İnsan, bacısının və ya qardaşı arvadının qardaşına məxsus olan südündən kamil süd verdiyi bir qız ilə izdivac edə bilməz. Həmçinin, insan, bacısı uşağı və ya qardaşı uşağının və ya bacısı, ya qardaşı nəvəsinin süd verdiyi qız ilə izdivac edə .bilməz

Məsələ ۲۴۳۸: Əgər bir qadın öz qızının uşağına kamil süd versə, o qız öz ərinə haram olur. Həmçinin, qızın ərinin başqa

qadından olan uşağına süd versə eyni qayda ilə. Amma bir qadın öz oğlunun uşağına .süd versə, oğlunun arvadı ki, süd verən uşağın anasıdır, öz ərinə haram olmaz

Məsələ ۲۴۳۹: Əgər bir qızın atasının arvadı, o qızın ərinin uşağına atasına məxsus olan süddən versə, ۲۴۳۲-ci məsələdə deyilən ehtiyata görə o qız öz ərinə haram olar, istər .uşaq o qızdan olsun, istərsə başqa qadından

## MƏHRƏMLİYƏ SƏBƏB OLAN SÜDVERMƏNİNŞƏRTLƏRİ

:Məsələ ۲۴۴۰: Məhrəm olmağa səbəb olan süd vermənin ۸ şərti var

Uşaq diri qadının südünü əmsin. Deməli, əgər süd vermədə şərt olan südün bir .۱ .(qismini ölmüş qadının döşündən əmsə, faydası yoxdur (məhrəmliyə səbəb olmur

O qadının südü şəri doğumdan olsun, hərçənd vətyi-şübhədən olsa belə; deməli, .۲ əgər doğumdan olmayan südü, yaxud zinadan dünyaya gəlmiş uşağın südünü başqa .uşağa versələr, o süd ilə uşaq heç kəsə məhrəm olmaz

Uşaq südü döşdən əmsin, deməli, əgər südü onun boğazına töksələr, təsiri yoxdur .۳ .(.(məhrəmliyə səbəb olmur

.Süd xalis olsun və başqa şeylə qarışmasın .۴

Məhrəmliyə səbəb olan süd bir ərdən olsun; deməli, süd verən qadına təlaq verilsə, .۵ sonra başqasına ərə getsə və ondan hamilə olsa, doğana qədər birinci ərdən südü qalsa, məsələn, ۸ dəfə doğmamışdan qabaq birinci ərin südündən, yeddi dəfə isə .doğandan sonra ikinci ərin südündən bir uşağa versə, o uşaq bir kəsə məhrəm olmaz

.(Uşaq südü qusmamalıdır, əgər qussa təsiri yoxdur (məhrəmliyə səbəb olmur .۶

Uşağa süd vermək o miqdarda olsun ki, sümükləri o süddən bərkisin və bədəninə ət .۷ gəlsin. Əgər məlum olmasa ki, bu həddə yetişib ya yox, belə ki, bir gecə-gündüz, ya on beş dəfə

sonrakı məsələdə deyiləcək şəkildə doyunca süd əmsə, yenə də kifayətdir, amma əgər uşağın bir gecə-gündüz ya ona on beş dəfə süd əmməsinə baxmayaraq bu südün uşağın sümüklərinin bərkiməsində və bədəninə ət gəlməsinə təsir olmadığı məlum olsa, belə hallarda ehtiyat-vacibə əməl etmək tərk olunmamalıdır. Deməli qeyd .olunan hallarda gərək (onlarla) izdivac etməsin və məhrəmcəsinə nəzər salmasın

Uşağın iki yaşı tamam olmasın. Əgər iki yaşı tamam olandan sonra ona süd versələr, .۸ bir kəsə məhrəm olmaz, hətta əgər iki yaşı tamam olmamışdan qabaq səkkiz dəfə və ondan sonra yeddi dəfə süd əmsə, bir kəsə məhrəm olmaz. Amma əgər, süd verən qadının, doğmasından iki ildən çox il keçsə və onun südü qalsa və bir uşağa süd versə, .o uşaq deyilən kəslərə məhrəm olar

Məsələ ۲۴۴۱: Keçən məsələdən məlum oldu ki, südün məhrəmliyə səbəb olmasının üç :meyarı var

Südü elə bir həddə əmsin ki, camaat arasında ət əmələ gəlməsinə, sümüyün - ۱ bərkiməsinə səbəb sayılsın. Onun da şərti budur ki, yalnız südün (bu işdə) rolu olsun, onunla yanaşı yemək yeməsin. Amma bir az yemək yesə və deməsələr ki, təsiri olub, eybi yoxdur. Əgər iki qadından süd əmsə, belə ki, ət-sümüyün əmələ gəlməsinin bir qismi bir qadına, digər qismi isə ikinci qadına istinad edilərsə, onların hər ikisi süd anası .sayılacaq. Əgər ikisinə birlikdə istinad verilsə, haramlığa (məhrəmliyə) səbəb olmaz

Zaman hesabı ilə; onun da şərti budur ki, bir gecə-gündüz əsnasında yemək - ۲ yeməsin, yaxud başqa bir kəsin südünü əmməsin. Amma əgər su içsə, ya dərman qəbul etsə, ya çox az yemək yesə, belə ki, «arada yemək yeməyib» deyilsə, eybi yoxdur. Gecə-gündüz boyunca ardıcıl olaraq ehtiyac duyduğu, ya meyl etdiyi zaman süd yesin və bunun qarşısı alınmamış olsun. Hətta ehtiyat-vacibə görə, gecə-gündüzün əvvəlini o vaxtdan hesablamalıdırlar ki, uşaq acmış olsun, axırı isə onun .doyduğu vaxtdır

Sayın hesablanması, yəni on beş dəfəni bir qadının südündən əmsin və on beş - ۳ dəfənin əsnasında başqa kəsin

südündən əmməsin. Amma onların arasında yemək yeməsinin zərəri yoxdur, on beş dəfənin arasındakı zaman fasiləsinin də eybi yoxdur, hər dəfə də kamil süd əmməlidir. Yəni, ac olsun və tam doyuncaya qədər süd əmsin. Amma əgər süd əmən zaman nəfəs çəksə, ya bir az gözləsə, belə ki, birinci zamandan ki, döşü ağzına alıb əmsin, .doyana qədər bir dəfə hesab olsa, eybi yoxdur

Məsələ ۲۴۴۲: Əgər qadın öz ərinin südündən başqa uşağa süd versə və sonra başqa ərə getsə və ikinci ərinin südündən bir uşağa süd versə, o iki uşaq bir-birinə məhrəm .olmaz

Məsələ ۲۴۴۳: Əgər bir qadın bir ərin südündən bir neçə uşağa süd versə, onların hamısı .bir-birinə, ərə və süd verən qadına məhrəm olarlar

Məsələ ۲۴۴۴: Əgər bir kəsin bir neçə arvadı olsa və onların hər biri dediyimiz şərtlər ilə .süd versə, o uşaqların hamısı bir-birinə, ərə və o qadınların hamısına məhrəm olurlar

Məsələ ۲۴۴۵: Əgər bir kəsin iki süd verən arvadı olarsa və onların biri, məsələn; uşağa .səkkiz dəfə və o biri yeddi dəfə süd versə, o uşaq bir kəsə məhrəm olmaz

Məsələ ۲۴۴۶: Əgər bir qadın bir ərinin südündən bir oğlan və bir qıza kamilən süd versə, .o qızın qardaş və bacısı, o oğlanın qardaş və bacısına məhrəm olmazlar

Məsələ ۲۴۴۷: İnsan öz arvadının izni olmadan süd əmməklə o arvadın bacısı qızı, ya qardaşı qızı olan qadınlar ilə izdivac edə bilməz. Həmçinin, əgər nabaliğ bir oğlan ilə ləvat etsə, o oğlanın qızı, bacısı, anası və nənəsi ki, rizaidirlər, yəni süd əmməklə onun qızı, bacısı və anası olub, onu özü üçün əqd edə bilməz. Bu hökm, ehtiyat-vacibə .əsasən ləvat edənin baliğ olmadığı və ya ləvat olunanın baliğ olduğu hala da aiddir

.Məsələ ۲۴۴۸: İnsanın qardaşına süd verən qadın insana məhrəm olmaz

Məsələ ۲۴۴۹: İnsan, iki bacı ilə, süd əmməklə bir-birilə bacı olsalar da, izdivac edə bilməz. Belə ki, iki qadını əqd etsə və sonra başa düşsə ki, onlar bacı imişlər, onların əqdi eyni vaxtda olmuşsa, hər ikisi batildir və əgər bir vaxtda olmayıbsa, «birinci» əqd

Məsələ ۲۴۵۰: Əgər qadın öz əri ilə əlaqədar olan süddən, sonradan deyiləcək kəslərə .süd versə, əri ona haram olmaz

.Öz bacısı və qardaşına .۱

.Öz əmi, bibi, dayı və xalasına və onların övladlarına .۲

Öz nəvələrinə, hətta qız nəvəsi ilə əlaqədar (südvermədə) qızının onun ərinə haram .۳ .olması ilə nəticələnir

.Öz qardaşı uşağına, ya bacısı uşağına .۴

.Öz ərinin qardaşına, ya bacısına .۵

.Ərinin qardaşı uşağına və ya bacısı uşağına .۶

.Ərinin xala, dayı, əmi və bibisinə .۷

.Öz ərinin başqa arvadından olan nəvəsinə .۸

Məsələ ۲۴۵۱: Əgər bir kəs insanın xalası qızına ya bibisi qızına süd versə, ona məhrəm .olmaz

Məsələ ۲۴۵۲: İki arvadı olan kişinin, əgər o iki arvaddan biri o biri arvadın əmisi uşağına .süd versə, o arvadın ki, əmisi uşağı süd əmib, öz ərinə haram olmaz

## SÜD VERMƏYİN QAYDASI

Məsələ ۲۴۵۳: Uşağa süd vermək ilk növbədə onun anasının haqqıdır. Atanın haqqı yoxdur ki, (süd vermək üçün) uşağı başqa adama versin. Amma əgər ona muzd istəsə, ata da pulsuz, yaxud az pul alan bir dayə tapsa, bu halda atası uşağı dayəyə verə bilər. .Bundan sonra anası qəbul etməzsə və özü süd versə, muzd almağa haqqı yoxdur

Məsələ ۲۴۵۴: Müstəhəbbdir ki, uşaq üçün tutulmuş dayə, ağıllı, habelə əxlaqi, cismi ruhi baxımdan gözəl sifətlərə malik olsun. Əqli az olan, kafir, çox yaşlı, pis surətli olan

qadını dayə tutmaq məkruhdur. Həmçinin məkruhdur ki, südü zinadan dünyaya gəlmiş .uşağın südü olan, ya özü zinadan əmələ gələn dayə tutsunlar

## SÜD VERMƏNİN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۲۴۵۵: Daha yaxşı budur ki, qadınların hər uşağa süd verməsinin qarşısı alınsın. Çünki ola bilsin ki, hansı uşağa süd verməsini unudub sonradan bir-birinə məhrəm .olan iki nəfər evlənsinlər

Məsələ ۲۴۵۶: Müstəhəbbdir ki, uşağa iyirmi bir ay tamam süd versinlər və iki ildən çox .süd vermək layiqli deyil

Məsələ ۲۴۵۷: Əgər süd verməklə ərin haqqı aradan gedərsə, qadın ərinin icazəsi .olmadan başqasının uşağına süd verə bilməz

Məsələ ۲۴۵۸: Əgər bir qadının əri, südəmər qızı özü üçün əqd etsə, belə ki, arvadı qıza süd versə, ehtiyat-vacibə görə qadın əbədi olaraq ona haram olur. Ehtiyatən ona təlaq verməlidir və gərək heç vaxt onunla izdivac etməsin. Əgər süd onun özünə aid olursa, südəmər qız da ona əbədi haram olur. Əgər süd, əvvəlki ərinə aid olsa, ehtiyata görə .onun əqdi batil olur

Məsələ ۲۴۵۹: Əgər bir kəs istəsə ki, qardaşı arvadı ona məhrəm olsun, bəziləri buyurublar ki, gərək südəmər bir qızı, məsələn, iki günlük özü üçün siğə etsin və o iki gün müddətində ۲۴۴۱-ci məsələdə deyilən şərtlər ilə qardaşı arvadı o qıza süd versin ki, onun arvadının süd anası olsun. Amma bu hökm qardaşının arvadı onun qardaşının .südü ilə o qız uşağına süd verdiyi təqdirdə işkallıdır

Məsələ ۲۴۶۰: Əgər kişi bir qadını özü üçün əqd etməmişdən qabaq desə ki, o qadın süd əmmə ilə ona haram olub, məsələn, desə ki, onun anasının südünü əmib, belə ki, onu təsdiq etmək mümkün olsa, o qadın ilə izdivac edə bilməz. Əgər əqddən sonra desə və qadın onun sözünü qəbul etsə, əqd batildir. Əgər kişi onunla yaxınlıq etməyibsə, ya yaxınlıq edibsə, amma yaxınlıq edən vaxt qadın o kişiyə haram olduğunu bilibsə, mehriyyəsi yoxdur, əgər qadın yaxınlıq etdikdən sonra o kişiyə haram olduğunu .bilibsə, ər gərək onun mehrini, onun mislində olan qadınlara uyğun olaraq versin

Məsələ ۲۴۶۱: Əgər qadın əqddən qabaq desə ki, süd əmmək vasitəsilə o kişiyə haram olmuşdur və onu təsdiq etmək mümkün olsa, o kişi ilə izdivac edə bilməz. Əgər əqddən sonra desə, kişinin əqddən sonra o qadının ona haram olduğunu deməsi kimidir və .onun hökmü qabaqdakı məsələdə deyildi

:Məsələ ۲۴۶۲: Məhrəm olmağa səbəb olan süd vermək iki şeylə sübut olur

;Sözlərindən yəqin və ya əminlik hasil olan şəxs və ya şəxslərin xəbər verməsi .۱

İki adil kişinin şəhadəti, amma gərək süd verməyin şəraitini də desinlər; məsələn, .۲ desinlər «biz gördük ki, filan uşaq filan qadının döşündən ۲۴ saat süd əmib və bu əsnada başqa şey yeməyib» və həmçinin ۲۴۴۱-ci məsələdə deyilmiş başqa şərtləri də şərh etsinlər. Amma süd verməyin bir adil kişi və iki qadının və ya dörd adil qadının .şəhadəti ilə sübut olması işkallıdır, deməli, ehtiyat olunmalıdır

Məsələ ۲۴۶۳: Əgər uşağın, məhrəm olmağa səbəb olacaq qədər süd əmib-əmmədiyində şəkk edilərsə, ya da o miqdar süd əmdiyi guman edilərsə, uşaq heç kimə .məhrəm olmaz. Amma ehtiyat etmək daha yaxşıdır

## TƏLAQIN HÖKMLƏRİ

**Point**

Məsələ ۲۴۶۴: Öz arvadına təlaq verən kişi, gərək baliğ və aqil olsun, amma əgər on yaşlı uşaq öz arvadına təlaq versə, gərək bu halda ehtiyata əməl etmək tərk olunmasın; həmçinin kişi gərək öz ixtiyarı ilə təlaq versin və əgər arvadına təlaq verməyə onu məcbur etsələr, təlaq batildir; və həmçinin gərək təlaq vermək qəsdi olsun, əgər siğəsini zarafat ilə, yaxud sərxoş halda desə, səhih deyil.

Məsələ ۲۴۶۵: Qadın gərək təlaq vaxtında heyz və nifas qanından pak olsun və əri o paklıqda onunla yaxınlıq etməmiş olsun. Bu iki şərtin təfsili gələcək məsələlərdə deyiləcək.

Məsələ ۲۴۶۶: Heyz və nifas halında qadına təlaq vermək üç halda səhihdir:

۱) Evlənəndən sonra əri onunla yaxınlıq etməmiş olsun;

۲) Hamilə olmağı məlum olsun; əgər məlum olmasa və əri heyz halında təlağını versə və sonra başa düşsə ki, hamilə imiş, təlaq batildir, hərçənd yaxşısı odur ki, ona təlaq verməklə olsa belə ehtiyata riayət edilsin;

۳) Kişi qayib olsa və ya hər hansı səbəbdən hətta qadının gizlənməsinə görə, arvadının heyz və nifas qanından pak olub-olmadığını başa düşə bilməsə; Bu halda ehtiyat-vacib budur ki, arvadından ayrıldığı gündən ən azı bir ay keçənə qədər səbr edib sonra ona təlaq versin.

Məsələ ۲۴۶۷: Əgər qadını heyz halından pak olduğunu bilsə və təlaqını versə, sonradan məlum olsa ki, təlaq vaxtında heyz halında imiş, onun təlaqı fərz olunan hal istisna olmaqla batildir. Əgər onun, heyz halında olduğunu bilsə və təlaqını versə, sonradana məlum olsa ki, pak imiş, onun təlaqı səhihdir.

Məsələ ۲۴۶۸: Əgər bir şəxs arvadının heyz, ya nifas halında olduğunu bilə-bilə ondan ayrı düşsə, məsələn, səfərə çıxsa və ona təlaq vermək istəsə, gərək arvadın heyz ya nifas qanından pak olduğuna yəqinlik, ya arxayınlıq hasil edənə kimi səbr etsin və sonra bilsə ki, pak olubdur, ona təlaq verə bilər və həmçinin əgər şəkki olsa, o halda .۲۴۶۶-ci məsələdə göstərilən qayibdə olan kişinin təlaq hökmünə riayət etsin

Məsələ ۲۴۶۹: Əgər arvadından ayrı düşən kişi öz arvadına təlaq vermək istəsə, belə ki, arvadının heyz və nifas halında olub-olmamasından xəbər tuta bilsə, hərçənd onun xəbəri qadının heyz adəti üzrə, ya şəriətdə müəyyən olunmuş başqa nişanələrdən olsa belə, əgər ona təlaq versə və sonra məlum olsa heyz, ya nifas halında olub, o .halda onun təlaqı səhih deyil

Məsələ ۲۴۷۰: İstər heyz, ya nifas halında olan, istərsə pak olmuş əyalı ilə yaxınlıq etsə və təlaq vermək istəsə, gərək təzədən heyz olub pak olana qədər gözləsin. Amma doqquz yaşı tamam olmamış, yaxud qadının hamilə olması yəqin olsa, əgər yaxınlıq edəndən sonra təlaq versə, həmçinin yaisə olsa da, işkalı yoxdur (yaisənin mənası .(۲۴۱۴-ci məsələdə deyilib

Məsələ ۲۴۷۱: Əgər heyz və nifas qanından pak olan qadın ilə yaxınlıq etsə və həmin paklıqda onun təlaqını versə, sonradan isə məlum olsa ki, təlaq vaxtı hamilə imiş, o təlaq batildir, hərçənd təlaqın yenidən verilməsi ilə olsa belə ehtiyata riayət etmək .daha yaxşıdır

Məsələ ۲۴۷۲: Əgər heyz və nifas qanından pak olmuş qadın ilə yaxınlıq etsə və sonra ondan ayrılsa, məsələn; səfərə getsə, belə ki, səfərdə təlağını vermək istəsə və onun halından xəbərdar ola bilməsə, gərək qadının o paklıqdan sonra qan görüb və təzədən pak olması qədər səbr etsin. Ehtiyat-vacib budur ki, o müddət bir aydan az olmasın. Əgər qeyd olunanlara riayət etməklə təlaq versə, sonra təlağın elə həmin paklıq .dövründə baş verməsi məlum olsa, eybi yoxdur

Məsələ ۲۴۷۳: Əgər kişi xilqətindən, ya xəstəliyinə görə, ya süd verdiyinə görə, ya dərman qəbul etdiyinə görə və ya hansı başqa səbəbdən heyz görməyən arvadına

arvadı ilə yaxınlıq etdiyi vaxtdan üç ay müddətində onunla cima etməkdən çəkinsin və .sonra ona təlaq versin

Məsələ ۲۴۷۴: Təlaqın siğəsi gərək ərəbcə düz və «Taliq» kəlməsi ilə oxunsun, iki adil kişi də onu eşitsinlər. Əgər ərin özü təlaq siyğəsini oxumaq istəsə və arvadının da adı; :məsələn: Fatimə olsa gərək desin

زَوْجَتِي فَاطِمَهُ طَالِقٌ

Zovcəti Fatimətu taliqun» yəni mənim arvadım Fatimə azaddır. Əgər başqasını vəkil » :etsə, gərək o vəkil desin

زَوْجَهُ مُوَكِّلِي فَاطِمَهُ طَالِقٌ

Zovcətu müvəkkili Fatimətu taliqun» və qadın müəyyən olan halda onun adını demək » lazım deyil. Əgər orada hazır olsa və «hazihi taliqun» deyərək ona işarə etsə və ya ona xitab edilərək ənti taliq desə, kifayətdir. Əgər kişi təlaq siğəsini ərəbcə oxuya bilməsə və ya vəkil tuta bilməsə, hansı dildə olursa olsun, ərəbcə oxunan siğənin mənasını .deyib, təlaq verə bilər

Məsələ ۲۴۷۵: Müvəqqəti əqd ilə siğə olunmuş qadının təlaqı yoxdur. Onun azad olması, əqdin tamam olması ilə, yaxud kişinin ona «Müddəti sənə bağışladım» deyərək müddəti .bağışlaması ilə olur. Şahid tutmaq və qadının heyzdən pak olması lazım deyil

## TƏLAQIN İDDƏSİ

Məsələ ۲۴۷۶: Doqquz yaşı tamam olmamış, habelə yaisə qadının iddəsi yoxdur, yəni əri .onunla yaxınlıq etsə də, təlaqdan sonra dərhal ərə gedə bilər

Məsələ ۲۴۷۷: Doqquz yaşı tamam olan və yaisə olmayan qadının əri onunla yaxınlıq edib təlaqını versə, təlaqdaq sonra gərək iddə saxlasın. İki heyzin arasındakı fasilə üç aydan az olan qadının iddəsi odur ki, əri paklığında ona təlaqını verəndən sonra

o qədər gözləsin ki, iki dəfə heyz görsün və pak olsun. Üçüncü heyzi görən kimi onun iddəsi tamam olur və ərə gedə bilər, amma əgər yaxınlıq etməmişdən qabaq ona təlaq versə, iddəsi yoxdur, yəni təlaqdan sonra dərhal ərə gedə bilər, amma əgər ərindən xaric olan məni, (cəzb və ya ona oxşar yol ilə) qadının fərcinə daxil olsa, bu halda gərək .iddə saxlasın

Məsələ ۲۴۷۸: Heyz görməyən qadın əgər heyz görən qadınlar yaşda olsa, ya iki heyzi arasındakı zaman fasiləsi üç aydan artıq olsa, belə ki, əri onunla yaxınlıq etdikdən .sonra təlaq versə, gərək təlaqdaq sonra qəməri tarixlə üç ay iddə saxlasın

Məsələ ۲۴۷۹: İddəsi üç ay olan qadının əgər hilali ayın əvvəlində təlaqını versələr, üç ay iddə saxlasın. Əgər ayın əsnasında təlaqını versə, gərək ayın qalanını sonrakı iki ay ilə bərabər və birinci aydan, qalanını isə dördüncü aydan iddə saxlasın ki, üç ay tamam olsun. Məsələn, əgər ayın ۲۰-ci gününün qürubunda təlaqını versələr və o ay ۳۰ gün olsa, onun iddəsi dördüncü ayın ۲۰-ci günü qürub vaxtı tamam olur. Əgər ay ۲۹ gün olsa, ehtiyat-vacib budur ki, dördüncü aydan ۲۱ gün iddə saxlasın ki, birinci aydan iddə .saxladığı miqdarla ۳۰ gün olsun

Məsələ ۲۴۸۰: Əgər hamilə qadına təlaq versələr, iddəsi uşaq dünyaya gələnə qədər, ya siqt olana qədərdir. Buna görə də əgər təlaqdan bir saat sonra uşaq dünyaya gəlsə, iddəsi tamam olur, amma bu o haldadır ki, uşaq ərinin şəri övladı olsun. Buna əsasən əgər qadın zinadan hamilə olsa və əri ona təlaq versə, onun iddəsi, uşağa hamiləlik .dövrü ilə tamam olmur

Məsələ ۲۴۸۱: Doqquz yaşı tamam olmuş və yaisə olmayan qadın əgər siğə olunsa, belə ki, əri onunla yaxınlıq etsə və o qadının müddəti tamam olsa, ya əri müddəti ona bağışlasa, gərək iddə saxlasın. Əgər heyz görürsə, gərək iki heyz miqdarında iddə saxlasın və ərə getməsin, ehtiyat-vacibə görə bir dəfə heyz görməsi kifayət deyil və əgər heyz görmürsə ۴۵ gün ərə getməkdən çəkinsin. Hamilə olan halda onun iddəsi uşaq dünyaya gələnə qədər, ya siqt olana qədərdir, hərçənd ehtiyat-müstəhəb budur .ki, doğuş və ۴۵ gün arasında hansı daha çox olsa, onu daha çox iddə saxlasın

Məsələ ۲۴۸۲: Təlaq iddəsinin əvvəli təlaq siğəsi oxunub tamam olandan sonra başlayır, istər qadın ona təlaq verdiyini bilsin, ya bilməsin. Əgər iddə tamam olandan sonra ona .təlaq verildiyini başa düşsə, təzədən iddə saxlamağı lazım deyil

## ƏRİ ÖLƏN QADININ İDDƏSİ

Məsələ ۲۴۸۳: Əri ölən qadın hamilə olmasa, gərək Qəməri ayla ۴ ay ۱۰ gün iddə saxlasın, yəni ərə getməkdən çəkinsin, hərçənd səğirə, yaisə, siğə, kafir, rici təlaq verilmiş iddə halında olsa, əri onunla yaxınlıq etməsə də, hətta əri uşaq və ya dəli də olmuş olsa, hökm eynidir. Əgər hamilə olsa, gərək doğana qədər iddə saxlasın. Amma ۴ ay ۱۰ gün keçməmişdən qabaq dünyaya gəlsə, gərək ərinin ölümündən sonra ۴ ay ۱۰ .gün gözləsin. Bu iddəyə, vəfat iddəsi deyərlər

Məsələ ۲۴۸۴: Vəfat iddəsində olan qadına zinət libasları geymək və sürmə çəkmək haramdır. Həmçinin zinət hesab olunan başqa işlər də ona haramdır. Amma evdən .çölə getmək ona haram deyil

Məsələ ۲۴۸۵: Əgər bir qadın ərinin öldüyünü yəqin etsə və vəfat iddəsi tamam olandan sonra ərə getsə, əgər məlum olsa ki, onun əri sonradan ölüb, ikinci əqd də birinci ərinin sağlığında və ya həqiqi vəfat iddəsi dövründə baş veribsə, gərək ikinci ərindən ayrılsın və ehtiyat-vacibə görə iki iddə saxlasın. Əgər ikinci ərindən hamilə olubsa, bu halda doğana qədər ikinci ər üçün (eynilə təlaq iddəsi kimi olan) vəty-şübhə iddəsi, ondan sonra isə birinci ər üçün vəfat iddəsi saxlasın, ya da əvvəlki iddəsini təkmil etsin. Əgər hamilə olmasa və birinci əri ikinci ərinin yaxınlıq etməsindən qabaq ölmüş olsa, əvvəlcə birinci ər üçün vəfat iddəsi, ondan sonra isə ikinci əri üçün vəty-şübhə iddəsi saxlasın. .Əgər yaxınlıq vəfatdan qabaq olubsa, onun iddəsi irəlidir

Məsələ ۲۴۸۶: Vəfat iddəsinin əvvəli əri qayib və ya qayib hökmündə olan halda, ərin ölümündən sonra yox, qadının ərinin ölümündən xəbərdar olmasından başlayır, amma bu hökm əgər

qadın həddi-büluğa çatmamış, ya dəli olan surətdə işkallıdır, ehtiyata riayət etmək .vacibdir

Məsələ ۲۴۸۷: Əgər qadın «iddəm tamam olub», desə onun sözü qəbul olunur, amma əgər qadın töhmət vurulan bir məqamda olsa, bu halda ehtiyat-vacibə görə ondan qəbul olunmur, məsələn, əgər iddia etsə ki, bir ayda üç dəfə heyz görüb, onun iddiası təsdiq olunmur. Amma əgər ona yaxın olan qadınlar onun bu adət üzrə heyz görməsini .təsdiq etsələr, bu halda ondan qəbul olunar

## BAİN VƏ RİCİ TƏLAQ

Məsələ ۲۴۸۸: Bain təlaqı budur ki, təlaqdan sonra kişinin öz arvadına qayıtmaq haqqı :olmasın. Yəni, əqd oxunmadan onu arvad kimi qəbul edə bilməz. Bu altı qismdir

.Doqquz yaşı tamam olmayan qadının təlağı .۱

.Yaisə olan qadının təlağı .۲

.Əqddən sonra əri onunla yaxınlıq etməmiş olan qadının təlaqı .۳

.(Üç dəfə boşanmış bir qadının təlaqı (۲۴۹۳-ci məsələdə gələcək .۴

.Xüli və mübarat təlaqı. Bunların hökmləri sonradan deyiləcək .۵

Şəriət hakiminin, ərinin nə nəfəqəsini təmin etməyə və nə də boşamağa hazır . ۶ .olduğu bir qadına verdiyi təlaq

Bunlardan başqa olan təlaqlar isə rici təlaqdır. Yəni qadının iddədə olduğu müddətdə .əri yenidən ona rücu edə bilər

Məsələ ۲۴۸۹: Arvadını rici təlaqla boşayan şəxsə arvadını, boşanma zamanı yaşadığı evdən çıxarması haramdır. Amma bəzi zamanlarda ki, qadının zina etmiş olması bunlardan biridir, qadını evdən çıxarmasının eybi yoxdur. Həmçinin qadının ərindən icazəsiz lazımsız işlər üçün evdən çıması haramdır. Kişiyə də vacibdir ki, iddə dövründə .onun xərclərini təmin etsin

## RÜCU ETMƏYİN HÖKMLƏRİ

:Məsələ ۲۴۹۰: Rici təlaqda kişi iki yolla öz arvadına rücu edə bilər

.Qadını, yenidən öz arvadı qərar verməsini bildirən bir söz desin .۱

Bir iş görsə ki, o iş ilə rücu qəsdi olsun. Yaxınlıq etməklə rücu gerçəkləşir, hərçənd .۲ rücu qəsdi olmasa da; amma şəhvətli ləms və öpüş ilə rücunun gerçəkləşməsi .işkallıdır. Ehtiyat-vacibə görə əgər rücu etmək istəməsə, gərək yenidən təlaq versin

Məsələ ۲۴۹۱: Rücu etmək üçün kişinin şahid tutması, ya da arvada xəbər verməsi lazım deyil. Hətta əgər heç kəs bilmədən özü rücu etsə, rücu etməyi düzdür. Amma əgər iddədən sonra kişi desə ki, iddə içərisində rücu etmişəm, qadın onu təsdiq etməsə, .kişinin öz iddasını isbat etməsi lazımdır

Məsələ ۲۴۹۲: Öz arvadına rici təlaq verən kişi əgər ondan bir mal alsa və onunla sülh etsə ki, bir daha ona rücu etməsin, hərçənd bu müsalihə düz olsa da və rücu etməməsi vacib olsa da, amma onun rücu etmək haqqı aradan getmir və rücu etdiyi surətdə, .yenidən izdivac bərqərar olur

Məsələ ۲۴۹۳: Əgər bir qadına iki dəfə təlaq verib ona rücu etsə, ya iki dəfə ona təlaq verib və hər təlaqdan sonra əqd etsə, ya bir təlaqdan sonra rücu etsə, o biri təlaqdan sonra əqd etsə, üçüncü təlaqdan sonra o qadın ona haramdır. Amma əgər üçüncü təlaqdan sonra başqasına ərə getsə, beş şərt ilə birinci ərinə halal olar, yəni o qadını :təzədən əqd edə bilər

İkinci ərin əqdi həmişəlik olsun. Əgər onu siğə etsə, ondan ayrılandan sonra birinci .۱ .ər onu əqd edə bilməz

İkinci ər onunla yaxınlıq etsin və düxul olsun və ehtiyat-vacib budur ki, yaxınlıq .۲ .qadının fərcindən olsun

.İkinci ər təlaqını versin, ya ölsün .۳

.İkinci ərin təlaq, ya vəfat iddəsi tamam olsun .۴

.Ehtiyat-vacibə görə ikinci ər yaxınlıq zamanı baliğ olsun .۵

## XÜL TƏLAQI

Məsələ ۲۴۹۴: Ərinə meyli olmayan və ya ona kərahəti olan qadının mehrini və ya özünə aid olan başqa malını boşanması üçün ərinə bağışlayarsa, buna, xül təlaqı deyilir. Xül təlaqında qadının ərinə qarşı olan meylsizliyi o həddə olmalıdır ki, onun evlilik haqqını .riayət etmədiyini təhdid etsin

Məsələ ۲۴۹۵: Əgər təlaq siğəsini ər özü oxumaq istəsə, qadının adı məsələn: Fatimə :olsa qərara alınmış şey verildikdən sonra, desin

زَوْجَتِی فَاطِمَهُ خَلَعْتُهَا عَلَی مَابَذَلَتْ

Zovcəti Fatimətu xalə`tuha əla ma bəzələt». Ehtiyat-müstəhəbə görə “Hiyə taliq” « cümləsin də, desin. Yəni arvadım Fatiməni verdiyi şey müqabilində xül təlaqı verdim və o azaddır. Qadın müəyyən olan halda bu təlaqda və mübarat təlaqında onun adını .demək lazım deyil

Məsələ ۲۴۹۶: Əgər bir qadın bir kəsi vəkil etsə ki, onun mehrini ərinə bağışlasın və ər də həmin adamı vəkil etsə ki, arvada təlaq versin, belə ki, ərin adı Muhəmməd və qadının :adı Fatimə olsa, vəkil təlaq siğəsini bu cür oxuyacaq

عَنْ مُوَكِّلَتِی فَاطِمَهَ بَذَلْتُ مَهْرَهَا لِمُوَكِّلِی مُحَمَّدٍ لِیَخْلَعَهَاعَلَیْهِ

Ən muvəkkiləti Fatimətə bəzəltu məhrəhə limuvəkkili Muhəmmədin liyəxlə`əha« :ələyhi», ondan sonra deyəcək

زَوْجَهُ مُوَكِّلِی خَالَعْتُهَا عَلَی مَابَذَلَتْ هِیَ طَالِقٌ

Zəvcətu muvəkkili xalə`tuha əla ma bəzələt fə hiyə taliqun». Əgər bir qadın bir kəsi« vəkil etsə ki, mehrdən başqa bir şeyi onun ərinə bağışlasın ki, ona təlaq versin, vəkil gərək «məhrəha» sözünün yerinə o şeyi desin. Məsələn; ۱۰۰ manat versə gərək desin: .««bəzələt mi`ətə manat

## MÜBARAT TƏLAQI

Məsələ ۲۴۹۷: Əgər ər və arvad bir-birlərini istəməsələr, bir-birlərindən ikrah etsələr və qadın bir malı ona təlaq verməsi üçün kişiyə versə, bu təlaqa mübarat təlağı deyilir.

Məsələ ۲۴۹۸: Əgər ər mübarat siğəsini oxumaq istəsə, belə ki, qadının adı Fatimə olsa, gərək desin:

بَارَأْتُ زَوْجَتِی فَاطِمَهَ عَلَی مَابَذَلَتْ

«Barə`tu zəvcəti Fatimətə əla ma bəzələt» və ehtiyat-lazıma əsasən «fəhiyə taliqun», cümləsin də, desin. Yəni mən və arvadım Fatimə, onun verdiyi şeyin müqabilində bir-birimizdən ayrıldıq və o azaddır. Əgər başqasını vəkil etsə, vəkil gərək desin:

عَنْ قِبَلِ مُوَکِّلِی بَارَأْتُ زَوْجَتَهُ فَاطِمَهَ عَلَی مَابَذَلَتْ فَهِیَ طَالِقٌ

«Ən qibəli müvəkkili barə`tu zəvcətəhu Fatimətə əla ma bəzələt fəhiyə taliqun», hər iki halda əgər «əla ma bəzələt» kəlməsinin yerinə, «bima bəzələt» desə, eybi yoxdur.

Məsələ ۲۴۹۹: Xül və mübarat təlaqının siğəsi gərək imkan olan halda ərəbcə səhih oxunsun və əgər mümkün olmasa, onun hökmü ۲۴۷۴-ci məsələdə olan təlaqın hökmüdür, amma əgər qadın öz malını ərinə bağışlamaq üçün məsələn, azərbaycanca desə ki, təlaq üçün filan malı sənə bağışladım, eybi yoxdur.

Məsələ ۲۵۰۰: Əgər qadın xül, ya mübarat təlaqının iddəsinin əsnasında bəxşiş fikrindən qayıtsa, ər rücu edə bilər və əqdsiz təzədən onu öz arvadı edə bilər.

Məsələ ۲۵۰۱: Mübarat təlaqı üçün ərin aldığı mal gərək mehrdən çox olmasın, hətta ehtiyat-vacibə görə gərək mehrdən az olsun, amma xül təlağında çox olsa, eybi yoxdur.

## TƏLAQIN MÜXTƏLİF HÖKMLƏRİ

Məsələ ۲۵۰۲: Əgər bir kişi naməhrəm qadını öz əyalı güman edib, onun ilə yaxınlıq etsə, istər o qadın əri olmadığını bilsin, istərsə də əri olduğunu güman etsin, gərək iddə .saxlasın

Məsələ ۲۵۰۳: Bir kişi öz arvadı olmadığını bildiyi bir qadınla zina etsə, əgər qadın onun əri olmadığını bilsə, iddə saxlaması lazım deyil, amma əri olduğunu güman etsə, .ehtiyat-vacibə görə iddə saxlamalıdır

Məsələ ۲۵۰۴: Əgər bir kişi, bir qadını onunla evlənməsi üçün ərini boşama məcburiyyətində qoymaq məqsədiylə evlilik hüquqlarına riayət etməməsi üçün aldadarsa, o qadının təlağı və əqdi səhihdir. Amma hər ikisi də böyük günah etmiş .olurlar

Məsələ ۲۵۰۵: Əgər qadın əqdin zimnində əri ilə şərt etsə ki, xüsusi şərait irəli gəlsə, məsələn, əgər ər uzun müddətli səfərə getsə, ya məsələn, altı ay onun xərcini verməsə, ya uzun müddət həbsə məhkum edilsə, təlaqın ixtiyarı onunla olsun, bu şərt batildir, amma şərt etsə ki, ərinin tərəfindən xüsusi şərtlərdə və ya heç bir qeyd-şərt olmadan özünə təlaq vermək üçün vəkil olsa, şərt düzdür və əri sonradan onu vəkillikdən əzl edə bilməz, əgər bu halda (vəkil olduğu halda qadın) özünə təlaq versə .təlaq səhihdir

Məsələ ۲۵۰۶: Əri itmiş qadın, əgər başqasına ərə getmək istəsə, gərək adil müctəhidin yanına getsin və «Minhacus-sadiqin» kitabında qeyd etdiyimiz xüsusi şərtlər daxilində .müctəhid ona təlaq verə bilər

Məsələ ۲۵۰۷: Dəlinin ata və ata tərəfindən olan babası, onun arvadına onun .məsləhətinə olsa, təlaq verə bilərlər

Məsələ ۲۵۰۸: Əgər ata, ya ata tərəfindən olan babası öz uşağı üçün bir arvadı siğə etsə, uşağın mükəlləf olan vaxtından bir qədəri siğənin müddətində olsa belə, məsələn, ۱۴ yaşlı oğlan üçün bir qadını iki illik siğə etsə, belə ki, uşağın xeyrinə olsa, o

.qadının müddətini bağışlaya bilər. Amma onun daimi arvadına təlaq verə bilməz

Məsələ ۲۵۰۹: Əgər şəri höccət üzündən kişi iki nəfəri adil bilsə və öz arvadına onların qarşısında təlaq versə, bir başqası ki, onların ədaləti onun yanında sübut deyil, əgər ehtimal versə ki, onların ədaləti təlaq verənin yanında sabitdir, o qadını iddə tamam olandan sonra özü üçün və ya başqası üçün əqd edə bilər. Amma onların ədalətli .olmadığına yəqin etsə, o qadını əqd edə bilməz

Məsələ ۲۵۱۰: Kişinin rici təlaq verdiyi qadın, iddəsi tamam olana qədər onun şəri həyat yoldaşı hökmündədir. Belə ki, ərinin ondan hər növ cinsi ləzzət almasına mane olmağa haqqı yoxdur. Caiz və hətta müstəhəbdir ki, qadın özünü onun üçün bəzəsin. Onun icazəsi olmadan evdən çıxması icazəli deyil. Əgər naşizə olmasa, (itaətdən boyun qaçırmasa) nəfəqəsini vermək ərinə vacibdir, eləcə də kəfəni, fitrə zəkatı da ərin öhdəsinədir. Hər biri ölərsə, digəri ondan irs aparır. Kişi, arvadının iddədə olduğu .zaman onun bacısını ala bilməz

## QƏSBİN HÖKMLƏRİ

**Point**

Qəsb odur ki, insan zülm ilə başqasının haqqına, ya malına sahib olsun. Bu da əql, Quran və rəvayətlərin hökmü ilə haramdır. Peyğəmbəri Əkrəmdən (səlləllahu ələyhi və alihi və səlləm) rəvayət olunub ki, "Hər kəs bir qarış torpağı başqasından qəsb etsə, Qiyamət günü o torpağı onun yeddi təbəqəsi ilə birlikdə boyunbağı kimi onun boynundan asacaqlar."

Məsələ ۲۵۱۱: Əgər insan hamı üçün tikilmiş məscid, mədrəsə, körpü və başqa yerlərdən camaatın istifadə etməsini qoymasa, onların haqqını qəsb etmişdir. Həmçinin, əgər bir kəs məsciddə özü üçün bir yer tutsa və başqası da onun oradan istifadə etməsini qoymazsa, günah etmişdir.

Məsələ ۲۵۱۲: Əgər girov qoyan və girov götürən qərar qoysalar ki, o şey ki, girov qoyulmuşdur, girov götürənin, ya üçüncü şəxsin əlində olsun, girov verən girov qoyduğu əşyanın əvəzini ödəməmiş qoyduğu girovu götürə bilməz. Əgər götürsə, gərək dərhal qaytarsın.

Məsələ ۲۵۱۳: Bir kəsin yanında girov qoyulan malı başqası qəsb etsə, mal sahibi və girov götürən şəxsin hər biri qəsb edilmiş şeyi tələb edə bilər. Belə ki, o şeyi ondan alsalar, yenə də girovdadır.

Məsələ ۲۵۱۴: Əgər insan bir şeyi qəsb etsə, gərək sahibinə qaytarsın. Əgər o şey aradan getsə və qiyməti olsa, gərək onun əvəzini ۲۵۲۶ və ۲۵۲۷-cı məsələlərdə deyilən şərhlə ona versin.

Məsələ ۲۵۱۵: Əgər qəsb edilmiş şeydən mənfəət əldə edilsə, məsələn, qəsb edilmiş qoyundan quzu olsa, o mal sahibinindir. Həmçinin, bir evi qəsb etmiş bir kəs orada oturmasa da, gərək onun icarəsini versin.

Məsələ ۲۵۱۶: Əgər uşağın və ya dəlinin malını qəsb etsələr, həmin şeyi vəlisinə .verməlidirlər. Əgər o şey aradan getsə, əvəzi ödəməlidirlər

Məsələ ۲۵۱۷: Əgər iki nəfər birlikdə bir şeyi qəsb etsələr, hər ikisi bütünlüklə o şeydən istifadə etsələr, hər biri təklikdə o şeyi qəsb etməyi bacarmamasına baxmayaraq .onlardan hər biri, o şeyə bütünlüklə zamindirlər

Məsələ ۲۵۱۸: Əgər qəsb edilmiş bir şeyi digər bir şey ilə qarışdırsalar, məsələn, qəsb olunmuş buğdanı arpa ilə qarışdırsalar, belə ki, onları ayırmaq mümkün olsa, əziyyət .ilə olsa da, gərək ayrılsın və sahibinə qaytarılsın

Məsələ ۲۵۱۹: Əgər bir şəxs düzəldilmiş qızıl parçasını məsələn, qəsb etdiyi sırğanı əritsə, gərək onu əritdikdən qabaq və sonrakı qiymətinin fərqi ilə sahibinə versin. Əgər qiymətinin fərqini ödəməsə, desə ki, onu əvvəlki kimi düzəldəcəyəm, malik məcbur deyil ki, qəbul etsin. Həmçinin malik onu, əvvəlki kimi düzəltməyə də məcbur edə .bilməz

Məsələ ۲۵۲۰: Qəsb edilmiş bir şeyi əvvəlkindən yaxşı olacaq bir şəkildə dəyişdirilsə, məsələn, qəsb edilmiş qızıldan sırğa düzəltsə, belə ki, mal sahibi «malı bu halda mənə ver» desə, gərək ona versin və ondan çəkdiyi zəhmət üçün muzd ala bilməz. Həmçinin malikin icazəsi olmadan onu əvvəlki halına salmağa haqqı yoxdur. Amma malikin icazəsi olmadan onu əvvəlki, ya başqa şəklə salsa, iki halət arasında olan qiymət .fərqinə zamin olması məlum deyil

Məsələ ۲۵۲۱: Əgər qəsb edilmiş bir şeyi əvvəlkindən daha yaxşı olacaq bir şəkildə dəyişdirsələr və mal sahibi desə ki, gərək onu əvvəlki şəklə salasan, əgər bu istəkdə onun müəyyən hədəfi olsa, vacibdir ki, qəsb edən onu əvvəlki şəklə salınsın. Belə ki, onun qiyməti, dəyişdirmək vasitəsilə əvvəlkindən az olsa, gərək onun fərqini də sahibinə versin. Belə ki, qəsb edilmiş qızıldan əgər sırğa düzəldilsə və onun sahibi desə: «onu əvvəlki şəklə sal» o halda əridəndən sonra onun qiyməti sırğa düzəltməmişdən .qabaqkı qiymətdən az olsa, gərək onun fərqini ödəsin

Məsələ ۲۵۲۲: Qəsb etdiyi yerdə əkin, ya ağac əksə, o ağacın və əkinin barı onundur. Belə ki, torpağın sahibi razı olmasa ki, əkin, ya ağac onun yerində qalsın, qəsb edən şəxs gərək dərhal öz ağac, ya əkininin zərəri olsa da, yerdən çıxartsın. Həmçinin ağac, ya əkin o yerdə olan müddətdə yerin icarəsini yer sahibinə versin və yerdə olan xarablıqları düzəltsin, məsələn, ağacların yerini doldursun. Əgər bunların vasitəsilə yerin qiyməti əvvəlkindən az olsa, gərək onun fərqini də versin. O, yer sahibini məcbur edə bilməz ki, yeri ona satsın, ya icarə versin. Həmçinin yer sahibi onu məcbur edə .bilməz ki, əkin, ya ağacı ona satsın

Məsələ ۲۵۲۳: Əgər yer sahibi ağacın, ya əkinin onun yerində qalmasına razı olsa, oranı qəsb edən şəxs lazım deyil ki, ağacı, ya əkini oradan çıxartsın, amma gərək o yerin .icarəsini qəsb etdiyi vaxtdan yer sahibi razı olan vaxta qədər versin

Məsələ ۲۵۲۴: Əgər qəsb edilmiş şey aradan getsə, o halda ki, inək və qoyun kimi «qiyməti» olsa, gərək («qiyməti» o şeyə deyilir ki, tələbatın cəlb olunmasında rol oynayan xüsusiyyətləri baxımından onun misli çox deyildir) gərək onun qiymətini versin və əgər onun bazar qiyməti istək və təklif vasitəsilə fərq etsə, gərək tələf olduğu vaxtda olan .qiyməti versin

Məsələ ۲۵۲۵: Əgər qəsb edilmiş şey aradan getsə, məsələn: arpa və buğda kimi «misli» olsa, qəsb olunmuş şey ödənilməlidir. («Misli» o şeyə deilir ki, tələbatın cəlb olunmasında təsirli olan xüsusiyyətlər baxımından onun misli çoxdur.) Amma ödənilən şeyin tələbatın cəlb olunmasında təsirli olan maddə və növ xüsusiyyətləri qəsb etdiyi və aradan getdiyi şeyin mislində olsun. Məsələn, əgər əla növ düyü qəsb edibsə, .ondan aşağı növ düyünü qaytara bilməz

Məsələ ۲۵۲۶: Əgər «qiyməti» olan bir şey, qəsb edilsə və aradan getsə, belə ki, onun yanında olan müddətdə müəyyən bir xüsusiyyət tapıbsa və buna görə də qiyməti artıbsa, məsələn, kökəlsə, sonra tələf olsa, əgər bu kökəlmə qəsb edənin yaxşı bəsləməsinə görə olmayıbsa, gərək kök olan vaxtın qiymətini versin. Amma əgər yaxşı .bəsləməsinə görə kökəlibsə, artan hissənin qiymətini verməsi lazım deyil

Məsələ ۲۵۲۷: Qəsb edilmiş şeyi əgər başqası ondan qəsb etsə və aradan getsə, mal sahibi onların hər birindən onun əvəzini ala bilər, ya da onların hərəsindən əvəzin bir qədərini tələb edə bilər. Belə ki, onun əvəzini birincidən alsa, onda birinci də verdiyi şeyi ikincidən ala bilər. Amma əgər mal sahibi ikincidən alsa, ikinci qəsb edən sahibinə .verdiyi şeyi birincidən tələb edə bilməz

Məsələ ۲۵۲۸: Əgər satdıqları bir şeydə müamilənin şərtlərindən biri olmasa, məsələn, o şey ki, gərək çəki ilə alış-veriş edilsin, çəkisiz müamilə etsələr, müamilə batildir və belə ki, satıcı və alıcı müamiləni nəzərə almadan razı olsalar ki, bir-birinin malında istifadə etsinlər, eybi yoxdur. Əgər belə olmasa, bir-birlərindən aldıqları şey qəsbi mal kimidir və gərək hər biri onu digərinə qaytarsın. Bu halda əgər hər birinin malı o birisinin əlində tələf olsa, istər müamilənin batil olduğunu bilsin, istərsə də bilməsin, gərək onun .əvəzini versin

Məsələ ۲۵۲۹: Əgər bir malı satıcıdan, baxmaq üçün götürsə, yaxud müəyyən müddətdə öz yanında saxlayıb bəyənəcəyi halda almaq üçün götürdüyü təqdirdə, o mal tələf .olarsa, məşhura əsasən, gərək onun əvəzini sahibinə versin

## İNSANIN TAPDIĞI MALIN HÖKMLƏRİ

Məsələ ۲۵۳۰: Heyvan qismindən olmayan itmiş malı insan tapsa və sahibi məlum olmaq üçün heç bir nişanəsi olmasa, istər onun qiyməti bir dirhəm (۱۲,۶ noxud sikkəli gümüş) olsun, istərsə olmasın, onu özü üçün götürə bilər. Amma ehtiyat-müstəhəbə əsasən, onu sahibi tərəfindən fəqirə sədəqə versin. Əlaməti olmayan pul da bu hökümdədir. Amma əgər məkan və ya zaman xüsusiyyətləri və miqdarı, pul üçün bir əlamət olarsa, .gərək onu ۲۵۳۱-cü məsələdəki əsasda elan etsin

Məsələ ۲۵۳۱: Əgər tapdığı şeydə onunla sahibini tapa biləcək, bir nişanı olsa, hərçənd bilsə ki, onun sahibi malı möhtərəm olan kafirdir, o halda o şeyin qiyməti bir dirhəmə çatsa, gərək tapdığı gündən bir ilə kimi camaatın toplandığı yerlərdə elan etsin. Əgər -qiyməti bir dirhəmdən az olsa, ehtiyat

vacib budur ki, onu sahibi tərəfindən sədəqə versin. Hər vaxt sahibi tapılsa, əgər .sədəqə verməyə razı olmasa, onun əvəzini ona versin

Məsələ ۲۵۳۲: Əgər insanın özü elan etmək istəməsə, əmin olduğu şəxsə, onun .tərəfindən elan etməsini deyə bilər

Məsələ ۲۵۳۳: Əgər bir ilə qədər elan etsə və mal sahibi tapılmasa, belə ki, o malı Məkkə hərəmindən qeyri bir yerdə tapıbsa, onu sahibi tapılan zaman ona vermək üçün saxlaya bilər. Bu müddət ərzində malın özünü saxlayıb ondan özü üçün istifadə edə bilər. Həm də onu, sahibi tərəfindən sədəqə olaraq fəqirlərə də verə bilər. Ehtiyat-vacib budur ki, onu özü üçün götürməsin. Əgər malı hərəmdə tapıbsa, ehtiyat-vacib .budur ki, onu fəqirlərə sədəqə versin

Məsələ ۲۵۳۴: Əgər bir il elan edəndən sonra mal sahibi tapılmasa, malı sahibi üçün saxlasa və aradan getsə, belə ki, onu saxlamaqda israfçılıq və səhlənkarlıq etməsə, zamin deyil. Amma əgər sahibi tərəfindən sədəqə versə, sahibin ixtiyarı var ki, ya sədəqəyə razı olsun, ya malının əvəzini tələb etsin. Sədəqənin savabı sədəqə verənin .olar

Məsələ ۲۵۳۵: Malı tapan kəs əgər bilərəkdən deyilmiş göstərişlərə əsasən elan etməsə, günah etməsindən əlavə, əgər elan etməsinin faydası olduğunu ehtimal etsə, elan .etməsi vacibdir

Məsələ ۲۵۳۶: Əgər dəli, ya həddi-büluğa çatmayan uşaq, üzərində nişanəsi olan və qiyməti bir dirhəmə çatan bir şey taparsa, onun vəlisi elan edə bilər. Hətta o şeyi uşaqdan və ya dəlidən almışdırsa, elan etməsi vacibdir. Əgər bir il elan edilsə, malın .sahibi tapılmasa, gərək ۲۵۳۳-cı məsələdə deyilənə əməl etsin

Məsələ ۲۵۳۷: Əgər insan elan etdiyi ilin içərisində sahibinin tapılacağından ümidsiz olsa, .ehtiyat-vacibə əsasən, gərək şəriət hakiminin izni ilə onu sədəqə versin

Məsələ ۲۵۳۸: Əgər elan etdiyi ilin içərisində mal aradan getsə, belə ki, onun saxlanmasında səhlənkarlıq və ya ondan istifadə etmişdirsə, onun əvəzini sahibinə

davam etdirməlidir. Əgər səhlənkarlıq və istifadə də etməyibsə, ona heç bir şey vacib .deyil

Məsələ ۲۵۳۹: Əgər nişanəsi olan və qiyməti bir dirhəmə çatan malı, elan verməklə onun sahibinin tapılmayacağı məlum olan bir yerdə taparsa, ehtiyat-vacibə əsasən onu birinci gün sahibləri tərəfindən şəriət hakiminin izniylə fəqirlərə sədəqə verə bilər və il .tamam olana qədər səbr etməməlidir

Məsələ ۲۵۴۰: Əgər bir şey tapsa və öz malı bilib götürsə, sonra öz malı olmadığını başa .düşsə, keçmiş məsələlərdə verilmiş hökmlərə görə əməl etməlidir

Məsələ ۲۵۴۱: Tapılan şeyi sahibinin elanı eşitdiyi təqdirdə, o şeyi öz malı olduğuna ehtimal verəcək şəkildə elan etməlidir. Bu çür elan yerlərin dəyişməsi ilə dəyişir. Bəzi hallarda, məsələn; «bir şey tapmışam» deməsi, kifayət edir. Amma bəzi hallarda isə onun cinsini də müəyyən etməlidir. Məsələn; «bir qızıl parçası tapmışam» deməlidir. Bəzi yerlərdə də onun müəyyən xüsusiyyətlərini də əlavə etməlidir. Məsələn; «bir qızıl sırğa tapmışam» deməlidir. Amma hər bir halda, o şeyin müəyyən olana qədər bütün xüsusiyyətlərini deməməlidir. Elə bir yerdə elan etməlidir ki, sahibinə xəbər çatmasına .ehtimal versin

Məsələ ۲۵۴۲: Əgər bir kəs, bir şey tapsa və başqası «mənim malımdır» deyərək, onun nişanələrini deyərsə, malı olduğuna xatircəm olduğu halda o malı, ona verməlidir. Mal .sahibinin çox vaxt diqqət etmədiyi nişanələri demək lazım deyildir

Məsələ ۲۵۴۳: Əgər tapdığı şeyin qiyməti bir dirhəm qədər olsa, belə ki, elan etməsə, məsciddə və ya camaatın toplaşdığı başqa yerdə qoysa və o şey aradan getsə və ya .onu başqası götürsə, onu tapan adam zamindir

Məsələ ۲۵۴۴: Əgər bir ilə qədər qalmayacaq bir şey taparsa, gərək qala biləcək axır müddətə kimi, əlbəttə qiymətinə təsir edən bütün xüsusiyyətləri ilə bir yerdə saxlasın. Ehtiyat-vacib budur ki, bütün bu müddət boyu elan etsin. Əgər sahibi tapılmasa, onun qiymətini müəyyən edib özünə götürə bilər, ya onu satıb pulunu saxlamalı, hər iki



halda elanını davam etdirməlidir. Əgər sahibi tapılsa pulunu ona verər. Əgər bir ilə

.qədər sahibi tapılmasa, gərək ۲۵۳۳-cü məsələdə deyilənlərə əməl etsin

Məsələ ۲۵۴۵: Əgər tapdığı şey dəstəmaz aldığı və namaz qıldığı vaxt onunla olsa, hətta .sahibi tapılan halda o şeyi qaytarmaq istəməsə, dəstəmazı və namazı batil olmur

Məsələ ۲۵۴۶: Əgər bir kəsin ayaqqabısını aparsalar və onun yerində başqa ayaqqabı qoysalar, belə ki, qalan ayaqqabının onun ayaqqabısını aparan kəsin olduğunu və ayaqqabını aparan həmin adamın apardığı ayaqqabının əvəzində öz ayaqqabısını götürməyə razı olduğunu bilsə, o ayaqqabını özünkünün yerinə götürə bilər. Onun ayaqqabısını haqqsız yerə, zülm olaraq götürüldüyünü bildiyi təqdirdə də hökm eynidir. Amma bu halda o ayaqqabının qiyməti öz ayaqqabısının qiymətindən çox olmamalıdır. Əgər belə olmasa, artıq qiymət üçün məchulul-malikin hökmü caridir. Bu .iki haldan başqa halda, məchulul-malikin hökmü o ayaqqabıya cari olacaqdır

Məsələ ۲۵۴۷: Əgər insanın əlində olan mal məchulul-malik olsa, yəni sahibi naməlum olsa və o mala itirilmiş deməsələr, onun sahibinin həmin insanın o maldan istifadə etməsinə razı olduğuna əmin olandan sonra, hansı tərzdə onun istifadəsinə razı olsa, o maldan o cür istifadə edə bilər. Əgər belə olmasa onun sahibini tapmağa ehtimal verdiyi vaxta qədər axtarmaq lazımdır, sahibinin tapılmasından məyus olduqdan sonra gərək o malı fəqirə sədəqə versin. Ehtiyat-vacibə əsasən, sədəqə şəriət hakiminin icazəsi ilə verilməlidir. Həmçinin, onun icazəsi ilə malın qiymətini də sədəqə verə bilər. Əgər sonra sahibi tapılsa, belə ki, sədəqə verildiyinə razı olmasa, ehtiyat-.vacibə əsasən malın əvəzini ona verməlidir

## HEYVANLARIN BAŞINI KƏSMƏYİN VƏ – OVLAMAĞIN HÖKMLƏRİ

**Point**

Məsələ ۲۵۴۸: Əti halal olan heyvanlar, istər vəhşi olsun, istər ev heyvanı əgər onların başlarını sonra deyiləcək qayda ilə kəssələr, can verəndən sonra, onun əti halal və bədəni pakdır. Amma dəvənin, balığın və çəyirtkənin halal olması üçün başqa yol var .ki, sonrakı məsələlərdə qeyd olunacaq

Məsələ ۲۵۴۹: Əti halal olan vəhşi heyvanlar, məsələn; ceyran, kəklik, dağ keçisi və əti halal olub, sonradan vəhşi olan, məsələn; sonradan qaçıb vəhşi olmuş və tutulması mümkün olmayan əhli olan öküz və dəvə, əgər sonra deyiləcək qayda ilə onları ovlasalar, pak və halaldır. Amma qoyun, toyuq kimi əti halal olan heyvanla, tərbiyə .edilərək əhli olmuş əti halal vəhşi bir heyvan ovlamaqla pak və halal olmaz

Məsələ ۲۵۵۰: Əti halal olan vəhşi heyvan qaçıb və ya uça bildiyi təqdirdə, (ovlandıqda) pak və halal olur. Deməli, ceyranın qaça bilməyən, kəkliyin uça bilməyən balasını ovlamaqla pak və halal olmur. Əgər ahu və onun qaça bilməyən balası bir güllə ilə .ovlansa, ahu halal, balası haram olur

Məsələ ۲۵۵۱: Balıq kimi, sıçrayan qana malik olmayan, əti halal olan bir heyvan özü-.özünə ölərsə, pakdır. Amma onun ətini yemək olmaz

Məsələ ۲۵۵۲: Əti haram olan və qanı sıçramayan heyvanın, məsələn, ilan və kərtənkələ .kimi ölüsü pakdır. Deməli, onu ovlamağın və ya başını kəsməyin təsiri yoxdur

Məsələ ۲۵۵۳: İt və donuzu ovlamaqla və başını kəsməklə pak olmaz və onların ətini yemək də haramdır. Həmçinin yerdə yuva quran, sıçrayan qanı olan siçan kimi heyvanı .baş kəsmək və ya ovlamaqla əti və ya dərisi pak olmur

Məsələ ۲۵۵۴: Əvvəlki məsələdə deyilmişlərdən başqa əti haram olan heyvanları silah ilə ovlamaq, ya başını kəsməklə ətləri və dəriləri pak olur, istər yırtıcı olsunlar, istər qeyrisi. Hətta əgər (fiqhi nəzərdə ixtilaflı olan) fil, ayı və meymun olsa belə. Amma əgər .əti haram olan heyvanı silah, itlə şikar etsələr, pak olması məhəlli işkaldır

Məsələ ۲۵۵۵: Əgər diri heyvanın qarnından ölü bala çıxsa, ya onu çıxarsalar, onun ətini .yemək haramdır

**HEYVANLARIN BAŞINI KƏSMƏYİN QAYDASI**

Məsələ ۲۵۵۶: Heyvan kəsməyin üsulu belədir. Onun dörd böyük damarını tamam kəsməlidirlər: ۱- Nəfəs borusu, ۲- Udlaq (yemək borusu) ۳-۴-Hülqum və udlağın yan tərəflərində olan iki yoğun damar. Əgər onları yarsalar və ya təkcə hulqumu kəsərlərsə, ehtiyat-vacibə görə kifayət deyil. Bu dörd damarın kəsilməsi, boğazdakı .hulqum ilə udlağın ayrıldığı çıxıntının altından kəsilməsə, düz olmaz

Məsələ ۲۵۵۷: Əgər dörd damardan bəzisini kəssələr və gözləsələr ki, heyvan ölsün və sonra qalanını kəssinlər, faydası yoxdur. Amma onları can verməmişdən qabaq .kəssələr, adi qaydada bir-birinin ardınca olmasa, o heyvan pak və halaldır

Məsələ ۲۵۵۸: Əgər qurd qoyunun boğazını, boynunda kəsilməli olan dörd damardan bir şey qalmayacağı şəkildə yırtsa, o qoyun haram olur və həmçinin əgər hulqumundan da bir şey qalmasa, hətta əgər bir miqdar boynundan yırtsa və dörd damar başından asılı qalsa, ya bədəninə birləşik qalsa, o qoyun ehtiyat-vacibə əsasən haram olur. Amma bədəninin başqa bir yerini yırtsa, əgər qoyun diri olsa və deyilmiş qayda ilə .başını kəssələr, halal və pak olar. Bu hökm təkcə qurd ilə qoyuna aid deyil

## HEYVANLARIN BAŞINI KƏSMƏYİN ŞƏRTLƏRİ

:Məsələ ۲۵۵۹: Heyvanın başını kəsməyin bir neçə şərti vardır

Heyvanın başını kəsən istər kişi olsun, istərsə qadın, gərək müsəlman olsun. . ۱ Müsəlman uşağı əgər müməyyiz olsa, yəni yaxşı ilə pisi ayıra bilirsə, heyvanın başını kəsə bilər. Amma kitab əhli olmayan kafir və ya kafir hökmündə olan firqələrdən bir kəs, məsələn, nəvasib kimi, heyvanın başını kəssə, o heyvan halal olmaz, hətta kitab əhli olan kafir, əgər heyvanın başını kəssə, hərçənd «Bismillah» demiş olsa belə, .ehtiyat-vacibə əsasən o heyvan halal olmur

Heyvanın başını imkan daxilində dəmirdən olan şey ilə kəsməlidirlər. Ehtiyat-vacibə .۲ əsasən istil bıçaqla kəsmək kifayət deyil. Amma əgər dəmir tapılmasa, onun dörd damarını ayıra biləcək iti bir şey ilə, məsələn, şüşə və daş ilə də kəsmək olar, hərçənd .onun başını kəsməyə münasib zəruriyyət olmasa belə

Heyvan başı kəsilən vaxtı üzü qibləyə olmalıdır. Deməli, əgər ayaq üstə, ya oturan .۳ halda olsa, heyvanın üzü qibləyə olmağı insanın namazda üzü qibləyə olan halı kimidir. Əgər heyvan sağ, ya sol tərəfində uzadılmış olsa, gərək kəsilən yeri və qarnı üzü qibləyə olsun və onun ayaqlarının, əllərinin və üzünün qibləyə tərəf olmağı lazım deyil. O kəs ki, bilir heyvanın başı gərək üzü qibləyə kəsilsin və bilərəkdən onu qibləyə tərəf çevirməsə, heyvan haram olur, amma əgər yadından çıxarsa, ya məsələni bilməsə, ya qibləni səhv salsa eybi yoxdur. Əgər qiblənin hansı tərəfdə olduğunu bilməsə, ya başqasının köməyi ilə də olsa, heyvanı üzü qibləyə tərəf çevirə bilməsə, belə ki, heyvan ipə-sapa yatmayan olsa, ya bir çalaya düşmüş olsa və onu kəsməyə məcbur olsalar, hər istiqamətə zibh etsələr, eybi yoxdur. Əgər üzünü qibləyə çevirməkdə yubansalar, heyvan öləcəksə, hökm eynidir. Heyvanın üzü qibləyə kəsilməsinə etiqadı olmayan müsəlmanın zibh etməsi, üzü qibləyə kəsməsə

.də səhihdir. Ehtiyat-müstəhəb budur ki, heyvanın başını kəsənin də üzü qibləyə olsun

Heyvanın başını kəsən vaxt, ya bıçağı boğazına qoyduqda onu kəsən şəxsin özü baş .۴ kəsmək niyyəti ilə Allahın adını çəksin. Əgər kəsən şəxsdən başqası Allahın adını çəksə, kifayət deyil. «Bismillah» desə, hətta əgər yalnız «Allah» desə də, ehtiyatın xilafına olsa da, kifayətdir. Əgər baş kəsmək qəsdi olmadan Allahın adını çəksə, ya məsələni bilmədiyinə görə Allahın adını çəkməsə, o heyvan halal olmaz. Amma əgər yaddan .çıxarıb Allahın adını çəkməsə, eybi yoxdur

Heyvan başı kəsildikdən sonra gözünü, ya quyruğunu hərəkət etdirməklə, ya ayağı .۵ yerə vurmaqla olsa belə, çırpınmalıdır. Bu hökm heyvanın diri olmasına şübhə olduğu .təqdirdədir. Əgər belə olmasa, heç bir lüzum yoxdur

Heyvanın bədənindən adi miqdarda qan axmalıdır. Əgər qan onun damarlarında .۶ laxtalanarsa və ondan qan axmazsa və ya axan qan o növ heyvana nisbətdə az olarsa, o heyvan halal olmur, amma az qanın axması, heyvanın başını kəsməkdən .əvvəl qan axması olduğuna görə olsa, o halda eybi yoxdur

Boğazın kəsilməsi zibh etmək qəsdi ilə olmalıdır. Deməli, əgər bıçaq birinin əlindən .۷ düşsə və ixtiyarsız olaraq bir heyvanın başını kəssə, yaxud başı kəsən adam yuxulu, məst, bihuş, uşaq, dəli və başqa məqsədlə bıçağı heyvanın başına çəksə və təsadüfən .kəssə, halal olmaz

Məsələ ۲۵۶۰: Ehtiyat-vacibə əsasən ruh bədənindən çıxmamış heyvanın başını bədənindən ayırmaq olmaz. Belə ki, bu iş heyvanın haram olmağına səbəb olmaz. Amma əgər bilməməzlikdən olsa, ya bıçaq iti olduğuna görə baş ayrılsa, eybi yoxdur. Həmçinin ehtiyat-vacibə görə heyvanın boynunu sındırmaq və boynundan quyruğuna qədər uzanan və nuxa (onurğa beyini) adlanan ağ damarı, ruh bədənindən çıxmamış .kəsmək icazəli deyildir

## DƏVƏNİN NƏHR EDİLMƏSİNİN QAYDALARI

əsələ ۲۵۶۱: Dəvənin, can verdikdən sonra pak və halal olması üçün heyvanları kəsmək üçün deyilən şərtlərlə birlikdə bıçağı, yaxud da dəmirdən düzəldilmiş və kəsici olan aləti sinə ilə boyun arasında yerləşən çuxur yerə batırmalıdır. Daha yaxşı budur ki, .dəvə nəhr olunanda ayaq üstə olsun

Məsələ ۲۵۶۲: Əgər bıçağı dəvənin boynunun çuxuruna batırmaq əvəzinə onun başını kəssələr və ya qoyun, inək və bu kimi heyvanları kəsmək əvəzinə dəvə kimi boyunlarının çuxuruna bıçaq batırsalar, onların əti haram, bədənləri isə nəcisdir. Amma əgər dəvəni zibh etsələr və ölməmişdən əvvəl bıçağı boynunun çökəkliyinə batırsalar, onun əti halal və bədəni pakdır. Həmçinin əgər inək, qoyun və bu kimi .heyvanların boynunun çuxuruna bıçaq batırıb diri ikən başını kəssələr, halal və pakdır

Məsələ ۲۵۶۳: Əgər dəvə özbaşınalıq etsə ipə-sapa yatmasa və onu şəriətdə deyilən qayda ilə kəsə bilməsələr və ya məsələn; quyuya düşsə və orada öləcəyinə ehtimal verərlərsə və onu şəri qayda ilə kəsmək mümkün olmasa, bədəninin hər hansı yerinə bir yara vurub və o yaranın təsirindən can verərsə, halal olar, bu halda onun üzünü qibləyə çevirmək də lazım deyil. Amma heyvanın başını kəsmək üçün o biri şərtlərin də .olması gərəkdir

## HEYVAN KƏSİLƏNDƏ MÜSTƏHƏB OLAN ŞEYLƏR

Məsələ ۲۵۶۴: Fəqihlər (Allah onlara rəhmət eləsin) heyvanın başının kəsilməsində bir :neçə şeyi müstəhəbb bilmişlər

Qoyun kəsərkən, iki əl və bir ayağını bağlamaq, o biri ayağını isə sərbəst buraxmaq; .۱ İnək kəsərkən dörd ayağını da bağlayıb, quyruğunu sərbəst buraxmaq; Dəvə kəsərkən oturaq

halda olsa, iki qabaq ayağını aşağıdan dizə qədər və ya qoltuğunun altında bir-birinə bağlayıb, arxa ayaqlarını sərbəst buraxmaq, əgər ayaq üstə olsa, sol ayağını bağlamaq. Toyuğu, kəsildikdən sonra çırpınması üçün sərbəst buraxılması .müstəhəbdir

.Heyvanı kəsməzdən əvvəl qabağına su qoymaq .۲

Heyvanı, az əzab-əziyyət çəkəcək şəkildə kəssinlər; məsələn: bıçağı yaxşı itiləsinlər .۳ .və başını tez kəssinlər

## HEYVAN KƏSƏNDƏ MƏKRUH OLAN ŞEYLƏR

:Məsələ ۲۵۶۵: Bəzi rəvayətlərdə heyvan kəsilərkən bir neçə şey məkruh sayılmışdır

.Canı çıxmazdan əvvəl heyvanın dərisini soymaq .۱

.Heyvanı öz cinsindən olan başqa bir heyvanın gözü qabağında kəsmək .۲

Heyvanı gecə və ya cümə günü zöhrdən əvvəl kəsmək, amma ehtiyac olduğu halda, .۳ .məkruh deyil

.İnsanın özünün bəslədiyi dörd ayaqlı heyvanın başını kəsməsi .۴

## SİLAH İLƏ OV ETMƏNİN HÖKMLƏRİ

Məsələ ۲۵۶۶: Əgər əti halal olan vəhşi heyvanı silah ilə ovlasalar və o ölsə, beş şərt ilə .halal və bədəni pak olar

Ov silahı bıçaq və qılınc kimi kəsici və ya nizə və ox kimi iti olsun ki, heyvanın bədənini .۱ parçalasın. İkinci halda, əgər silahın süngüsü olmasa, halal olmasının şərti budur ki, heyvanın bədənini yaralasın, yaxud parçalasın. Əgər süngüsü olsa, yaralamasa da belə, onu öldürməsi kifayətdir. Əgər tələ, ağac və ya daş və bu kimi vasitə ilə bir heyvanı ovlasalar və o, ölsə, pak olmaz və onu yemək də haramdır. Həmçinin, ehtiyat-vacibə əsasən, silah olmayan iti bir şeylə, məsələn, böyük iynə, çəngəl, kabab şişi və .bu kimi şeylə heyvanı ovlasalar, hökm eynidir

Əgər bir heyvanı tüfəng ilə ovlasalar, belə ki, onun gülləsi heyvanın bədəninə daxil olaraq onu parçalayarsa, pak və halaldır, istər güllə iti olsun, istər olmasın. Güllənin də dəmirdən olması lazım deyil. Amma əgər güllə heyvanın bədəninə daxil olmasa və təzyiq nəticəsində heyvanı öldürsə, ya onun istiliyi ilə heyvanın bədənini yandırsa və .yandırmaq nəticəsində heyvan ölsə, onun pak və halal olması işkallıdır

Ov edən şəxs gərək müsəlman, ya yaxşı və pisi başa düşən müsəlman uşağı olsun. .۲ Əgər əhli-kitab olmayan kafir, ya kafir hökmündə olan (nəvasib kimi) şəxs bir heyvanı ovlasa, o ov halal deyil. Hətta əgər kitab əhli olan kafir bir heyvan ovlasa və Allahın .adını çəksə də, ehtiyat-vacibə əsasən o heyvan halal olmur

Silahı, heyvan ovlamaq üçün işlətsin. Əgər bir yeri nişan alıb, təsadüfən bir heyvanı .۳ öldürsə, o heyvan pak deyil və ətini yemək də haramdır. Amma əgər bir heyvanı .tuşlayıb atsa və başqasına dəyib öldürsə, halal olur

Silahı işlədən vaxt Allahın adını çəksin, belə ki, hədəfə dəyməzdən əvvəl Allahın adını .۴ çəksə, kifayət edər. Amma əgər bilə-bilə Allahın adını çəkməsə, ov halal olmaz, lakin .yaddan çıxarsa, eybi yoxdur

Heyvana çatanda ölmüş olsun və ya diri olarsa da, başını kəsəcək qədər vaxt .۵ olmamalıdır. Əgər başını kəsəcək qədər vaxtı olduğu halda, heyvanın başını kəsməsə .və heyvan ölərsə, o heyvan haramdır

Məsələ ۲۵۶۷: Əgər iki nəfər bir heyvan ovlasalar, onlardan biri yuxarıda deyilən şərtlərə əməl etsə, amma o biri əməl etməsə, məsələn, ikisindən biri Allahın adını .çəksə, o biri isə bilə-bilə Allahın adını çəkməsə, o heyvan halal deyil

Məsələ ۲۵۶۸: Əgər heyvanı; məsələn: güllə ilə vurduqdan sonra suya düşsə və insan onun həm güllə, həm də suya düşmək səbəbilə can verdiyini bilsə, halal deyil. Hətta .təkcə güllə səbəbilə ölüb-ölməməsində şəkk etsə də, halal deyil

Məsələ ۲۵۶۹: Əgər bir şəxs qəsbi it və ya qəsbi silah ilə heyvanı ovlasa, ov halal və onun .öz malıdır. Amma günah etməklə yanaşı silahın və ya itin muzdunu sahibinə verməlidir

Məsələ ۲۵۷۰: Əgər qılınc kimi ovçuluq aləti ilə heyvanın qol və ayağı kimi üzvlərindən birisini ayırarsa, o üzv haram olar. Amma əgər ۲۵۶۶-ci məsələdə deyilən şərtlərə uyğun olaraq o heyvanın başını kəsərlərsə, onun bədəninin yerdə qalanı halal olur. Əgər ovçuluq aləti keçən şərtlərə uyğun olaraq heyvanın bədəninin boyun və başını bir tərəfə salsa və insan heyvanın can verəndən sonra çatarsa, hər iki hissə halal olur. Heyvanın canlı olduğu halda başını kəsəcək qədər fürsət olmadığı təqdirdə də hökm eynidir. Amma əgər heyvanın başını kəsə biləcək qədər fürsət olub, heyvanın bir müddət canlı qalması mümkün olarsa, baş və boyunun üzərində olmayan hissə haramdır, baş və boyun üzərində olan hissə isə şəriətdə göstərilən göstərişə uyğun .olaraq kəsilərsə halal, əks təqdirdə o da haramdır

Məsələ ۲۵۷۱: Əgər ağac, daş və ya ov etmək səhih olmayan başqa şeylə bir heyvanı iki yerə bölsələr, üstündə baş və boynu olmayan tərəf haramdır. Baş və boynu olan tərəf isə əgər diri olsa və bir qədər diri qalmağı mümkün olsa, şəriətdə müəyyən olunmuş .qayda ilə onun başını kəssələr, halal olar. Əgər belə olmasa, o hissəsi də haram olar

Məsələ ۲۵۷۲: Əgər bir heyvanı ovlasalar və ya başını kəssələr, onun qarnından balası diri çıxsa, bu halda onu şəriət qaydalarına uyğun kəssələr, halal, əks halda isə .haramdır

Məsələ ۲۵۷۳: Əgər bir heyvanı ovlasalar, ya başını kəssələr və onun qarnından ölü bala çıxarsalar, əgər o bala o heyvanı öldürməzdən əvvəl ölməmiş olsa və həmçinin o heyvanın qarnından gec çıxarma səbəbindən də ölməyibsə, belə ki, balanın xilqəti .tamamlanmış olub, bədəninin tük və ya yunu çıxıbsa, pak və halaldır

## OV İTİ İLƏ OV ETMƏK

Məsələ ۲۵۷۴: Əgər ov iti əti halal olan vəhşi bir heyvanı ovlasa, o heyvanın pak və halal :olmasının altı şərti vardır

İt elə tərbiyə olunsun ki, onu nə vaxt ovu tutmaq üçün göndərsələr getsin və nə vaxt .۱ getməyinin qarşısını alsalar, dayansın. Amma ova yaxınlışdığı və onu gördüyü zaman

qarşısını almaqla dayanmazsa, zərəri yoxdur. Həmçinin sahibi gələnədək ovdan yeməyi adət etmişsə eybi yoxdur. Ovun qanını yeməyi adət etmiş olsa da, eybi yoxdur. Amma ehtiyat-vacibə əsasən sahibi ovu ondan almaq istədiyi vaxt mane olmamasının .onda adət olması şərtdir

Sahibi onu göndərsin, əgər özü ovun dalınca getsə və bir heyvanı ovlasa, o heyvanı .۲ yemək haramdır. Hətta əgər it özü ovun dalınca getsə və sonradan sahibi səslənsə ki, iti daha tez ova çatdırsın, sahibinin səsi ilə tələssə də ehtiyat-vacibə əsasən, o ovu .yeməkdən çəkinsinlər

.İti göndərən şəxs, silahla ovlama bəhsində deyildiyi kimi gərək müsəlman olsun .۳

Şikarçı iti göndərən vaxt ya it heyvana çatmazdan qabaq Allahın adını çəksin. Əgər .۴ .bilə-bilə Allahın adını çəkməsə, ov haramdır. Amma əgər yaddan çıxarsa, eybi yoxdur

Ov, itin dişindən aldığı yara səbəbilə ölsün; Deməli, it ovu boğsa, yaxud ov qaçmaqla .۵ .və ya qorxudan ölsə, halal deyil

İti göndərən şəxs, ora çatan zaman heyvan ölmüş olsun, əgər diridirsə, baş .۶ kəsməyə vaxt olmasın (amma ova çatmaqda adi haldan artıq gecikməsin). Amma əgər heyvanın başını kəsə biləcək qədər vaxtın olduğu halda çatsa və heyvan ölənə .qədər başını kəsməsə, halal deyildir

Məsələ ۲۵۷۵: İti göndərən şəxs, ora çatan zaman heyvanın başını kəsə bilərsə, belə ki, bıçağı çıxartmaq kimi hazırlıq görəndə vaxt keçsə və o heyvan ölsə, halaldır. Amma əgər heyvanı kəsmək üçün yanında bir şey olmasa və heyvan ölsə, ehtiyat-vacibə .əsasən, halal deyil. Əlbəttə bu halda heyvanı buraxsa və it onu öldürsə, halal olar

Məsələ ۲۵۷۶: Əgər bir neçə iti birlikdə bir heyvanı ov etmək üçün göndərsələr, belə ki, onların hamısında ۲۵۷۴-ci məsələdə deyilmiş şərtlər olsa, ov halaldır, əgər onların .birində o şərtlər olmasa, ov haramdır

Məsələ ۲۵۷۷: Əgər iti bir heyvanı ovlamaq üçün göndərsə və it başqa heyvanı ovlasa, o

ov halal və pakdır. Həmçinin əgər o heyvanı başqa bir heyvan ilə birlikdə ovlasa, .onların hər ikisi halal və pak olar

Məsələ ۲۵۷۸: Əgər neçə nəfər birlikdə iti göndərsələr və onlardan biri bilə-bilə Allahın adını çəkməsə, o ov haramdır. Həmçinin əgər göndərdikləri itlərdən biri ۲۵۷۴-ci .məsələdə deyildiyi kimi tərbiyə olunmasa, o ov haram olar

Məsələ ۲۵۷۹: Əgər şahin və ya ov itindən başqa bir heyvan bir heyvanı ovlasa, o ov halal deyil. Amma ovlanan heyvana canlı olduğu halda yetişərlərsə və onu İslami .qaydalara əsasən kəsərlərsə, halaldır

**BALIQ VƏ ÇƏYİRTKƏ OVU**

Məsələ ۲۵۸۰: Əgər əsl yaradılışında pulcuqu olan balıq, sonradan hər hansı bir səbəbə görə pulcuqu tökülmüş olsa da, sudan diri tutub, sudan kənarda can verərsə, pak və onu yemək halaldır. Belə ki, suda ölsə pak, amma onu yemək haramdır. Hərçənd zəhər kimi bir vasitə ilə ölmüş olsa belə. Amma əgər balıqçının torunda suda ölərsə, bu halda onu yemək halaldır. Pulcuqsuz balığı sudan diri tutsalar da və sudan kənarda .can versə də, haramdır

Məsələ ۲۵۸۱: Əgər balıq sudan kənara düşsə və ya dalğa onu kənara atsa, yaxud su çəkilsə və balıq quruda qalsa, belə ki, ölməmişdən qabaq bir kəs onu əl ilə ya başqa bir .şey ilə tutsa, can verəndən sonra halal olar. Əgər tutmazdan əvvəl ölsə, haramdır

Məsələ ۲۵۸۲: Balıq tutan adamın müsəlman olmağı və tutan zaman Allahın adını çəkməsi lazım deyil. Amma gərək müsəlman, onun sudan diri tutulduğunu və ya suyun .içində balıqçının torunda öldüyünü görsün, ya da başqa bir yolla buna xatircəm olsun

Məsələ ۲۵۸۳: Sudan diri və ya ölü tutulması məlum olmayan balıq müsəlmanın əlində olsa və onda halal olmasını göstərən bir təsərrüf etsə, məsələn yemək, ya satmaq kimi, halaldır. Əgər kafirin əlində olsa, diri tutduğunu desə də, haramdır. Amma əgər insanın, onun sudan diri tutulduğuna və ya suda balıqçı torunda öldüyünə xatircəmliyi .olarsa, halaldır

.Məsələ ۲۵۸۴: Canlı balığı yemək halaldır

Məsələ ۲۵۸۵: Əgər diri balığı qızartsalar, ya sudan kənarda can verməmişdən qabaq .öldürsələr, onu yemək caizdir

Məsələ ۲۵۸۶: Əgər balığı sudan kənarda iki yerə bölsələr və onun bir hissəsi diri halda .suya düşsə, sudan kənarda qalmış hissəni yemək caizdir

Məsələ ۲۵۸۷: Əgər çəyirtkəni əl və ya başqa bir şey ilə diri tutsalar, can verəndən sonra halaldır. Onu tutan şəxsin müsəlman olması və tutan vaxt Allahın adını çəkməsi lazım deyil. Amma əgər ölü çəyirtkə kafirin əlində olsa, onun diri ya ölü tutulması məlum .olmasa, «diri tutmuşam» deməsinə baxmayaraq, haramdır

.Məsələ ۲۵۸۸: Qanad çıxarmamış və uça bilməyən çəyirtkəni yemək haramdır

## YEMƏLİLƏRİN VƏ İÇMƏLİLƏRİN HÖKMLƏRİ

### Point

Məsələ ۲۵۸۹: Şahin, kərkəs, qırğı və qartal kimi yırtıcı və caynaqlı olan hər quşun əti haramdır. Ehtiyat-vacibə əsasən bütün qarğa növləri də haramdır. Qanad çalması süzməsindən az olan hər quş caynaqlıdır və əti haramdır. Qanad çalması süzməsindən çox olan hər quşun da əti halaldır. Buna əsasən quşların əti halal olanlarını haram olanlardan onların uçma tərzinə baxmaqla ayırmaq mümkündür. Amma əgər bir quşun uçma tərzi məlum olmasa, əgər onun çinədanı, ya mədə və ya ayağının arxasında buynuzu varsa, halaldır. Əgər bunlardan heç biri onda olmazsa, haramdır. Amma deyilənlərdən başqa toyuq, göyərçin, sərçə, hətta dəvə quşu və tovuz quşu kimi digər quşların hamısı halaldır. Amma hüdhüd və qaranquş kimi bəzi quşları öldürmək məkruhdur. Yarasa kimi, uçduqları halda qanadları olmayan heyvanların əti isə haramdır. Həmçinin ehtiyat-vacibə əsasən, arı, milçək və digər uçan həşəratlar da .eyni hökmü daşıyır

Məsələ ۲۵۹۰: Ruhu olan bir şeyi, canlı bir heyvandan qopararlarsa, məsələn, quyruq və .ya bir parça əti canlı bir qoyundan ayırarlarsa, nəcis və haramdır

Məsələ ۲۵۹۱: Əti halal olan heyvanların bədəninin bəzi üzvləri haramdır. Onların sayı ۱۴-:dür

.Qan .۱

.Fəzlə .۲

.Erkəklik; cinsiyyət üzvü .۳

.Dişilik; cinsiyyət üzvü .۴

.Balalıq .۵

(.Duşul" adlanan vəzlər; (artıq ətlər" .۶

.Noxud ölçüsündə beynində olan şey .۸

.Onurğa sütunun içində olan haram ilik .۹

.Ehtiyat-vacibə əsasən, onurğa sütunun iki tərəfində olan piy .۱۰

.Öd kisəsi .۱۱

.Dalaq .۱۲

.Sidik kisəsi .۱۳

.Gözlərin bəbəyi .۱۴

Bunların hamısı quş, balıq və çəyirtkə olmayan, əti halal heyvanlarda, haram olan üzvlərdir. Quşlara gəlincə isə onların qan və ğaiti şübhəsiz haramdır. Amma bu ikisindən başqa, yuxarıda deyilən şeylərdən birisi onlarda olarsa, onun haram olması ehtiyat-vacibə əsasəndir. Həmçinin, ehtiyat-vacibə əsasən, balığın qan və fəzləsi, .çəyirtkənin fəzləsi də eyni hökmü daşıyır. Bunlardan başqa şeylər onlarda haram deyil

Məsələ ۲۵۹۲: Əti haram olan heyvanın sidiyini içmək haramdır. Əti halal olan heyvanların sidiyi də hətta ehtiyat-lazıma əsasən, dəvənin də sidiyi eyni hökmü .daşıyır. Amma müalicə üçün, dəvə, inək və qoyunun sidiyini içməyin eybi yoxdur

Məsələ ۲۵۹۳: Palçığı yemək haramdır. Ehtiyat-lazıma əsasən, torpaq və qum da, eyni hökmü daşıyır. Müalicə üçün, çarəsiz qaldığı halda Dağıstan, İrəvan və onlardan başqa palçığı yeməyin, işkalı yoxdur. Şəfa tapmaq üçün Həzrət Seyyidüş-şühədanın (əleyhis-səlam) türbətindən orta ölçülü noxud qədər yemək caizdir və əgər onu müqəddəs qəbrin özündən və ya ətrafından götürməsələr, hərçənd «imam Hüseynin (əleyhis-səlam) türbəti» adlana bilsə də, ehtiyat-vacibə görə gərək bir miqdar suda və bu kimi şeydə həll etsinlər ki, aradan getsin. Sonra o suyu içsinlər. Həmçinin türbətin imam Hüseynin (əleyhis-səlam) qəbrindən olmasına xatircəm olmasalar, bu barədə bir dəlil .də olmasa, bu ehtiyata riayət etmək lazımdır

Məsələ ٢٥٩٤: Burun suyu və ağıza gəlmiş sinə bəlğəmini udmaq haram deyil və .həmçinin dişləri təmizləyərkən onun dibindən çıxan yeməyi udmağın eybi yoxdur

.Məsələ ۲۵۹۵: Ölümə səbəb olan, ya insana mühüm bir zərəri olan şeyi yemək haramdır

Məsələ ۲۵۹۶: At, qatır və ulaq ətini yemək məkruhdur. Əgər bir şəxs onlarla yaxınlıq etsə, əti haram olar və yaxınlıqdan sonrakı südü və nəsilləri də ehtiyat-vacibə əsasən haram olar. Onların sidik və peyini də nəcis olar, gərək onları şəhərdən çıxartsınlar və başqa yerdə satsınlar; yaxınlıq edən əgər onun sahibi deyilsə, lazımdır ki, onun qiymətini sahibinə versin. Satılmasından əldə edilən pul da yaxınlıq edən üçündür. Əgər əti adətən istifadə olunan heyvan ilə (məsələn; dəvə inək və qoyun) yaxınlıq etsə, onların sidik və peyini nəcis olar. Onların ətini yemək də haramdır. Ehtiyat-vacibə əsasən, onların südünü içmək və yaxınlıqdan sonra onlardan törəyən nəsil də, eyni hökmü daşıyır. Gərək dərhal o heyvanı öldürsünlər və yandırsınlar, onunla yaxınlıq .edən şəxs, əgər onun sahibi deyilsə, pulunu sahibinə versin

Məsələ ۲۵۹۷: Əgər çəpiş donuzdan, ət və sümüyü qüvvət alan miqdarda süd əmərsə, onun özü, nəsli və südü haram olar. Amma əgər bundan az miqdarda süd əmərsə, ehtiyat-vacibə əsasən istibra edilməlidir və bundan sonra halal olur. Onun istibrası isə yeddi gün pak süd əmməsi ilə olur, əgər süd əmməyə ehtiyacı yoxdursa, yeddi gün ot yeməlidir. Ehtiyat-vacibə əsasən südəmən buzov, quzu və digər əti halal heyvanların balaları da, eyni hökmü daşıyır. Nəcis yeyən heyvanın da ətini yemək haramdır. Belə ki, istibra edilərlərsə, halal olar. Bunların da istibrasının necəliyi ۲۱۹-cu məsələdə bəyan .olub

Məsələ ۲۵۹۸: Şərab içmək haramdır və bəzi hədislərdə böyük günahlardan hesab edilib. Həzrət İmam Sadiqdən (əleyhis-səlam) rəvayət olunmuşdur ki, Şərab pisliklərin kökü və günahların mənşəyidir. Şərab içən şəxs, öz əqlini əldən verir və o zaman Allahı tanımır, heç günahdan çəkinmir, heç kəsin ehtiramını saxlamır, yaxın qohumlarının haqqına əməl etmir, aşkar çirkinliklərdən üz döndərmir. Əgər bir qurtum içsə, Allah, mələklər, peyğəmbərlər və möminlər ona lənət edirlər. Əgər sərxoş olana qədər içərsə, iman və Allah tanımaq ruhu ondan

uzaqlaşar, onun yerinə nöqsanlı xəbis ruh qərarlaşar. Qırx günə kimi onun namazı .qəbul olmur

Məsələ ۲۵۹۹: Şərab içilən süfrədən bir şey yemək haramdır. Ehtiyat-vacibə əsasən .şərab içilən süfrədə oturmaq haramdır

Məsələ ۲۶۰۰: Hər müsəlmana vacibdir ki, əgər öz canı təhlükədə olmasa, aclıqdan və ya susuzluqdan ölmək ərəfəsində olan başqa bir müsəlmana su və çörək verib, ölümdən nicat versin. Həmçinin o şəxs müsəlman olmasa da, amma qətli vacib .olmayan bir insandırsa, hökm eynidir

## YEMƏK YEMƏYİN ƏDƏBLƏRİ

:Məsələ ۲۶۰۱: Yemək yeyərkən bir neçə şey müstəhəbdir

.Yeməkdən qabaq hər iki əli yumaq .۱

.Yeməkdən sonra əlini yuyub dəsmal ilə qurulamaq .۲

Süfrə sahibi yeməyə hamıdan əvvəl başlasın və hamıdan sonra qurtarsın.. ۳ Yeməkdən əvvəl süfrə sahibi öz əlini yusun, sonra onun sağ tərəfində oturan adamdan başlayıb, onun sol tərəfində oturan adama qədər tərtib ilə əllərini yusunlar. Yeməkdən sonra süfrə sahibinin sol tərəfində oturandan başlayıb süfrə sahibinə .qədər əllərini yusunlar

Yeməyə başlayanda «Bismillah» desin. Amma süfrədə bir neçə növ yemək olsa, . ۴ .onların hər birini yeməyə başlayanda «Bismillah» desin

.Yeməyi sağ əli ilə yemək .۵

.Üç barmaq, ya çox barmaqla yemək yemək; İki barmaqla yemək yeməsin .۶

.Əgər bir neçə nəfər süfrədə otursalar, hər şəxs, öz qabağındakı yeməklərdən yesin .۷

.Tikəni kiçik götürsün .۸

٩. Süfrə başında çox otursun və yeməyi uzatsın.

١٠. Yeməyi yaxşı çeynəsin.

١١. Yeməkdən sonra aləmlərin Rəbbinə həmd etsin.

١٢. Barmaqlarını yalasın.

۱۳. Yeməkdən sonra dişlərini təmizləsin, amma reyhan, qamış, nar çubuğu və xurma ağacının yarpağı ilə təmizləməsin.

۱۴. Süfrənin kənarına tökülən şeyi yığıb yesin. Amma əgər səhrada yemək yeyirsə, müstəhəbdir ki, yerə tökülənləri quşlar və heyvanlar üçün saxlasın.

۱۵. Günün əvvəlində və gecənin əvvəlində yemək yesin, gecənin ortasında və günün ortasında yemək yeməsin.

۱۶. Yeməkdən sonra arxası üstə uzansın və sağ ayağını sol ayağının üstünə qoysun.

۱۷. Yeməyin əvvəlində və axırında duz yesin.

۱۸. Meyvəni yeməmişdən qabaq su ilə yusun.

### YEMƏK YEYƏRKƏN MƏKRUH OLAN ŞEYLƏR

Məsələ ۲۶۰۲: Yemək yeyərkən bir neçə şey məkruhdur:

۱. Tox olduğu halda yemək yemək.

۲. Çox yemək; Hədislərdə Allahın hər şeydən çox, dolu qarından acığı gəldiyi nəql olunmuşdur.

۳. Yemək yeyərkən başqalarının üzünə baxmaq.

۴. Çox isti xörək yemək.

۵. İçdiyi və ya yediyi bir şeyi üfürmək.

۶. Süfrəyə çörək qoyduqdan sonra başqa bir şeyi gözləmək.

۷. Çörəyi bıçaqla kəsmək.

۸. Çörəyi xörək qabının altına qoymaq.

۹. Sümüyə yapışmış əti heç bir şey qalmayacağı şəkildə təmizləmək.

.Qabıqlı yeyilən meyvənin qabığını soymaq .۱۰

.Meyvəni tamam yemədən atmaq .۱۱

## SU İÇMƏYİN QAYDALARI

:Məsələ ۲۶۰۳: Su içməyin bir neçə qaydası vardır

.Suyu sovurub içmək .۱

.Gündüz ayaq üstə su içmək .۲

.Suyu içməmişdən qabaq «Bismillah», sonra isə «Əlhəmdu lillah» demək .۳

.Suyu üç dəfəyə içmək .۴

.Meyli olanda su içmək .۵

Su içəndən sonra İmam Hüseyn (əleyhis-səlam) və onun əhli-beytini yad edib və .۶ .onun qatillərinə lənət göndərmək

#### SU İÇƏNDƏ MƏKRUH OLAN ŞEYLƏR

Məsələ ۲۶۰۴: Çox su içmək, yağlı xörəkdən sonra və gecə ayaq üstə içmək bəyənilməz hesab edilmişdir. Suyu sol əli ilə, həmçinin qabın sınıq yerindən və onun dəstəsi olan .yerindən içmək bəyənilməz hesab olunub

## NƏZR VƏ ƏHDİN HÖKMLƏRİ

Məsələ ۲۶۰۵: Nəzr, insanın Allah üçün, xeyir bir iş etməyi, ya da edilməməsi daha yaxşı .olan bir işi tərk etməyi özünə vacib etməsinə deyilir

Məsələ ۲۶۰۶: Nəzirdə əqd oxunmalıdır. Amma onun ərəb dilində oxunması lazım deyildir. Məsələn; «Xəstəm yaxşı olsa, Allah rizası üçün bir fəqirə ۱۰ manat pul verəcəyəm» deyərsə, nəziri səhihdir. Əgər «Allah üçün bu işi görməyi nəzir edirəm» desə, ehtiyat-vacibə görə əməl etməlidir. Amma əgər Allahın adını çəkməsə, təkcə «nəzir etdim» desə, yaxud Allah övliyalarından birinin adını çəkərsə, nəzr səhih deyildir. Əgər nəzir səhih olsa və mükəlləf öz nəzrinə qəsdən əməl etməsə, günah etmiş olur və kəffarə verməlidir. Nəzrə əməl etməməyin kəffarəsi sonradan deyiləcəyi kimi, and .ilə müxalifət etməyin kəffarəsi kimidir

Məsələ ۲۶۰۷: Nəzr edən, gərək həddi-büluğa çatmış və ağıllı olsun, özü qəsd və ixtiyarla nəzr etməlidir. Buna görə də, icbari və ya əsəbilik vasitəsilə, qeyri-ixtiyari və .qəsdsiz nəzr edərsə, səhih deyildir

Məsələ ۲۶۰۸: Malını boş yerə xərcləyən səfeh bir şəxs, əgər fəqirə bir şey verməyi nəzir edərsə, səhih deyildir. Həmçinin müflis olmuş bir şəxs, məsələn, istifadə edilməsi .qadağan olunduğu mallarından bir şeyi fəqirə verməyi nəzr edərsə, səhih deyildir

Məsələ ۲۶۰۹: Ərinin əvvəldən icazə vermədiyi, yaxud sonradan icazəsi olmadan, qadının ərinin ondan ləzzət alma haqqına zidd olan hallarda, nəzr etməsi səhih deyildir. Hətta əgər izdivacdan əvvəl nəzir etmiş olsa, hökm eynidir. Qadının öz malından nəzr .etməsi, ərindən icazəsi olmadan məhəlli işkaldır

Deməli, ehtiyata riayət olunmalıdır. Amma həcc, zəkat, sədəqə, ata-anaya ehsan .etmək və sileyi-ərham istisnadır

Məsələ ۲۶۱۰: Əgər qadın ərinin icazəsilə nəzr edibsə, əri onun nəzrini poza bilməz və .onu nəzrə əməl etməsinin qarşısını ala bilməz

Məsələ ۲۶۱۱: Övladın nəzrində atasının icazəsi şərt deyil. Amma əgər, ata ya anası onu nəzr etdiyi əməldən çəkindirsə, onların nəhy etməsi mehribanlıq, ürəyiyananlıq üzündən olsa və övladın müxalifət etməsi onların əzab-əziyyətə düşməsinə səbəb .olacaqsa, nəzr batil olur

Məsələ ۲۶۱۲: İnsan, ancaq özü üçün əməl etməsi mümkün olan bir işi nəzir edə bilər. Buna görə də, əgər Kərbəlaya piyada gedə bilməyən şəxs, Kərbəlaya piyada getməyi nəzr edərsə, onun nəzri səhih deyildir. Əgər nəzr etdiyi vaxt qadir olsa, amma əgər sonradan aciz olsa, onun nəzri batil olur, onun üzərinə heç bir şey vacib olmaz. Amma nəzr etdiyi şey oruc tutmaq olarsa və onu tutmağa qadir olmasa ehtiyat-vacib budur ki, ya bir fəqirə ۷۵۰ qram yemək sədəqə versin, ya da başqa bir kəsə ۱,۵ kq versin ki, .onun əvəzinə oruc tutsun

Məsələ ۲۶۱۳: Əgər məkruh, haram bir iş görməyi, yaxud vacib, müstəhəb işi tərk .etməyi nəzr etsə, nəzri səhih deyil

Məsələ ۲۶۱۴: Əgər mübah bir işi etməyi və ya tərk etməyi nəir edərsə, əgər o işi etmək və etməmək şərən hər cəhətdən bərabər olsa, onun nəziri səhih deyildir. Amma əgər onu etmək bir cəhətdən şərən daha yaxşı olsa və insan da həmin cəhətdən nəzir edərsə, məsələn, ibadətdə daha güclü olmaq üçün bir yemək yeməyi nəzr edərsə, nəzri səhihdir. Həmçinin onu tərk etmək bir cəhətdən şərən daha yaxşı olarsa, insan da həmin cəhətdən onu tərk etməyi nəzr edərsə, məsələn, siqaret tüstüsünün zərərli olduğu və şəri vəzifəsini ən gözəl şəkildə yerinə yetirməyə mane olduğu üçün siqaret çəkməməyi nəzr edərsə, nəzri səhihdir. Amma əgər sonradan siqareti tərk etməyi ona .zərərli olarsa, nəzr batil olur

Məsələ ٢۶١۵: Öz vacib namazını, namazın savabını öz-özlüyündə artırmayan bir yerdə, məsələn, bir otaqda qılmağı nəzr edərsə, əgər orada namaz qılmaq bir cəhətdən şərən daha

yaxşıdırsa, məsələn, tənha olmaq vasitəsilə insan hüzuriqəlb taparsa, o da bu .cəhətdən nəzr edibsə, nəzr səhihdir

Məsələ ۲۶۱۶: Əgər bir işi görməyi nəzr edərsə, gərək onu nəzr etdiyi şəkildə etsin. Buna görə də əgər ayın birinci günü sədəqə verməyi və ya oruc tutmağı, ya da ayın əvvəlinin namazını qılmağı nəzr edərsə, bunları o gündən bir gün əvvəl və ya sonra edərsə, kifayət deyildir. Həmçinin «xəstəm sağalarsa, sədəqə verəcəyəm» deyə nəzr edibsə, .xəstəsi sağalmazdan əvvəl sədəqəni verərsə, kifayət etməz

Məsələ ۲۶۱۷: Oruc tutmağı nəzir etsə, amma vaxtını və miqdarını müəyyən etməsə, bir gün oruc tutsa kifayətdir. Əgər namaz qılmağı nəzr etsə, lakin miqdar və xüsusiyyətlərini müəyyən etməsə, iki rəkət namaz, ya vitr namazını qılsa, kifayətdir. Əgər sədəqə verməyi nəzr etsə, amma onun növ və miqdarını müəyyən etməsə, «sədəqə verdi» deyiləcək miqdarda bir şey verərsə, nəzirinə əməl etmiş olar. Əgər Allah üçün hər hansı bir işi yerinə yetirməyi nəzr edərsə, bir namaz qılıb və ya bir oruc .tutub, ya da bir sədəqə verərsə, nəzrni yerinə yetirmiş olar

Məsələ ۲۶۱۸: Müəyyən bir gündə oruc tutmağı nəzir edərsə, gərək o günü oruc tutsun. Qəsdən o günü oruc tutmasa, gərək onun qəzasını tutmaqdan əlavə, kəffarəsini də versin. Amma o günü ixtiyarlı halda səfərə çıxa bilər və oruc tutmaya bilər. Səfərdə olsa, iqamət qəsdi edib, oruc tutması lazım deyildir. Əgər səfərə çıxmaq səbəbindən, ya xəstəlik və ya heyz kimi digər üzr səbəbindən o günü oruc tutmasa, lazımdır ki, o .gününün qəzasını tutsun, amma kəffarəsi yoxdur

.Məsələ ۲۶۱۹: Əgər insan ixtiyarlı halda nəzirinə əməl etməsə, gərək kəffarə versin

Məsələ ۲۶۲۰: Müəyyən bir vaxta qədər bir işi tərk etməyi nəzir edərsə, vaxt keçdikdən sonra o işi edə bilər. Əgər vaxtı keçməzdən qabaq unutqanlıq və ya çarəsizlik üzündən o işi edərsə, ona bir şey vacib olmaz. Fəqət yenə də, o vaxta qədər gərək o işə əməl etməsin və ikinci dəfə müəyyən etdiyi vaxtdan qabaq üzrsüz olaraq o işi edərsə, gərək .kəffarə versin

Məsələ ۲۶۲۱: Bir şəxs, bir əməli tərk etməyi nəzr etsə və onun üçün müəyyən bir vaxt təyin etməsə, əgər unutqanlıq, çarəsizlik və ya bilməməzlik və qəflət üzündən o əməli edibsə, ya bir kəs onu məcbur etsə, ya qasir cahil olsa, kəffarə ona vacib olmaz. Amma nəzr öz yerində qalır. Belə ki, əgər sonradan onu öz ixtiyarı ilə edərsə, gərək kəffarə .versin

Məsələ ۲۶۲۲: Hər həftə müəyyən bir gündə, məsələn, cümə günü, oruc tutmağı nəzir edərsə, əgər cümə günlərindən birisi Ramazan və ya Qurban bayramı gününə düşərsə, ya cümə günü səfər və ya heyz kimi oruc tutmasına mane olan bir üzrü .olarsa, o gün oruc tutmamalı və onun qəzasını tutmalıdır

Məsələ ۲۶۲۳: Əgər bir miqdar sədəqə verməyi nəzir etsə və sədəqə verməzdən qabaq ölərsə, onun malından o miqdarı sədəqə vermək lazım deyildir. Amma daha yaxşı odur .ki, varislərdən həddi-büluğa çatanı o miqdarı öz payından və meyyitin adından versin

Məsələ ۲۶۲۴: Əgər müəyyən bir fəqirə sədəqə verməyi nəzr edərsə, onu başqa bir .fəqirə verə bilməz. Əgər o fəqir ölərsə, onun varisinə verməsi lazım deyil

Məsələ ۲۶۲۵: Əgər İmamlardan hər hansı birinin (məsələn: Həzrəti Əba Əbdillahın (əleyhis-salam) ziyarətinə getməyi nəzr edib başqa İmamın ziyarətinə getsə, kifayət deyil. Əgər müəyyən üzr səbəbilə həmin İmamı ziyarət edə bilməsə, ona bir şey vacib .deyil

Məsələ ۲۶۲۶: Ziyarətə getməyi nəzr edən, amma ziyarət qüslü və ziyarət namazını nəzr .etməyən bir şəxsin, onları yerinə yetirməsi lazım deyil

Məsələ ۲۶۲۷: Əgər bir şəxs, imamlardan və ya imam övladlarından birinin hərəmi üçün bir şey nəzr etsə və hansı işdə xərcləməyi nəzərində tutmasa, gərək onu hərəmin təmirində, işıqlandırılmasında, döşənmə və bu kimi işlərdə xərcləsin. Əgər mümkün olmasa, yaxud o hərəmin heç bir ehtiyacı olmasa, o hərəmin yoxsul ziyarətçilərinə sərf .etməlidir

Məsələ ۲۶۲۸: Əgər Peyğəmbər (səlləllahu ələyhi və alihi və səlləm), ya imamlardan

(əleyhis-səlam) ya imam övladlarından biri, ya keçmiş alimlərdən və bu kimi şəxslərdən biri üçün bir

şey nəzir edib müəyyən yerdə xərclənməsi qəsd edərsə, gərək ona sərf etsin. Amma müəyyən bir yerdə xərclənməsi qəsd etməyibsə, o həzrətə nisbəti olan bir məsrəfə xərcləməlidir, məsələn, onun fəqir ziyarətçilərinə və ya onun hərəminə, ya da onun .adının daha da ucalmasına səbəb olan işlərə xərcləməlidir

Məsələ ۲۶۲۹: Sədəqə və ya İmamlardan (ələyhimus-səlam) biri üçün nəzr edilmiş qoyun, nəzrə sərf edilməzdən əvvəl süd versə və ya doğarsa, ümumi qəsd etməyibsə, .nəzr edən şəxsin malıdır. Amma qoyunun yunu və kökələn miqdarı nəzrə aiddir

Məsələ ۲۶۳۰: Əgər xəstəsinin sağalması və ya səfərdə olanı qayıtması üçün bir işi nəzr edərsə, sonradan xəstənin nəzr etməzdən əvvəl sağaldığı və ya səfərdə olanın .nəzrdən əvvəl qayıtdığı məlum olarsa, nəzrə əməl etməyi lazım deyildir

Məsələ ۲۶۳۱: Əgər ata ya ana, qızını Seyyid olan və ya başqa bir şəxslə evləndirməyi .nəzr edərsə, qızla əlaqədar bu nəzrin etibarı yoxdur və ona bir təklif gəlməz

Məsələ ۲۶۳۲: Əgər bir şəxs, şəri olan hacətinə çatarsa, bir işi etməyi Allahla əhd etsə, hacətinə çatmış olsa, gərək o işi etsin. Həmçinin bir hacəti olmadan bir işi görməyi əhd .edərsə, o işi etmək ona vacibdir

Məsələ ۲۶۳۳: Əhddə də, nəzidə olduğu kimi, gərək əqd oxunsun. Məsələn, desin ki, «Allahla əhd etdim ki, belə edəm» yerinə yetrilməsi əhd olunan işin şərən daha yaxşı bir iş olmasa, vacib deyil. Sadəcə şəriətdə nəhy edilməmiş işdən olmasa və əql sahiblərinin nəzərində üstünlüyə malik olması və ya şəxs üçün o işdə müəyyən məsləhət olması kifayətdir. Əgər əhd ediləndən sonra o işdə məsləhət olmasa, yaxud .şərən bəyənilməyən olsa, hərçənd məkruh da olsa, ona əməl etmək lazım deyil

Məsələ ۲۶۳۴: Əgər öz əhdinə əməl etməsə, günah etmişdir və gərək kəffarə versin. .Yəni, altmış fəqiri doydurmalı, iki ay ardıcıl oruc tutmalı, yaxud bir qul azad etməlidir

## AND İÇMƏYİN HÖKMLƏRİ

Məsələ ۲۶۳۵: Əgər bir işi yerinə yetirəcəyinə, ya tərk edəcəyinə and içsə, məsələn, oruc tutmağını, ya siqaret çəkməməyini and içsə, belə ki, bilə-bilə andı ilə müxalifət etsə, günah etmiş olur və gərək kəffarə versin, yəni bir qul azad etsin, ya on fəqiri doydursun, ya onları geyindirsin, əgər bunları edə bilməsə, gərək üç gün ardıcıl oruc .tutsun

:Məsələ ۲۶۳۶: Andın bir neçə şərti vardır

۱. And içən şəxs, gərək baliğ və aqil olsun. Qəsd və ixtiyar üzündən and içsin. Deməli, uşaq, dəli, məst və məcbur olunan şəxsin and içməsi düzgün deyildir. Həmçinin əsəbi .halda, ixtiyarsız və qəsdsiz and içsə, düz deyildir

۲. And içib yerinə yetircəyi iş, gərək haram, ya məkruh olmasın və and içib tərk edəcəyi iş gərək vacib, ya müstəhəbb olmasın. Əgər mübah işi tərk edəcəyinə, ya yerinə yetirəcəyinə and içsə, onu tərk etmək və ya əmələ gətirmək əql sahiblərinin nəzərində .üstünlüyə malik olarsa, yaxud onun özü üçün dünyəvi məsləhəti olarsa, andı səhihdir

۳. Allahın adlarından birinə and içsin ki, Onun müqəddəs zatından başqa o ad heç kəsə deyilməz, məsələn; «Allah», «Tanrı». Yaxud yalnız Allaha məxsus olan sifət və ya fe`llərlə (işlərlə) Allahı yad etsin, məsələn asimanları və yeri yaradan kəsə and olsun deyə and içsin. Və ya elə bir ada and içsin ki, o ad Allahdan başqasına da deyilər, amma o ad, o qədər Allaha deyilib ki, nə vaxt bir şəxs o adı desə, ancaq onun müqəddəs zatı nəzərə gəlir. Məsələn; «Xaliq» və «Raziq» adına and içsə, səhihdir. Hətta elə bir ada and içsə ki, yalnız and içmə məqamında Allahın zatını xatırlayarsa, (Səmi və .Bəsir kimi) andı səhihdir

Andı dilə gətirməlidir. Amma lal olan bir şəxs işarə ilə and içərsə, səhihdir. Həmçinin .۴ danışmaq gücünə qadir olmayan bir şəxs, əgər onu yazıb, qəlbində də qəsd edərsə, kifayətdir. Hətta əgər danışmağa qadir olsa belə, andı yazarsa, ehtiyat-vacibə görə .ona əməl etməlidir

Anda əməl etmək onun üçün mümkün olmalıdır. Əgər and içdiyi zaman mümkün .۵ olmasa, amma, sonradan mümkün olsa, kifayətdir. Əgər and içdiyi zaman mümkün olub, sonradan ona əməl etməkdə aciz qalsa, aciz qaldığı vaxtdan etibarən andı pozular. Həmçinin əgər anda əməl etmək dözülməyəcək qədər məşəqqətli olarsa, hökm eynidir. Əgər bu acizlik onun ixtiyarı ilə olsa, yaxud öz ixtiyarı ilə olmasa da, qadir .olduğu zamandan təxirə salmaqda üzrü olmasa, günah edib və kəffarə də vacibdir

Məsələ ۲۶۳۷: Əgər ata övladını, ya da əri arvadını and içməkdən çəkindirərsə, onların .andı səhih deyildir

Məsələ ۲۶۳۸: Əgər övlad atasının icazəsi olmadan və arvad ərinin icazəsi olmadan and .içərsə, ata və ər onların andını poza bilər

Məsələ ۲۶۳۹: Əgər insan unutqanlıq, çarəsizlik və ya qəflət üzündən öz andına əməl etməsə, ona kəffarə vacib deyildir. Həmçinin, əgər onu andına əməl etməməyə məcbur etsələr də bu cürdür. Vəsvəsəli olan şəxs, məsələn; «Allaha and olsun ki, indi namaza başlayıram» deyə and içərsə, sonra da vəsvəsəli olduğuna görə namaza məşğul olmazsa, belə ki, onun vəsvəsəsi qeyri-ixtiyari olaraq öz andına əməl .etməyəcək şəkildə olarsa, ona kəffarə verməsi lazım deyildir

Məsələ ۲۶۴۰: Sözünün doğru olduğu üçün and içən şəxsin sözü doğru olarsa, and içməsi məkruhdur. Əgər yalan olarsa, haramdır. Hətta mübahisəni sona yetirmək müqabilində yalan yerə and içmək böyük günahlardandır. Fəqət özünü və ya başqa bir müsəlmanı bir zalımın şərrindən qurtarmaq üçün yalandan and içərsə, eybi yoxdur. Hətta bəzən vacib də olur. Yalnız «tovriyə» etməsi (yəni and içdiyi zaman, sözün əsil mənasını bir işarə qoymadan cümlənin zahirdən ifadə etdiyi mənadan başqa bir məna qəsd etməsi) mümkündürsə, ehtiyat-vacib budur ki, tovriyə etsin. Məsələn, bir şəxsə

insandan onu görüb-görmədiyini soruşarsa, o da onu bir saat qabaq görübsə, beş dəqiqə qabaq görmədiyini qəsd edərək «xeyr, görməmişəm» deyər.

## VƏQFİN HÖKMLƏRİ

Məsələ ۲۶۴۱: Əgər bir şəxs bir şeyi vəqf edərsə, onun mülkündən çıxır, özü və başqaları onu bağışlaya və ya sata bilməzlər, heç kəs o mülkdən irs aparmaz, amma bəzi .yerlərdə ۲۰۵۲ və ۲۰۵۳-ci məsələdə deyildiyi kimi onu satmağın eybi yoxdur

Məsələ ۲۶۴۲: Vəqfin siğəsini ərəbcə oxumaq lazım deyildir, hətta məsələn; «bu kitabı tələbələrə vəqf etdim» deyərsə, vəqf səhihdir. Hətta vəqf əməllə də gerçəkləşir, məsələn, bir həsiri vəqf niyyətilə məscidə sərərsə və ya bir binanı məscid şəklində, məscid niyyəti ilə tikərsə, vəqf olmaq gerçəkləşər. Lakin təkcə niyyətlə vəqf olmağı gerçəkləşmir. Vəqfin səhih olması üçün bir şəxsin qəbul etməsi lazım deyildir, istər .ümumi vəqf olsun, istərsə xüsusi. Həmçinin qürbət qəsdi də lazım deyil

Məsələ ۲۶۴۳: Əgər bir mülkü vəqf üçün müəyyən etsə və vəqf siğəsi oxunmazdan qabaq peşman olsa ya ölsə, vəqf gerçəkləşmir. Xüsusi vəqfdə də kimə vəqf edilibsə, o, .vəqfi ixtiyarına keçirməzdən qabaq ölərsə eyni hökmü daşıyır

Məsələ ۲۶۴۴: Bir malı vəqf edən şəxs, gərək vəqf etdiyi vaxtdan, malı daimi vəqf etsin. Əgər desə ki, «bu mal mən öləndən sonra vəqf olsun», siğə oxunan zamandan o ölənə qədər vəqf olmadığına görə səhih deyildir, yaxud desə ki, ۱۰ ilə kimi vəqf olunsun və ondan sonra vəqf olunmasın, ya desə ki, ۱۰ il vəqf olub, sonra ۵ il vəqf olmasın və ondan sonra yenə də vəqf olsun, vəqf səhih deyil. Amma bu halda o yeri həbs etmək .(istifadədən saxlamaq) qəsdi olsa, həbsi gerçəkləşir

Məsələ ۲۶۴۵: Xüsusi vəqf o halda düz olar ki, vəqf etdiyi malı, vəqf olunan kəslərin, ya onların vəkil və ya vəlisinin istifadəsinə buraxsın. Birinci təbəqədən olanların təsərrüf etməsi kifayətdir. Əgər onların bəzisi təsərrüf etsə, yalnız onların nisbətində səhihdir. Amma əgər bir şeyi öz səğir övladı üçün

.vəqf etsə malın eyni onun əlində olsa, kifayətdir və vəqf səhihdir

Məsələ ۲۶۴۶: Məscid, mədrəsə və s. bu kimi ümumi vəqflərdə qəbz şərt deyil və vəqf .sadəcə vəqf etməklə gerçəkləşər

Məsələ ۲۶۴۷: Vəqf edən, gərək aqil, baliğ olsun, öz qəsdi və ixtiyarı ilə vəqf etsin və həmçinin şərən öz malında istifadə edə bilsin. Buna görə də səfehin (yəni malını bihudə yerdə xərcləyən) öz malından istifadə etməyə haqqı olmadığına görə əgər bir şeyi .vəqf etsə, səhih deyildir

Məsələ ۲۶۴۸: Əgər bir malı ana bətnində olan və dünyaya gəlməmiş bir uşağa vəqf etsə, o vəqfin səhihliyi işkallıdır və lazımdır ki, ehtiyata riayət olunsun. Amma əgər hal-hazırda mövcud olan şəxslərə və onlardan sonra dünyaya gələn şəxslərə vəqf edərsə, vəqf gerçəkləşən zamanda onlar ana bətnində olmasalar da, vəqf mühəqqəq olar. Məsələn; bir şeyi uşaqlarından sonra nəvələrinə aid olub, hər bir dəstə əvvəlki .dəstədən sonra ondan istifadə etməsilə uşaqlarına vəqf edərsə, səhihdir

Məsələ ۲۶۴۹: Bir şeyi özü üçün vəqf edərsə, məsələn; dükanının gəlirini öz borclarını ödəməyə, ibadətləri üçün əcir tutulmasına xərcləməyi vəqf edərsə, səhih deyildir. Amma əgər bir malı fəqirlərə vəqf edərsə və özü də fəqir olsa, orada sakin ola bilər. Amma əgər icarə pulu fəqirlərin arasında bölüşdürülsün deyə, vəqf etsə və özü də .fəqir olsa, o maldan özünün götürməsi işkallıdır

Məsələ ۲۶۵۰: Əgər vəqf etdiyi şey üçün nəzarətçi müəyyən etsə, gərək onun qərar qoyduğuna mütabiq əməl etsin. Əgər müəyyən etməsə, belə ki, məxsusi şəxslərə, məsələn; öz övladına vəqf etsə, ondan istifadə etmək ixtiyarı onların özü ilə olar. Əgər həddi-büluğa çatmamış olsalar, ixtiyar onların vəlisinindir və vəqfdən istifadə etmək üçün şəriət hakiminin icazəsi lazım deyil. Amma vəqfi təmir etmək və gələcək nəsillərin mənfəətinə olaraq onu kirayə vermək kimi, vəqfin və ya gələcək nəsillərin məsləhəti .olan məsələlərdə ixtiyarı şəriət hakiminin əlindədir

Məsələ ۲۶۵۱: Bir mülkü, məsələn; fəqirlərə, yaxud seyyidlərə və ya qazancı xeyir işlərə sərf edilmək üçün vəqf edərsə, o mülk üçün bir nəzarətçi təyin etməyibsə, onun .ixtiyarı şəriət hakiminin əlindədir

Məsələ ۲۶۵۲: Əgər bir mülkü xüsusi şəxslərə, məsələn; öz övladına vəqf etsə ki, hər bir nəsil öz növbəsində ardıcıl ondan istifadə etsin, belə ki, nəzarətçi onu icarəyə versə və ölsə, icarə batil olmaz. Amma əgər nəzarətçisi olmasa və onlara mülk vəqf etmiş şəxslərin bir təbəqəsi onu icarə versələr və icarənin müddəti əsnasında ölsələr, belə ki, onlardan sonrakı təbəqə icarəyə imza qoymasalar, icarə batil olar. Belə halda icarə edən, bütün müddətin icarəsinin haqqını veribsə, icarənin haqqını onların öldüyü .zamandan icarənin müddətinin axırına qədər onların malından götürəcək

Məsələ ۲۶۵۳: Əgər vəqf olunan malın eyni xarab olsa, vəqfliyindən çıxmır. Amma əgər vəqf olunan şey məxsusi bir ünvana qəsd olunmuşsa və o ünvan aradan gedərsə, vəqf batil olur. Məsələn; bir bağçanı, bağça olaraq vəqf etmişlərsə, o bağça xarab .olduğu təqdirdə, vəqf batil olur. O mülk isə vəqf edənin varislərinə qayıdır

Məsələ ۲۶۵۴: Bir qismi vəqf olub, digər bir qismi vəqf olunmayan bir mülk bölünməyibsə, vəqfin nəzarətçisi və vəqf olmayan hissənin maliki vəqf malını ayıra .bilərlər

Məsələ ۲۶۵۵: Əgər vəqfin nəzarətçisi xəyanət etsə, məsələn; vəqfin gəlirini müəyyən olunmuş məsrəflərə çatdırmasa, şəriət hakimi inanılmış bir adamı ona qoşacaq ki, ona xəyanət etməyə mane olsun. Mümkün olmayan halda isə, onu əzl edib onun yerinə .inanılmış bir adamı nəzarətçi təyin edə bilər

Məsələ ۲۶۵۶: Hüseyniyyə üçün vəqf olunan xalçanı namaz qılmaq üçün məscidə, hətta məscid Hüseyniyyəyə yaxın olsa belə, apara bilməzlər. Amma əgər Hüseyniyyənin .mülkü olsa, nəzarətçinin icazəsi ilə başqa yerə aparmaq olar

Məsələ ۲۶۵۷: Bir mülkü bir məscidin təmiri üçün vəqf edərlərsə, əgər o məscidin təmirə ehtiyacı olmayıb, yaxın bir zamanda da təmir ehtiyacı olmağı gözlənilməyən təqdirdə,

etmək üçün toplayıb saxlamaq mümkün olmasa, ehtiyat-lazım budur ki, o mülkün gəlirləri vəqf edən şəxsin niyyətinə ən yaxın olan işlərə xərclənsin, məsələn; ondan, o .məscidin digər ehtiyaclarında və ya başqa bir məscidin tə`mirində istifadə olunmalıdır

Məsələ ۲۶۵۸: Əgər bir mülkün gəlirinin məscidin təmirinə, imam-camaata və məsciddə azan deyən şəxsə xərclənməsi üçün vəqf etsə, əgər hər biri üçün bir miqdar müəyyən etmiş olsa, gərək həmin cür xərcləsinlər. Əgər təyin etməyibsə, gərək əvvəl məscidi təmir etsinlər, əgər bir şey artıq qalarsa, mütəvəlli onu məsləhət bildiyi şəkildə imam-camaatla, azan deyənin arasında bölər. Yaxşısı budur ki, bu iki nəfər öz aralarında .bölən zaman sülh etsinlər

## VƏSİYYƏTİN HÖKMLƏRİ

Məsələ ۲۶۵۹: Vəsiyyət, insanın ölümündən sonra özü üçün bəzi işlərin yerinə yetirilməsini sifariş etməsinə və ya ölümündən sonra malından bir şeyin başqasının malı olmasını, ya da onun malından bir şeyi başqa bir şəxsin mülkiyyətinə keçirmələrini və ya xeyir işlərdə xərcləmələrini söyləməsinə və yaxud öz övladı və ixtiyarında olan şəxslər üçün müəyyən bir şəxsi qəyyum (başçı) təyin etməsinə deyilir. Vəsiyyət edilən .şəxsə isə vəsi deyilir

Məsələ ۲۶۶۰: Danışa bilməyən şəxs, əgər işarə ilə öz məqsədini başa salsa, hər bir iş üçün vəsiyyət edə bilər. Hətta danışa bilən şəxs də, əgər işarə ilə öz məqsədini başa .salıb vəsiyyət etsə, səhihdir

Məsələ ۲۶۶۱: Əgər yazılmış bir şeyi meyyitin imzası ya möhürü ilə görsələr, belə ki, mövcud əlamətlərdən onun məqsədini başa düşsələr və məlum olsa ki, vəsiyyət .etmək üçün yazıb, gərək ona uyğun əməl etsinlər

Məsələ ۲۶۶۲: Vəsiyyət edən şəxs, gərək ağıllı və həddi-büluğa çatmış olsun, səfeh olmamalıdır və öz ixtiyarı ilə vəsiyyət etməlidir. Həddi-büluğa çatmamış uşağın vəsiyyəti səhih deyildir. Amma əgər uşaq on yaşında olsa və öz qohumları üçün, ya da ümumi xeyir işlərdə sərf edilməsi üçün vəsiyyət edərsə, uşağın bu iki halda olan vəsiyyəti səhihdir. Amma əgər qohumlarından qeyrisi üçün və ya yeddi yaşında olan bir uşaq, malından az bir şeyi vəsiyyət edərsə, onun vəsiyyətinin nüfuzlu olması işkallıdır. Bu halda ehtiyata əməl etmək lazımdır. Əgər bir şəxs səfeh olsa, onun öz malı üçün etdiyi vəsiyyət nüfuzlu deyildir. Amma onun bundan başqa olan vəsiyyəti, .məsələn; ölümündən sonra cənazə üçün edilən işlər haqqındakı vəsiyyəti nüfuzludur

Məsələ ۲۶۶۳: Bir kəs bilə-bilə, özünü öldürmək məqsədi ilə həlak olacağı tərzdə özünü yaralayıb və ya ölümə səbəb olan zəhər içsə, əgər malının bir miqdarını bir yerə istifadə üçün çatdırmalarını vəsiyyət etsə, sonra ölərsə, onun vəsiyyəti səhih deyildir. (Amma əgər onun işi Allah yolunda cihad olarsa, bu, istisnadır.) Amma mal-dövlətlə .əlaqədar olmayan şeylərdə vəsiyyəti səhihdir

Məsələ ۲۶۶۴: İnsan, malından bir şeyi, bir şəxsin olmasını vəsiyyət edərsə, o şəxs, onu qəbul etdiyi halda, istər onun sağlığında, istərsə vəfatından sonra olsun, o şey vəsiyyət edənin malının üçdə birindən çox olmasa, həmin şey vəsiyyət edənin ölümündən .sonra onun mülkiyyətinə keçər

Məsələ ۲۶۶۵: İnsan, ölüm nişanələrini özündə görən vaxt, gərək dərhal camaatın əmanətlərini sahiblərinə çatdırsın, ya da ۲۳۰۶-ci məsələdə deyildiyi kimi, onlara xəbər versin. Əgər camaata borcu varsa və onun da verilmə vaxtı çatmayıbsa və ya çatıb, amma tələbkar da öz alacağını tələb etmirsə, ya tələb etsə də verməyə gücü çatmırsa, ölümündən sonra, onun tələbkara veriləcəyinə əmin olacaq bir iş etməlidir. Məsələn; onun başqalarına borclu olduğu məlum deyilsə, vəsiyyət etməlidir və vəsiyyəti üçün şahid tutmalıdır. Amma əgər ödəyə bilərsə və vaxtı da çatıbsa, tələbkar .da tələb edibsə, gərək ölüm əlamətlərini görməsə belə dərhal ödəsin

Məsələ ۲۶۶۶: Ölüm nişanələrini özündə görən kəs, əgər xüms, zəkat və boynunda məzalim varsa və hal-hazırda verə bilmirsə, belə ki, özünün malı varsa ya ehtimal versə ki, bir kəs onları əda edəcək, gərək elə bir iş etsin ki, ölümündən sonra ödəniləcəyinə əmin olsun. Məsələn, etimadlı bir adama vəsiyyət etsin. Həmçinin, əgər həcc ona vacib olsa və haliyədə naib tuta bilməsə də, bu cürdür. Amma əgər şəri vergilərdən olan borcunu verə bilərsə, hərçənd onda ölüm nişanələri olmasa belə, .gərək dərhal versin

Məsələ ۲۶۶۷: Ölüm nişanələrini özündə görən şəxsin əgər qəza namazı və orucu varsa, ,gərək elə bir iş görsün ki

ölümündən sonra onun əvəzindən yerinə yetiriləcəyinə əmin olsun, məsələn, vəsiyyət etsin ki, öz malından onlar üçün əcir tutsunlar. Hətta əgər malı olmasa, amma ehtimal versə ki, bir şəxs bir şey almadan onları yerinə yetirəcək, yenə də vacibdir ki, vəsiyyət etsin. Əgər onun oruc və namazının qəzasını etmək üçün bir kəs olsa, məsələn böyük oğlu, əgər bilsə ki, ona xəbər versə, qəza oruc və namazlarını yerinə yetirəcək, ona .xəbər verməsi kifayətdir, vəsiyyət etməsi lazım deyil

Məsələ ۲۶۶۸: Ölüm nişanələrini özündə görən şəxsin əgər bir nəfərdə malı varsa, ya da vərəsənin bilmədiyi bir yerdə gizlədibsə, ehtiyat-vacibə görə gərək onlara xəbər versin. Öz səğir uşaqları üçün qəyyum müəyyən etməsi lazım deyildir, amma qəyyumsuz onların malı aradan gedəcəksə, ya özləri tələf olacaqlarsa, gərək onlar .üçün bir qəyyum müəyyən etsin

Məsələ ۲۶۶۹: Vəsi gərək aqil olsun. Vəsiyyət edənə aid olan işlərdə və həmçinin ehtiyat-vacibə əsasən digərlərilə bağlı işlərdə etibarlı olmalıdır. Ehtiyat-vacibə əsasən müsəlmanın vəsisi müsəlman olmalıdır. Habelə ehtiyata əsasən həddi-büluğa yetməmiş bir uşağa tək başına olmaq şərti ilə vəsiyyət etmək ehtiyat-vacibə görə səhih deyildir və onun təsərrüf etməsi şəriət hakiminin icazəsi ilə olmalıdır. Əlbəttə bu vəsiyyət edən şəxsin, məqsədinin onun uşaqlıq halında vəlisinin icazəsi olmadan istifadə etməsi olduğu təqdirdədir. Amma əgər məqsədi, onun həddi-büluğa .çatmasından sonra və ya vəlisinin izni ilə istifadə etməsi olursa, eybi yoxdur

Məsələ ۲۶۷۰: Əgər bir şəxs, özü üçün bir neçə vəsi təyin etsə və hər birinə tək başına vəsiyyətə görə hərəkət etmə izni versə, vəsiyyəti yerinə yetirmədə bir-birlərindən izn almaları lazım deyil. Amma izn verməmiş olsa, istər hamısının birlikdə əməl etməsini bildirsin, istər bildirməsin, vəsiyyətə bir-birlərinin fikirlərinə görə hərəkət etmələri gərəkdir. Əgər birlikdə vəsiyyətə əməl etməyə hazır olmasalar, arada hər birinin digəri ilə anlaşmasına qarşı olan bir şəri maneə yoxdursa, şəriət hakimi onları anlaşmaya məcbur edər. Əgər ona itaət etməzlərsə və ya hər biri üçün anlaşılmağın qarşısını alan şəri bir maneə mövcud

.olsa, şəriət hakimi onlardan birinin yerinə ayrı bir şəxsi təyin edər

Məsələ ۲۶۷۱: Əgər insan öz vəsiyyətindən dönərsə, məsələn; malının üçdə birini bir şəxsə verilməsini vəsiyyət etdiyi halda, sonra «ona verməyin» desə, vəsiyyət batil olur. Əgər vəsiyyətini dəyişdirsə, məsələn; əvvəl uşaqları üçün bir qəyyum təyin edib, sonra da başqa birini onun yerinə qəyyum təyin edərsə, onun birinci vəsiyyəti batil olur və .gərək ikinci vəsiyyətinə əsasən əməl olunsun

Məsələ ۲۶۷۲: Bir şəxs vəsiyyətindən döndüyünü məlum edən bir iş görərsə, məsələn; birinə verilməsinə vəsiyyət etdiyi bir evi satarsa və ya əvvəlki vəsiyyətinə nəzər .yetirdiyi halda başqa birisinin onu satmaq üçün vəkil təyin edərsə, vəsiyyət batil olur

Məsələ ۲۶۷۳: Əgər müəyyən şeyi bir şəxsə verməyi vəsiyyət etsə, sonra isə həmin şeyin yarısını başqasına verilməsini vəsiyyət etsə, gərək o şeyi iki yerə bölsünlər və o .iki nəfərin hər birinə onun yarısını versinlər

Məsələ ۲۶۷۴: Bir şəxs ölümünə səbəb olan bir xəstəlik halında, malının bir qismini bir şəxsə bağışlasa və ölümündən sonra da bir miqdarının başqasına verilməsini vəsiyyət edərsə, əgər malının üçdə birini hər ikisinə verməyə kifayət etməsə və varislər də ondan artıq verilməsinə icazə verməzlərsə, gərək əvvəl bağışladığı malı, malın üçdə .birindən çıxıb sonra da onun yerdə qalanını vəsiyyət edilən yerdə xərcləməlidirlər

Məsələ ۲۶۷۵: Malının üçdə birinin satılmamasını və gəlirinin bir şeyə sərf edilməsini .vəsiyyət edərsə, gərək onun dediyinə uyğun olaraq əməl etsinlər

Məsələ ۲۶۷۶: Əgər ölümünə səbəb olan xəstəlik halında başqa birinə bir miqdar, borclu olduğunu desə, belə ki, «bu sözü vərəsəyə ziyan vurmaq üçün söyləmişdir» deyə ittiham edilərsə, gərək təyin etdiyi miqdarı onun malının üçdə birindən verilsin. Əgər ittiham olunmasa, onun dediyinin nüfuzu vardır və gərək onun malının əslindən .verilsin

Məsələ ۲۶۷۷: İnsan, bir şəxsə bir şey verəcəyini vəsiyyət edərsə, vəsiyyət halında onun mövcud olmağı lazım deyildir. Deməli, o kəs vəsiyyət edənin ölümündən sonra mövcud

lazımdır ki, o şeyi ona versinlər. Əgər mövcud olmasa və belə ki, vəsiyyətdən bir neçə mətləb istifadə olunarsa, gərək onu vəsiyyət edənin nəzərinə daha yaxın olan başqa bir yerə sərf etsinlər. Əks təqdirdə varislər onu öz aralarında bölə bilərlər. Amma əgər vəsiyyət etsə ki, onun malından bir şey ölümündən sonra bir kəsin malı olsun, əgər o şəxs vəsiyyət edənin ölən vaxtında mövcud olsa, hərçənd bədəndə ruh daxil olmamış uşaq olsa belə vəsiyyət səhih, əks təqdirdə isə batildir və onun üçün vəsiyyət edilən .şeyi, vərəsələr öz aralarında bölərlər

Məsələ ۲۶۷۸: Əgər insan, onu bir şəxs vəsi etdiyini bilib, onun vəsiyyətini yerinə yetirməyə hazır olmadığını bildirərsə, onun ölümündən sonra vəsiyyətinə əməl etməsi lazım deyildir. Amma əgər ölməzdən qabaq onu vəsi etdiyini bilməsə və ya bilib ona xəbər verməsə ki, onun vəsiyyətinə əməl etməyə hazır deyildir, ona əziyyət olmadığı halda, gərək onun vəsiyyətinə əməl etsin. Həmçinin, əgər vəsi, vəsiyyət edənin ölümündən əvvəl o zaman başa düşsə ki, vəsiyyət edən ağır xəstə olduğuna görə ya başqa bir maneəyə görə başqasına vəsiyyət edə bilməz, ehtiyat-vacibə əsasən, gərək .vəsi vəsiyyətini qəbul etsin

Məsələ ۲۶۷۹: Əgər vəsiyyət edən ölsə, vəsi başqasını, meyyitin işlərini yerinə yetirmək üçün vəsi təyin edə bilməz və özü də o işlərdən kənara çəkilə bilməz. Amma vəsiyyət edənin məqsədi sadəcə bu işlərin edilməsi olub, yalnız vəsinin etməsi nəzərində .olmamasını başa düşsə, o zaman başqasını öz tərəfindən vəkil təyin edə bilər

Məsələ ۲۶۸۰: Əgər bir şəxs, iki nəfəri birlikdə vəsi edərsə, belə ki, onlardan biri ölsə, ya dəli, yaxud kafir olsa, vəsiyyətin ibarələrindən başa düşülsə ki, belə hallarda digəri müstəqil şəkildə vəsidir, gərək həmin qaydada əməl olunsun, əks halda şəriət hakimi başqa bir nəfəri onun yerinə təyin edər. Əgər hər ikisi ölsə, ya dəli, yaxud da kafir olsalar, şəriət hakimi başqa iki nəfəri təyin edər. Amma əgər bir nəfər vəsiyyətə əməl .edə bilərsə, iki nəfəri təyin etmək lazım deyildir

Məsələ ۲۶۸۱: Əgər vəsi, ölənin işlərini hərçənd başqasını vəkil və ya əcir tutmaqla da .təkbaşına yerinə yetirə bilməsə, şəriət hakimi başqasını ona köməkçi təyin edər

Məsələ ۲۶۸۲: Əgər meyyitin malından bir miqdarı vəsinin əlində tələf olsa, belə ki, onu saxlamaqda səhlənkarlıq və ya israfçılıq etsə, məsələn; ölən şəxs, «filan şəhərin fəqirlərinə bu qədər ver» deyibsə, o da malı başqa bir şəhərə apararkən yolda aradan getsə, zamindir. Əgər səhlənkarlıq və israfçılıq etməyibsə, zamin deyildir.

Məsələ ۲۶۸۳: Əgər insan, bir şəxsi vəsi təyin etsə və «o şəxs ölsə, filankəs vəsi olsun» deyərsə, birinci vəsinin ölümündən sonra, vəsiyyəti ikinci vəsi yerinə yetirməlidir.

Məsələ ۲۶۸۴: Ölənə istitaətlə vacib həcc, borclar və ödənməsi vacib olan xüms, zəkat, məzalim kimi verilməsi vacib olan hüquqlar gərək meyyit onlar üçün vəsiyyət etməmiş olsa da, onun malının əslindən versinlər. Amma kəffarələr, nəzrlər, o cümlədən nəzr olunan həcc vəsiyyətlə, onun malının üçdə birindən yerinə yetirilməlidir.

Məsələ ۲۶۸۵: Əgər meyyitin malı borcdan, vacib həccdən və ona vacib olan məzalim, zəkat və xums kimi hüquqlardan artıq gəlsə, belə ki, vəsiyyət etmiş olsa ki, malın üçdə birini və ya üçdə birinin bir miqdarını bir xərcə çatdırsınlar, gərək onun vəsiyyətinə əməl etsinlər, əgər vəsiyyət etməyibsə, qalan şey vərəsənin malıdır.

Məsələ ۲۶۸۶: Meyyitin təyin etdiyi xərc, malın üçdə birindən artıq olarsa, onun malın üçdə birindən artıq olan miqdardakı vəsiyyəti, yalnız varislərin bu vəsiyyətə sözlə, ya əməllə icazə verdikləri təqdirdə səhihdir. Təkcə onların qəlbdə razı olması kifayət deyildir. Əgər onun ölümündən bir müddət keçdikdən sonra da icazə verərlərsə, səhihdir. Əgər varislərdən bəzisi razı olub bəziləri isə rədd edərlərsə, vəsiyyət yalnız vəsiyyətə razı olanların hissəsində səhih və keçərlidir.

Məsələ ۲۶۸۷: Əgər meyyitin müəyyən etdiyi xərc onun malının üçdə birindən çox olsa və vərəsələr də icazə versələr, öz icazələrindən dönə bilməzlər. Əgər vəsiyyət edənin sağlığında rədd ediblərsə, ölümündən sonra icazə verə bilərlər. Amma əgər o öləndən sonra rədd etsələr, ondan sonra icazə vermələrinin faydası yoxdur.

Məsələ ۲۶۸۸: Əgər vəsiyyət etsə ki, malının üçdə birindən xüms, zəkat, ya başqa bir borcu versinlər və onun orucu və namazı üçün əcir tutsunlar, həmçinin fəqirlərə təam vermək kimi müstəhəbb bir iş yerinə yetirsinlər, gərək əvvəl onun borcunu malının üçdə birindən versinlər. Əgər bir şey artıq qalsa, onun namaz və orucu üçün əcir tutsunlar. Əgər ondan da bir şey artıq qalsa, müəyyən etdiyi müstəhəbb işlərə çatdırsınlar. Belə ki, onun malının üçdə birini ancaq borcuna çatsa və vərəsələr də onun malının üçdə birindən çox xərclənməsinə icazə verməsələr, onun namaz və .orucu üçün, həmçinin müstəhəb işlər üçün etdiyi vəsiyyət batildir

Məsələ ۲۶۸۹: Borclarının verilməsini, namaz və oruclarına əcir tutulmasını və müstəhəbb bir işin də edilməsini vəsiyyət edərsə və bunların malın üçdə birindən verilməsini vəsiyyət etməzsə, onun borcunu malın əslindən verməlidirlər. Əgər bir şey artıq qalsa, onun üçdə birini namaz və oruca, həmçinin müəyyən etdiyi müstəhəbb işlərə çatdırsınlar. Malın üçdə birini onlara kifayət etməyən halda əgər vərəsələr icazə versələr, gərək onun vəsiyyətinə əməl olunsun. Əgər icazə verməsələr, gərək namaz və orucunu malın üçdə birindən versinlər. Əgər bir şey artıq qalsa, müəyyən etdiyi .müstəhəb işlərə çatdırsınlar

Məsələ ۲۶۹۰: Əgər bir şəxs, «meyyit bu qədər məbləğin mənə verilməsini vəsiyyət etdi» deyərsə, iki adil kişi onun sözünü təsdiq edərsə və ya and içsə və bir adil kişi onu təsdiq etsə, ya bir adil kişi və iki adil qadın onun sözünü təsdiq edərsə, ya da dörd adil qadın onun sözünü təsdiq edərsə, söylənilən miqdar ona verilməlidir. Əgər bir adil qadın şahidlik edərsə, istədiyi malın dörtdə birini ona verilməlidir. Əgər iki adil qadın təsdiq edərsə, onun yarısını, əgər üç adil qadın təsdiq edərsə onun dörtdə üçünü ona verməlidirlər. Həmçinin, şəhadət verəcək bir müsəlman tapılmasa öz dinlərində adil sayılan iki kitab əhli olan kafir, onun sözünü təsdiq etdikdə də tələb etdiyi şeyi ona .verməlidirlər

Məsələ ۲۶۹۱: Əgər bir şəxs, «mən meyyitin malını hər hansı bir yerdə istifadə etməkdə onun vəsisiyəm» deyərsə, iki adil kişi onun sözünü təsdiq edən halda, yaxud şəhadət vermək üçün bir

müsəlman olmazsa, öz dinlərində adil olan iki zimmə əhlinin təsdiqi ilə, habelə .vərəsənin iqrar etməsi ilə də onun sözü sübut olunur

Məsələ ۲۶۹۲: Malından bir şeyin, bir şəxsin malı olmasını vəsiyyət edərsə və o şəxs də qəbul və ya rədd etməzdən qabaq ölərsə, onun vərəsələri vəsiyyəti rədd etməyənə qədər o şeyi qəbul edə bilərlər. Amma bu hökm, vəsiyyət edənin öz vəsiyyətindən .dönmədiyi təqdirdədir. Əgər vəsiyyətindən dönərsə, o şeydə haqqları yoxdur

## İRSİN HÖKMLƏRİ

**Point**

:Məsələ ۲۶۹۳: Qohumluq vasitəsilə irs aparan şəxslər üç dəstədir

Birinci dəstə: Meyyitin ata-anası və övladıdır. Övlad olmayanda isə övladın övladı və nə qədər aşağı getsə, bunlardan hər kəs ki, meyyitə daha yaxın olsa, irs aparır. Bu .dəstədən bir nəfər qalana qədər ikinci dəstə irs aparmazlar

İkinci dəstə: Baba, nənə, bacı və qardaşdır. Qardaş və bacı olmayanda isə onların övladından hər kəs ki, meyyitə daha yaxındır, irs aparar. Bu dəstədən bir nəfər qalana .qədər üçüncü dəstə irs aparmırlar

Üçüncü dəstə: Əmi, bibi, dayı, xala və onların övladıdır. Meyyitin əmilərindən, bibilərindən, dayılarından və xalalarından biri sağ olana qədər onların övladı irs aparmazlar. Amma ölənin fəqət ata tərəfindən olan əmisi ilə həm ana, həm də ata tərəfindən olan əmisi oğlu olarsa, dayı və xalası olmazsa, miras, ana və ata tərəfindən olan əmisi oğluna düşər və təkcə ata tərəfindən olan əmisi miras almaz. Əgər əmi və əmisi oğlanları bir neçə nəfər olsa, yaxud meyyitin həyat yoldaşı diri olsa, bu hökm .işkalsız deyildir

Məsələ ۲۶۹۴: Əgər meyyitin özünün əmisi, bibisi, dayısı, xalası, həmçinin onların övladı və övladının da övladı olmasa, onda meyyitin atasının və anasının əmi, bibi, dayı və xalası irs apararlar. Əgər bunlar da olmasa, onların övladı irs apararlar və əgər bunlar da olmasa, o halda babasının və nənəsinin əmisi, bibisi, dayısı və xalası, əgər bunlar da .olmasa, onların övladları irs apararlar

.Məsələ ۲۶۹۵: Ər və arvad sonradan deyiləcək təfsil ilə bir-birindən irs apararlar

## BİRİNCİ DƏSTƏNİN İRSİ

Məsələ ۲۶۹۶: Əgər meyyitin varisi birinci dəstədən ancaq bir nəfər olsa, məsələn; ata, ya anası, ya bir oğlu, ya bir qızı olsa, meyyitin malının hamısı ona çatar. Əgər bir oğlu .və bir qızı olsa, malı elə bölməlidirlər ki, oğul qızdan iki dəfə artıq aparsın

Məsələ ۲۶۹۷: Əgər meyyitin varisi ancaq onun ata və anası olsa, malı üç yerə bölünür, onun iki hissəsini ata və bir hissəsini ana aparar. Amma meyyitin iki qardaşı, ya dörd bacısı, ya bir qardaş və iki bacısı olsa ki, onların hamısı müsəlman, azad və onların atası meyyitin atası ilə bir olsa, istər onların anası meyyitin anası ilə bir olsunlar, istər olmasınlar, və bu şərtlə ki, dünyaya gəlmiş olsunlar, baxmayaraq ki, meyyitin ata-anası olana qədər bunlar irs aparmır, amma əgər bunlar olarsa, ana malın altıda birini .irs aparır, qalanını isə atasına verərlər

Məsələ ۲۶۹۸: Meyyitin varisi yalnız ana, ata və bir qız olarsa, əgər meyyitin əvvəlki məsələdə deyilən şərtlərlə, qardaşı və ya bacısı olmazsa, malı beş qismə bölərlər, ana və ata hər biri bir pay, qız isə üç pay alar. Əgər keçən şərtlərlə qardaş, ya bacısı olarsa, ata beşdə bir və ana altıda bir pay, qız isə beşdə üç pay alar. Yerdə qalan üçdə birdə isə ehtiyat-vacibə görə bir-biri ilə sülh etməlidirlər. Belə ki, onun üçdə biri ananın, .dörddə üçü qızın və dörddə biri atanın olması ehtimal verilir

Məsələ ۲۶۹۹: Əgər meyyitin varisi ata-ana və bir oğul olsa, malı altı yerə bölərlər, ata və ananın hər biri onun bir hissəsini, oğul isə dörd hissəsini aparar. Əgər bir neçə oğlu, ya bir neçə qızı olsa, o dörd hissəni öz aralarında bərabər bölərlər, əgər həm oğlan və .həm də qız olsalar o dörd hissəni elə bölləcəklər ki, oğul qızdan iki dəfə artıq aparsın

Məsələ ۲۷۰۰: Əgər meyyitin varisi, ata, ana və bir ya bir neçə oğul olsa, malı altı yerə bölərlər. Onun bir hissəsini ata, ya ana, beş hissəsini isə oğul aparar. Əgər bir neçə .oğlu olsa, onlar beş hissəni bərabər halda bölərlər

Məsələ ۲۷۰۱: Əgər meyyitin varisi ancaq ata ya ana, bir neçə oğul və qız ilə olsalar, malı altı hissəyə bölərlər. Onun bir

hissəsini ata ya ana aparar, qalanını isə elə böləcəklər ki, oğul qızdan iki dəfə artıq .aparsın

Məsələ ۲۷۰۲: Əgər meyyitin varisi ancaq ata, ya ana və bir qız olsa, malı dörd hissəyə .bölərlər, onun bir hissəsini ata ya ana, qalanını isə qız aparar

Məsələ ۲۷۰۳: Əgər meyyitin varisi ata, ya ana və bir neçə qız olsa, malı beş hissəyə bölərlər, onun bir hissəsini ata ya ana, qalan dörd hissəsini isə qızlar öz aralarında .bərabər bölərlər

Məsələ ۲۷۰۴: Əgər meyyitin övladı olmasa, onun oğul nəvəsi qız da olsa, meyyitin oğlunun səhmini aparar. Onun qız nəvəsi oğlan da olsa, meyyitin qızının səhmini aparar, məsələn; əgər meyyitin öz qızından bir oğlu və oğlundan bir qızı olsa, malı üç yerə böləcəklər, onun bir hissəsini qızının oğluna, iki hissəni isə oğlunun qızına .verəcəklər. Nəvələrin irs aparmasında ata və ananın olmaması şərt deyil

## İKİNCİ DƏSTƏNİN İRSİ

Məsələ ۲۷۰۵: Qohumluq vasitəsilə irs aparan ikinci dəstə meyyitin babası, nənəsi, .qardaşı və bacısıdır. Əgər bacı və qardaşı sağ olmasa, onların övladı irs aparar

Məsələ ۲۷۰۶: Əgər meyyitin varisi ancaq bir qardaş, ya bir bacı olsa, malın hamısı ona çatar. Əgər ata-anadan bir olan bir neçə qardaşı, ya ata-anadan olan bir neçə bacısı olsa, malı öz aralarında bərabər böləcəklər. Əgər ata-anadan bir olan bir neçə bacı-qardaşı olsa, hər qardaş hər bacıdan iki bərabər çox aparacaq. Məsələn; əgər ata-anadan bir olan iki qardaşı və bir bacısı olsa, malı beş yerə böləcəklər, hər qardaş onun .iki hissəsini, bacı isə bir hissəsini aparacaq

Məsələ ۲۷۰۷: Əgər meyyitin ata-anadan bir olan qardaş və bacısı olsa, atadan bir, anadan ayrı olan qardaş və bacısı irs aparmaz. Əgər ata-anadan bir olan qardaş və bacısı olmasa və əgər ancaq atadan bir olan bir bacı, ya bir qardaşı olsa, malın hamısı ona çatır. Əgər ata tərəfdən bir olan bir neçə qardaş, ya bir neçə bacı olsa, malı öz aralarında bərabər böləcəklər. Əgər

atadan bir olan həm qardaşı və həm də bacısı olsa, hər qardaş hər bacıdan iki bərabər .çox irs aparacaq

Məsələ ۲۷۰۸: Əgər meyyitin varisi ancaq anadan bir olub, atadan ayrı olan bir bacısı ya bir qardaşı olsa, malın hamısı ona çatar. Əgər anadan bir olan bir neçə qardaş ya bir .neçə bacı ya bacı və qardaş olsa, malı bərabər öz aralarında bölləcəklər

Məsələ ۲۷۰۹: Əgər meyyitin həm ata-anadan bir olan qardaş və bacısı, həm atadan bir olan qardaş və bacısı, həm də anadan bir olan bir qardaş ya bir bacısı olsa, atadan bir olan bacı və qardaş irs aparmaz. Malı altı yerə bölərlər, onun bir hissəsini anadan bir olan qardaş və ya bacı öz aralarında bərabər bölləcəklər. Qalanını isə ata-anadan bir .olan qardaş və bacıya verərlər ki, hər qardaş hər bacıdan iki dəfə çox aparacaq

Məsələ ۲۷۱۰: Əgər meyyitin varisi ancaq ata-anadan bir olan qardaş və bacı, atadan bir olan qardaş və bacısı və anadan bir olan bir neçə qardaş və bacısı olsa, atadan bir olan bacı-qardaş irs aparmaz, malı üç yerə bölləcəklər, onun bir hissəsini anadan bir olan qardaş və bacı aparacaq və öz aralarında bərabər şəkildə bölləcəklər, qalanını isə ata-anadan bir olan qardaş və bacıya verəcəklər ki, hər qardaş bacıdan iki dəfə çox .aparacaq

Məsələ ۲۷۱۱: Əgər meyyitin varisi ancaq atadan bir olan qardaş-bacı və anadan bir olan bir qardaş və ya bir bacısı olsa, malı altı yerə bölləcəklər, onun bir hissəsini anadan bir olan qardaş və bacı aparar, qalanını isə atadan bir olan qardaş və bacıya .verəcəklər ki, hər qardaş hər bacıdan iki dəfə çox aparacaq

Məsələ ۲۷۱۲: Əgər meyyitin varisi ancaq atadan bir olan, bacı və qardaş, anadan bir olan bir neçə bacı və qardaş olarsa, malı üç yerə bölləcəklər: bir hissəsini anadan bir olan bacı və qardaş öz aralarında bərabər bölləcəklər, yerdə qalanın atadan bir olan .bacı və qardaşa verəcəklər, hər qardaş iki bacı payı qədər irs aparar

Məsələ ۲۷۱۳: Əgər meyyitin varisi ancaq qardaş, bacı və arvadı olsa, arvad sonradan deyiləcək təfsilat ilə öz irsini aparacaq, qardaş və bacı isə yuxarıda deyildiyi kimi öz

irsini aparacaq. Həmçinin əgər bir qadın ölsə və onun varisi ancaq

qardaş, bacı və əri olsa, əri malın yarısını aparacaq, qardaş və bacı isə əvvəldə deyildiyi kimi öz irsini aparacaqlar. Amma ər ya arvadın irs apardığına görə anadan bir olan qardaş və bacının səhmindən bir şey azalmaz, amma ata-anadan ya təkcə atadan bir olan qardaş və bacının səhmi azalar. Məsələn; əgər meyyitin varisi ər və anadan bir olan qardaş və bacı, həmçinin, ata-anadan bir olan qardaş və bacısı olsa, malın yarısı ərinə çatacaq və malın əslinin üç hissəsindən bir hissəsi anadan bir olan qardaş-bacının malıdır və qalanını ata və anadan bir olan bacı və qardaşın malıdır. Beləliklə, əgər onun malı altı manat olsa, üç manat ərinə, iki manat anadan bir olan .qardaş-bacısına, bir manat isə ata-anadan bir olan qardaş-bacısına çatacaq

Məsələ ۲۷۱۴: Əgər meyyitin bacı-qardaşı olmasa, onların irsdəki payını övladlarına verəcəklər və anadan bir olan qardaş və bacısının uşaqlarının səhmi onların arasında bərabər bölünəcək, amma atadan, ya ata-anadan bir olan qardaş və bacısının uşaqlarının səhmində isə, məşhura əsasən, hər oğlan qızdan iki dəfə çox aparacaq. Amma bunların da arasında bərabər bölünmə uzaq deyil, amma ehtiyat-vacibə .əsasən öz aralarında razılaşmalıdırlar

Məsələ ۲۷۱۵: Əgər meyyitin varisi ancaq bir baba ya bir nənəsi olsa, istər ata tərəfdən olsun, istər ana tərəfdən, malın hamısı ona çatacaq. Meyyitin babası ola-ola onun babasının atası irs aparmaz. Əgər meyyitin varisi ancaq ata tərəfdən olan babası və nənəsi olsa, mal üç yerə bölünər, iki hissəsini baba, bir hissəsini isə nənə aparacaq. Əgər ana tərəfdən olan babası və nənəsi olsa, mal onların arasında bərabər .bölünəcək

Məsələ ۲۷۱۶: Əgər meyyitin varisi ancaq ata tərəfdən bir olan baba ya nənə və ana tərəfdən olan bir baba ya nənəsi olsa, mal üç yerə bölünəcək, onun iki hissəsini ata tərəfdən olan baba ya nənə, bir hissəsini isə ana tərəfdən olan baba ya nənə .aparacaq

Məsələ ۲۷۱۷: Əgər meyyitin varisi ata tərəfdən olan baba-nənəsi və ana tərəfdən olan baba-nənəsi olsa, mal üç yerə bölünəcək, onun bir hissəsini ana tərəfdən olan baba-nənəsi öz aralarında bərabər böləcəklər, iki hissəsini isə ata tərəfdən olan

.baba-nənəsinə verəcəklər ki, baba nənədən iki dəfə çox aparacaq

Məsələ ۲۷۱۸: Əgər meyyitin varisi təkcə arvadı, ata tərəfindən olan baba-nənəsi, həmçinin ana tərəfdən olan baba-nənəsi olsa, arvad öz irsini sonradan deyiləcək kimi aparacaq. Əsli malın üç hissəsindən bir hissəsini ana tərəfdən olan baba və nənəyə verəcəklər ki, öz aralarında bərabər bölsünlər. Qalanını isə ata tərəfdən olan baba və nənəyə verəcəklər ki, baba nənədən iki dəfə çox aparacaq. Əgər meyyitin varisi əri, baba və nənəsi olsa, əri malın yarısını aparacaq, baba və nənəsi isə keçən .məsələlərdə deyildiyi kimi öz irsini aparacaq

Məsələ ۲۷۱۹: Qardaşın, bacının və ya qardaşların və bacıların, baba yaxud nənə və ya :babalar yaxud nənələr ilə cəmlənməsinin bir neçə surəti vardır

Baba ya nənənin hər biri və qardaş ya bacı, hamısı ana tərəfdən olsunlar. Bu halda .۱ .onların arasında kişi və qadın olmaqda müxtəlif olsalar da, bərabər bölünəcək

Onların hamısı ata tərəfindən olsunlar, bu halda hamısı kişi və ya hamısı qadın olsa, .۲ mal onların arasında bərabər bölünəcək. Əgər kişi və qadın olmaqda müxtəlif olsalar, .hər kişi qadından iki dəfə çox aparacaq

Baba və ya nənədən hər biri ata tərəfdən olsun və bacı ya qardaş ata-anadan olsun. .۳ Bunun hökmü keçən haldakı hökm kimidir. Məlum oldu ki, meyyitin ata tərəfdən olan bacı, ya qardaşı əgər ata-anadan bir olan bacı ya qardaşla cəm olsa, ata tərəfdən .olanlar irs aparmır

Babalar, ya nənələr, ya hər ikisi həm ata tərəfdən olsun, həm ana tərəfdən olsun, .۴ qardaşlar ya bacılar, ya da hər ikisi də belə olsalar, bu halda ana tərəfdən qohum olan qardaşlar, bacılar, babalar, nənələr, malın üçdə birini öz aralarında bərabər böləcəklər, kişi və qadın olmaqda müxtəlif olsalar da; Ata tərəfdən qohum olanlara isə malın üçdə ikisidir ki, hər kişiyə qadından iki dəfə çox veriləcək. Əgər onların arasında .hamısı kişi, ya hamısı qadın olsa, onların arasında bərabər bölünəcək

Ata tərəfdən olan baba ya nənə, ana tərəfdən olan qardaş ya bacı ilə cəm olsun. Bu .۵

altıda birini aparacaq, əgər tək deyilsə, onun üçdə birini bərabər öz aralarında böləcəklər, qalanını isə baba ya nənənin malıdır. Əgər baba ya nənə hər ikisi olsa, .baba nənədən iki dəfə çox aparacaq

Ana tərəfdən olan baba ya nənə, ata tərəfdən olan qardaş ya qardaşlar ilə cəm .۶ olsun. Bu halda baba, ya nənə üçün malın üçdə biridir, əgər hər ikisi sağ olsa, üçdə birini bərabər şəkildə bölərlər, onun üçdə ikisi isə qardaş ya qardaşlar üçündür. Əgər o baba ya nənə ilə ata tərəfdən bacı olsa, tək olan halda malın yarısını aparacaq, əgər çox olsalar, üçdə ikisini aparacaqlar, hər halda baba ya nənə üçün malın üçdə biridir. Buna görə də əgər bacı tək olsa, meyyitin malının altıda biri onlardan artıq qalır. Bunun da bacıya verilməsi və ya baba ilə nənə arasında bölünməsi ehtimalı var. Bu halda .ehtiyat-vacibə əsasən bir-birləri ilə razılaşmalıdırlar

Babalar, nənələr, ya hər ikisi həm ata tərəfdən, həm də ana tərəfdən olsun və onlar .۷ ilə ata tərəfdən bacı ya qardaş olsun, istər tək olsun, istərsə də çox, bu halda ana tərəfdən olan baba ya nənə üçün malın üçdə biridir. Əgər çox olsalar öz aralarında kişi və qadın olmaqda müxtəlif olsalar da, bərabər böləcəklər. Ata tərəfdən olan baba ya nənə üçün və ata tərəfdən olan bacı ya qardaş üçün qalan malın üçdə ikidir. Əgər kişi və qadın cəhətindən müxtəlif olsa, kişilər qadından iki dəfə çox aparacaq. Əgər o babalar ya nənələrlə bir anadan olan bacı ya qardaş olsalar, bir anadan olan babaya ya nənəyə, bir anadan olan bacı ya qardaş ilə birlikdə üçdə bir düşəcək və onların arasında bərabər bölünəcək. Kişi və qadın cəhətindən müxtəlif olsa belə və ata .tərəfdən olan baba ya nənə üçün üçdə ikidir. Baba nənədən iki qat artıq pay aparır

Qardaş ya bacıların bəzisi ata tərəfdən, bəzisi isə ana tərəfdən olsun və onlar ilə ata .۸ tərəfdən olan baba ya nənə olsun, bu surətdə, ana tərəfdən olan bacı ya qardaş üçün tək olan surətdə malın altıda birdir. Əgər çox olsalar, malın üçdə birdir ki, öz aralarında bərabər böləcəklər. Ata tərəfdən olan bacı ya qardaş üçün ata tərəfdən olan baba ya nənə ilə birlikdə malın qalanıdır. Kişilər qadınlardan iki qat artıq pay aparacaq. Əgər o

qardaş ya bacılar ana tərəfdən olan baba ya nənə ilə birlikdə olsa, ana tərəfdən olan baba ya nənə üçün ana tərəfdən bacı qardaş ilə birlikdə malın üçdə biridir ki, öz aralarında bərabər böləcəklər, ata tərəfdən olan bacı ya qardaş üçün irsin üçdə .ikisidir. Onların kişiləri qadınlardan iki dəfə çox irs aparır

Məsələ ۲۷۲۰: Meyyitin qardaş və bacısı olduğu təqdirdə meyyitin qardaşının və ya bacısının uşağına yetişməz. Lakin bu hökm qardaşın və ya bacının övladının qardaş və bacının mirasına bir əngəl təşkil etmədiyi hala aid deyil. Məsələn; əgər meyyitin ata tərəfdən olan qardaşı və ana tərəfindən olan babası olarsa, ata tərəfindən olan qardaşı malın üçdə ikisini və ana tərəfindən olan babası malın üçdə birini irs aparır, bu təqdirdə meyyitin ana tərəfindən olan qardaşı oğlu da olarsa, o qardaşoğlu babası ilə .malın üçdə birinə şərik olur

**ÜÇÜNCÜ DƏSTƏNİN İRSİ**

Məsələ ۲۷۲۱: Üçüncü dəstə əmi, bibi, xala, dayı və onların övladlarıdır ki, əgər birinci və .ikinci dəstədən bir kəs olmasa, bunlar irs aparacaqlar

Məsələ ۲۷۲۲: Əgər meyyitin varisi ancaq bir əmi ya bir bibi olsa, istər meyyitlə ata-anadan bir olsun, istər atadan bir olsun, istərsə də anadan bir olsun, malın hamısı ona çatar. Əgər bir neçə əmisi, ya bir neçə bibisi olsa və hamısı ata-anadan, ya atadan, ya anadan bir olsa, malı öz aralarında bərabər böləcəklər. Əgər həm əmi və həm bibisi .olsa, əmi bibidən iki dəfə çox aparacaq

Məsələ ۲۷۲۳: Əgər meyyitin varisi əmi və bibi olsa və onların bəzisi atadan, bəzisi anadan, bəzisi isə ata-anadan bir olsa, atadan bir olan əmi və bibi irs aparmaz. Məsələn əgər meyyitin ana tərəfdən bir əmisi, ya bir bibisi olsa, malı altı yerə böləcəklər, onun bir hissəsini anadan bir olan əmi ya bibiyə, qalanı isə ata-anadan bir olan əmi və bibiyə, onlar olmayan halda isə atadan bir olan əmi və bibiyə verəcəklər. Əgər anadan bir olan həm əmisi və həm bibisi olsa, malı üç yerə böləcəklər. İki

hissəsini ata-anadan bir olan əmi və bibiyə, onlar olmasa, atadan bir olan əmi və bibiyə, bir hissəsini isə anadan bir olan əmi və bibiyə verəcəklər. Əmi hər bir halda .bibidən iki dəfə çox irs aparır

Məsələ ۲۷۲۴: Əgər meyyitin varisi ancaq bir dayı ya bir xala olsa, malın hamısı ona çatar. Əgər həm dayı və həm xalası olsa və hamısı ata-anadan ya atadan ya anadan bir olsalar, uzaq deyil ki, dayı xaladan iki dəfə çox aparsın. Lakin, bərabərçiliyə də .ehtimal edilir, buna görə də, ehtiyat-vacibə görə artıq miqdarda razılaşmalıdırlar

Məsələ ۲۷۲۵: Əgər meyyitin varisi ancaq anadan bir olan bir ya bir neçə dayısı, ya bir xalası, ata-anadan bir olan xalası və dayısı, həmçinin atadan bir olan dayı və xalası olsa, atadan bir olan xala və dayının irs aparmaması işkallıdır. Hər halda anadan bir olan dayı və ya xalası bir nəfər olsa, altıda birini, əgər bir neçə nəfər olsalar, üçdə birini irs aparırlar, yerdə qalanı isə atadan ya ata-anadan bir olan dayı və ya xalaya çatır. Hər bir halda dayının xaladan iki dəfə çox irs aparması ehtimal verilir. Amma ehtiyat-.vacibə görə razılaşmalıdırlar

Məsələ ۲۷۲۶: Əgər meyyitin varisi bir ya bir neçə dayı, ya bir ya bir neçə xala, ya xala və dayısı və bir ya bir neçə əmi, ya bir və ya bir neçə bibi, ya əmi və bibisi olsa, malı üç qismə böləcəklər. Bir hissəsini dayı ya xala, ya hər ikisi, qalanını isə əmi, ya bibi, ya hər .ikisi aparar. Hər iki dəstənin malı necə bölüşdürülməsi yuxarıda deyildi

Məsələ ۲۷۲۷: Əgər meyyitin əmi, bibi, dayı, xalası olmasa, onların övladına veriləcək. Əgər bir bibi qızı və bir neçə dayısı oğlu olarsa, bibisi qızı üçdə ikisi qədər, dayısı oğlanları isə üçdə birini aparır və öz aralarında bölürlər. Bu dəstə (dayının, əminin, bibi və xalanın övladları) meyyitin ata və ya anasının əmisi, bibisi, dayısı və xalasından .irəlidir

Məsələ ۲۷۲۸: Əgər meyyitin varisi, atasının əmi, bibi, dayı və xalası, həmçinin onun anasının əmi, bibi, dayı və xalası olsa, malı üç yerə böləcəklər. Onun bir hissəsini meyyitin anasının əmisi, bibisi, dayısı və xalası irs aparacaqlar və məşhura əsasən malın, onların arasında bərabər bölünəcəyi və ya kişinin iki

qadın payı aparacağı ixtilaflıdır. Ehtiyat-vacib əsasən razılaşmalıdırlar. Onun qalan iki hissəsini üç yerə bölləcəklər: onun bir hissəsini meyyitin atasının dayısı və xalası öz aralarında eyni qayda ilə bölləcəklər, o biri iki hissəni isə onun atasının əmisi və bibisi .eyni qayda ilə bölləcəklər

## ƏR VƏ ARVADIN İRSİ

Məsələ ۲۷۲۹: Əgər bir qadın ölsə və övladı olmasa, onun bütün malının yarısı ərinə, qalanı isə o biri vərəsələrə çatacaq. Əgər həmin ərdən, ya başqa ərdən övladı olsa, .bütün malının dörddə biri ərinə, qalanı isə o biri vərəsələrə çatacaq

Məsələ ۲۷۳۰: Əgər bir kişi ölsə və övladı olmasa, malının dörddə biri arvadına, qalanı isə başqa vərəsələrə çatacaq. Əgər o qadından ya başqa qadından övladı olsa, malının səkkizdə biri arvadına, qalanı isə başqa vərəsələrə çatacaq. Qadın evin yerindən, bağdan, əkindən və başqa yerlərdən irs aparmaz, nə yerin özündən, nə də onun qiymətindən. Həmçinin bina və ağac kimi havada (torpaqdan yuxarı) olan malın özündən irs aparmaz, amma onun qiymətindən irs aparar. Həmçinin, bağda, əkin sahəsində və başqa yerlərdə olan ağac, əkin və evlərin hökmü də bu cürdür. Amma əri .ölən zaman ağacda (ağacın üstündə) olan meyvələrin özündən irs aparır

Məsələ ۲۷۳۱: Əgər qadın irs aparmadığı şeylərdən, məsələn; məskunlaşmış evin yerini istifadə etmək istəsə, gərək başqa vərəsədən icazə alsın. Həmçinin, vərəsələr arvadın payını verməmiş, arvadın qiymətindən irs apara biləcəyi şeylərdən (məsələn; bina, .ağac) onun icazəsi olmadan istifadə etməsi icazəli deyildir

Məsələ ۲۷۳۲: Bina, ağac və buna bənzər şeylərin qiymətini müəyyən etmək istərlərsə, dəyər müəyyən edən mütəxəssislərin etdiyi kimi, onların olduqları yerin xüsusiyyətini nəzərə almadan nə qədər qiymət daşıdıqlarını hesab etməlidirlər. Onları yerdə qoparılmış fərz edərək və ya kirayəsiz olaraq o yerdə qalacaqları nəzərə alınaraq .qiymətləri hesab edilməməlidir

Məsələ ۲۷۳۳: Kanal suyunun məcrası və s. yerin hökmünə aiddir, orada işlədilən kərpic .və digər şeylər tikinti hökmündədir. Amma suyun özündən irs aparır

Məsələ ۲۷۳۴: Əgər meyyitin bir neçə arvadı olsa, belə ki, (ərin) övladı olmasa, malın dördə birini, əgər övladı olsa, malın səkkizdə birini şərh olunduğu kimi, o qadınların arasında bərabər böləcəklər. Hətta ər onlardan heç biri ilə və ya bəzisi ilə yaxınlıq etməmiş olsa belə. Amma ölümünə səbəb olan xəstəlik zamanı bir qadını nikah etmiş .və onunla yaxınlıq etməmişdirsə, o qadın irs aparmaz və mehr haqqı da yoxdur

Məsələ ۲۷۳۵: Əgər qadın xəstə halında ərə getsə və o xəstəlik ilə ölsə, əri onunla .yaxınlıq etməsə də, ondan irs aparır

Məsələ ۲۷۳۶: Əgər təlaq hökmlərində deyilən tərtib ilə bir qadına rici təlaq versələr və iddə əsnasında ölsə, ər ondan irs aparar. Həmçinin əgər ər o iddənin əsnasında ölsə, qadın ondan irs aparar. Amma əgər iddə keçəndən sonra ya bain iddəsində onlardan .biri ölsə, o biri irs aparmaz

Məsələ ۲۷۳۷: Əgər ər, xəstə halında öz əyalına təlaq versə və on iki hilali ayı keçməzdən əvvəl ölsə, qadın üç şərt ilə ondan irs aparar, istər rici təlaq olsun, istərsə :bain

Bu müddətdə başqa ərə getməsin, ərə gedən halda irs aparmır. Hərçənd ehtiyat- .۱ .müstəhəb budur ki, razılaşsınlar

Təlaq, qadının istək və razılığı ilə olmamış olsun, əks təqdirdə, istər onun təlaqı üçün .۲ .ərinə bir şey vermiş olsun və ya verməsin, irs aparmaz

Ər qadına təlaq verdiyi vaxtda olan xəstəlik ilə ya başqa bir səbəbdən ölsə, beləki .۳ əgər o xəstəlikdən yaxşı olub başqa bir səbəbə görə dünyadan getsə, qadın ondan irs .aparmaz. Amma rici təlaq iddəsində vəfat edibsə, irs aparar

Məsələ ۲۷۳۸: Ərin, öz qadınının geyməsi üçün aldığı paltar, qadının əynində olsa da, ərin ölümündən sonra ərin malındandır. Əgər qadının mülkiyyətinə keçiribsə (öz) malı olar.

Qadının nəfəqə ünvanı ilə ərindən, libasları onun mülkiyyətinə keçirməsini tələb .etməyə haqqı var

## İRSİN MÜXTƏLİF MƏSƏLƏLƏRİ

Məsələ ۲۷۳۹: Meyyitin Quranı, üzüyü və qılıncı, həmçinin geydiyi ya geymək üçün saxladığı paltarlar böyük oğlunun malıdır. Əgər meyyitin əvvəlki üç şeyi birdən çox olarsa, məsələn; iki Quranı və ya iki üzüyü olsa, ehtiyat-vacib budur ki, böyük oğul onlardan başqa vərəsələr ilə razılaşsın. Rəhl, (Quran qoyulan taxta) tüfəng, xəncər və .bu kimi silahların, qılıncın qını, Quranın qabı da onlara aiddir

Məsələ ۲۷۴۰: Əgər meyyitin böyük oğlu birdən çox olsa, məsələn; onun iki arvadından eyni vaxtda iki oğlu olsa, gərək yuxarıda deyilən əşyaları öz aralarında bərabər .bölsünlər. Bu hökm ondan böyük bacıları olsa belə, yalnız böyük oğula məxsusdur

Məsələ ۲۷۴۱: Əgər meyyitin borcu olsa, belə ki, borcu onun malı qədər ya ondan çox olsa, gərək böyük oğul onun malı olan və yuxarıdakı məsələdə deyildiyi əşyalardan onun borcuna versin ya da onların qiyməti qədərincə öz malından versin. Əgər meyyitin borcu malından az olarsa, böyük oğula çatan bir neçə əşyadan başqa, yerdə qalan malı, borcunu ödəməyə kifayət etməzsə, böyük oğul ya o əşyalardan ya da öz malından onun payına düşən nisbətlə gərək onun borcunu versin. Həmçinin ehtiyat-lazım budur ki, deyilmiş şəkildə böyük oğul meyyitin borcunu ödəməkdə iştirak etsin, məsələn; əgər onun malı ۶۰ manat olarsa və ondan ۲۰ manat böyük oğlun malı olan şeylərdən olsa və ۳۰ manat da borcu olsa, böyük oğul gərək o dörd şeydən ۱۰ manat .miqdarında meyyitin borcuna versin

Məsələ ۲۷۴۲: Müsəlman kafirdən irs aparır. Amma kafir, müsəlman meyyitin oğlu ya .atası olsa da, ondan irs aparmır

Məsələ ۲۷۴۳: Əgər bir şəxs, öz qohumlarından birini bilə-bilə və nahaqdan öldürsə, ondan irs aparmır, amma əgər haqqlı olsa, məsələn, qisas, ya hədd icra olunması və ya müdafiə kimi olsa, irs aparır. Həmçinin əgər xəta üzündən olsa, məsələn; daşı havaya atsa və təsadüfən qohumlarından birinə dəyib öldürsə, ondan irs aparır, amma qətlin diyəsindən qatilin ata tərəfdən kişi

qohumları verdiyi diyədən irs apara bilməz. Əgər qətl şibhi-qəsd olarsa, (yəni adətən qətlə səbəb olmayan, qətl qəsdi də olmayan, amma o işi öldürülənə nisbətdə yerinə yetirmək qəsdində olarsa) bu iş irsə mane olmaz.

Məsələ ۲۷۴۴: Əgər irsi bölmək istəsələr, ana bətnində olan və diri dünyaya gəldikdə irs aparan, uşağın bir ya bir neçə olması, habelə qız və ya oğlan olması məlum olsa, hətta elmi vasitələrin köməyi ilə olsa belə, gərək onun payını saxlasınlar. Əgər məlum olmasa, iki və ya üç, olmasına etibarlı ehtimal verirlərsə, ehtimal verilən uşaqların payını kənara qoymalıdırlar. Əgər sonradan, məsələn; bir oğlan və bir qız dünyaya gələrsə, artıq qalanını varislər öz aralarında bölələcəklər.

## ƏLAVƏLƏR

### BANKA PUL QOYMAQ VƏ BORC ALMAQ – ۱

:İslami ölkələrdə banklar üç növdür

Xüsusi banklar. Belə ki, onun sərmayəsi bir və ya bir neçə şəxsin sərmayə qoyması-۱ ilə təşkil olunur.

.Dövlət bankları. Onun sərmayəsi dövlət, malından təşkil olunur-۲

Müştərək banklar. Onun sərmayəsi həm dövlət həm də xüsusi sərmayədən təşkil-۳ olunur.

Məsələ ۱: Xüsusi banklardan borc edilən məbləğdən artıqlaması ilə verilməsi şərti ilə borc almaq, riba və haramdır. Əgər bir şəxs bu qaydada borc alarsa borcun özü səhih, şərt isə batildir. Şərtə əməl etmək adı ilə əlavə məbləğ almaq, yaxud vermək haramdır.

:Ribadan qurtarmaq üçün müəyyən yollar qeyd edilib, o cümlədən

Borc alan şəxs, misal üçün, bankdan, yaxud onun vəkilindən müəyyən bir malı həqiqi-۱ qiymətindən on və, yaxud iyirmi faiz artıqlaması ilə alır və, yaxud hər hansı bir malı onun həqiqi qiymətindən az qiymətə banka satır və müamilə əsnasında şərt edilir ki, bank iki tərəfin razılaşdığı məbləği müəyyən bir müddətdə ona borc versin. Belə vəziyyətdə deyirlər ki, bankdan borc götürmək caizdir və riba deyildir.

Lakin bu məsələ işkalsız deyildir və ehtiyat-vacib budur ki, ondan çəkinilsin. Həmin məsələ hibə, icarə və sülhdə də borc vermək şərti ilə caridir.

Əgər bir kəs bir mühabati müamilədə (həqiqi qiymətindən az qiymətə satmaq, yaxud ondan artıq qiymətə almaq) onun

.borcunu ödəməkdə möhlət verilməsini şərt edərsə də hökm eynidir

Borcu alverə çevirsinlər. Məsələn, bank müəyyən bir məbləği, misal üçün min-٢ manatı, min iki yüz manata nisyə olaraq iki aylığa satır. Bu cür hallarda borc verməyin .həqiqəti ribalı olmadığına baxmayaraq müamilənin səhih olması işkallıdır

Əlbəttə, bank müəyyən bir məbləği, məsələn min manatı, iki aylıq nisyə olaraq borc götürənə sata bilər və onun sonradan əldə edəcəyi qiymətini də başqa puldan min iki yüz manata, özü də onun bir puldan başqa pula çevrilməsinə sərf etdiyi əmək müqabilində verə bilər. O müddətdən sonra bank ondan borc alan şəxsdən təyin olunmuş pulu və, yaxud onun manatla olan əvəzini ala bilər ki, öz cinsindən başqası .olsun və haram riba lazım gəlməsin

Bank müəyyən bir malı müəyyən məbləğə, misal üçün, min iki yüz manatı nisyə-٣ olaraq müştəriyə satır və sonra həmin məbləği nağd olaraq ondan az qiymətə, .məsələn min manata alır

Bu formada olan müamilə də, əgər birinci müamilədə bank malı yenidən nağd olaraq onun nisyə qiymətindən az qiymətə aldığı halda, yaxud müqavilədən əvvəl şərt etdikləri və müqaviləni onun əsasında qurduqları halda səhih deyildir. Lakin əgər belə .bir şərt qoyulmamış olarsa işkalı yoxdur

Qeyd etmək lazımdır ki, bu kimi yollar düz olsalar da belə, bank müamilələrində əsaslı bir hədəfi gerçəkləşdirmir. O da bundan ibarətdir ki, bank müəyyən olunmuş vaxtda borcun qaytarılması mümkün olmadıqda daha artıq pulu öz haqqının təxirə salınmasına görə tələb edə bilər. Çünki borclunun öz borcunu ödəməyi təxirə saldığı halda əlavə qazanc alınması haram ribadır. Hətta onu əqd əsnasında şərt kimi qoymuş .olsalar belə

Məsələ ٢: Dövlət banklarından, əlavə qazanc ödəməklə borc götürmək icazəli deyildir. Çünki bu ribadır və onda rəhn qoyub-qoymamaq arasında heç bir fərq yoxdur. Əgər ,bir şəxs bu şərtlərlə dövlət banklarından borc götürərsə onun həm borcu

həm də şərti batildir. Çünki bank öz əlində olan malların sahibi deyildir ki, onu borc .alanın mülkiyyətinə keçirə bilsin

Bu işkaldan xilas olmaq üçün borc alan şəxs nəzərdə tutduğu məbləği bankdan məchulul-malik adı ilə şəriət hakimin (Mərcəi-təqlid) icazəsi ilə götürə bilər. Onlardan istifadə etməyin ixtiyarı şəriət hakiminin əlindədir və bu icazəni biz bütün möminlərə vermişik və bu icazəmiz kifayət edər, və möminlərin niyyəti bu olsun ki, şəriət hakimindən borc alıram, sudu verməmək şərti ilə. Baxmayaraq ki, qanuna əsasən .götürülən pulun miqdarı və onun sudunu banka verilməsinin lazımlığını bilsinlər

Məsələ ۳: Xüsusi banklarda, onlara borc vermək mənasına olan əmanət qoyuluşu əlavə qazanc şərt olmadan caizdir. Bu mənaya ki, borc verməyi bankı əlavə qazanc verməyə məcbur etməklə əlaqələndirməsinlər. Nəinki şəxsin özünün öz batinində bankın vermədiyi halda qazancı tələb etmək məqsədi olmasın; Çünki bir şeyi tələb etməyi nəzərdə tutmaq, şərt etməməklə bir yerə cəm ola bilər. Eləcə də tələb etməməyi nəzərdə tutmaq, şərt qoymaqla bir yerə yığışa bilər. Bir şəxs hər hansı bir .şeyi şərt etmədən onu istəyə bilər, yaxud şərt edərək istəməyə bilər

Məsələ ۴: Xüsusi banklarda, onlara borc vermək mənasına olan əmanət qoyuluşu əlavə qazanc şərti ilə icazəli deyildir. Əgər bir kəs belə eləsə əmanət qoymağın özü səhih, lakin şərt batildir. Əgər bank əlavə qazancı ödəyərsə o, onlara malik olmaz. Amma əgər bank sahiblərinin, hətta şərən malik olmadıqlarını bildiyi halda onun bu qazancda təsərrüf etmələrinə razı olduqlarına xatircəm olsa onun təsərrüf etməsinin .işkalı yoxdur və əksər hallarda da belə olur

Məsələ ۵: Dövlət banklarında, onlara borc vermək mənasına olan əmanət qoyuluşu qazanc almağın şərt edilməsi ilə, icazəli deyildir və o qazanc ribadır. Hətta, bu kimi banklara pul qoymaq, hərçənd qazanc almamaqla olsa belə şərən malın tələf edilməsi sayılır. Çünki bankdan sonradan alacağı şeylər bankın malı deyil, əksinə məchulul-malikdən sayılır. Buna əsasən, şəxsin il boyu əldə etdiyi qazanc və faydaların dövlət banklarına onun xümsünü vermədən qoyulması müşküldür (işkallıdır). Çünki onun bu mal-dövlətdən öz xərcləri üçün təsərrüf

edilməsinin icazəsi vardır və onu tələf etməyə icazə verilmir. Əgər onu tələf edərsə onun xümsünü sahiblərinə zamindir. Əlbəttə bu o, haldadır ki, əmanət qoymaq şərit hakiminin icazəsi olmadan olsun. Amma şəriət hakimi əmanət qoymağı bir şəxsə icazə versə və bank sisteminə, əmanəti bankda mövcud olan əmvaldan ödəməsinə icazə versə, əmanət qoymaq şəri irad tapmır. Necəki əmanət qoyanın şərt qoyulmamış sudu alması və onun yarsını öz şəxsi işləri digərini isə müstəhəq və fəqir şəxslərə sədəqə verməsi caizdir. Bütün möminlər bizim tərəfdən icazələri var əmanət qoyub və .sudu alıb qeyd olunan surətdə istifadə etsinlər

Məsələ ۶: Qeyd olunan hallarda banklara sabit əmanətlə pul qoymaqda (ki, müddəti vardır və bankın onu daim olaraq pul qoyan şəxsin ixtiyarına qoymasına iltizamlı deyil) cari hesablar arasında (ki, bank onu pul qoyan şəxsin ixtiyarına verməyə iltizamlıdır) .heç bir təfavüt yoxdur

Məsələ ۷: Qeyd olunan hallarda müştərək banklar da dövlət bankları hökmündədir və onda mövcud olan mal-dövlətlər məchulul-malik hökmündədir və şəriət hakiminə .müraciət etmədən onlardan istifadə etmək icazəli deyildir

Məsələ ۸: Xüsusi və dövlət banklarından borc almaq və ora pul qoymaq barəsində qeyd olunanlar İslam dövlət bankları ilə əlaqədar idi. Lakin əlavə qazanc əldə etmək məqsədi ilə sərmayələri, mal-dövlətləri möhtərəm sayılmayan kafirlərə məxsus olan banklarda qoymaq caizdir istər bu banklar xüsusi olsun, istər dövləti, istərsə də müştərək. Çünki onlardan riba almaq caizdir. Lakin onlardan əlavə gəlir ödəmək məqsədi ilə borc almaq haramdır. Bu işdən qurtarmaq üçün malı borc adı ilə deyil, qənimət adı ilə bankdan alıb şəriət hakiminə müraciət etməyə heç bir ehtiyac olmadan təsərrüf etmək olar. Hərçənd onların həm malın əslini, həm də qazancını ondan tələb .edəcəklərini bilsə belə

## KREDİTLƏR – ۲

:Kredit iki növdür

.İdxalat üçün olan kreditlər-۱

Xarici malları ölkəyə daxil etmək istəyən bir şəxs banka müraciət edərək kredit götürmək istəyir (kredit götürməsi üçün sənəd verir). Nəticədə bank ona iltizam verir ki, ölkəyə gətirilən xarici əmtəələrin sənədlərini kredit sahiblərinə təhvil versin və onun .məbləğini əmtəəni ixrac edən şəxsin hesabına köçürsün

Malı ixrac edənlə müamilə yazışma, yaxud ölkədə mövcud olan vəkilə müraciət etməklə tamam olduqdan, eləcə də əmtəələrin keyfiyyət və kəmiyyətini bəyan edən listi aldıqdan, əmtəənin qiymətinin bir hissəsini bankın hesabına köçürdükdən sonra .nəhayət bank sənədləri təhvil alır və əmtəələrin məbləğini satıcıya göndərir

.İxracat üçün kredik-۲

Bunun yuxarıdakı kreditlə yalnız adda fərqi vardır. O da bundan ibarətdir ki, əmtəəni ölkədən xaricə ixrac etmək istəyir, xarici alıcı onunla rabitə yaratmaq üçün bankda kredit götürmək üçün sənəd açır ki, onun əsasında bank əmtəənin sənədlərini alıcıya təhvil versin və onun məbləğini yuxarıdakı mərhələləri keçdikdən sonra malı ixrac .edənə verir

Bu iki növ kreditin nəticəsində həqiqətdə heç bir fərq yoxdur; kredit istər idxal üçün olsun, istərsə də ixrac üçün və bankın müştərinin borcunu ödəmək barəsində verdiyi iltizamdan yəni alınmış əmtəələrin qiymətini satıcıya və onun sənədlərini isə müştəriyə .vermək haqda iltizamından ibarətdir

Əlbəttə bir növ kredit da mövcuddur. Belə ki, əmtəə ixrac edən şəxs əmtəələrin keyfiyyət və kəmiyyətini göstərən bir siyahını, idxal edən şəxslə heç bir müamilə baş vermədən banka, yaxud onu ölkə daxilindəki şöbəsinə göndərir, bank da öz növbəsində o listi ehtimal verilən alıcılara göndərir. O şəxs listə qeyd olunan əmtəələri

.üçün sənəd verir və bank da əmtəələrin sənədlərini təhvil verib pulunu alır

Məsələ ۹: Zahirən yuxarıda qeyd olunan kredit növlərinin hamısının banklarda açılması .və bu işlərin banklar tərəfindən köçürülməsi caizdir

:Məsələ ۱۰: Bank kredit sahibindən iki cür qazanc əldə edir

Bankla əlaqədar xidmətlərdən əldə edilən qazanclar. Məsələn, borcun ödənilməsinə-۱ dair verdiyi iltizam, əmtəəni ixrac edənlə rabitə yaratmaq və onun sənədlərini alıb .alıcıya təhvil verməsi və sair kimi xidmətlər

Bu cür qazanc əldə etmək caizdir, çünki cüalə əqdi sırasında yerləşir. Yəni kredit sahibi müəyyən bir məbləği etdiyi xidmətlər müqabilində bank üçün təyin edir. Həmçinin onu .səhih olma şərtlərinə malik olduqda icarə əqdində də daxil etmək olar

Bank malın qiymətini müştərinin hesabından deyil, öz malından ödəyir və müəyyən-۲ müddətə qədər müştərinin onu tələb etməməsi müqabilində ödəmiş olduğu məbləğin .məcmusundan müəyyən faizi qazanc kimi əldə edir

Deyilmişdir ki, bu cür qazanc əldə etməyi belə səhih hesab etmək olar ki, bank kredit sahibinə pul borc vermir ki, borc əqdi ilə onun mülkiyyətinə keçsin və riba hasil olsun; əksinə, bank müştərinin istəyi ilə onun borcunu başqasına ödəyir. Buna əsasən itlaf (tələf etmə) qanununa müvafiq olaraq kredit sahibinin zəmanəti qəramət zəmanətidir .və bu, borc zəmanəti deyil ki, qazanc alınması haram olsun

Amma aydındır ki, kredit sahibi yalnız özünün banka olan borcunun əslinə zamindir. Deməli, bank tərəfindən onun ödənməsi üçün möhlət verilməsi müqabilində müəyyən .qədər qazanc alınması haram ribadır

Əlbəttə, əgər kredit sahibi, bank tərəfindən borcun ödənilməsi müqabilində borcun əslini və onun müddətli olan qazancını, misal üçün iki aya, cüalə ünvanı ilə qərar verərsə bu əqd cüalə müqaviləsinə daxil olacaqdır və bu surətdə onun səhih olması .dəlilsiz (əsassız) deyildir

Həmçinin bu müamilənin ribalı olmasından qurtarmaq və qazanca səhihlik vermək üçün onu al-ver əqdinə daxil etmək

olar. Çünki bank malın qiymətini xarici pul dəyərində onu ixrac edən şəxsə ödəyir, həmin miqdar xarici pulu da müştərinin zimməsində ölkədə yayılmış pul məbləğinə sata bilər ki, o pulun müadili (bərabəri) və qazancı nəzərdə tutulmuş olsun. Verilən və .alınan cinslərin müxtəlif olduğuna görə heç bir işkalı yoxdur

Yuxarıda qeyd olunan halların hamısı o yerdədir ki, hesab tərəfi olan bank xüsusi olsun. Amma dövlət və, yaxud müştərək bank olarsa borc istəyən kredit məchulul malik malından ödədiyinə görə şəxsən özü banka borclu olmur. Buna görə də borcun əslini onun qazancı ilə yanışı ödəməyə dair iltizam vermək haram riba qəbilindən .sayılmır

### ƏMTƏƏNİN SAXLANMASI – ۳

Bəzi vaxtlar bank malın ixrac edəndən, idxal edənə çatdırılmasında bir vasitə olur və onu idxal edənin hesabına saxlayır. Belə ki idxal edənlə ixrac edən arasında müqavilə bağlandıqdan, malın qiyməti ödəndikdən və qəbz alındıqdan sonra bank onun sənədlərini idxal edən şəxs üçün göndərir və onu malın çatmasından xəbərdar edir, idxal edən şəxsin malı təhvil almaqda təxirə yol verdiyi zaman onu həmin şəxsin tərəfindən saxlayır və onun müqabilində müəyyən ücrət alır. Həmçinin malı ixrac edən şəxs də idxal edən şəxslə heç bir müqavilə bağlmadığı halda bank üçün müəyyən mal göndərir, bank malın göndərildiyi siyahını ehtimal verilən alıcı üçün göndərir. Əgər onlar malı almasalar onu saxlaması müqabilində ixrac edən şəxsdən müəyyən qədər .ücrət ala bilər

Məsələ ۱۱: Əgər malın saxlanması bankın qazancından ixrac edən, yaxud idxal edən şəxsin istəyi ilə olsa və ya müqavilə əsnasında şərt edilmiş olsa hətta bu şərt deyilməmiş olsa və zehnlərdə olsa belə bank üçün o malları saxlamaq müqabilində .ücrət almaq caizdir, əks halda bir şey tələb etməyə haqqı yoxdur

## TƏRK OLUNMUŞ MALLARIN SATILMASI – ۴

Bəzən mal sahibləri bankı malın varlığından xəbərdar etdikdən sonra onu təhvil almaq və banka ücrət verməkdən çəkinirlər. Bank həmin malı satır və onun qiymətindən öz .haqqını götürür

Məsələ ۱۲: Yuxarıda qeyd olunan halda bank üçün malı satmaq, başqaları üçün isə onu almaq caizdir. Çünki aşkar şəkildə deyilmiş, yaxud zehnlərdə məlum olan şərtin tələbinə görə bu kimi hallarda mal sahibləri öz malını təhvil alaraq bankın haqqını verməklə əlaqədar şərti pozduqda bank onların tərəfindən həmin malı satmağa .vəkildir. Əgər onun satışı icazəlidirsə, alınması da icazəlidir

## BANK VƏKALƏTİ – ۵

Bəzən bir, ya bir neçə şəxs müştərək olaraq dövlət, ya qeyri-dövlət mərcəyi müqabilində razılaşırlar ki, müəyyən bir layihəni işləsinlər. Məsələn, müəyyən bir mədrəsə, yaxud poliklinika, yaxud körpü tiksinlər. Belə hallarda bəzən elə olur ki, kimin üçün iltizam verilibsə, iltizam verən şəxsdən istəyir ki bu layihənin icra olunmasına müəyyən zəmanət versin və onun təyin olunmuş zamanda icra olunmadığı təqdirdə dəyən xəsarətləri ödəsin. Öz verdiyi iltizama riayət edəcəyinə əmin olmaq üçün iltizam verən şəxsdən bu barədə bir kəfil də istəyir. Belə olan hallarda iltizam verən şəxs banka müraciət edir ki, kəfil olmaq barəsində sənəd versin və onun əsnasında kəfil olsun ki, iltizam verən şəxsin qərara alınmış möhlət zamanında icra etmədiyi və təyin .olunan xəsarəti ödəmədiyi təqdirdə bank o xəsarətləri ödəməyi zamin olur

Məsələ ۱۳: Bankın iltizam verən şəxsin layihəni icra etməkdən, yaxud dəyən xəsarəti ödəməkdən boyun qaçırdığı surətdə layihə sahibinə istədiyi müəyyən bir məbləği verməsi əsasında olan iltizamı bir növ mali kəfalətdir (bu, müamilə

bölmələrində deyilən istilahi kəfalətin müqabilindədir; belə ki, bir şəxs üzərində haqqı .(olan başqa şəxsi çağırmaqla əlaqədar iltizam verir

Mali kəfalətin zamin olmaqla fərqi bundan ibarətdir ki, zəmanətdə zamin duran şəxsin zimməsi zəmanət verilən malın zamin olunmuş şəxsin xeyrinə təhvil verilməsi əsasında məşğul olur. Əgər ona əməl etmədən ölərsə, ondan qalan mal bölüşdürülməmişdən əvvəl ondan götürülür və ödənilir. Amma bu cür zəmanətdə zamin borclu deyil. Bəlkə vacibdir onu ödəsin. Əksinə onu ödəməsə və vəsiyyətdə .etməsə ondan qalan maldan götürə bilməzlər

Kəfalət əqdi, kəfilin icabı (qəbul etməsi), iltizam verməsini göstərən hər bir şeylə istər məkfulun ləhin sözü, istərsə yazısı, istər əməli, qəbulu olsun, onun razılığını çatdıran .hər bir şeylə səhihdir

Məsələ ۱۴: Bank üçün layihənin icra olunması əsasındakı kəfalət müqabilində verdiyi iltizamdan müəyyən muzd alması caizdir və bu müqaviləni cüalə qəbilindən hesab etmək olar. Belə ki, iltizam verən şəxs bankın kəfil olması müqabilində onun üçün bir .cüalə təyin edir və bu halda bank üçün həmin məbləği alması halaldır

Məsələ ۱۵: Əgər iltizam verən şəxs təyin olunmuş müddət ərzində layihənin icra olunmasına xilaf çıxarsa, sahibkara iqrar etdiyi xəsarətin ödənilməsindən imtina edərsə və onun kəfili olan bank istənilən məbləği sahibkara versə bank iltizam verən şəxsə müraciət edə bilər. Çünki bankın kəfalət və iltizamı məhz iltizam verən şəxsin istəyi ilə olmuşdur və o, öz verdiyi iltizamın nəticəsində banka dəyən xəsarətlərə .zamindir. Buna görə də bank ona müraciət edib xəsarətləri ondan tələb edə bilər

### SƏHMİYYƏNİN (VAUÇER) SATILMASI – ۶

Bəzən səhmdar şirkətlər bankları öz səhmlərinin satılmasında bir vasitə qərar verirlər, banklar da müəyyən bir ücrət almaq

müqabilində qeyd olunan şirkətlərin tərəfindən bir nümayəndə kimi onların səhmlərini .satmağa başlayır

Məsələ ۱۶: Bankla edilən bu cür müamilə caizdir. Çünki həqiqətdə ya icarəyə daxildir, belə ki, şirkət bankı müəyyən etdiyi muzd müqabilində bu işi görməyə əcir edir, yaxud da cüalə qismindən hesab etmək olar. Hər iki halda müamilə səhihdir və bank bu işi .yerinə yetirdiyinə görə əmək haqqı (muzd) almağa haqlıdır

Məsələ ۱۷: Bu səhmlərin alınıb satılması səhihdir. Əlbəttə, əgər səhmdar şirkətlərin müamiləsi haram olsa, məsələn, şərab alverinə, yaxud ribalı müamilələrə girişsələr, .onun səhmlərini almaq və bu müamilədə iştirak etmək icazəli deyildir

## İSTİQRAZ VƏRƏQLƏRİNİN SATIŞI – ۷

Qərzə (istiqraz) vərəqələrini əlaqədar qanuni mərkəzlər müəyyən rəsmi qiymətə və müəyyən müddətə çıxarır və onu rəsmi qiymətindən ucuz satır. Məsələn, rəsmi qiyməti min manat olan bir şeyi doqquz yüz əlli manata nağd olaraq satır, bu şərtlə ki, onu sonrakı il min manata alsın. Bəzən bank müəyyən muzd almaq müqabilində bu .vərəqələrin satışını öhdəsinə götürür

:Məsələ ۱۸: Bu müamilə iki yolla baş tuta bilər

Sənədi çıxaran şəxs həqiqətdə onun alıcısından doqquz yüz əlli manatı (yuxarıdakı-۱ misaldakı kimi) borc alıb müəyyən müddət başa çatdıqdan sonra sənədi alan şəxsə min manat qaytarır. Doqquz yüz əlli manat malın əsli, əlli manat isə ona əlavə olunan. .Bu iş riba və haramdır

Sənədi çıxaran şəxs min manatlıq bir sənədi (müəyyən müddətdən sonra ödənilə-۲ .bilər) nağd olaraq doqquz yüz əlli manata satır

Bu hal baxmayaraq ki, həqiqətdə ribalı borc deyil, lakin qeyd olunduğu kimi, .müamilənin səhihliyi işkallıdır

Nəticə alınır ki rəsmi mərkəzlərin müamilə etdiyi bu kimi vərəqlərin satışını səhih

Məsələ ۱۹: Bankların bu kimi vərəqləri alıb-satması icazəli deyildir. Həmçinin bu iş üçün .əmək haqqı almaq da icazəli deyildir

## DAXİLİ VƏ XARİCİ HƏVALƏLƏR – ۸

Məsələ ۲۰: Şəriət fiqhi istilahında həvalə bu mənayadır ki, həvalə verən şəxsin boynunda olan borclar, o şəxs ki, ona həvalə olunur onun boynuna keçir. Lakin burada :daha ümumi mənada işlənir. Bank həvalələrinin nümunələri aşağıdakılardan ibarətdir

Bank öz müştərisinə həvalə çıxarmaq əvəzində qəbul edir ki, onun ölkənin daxilində,-۱ yaxud xaricdə olan vəkilindən müəyyən bir məbləği müştərinin hesabına əgər bankda hesab nömrəsi olsa köçürsün və onun müqabilində müəyyən qədər əmək haqqı alsın. Zahirən bu cür əmək haqqını almaq caizdir. Çünki bankın haqqı vardır ki, bankdan qeyri yerlərdə öz borcunu müştəriyə verməsin. Buna əsasən öz haqqından keçmək və .başqa bir yerdə borcu ödəmək müqabilində əmək haqqı almaq caizdir

Bank elə bir şəxs üçün bir həvalə verir ki, onun əsasında şəxs müəyyən məbləği-۲ başqa bir bankdan daxildə ya xaricdə müştərinin onda hesab nömrəsi olmadığı bir vaxt borc adı ilə götürsün. Bank da bu işi görməsi müqabilində müəyyən qədər muzd .alır

Zahirən caizdir ki, bank bu cür həvalə vermə müqabilində muzd alsın. Çünki birinci bank ikinci bankı birinci bankın ikinci bankın hesabında olan mal-dövlətindən, ya hesabından şəxsə borc vermə işi müqabilində vəkil etmək üçün zəhmət haqqı əldə edir. Bu da məhz borc verməyin müqabilində zəhmət haqqı almaq deyil ki, haram olsun. Əksinə borc verməkdə başqasını vəkil etmək müqabilində müəyyən bir məbləğ almaqdır. Buna görə də borc vermək müqabilində əmək haqqı vermək və onunla .əlaqədar deyil əksinə borcda vəkil tutmaq üçündür, buna görə də heç bir işkalı yoxdur

Əgər həvalədə qeyd olunan məbləğ xarici pul olsa bank üçün başqa haqq da yaranır, belə ki, borclu şəxsin zimməsi həvalədə qeyd olunan xarici pulun dəyərini ödəməyə məşğul olur və onu

ödəməyə iltizamlı olur. Buna görə də əgər bank bu haqdan keçsə və borclunun onun qədərincə olan ölkə daxilindəki pullardan verməyini qəbul etsə, caizdir ki, öz haqqından belə güzəştə getmə müqabilində müəyyən məbləğdə pul alsın. Həmçinin .onu, artıqlaması ilə ölkə daxilində olan pula çevirə bilər

Şəxs müəyyən bir məbləği, məsələn Nəcəfi-Əşrəfdəki bir banka təhvil verib və-۳ həvalə alır ki, onun əsasında həmin məbləği, yaxud onun dəyərini (bərabərini) Kərbəlada, yaxud Livan kimi xarici bir ölkədə başqa bir bankdan alsın. Bank bu xidmət :müqabilində müəyyən qədər zəhmət haqqı alır. Bu fərz iki cür təsəvvür olunur

Şəxs ölkə daxilində işlənən pulun müəyyən məbləğini öz pulunun dəyərində olan (۱ xarici pul məbləğinə satır və həvalə almaq və bank xidmətləri üçün müəyyən qədər .əmək haqqı da ödəyir. Bu halda işkalı yoxdur və bunun oxşarı yuxarıda qeyd olundu

Şəxs müəyyən bir məbləği banka borc verir və şərt edir ki, daxildə ya xaricdəki bir (۲ banka həvalə çıxarmaq müqabilində müəyyən əmək haqqı ödəsin. Bu halda olan işkal bundan ibarətdir ki, həvalə vermək möhtərəm bir əməldir və maliyyətə malikdir. Onu borc verən şəxs tərəfindən onun borc alan şəxsə icra olunması eynilə o şərt kimidir ki, mali dəyəri olsun və şərən haram olsun. Lakin xüsusi rəvayətlərdən aydın olur ki, borc verən şəxs borc alan şəxsə belə şərt qoya bilər ki, borcunu başqa bir yerdə ödəsin. Deməli, həvalə verməyi də şərt edə bilər. Əgər bu şərt pulsuz olaraq caizdirsə .müəyyən qədər əmək haqqı vermək müqabilində də sözsüz ki, caizdir

Bir şəxs, misal üçün Nəcəfi-Əşrəfdə olan bankdan müəyyən bir məbləğ götürür,-۴ onun müqabilində banka həvalə verir ki, ödənəcək pulun bərabərini başqa bir bankdan daxildə, ya ölkə xaricində götürsün bank da bu həvaləni qəbul etmək .müqabilində əmək haqqı alır

:Bu fərziyə də iki surətdə təsəvvür olunur

Bank bir şəxsə ölkə daxilində işlənən müəyyən məbləğ pul verir və onun-۱ müqabilində olan xarici pulu və əlavə olaraq əmək

haqqı satır və müştəri də bankı, o pulu almaq üçün başqa bir banka həvalə edir. Bu .surətdə caizdir

Bank müəyyən bir məbləği bir şəxsə borc verir, onun borcunu başqasının zimməsinə-۲ nəql etdirmək və başqa bir yerdə həmin məbləği almaq müqabilində müəyyən qədər əmək haqqı almasını şərt edir. Bu halda ribadır. Çünki borcdan artıq almağı şərt etmək .qəbilindədir, hətta həvalə vermə işlərinin müqabilində olsa belə

Əlbəttə, əgər bu hadisə əvvəldən şərt olmadan olarsa, belə ki, əvvəlcə şəxs bankdan müəyyən qədər borc alsın, sonra öz borcunu ödəmək üçün bank, ona əvvəlcədən pul verən şəxsi başqa bir banka həvalə versin və bank bu həvalə vermək müqabilində əmək haqqı tələb etsin. Bu surətdə onun verilməsi caizdir. Çünki bankın borcu başqa bir banka nəql etdirmək və borc alanın şərtini qəbul etməkdən imtina etməyə haqqı vardır. Buna görə də bu haqqdan güzəştə getmək müqabilində müəyyən məbləğ ala bilər. Bu tələbkarın öz pulunun təxirə salınması müqabilində aldığı məbləğ qəbilindən deyildir ki, riba olsun; əksinə, bank bu məbləği (borcu) başqasının zimməsinə nəql etdirmək və onu başqa bir yerdə almaq müqabilində əldə edir, buna görə də işkalı .yoxdur

Məsələ ۲۱: Bəzən bir həvalənin əsnasında iki həvalə olur. Məsələn, borclu şəxs öz tələbkarını onun adına bir çek yazmaqla banka həvalə edir və bank da həmin çekdə dərc olunan məbləği tələbkarın yaşadığı şəhərdəki şöbəyə, yaxud başqa bir banka göndərir ki, tələbkar qeyd olunan məbləği orada alsın. Burada həqiqətdə iki həvalə ilə :rastlaşırıq

Birincisi budur ki, borclu şəxs öz tələbkarını banka həvalə edir, beləliklə də bank o -۱ .şəxsə borclu sayılır

İkincisi budur ki, bank qeyd olunan məbləği almaq üçün tələbkarı öz şöbələrindən-۲ .birinə, yaxud başqa bir banka göndərir

Birinci həvalədəki bankın rolu həvaləni qəbul etmək, ikincidə isə həvalə çıxarmaqdır.

Hər iki həvalə də şərən səhihdir, lakin əgər bankın öz şöbəsinə həvalə verməsi eynilə həvalə verən bankın zimməsi olsa, fiqhi istilahda ona həvalə deyilməz, çünki onda borcun bir yerdən başqa yerə nəql olunması baş verməmiş

olur, əksinə həqiqətdə bank öz vəkilindən istəmişdir ki, şəxsin tələbini nəzərdə tutulan .yerdə versin

Hər halda caizdir ki bank yuxarıdakı işləri yerinə yetirdiyinə görə hətta bankda hesabı olan şəxsin həvaləsini qəbul etmək qarşısında belə, əmək haqqı tələb etsin. Çünki bu həvalə borcluya həvalə vermək qəbilindəndir ki, onu qəbul edə bilər. Bu halda əmək .haqqı almağa icazəlidir

Məsələ ۲۲: Həvalənin qismləri və onun şəri hökmlərində qeyd olunanlar eynilə şəxslərə verilən həvalədə də doğrudur. Belə ki, şəxs müəyyən bir məbləği bir şəxsə verib və ondan başqa bir şəhər üçün həvalə ala bilər və onun müqabilində də müəyyən qədər əmək haqqı ala bilər, yaxud müəyyən bir məbləği bir kəsdən alıb, onu başqa bir şəxsə .həvalə verə bilər ki bunun müqabilində də əmək haqqı alsın

Məsələ ۲۳: Qeyd olunanlarda həvalənin borclu şəxsə, ya qeyrisinə olması arasında heç bir fərq yoxdur. Birincisi belə ola bilər ki, həvalə edilən şəxsin yanında mali hesabı .olsun, ikincisi odur ki, belə olmasın

## BANK MÜKAFATLARI – ۹

Bəzən banklar ona əmanət olaraq qoyulan pul sahibləri arasında püşk atır və onları banka daha çox pul qoymağa təşviq etmək üçün adları çıxan şəxslərə müəyyən .mükafat və hədiyyələr verir

Məsələ ۲۴: Görəsən bankların bu işi düzdürmü? Bu məsələnin bir qədər izaha ehtiyacı vardır. Belə ki, əmanət qoyan şəxs əmanət qoyma işini püşk atmaya şərtləndirməyibsə və banklar sadəcə olaraq onların təşviq edilməsi, banklara daha çox pul qoyulması və başqalarının hesab açmağa təşviq edilməsi üçün bu işi görmüş olarsa, bu iş icazəlidir eləcə də püşkdə adları çıxanların həmin mükafatları alması da icazəlidir. Amma əhvətə əsasən əgər müştərək, yaxud dövlət bankları olarsa, məchulul-malik mal ünvanı ilə onları alıb təsərrüf etmək üçün şəriət hakimindən icazə almalıdır. Amma bank xüsusi olarsa

hədiyyələri alıb onlardan istifadə etmək caizdir və şəriət hakiminə müraciət etməyə .ehtiyac duyulmur

Lakin banka pul qoyanlar öz pul qoymalarını əqd və başqa şey əsnasında püşk atmaqla şərtləndirmiş olsalar, bank da bu şərti icra etmək məqamında püşk atmış olarsa bu iş icazəli deyildir. Eləcə də bu halda adına püşk çıxmış şəxsin hədiyyələri alması əgər şərtə əməl etmək ünvanı ilə olsa icazəli deyil amma bu şərt olmazsa .caizdir

## SƏFTƏNİN KÖÇÜRÜLMƏSİ – ۱۰

Bank xidmətlərindən biri də öz müştərisinin nümayəndəsi olaraq səftənin hesaba köçürülməsidir. Belə ki, onun vaxtı çatmazdan qabaq bank, səftəni imza edən şəxsi, vaxtın çatmasından və onun miqdarından xəbərdar edir ki, onu ödəmək üçün hazırlaşsın. Bank, səftənin məbləğini əldə edəndən sonra onu öz müştərisinin hesabına köçürür, yaxud nəqd olaraq ona verir, əvəzində isə əmək haqqı alır. Həmçinin bank öz müştərisinin nümayəndəsi kimi, çekin də hesaba köçürülməsi ilə əlaqədar onun şəhərində, yaxud başqa şəhərdə bu işi görür, çek əlində olan şəxs onun hesaba köçrülməsini istəmədiyi vaxt onun tərəfindən nümayəndə kimi hesaba tökür .və bu xidmətin müqabilində də muzd alır

Məsələ ۲۵: Səftənin hesaba köçürülməsi və bunun müqabilində əmək haqqı :alınmasının bir neçə forması vardır

Səftədən istifadə edən onu, həvalə edilmədiyi bir banka verir, müəyyən qədər əmək-۱ .haqqı vermək müqabilində həmin məbləğin hesaba köçürülməsini istəyir

Zahirən bu xidmət və onun müqabilində əmək haqqı almaq cizdir, bu şərtlə ki, bank yalnız səftəni hesaba köçürsün. Lakin onun ribalı qazancını hesaba köçürmək icazəli deyildir. Bu iş müqabilindəki əmək haqqını fiqhi nəzərdən cüalə hesab etmək olar ki, .bunun əsasında tələbkar öz tələbinin hesaba köçürülməsini bank yolu ilə istəyir

Səftədən istifadə edəni onu, həvalə edildiyi banka təqdim edir, lakin bank onu imza-۲ edən şəxs qarşısında borclu deyil və yaxud ona həvalə edilən puldan başqa bir pul .borclu olur

Belə olan halda caizdir ki, bank bu həvaləni qəbul etmə müqabilində (əvvəlki halda qeyd olunan şərtlərlə yanaşı) əmək haqqı alsın. Çünki borclu olmayan şəxsə həvaləni qəbul etmək və, yaxud həvalədə qeyd olunan şeydən başqa bir cinsə borclu olsa vacib deyildir. Buna görə də bu haqqdan güzəştə getmək və xidmət işlərini yerinə yetirmək .üçün bir şey almağın işkalı yoxdur

Səftəni imza eləyən şəxs o pulu bankın nəzdində olan hesabından verməyə işarə-۳ edərək onu banka həvalə edir ki, vaxtı çatan zaman onun hesabından çıxılsın və o məbləğ səftəyə malik olan şəxsin hesabına köçürülsün, yaxud nəqd olaraq ona verilsin. Belə olan halda səftəni imzalayan öz tələbkarını, özünün borclu olduğu banka həvalə etmiş olur. Buna görə də borcluya həvalə etmə qəbilindəndir. Həvalə edilən şəxsin (bankın) bu həvalə ilə razılaşmaması lazım deyildir və bank tərəfindən onun qəbul olunmadığı halda da keçərli deyildir. Buna görə də bank üçün caizdir ki, bu həvalənin, eləcə də həvalə verənin borcunu ödəmək müqabilində müəyyən qədər .zəhmət haqqı alsın

**VALYUTA AL–VERİ – ۱۱**

Bankların işlərindən biri də pul al-veri, eləcə də öz müştərilərinin, xüsusilə xarici mal gətirən müştərilərin ehtiyaclarını təmin etmək üçün kifayət qədər pulu dəyişdirmək və pul alveri işlərini yerinə yetirməkdir ki, nəticədə pulun alış və veriş qiymətlərinin fərqli .olmasından qazanc əldə edir

Məsələ ۲۶: Pulun bazar qiymətinə yaxud ondan az və ya daha çox qiymətə al-veri istər .nəqd olsun, istərsə də müddətli, səhihdir

## ARTIQ GÖTÜRMƏK – ۱۲

Hər kəsin banklarda cari hesabı olsa, oraya qoyduğu puldan artıq olmayan bir məbləği .oradan götürə bilər

Bəzən bank etimad etdiyi bəzi hesab sahiblərinə icazə verir ki, malik olduqları puldan artıq götürsün. Bu işə «artıq götürmə» deyilir. Bank bu yolla özü üçün müəyyən .məbləğdə qazanc nəzərdə tutur

Məsələ ۲۷: Artıq götürmək həqiqətdə əlavə qazanc qaytarmaq məqsədi ilə bankdan borc götürməkdir və nəticədə ribalı və haram borcdur. Bankın əlavə məbləğdən .götürdüyü qazanc ribalı və haram qazanclardan sayılır

Əlbəttə, əgər bank dövləti, ya müştərək bank olsa onların əlavə götürmələri borc ünvanı ilə deyil, əksinə məchulul-malikin malını əldə etmək üçün olsa (əvvəlki .məsələdə deyilən yolla) işkalı yoxdur

## ÇEK VƏ SƏNƏDLƏRİN AŞAĞI QİYMƏTƏ SATILMASI – ۱۳

:Bir neçə müqəddimə

:Birinci; Al-verin borc vermə ilə müxtəlif fərqləri vardır, o cümlədən

Al-ver bir cins müqabilində malın özünü alıcının mülkiyyətinə keçirməkdir. Halbuki,-۱ borc misli olduqda malın mislini, qiymi olduqda isə qiymətini ödəməyə iltizam verməsi .müqabilində malı mülkiyyətə keçirməyə deyilir

Ribalı bey ümumiyyətlə batildir, amma ribalı borcda onun əsli səhihdir, lakin artıq-۲ .alınan hissə batildir

Borcda əlavə alınması şərt olunan hər bir şey riba və haramdır. Amma al-ver belə-۳ deyildir, ölçü və çəki ilə satılan şeylərdə (peymanə, yaxud çəki ilə müamilə olunan əşyalarda) əgər bir cinsdən olsalar, artıq alınan miqdar mütləq şəkildə haramdır. Amma cinsləri müxtəlif olsa, yaxud ölçü və çəki ilə satılanlardan olmasa, bu halda əgər müamilə nəqdi olarsa artıq alınan riba deyil, müamilə də səhihdir. Lakin əgər müamilə müddətli olsa məsələn yüz yumurtanı sonradan təhvil verəcəyi yüz on yumurtaya satsa, yaxud iyirmi kilo düyünü bir aydan sonra təhvil alacağı qırx kilo buğdaya satsa .bu mümilənin ribalı olmamasında işkal vardır, ehtiyat-vacib budur ki, ondan çəkinilsin

İkincisi; Əskinaslar sayılanlardan hesab olunduğuna görə onların artığına ya əskiyinə satılması, yaxud dəyişdirilməsi bir cinsdən olmazsa və nəqdi və nisyə olarsa caizdir. Lakin əgər bir cinsdən olsalar onların artığına satılması yalnız nəqd olduqda caizdir. .Amma onların nisyə satılması yuxarıda da qeyd olunduğu kimi, işkalsız deyildir

Buna əsasən, misal üçün, on İraq dinarı borc verən şəxs öz borcunu ondan az məsələn doqquz nəqd dinara sata bilər. Həmçinin caizdir ki, onu öz qiymətindən az başqa pula məsələn doqquz İordoniya dinarına nəqd satsın. Amma almaq vaxtı çatmayana qədər nisyə şəkildə icazəli deyil. Çünki alınacaq şeyin vaxtı çatmayana qədər tərəf müqabili .borca salmaq çaiz deyi

Üçüncüsü; Bazar tacirləri arasında geniş yayılmış səftələrin (əskinaslar kimi) mali etibarı yoxdur və sadəcə olaraq borcunu isbat etmə sənədi hesab olunur və bunu göstərir onda dərc olunan məbləğ onu imza edən şəxsin öhdəsində və o şəxs üçündür ki, səftə onun adına çıxarılmışdır. Buna əsasən müamilələr onların özləri üzərində cərəyan etmir, əksinə o

malların üzərində cərəyan edir ki, bu vərəqlər onların göstəricisidir. Həmçinin əgər müştəri satıcıya bərat, yaxud səftə verərsə malın qiymətini də ödəmiş olur. Buna görə də əgər o sənəd itərsə, yaxud satıcının yanında tələf olarsa onun malından tələf olmamışdır və müştərinin zimməsi borcdan xilas olmamışdır. Amma əgər əskinas hər .bir qiymətə verilmiş olsa tələf olduqda satıcının malından tələf olur

.Məsələ ۲۸ : Veksellər iki növdür

Həqiqi borcları göstərən səftələr. Belə ki, onu imza eləyən şəxs veksel kimi adına-۱ .yazılmışsa, o şəxsə borclu olur

.Qeyri-həqiqi və zahiri borcun göstəricisi-۲

Birinci halda tələbkar borclunun öhdəsində olan öz müddətli tələbini nağd olaraq ondan az məbələğə sata bilər. Məsələn, əgər onun alacağı yüz manat olsa və onu doxsan manata nağd olaraq satsa (əlbəttə, onun müdətli satışı icazəli deyildir, çünki borcun borca satışıdır) və bundan sonra bank, yaxud başqa şəxs borcludan (səftəni .imza edəndən) almağa haqlı olduğu zamanda onun qiymətini tələb edə bilər

Amma ikinci halda qeyri-həqiqi olan tələbkar üçün səftəni satmaq icazəli deyildir, çünki həqiqətdə heç bir borc mövcud deyil və onu imzalayan şəxsin də öhdəsində deyil, sadəcə olaraq aşağı qiymətə satılmaq üçün çıxarılmışdır. Buna görə də «dostluq .səftəsi» adı ilə məhşurdur

Bununla belə, onun tənzilini də başqa şəkildə qanuni hesab etmək olar. Belə ki, səftəni imza eləyən şəxs istifadə edən şəxsi vəkil edir ki, səftənin miqdarını imza edənin zimməsində, başqa pula və onun qiymətindən ucuzuna satsın. Məsələn əgər səftə ۵۰ İraq dinarı dəyərində olsa və onun həqiqi dəyəri ۱۱۰۰ manat olsa, istifadə edən imzalayan şəxsin tərəfindən vəkil olaraq əlli dinarı onun zimməsində ۱۰۰۰ manata satır. Bu müamilədən sonra səftəni imza edən şəxsin zimməsi əlli dinara məşğul olur və imza edənin mülkü olan min manatdan istifadə edən, onu alır. Sonra istifadə edən şəxs min manatı imza edənin vəkili olaraq öz boynunda olan əlli dinarın müqabilində

onun özünə satır. Nəticədə o, imza edən şəxs üçün, imza edənin banka borclu olduğu .əlli dinar miqdarında borclu olur

Lakin bu yolun az faydası vardır. Çünki yalnız o hallarda faydalı olur ki, aşağı qiymətə satılma xarici pulla baş vermiş olsun. Amma ölkə daxilində işlənən pullara gəldikdə isə heç bir təsiri yoxdur. Çünki onun al-ver ilə təshih olunması (sayla al-verdə artığına .satmanın işkalına diqqət yetirməklə) mümkün deyildir

Amma zahiri səftənin qiymətinin banka borc olaraq qoyulması, belə ki, borc alan və səftədən istifadə edən səftənin rəsmi qiymətindən az olan bir məbləği bankdan borc alsa və bankı səftəni imzalayana (ki, borclu deyildir), onun bütün qiymətinin hamısını köçürmək üçün həvalə etsə, bu haram və ribadır. Çünki bankın səftənin məbləğinin bir miqdarının azaldılması şərti həqiqətdə artıq qazanc almadır və haramdır. Hətta, bu artıq alınan hissə möhlət verilməsi müqabilində olmasa, əksinə müəyyən bank əməliyyatları icrası müqabilində olsa, məsələn, borcun qeydə alınması və onun əldə edilməsi olsa belə. Çünki borc verənin haqqı yoxdur ki, borc alan şəxsə, onda onun özü .üçün mali bir mənfəət olan şərt qoysun

Yuxarıdakı hökm xüsusi banklarla əlaqədardır. Amma dövləti, yaxud müştərək banklara gəldikdə isə riba müşkülündən xilas olmaq üçün belə əməl etmək olar ki istifadə edən, səftəni tənzil edərkən satmaq və borc etmək qəsdi olmasın, əksinə onun məqsədi məchulul malik olan bir malı əldə etmək olsun. Bu halda əhvət nəzərə əsasən şəriət hakiminin icazəsi ilə onu götürmək, sonra onda təsərrüf etmək və islah etmək üçün hakimə müraciət etmək olar. Müddətin axırında bank səftəni imza edənə müraciət etsə və onun qiymətini ödəməyə vadar etsə imza edən də ödədiyi şeylərin əvəzini almaq üçün istifadə edənə müraciət edə bilər. Belə ki, əgər onun istəyi ilə imza .etmiş olsa

## BANKDA İŞLƏMƏK – ۱۴

:Bank işləri iki cür olur

Bankda olan haram işlər; bu, ribalı müamilələrlə əlaqədar olan işlər kimi. Məsələn,-۱ onların icra olunmasında

nümayəndəlik, onların qeydə alınması və onlara şəhadət verilməsi, alanın xeyrinə olaraq artıq ribalı qazanc almaq. Həmçinin, ribalı müamilələri olan şirkətlərin müamilələri ilə əlaqədar olan işlər, yaxud şərab ticarəti ilə məşğul olanlar, onların .səhmlərini satmaq, onlar üçün kiredit götürmək haram işlərdən hesab olunur

Bu işlərin hamısı haramdır və belə bölmələrdə işləmək icazəli deyildir, ücrət almağa .haqlı olmağa səbəb olmur

Bankın icazəli olan işləri; bu, yuxarıda qeyd olunan işlərdən tamamilə fərqlənir,-۲ .orada işləmək və əmək haqqı almaq icazəlidir

Məsələ ۲۹: Əgər ribalı müamilədə artıq verən tərəf malı möhtərəm olmayan kafir olsa, istər xarici bank olsun, istər başqası, bu halda, qeyd olunduğu kimi, bu artıq hissəni almaq müsəlman üçün icazəlidir. Nəticədə belə ribalı müamilələrin icrası ilə əlaqədar .bank işləri bölməsində və sair yerlərdə işləmək icazəlidir

Məsələ ۳۰: İslam ölkələrindəki dövlət banklarında, yaxud müştərək banklarda mövcud olan sərmayə məchulul-malik malındandır ki, şəriət hakiminə müraciət etmədən onlarda təsərrüf etmək icazəli deyildir. Buna əsasən, bu cür banklarda işləmək, eləcə də mallarını (sərmayələrini) islah etmək üçün şəriət hakiminə müraciə etməyib onlarda təsərrüf edən müştərilərə mal (sərmayə) vermək və ya onlardan mal almaq .işkallıdır

Məsələ ۳۱: Cüalənin, icarənin həvalənin və islam ölkələrinin dövlət banklarında mövcud olan sair müamilələrin səhih olması şəriət hakiminin icazəsinə bağlıdır və onun icazəsi .olmadan bu müamilələr səhih deyildir

## SIĞORTA MÜQAVİLƏSİ – ۱۵

Sığorta bir müqavilədir ki, onun əsasında sığorta olunan şəxs iltizam verir ki, aylıq, illik, yaxud birdəfəyə olaraq müəyyən bir məbləği sığorta edənə versin və onun müqabilində sığorta edən

şəxs də iltizam verir ki, sığortaya üzv olan şəxsə, yaxud adı sığorta müqaviləsində müəyyən olunan və müqavilənin onun xeyrinə olduğu üçüncü bir şəxs müəyyən məbləğdə pulu, yaxud sabit bir ödənci və yaxud hər hansı başqa bir şeyi həmin müqavilədə aşkar şəkildə qeyd olunan hər hansı bir gözlənilməz hadisə baş verdikdə, .yaxud zərər çatdıqda ödəsin

:Məsələ ۳۲: Sığortanın bir neçə növü vardır, o cümlədən

.Şəxsin ölüm, xəstəlik və sair hadisələr müqabilində sığortası-۱

Mal-dövlətin, o cümlədən, avtomobil, təyyarə, gəmi kimi şeylərin yanğın, qərq olma,-۲ .oğurluq və sair kimi işlər müqabilində sığortası

Sığortanın digər növləri də vardır ki, onun şəri hökmləri qeyd olunan hallarla heç də .fərqlənmir buna görə onların qeyd olunmasına ehtiyac duyulmur

:Məsələ ۳۳: Sığorta müqaviləsinin bir neçə rüknü vardır

və ۲-Sığorta edən və sığorta olunan şəxslərin icab və qəbulu demələri belə ki, orada ۱ .danışıqları, yazıları, yaxud onlara dəlalət edən hər hansı bir şey kifayətdir

Sığorta hansı barədə olsa, istər şəxs, istərsə də mal-dövlət barəsində növü təyin-۳ .edilməlidir

.Sığorta müqaviləsinin əvvəli və sona çatma dövrünün qeyd olunması-۴

Məsələ ۳۴: Sığorta müqaviləsində xətər və ziyanın amili məsələn, yanğın, oğurluq, suda qərq olmaq, xəstəlik, ölüm və sair kimi şeylər; eləcə də əgər hissə-hissə .ödəniləcəksə sığortanın illik, yaxud aylıq ödəniş miqdarı təyin edilməlidir

Məsələ ۳۵: Sığorta müqaviləsindəki tərəflər həddi-büluğa çatmış, ağıllı olmalı qəsd və ixtiyar üzərindən bu müqaviləni bağlamalı, onların səfehlik, yaxud müflisləşmə nəticəsində məhcur olmamaları (mal-dövlətindən istifadə etməkdən məhrum edilməmələri) şərtdir. Əgər hər iki tərəf, yaxud onlardan biri həddi-büluğa çatmayan,

dəli, bu işə məcbur edilmiş, yaxud mal-dövlətində təsərrüfdən qadağan edilmiş olsalar, yaxud ciddi məqsədləri olmasa, müqavilə səhih deyil.

Məsələ ۳۶: Sığorta müqaviləsi lazım əqdlərdən sayılır və iki tərəfin razılığı olmadan .pozula bilməz

Əlbəttə, əgər müqavilədə şərt edilsə ki, sığorta edən və sığorta olunan, yaxud hər ikisinin müqaviləni pozma hüquqları vardır, bu şərtə əsasən sığorta müqaviləsini .pozmaları caizdir

Məsələ ۳۷: Əgər sığorta edən öz verdiyi iltizamına əməl etməsə, sığorta olunan şəxs şəriət hakiminə və, yaxud ondan başqasına müraciət etməklə onu öz vəzifəsini yerinə yetirməyə vadar edə bilər. Həmçinin müqaviləni poza da bilər və sığorta haqqı adı ilə .verdiyi məbləğin geri qaytarılmasını tələb edə bilər

Məsələ ۳۸: Əgər sığorta müqaviləsində müəyyən olunsa ki, sığorta olunan şəxs müəyyən bir məbləği sığorta haqqı adı altında hissə-hissə ödəsin və, bu razılaşmanın icrasında istər miqdar baxımından, istərsə də ödəniş zamanı baxımından vədəsinə xilaf çıxsa, sığorta edənə vacib deyildir ki, müəyyən hadisə və ya zərər büruz etdikdə müəyyən məbləği ödəməklə əlaqədar verdiyi iltizama əməl etsin və sığorta olunan da .ödənmiş sığorta haqqının qaytarılmasını tələb edə bilməz

Məsələ ۳۹: Sığortada xüsusi bir müddətin təyin edilməsi şərt deyildir, əksinə .müqavilədəki tərəflərin yəni sığorta edən və sığorta olunanın razılığına tabedir

Məsələ ۴۰: Əgər bir neçə nəfər öz müştərək mallarından əldə etdikləri sərmayə ilə bir şirkət təsis etsələr və onlardan hər biri şirkət (şəriklik) müqaviləsi əsnasında başqasına şərt etsə ki, onun özünə, yaxud mal-dövlətinə müəyyən bir hadisə baş verdiyi təqdirdə (onun növünü də şərtin əsnasında müəyyən etsələr) şirkət vəzifəlidir ki, şirkətin sərmayəsindən, yaxud qazancından istifadə edərək dəymiş xəsarətləri aradan qaldırsın; bu halda müqavilənin qüvvədə qaldığı dövrdə bu şərtə əməl edilməsi .vacibdir

## SƏRQÜFLİ – ۱۶

Tacir və bazar işçiləri arasında geniş yayılmış müamilələrdən biri də sərqüfli, yaxud

Məqsəd budur ki, icarə edən şəxs özünün icarə etdiyi və ixtiyarında olduğu məhəlli iki tərəfin razılığı əsasında alınmış məbləğ müqabilində başqasına həvalə edir, yaxud malik aldığı müəyyən məbləğ müqabilində icarə müddəti sona çatdıqdan sonra .icarəçini, icarə etdiyi yerdən çıxarmaqdan, yaxud icarə haqqını artırmaqdan çəkinsin

Məsələ ۴۱: Kəsb-ticarət yeri kimi bir yerin icarə edilməsi icarəçi üçün orada heç bir haqq gətirmir və o, icarə müddəti qurtardıqdan sonra oranın malikinin öz mülkündə təsərrüf etməsinə, oranı boşaltmasına, yaxud əvvəlki icarə məbləğinin artırılmasına mane ola bilməz. Həmçinin icarəçinin müəyyən bir məhəldə uzun müddətli olması, həmin məhəllin müəyyən dəyər və yaxşı ticarət mövqeyi qazanması və sair kimi şeylər onun üçün həmin yerdə qalmağa heç bir haqq gətirmir. İcarə müddəti qurtardıqdan .sonra həmin yeri boşaldaraq malikinə təhvil verməsi vacibdir

Əgər icarəçi dövlət qanunundan (belə ki, bu qanun malikin icarəçini zorla icarə etdiyi yeri boşaltmağa vadar etməsinin və yaxud icarə miqdarını artırmasının qarşısını alır) istifadə etsə və həmin yeri boşaltmaqda, yaxud icarə haqqının artırılmasından imtina etsə bunun işi haramdır və onun həmin yerdə malikinin razılığı olmadan təsərrüf etməsi qəsb sayılır. Əgər həmin yeri boşaltmaq işi müqabilində müəyyən məbləğ alsa .haramdır

Məsələ ۴۲: Əgər malik bir yeri məsələn bir il müddətində on min manata icarəyə versə, bundan əlavə, əlli min manat məbləğində ondan alsa və müqavilə əsnasında şərt etsə ki, hər il həmin məbləği artırmadan onun icarə müddətini uzatsın, yaxud həmin məbləğə, amma icarəçinin o məhəlli həvalə etdiyi şəxs (ikinci icarəçiyə) icarəyə versin, həmçinin, ikinci şəkildə üçüncü icarəçiyə və sair... belə olan halda caizdir ki, icarəçi malikə verdiyi məbləğ qədər və ya ondan çox, yaxud ondan az məbləğ alaraq belə bir .şərtdən əldə olunan razılaşma əsasında həmin yeri başqasına həvalə etsin

Məsələ ۴۳: Əgər malik bir yeri müəyyən bir şəxsə müəyyən müddət ərzində icarəyə versə və icarə əqdinin əsnasında özünə şərt etsə ki, müəyyən bir məbləğ almaqla, ,yaxud almamaq

müqabilində müddət sona çatdıqdan sonra onun icarəsini birinci ildə razılaşdıqları həmin surətdə və ya hər il adi qayda uzatsın və təsadüfən digər bir şəxs icarəçiyə müəyyən məbləğ versə ki, o təkcə icarə yerini boşaltsın, belə ki, daha onun orada qalmaq haqqı olmasın və malik oranı boşaltdıqdan sonra həmin yeri istədiyi kimi icarə versin, belə olan halda caizdir ki, icarəçi razılaşılan məbləği alsın. Bu sərqüfli icarəçinin təsərrüf etmə haqqının ikinci şəxsə nəql olunması müqabilində deyil, yalnız oranın .boşaldılması üçün olacaqdır

Məsələ ۴۴: Malikə vacibdir ki, müqavilə əsnasında özünə etdiyi şərtlərə vəfa etsin. Belə ki, ۴۲-ci məsələdə fərz olunan halda malikə vacibdir ki, həmin yeri icarəçiyə, yaxud icarəçinin onun xeyrinə olaraq kənara çəkildiyi üçüncü bir şəxsə, icarə haqqını artırmadan icarəyə versin. Həmçinin ۴۳-cü məsələdə fərz olunduğu kimi malikə vacibdir ki, icarə müddətini, icarəçinin qalmağa meylli olduğu müddətə qədər həmin .əvvəlki icarə miqdarında, yaxud adi qaydada (şərt olunan hər növdə) uzatsın

Malik öz şərtinə əməl etməzsə və icarə müddətini uzatmaq istəməzsə, icarəçi şəriət hakiminə, yaxud başqasına müraciət etməklə onu öz şərtinə əməl etməyə məcbur edə bilər. Lakin əgər hər hansı bir dəlilə görə onu öz şərtinə əməl etməyə vadar edə .bilməsə, malikin razılığı olmadan icazəli deyildir ki, icarə olunan yerdə təsərrüf etsin

Məsələ ۴۵: Əgər şərt, ۴۲-ci və ۴۳-cü məsələlərdə fərz olunduğu kimi, fel şərtində deyil, icarə əqdində qeyd olunsa (nəticənin şərti surətində) yəni (bizim fərz etdiyimiz halda) icarənin vaxtının uzadılması şərti olsa, belə ki, icarəçi maliklə şərtləşsin ki, o, ya da onun birbaşa, yaxud müəyyən yollarla müəyyən etdiyi şəxs həmin yerdə, təsərrüf etmək və ondan istifadə etmək haqqını illik müəyyən məbləğ vermək müqabilində, yaxud hər ildə adi qaydada verilən qiymət müqabilində olsun, bu halda icarəçi, yaxud icarəçinin təyin etdiyi şəxs malikinin razılığı olmadığı yerdə təsərrüf və istifadə etmək .haqqına malikdir və malikin yalnız razılaşılan məbləği tələb etməyə haqqı vardır

## İQRAR VƏ ƏVƏZ ÇIXMAQ QAYDASI HAQDA MÜƏYYƏN MƏSƏLƏLƏR – ۱۷

Bəzi üqud, iqaat (üqud iki tərəfli, (nikah əqdi kimi), iqaat isə bir tərəfli olan (təlaq kimi) əqddir) və hüquq məsələləri ixtilaflıdır. Bu barədə şiə alimlərinin rəyləri sair İslam məzhəbləri ilə bəzi hallarda cüzi, bəzi hallarda isə külli şəkildə fərqlənir. Buna görə də bu kimi məsələlərlə əlaqədar şiələrin qeyri şiələrlə rəftarı barəsində sual olunur və mütəəxxir fəqihlər (Allah onlardan razı olsun) bu məsəlinin hökmünü «ilzam qaydası» əsasında bəyan etmişlər. Yəni şiə olmayan şəxsləri öz məzhəblərinin hökmlərinə vadar etmək. Lakin bizim nəzərimizdə bu qayda sübuta yetmədiyindən, bu məsələni ilzam qaydasının canişini olan müxtəlif qaydalarla, məsələn növi təqass qaydası (yəni onların sünnət və hökmləri əsasında sizdən aldıqları kimi siz də onlardan alın), yaxud iqrar qaydası (şiə olmayan şəxslərlə, onların öz məzhəb hökmlərinə əsasən rəftar edərək onları öz məzhəb qanunlarına məcbur etmək) uyğunlaşdırır və onların .hökmünü bəyan edirik

Məsələ ۴۶: İmamiyyə fiqhinin nəzərində nikah əqdi şahid tutmadan da səhihdir. Lakin sünnü məzhəbləri bu məsələdə ixtilafa düçar olmuşlar. Onların bəziləri İmamiyyə ilə müvafiq, bəziləri isə hənəfilər, şafeilər, hənbəlilər kimi şahid tutmadan olan nikahı fəsad (yəni batil) hesab edirlər. Malikilər də məxfi şəkildə baş verən nikahı fasid (batil) :hesab edirlər. Bunun fasid olduğunu idda edənlər özü də iki dəstəyə ayrılır

Malikilər və Hənbəlilərin çoxu səhih və ya batil olmasında ixtilaf olan bu cür nikahlar barəsində inanırlar ki, heç kəsin bu qadınla (yəni şahid tutulmadan əqdi oxunan və əqdi batil olan qadınla) izdivac etməyə haqqı yoxdur. Nikah əqdi kimin adına oxunubsa yalnız onun həmin qadına təlaq verməsindən, yaxud nikahı fəsx etməsindən sonra o qadının ərə getməyə haqqı vardır. Deməli, əgər ər bu iki məzhəbdən birinin ardıcılı olsa, belə bir qadınla izdivac edə bilməz, yalnız təlaq versə, yaxud nikahını

.(fəsx etsə, (yenidən onunla öz məzhəbinə uyğun izdivac edə bilər

Şafeilər və hənəfilər bu kimi nikah barəsində inanırlar ki, belə qadınla izdivac etmək .olar və təlağa, yaxud nikahın fəsx edilməsinə də ehtiyac yoxdur

Buna əsasən, əgər ər bu iki məzhəb ardıcılı olsa ilzam qaydasına əsasən ər öz məzhəbinin hökmlərinə məcbur edilməlidir. Əgər qadın onların nəzərində iddə saxlamağa ehtiyaclı olarsa, əzhər nəzərə əsasən iddəsi qurtardıqdan sonra onunla .evlənmək olar

Həmçinin əgər qadın şiə, onun əri isə bu iki məzhəb ardıcılı olsa belə ki, onların nəzərində iddə saxlamağa ehtiyac olsa iddə tamam olduqdan sonra izdivac etməsi caizdir. Amma hər iki halda şübhədən xaric olmaq və ehtiyata riayət etmək üçün daha yaxşı olar ki, kişinin qadına təlaq verməkdən imtina etdiyi halda şəriət hakiminin .vasitəsi ilə olsa belə onun təlaqını alsınlar

Məsələ ۴۷: Sünnü alimlərinin nəzərinə əsasən bir qadınla onun qardaşı qızını, yaxud bacısı qızını eyni vaxta əqd etmək icazəli deyil. Əgər hər ikisini eyni zamanda (bir nəfərə) əqd edərlərsə, hər iki əqd batildir. Əgər əqdin biri digərindən sonra olarsa .ikincisi batildir

Lakin imamiyyə fiqhi nəzərindən bir qadının əqdi, onun qardaşı uşağının əqdindən sonra və eləcə də bir qadının əqdi bacısı qızının əqdindən sonra mütləq şəkildə caizdir. Həmçinin bir qadının əqdindən sonra onun qardaşı qızını əqd etmək və ya bir qadının əqdindən sonra onun bacısı qızını əqd etmək bununla şərtlənir ki, əvvəlcə o qızın bibisi .və xalası razılıq vermiş olsunlar və ya sonradan da razılıq versələr caizdir

Buna əsasən, əgər sünnülər bir qadınla onun qardaşı qızını, yaxud bacısı qızını eyni vaxta əqd etsələr, əgər onların əqdləri eyni zamanda olsa, onların məzhəbinə əsasən hər ikisi batil olduğuna görə imamiyyə ardıcıllarının nəzərinə görə onlardan hər biri ilə və ya qızın bibi ya xalası razı oluduğu surətdə hər ikisini əqd etməsi caizdir. Əgər sünnü kişinin əqdi eyni zamanda olmazsa, qeyd olunan fərzdə ikinci arvadının əqdi onların

.məzhəbinə görə batildir və şiə bir kişi onunla izdivac edə bilər

.Hər ikisi imamiyyə şiəsi olduğu zaman o iki qadının hər biri barəsində bu hökm caridir

Məsələ ۴۸: İmamiyyə məzhəbinə əsasən təlaq verilmiş qadının, yaisə və sağirə olsa yaxınlıq edilmiş olsa da belə, iddəsi yoxdur. Lakin sünnü məzhəblərinin nəzərinə görə (sağirə qız uşağı üçün iddə saxlamağın şərtlərindəki ixtilaflarla yanaşı) onlara da iddə saxlamaq vacibdir. Belə ki, əgər ər sünnü olsa, qadın isə yaisə və sağirə olan qadınına sağirə üçün iddə saxlamağın lazım olmasına etiqad bəsləyərək təlaq versə, öz məzhəbinin təlaq verilmiş qadının bacısını almaq və iddə dövründə eyni vaxtda əqd edilməsi haram olan qadınların nikahının haram olması kimi qanunlarına riayət etməyə .borcludur

Ehtiyat-vacib budur ki, Şiə olan kişi, belə qadınla iddəsi tamam olmamışdan qabaq evlənməsin. O qadın da əgər şiə olsa, yaxud (sonradan) şiəliyi qəbul etsə iddəsinin axırına qədər gərək izdivac etməsin. Həmçinin əhvət nəzər odur ki, iddə dövründə öz ərindən nəfəqə almasın, baxmayaraq ki, ərinin məzhəbinə görə onun nəfəqəsini yeyən olsun. Amma əgər şərtləri mövcud olduğu zaman növ`i təqass qaydalarını icra .etmək qəbilindən olsa o nəfəqəni ala bilər

Məsələ ۴۹: İmamiyyə fiqhi nəzərindən təlaqın səhih olmasının müxtəlif şərtləri vardır ki, sair İslami məzhəblər nəzərindən onun heç biri, yaxud bəziləri təlaqın səhihliyində şərt sayılmır. Buna görə də əgər şiə olmayan bir şəxs öz qadınına onun məzhəbində səhih sayılan qaydada təlaq versə, amma həmin təlaq bizim məzhəb nəzərindən batil olsa, imamiyyə məzhəbi ardıcılı üçün, qarşı tərəfi öz məzhəbinin hökmlərinə əməl etməyə məcbur etmək qanununa əsasən o qadının iddəsi qurtarandan sonra öz məzhəbinə əsasən iddə saxlamalı olan qadınlardan olsa, onunla izdivac etməsi caizdir. .Həmçinin təlaq verilmiş qadın imamiyyə şiəsi olsa başqası ilə izdivac edə bilər

İmamiyyə fiqhinə əsasən təlaqın səhih olmasının bəzi şərtləri aşağıdakılardan :ibarətdir, belə ki, sair məzhəblərin nəzərindən onların heç biri, yaxud bəzisi şərt deyil

.Qadına, onunla yaxınlıq edilməmiş bir paklıq dövründə təlaq verilməlidir-۱

.Təlaq qəti olmalıdır, heç nə ilə şərtləndirilməməlidir-۲

.Təlaq deyilməklədir (ləfzlə) yazılmaqla deyil-۳

.Təlaq icbar üzündən deyil, ixtiyar əsasında olmalıdır-۴

.Təlaq iki adil şahidin hüzurunda verilməlidir-۵

Məsələ ۵۰: Şafei məzhəbinə əsasən bir kəs bir şeyi alsa və onu görsə röyət ixtiyarından istifadə edə bilər, hətta alınan şey zikr olunan xüsusiyyətlərə müvafiq olsa belə. Halbuki, İmamiyyə məzhəbinin nəzərinə əsasən müştəri fərz olunan halda röyət ixtiyarından istifadə edə bilməz. Deməli, əgər Şafei məzhəbi İmamiyyə məzhəbinə nifuzlu olsa, belə ki, müştəri Şafei məzhəbli olsa, bu kimi hallarda İmamiyyə məzhəbində olan satıcıya, bu ixtiyardan istifadə edə bilər, İmamiyyə şiəsi olan müştəri də bunun əvəzini götürə bilər və növi təqass qaydasına əsasən Şafei məzhəbli satıcı .barəsində bu qaydadan istifadə edə bilər

Məsələ ۵۱: Əbu Hənifə və Şafei məğbun üçün ğəbn ixtiyarının olduğuna inanmırlar, halbuki bizim məzhəbimizdə bu ixtiyar sübuta yetmişdir. Zahirən bu ixtiyar haqqının sübut olub-olmaması o məğbun olmuş şəxsin qərarı qiymətə diqqətsizlik, malın hər qiymətə satılıb və alınması olduğu hallara şamil olmur. Fərz olunan bu halda zahirən ğəbn ixtiyar haqqı sübuta yetmir. Həmçinin müamilə edən iki tərəfin nəzəri artıq qiymətə deyil, bazar qiymətinə uyğun olaraq nəql-intiqal olmasıdır və məğbun olmuş şəxs də ğəbn edən şəxsin qiymətin yuxarı olmamasına dair sözünə etina etdiyi hallarda şamil olmur. Çünki zahirən hamının nəzərində bu kimi yerdə (al-veri pozma) ixtiyarı satıcının aldatması cəhətindən sabitdir. Həmçinin bu haqq o yerlərə şamil olmur ki, xüsusi ürfün nəzərində zehndə olan şərt əsasında fəsx haqqından başqa qiymət fərqini tələb etmək kimi sair haqq mövcud olsun. Hər halda İmamiyyə məzhəbi nəzərindən hər yerdə ğəbn ixtiyarı sübut olsa və sünnü məzhəbləri onu inkar etsələr, imami məzhəbində olan şəxs üçün növ`i təqass qəbilindən caizdir ki, sünnünü ğəbn

.hamıya, həmçinin İmami məzhəb olan şəxsə də nüfuzlu və cari olsun

Məsələ ۵۲: Hənəfi məzhəblilərin nəzərində sələm əqdi satılan şeyin əqd zamanında mövcud olması ilə şərtlənir, halbuki İmamiyyə fiqhi nəzərindən belə bir şərt etibarlı deyildir. Deməli, əgər hənəfi məzhəbi İmamiyyə məzhəbinə nüfuzlu olsa, belə ki, müştəri hənəfi məzhəbli olsa və satıcını bu əqdi batil etməyə məcbur etsə İmamiyyə məzhəbli müştəri üçün də caizdir ki, növi təqass qaydasının tələbinə uyğun olaraq hənəfi satıcını bu əqdin batil etməyə məcbur etsin. Halbuki ondan sonra müştəri .İmamiyyə məzhəbli olsa, həmin hökm caridir

Məsələ ۵۳: Sünnülərin nəzərinə əsasən irs aparanların irs payından artıq qalanlarını meyyitin qardaşı kimi olan əsəbəsinə verilər. Lakin İmamiyyə məzhəbi bunun əksinədir. Məsələn, əgər bir kişi ölsə və yalnız bir qızı və bir qardaşı olsa, İmamiyyə nəzərindən gərək irsin yarısı qıza irs səhmi adı ilə verilsin, digər yarısı isə ona qaytarılma adı ilə verilsin, meyyitin qardaşına heç bir şey düşmür. Lakin sünnülərin nəzəri budur ki, fərz olunan bu halda meyyitin irsinin yarısı onun qardaşına veriləcəkdir. Çünki o, meyyitin əsəbəsindən (qardaşı kimi) sayılır. Belə ki, əgər sünnü məzhəbli bir şəxs İmami məzhəbdən olan bir şəxsin varisinə nafiz olarsa və irs paylarından artıq qalan ona verilməzsə əgər meyyitin əsəbəsi İmami məzhəb olsalar, əvəz çıxmaq qaydasına uyğun olaraq irsdən artıq qalan payları sünnü məzhəb .varisindən ala bilərlər

Məsələ ۵۴: Sünnülərin nəzərində qadın öz ərindən qalan şeylərin hamısından istər mənqul olsun istərsə torpaq və sair kimi qeyri mənqul irs aparır. Halbuki İmamiyyə məzhəbi nəzərindən qadın yerin əslindən, yaxud onun qiymətindən irs aparmır. Yalnız binanın və ağacların qiymətindən irs aparır onların əslindən yox. Buna əsasən əgər sünnü məzhəbi şiəyə nafiz olarsa, belə ki, sünnü məzhəbli bir qadın yerdən, binanın və ağacların əslindən irs aparsa, əgər başqa vərəsəsi də İmami məzhəb olsa İmami məzhəbdən olan qadın da sair sünnü vərəsələr kimi, torpaqdan bina və ağacların .əslindən ona çatan payı ala bilər

## BƏDƏN YARMAĞIN HÖKMLƏRİ – ۱۸

Məsələ ۵۵: Ölü müsəlmanın bədənini yarmaq icazəli deyildir. Əgər bir kəs bu işi .görərsə, diyə kitablarında qeyd olunan təfsilə əsasən, ona diyə vermək vacib olur

Məsələ ۵۶: Ölü kafirin bədənini yarmaq, hansı qrupdan olsa belə, əgər sağlığında qanı möhtərəm deyildirsə caizdir. Lakin əgər zimmi kafir olsa ehtiyat-vacib budur ki, onun bədənini yarmaqdan çəkinsinlər. Əlbəttə, əgər onun bədəninin yarılması öz şəriətində caizdirsə, istər mütləq şəkildə, istərsə sağlığında bu işə icazə vermiş olsun və ya ölümündən sonra onun vəlisi icazə versin, bu kimi hallarda onun bədəninin .yarılmasının caiz olması uzaq deyildir

Əgər kafirin qanının həyatında möhtərəm olmasında şəkk edilsə və bu barədə heç bir .nişanə olmasa onun bədənini yarmaq caizdir

Məsələ ۵۷: Əgər bir müsəlmanın canının qorunması digər müsəlmanın bədəninin yarılmasına (və ondan müəyyən üzvün götürülməsinə) bağlıdırsa, mümkün olan halda qanı möhtərəm olmayan, yaxud şəkkli olan bir kafiri, əgər bu da mümkün olmasa ondan başqa (ölü) bir kafiri yarmalıdırlar. Əgər bu da mümkün olmasa müsəlman .ölüsünü yarmaq caizdir

Təlim və başqa məqsədlə müsəlman bədənini yarmaq icazəli deyildir. Amma əgər bir .müsəlmanın hətta gələcəkdə belə canının qorunması buna bağlıdırsa, onda caizdir

## BƏDƏN ÜZVLƏRİNİN CALAĞI VƏ KÖÇÜRÜLMƏSİ HÖKMLƏRİ – ۱۹

Məsələ ۵۸: Ölmüş müsəlmanın bədən üzvlərini, məsələn gözünü, əlini və s. diri bir şəxsin bədəninə peyvənd etmək üçün kəsilməsi icazəli deyildir. Əgər bir kəs bu işi görərsə onun diyə

verməsi lazımdır. Kəsilmiş üzvün dəfn edilməsi də vacibdir. Amma əgər biri peyvənd .vurarsa və diri insanın bir üzvü sayılarsa onu yenidən kəsmək vacib deyildir

Məsələ ۵۹: Əgər bir müsəlmanın həyatının qorunması bir ölmüş müsəlmanın bədən üzvünün kəsilməsinə bağlıdırsa onun kəsilməsi caizdir. Lakin onu kəsən şəxsə diyə vacib olur. Hər zaman bu üzv diri insanın bədəninə peyvənd vurulsa onun bir hissəsi .sayılır və diri şəxsin bədənində olan hökmlər də ona aid olur

Məsələ ۶۰: Qeyd olunan məsələlərdə meyyit dedikdə məqsədimiz o, şəxsdir ki, ağ ciyəri və ürəyi kamil şəkildə dayansın və yenidən işə düşməsin. Əgər bir nəfərin beyni ölsə ürəy və ağ ciyəri hətta aparat vasitəsi ilə işləyib və öz vəzifələrini yerinə yetirsələr, ölü deyil. Onun bədən üzvlərini başqa bir diri şəxsə peyvənd vurmaq üçün .kəsmək heç bir yolla caiz deyil

Məsələ ۶۱: Diri insanın bədənindən hər hansı bir üzvü peyvənd vurmaq üçün kəsilməsi insana mühüm bir ziyan yetirərsə, gözün, əlin, ayağın və bu kimi üzvlərin kəsilməsi .kimi, icazəli deyil

Amma çoxlu ziyanı olmasa məsələn ətinin, dərisinin və onurğa beynin bir hissəsini, yaxud böyrəyin biri sağlam olarsa digər böyrəyi, can yəsi uşaq və dəli olmazsa razı olduğu surətdə icazəlidir. Əks halda bir yolla caiz deyil. Onların (üzvlərin) kəsilməsi caiz .olduğu yerlərdə onların müqabilində pul almaq da caizdir

Məsələ ۶۲: Ehtiyacı olanlara qan hədiyyə eləmək, eləcə də onun müqabilində pul almaq .caizdir

Məsələ ۶۳: Qanı möhtərəm olmayan, yaxud şəkkli olan ölmüş kafirin bədən üzvünü müsəlmana peyvənd etmək üçün kəsmək caizdir. Peyvənd edildikdən sonra müsəlmanın bədəninin hökmləri o üzvə də şamil olur. Çünki onun bədənindən bir hissə kimi hesab olunur. Həmçinin it kimi nəcisül-eyn (zatən nəcis olan) heyvanın bədən üzvlərindən birini kəsib müsəlmanın bədəninə peyvənd edilməsinin işkalı yoxdur. (Peyvənd edildikdən sonra da) müsəlman bədəninin hökmləri

ona şamil olur. Çünki artıq diri şəxsin bədən üzvündən hesab olunur və o hissədə .həyat vardır, pakdır və onunla namaz qılmaq caizdir

## SÜNİ MAYALANDIRMA – ۲۰

Məsələ ۶۴: Qadını, ərindən başqasının mənisi ilə mayalandırmaq icazəli deyildir, istər ərli olsun istər ərsiz, İstər ər və arvad buna razı olsunlar, istər razı olmasınlar, istər bu .iş ərinin vasitəsi ilə baş versin, istərsə də başqasının vasitəsi ilə

Məsələ ۶۵: Əgər bir qadın, öz ərindən başqasının mənisi ilə mayalandırılsa və hamilə olub övlad dünyaya gətirsə, bu hadisə səhv üzündən baş vermiş olduğu halda, yəni onu ərinin mənisi ilə mayalandırmaq istədikləri halda başqasının mənisi ilə səhvə düşübsə, belə olan surətdə şübhəsiz övlad məni sahibinindir. Bu məsəlinin hökmü vəty be şübhə kimidir. Lakin əgər belə bir mayalandırma agahlıq üzündən və qəsdən olarsa, yenə də övladın məni sahibinin olması uzaq deyildir və bütün nəsəb hökmləri, hətta irs onların arasında sabitdir. Çünki irsdən istisna olunan hallar zinadan əmələ gələn övladdır. Nütfənin bağlansamına səbəb olan bir işin haram olmasına .baxmayaraq lakin bu məsələ zina hökmündə deyildir

Həmçinin bu övlad hər iki surətdə anasınındır və onunla sair övladları arasında heç bir .fərqi yoxdur

Əgər qadın öz ərinin nütfəsini müsahiqə (ləzbiyənlik) və sair yollarla başqa bir qadının bətninə daxil edərsə və o qadın hamilə olub övlad dünyaya gətirərsə övlad nütfənin .sahibinə və onu dünyaya gətirən qadına aiddir, baxmayaraq ki, bu əməl haramdır

Məsələ ۶۶: Əgər qadının yumurta hüceyrəsi və kişinin sperması götürülüb mayalandırıldıqdan sonra süni bətnə qoyulsa və bu işdən bir övlad dünyaya gəlsə zahir budur ki, yumurta hüceyrə və spermanın sahiblərinə aid olur və bu övladla o iki şəxsin arasında bütün nəsəb (qohumluq) hökmləri hətta irs hökmü belə cari olur. Əlbəttə, əgər mayalandırılma yerinə

.yetməzdən öncə o ikisindən biri dünyadan getsə övlad ondan irs aparmaz

Məsələ ۶۷: Əgər bir qadının mayalanmış yumurta hüceyrəsini başqa bir qadının bətninə qoysalar və orada inkişaf edib övlad dünyaya gəlsə onun birinci qadına aid .edilməsinin bir əsası vardır. Amma ehtiyat da tərk olunmamalıdır

Məsələ ۶۸: Qadının öz ərinin mənisi ilə mayalandırılması diri olarsa caizdir. Əlbəttə əgər bu iş baxışı haram olan yerlərə baxmağı, ləms etməyin haram olduğu yerlərinə ləms etməyi lazım tutursa, bu işin yerinə yetirilməsi ərindən başqasına icazəli deyildir. Amma zərurət halı istisna olunur, məsələn (təbii yolla) uşaq sahibi olmaq onun üçün çox çətin olsa, hətta başqalarının danlanması cəhətindən olsa və hamilə olmağı üçün də bundan başqa yol olmasa bu cür mayalandırılmadan dünyaya gələn övlad da heç bir fərqi olmadan onların sair övladları kimidir. Amma qadının öz ərinin mənisi ilə mayalandırılması öləndən sonra ehtiyat-vacibə əsasən icazəli deyil. Əgər bu işi .tutarlarsa uşağın onun olmasına baxmayaraq uşaq ondan irs aparmır

## ƏHALİ ARTIMINA NƏZARƏTİN HÖKMLƏRİ – ۲۱

Məsələ ۶۹: Caizdir ki, qadın ona mühüm bir ziyanı çatmadığı təqdirdə hamiləliyin qarşısını alan dərmanlardan istifadə etsin, istər əri bu işə razı olsun, istərsə razı .olmasın. Əgər ərin şəri hüquqları ilə zidd olsa bu işi edə bilməz

Məsələ ۷۰: Caizdir ki, qadın ona mühüm bir zərəri olmadığı təqdirdə hamiləliyin qarşısını alan cihazlardan və sair kimi şeylərdən istifadə etsin. Amma əgər onun fərcinə bu kimi cihazların qoyulması baxılması haram olan yerlərə nəzər salmağa bağlıdırsa, yaxud ləms etmək halal olmayan yerlərə ləms etməyini lazım tutursa bu işin ərindən başqası tərəfindən yerinə yetirilməsi icazəli deyildir. Amma zərurət halı bundan istisna olunur, məsələn, uşaq sahibi olmağın onun üçün zərəri olarsa və ya elə bir çətinlik yaradarsa adətən dözülməzdir, bu o, haldadIr ki, hamiləliyin qarşısını almağa başqa bir yol olmasın

və olarsa da zərər yaxud çətinliyi olsun. Bu o haldadır ki, həmin cihazın nütfəni mayalandıqdan sonra məhv etməsi məlum olmasın. Əgər məlum olarsa ehtiyat-vacibə əsasən gərək hər halda tərk edilsin.

Məsələ ۷۱: Qadın cərahiyyə əməliyyatı ilə rəhim (doğum) turbalıqlarını bağlatdırması hətta daha heç bir vaxt hamilə olmasada icazəlidir. Amma bu iş bənən örtülməsi vacib olan üzvlərin görünməsi və ya bəzi yerlərə toxunmaq ki, əlcəksiz toxunmaq icazəli deyil. Qeyd etdiyimiz kimi, zərurət halları istisnadır. Amma bu iş uşğlığın götürülməsi və ya yumurtalıq kimi bir üzvün kəsilməsi nəticəsində ciddi bir ziyana səbəb olmasın. Məgər inki xəstə bu zərurəti qəbul etsin. Bu hökmün oxşarı kişilər haqda da cari olur. Əlbəttə əgər bu cərrahiyyə əməliyyatı ərindən başqasının əli ilə görülərsə və baxışı haram olan yerlərə baxmağa səbəb olarsa, ləms edilməsi haram olan bədənin üzvlərinə ləms edilməsini lazım tutarsa, bu halda bu iş icazəli deyildir. Yalnız zərurət halında caiz ola bilər, məsələn uşaq sahibi olmaq onun üçün zərərli olsa. Bu məsələnin hökmü tamamilə kişilərin barəsində də caridir.

Məsələ ۷۲: Nütfə bağlandıqdan sonra bətndə olan rüşeymi saldırmaq icazəli deyildir. Amma əgər bətndə olan rüşeymin davam etməsi anaya çox ziyan çatdırarsa və ya elə bir çətinlik yaradarsa adətən dözülməzdir, bu halda əgər ruh daxil olmayıbsa, saldırması caiz, amma ruh daxil olduqdan sonra rüşeymi saldırmaq mütləq şəkildə icazəli deyildir. Əgər ana öz bətnində olanı saldırsa miqdarı diyə kitablarında deyilən qədər diyə vermək ona vacib olur və onu uşağın atasına, yaxud bətnindəki uşağın vərəsələrinə verməlidir. Əgər ata uşağı saldırsa diyə vermək ona vacib olur və onu anasına verməlidir. Əgər birbaşa həkimin vasitəsi ilə saldırılarsa ata və ananın istəyi ilə olmasına baxmayaraq diyə ona vacib olur, amma əgər vərəsələr ona güzəştə getsələr onda vacib olmaz. Rüşeymi saldırdıqlarına görə beş min iki yüz əlli misqal gümüş versələr kifayətdir. Əgər rüşüym oğlan uşağı olsa beş min iki yüz əlli misqal gümüş, əgər qız uşağı olarsa bunun yarsını (öldürdükdən sonra) diyə versə kifayətdir. Ehtiyat-vacibə əsasən ana bətnində

ölən rüşüymin də diyəsi bu qədərdir. Əgər rüşeym canlı olmasa və nütfə halında olsa yüz əlli misqal gümüş, əgər qan bağlasa (qan halında olsa) iki yüz on misqal gümüş, əgər ət halında olsa üç yüz on beş misqal gümüş, əgər sümüy bağlayıbsa dörd yüz iyirmi misqal gümüş, əgər bədən üzvləri kamil olsa beş yüz iyirmi beş misqal gümüş, diyə verilməlidir. Ehtiyat-vacibə əsasən canlı olmazsa oğlanla qızın arasında fərq .yoxdur

Məsələ ۷۳: Caizdir ki, qadın bəzi vacib əməlləri tamamlamaq üçün adət günlərini təxirə salan dərmanlardan istifadə etsin. Məsələn oruc, həcc əməlləri və başqa hallarda. Bu şərtlə ki, bu iş ona mühüm bir ziyan çatdırmasın. Əgər bu dərmanlardan istifadə etdiyi halda ardıcıl olmayan qan görsə adəti dövründə olsa belə, heyz hökmləri ona aid .olmayacaqdır

## DÖVLƏTİN SALDIRDIĞI XİYABAN VƏ KÜÇƏLƏRİN HÖKMLƏRİ – ۲۲

Məsələ ۷۴: Əvvəllər camaatın şəxsi əmlakı, evləri olan, sonradan dövlətin öz mülkiyyətinə keçirərək yol saldırdığı yerləşən səkilərdə və xiyabanlarda hərəkət etmək caizdir. Əlbəttə, əgər bir kəs bu yerlərdən xüsusi bir yerinin dövlət tərəfindən zorla, onun sahiblərinə dəyən xəsarəti ödəmədən, yaxud onları razı salmadan istifadə etdiyini bilsə, qəsbi yerlər hökmünü daşıyacaq orada hər növ təsərrüf, hətta o yerdən keçmək belə caiz olmayacaq. Amma əgər onun malikini, yaxud vəlisini (atası, babası, yaxud o ikisinin tərəfindən təyin edilən qəyyumu) razı salsa onda eybi yoxdur. Əgər malikini tanımasalar məchulul-malik hökmlərinə malik olacaq və bu barədə şəriət hakiminə müraciət edilməlidir. Bu məsələdən bu kimi torpaqların yerdə qalan hissələrinin də hökmü aydın olur, belə ki, malikinin icazəsi olmadan onlardan istifadə .etmək icazəli deyildir

Məsələ ۷۵: Məscid, hüseyniyyə, qəbiristan və yol üzərində salınmış olan ümumi vəqf yerlərində yol getmək, oturmaq və bu

kimi qəbildən olan təsərrüflər etmək caizdir. Lakin bu cür təsərrüflər xüsusi vəqf yerlərindən olan mədrəsə və bu kimi şeylərin yerindən, kimə vəqf olunubsa onlardan .başqasında caiz olması işkallıdır

Məsələ ۷۶: Xiyabanlarda və səkilərdə yerləşən məscidin torpağı vəqf olmaqdan xaric olmur, lakin məscid ünvanı ilə gələn hökmlərə malik deyildir. O cümlədən onu nəcis etməyin haram, nəcis olduqda paklamağın vacibliyi, cünub, haiz və nəfsa qadınların .orada dayanmağının haramlığı kimi hökmlər ona şamil olmur

Amma məscidin qalan yerləri, əgər məscid olmaq ünvanından xaric olmayıbsa məscidlə əlaqədar olan bütün hökmlər ona gələcəkdir. Lakin məscid olmaq ünvanından xaric olubsa, məsələn hər hansı bir zalım onu dükan, məhəll, yaxud başqa bir evə çeviribsə məscid hökmü ona aid olmaz, ondan bütün halal faydalar caizdir. .Amma əgər qəsbin təsdiq olunmasına səbəb olarsa icazəli deyildir

Məsələ ۷۷: Məscid uçurulduqdan sonra ondan qalan əsərlər, daşı, taxtaları, dəmirləri və onun vasitələri, o cümlədən çıraqları, istilik və soyuqluq verən şeyləri, əgər həmin məscidə vəqf olunmuşsa, başqa məscidə sərf olunması vacibdir. Əgər bu iş mümkün olmazsa ümumi xalq mənafeyində məsrəf edilməlidir. Onları satmaqdan başqa yolla istifadə etmək mümkün olmazsa, gərək mütəvəlli, yaxud onlardan istifadə etmək .haqqına malik olan şəxs onları sataraq başqa məscidlərə məsrəf etsin

Məscidin yerdə qalmış əsərləri onun mülkü olarsa məsələn məscidə vəqf olunmuş malın eyninin mənfəətindən məscid üçün alınmışsa bunların özünün başqa məscidlərə sərf olunması vacib deyildir. Əksinə caizdir ki, mütəvəlli, yaxud onlarda təsərrüf etmək haqqına malik olan bir şəxs məsləhət gördüyü təqdirdə onları satsın və onların pulunu .başqa məscidə xərcləsin

Bu qeyd olunan hökm ümumi vəqf olunan yerlərin, o cümlədən yol üstündə yerləşən .mədrəsələrin və Hüseyniyyələrin üzərinə də gəlir

Məsələ ۷۸: Yol üzərində yerləşən müsəlman qəbiristanlığı-nın, eləcə də şəxsi, ya

əmlakının hökmü qeyd olunanlardan aydın olur. Bu o haldadır ki, qəbiristanın torpağında gediş-gəliş müsəlman ölülərinin hörmətsizliyinə səbəb olmasın, əks halda orada gediş-gəliş icazəli deyil. Lakin əgər qəbiristan bir şəxsin mülkü, yaxud vəqf .olmazsa, hörmətsizlik olmadığı təqdirdə hər növ istifadə etməyin işkalı yoxdur

Bu məsələdən qəbiristanlığın yola salınmayan hissələrinin hökmləri aydın olur. Belə ki, birinci halda (şəxsi əmlak olduqda) onlardan istifadə etmək və ya satmaq malikinin icazəsi olmadan icazəli deyildir. İkinci halda isə (ümumi vəqflərdən olarsa) mütəvəllinin, yaxud onda təsərrüf etmək haqqına malik olan şəxsin icazəsi olmadan icazəli deyildir. Onun pulu sair müsəlman qəbiristanlıqlarında istifadə edilməlidir. Ehtiyat-vacibə görə yaxında olan qəbiristanlıq bu işə daha üstündür. Üçüncü halda bir kəsin icazəsinə ehtiyac duyulmadan ondan istifadə etmək caizdir. Belə ki, əgər bu iş başqalarının mülkündən xarab olmuş qəbirlərin əsərlərindən istifadə etməyə səbəb .olmasın

## NAMAZ VƏ ORUC HAQDA MÜXTƏLİF MƏSƏLƏLƏR – ۲۳

Məsələ ۷۹: Əgər oruc tutan bir şəxs gün batdıqdan sonra öz şəhərində iftarını açmadan təyyarə ilə qərb tərəfə səfər etsə və günəşin hələ batmadığı bir yerə çatsa həmin yerdə gün batana qədər özünü oruc saxlaması vacib deyildir. Lakin ehtiyat .müstəhəb orucunu açmaqdan çəkinməsidir

Məsələ ۸۰: Əgər mükəlləf öz şəhərində sübh namazını qıldıqdan sonra qərbə tərəf səfər etsə və sübhün açılmadığı bir yerə çatsa və sübh açılana qədər orada qalsa; yaxud zöhr namazını öz yerində qılıb sonra günorta olmadığı bir yerə səfər etsə və günorta daxil olana qədər orada qalsa; yaxud məğrib namazını öz şəhərində qılıb sonradan səfərə getsə və hələ günəşin batmadığı bir yerə çatıb gün batana qədər orada qalsa fərz olunan bu halların hamısında namazı yenidən qılmaq vacib deyil. .Amma ehtiyat-müstəhəb budur ki, onu yenidən qılsın

Məsələ ۸۱: Əgər bir şəxs namaz qılmasa, nəticədə onun vaxtı keçsə, sonradan təyyarə ilə hələ namaz qılmağa vaxt olan bir yerə getsə ehtiyat-vacibə görə gərək namazını .mafiz-zimmə niyyəti ilə, yəni əda və qəza niyyəti etmədən yerinə yetirsin

Məsələ ۸۲: Əgər mükəlləf təyyarə ilə səfər etsə və orada namaz qılmaq istəsə namaz vaxtı üzü qibləyə olmaq, bədənin aramlaşması və sair şərtlərə riayət etməklə namazını qılsa namazı səhihdir. Əks halda əgər vaxtı olsa, onda təyyarədən çıxandan sonra şərtlərə malik olan namazı qılmağa imkanı olsa ehtiyata əsasən təyyarədə qıldığı namaz səhih deyil. Lakin əgər vaxt dar olsa vacibdir ki, namazı təyyarənin içində qılsın, belə olan halda əgər qiblənin istiqamətini bilsə həmin istiqamətə qılmalıdır. Zərurət halı istisna olmaqla qiblənin şərtlərinə riayət etmədən namazı səhih olmaz. Bu halda gərək təyyarə hər vaxt qiblə səmtindən dönsə o qibləyə tərəf dönsün və döndüyü zaman zikr və qiraəti deməsin. Qiblənin özünə diqqət yetirə bilməsə sağ əli ilə sol əli arasında olan istiqamətlərə diqqət yetirməlidir. Əgər qiblənin istiqamətini bilməsə onu təyin etmək üçün çalışmalı və öz gumaninə əsasən əməl etməlidir. Əgər guman əldə edə bilməsə namazını qiblə olmasına ehtimal verdiyi hər tərəfə qıla bilər. Amma əhvət budur ki, namazı dörd istiqamətdə qılsın. Bu o hallardadır ki, qibləni tanımaqla üzü qibləyə dayana bilsin. Əgər təkbirətül-ehramdan başqa bunu yerinə yetirə bilməsə onunla kifayətlənsin əgər ümumiyyətlə bacara bilməsə üzü qibləyə .dayanmaq şərti qüvvədən düşür

Caizdir ki, insan namazın vaxtından əvvəl ixtiyari halda təyyarə ilə səfər etsin. Hərçənd bilsə ki, təyyarənin içərisində namazın bədənin aramlaşması və qiblə kimi şərtlərinə .malik olmayacaq

Məsələ ۸۳: Əgər bir şəxs sürəti yerin fırlanma sürəti ilə bir olan bir təyyarəyə minsə və yerin şərqindən qərbinə doğru hərəkət edib bir müddət yerin ətrafına fırlansa, ehtiyat-vacib budur ki, hər iyirmi dörd saatda beşlik təşkil edən namazları mütləq .qürbət niyyəti ilə yerinə yetirsin. Lakin orucun qəzasını etməlidir

Əgər təyyarənin sürəti yerin fırlanma sürətindən iki qat artıq olsa təbiidir ki, hər on iki saatda bir dəfə yerin ətrafına fırlanacaqdır və iyirmi dörd saatda iki dəfə sübhün açılışını, iki dəfə günortanı və iki dəfə qürubu görəcəkdir. Ehtiyat-vacib budur ki, hər sübh açılanda sübh namazını, hər günorta zamanı zöhr və əsr namazını və hər .qürubdan sonra məğrib və işa namazını qılsın

Əgər daha yüksək sürətlə yerin ətrafına fırlansa və məsələn hər üç saat, yaxud daha az bir zamanda yerin ətrafına fırlansa hər sübh açılanda, günorta və qürubda namaz vacib deyil. Ehtiyat-vacib budur ki, hər iyirmi dörd saatda mütləq qürbət qəsdi ilə beşlik namazları yerinə yetirsin. Bunu da nəzərə alsın ki, sübh namazını fəcr açılanla günəş doğan vaxt arasında, zöhr və əsr namazını günorta ilə qürub arasında, məğrib və işa .namazını qürubla gecə yarısı arasında qılsın

Bu məsələdən aydın olur ki, əgər onun sürəti yerin hərəkət sürətinə bərabər olsa və məğribdən məşriğə doğru getsə gərək beşlik namazları öz vaxtlarında qılsın. Həmçinin əgər onun sürəti yerin sürətindən az olsa da, hökm eynidir amma əgər onun sürəti yerin sürətindən daha artıq olsa, məsələn hər üç saatda, yaxud ondan az vaxtda yerin .ətrafına dolansa, onun məsələsi qeyd olunanlardan aydın olur

Məsələ ۸۴: Əgər səfərdə vəzifəsi oruc tutmaq olan bir şəxs sübh açılandan sonra öz şəhərində oruc niyyəti edib hava yolu ilə səfər etsə və hələ sübh açılmadığı bir şəhərə .çatsa sübh açılana qədər yeyib içə bilər

Məsələ ۸۵: Əgər bir şəxs Ramazan ayında günortadan sonra öz şəhərindən səfər edib hələ günorta olmamış bir şəhərə çatsa ehtiyat-vacibə görə orucunu açmamalı və onu .sona çatdırmalıdır

Məsələ ۸۶: Əgər bir şəxsin vəzifəsi səfərdə oruc tutmaq olsa və öz yerində Ramazan ayının hilalını gördükdən sonra üfüqün fərqli olmasına görə hələ hilalın görünmədiyi bir yerə getsə həmin günün orucu ona vacib deyildir. Əgər Şəvval ayının hilalını gördüyü bir ölkədə bayram keçirib sonra bir yerə getsə ki, üfüqün fərqli oluğuna görə hələlik ,hilal orada görünməyib

ehtiyat-vacibə görə gərək o günün qalanını orucunu açmasın onun qəzasını da yerinə .yetirsin

Məsələ ۸۷: Əgər mükəlləf ilin altı ayının gecə, altı ayının gündüz olduğu yerdə olsa ehtiyat-vacibə görə namazında ora ən yaxın olan bir məkanı nəzərə almalıdır ki, hər iyirmi dörd saatda bir gecə-gündüz olur. Mütləq qürbət niyyəti ilə beşlik namazlarını həmin yerin üfüqünə uyğun yerinə yetirməlidir. Oruc barəsində də vacibdir ki, Ramazan ayında elə bir şəhərə getsin ki, orada oruc tuta bilsin, yaxud ondan sonra .gedib qəzasını etsin. Əgər bunu edə bilməsə oruc əvəzinə fidyə verməlidir

Lakin hər iyirmi dörd saatında gecə-gündüz olan bir şəhərdə olsa hətta gündüzü iyirmi üç saat, gecəsi isə bir saat, ya əksinə olsa onun namazının vaxtı xüsusi vaxtlara .tabedir

Amma oruca gəldikdə isə mümkün olduğu qədər Ramazan ayının orucunu tutması vacibdir. Mümkün olmadığı təqdirdə ondan götürülür. Əgər onun qəzasını yerinə yetirə .bilərsə qəzası ona vacib olur, əks halda fidyə verməsi lazımdır

## BƏXT YOXLAMA BİLETLƏRİ – ۲۴

(LOTOREYA BİLETLƏRİ)

Bəxt yoxlama biletləri bir vərəqədir ki, bəzi şirkətlər onu müəyyən məbləğə satır və iltizam verirlər ki, bu vərəqələri alanların içərisində püşk ataraq püşk kimin adına çıxsa, :ona müəyyən məbləğdə mükafat versin. Bu iş bir neçə vəch ilə təsəvvür olunur

Pulu həmin vərəqin müqabilində püşk atmada udmaq və mükafatı əldə etmək-۱ ehtimalı ilə versin. Bu halda müamilə şəksiz haram və batildir. Əgər bir kəs bu haram işə mürtəkib olsa və püşk atanda udsa püşk atan şirkət dövləti olsa hədiyyə ünvanı ilə aldığı məbləğ məchulul malikdir və onda təsərrüf etmək şəriət hakiminə müraciət etməklə şərtlənir. Əgər o şirkət xüsusi

olsa o halda təsərrüf etmək caizdir ki, sahibinin onun təsərrüf etməsinə razı olmasını .bilsin, hətta malı olmadığını bilsə belə

Pul verməkdə məqsəd qazanc və mükafat əldə etmək deyil, mədrəsə, məktəb, -۲ körpü saldırmaq kimi xeyriyyə işlərində iştirak edib maddi kömək etmək olsa, bu halda işkalı yoxdur. Bu halda əgər püşk bir adamın adına çıxsa, belə ki, şirkət dövləti olsa, mükafatı almaq ehtiyat-vacibə görə şəriət hakiminin icazəsi ilə və ona müraciət etməklə ondan istifadə etməyin işkalı yoxdur. Əgər dövlət şirkəti olmazsa, verilən hədiyyədən istifadə etməkdə şəriət hakiminə müraciət etməyə və onun icazəsinə .ehtiyac yoxdur

Pul verməkdə məqsəd şirkətə borc vermək olsun belə ki, vərəqəni alan, müəyyən -۳ məbləği, misal üçün, altı aylıq şirkətə borc verir, şirkətin də vəzifəsi bu olur ki, qeyd olunan məbləği qaytarmaqdan əlavə, püşk atmaqla adı çıxan şəxsə müəyyən məbləği .mükafat adı ilə versin. Bu müamilə haramdır. Çünki ribalı borcdan hesab olunur

Vəlhəmdu lillahi əvvələn və axirən

## ŞƏRİ TERMİNLƏRİN İZAHI

A

Adil: Haram olan şeyləri tərk edib, vacib olan şeyləri yerinə yetirməyə sövq edən .mələkəyə sahib olan şəxs, ədalətlə davranan adam

Axar su: Axar su o suya deyilir ki, yerdən coşub çıxsın və axmaqla hərəkətdə olsun. .Yerdən çıxan çeşmə və kəhriz və s. kimi

Az su: Kürr miqdarında olmayan, yerdən coşmayan və göydən yağmayan sulara .(məsələn, kasa, kuzə, aftafa suyuna və bu kimi sulara), az su deyilir

Amil: Əməl edən, çalışan; zəkatı toplama, bölmə və digər işlər tapşırılmış adam; cualə .qərarına əməl edən şəxs

.Ariyə: Öz malını geri alıb əvəzsiz olaraq başqalarının istifadəsinə vermək

.Asi: Üsyan edən, İlahi əmrlərə itaət etməyən

Ayət namazı: Zəlzələ olduqda, Ay və Günəş tutulduqda və təbii hadisələr baş verərkən .əksər camaat qorxarsa vacib olan iki rəkət namaz

B

.Baliğ : Həddi-buluğa çatmış oğlan və ya qız

.Batil: Düzgün olmayan, Allahın istədiyi kimi yerinə yetirilməyən bir əməl

Bayram namazı: Fitr və Qurban bayramı günü xüsusi bir şəkildə qılınan iki rəkət .namaz

Bidət: Yeni bir şey; Dində olmayan və sonradan İlahi hökmlərə əlavə olunan yeni bir .şey

.Birinci fəcr : Sübh azanına yaxın gündoğandan görünən aydınlıq

.Böyük hədəs: Qüslə səbəb olan hər şey, cima və heyz kimi

V

Vacib: Görülməsi (yerinə yetirilməsi) lazım, tərk olunması isə İlahi əzaba səbəb olan .(əməldir (namaz, oruc və s. kimi

Vacibi eyni: Hər bir şəxsin özünə (başqalarını nəzərə almadan) vacib olan əməldir .((namaz, oruc, kimi

Vacibi kifai: Hamıya vacib olan, amma bir, yaxud bir neçə nəfər yerinə yetirdikdə .(hamının öhdəsindən götürülən əməl (məsələn: meyyit namazı kimi

.Vacibi təxyiri: Bir neçə vacibdən, istədiyini görməkdə ixtiyar sahibidir

.Vacib qüsl: Yerinə yetirilməsi gərəkli olan qüsl

:Vacib qüsllər

.Cənabət qüslü .۱

.Heyz qüslü .۲

.Nifas qüslü .۳

.İstihazə qüslü .۴

.Məss meyyit qüsü .۵

.Meyyit qüslü .۶

.Nəzr, and və başqa yollarla vacib olan qüsl .۷

.Vədiə: Əmanət

.Vəhşət namazı: Ölən şəxs üçün dəfn edildiyi günün ilk gecəsi qılınan iki rəkət namaz

Vəqf: Malı öz istifadəsindən çıxarıb, onun mənfəətini bəzi fərdlərə və ya xeyir işlərə .sərf etmək

.Varis: İrs aparan şəxs, ölən adamın malına şərən sahib olan şəxs

.Vəliyy: Şəri cəhətdən ixtiyar sahibi olan şəxs, ata, baba və şəri hakim kimi

.Vəsiy: Vəsiyyəti icra etməyə məsul olan şəxs, ölünün vəsiyyət etdiyi şəxs

.Vəsiyyət: İnsanın ölümündən sonra görüləcək işlər barəsindəki tövsiyyələri

.Vətən: İnsanın özünə yaşamaq üçün seçdiyi yer

.Vədi: Bövl etdikdən sonra insandan çıxan su

.Vəkalət: Bir şəxsi, öz tərəfindən bir işi görməyə vəkil etmək

.Vəkil: Başqası üçün bir işi görən adam

.Vəzi: Bəzi vaxtlarda insandan məni gəldikdən sonra çıxan su

Vitr namazı: Səkkiz rəkət gecə namazı və iki rəkət şəf namazından sonra qılınan bir .rəkətlik namaz

Q

.Qəyyum: Başçı, sərpərəst

.Qəsb: Başqasının malını və ya haqqını zülümlə mənimsəmək, zorla almaq

.Qəsr: dörd rəkətli namazların səfərdə iki rəkətqılınması

.Qürbət qəsdi: Yəni bir işi Allah üçün görmək

Qünut: Namazın ۲-ci rəkətində qiraətdən sonra əllərin içini üzün qarşısında tutaraq .zikr və dua oxumaq

.Qüsl: Qürbət qəsdilə bədəni xüsusi şəkildə yumaq

Qiyam: Durmaq, namaz qılmaq

Quranın vacib səcdəsi: Qurani-Kərimdə ۱۵ səcdə ayəsi vardır. Yəni insan o ۱۵ ayəni oxuyarkən və ya eşidərkən dərhal Allahın əzəməti və böyüklüyü qarşısında səcdə

etməlidir. Bu ۱۵ ayənin dördünün səcdəsi vacib, qalan on birinin səcdəsi müstəhəbdir.

Səcdəsi vacib olanlar:

۱. ۲۱-ci cüz, «Səcdə» surəsi, ۱۵-ci ayə.

۲. ۲۴-cü cüz, «Fusillət» surəsi, ۳۷-ci ayə.

۳. ۲۷-ci cüz, «Nəcm» surəsi, son ayə.

۴. ۳۰-cu cüz, «Ələq» surəsi, son ayə.

Səcdəsi müstəhəb olanlar:

۱. ۹-cu cüz, «Ə`raf» surəsi, ۲۵۶ ayə.

۲. ۱۳-cü cüz, «Rə`d» surəsi, ۱۵-ci ayə.

۳. ۱۴-cü cüz, «Nəhl» surəsi, ۴۹-cu ayə.

.ci cüz, «İsra» surəsi, ۱۰۷-ci ayə-۱۵ .۴

.cı cüz, «Məryəm» surəsi, ۸۸-ci ayə-۱۶ .۵

.ci cüz, «Həcc» surəsi, ۱۸-ci ayə-۱۷ .۶

.ci cüz, «Həcc» surəsi, ۷۷-ci ayə-۱۷ .۷

.ci cüz, «Furqan» surəsi, ۶۰-cı ayə-۱۹ .۸

.cu cüz, «Nəml» surəsi, ۲۵-ci ayə-۱۹ .۹

.cü cüz, «Sad» surəsi, ۲۴-cü ayə-۲۳ .۱۰

.cu cüz, «İnşiqaq» surəsi, ۲۱-ci ayə-۳۰ .۱۱

Ğ

Ğəşş: Xəyanət, hiylə, xalqı aldatmaq məqsədilə dəyəri az olan malı, dəyəri yüksək olan .bir malla məlum olmayacaq bir şəkildə qarışdırmaq

.Ğüsalə: Yaxantı, bir şeyi yuduqdan sonra ondan öz-özünə və ya sıxmaqla tökülən su

Ğufeylə namazı: Məğrib namazından sonra günbatandan qızartı çəkilməmiş qılınması .müstəhəb olan iki rəkətli xüsusi namaz

.Ğait: İfrazat

D

.(Dinin zəruriyyəti: Dinin ən mühüm hökmləri (namaz və orucun vacibliyi kimi

Diyə: Qan və ya insan bədənində aşkar edilən yaranın, üzvlərinin nöqsanlığının .əvəzində ödənilən mal

Ə

.Ədalət: İnsanı haramları tərk edib, vacibləri yerinə yetirməyə sövq edən mələkə

Əhd: Öhdəyə alma, söz vermə. Yaxşı bir iş görmək, pis bir işi tərk etmək üçün xüsusi .bir siğə ilə Allah-təala ilə əhd bağlamaq, Allah-təalaya söz vermək

Əqdi-daim: Ömrünün sonuna kimi həyat yoldaşı ilə bərabər yaşamaq məqsədiylə .qurulan evlənmə əlaqəsi

.Əqd: Bağlılıq, evlənmə bağlılığı

.Əcr tutmaq: Müqaviləyə əsasən gördüyü işin qarşısında haqqını alan şəxs

.Ə`ləm: Daha elimli

.Əhvət: Ehtiyata uyğun

Əhli-kitab: Səmavi kitaba sahib olan peyğəmbərlərin ardıcılları. Yəhudi, Məsihi və .Zərdüşti kimi

E

.Ehtiyat: Həqiqətə yetişdiyinə güvənə biləcək şəkildə əməl etmək

Ehtiyat vacib: Fətva ilə bərabər olmayan və edilməsi lazım olan ehtiyat. Ehtiyat-vacib və ehtiyat-lazım deyilən məsələlərdə müqəllid istəsə, başqa bir müctəhidin fətvasına .əməl edə bilər

.Ehtiyat lazım: Ehtiyat-vacib, edilməsi lazım olan ehtiyat

Ehtiyat müstəhəb: Müctəhidin fətvasından kənar bir ehtiyat, yəni fətva ilə birlikdə olan .ehtiyat. Buna görə də, bu ehtiyata əməl etmək gərəkli deyildir

Ehtiyat namazı: Gündəlik namazların rəkətlərində şəkk edildiyi namazı tamamladıqdan .sonra şəkk edilən rəkətləri kamil etmək üçün surəsiz qılınan namaz

Ehtiyat tərk edilməsin: Bu termin müctəhidin fətva vermədiyi bir yerdə istifadə edildiyi zaman ehtiyat-vacib mənasındadır. Amma fətva verdiyi bir yerdə ehtiyatın çox yaxşı .olduğu bildirilir

Eyni nəcis: Bövl, ğait, məni, murdar, qan, it, donuz, kafir və şərab kimi nəcis olan .şeylərin əsli

İ

İcarə: Bir malın və ya bir şəxsin işin mənfəətlərini müəyyən bir qiymətlə başqasının .istifadəsinə vermək barədə bağlanan müqavilə

.İftar: Orucu açmağa deyilir

.İhtilam: İnsandan məni çıxması

.İqamət qəsdi: Yolçünün bir yerdə on gün qalmağa qərar verməsi

İkinci fəcr: Birinci fəcrdən sonra uzununa görünən ağarma, sübh namazı o vaxtdan .olaraq başlayır

.İmsaq: Bir şeydən çəkinmək

İnşa qəsdi: Nikah, alqı-satqı və s. kimi mühüm işləri, bir sıra xüsusi kəlmələri dilə .gətirməklə vücuda gətirməyi qəsd etmək

.İrtimasi-qüsl: Qüsl niyyətilə bir dəfə suya baş vurmaqla yerinə yeirilən qüsl

İrtimasi dəstəmaz: Üzü və əlləri suya batırıb-çıxararkən dəstəmaz niyyəti edilərək .alınan dəstəmaz

.İrs: Ölən bir şəxsdən varisinə qalan mal

:İstibra: Murdardan təmizlənməyə çalışmaq, bu söz üç yerdə istifadə olunur

.Bövldən istibra .۱

Mənidən istibra; belə ki, məni çıxdıqdan sonra məcrada məni zərərlərinin .۲ .qalmadığına əmin olmaq üçün bövl etmək

Nəcis yeməyə alışmış heyvanın istibrası; yəni nəcis yeyən heyvan, öz təbii yeməyinə .۳ .alışana qədər insan nəcasətini yeməkdən qorumaq

İstihalə: Bir şeyin başqa bir şey sayılacaq qədər dəyişməsi; ağacın yanıb kül olması və .ya itin bir duzluğa düşüb duza çevrilməsi

.İstihazə: Qadınların gördüyü üç növ qandan birinin adı

.İstimna: Məninin xaric olması üçün özü ilə hər hansı bir işi yerinə gətirmək

.İstisqa namazı: Yağış yağması üçün xüsusi bir şəkildə qılınan namaz

İstitaət: Vacib həcci yerinə yetirməyə bədən, mal və yol baxımından qüvvəsi çatmaq; .şəxsin boynuna həcc gəlməsi

İbnus-səbil: Səfərdə xərclik pulu və yaşayış üçün lazım olan əşyaları olmayan, yarı .yolda qalan musafirə deyilir

İstifta: Fətva tələb etmə; Bir məsələ barədə onun şəri hökmünü ələ gətirməkdən ötrü .müctəhiddən sual etmək

.İşkalı var: Yəni, ehtiyat-lazımın xilafınadır

.İmam cəmaat: Namazda iqtida olunan şəxs

Z

.Z`əf: Qüvvətsizlik, qüdrətsizlik, bir işi görməyə gücü çatmamaq

.Zamin: Təzminə məcbur olan və ya təzmin etməyi qəbul edən, kəfil

.Zərurət: Çarəsizlik, məcburluq

Zəkat: İnsanın bəzi mallardan nisab həddinə yetişincə xüsusi yerlərdə məsrəf edilmək .üçün ayırdığı miqdir

.Zəkat nisabı: Zəkatı vacib olan şeylərin hər birində təyin edilmiş miqdar

Zimmət şərtləri: Müsəlman ölkəsində yaşayan kitab əhli olan kafirlərin İslam dövləti .sayəsində can və mallarının hifz olunması üçün əməl etməli olduqları şərtlər

Zimmi-kafir, Zimmə əhli: Müəyyən şərtlər daxilində İslam hökmətinin pənahında .(yaşamağa iltizamlı olan kitab əhli. (Yəhudilər və məsihilər kimi

.Zina: Kəbindənkənar əlaqə, bir-birinə haram olan kişi və qadının cinsi əlaqəyə girməsi

.Zira: Dirsəkdən barmaqların ucuna qədədər olanməsafədir

Y

.Yaisə: Heyz qanı görməyəcək yaşı yetişən qadın

.Yəqin: Doğru bilgi, yanlışlığına heç bir ehtimal olmayan məlumat

K

:Kafir

.Allahın varlığını inkar edən şəxs .۱

.Allaha şərik qoşan şəxs .۲

٣. Həzrət Məhəmmədin (səlləllahu ələyhi və alihi və səlləm) nübüvvətini qəbul etməyən şəxs.

۴. Yuxarıda qeyd etdiklərimizdən birində şəkk və şübhə edən şəxs.

Müsəlmanların zəruri yəni dinin bir parçası saydığı açıq, aydın hökmlərini inkar edən .۵ .və İmamlara qarşı düşmənlik izhar edən xəvaric və nəvasib kimi şəxslər

Kiçik hədəs: Dəstəmazı pozan şərtlər; bövl, ğait, yel xaric etmək, yatmaq, ağıl aparan .şeylər, istihazə və qüslü lazım etməyən şeylər

G

.Gecə namazı: Gecə yarısından sonra iki rəkətli qılınan ۸ rəkətli namaz

Gündəlik nafilələr: Gündəlik müstəhəbb namazlar. Cümə günü ۳۸, qalan günlərdə ۳۴ .rəkətdir

L

.(.Ləhv alətləri: Əyyaşlıq və digər əyləncə alətləri (saz, nağara və s

M

.Mafiz-zimmə: İnsanın öhdəsinə aldığı şey

Meyyitin malının əsli: Meyyitə məxsus olan üçdə biri çıxılmamış, vərəsələrin payı .ayrılmamış mal

.Mutə: Daimi olmayan əqd ilə bağlanan nigah

.Muhtəzər: Can vermə vəziyyətində olan adam

(.Mudd: Təqribən ۷۵۰ qramdır. (Bir “sir” ۷۴ qram, ۱۰ “sir” bir mudd, yəni ۷۵۰ qramdır

.Murdar: Öz-özünə ölən və ya qeyri-İslami qaydada öldürülən heyvan

.Muvalat: Fasiləsiz, namazın bölmələrini ara vermədən fasiləsiz qılmaq

Muzaf su: Müzaf su başqa bir şeydən alınan suya deyilir, məsələn, gülab, qarpız suyu, qora suyu və bu kimi sulara muzaf su deyilir. Habelə əgər şüşə qabda olan adi su əgər

.torpaq və bu kimi şeylərlə elə qarışsa ki, artıq ona su deyilməsə, o da muzaf sudur

.Mohrim: Həcc və umrə üçün ehram bağlayan şəxs

Muhtərəm mallar: İslami qaydalar üzrə olub, sahibinin icazəsi olmadan başqalarına .haram olan mallar

Muzariə: Yer sahibi ilə əkinçinin arasında bağlanan anlaşma. Bu anlaşmaya görə .məhsulun müəyyən miqdarı əkinçinin, qalanı isə torpaq sahibinin olur

Müstəhəb: Görülməsi yaxşı, savabı olan, lakin tərk edilməsi İlahi əzaba səbəb olmayan .(əməldir (salam vermək, sədəqə s. kimi

Müflis: Borcları mal-dövlətindən çox olduğuna görə cameuş-şərait müctəhid .tərəfindən öz malında təsərrüf etməsi qadağan olunan şəxs

Mürtədd: Əvvəlcə müsəlman olub müsəlmanlıqdan çıxaraq, Allahını, Peyğəmbərini .inkar etmək mənasına gələn, zəruri din hökmlərindən birini inkar edən şəxs

Müctəhid: Allahın hökmlərini anlamaqda ictihad dərəcəsinə yetişən, yəni Kitab (Quran) .və sünnətdən İslami hökmləri çıxarmağa elmi gücü olan şəxs

.Müqəllid: Müctəhidə təqlid edən, onun sözlərinə baxan

.Müstəhəb: Yerinə yetirilsə savab, yetirilməsə əzabı olmayan şər` i hökm

.Müməyyiz: Yaxşı və pisi anlayan uşaq

.Mükəlləf : Həddi-buluğa yetişmiş ağıllı insan

.Müvəkkil: Özünə vəkil tutan

.Müşrik: Allaha şərik qoşan

Mübah: Görülməsi və tərk edilməsi eyni dərəcədə olan əməldir. Onun savabı yoxdur .İlahi əzaba da səbəb olmur

.Mübtədiə: İlk dəfə heyz qanı görən qadın

Mütləq qürbət qəsdi: Şəriət sahibinin əmrini yerinə yetirmək qəsdi-istər vacib olsun, .istərsə müstəhəb

Mütləq su: Meyvə və ona bənzər şeylərdən əldə edilməyən və başqa bir şeylə .qarışmayan, əgər qarışarsa su halətindən çıxmayan normal su

.Müstəhazə: İstihazə qanını görməkdə olan qadın

Mütənəccis: Özlüyündə təmiz olan, lakin nəcis bir şeylə qarışaraq və ya nəcis şeyə .dəyərək nəcis olan şey

.Müztəribə: Heyz qanı görməsi zamanı normal olmayan qadın

Məsh: Bir şeyin üstünə əli sürtmək, dəstəmazda əlləri baş və ayaqların üzərinə .çəkmək

.Mən": Çəki vahididir. Təqribən ۳ kq-dır"

.Məmum: Camaat namazında imam camaata iqtida edən şəxs

Məzalim: İnsanın boynunda olan və sahibini tanımadığı, yaxud sahibini tapa bilmədiyi .şeylər

.Məhrəm: Şəri cəhətdən insanın evlənməsi əbədi haram olan şəxslər

.(Məzi: Qadınla oynaşarkən kişidən gələn su (bu məni deyil

.Məchulul-malik: Maliki məlum olmayan və itmiş şeyin hökmləri ona aid edilməyən şey

.Məzməzə: Suyu ağızda dolandırmaq

Məhəlli-işkal: İradı var, onun səhih olması şübhəlidir. (Müqəllid bu kimi məsələlərdə .(başqa müctəhidə müraciət edə bilər

Məhəlli təəmmül: Gərək ehtiyat edilsin. (Müqəllid bu kimi məsələlərdə başqa .(müctəhidə müraciət edə bilər

Məkruh: Tərk edilməsi yaxşı və savablı, lakin görülməsi İlahi əzaba səbəb olmayan .(əməldir (yeməyi üfürmək, qaynar xörək yemək və s.kimi

Milli mürtəd: Kafir ata və anadan dünyaya gələrək sonra İslamı qəbul edərək .müsəlman olduqdan sonra İslamdan üz döndərənə deyilir

.Miskin: Fəqir, yoxsul, vəziyyəti fəqirdən də pis olan şəxs

Misqal: ۴,۶۴ qramdır. (۲۴ noxud bir misqaldır, deməli bir noxud misqalın ۲۴-də biri (.qədərdir

.Möhtəlim: Yuxu halında məninin insandan xaric olması

N

Nəvasib:İmamlara (xüsusilə həzrət Əliyə (ələyhis-səlam)) qarşı nalayiq sözləri rəva .bilənlər

.Nafilə: Müstəhəb namaz

.Nasiyə: Adət vaxtını unudan qadın

.Nəcis: Təmiz olmayan şey

.Nəfsa: Nifas qanı görməkdə olan qadın

Nəfsi-muhtərəmə: Şərən qanı muhtərəm olan, halal olmayan şəxs, öldürülməsi caiz .olmayan şəxs

Nəzr: Xüsusi bir niyyətlə yaxşı bir işi görməyi və ya pis bir işi tərk etməyi özünə vacib .etmək

.Nifas: Doğumdan sonra qadının bətnindən gələn qan

.Nigah: Evlənmək

.Nisab: Təyin edilmiş miqdar

Nisa təvafı: (Qadın təvafı) Həcc və ümreyi-müfrədənin son təvafı. Bu təvafı tərk etmək .təvaf edən üçün haramdır

R

.Rəbəvi borc: Artığı ilə ödənilməsi şərtilə verilən borc

.Rəcaən: Həqiqətə çatmaq ümidi ilə bir işi görmək

Rəca qəsdilə: (Rəcaən) bir əməlin həqiqi hökmünü bilmədiyimiz təqdirdə onu həqiqətə .oxşatmaq ümidilə etmək

Rəhn: Borclu şəxsin borc aldığı miqdar əvəzində qoyduğu mal. Təyin edilmiş vaxtda borc qaytarılmasa, borc verən həmin maldan alacağı miqdar əvəzində istifadə edə .bilər

.Rükn: Bir şeyin təməl dirəyi, ibadətlərin təməl üzvü

.Rüku: Namazda Allahın əzəməti qarşısında əllər dizə çatacaq qədər əyilmək

S

.Sa: Çəkisi üç kiloqram olan bir ölçü

.Səmən: Əmtəənin qiyməti

Səcdeye-səhv: Namazda səhvən əmələ gələn yanlışlıqlar üçün namzdan sonra edilən .səcdə

T

.Təqib: Namazdan sonra zikr, dua və Quran oxumaqla məşğul olmaq

.Təqlid: Müctəhidin fətvalarına əsasən əməl etmək

